Elnur Nəsirov

Orta Əsrlərdə Yaşamış

# AZƏRBAYCANLI ALİMLƏR

fəqihlər, müfəssirlər, mühəddislər, mütəkəllimlər, ravilər, qarilər...

العلماء ورثة الأنبياء



**Orta Əsrlərdə Yaşamış**

# AZƏRBAYCANLI ALİMLƏR

**fəqihlər, müfəssirlər, mühəddislər, mütəkəllimlər, ravilər, qarilər ...**

# علماء أذربيجان

## في قرون الوسطى

**فقهاء, مفسّرين, محدّثين, متكلّمين, رُواة, القراء ...**

# THE AZERBAİJANİ SCHOLARS

## Lived in the Middle Ages

**fuqaha, mufassers, muhaddeses, mutakallims, ruwat, qurra ...**

Orta Əsrlərdə Yaşamış

# AZƏRBAYCANLI ALİMLƏR

**fəqihlər, müfəssirlər, mühəddislər, mütəkəllimlər, ravilər, qarilər ...**

العلماء ورثة الانبياء

**Elnur Nəsirov**

Kitabın üz qabığındakı rəsm tanınmış türk rəssamı
Osman Həmdi bəyin (1842-1910) "İlahiyyatçı" portretidir.

**Bakı 2011**

**azerialimler@box.az**

Kitabın üz qabığındakı ərəbcə yazıda Muhəmməd peyğəmbərin (ﷺ) "**Alimlər peyğəmbərlərin varisləridirlər**" sözü yazılmışdır. Hədisin bütünü isə belədir:

عَنْ أَبِي الدَّرْدَاءِ قَالَ : فَإِنِّي سَمِعْتُ رَسُولَ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ , يَقُولُ : مَنْ سَلَكَ طَرِيقًا يَطْلُبُ فِيهِ عِلْمًا , سَلَكَ بِهِ طَرِيقًا مِنْ طُرُقِ الْجَنَّةِ ، وَإِنَّ الْمَلائِكَةَ لَتَضَعُ أَجْنِحَتِهَا رِضًا لِطَالِبِ الْعِلْمِ ، وَإِنَّ فَضْلَ الْعَالِمِ عَلَى الْعَابِدِ كَفَضْلِ الْقَمَرِ لَيْلَةَ الْبَدْرِ عَلَى سَائِرِ الْكَوَاكِبِ ، وَإِنَّ الْعَالِمَ لَيَسْتَغْفِرُ لَهُ مَنْ فِي السَّمَوَاتِ وَمَنْ فِي الأَرْضِ ، وَكُلُّ شَيْءٍ حَتَّى الْحِيتَانِ فِي جَوْفِ الْمَاءِ ، إِنَّ الْعُلَمَاءَ وَرَثَةُ الأَنْبِيَاءِ ، إِنَّ الأَنْبِيَاءَ لَمْ يُوَرِّثُوا دِينَارًا ، وَلا دِرْهَمًا ، وَأَوْرَثُوا الْعِلْمَ , فَمَنْ أَخَذَهُ أَخَذَ بِحَظٍّ وَافِرٍ

Əbu'd-Dərda' (ﷵ) dedi: Həqiqətən mən Allah Rəsulunun (ﷺ) belə dediyini eşitdim: "Kim elm təhsil etmək məqsədiylə yola çıxsa Allah onu cənnətin yollarından birinə istiqamətləndirər. Şübhəsiz ki, mələklər elm tələbəsini o qədər xoşlayırlar ki, onun üçün qanadlarını açarlar. Şübhəsiz ki, alimin abidə olan üstünlüyü ondörd gecəlik ayın parlaqlığına görə digər ulduzlara olan üstünlüyü kimidir. Göylərdə, yerdə və sudakı məxluqat Allahdan alimin günahlarının bağışlanmasını diləyərlər. Alimlər peyğəmbərlərin varisləridirlər. Peyğəmbərlər miras olaraq dinar və dirhəm deyil, elm qoyub gedərlər. Kim o elmi əxz etsə çox böyük bir miras əldə edər".

(**Buxari**, *Səhih*, Elm 10; **Tirmizi**, *Sünən*, Qur'an 10, Elm 19; **Əhməd ibn Hənbəl**, *Müsnəd*, Elm 252, 325, 407)

*Əsər "**Alimlər peyğəmbərlərin varisləridirlər**" sözünə məzhər olanlara ithaf olunur*

**MÜNDƏRİCAT**

بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ

# ÖN SÖZ

2009-cu ilin ramazan ayına təsadüf edən günləri idi. Şəmsəddin Zəhəbinin hədis hafizlərinin bioqrafiyaları haqqındakı "Təzkərətü'l-Hüffaz" adlı əsərinin fihristini vərəqləyirdim və "Bərdəi" nisbəsi ilə rastlaşdım. Sonra "Ərdəbili", "Miyanəci", "Bərdici", başqa bir "Bərdəi" nisbəsinə rast gəldim. Fihristdəki səhifə nömrələrini bir kənara qeyd edib bu şəxslərin tərcümeyi-hallarını oxuyanda marağım daha da artdı. Bu nisbələrin sahiblərinin həyat hekayələrini oxuduqca üzərində yaşadığımız torpaqların necə mümtaz insanlar yetişdirdiyinin şahidi oldum. Daha əvvəl də bir sıra azərbaycanlı alimlərin bioqrafiyaları, həyat və elmi fəaliyyətləri ilə tanış olmuş, bu mövzuda araşdırma aparmışdım. Lakin "siqa", "müksir", "səduq" kimi böyük hədis alimləri üçün istifadə edilən titulların daşıyıcısı olan azərbaycanlı alimlərin həyat hekayələri ilə ilk dəfə bu qədər yaxından tanış olmuşdum. Şəmsəddin Zəhəbinin əsərindən sonra hədis alimlərinin həyat və fəaliyyətlərindən bəhs edən digər rical kitablarını, təbəqat və təzkirələri tədqiq etməyə başladım. Başa düşdüm ki, nəhəng bir dəryanın sahilində dayanmışam. Bu dəryanın dərinliklərinə dalmağın artıq sadəcə bir tədqiqatçı kimi "işim" deyil, bir müsəlman və azərbaycanlı olaraq borcum olduğunu dərk etmişdim. Həyat və elmi fəaliyyətlərini aydınlığa qovuşdurmaq bu nadir şəxsiyyətlər qarşısında mənəvi borcum idi. Sadəcə hədis alimləri deyil, orta əsrlərdə Azərbaycan torpaqlarında yetişmiş, bu məmləkətin övladı olan fəqih, müfəssir, mütəkəllim, qarilərin də həyat və elmi fəaliyyətləri haqqında mənbələrin nəql etdikləri məlumatları toplamaq qərarına gəldim. Beləcə bir illik gərgin və fasiləsiz əməkdən sonra ərsəyə gələn bu əsərin təməli qoyulmuş oldu.

Azərbaycanlılar ərəblərdən sonra İslamı, kütləvi surətdə, qəbul etmiş ilk millətdirlər. Allah Rəsulu Muhəmmədin (ﷺ) vəfatından cəmi 7 il sonra, 639-cu ildə Xoy və Səlmas şəhərlərinin əhalisinin böyük əksəriyyətinin İslamı qəbul etdiyi barədə tarixi mənbələr məlumat verirlər. İrəlidə, Azərbaycan şəhərləri haqqında məlumat verərkən, bu barədə daha ətraflı danışacağıq. Xilafətin şimala açılan qapısı olan Azərbaycan, ərəblərlə əsrlər boyu davam edən müharibələr aparmış Xəzər xaqanlığı ilə həmsərhəd olması səbəbiylə

böyük strateji əhəmiyyət kəsb etmişdi. Bu səbəbdən də istər raşid xəlifələr (ﻥ), istərsə də Əməvi və Abbasi xəlifələri İslamın bu coğrafiyada yayılmasında maraqlı olmuşdurlar. Xilafətin şimal sərhədinin təhlükəsizliyinin təmini üçün Azərbaycana kütlələr halında ərəb qəbilələri köçürülmüşdü. Bu köçürmə siyasəti İslamın azərbaycanlılar arasında yayılması prosesini sürətləndirmişdi. Sonrakı əsrlərdə İslam Azərbaycanda sürətlə yayılmış və böyük əksəriyyəti atəşpərəstliyə, müəyyən bir qismi isə xristianlığa sitayiş edən ölkə əhalisinin müştərək dininə çevrilmişdi. Din birliyinin meydana gəlməsi Azərbaycanın siyasi bütünlüyünün möhkəmlənməsini təmin etməklə yanaşı elmi və mədəni tərəqqi üçün də təkanverici amil olmuşdu. Abbasi xilafəti dövründə Azərbaycanın iri şəhərləri elmi və mədəni həyatın canlılığı ilə seçilirdi. Xilafətin zəifləməsi və mərkəzdənqaçma meyllərinin artması dövründə də bu canlılıq zəifləməmişdi. Hətta deyərdim ki, əksinə daha da qüvvətləndirmişdi. Xilafətin zəiflədiyi dövrdə Bağdaddan formal asılılığı olan Rəvvadi, Salari, Saci, Şəddadi və Şirvanşahlar kimi Azərbaycan dövlətlərini idarə edənlər hakim olduqları şəhərlərin istər iqtisadi-ticari, istərsə də elmi-mədəni inkişafında maraqlı idilər. Ticari-iqtisadi canlanmanın və tərəqqinin müşahidə edildiyi şəhərlər bir müddət sonra ölkənin ziyalı potensiyalını da özünə cəlb etməyə başlayırdı. Bu da öz növbəsində həmin şəhərlərdə elm və tədris ocaqlarının yaranıb inkişaf etməsinə səbəb olurdu. İrəlidə barələrində bioqrafik məlumat verəcəyimiz şəxslərin yaşadığı dövrlərlə onların yetişdikləri şəhərlərin tarixini müqayisə edərkən bunu rahatlıqla təsbit etmək mümkün olacaqdır. Məsələn klassik ərəb coğrafiyaşünaslarının "Arranın anası" adlandırdıqları Bərdə şəhəri xilafət dövründə Azərbaycanın şimalında inzibati mərkəz olmuşdur. İnzibati-siyasi əhəmiyyət qazanması tezliklə bu şəhərin ticari-iqtisadi inkişafına da təkan vermişdi. Bu inkişaf X əsrin ortalarında rusların Bərdəni xarabazara çevirmələrinə qədər davam etmişdir. "Bərdəi" nisbəsi daşıyan alimlərin də məhz VIII-X əsrlərdə yaşaması iqtisadi-ticari canlanmanın qaçılmaz olaraq elmi-mədəni tərəqqiyə təkan verdiyi barədəki fikrimizi dəstəkləyir. Eləcə də "Naxçıvani" nisbəsi daşıyan alimlərin daha çox XII-XIII əsrlərdə, yəni Atabəylərin hakimiyyəti dövründə, "Gəncəvi" nisbəsi daşıyan alimlərin isə X-XI əsrlərdə, yəni Şəddadilərin hakimiyyəti illərində yaşamalarını da buna nümunə göstərmək olar. Bu iki şəhər adı çəkilən dövlətlərin

paytaxtı olmuşdular. Eləcə də irəlidə ölkədən kənarda elmi fəaliyyətlə məşğul olan azərbaycanlı alimlərin müxtəlif dövrlərdə müxtəlif ölkələrə üz tutduqlarının şahidi olacağıq. Məsələn XI əsrə qədər Bağdadın elm ocaqları müsəlman şərqindəki ziyalı kütlə üçün cazibə mərkəzi idisə, bunun ardınca gələn dövrdə alimlər, elm və sənət adamları Buxara, Nişapur və Səmərqənd kimi şəhərlərə daha çox üz tuturdular. Çünki adı çəkilən şəhərlər elm və mədəniyyətə böyük əhəmiyyət verən Samanilərin böyük şəhərləri idi. Moğol işğalından sonrakı dövrdə isə Məmlüklülərinin idarəsi altına olan Misir və Şam diyarı, sonrakı əsrlərdə isə Osmanlı ölkəsindəki elmi-mədəni mərkəzlərin İslam coğrafiyasının dörd bir yanından gələn alim və mütəfəkkirləri özünə cəlb etdiyini müşahidə etmək olar.

Millətlərin və cəmiyyətlərin mədəni dəyəri onun yetişdirə bildiyi elm və düşüncə insanlarının keyfiyyəti ilə, sayı ilə deyil məhz keyfiyyəti ilə, birbaşa bağlıdır. Çünki bu həmin cəmiyyətin özünəməxsusluğunun, bənzərsizliyinin göstəricisidir. Elmin, təfəkkürün, ümumiyyətlə mədəniyyətin təqlidi siyasi və iqtisadi asılılıqdan daha ağır və faciəli nəticələrə səbəbiyyət verir. Siyasi və iqtisadi baxımdan asılı vəziyyətə düşmüş cəmiyyətlər fiziki cəhətdən ölürlərsə, elmi-mədəni baxımdan yad ünsürlərdən asılı olan və ya onu təqlid edən cəmiyyətlər ruhən məhv olurlar. Müsəlman şərqi son üç əsrdə ruhən ölmüş, fiziki baxımdan isə nəfəs alır vəziyyətdə idi. Son 30-40 ildəki hərəkətliliyi bu koma vəziyyətindən çıxışa doğru atılmış addımlar hesab etmək olar. Bu baxımdan azərbaycanlıların üzərində yaşadıqları torpağın altında necə insanların yatdığını bilmələrinin faydalı olacağı düşüncəsi ilə bu əsəri oxucunun xidmətinə təqdim edirəm.

Elnur Nəsirzadə

26 ramazan 1431/05 sentyabr 2010

ظ

كانت أيام رمضان من عام ٢٠٠٩. و كنت أتجول بين صفحات فهرس كتاب "تذكرة الحفّاظ" لشمس الدين الذهبي عن ترجمة حياة حفّاظ الحديث. و التقيت بكنية "بردعي" ثم "أردبيلي" ثم "ميانجي" ثم "برديجي" ثم "بردعي" آخر. وسجلت أرقام تلك الصفحات في مكان آخر و بدأت بقرآءة ترجمة حياة أولئك الأشخاص. و قد ازداد اهتمامي و شوقي في قرآءة هذا الموضوع. و عندما قرأت حكاية حياة هذه الأنساب علمت أن كم من أشخاص طيبة وهبت إلى العالم هذه الأراضي التي نعيش عليها. لقد قرأت عن حيات علماء أذربيجان و عن نشاطاتهم العلمية و حققت هذا الموضوع من قبل. و لكن كان هؤلاء الأشخاص أول من رأيت أنهم كَنّوا بثقة أو مكيثٍ أو صدوق حيث كان تستعمل هذه الكنى لكبار العلماء الحديث. و بعد كتاب شمس الدين الذهبي بدأت بتحقيق كتب أخرى التي تحدث عن نشاطات علماء الحديث و كتب الرجال. وفهمت أني قد وقفت في شاطئ محيط عظيم. و عرفت أن دخولي الى عمق هذا المحيط ليس عملي كمحقق فقط بل حق علي كمسلم و أذربيجاني. وكذلك كنت أحسب حقاً معنويا علي أن أبين حياتهم و نشاطاتهم أمام العالم. وقرّرت أن أجمع ما نقل إلينا المصادر التارخية عن حياة و نشاطات علمية أبناء هذا الوطن الفقهاء و المفسّرين و المتكلّمين و القرّاء في عصور الوسطن. وهكذا كتب كتاب الذي بين يديكم بعد عمل شديد دون التوقف.

شعب الآذربيجاني هو أول شعب دخل إلي الاسلام بالكتلة بعد العرب. كذلك يخبرنا مصادر تاريخية بأن أكثر أهل مدينة خُويّ و سلماس أسلموا عام ٦٣٩ و هذا بعد ٧ سنين فقط من وفاة رسول الله ق و ستكلّم إن شاء الله عن هذا مفصّلاً في ما بعد. كانت أذربيجان أرض ستراتيجي للخلافة و لأجل ذلك نستطيع أن نقول لأذربيجان باب الخلافة الذي يفتح إلي الشمال لأنها كانت تقع في حدود الخزر الذي حارب الإسلام و المسلمين وقتاً طويلا. ولذلك كان نشر الدعوة الإسلامية محل إهتمام الخلفاء الراشدين و لأمويين و العبّاسيين. ولأجل أمن الحدود الخلافة الشمالية كانوا ينقلون القبائل العربية إلى أذربيجان. وهذا كان يسهل نشر الدين بين شعب أذربيجاني. بعد ذلك أصبح الإسلام دنياً مشتركاً لقوم الذي كان اكثره من أهل مجوس و أقله نصرانيا. وإشتراك الشعب في دين واحد كان عاملاً مهماً لتقدم علمي و ثقافي. وكانت المدن الكبيرة تتميز بنشاطها العلمية و الثقافية في عهد العبّاسيه وهذا النشاط لم تضعف بضعف الخلافة من بعد بل أقول بالعكس أنه أصبح قوياً. لأن اللأمراء الذين كانوا يحكمون دول الأذربيجان "روّاديين", "سلاريين", "ساجيين", "شدّاديين", "شروانشاهيين" كانوا مهتمين في تطور المدن تحت رئاستهم اقتصادياً و سياسياً و علمياً و ثقافياً. وهذا التقدم الإقتصادي و التجاري كان يسبب ان يكون هذه المدن مدن أهل العلم و كذلك كان يسبب في فتح مدرس وتطور العلم في تلك المدن. مثلاً مدينة بردعة التي يسميها الجغرافيون العرب القدما " أمّ الرّان" كانت مركزاً إدارياً في شمال أذربيجان. كون هذه المدينة مركزاً إدارياً و سياسياً دفع إلى تقدم التجاري و الإقتصادي. امتد هذا التقدم إلى أن خرب الروس بردعة في عصر العاشر و إذا تأملنا العلماء الذين كنوا ببردعي أنهم عاشوا في عصور ٨ و ١٠. وهذا يؤيد فكرنا أن التقدم الإقتصادي و التجاري يدفع إلى التقدم العلمي و الثقافي. وكذلك نستطيع أن نضرب مثلاً أخر أن العلماء الذين كنوا بناخجواني في عصور١٢ و ١٣ أي في عهد إلدكزيين (اتابكيين الأذربيجان) والذين كنوا بجنزوي (بكنجوي) في عصور ١٠ و ١١ في عهد شدّاديين. هذه مدينتان بردعة و جنزة (كنجه) كانتا عاصمتان للدول التي أقمت في أراضي أذربيجان.

وأيضاً نرى أن علماء أذربيجانيين اتجهوا إلى دول مختلفة لطلب العلم. وإذا كانت بغداد مركزاً تجذب العلماء في عصر بل كانت العلماء تتجه إلى البخارىٰ و النيسابور و سمرقند للعلم و الثقافة. ونشاهد أن ديار المصر و الشام التان كانتا تحت حكم المملكيين بعد احتلال التاتار (المغول) و مراكز العلمي و الثقافي لدولة العثمانيين في عصور التي تليها كانت تجذب إليها علماء و المتفكّرين من كل أنحاء العالم. ثمن ثقافي للشعب و المجتمع مرتبط بكيفة العلماء و المتفكّرين الذين نشأهم هذا الشعب و المجتمع. لأن هذا دليل الى خصوصية ذلك الشعب و المجتمع. تقليد العلم و التفكّر و الثقافة أكبر ضرراً من تبعية سياسة و اقتصادية. إذا قلنا أن المجتمعات التي تتبع مجتمعات أُخرىٰ في السيسة و الإقتصاد تموت ماديا و بدنيا, إذن بقدرتنا أن نقول أن المجتمعات التي تتبع مجتمعات أُخرىٰ في العلم و الثقافة تموت معنويا. و شرق الاسلامي ميّتا معنويا في العصور ثلاثة الأخيرة وقد يتنفّس بدنيا فقط. ولكن تحرّكات التي

نشاحد منذ ٤٠ و ٣٠ عاما من الممكن أن نحسب خروج من الكوخ. ولأجل ذلك أقدم هذا الكتاب لشعب الأذربيجاني لأن يعلموا كم من أشخاص ممتازة ينام تحت أراضينا.

النور نصيرزاده

٢٦ رمضان ١٤٣١/٢٠١٠ سبتمبر ٥

## PREFACE

These were the days of ramadhan in 2009. I was looking through the biographical hadith memories by Shams al-Din Dhahabi. It was the book “Tadhkarat al-Huffaz”. When I faced the “Bardai” possession while reading. Then after one another came “Ardabili”, “Miyanaji”, “Bardiji”, the other “Bardai”. Now I was interested more and having noted the pages of these possessions and began to read the biographies of the authors. Before I had learned the biographies, life and activities of Azerbaijan scienties and made some researches. But it was the first time I closely studied life and activities of great scientists using titules for “as-siqa”, “al-mukthir”, “as-sadoq”.

While reading the great monuments of these people I witnessed what distinguished great people our land had grown. After the work by Shams al-Din Dhahabi I began to research the biographical encyclopaedies, “tabagats” and “tadhkirats” dealing with their life and activities and I realized that I was standing at the shore of the great waters. I understood that it was not simply my work as a researcher, but also it was my duty as a muslim and Azerbaijan one to make their activities clearer was my duty before these rare people too. I decided to collect information not only about “hadith” scientists but also the information about life and activities of Azerbaijan “fageeh”, “mufaser” and “gari” scientists. Thus after a long year’s work this book was finished.

Azerbaijanis are the first nation after arabian who admitted Islam. It is informed that the population of Khoy and Salmas admitted Islam in 639 after Muhammad prophet’s death. Further we’ll speak about it widely while informing about Azerbaijan cities. Azerbaijan was the door opening to the north for Caliphate and it was the reason for wars between Khazar kaganate and arabian. That’s why both rashed caliphs and Umayyad caliphs, Abbasid caliphs were interested in spreading Islam in these areas. In order to assure security of north borders of Caliphate crowds of Arabian tribes were moved to Azerbaijan. This policy was the reason for spreading Islam very rapidly among Azerbaijans. Next centuries Islam was spread more widely and united all the people even having other religious such as “fire-worshipper” and “christian”. The appearance of united religion was one of the main branch for both developing of science and culture of Azerbaijan integrity.

The flourishing of big Azerbaijan cities was seen even in the period rulers Rawadids, Salarids, Sajids, Shadadids and Shirvanshakhs. The progress was in the sphere of trade, economy and culture. The rulers of these states even those who depended on Baghdad were interested in it, too. It is was also followed by scientific and educational institutions. We'll also peak widely about it while companing history of these big cities, for example Barda called "mother of Arran" by classical arabian geographists was the administrative centre in the north of Azerbaijan during the reign of Caliphate. Political, economical and cultural progress lasted till midst of X centure when Russian turned it into ruins. Thus the economical and trade development, cultural and scientific development gives us idea to be sure that scientists of "Bardai" possession lived in VIII-X centuries. Also scientists of "Nakhchivani" possession lived in XII-XIII centuries, scientists of "Ganjavi" possession lived in X-XI centuries.

Further we'll also witness life and activities of other scientists living in other countries. Scientist used to go to Bukhara, Nishapur and Samargand after XI century becouse these big cities of Samanides were in great importance for science and culture.

The people grown by nations and societies are connected not by quantity but only by quality. Political and economical dependence are couse for bad and heavy tragedies. The societies depend on economically and politicaly die physicaly but societies depend on science and culture de spritualy. Muslim East died spiritualy last 3 centures but breathed physicaly. Last 30-40 years we can consider the steps running forward. In this point of view I leave this book for my readers to witness for living of great people of Azerbaijan.

Elnur Nasirzade

05 September 2010/26 Ramadhan 1431

**Qısaltmalar**

ق ------------------------Səllallahu Əleyhi Vəsəlləm (Allahın səlamı onun üzərinə olsun)

ل/ا -----------------Radiyallahu ənh / Radiyallahu ənha (Allah ondan razı olsun)

×-----------------------Əleyhissəlam (ona səlam olsun)

/-------------------------Rəhiməhullah (Allah ona rəhmət etsin)

AMEA Əİ---------------Azərbaycan Milli Elmlər Akademiyası Əlyazmalar İnstitutu

AÜİFD------------------Ankara Üniversitesi İlahiyat Fakültesi Dergisi

AÜTAD-----------------Ankara Üniversitesi Tarih Araştırmaları Dergisi

AzSSR EA--------------Azərbaycan Sovet Sosialist Respublikası Elmlər Akademiyası

C. ------------------------Cild

CBÜSBED--------------Celal Bayar Üniversitesi Sosyal Bilimler Enstütüsü Dergisi

CÜİFD-------------------Cumhuriyet Üniversitesi İlahiyat Fakültesi Dergisi

DAAD-------------------Dinbilimleri Akademik Araştırmalar Dergisi

DÜSBED ---------------Dumlupınar Üniversitesi Sosyal Bilimler Enstütüsü Dergisi

EÜSBED----------------Erciyes Üniversitesi Sosyal Bilimler Enstütüsü Dergisi

FÜİFD-------------------Fırat Üniversitesi İlahiyat Fakültesi Dergisi

İA-------------------------İslam Ansiklopedisi

İHK-----------------------İl Halk Kütüphanesi

BYEK------------------- Bölge Yazma Eserler Kütüphanesi

KSU----------------------King Saud University

Ktbx----------------------kitabxana

MEB---------------------Milli Eğitim Bakanlığı

Nr.------------------------Nömrə

Nşr.-----------------------Naşir, nəşr edən

S. -------------------------Sayı

s. -------------------------Səhifə

SÜİD--------------------Selçuk Üniversitesi İlahiyat Dergisi

SÜİFD------------------Sakarya Üniversitesi İlahiyat Fakültesi Dergisi

SÜTAD-----------------Selçuk Üniversitesi Türkiyat Araştırmaları Dergisi

SYEK-------------------Süleymaniye Yazma Eserler Kütüphanesi

TDV---------------------Türkiye Diyanet Vakfı

Trc.----------------------Tərcümə edən

trz. ----------------------tarixsiz

TTK--------------------Türk Tarih Kurumu

VGMK-----------------Vakıflar Genel Müdürlüğü Kütüphanesi

v. ----------------------Vərəq

və.s--------------------və sair

# GİRİŞ

## TƏDQİQAT ÜSULU VƏ MƏNBƏLƏRİN XÜLASƏSİ

Elmi tədqiqatlarda əsasən deduktiv metoda üstünlük verilir. Tədqiqatlarda, həmçinin təhqiqatlarda, deduktiv metodun, yəni faktlar və dəlillərin göstərdiyi istiqamətdə irəliləyərək problemin həllinə nail olmağın sözsüz ki, böyük əhəmiyyəti var. Buradakı araşdırmada da bu metoda üstünlük verilmişdir. Çünki məlumat sahibi olmadan fikir, qənaət sahibi olmaq zərərli olmaqla yanaşı, həm də təhlükəlidir. Hər şeydən əvvəl tədqiqatın əhatə etdiyi tarixi zaman dilimini müəyyənləşdirmək lazım gəlir və biz burada orta əsrlərdə yaşamış azərbaycanlı alimlər haqqında söhbət açacağıq. Həyat və fəaliyyətlərini araşdıracağımız şəxslərin böyük əksəriyyəti dini elmlər sahəsində tanınmış azərbaycanlılardır. Bunların əksəriyyəti fiqh, yəni İslam hüququ sahəsində, eləcə də hədis, təfsir, qiraət, kəlam sahələrində ixtisaslaşmış alimlərdir. Onlardan bəziləri həm də öz dövrünün tanınmış filoloq və ədəbiyyatşünaslarıdır. Bununla yanaşı tibb, riyaziyyat, astronomiya kimi dəqiq elm sahələrinə aid alimlərin, həmçinin orta əsrlərdə yaşamış bəzi azərbaycanlı dövlət xadimlərinin bioqrafiyalarına da yer verilmişdir. Burada bioqrafiyalarını qələmə aldığımız dini elmlər sahəsində fəaliyyət göstərmiş azərbaycanlı alimlər sələfi, əş’ari və maturidi etiqadi cərəyanlara mənsub şəxslərdir. Aralarında mö’təzilə və xəvaric kimi cərəyanlara mənsub, öz dövrünün tanınmış bir neçə aliminin bioqrafiyalarına da rast gələcəksiniz. Fütuvvət və təsəvvüf əhlinə mənsub təriqət şeyxlərinin bioqrafiyaları araşdırılarkən müəyyən kriteriyalar əsas götürülmüşdür. Məlum olduğu kimi sufi təriqətlərinə mənsub bəzi tanınmış simalar istər yaşadıqları dövrdə, istərsə də sonrakı dövrlərdə ciddi tənqidə məruz qalmışdırlar. Burada həyat və faəliyyətlərinə yer verdiyimiz azərbaycanlı sufilərin söz, hal, hərəkət və əsərlərinin Qur’an və səhih hədislərlə zidd olmamasına, yaxud onların hədis, hədis üsulu, fiqh, fiqh üsulu, təfsir, təsfir üsulu, qiraət, kəlam kimi dini elmlər sahəsində əsər qələmə almış olmalarına diqqət yetirilmişdir. Haqqında bioqrafik məlumat verilən şəxslərin adları əslən mənsub olduqları Azərbaycan şəhərlərinə görə, şəhər adları isə əlifba sırasına görə sıralanmışdır. Haqqında məlumat verilən şəxsin adı titul, ləqəb, künyə, ad, ata adı, əcdad və nisbə formasında düzülmüşdür. Məsələn: “Əllamə Tacəddin Əbü’l-Həsən Əli ibn Abdullah ibn Əbu Bəkr Ərdəbili”də **titul**-*əllamə*,

**ləqəb**-*Tacəddin*, **künyə**-*Əbü'l-Həsən*, **ad**-*Əli*, **ata adı**-*Abdullah*, **baba adı**-*Əbu Bəkr*, **nisbə**-*Ərdəbili* formasında düzülmüşdür. Sonu "əd-din"lə bitən ləqəblərin daşınması orta əsrlərdə İslam coğrafiyasında xeyli yayılmışdı. Künyə, yəni şəxsin öz oğlunun adı ilə tanınması və nisbə, yəni şəxsin hansı ölkə, şəhər, millət, etnik qrup və tayfaya mənsub olduğunu bildirməsi isə qədim ərəb ənənəsinin İslamı qəbul etmiş digər millətlərə də keçməsindən irəli gəlir. Ərəb cəmiyyətində hələ İslamdan əvvəl "ənsab" elmi, yəni nəsəbin bilinməsi və oğul atası olmaq mühüm əhəmiyyət kəsb edirdi.

İrəlidə ayrı-ayrı şəxslərin bioqrafiyasını oxuyarkən müxtəlif dini, elmi və fəlsəfi cərəyanlar, ictimai hərəkatlar, elm sahələri, mədəni və iqtisadi münasibətlərin mahiyyətinin daha asan və dərindən dərk edilə bilinməsi üçün sözü gedən dövrdə İslam dünyasında mövcud olmuş dini və fəlsəfi cərəyanlar haqqında əvvəlcədən ətraflı məlumat veriləcəkdir. Haqqında söhbət açılacaq şəxslər İslam coğrafiyasının müxtəlif yerlərində yaşadıqları və bu coğrafiyada mövcud olan sivilizasiyanın mənsubu olduqları üçün sivilizasiya, mədəniyyət məfhumları, İslam sivilizasiyasının yaranma və inkişafı proseslərinə nəzər salınacaqdır. Bundan başqa Azərbaycanın tarixi coğrafiyası mövzusuna da geniş yer veriləcək, bu haqda ortaya atılan bəzi əsassız və məsnədsiz iddiaların çürüdülməsinə də çalışılacaqdır.

Monoqrafiyanın əsas hissəsinin bioqrafiyalardan ibarət olduğunu nəzərə alaraq hər şeydən əvvəl orta əsr İslam coğrafiyasında tarixçiliyin, ələlxüsus bioqrafik tarixçiliyin yüksək inkişaf səviyyəsinə çatdığını və bu sahədə çox dəyərli əsərlərin qələmə alındığını qeyd etmək yerinə düşəcəkdir. İslam dünyasında siyasi hadisələrin gedişatı tarix elminin və tarixçiliyin inkişafına da əsaslı şəkildə təsir etmişdir. VIII-IX əsrlərdən etibarən siyasi tarix sahəsində ən dəyərli əsərlərin müəllifləri saray katibləri, bürokratlar olmuşdurlar. Çünki tarixçilik artıq ayrı-ayrı sülalələrin tarixini yazmaq ənənəsinə çevrilmişdi. Bu səbəbdən siyasi tarix qələmə almaqdan mümkün qədər uzaq qalmağa çalışan din alimləri bioqrafiya, tərcüməyi-hal kitabları yazmağa üstünlük vermişdirlər. Orta əsrlərdə yaşamış bir çox müsəlman tarixçi alimləri peyğəmbərlərin varisləri hesab etdikləri üçün onların həyatlarına dair qələmə alınmış tarixi əsərlərin İslam ümmətinin həqiqi tarixi olduğunu düşünmüşdürlər. Buna görə də mühəddis,

fəqih, müfəssir, qari, filoloq, ədib, şair, filosof və təbiblərin həyatı haqqında yüzlərlə, minlərlə kitab və risalə qələmə alınmışdır[1].

Tədqiq olunan dövrə və mövzuya aid mənbə materilların böyük hissəsini ərəb, müəyyən hissəsini isə farsca və türkcə qələmə alınmış əsərlər təşkil edir. Yuxarda qeyd etdiyimiz kimi hələ İslamdan əvvəl ərəb cəmiyyətində "ənsab" elmi mühüm əhəmiyyət kəsb edirdi. Tarixçilər tərəfindən cahiliyyə dövrü adlandırılan, ərəblərin İslamdan əvvəlki tarixi bütün mənfilikləri ilə yanaşı ərəblərin qəhrəmanlıq çağıdır. Ələlxüsus çöl ərəblərinin, yəni bədəvilərin başlıca öyünc mənbəyi igidlik, şairlik, nüfiz və sərvət sahibi olmaq idi. Bu bədəvilər arasında qəbilə, soy-kök təəssübkeşliyinin yaranması və möhkəmlənməsinə səbəb olmuşdu[2]. Hər bir ərəb qəbiləsinin ata-babasının adlarının yazıldığı "nəssabə" adlanan soy ağacları, şəcərələr tərtib olunurdu. Bu şəcərələr hətta ərəb millətinin iki ulu əcdadı hesab olunan Ədnan və Qəhtana qədər gedib çıxırdı. Bu ənənə İslam tarixçiliyinin meydana gəlməsi və inkişaf etməsində böyük rol oynamışdır[3]. "Rical", "təbəqat", "təzkirə" tipli ensklopedik tərcümeyi-hal kitablarının meydana gəlməsində bu amil mühüm yer tutmuşdur. Xüsusən mühəddislərin yazdıqları əsərlərdə ayrı-ayrı şəxslərin adları, xronoloji ünsürlər, vəfat tarixləri dəqiqliklə müəyyən edilərək qeyd edilmişdir. Bununla yanaşı haqqında məlumat verilən şəxslərin həyatlarında yaşanmış mühüm hadisələr nəql edilmiş, şairlərin şerlərindən, alimlərin hikmətli sözlərindən nümunələr iqtibas edilmişdir. Alimlərin elmi və ədəbi şəxsiyyəti bütün təfərrüatı ilə oxucuya çatdırılmağa çalışılmışdı. Burada istifadə etdiyimiz bu tərz kitabların ən əhəmiyyətlilərindən biri Əbu Sə'd Əbdülkərim əs-Səm'aninin *Kitabü'l-Ənsab* adlı əsəridir. 1113-cü ildə Xorasanın Mərv şəhərində dünyaya gəlmiş əs-Səm'ani 1167-ci ildə Mərvdəki Əhmədiyyə mədrəsəsində vəfat etmişdir. Sözü gedən əsər, haqqında məlumat verilən şəxslərin nisbələrinin əlifba sırasına görə düzülərək tərtib edildiyi bioqrafiya və coğrafiya kitabıdır. *Kitabü'l-Ənsab* öz sahəsinə dair mühüm mənbələrdən biridir. Əsər ilk dəfə Londonda 1912-ci ildə nəşr olunmuşdur. Daha sonra 1961-1969, 1980-ci illərdə Heydərabadda və 1976-1982-ci ildə

---

[1] Ramazan ŞEŞEN, *Müslümanlarda Tarih-Coğrafya Yazıcılığı*, s. 82-83, İstanbul 1998.
[2] Cavad ƏLİ, *Müfəssəl fi Tarixü'l-Ərəb Qəblə'l-İslam*, C. II, s. 533-534, Bağdad 1993; Neşet ÇAĞATAY, *İslam Dönemine Dek Arap Tarihi*, s. 128, 138, Ankara 1989.
[3] Ahmet ÖNKAL, "Araplarda Ensab İlmi ve İslam Tarihi Açısından Önemi", SÜİD, S. 3, Konya 1990, ss. 117-132.

Dəməşqdə nəşr olunmuşdur. *Kitabü'l-Ənsab* Ömər əl-Barudi tərəfindən 4 cild halında 1988-ci ildə Beyrutda çap edilmişdir. Biz burada göstərilən sonuncu nəşrdən istifadə etmişik.

Bioqrafiyalar sahəsində ən çox müraciət etdiyimiz əsərlərdən biri də 1179-1229-cu illərdə yaşamış Şihabəddin Yaqut ər-Rumi əl-Həməvinin *Mu'cəmü'l-Büldan* adlı əseridir. Müəllifin öz bioqrafyası da xeyli maraqlı və rəngarəngdir. Nisbəsindən də göründüyü kimi o, Rumlu, yəni Anadoluludur. Uşaq vaxtı Anadoluda əsir alınaraq Bağdada gətirilmiş, Həmalı tacir Əsgər ibn İbrahim tərəfindən kölə bazarından satın alınmışdır. Ağası onun yaxşı təhsil almasını təmin etmiş və müxtəlif ölkələrə özünün təmsilçisi olaraq ticarət səfərlərinə göndərmişdi. 1199-cu ildə ağası tərəfindən köləlikdən azad edilmiş və azad şəxs kimi Əsgər ibn İbrahimin yanında işləmişdi. Lakin bir müddət sonra sabiq ağası ilə arası dəymişdi. İran, Xorasan, Azərbaycan, Misir və Şam diyarlarını gəzən Yaqut əl-Həməvi moğolların ilk hücumu vaxtı sahib olduğu bütün mal-dövləti qoyaraq Xorasandan Suriyaya qaçmağa məcbur olmuşdu. Səyahətləri vaxtı İslam coğrafiyasının müxtəlif şəhərlərindəki kitabxanaları gəzərək yazacağı əsərlər üçün material toplamışdı. 1224-cü ildə Misirdə *Mu'cəmü'l-Büldan*ı yazıb bitirmişdi. Bu əsər əslində əlifba sırasına görə tərtib edilmiş coğrafi lüğətdir. Müəllif ölkələr, regionlar və şəhərlər haqqında coğrafi məlumatlarla yanaşı həmin yerlərdən yetişmiş məşhur alimlər haqqında da məlumat vermişdir. Yaqut əl-Həməvi, orta əsr müəlliflərinin bir çoxundan fərqli olaraq, nəql etdiyi tarixi-coğrafi və bioqrafik məlumatı aldığı mənbə və ya şəxsin adını da qeyd etmişdir. Burada *Mu'cəmü'l-Büldan*ın, müasir tədqiqatçılar tərəfindən ən çox istifadə edilən, 5 cild halındakı Beyrut nəşrindən istifadə olunmuşdur. Dəməşqli Əbdülhəyy ibnü'l-İmadın (1622-1679) *Şəzəratü'z-Zəhəb fi Əxbari mən Zəhəb* adlı ümumi bioqrafiya əsəri bu sahədə ən çox müraciət olunan mənbələrdəndir. İbnü'l-İmad bu əsərində 1592-ci ilə qədər İslam coğrafiyasında yaşamış alimlər və tanınmış şəxsiyyətlərin həyatından bəhs etmişdir. Əsər bir neçə dəfə nəşr olunmuşdur. Əbdülqadir Arnavud əsəri təqiq edərək 1986-1991-ci illərdə 10 cild halında Dəməşqdə nəşr etmişdi. Burada sözügedən nəşrdən faydalanılmışdır.

Şafi'i məzhəbinə mənsub fəqihlərin həyat və elmi fəaliyyətlərindən bəhs edən təbəqat kitabları ən çox müraciət etdiyimiz mənbələrdəndir. Belə ki, orta əsrlərdə Azərbaycan

coğrafiyasında yaşayan müsəlmanların böyük əksəriyyəti bu fiqhi məzhəbin mənsubları olmuşdurlar. Şafi'i təbəqatlarından Cəmaləddin Əbdürrəhim Əsənvinin *Təbəqatu's-Şafi'iyyə*, Əbu Bəkr ibn Qazi Şuhbənin *Təbəqatu's-Şafi'iyyə*, Təqiyəddin ibnü's-Səlah Şəhrəzurinin *Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, Tacəddin Əbdülvəhhab Sübkinin *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, İbn Kəsir əl-Ənsarinin *Zeyl Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə* adlı əsərləri tez-tez müraciət etdiyimiz bioqrafik mənbələrdir. Ümumiyyətlə fiqhi məzhəblərə, yəni hüquq məktəblərinə aid təbəqat kitabları İslam dünyasının elm tarixi ilə maraqlanan tədqiqatçılar üçün əvəzedilməz mənbələrdir. Fiqhi məzhəblərlə yanaşı hər bir elm sahəsinə aid alimlərin həyat və fəaliyyətlərindən bəhs edən təbəqat kitablarını bu kateqoriyaya daxil etmək olar. Əbdürrəhman Hənbəlinin *Zeyl Təbəqatu'l-Hənabilə*, Muhyəddin ibn Əbü'l-Vəfanın *Cəvahirü'l-Muziyyə fi Təbəqatü'l-Hənəfiyyə*, Zeynəddin ibn Qutlubuğanın *Tacü't-Tərcim fi Təbəqatü'l-Hənəfiyyə*, Əlaəddin Əli Xınalızadənin *Təbəqatü'l-Hənəfiyyə*si burada istifadə olunmuş hənəfi və hənbəli fəqihlərinin tərcümeyi-hallarından bəhs edən əsərlərdir. Bundan başqa təfsir, hədis, qiraət və tibb sahəsində öz dövrünün tanınmış elm adamlarının bioqafiyalarının yazıldığı təbəqat kitablarına da müraciət edilmişdir. Bunlardan ən əhəmiyyətliləri sırasında Şəmsəddin Davudinin *Təbəqatü'l-Müfəssirin* adlı İslam dünyasında yetişmiş təfsir alimlərinin bioqrafiyalarına dair əsərin adını çəkmək olar. İbn Əbdülhadi əd-Diməşqinin *Təbəqatu-Üləmai'l-Hədis* adlı dörd cildlik əsərində məşhur hədis alimlərinin həyat və fəaliyyətindən bəhs edilmişdir. Burada əsərin 1997-ci il Beyrut çapından istifadə edilmişdir. Əsərlərinə ən çox müraciət etdiyimiz müəlliflərdən biri də türk mənşəli alim Şəmsəddin Zəhəbidir. 1273-cü ildə Dəməşqdə dünyaya gələn alimin ata-babaları Anadoludan köçüb Şam diyarında məskunlaşmışdırlar. Şəmsəddin Zəhəbi təfsir, hədis, hüquq və tarix sahəsində dərin biliyi ilə fərqlənmişdi. Gənclik illərində İslam coğrafiyasının başlıca elm və mədəniyyət mərkəzlərini gəzərək şeyxülislam Təqiyəddin ibn Teymiyyə, şeyx Yusif əl-Mizzi, şeyx Elməddin Qasım əl-Birzali, İbn Dəqiq əl-İd kimi öz dövrünün tanınmış alimləri ilə görüşüb onların elmi bilik və fikirlərindən faydalanmışdı. Şəmsəddin Zəhəbi ümumilikdə müxtəlif elm sahələrinə dair 235 əsərin müəllifidir. Bunlardan 148-i tarixə aiddir. Şəmsəddin Zəhəbi istifadə etdiyi tarixi mənbələr haqqında təfsilatlı məlumat verməsi və xronoloji ardıcıllığa dəqiq

riayət etməsiylə seçilir. Onun *Kitab Təzkərətü'l-Hüffaz* adlı əsəri ilk dövr hədis hafizləri və mühəddislərin tərcümeyi-halının öyrənilməsi baxımından əvəzedilməz mənbələrdən biridir. Müəllifin *Mizanü'l-E'tidal fi Nəqdi'r-Rical*, *Müştəbih fi Əsmai'r-Rical* adlı əsərləri də yenə hədis alimləri və hədis raviləri haqqında qiymətli məluatların toplandığı əsərlərdir. Şəmsəddin Zəhəbinin *Siyəru Ə'lamü'n-Nübəla* adlı əsəri isə 24 cildlik bioqrafik ensklopediyadır. Bu əsər İslamın ilk günlərindən müəllifin vəfat tarixinə (1347) qədərki təqribən altı əsrlik dövrdə yaşamış, müxtəlif elm sahələrində şöhrət tapmış alimlər, dövlət və mədəniyyət xadimləri haqqında çox dəyərli məlumatları ehtiva etməkdədir.

XII əsrdə Azərbaycanda yaşamış hədis alimləri haqqında hafiz Əbu Tahir Əhməd əs-Süləfi İsfəhaninin (1083-1181) verdiyi məlumatlar son dərəcə əhəmiyyətlidir. Belə ki, məşhur azərbaycanlı filoloq, Xətib Təbrizi adı ilə şöhrət tapmış Əbu Zəkəriyyə Yəhya Təbrizinin tələbələrindən biri olub ondan ərəb qrammatikası dərsləri alan hafiz Əbu Tahir əs-Süləfi 1107-ci ildən etibarən təhsil almaq məqsədiylə səyahətə çıxmış, İslam coğrafiyasının başlıca elm və mədəniyyət mərkəzlərini gəzmişdi. O cümlədən Azərbaycanın Marağa, Miyanə, Təbriz, Ərdəbil, Xoy, Düveyn, Şirvan, Tiflis, Dərbənd kimi şəhər və vilayətlərini gəzərək buradakı hədis alimləri ilə görüşmüş və onlardan dərs almışdı. Əbu Tahir əs-Süləfi bu elmi səyahətlərində görüşdüyü alimlərin bioqrafiyası və onlardan aldığı dərslərin xülasəsini özünün *Mu'cəmü's-Səfər* və *Ərbəinü'l-Büldaniyyə* adlı əsərlərində qeyd etmişdir.

XII əsrdə Azərbaycanın şəhərlərini gəzərək buradakı alimlərdən hədis dərsləri almış digər bir alim də 1105-ci ildə Dəməşqdə dünyaya gəlmiş Əli ibn Əsakirdir (öl. 1175). 1134-cü ildə Suriyadan yola çıxan İbn Əsakir Azərbaycan, İran, Xorasan və Məvəraünnəhrin böyük şəhərlərinə səyahətlər etmiş, buraların qabaqcıl alimlərinin dərslərini dinləmək fürsəti tapmışdı. İbn Əsakir öz dövrünün tanınmış mühəddis, fəqih və tarixçilərindən biridir. Onun tarix sahəsində qələmə aldığı ən məşhur əsəri *Tarixu-Mədinəti-Diməşq*dir. Əsər 1995-2000-ci illərdə Mühibbəddin əl-Əmrəvi tərəfindən Beyrutda 80 cild halında nəşr edilmişdir. Bu əsər Dəməşq şəhərinin müfəssəl tarixidir. Əsər Dəməşqin yerləşdiyi coğrafiyanın üstün cəhətləri, topoqrafiyası, saraylar, imarətlər, məscidlər, məktəblər, mədrəsələr, kilsələr, karvansaraylar, hamamlar,

meydanlar, kanallar və digər tikililəri haqqındakı ətraflı məlumatlarla başlanır. Sonrakı cildlərdə isə Dəməşqdə yetişmiş, həmçinin buraya köçüb gəlmiş və bir müddət Dəməşqdə yaşamış müxtəlif elm sahələrinə mənsub alimlər, xəlifələr, sərkərdələr, şəhərin qaziləri, canişinləri, hökmdarları haqqında geniş məlumat verilir.

Elmi dairələrdə İbnü'l-Fuvati kimi tanınan Kəmaləddin Əbü'l-Fəzl Əbdürrəzzaq ibn Əhməd əş-Şeybaninin (1244-1323) *Təlxis Məcməü'l-Adab fi Mu'cəmü'l-Əlqab* adlı əsəri də orta əsrlərdə yaşamış görkəmli azərbaycanlıların həyat və elmi yaradıcılığını öyrənmək baxımından əvəzedilməz mənbələrdən biridir. Əsilzadə ailəsinə mənsub İbnü'l-Fuvati 14 yaşında ikən Bağdadın işğalı vaxtı moğollara əsir düşmüş, Nəsrəddin Tusinin vasitəçiliyi ilə əsirlikdən azad edilmişdi. O, Nəsrəddin Tusinin istəyi ilə Marağa rəsədxanasındakı kitabxananın müdiri olmuşdu. 1280-ci ildə Bağdada qayıdaraq Müstənsiriyyə mədrəsəsi kitabxanasının müdirliyinə təyin olunmuşdu. Daha sonra Azərbaycana qayıtmış, Olcaytunun hakimiyyəti illərində (1304-1306) Elxanilərin sarayında xidmət etmişdi. Bu və sonrakı illərdə Azərbaycanın əksər böyük şəhərlərini gəzmişdi. Ərəb filologiyası, tarix, astronomiya və fəlsəfə sahəsində yaşadığı dövrün tanınmış alimlərindən olan İbnü'l-Fuvati ana dili olan ərəbcə qədər farscanı da mükəmməl bilən nadir orta əsr ərəb müəlliflərindəndir. Hənbəli məzhəbinə mənsub olsa da fəlsəfəyə məyyal olması səbəbiylə İbnü'l-Fuvati müasiri olan digər hənbəli alimlərinin tənqidinə məruz qalmışdı. Onun fəlsəfəyə marağı ehtimal ki, dostu və hamisi Nəsrəddin Tusinin təsiri ilə meydana çıxmışdı. İbnü'l-Fuvatinin *Təlxis Məcməü'l-Adab fi Mu'cəmü'l-Əlqab* adlı əsəri nəhəng bioqrafik ensklopediyadır. Alimin 50 cilddə tərtib etdiyi bu əsərin günümüzə sadəcə IV və V cildləri gəlib çatmışdır. Daha doğrusu indiyə qədər sadəcə bu iki cild aşkar edilmişdir. Zahiriyyə kitabxanasında tapılan IV cild Dr. Mustafa Cavad tərəfindən 1962-1967-ci illərdə Dəməşqdə 4 cüz halında nəşr edilmişdir. Əsərin V cildi isə Hindistandakı əlyazma əsər kitabxanalarından birində aşkar edilmiş və Muhəmməd Əbdülqüddus əl-Qasımi tərəfindən 1937-1947-ci illərdə Lahorda "Oriental College Magazine"də nəşr edilmişdir. Mərhum akademik Ziya Bünyadov bu cildlərdə görkəmli azərbaycanlılar haqqında verilmiş məlumatları tərcümə və nəşr etmişdir. Bu haqda aşağıda ətraflı məlumat veriləcəkdir. Biz bu əsərin sadəcə Dr. Mustafa Cavad tərəfindən nəşr edilmiş IV cildinin 2-ci və 3-cü cüzlərini əldə

edərək tədqiq edə bilmişik. V cilddəki məlumatları isə Ziya Bünyadovun tərcüməsindən faydalanaraq oxucuya çatdırmağa çalışdıq.

Buraya qədər sadaladığımız müəlliflərin əsərlərində VIII-XIII əsrlərdə yaşamış alim və mütəfəkkirlərin bioqrafiyaları üstünlük təşkil etmişdir. Misirli tarixçi Şəmsəddin Əbü'l-Xeyr əs-Səxavinin (1427-1497) *Zəvu'l-Lami' fi Üləmai'l-Qərnü't-Tasi'* adlı 8 cildlik əsərində XV əsrdə yaşamış bir sıra məşhur azərbaycanlı alimin tərcümeyi-halına rast gəlmək mümkündür. əs-Səxavini digər bioqraf tarixçilərdən fərqləndirən ən əsas xüsusiyyəti onun tənqidçiliyidir. Onun əsərlərini bioqrafya və tarixi baxımdan qiymətli qılan digər bir amil də Məkkə və Mədinədə təhsil alması, daha sonra bir müddət burada tədrislə məşğul olması və 1466-1473-cü illərdə hər il həcc ziyarətində olmasıdır. Məkkə və Mədinədə uzun müddət yaşaması ona İslam dünyasının ən müxtəlif yerlərindən həcc ziyarəti üçün Hicaza[4] gələn XV əsr alim, mütəfəkkir və dövlət xadimləri ilə şəxsən görüşüb tanış olma fürsəti vermişdi. Burada əs-Səxavinin ünsiyətli xarakterə sahib olması da mühüm rol oynamışdır.

XIV-XV əsrlərdə yaşamış azərbaycanlı alimlərin bioqrafiyalarına geniş yer verilmiş digər bir əsər misirli mühəddis, fəqih və tarixçi İbn Həcər əl-Əsqəlaninin (1361-1449) *Dürərü'l-Kaminə fi Əyanü'l-miəti's-Saminə*, *Lisanü'l-Mizan*, *İbnai'l-Ğumr bi Əbnai'l-Umr* kimi çoxcildli əsərləridir.

XV əsrin birinci yarısı, xüsusilə də XVI əsrin əvvəllərindən etibarən Misirin də Osmanlı dövlətinə birləşdirilməsindən sonra başda İstanbul olmaqla Anadolunun böyük şəhərləri alimlər, mədəniyyət və incəsənət xadimləri üçün cazibə mərkəzinə çevrilmişdi. Türk alimi İsaməddin Taşköprüzadənin (1495-1561) əsərləri Osmanlı dövlətindəki alimlər, elmi fəaliyyətlər, elm tarixi, tədris müəssisələri və ictimai-mədəni həyat haqqında həqiqətən əvəzedilməz mənbələrdir. Onun *Şəqaiqü'n-Nu'maniyyə fi Üləmai-Dövləti'l-Osmaniyyə* adlı əsəri Osmanlı dövlətində yaşamış alimlərin bioqrafiyalarını ehtiva edir. Əsərdə Osmanlı dövlətinin quruluşundan (1299) 1555-ci ilə qədərki dövrdə Osmanlı dövlətində yaşamış müxtəlif elm sahələrinə aid alimlərin və din xadimlərinin tərcümeyi-halları on təbəqəyə ayrılaraq təfsilatı ilə yazılmışdır. Ümumilikdə bu əsərdə 371 alimin və 150 din xadiminin bioqrafiyası mövcuddur.

---

[4] Hicaz-Ərəb yarımadasının Qırmızı dəniz sahilindəki, Məkkə və Mədinə şəhərlərinin də daxil olduğu hissəsi.

Taşköprüzadənin *Mövzuatü'l-Ülum* adı ilə məşhur olmuş "Miftahü's-Səadə və Misbahü's-Siyadə" adlı əsəri İslam dünyasının elm tarixi sahəsində ən dəyərli əsərlərdən biridir. Burada müəllif 300-ə qədər elm sahəsindən, bu sahələrin mövzularından və qələmə alınmış əsərlərdən təfərrüatlı şəkildə bəhs edir.

Elm tarixi sahəsində Anadoluda yetişmiş nadir zəkalardan biri də heç şübhəsiz Hacı Xəlifə adı ilə tanınan Katib Çələbi Mustafa ibn Abdullahdır (1609-1657). 48 illik ömründə 25-dən çox əsər qələmə almış Katib Çələbinin müasir tədqiqatçılar tərəfindən ən çox müraciət olunan əsəri *Kəşfü'z-Zünun ən Əsami'l-Kütb və'l-Fünun*dur. Əsər İslam dünyasında elmlər, yazılan və tərcümə edilən əsərlər haqqında qələmə alınmış ən geniş miqyaslı və zəngin bir neçə mənbədən biridir. Katib Çələbi bu əsərində on mindən çox müəllifə aid ərəb, fars və türk dillərində qələmə alınmış 15 mindən çox əsərin adını maddələrə ayıraraq, gözəl bir üslub və tərtibatla sadalamış, haqqında məlumat vermişdir.

Azərbaycanın elm tarixi, daha dəqiq desək keçmiş dövrlərdə yaşamış azərbaycanlı alimlərin həyat və elmi fəaliyyətləri ən az tədqiq olunmuş mövzulardan biridir. Bu mövzuda əsərinə müraciət etdiyimiz əcnəbi tədqiqatçılardan biri Şərif Əbdülhəyy Hüseynidir (ö. 1923). Məlum olduğu kimi Hindistanda qurulmuş müsəlman-türk dövlətləri bu ölkənin bir sıra şəhərini elm və mədəniyyət mərkəzinə çevirmişdilər. Bu şəhərlər dünyanın müxtəlif yerlərindən elm, mədəniyyət və incəsənt xadimlərini özünə cəlb edirdi. *Nüzhətü'l-Xəvatir və Behcətü'l-Məsami' və'n-Nəvazir* adlı əsərində Şərif Əbdülhəyy Hüseyni hindli və Hindistana gəlib burada yaşamış müsəlman elm, dövlət və mədəniyyət xadimlərinin həyatına dair çox dəyərli məlumatlar vermişdir. Bunların arasında onlarla azərbaycanlı da var.

Sırf orta əsrlərdə yaşamış azərbaycanlı alim və mütəfəkkirlərin həyatına dair müasir tədqiqatçılar tərəfindən qələmə alınmış ən tanınmış əsər 1986-cı ildə nəşr edilmiş Zakir Məmmədovun *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri* adlı kiçik həcmli əsəridir. Əsərdə orta əsrlərdə yaşamış bir sıra azərbaycanlı alim və mütəfəkkirin həyatı və elmi yaradıcılığı işıqlandırılmışdır.

Bu mövzuda ilk tədqiqatlardan biri də Fazil Seyidova məxsusdur. Onun "Azərbaycanın Görkəmli Simaları"[5] adlı məqaləsində bir sıra azərbaycanlı alim və təsəvvüf ərbabının bioqrafiyası qeyd olunmuşdur. Həmçinin Ziya Bünyadovun "Vidnıye Deyateli Azerbaydjana v Soçinenii İbn al-Fuvati"[6], "Novıye Materialı o Vidnıx Deyatelyax Azerbaydjana ve Epoxu Srednevekovya"[7] və "Novıye Materialı o Vidnıx Deyatelyax Azerbaydjana"[8] adlı məqalələri də sözü gedən mövzuya dair sanballı tədqiqatlardandır. Mərhum akademik bu məqalələrində Cəmaləddin Qıfti, Səlahəddin Səfədi, Şəmsəddin Səxavi, İbnü'l-Fuvati kimi orta əsr ərəb müəlliflərinin əsərlərindəki azərbaycanlı alim, ədib və dövlət xadimlərinin bioqrafiyalarına dair materialların tərcüməsini oxucuya çatdırmışdır.

Bu mövzuda qələmə alınmış ən həcmli əsər heç şübhəsiz Məhəmməd Əli Tərbiyətin (1875-1940) *Danişməndani-Azərbaycan* adlı əsəridir. Əsər farscadan Azərbaycan türkcəsinə tərcümə edilərək 1987-ci ildə Bakıda nəşr olunmuşdur. Məhəmməd Əli Tərbiyətin bu əsəri, tədqiqat metodu baxımından xırda qüsurların olmasına rəğmən, Azərbaycanın görkəmli şəxsiyyətlərinin bioqrafiyası sahəsində yazılmış ən həcmli əsərdir. Lakin əsər Azərbaycan dilinə tərcümə edilərkən müəyyən xətalara da yol verilmişdir. Hər şeydən əvvəl qeyd edim ki, müəllif istifadə etdiyi mənbələri dəqiqliklə oxucuya çatdıra bilməmişdir. Yəni mənbələrin adı müəllif, cild, səhifə, nəşr yeri və ili göstərmədən qeyd olunmuşdur. Yer, şəxs, əsər v.s adlarına səhifəaltı qeydlərdə (deepnotes) aydınlıq gətirilməmişdir. Mütərcimlər, məncə heç lüzum yox ikən, mənbə adlarını tərcümə etmək zərurəti hiss etmişdirlər. Halbuki mənbə adlarının tərcümə edilmədən, olduğu kimi qeyd olunması tədqiqat üsulunun təməl qaydalarından biridir. Üstəlik mənbə adlarının tərcüməsində səriştəsizlik açıq-aşkar sezilir. Məsələn "Zeyli-Şəqaiq" "Lalə Sapı" kimi tərcümə olunmuşdur. Halbuki bu yuxarıda haqqında məlumat verdiyimiz Taşköprüzadənin *Şəqaiqü'n-Numaniyyə* adlı əsərinə yazılmış bir neçə zeyldən, yəni əlavədən hansısa biridir. M. Tərbiyət bunun hansı müəllifin "zeyl"i olduğunu qeyd etməyərək sadə "Zeyli-Şəqaiq" yazmış, mütərcimlər isə bunu hərfi

---

[5] **SSRİ EA AzF Xəbərləri**. Nr. 9, Bakı 1944, ss. 40-45.
[6] **AzSSR EA Xəbərləri**. Tarix, fəlsəfə və hüquq ser., Nr. 2, Bakı 1979, ss. 61-66.
[7] **AzSSR EA Xəbərləri**. Tarix, fəlsəfə və hüquq ser., Nr. 2, Bakı 1980, ss. 59-67.
[8] **AzSSR EA Xəbərləri**. Tarix, fəlsəfə və hüquq ser., Nr. 3, Bakı 1980, ss. 62-68.

tərcümə etmişdirlər[9]. Müəllifin yol verdiyi və mütərcimlərin də tənqidi-müqayisəli tədqiqat aparmadan tərcümə etdikləri digər bir xəta məşhur həkim Qəzənfər Təbrizinin yaşadığı dövrlə bağlıdır. M. Tərbiyət Qəzənfər Təbrizi haqqında "hicri qəməri XII-XIII (XVIII-XIX) əsrin alimlərindəndir"[10] deyə qeyd etmişdir. Halbuki Qəzənfər Təbrizi miladi XIII əsrdə Anadoluda yaşamış və mövlana Cəlaləddin Ruminin şəxsi həkimlərindən biri olmuşdur[11].

Orta əsrlərdə yaşamış azərbaycanlı elm xadimləri və mütəfəkkirlərin həyatı ayrı-ayrı monoqrafiyaların da mühüm hissəsini təşkil etmişdir. Bunlardan Ziya Bünyadovun *Azərbaycan Atabəyləri Dövləti* adlı əsərinin adını çəkə bilərik. Burada müəllif Eldənizlərin hakimiyyəti illərində (1136-1225) Azərbaycanda yaşamış tanınmış elm, mədəniyyət və incəsənt xadimlərinin həyat və fəaliyyətləri ilə bağlı təfərrüatlı məlumat vermişdir. Belə əsərlərdən biri də Sara Aşurbəylinin *Şirvanşahlar Dövləti* adlı monoqrafiyasıdır. Əsər VI-XVI əsrlər Şirvanın siyasi, iqtisadi və mədəniyyət tarixi ilə bağlı sanballı tədqiqatlardan biridir. Burada həmçinin sözü gedən dövrdə Şirvanda yaşamış görkəmli elm, mədəniyyət və incəsənət xadimləri haqqında da məlumat verilmişdir. Son iki əsər azərbaycan və rus dillərində bir neçə dəfə nəşr olunmuşdurlar.

Malik Mahmudovun *Ərəbcə Yazmış Azərbaycanlı Şair və Ədiblər* adlı əsərində orta əsrlərdə yaşamış bir sıra azərbaycanlı şair, ədib, elm və mədəniyyət xadiminin həyat və elmi yaradıcılığı dərindən araşdırılmışdır. Bu əsər 1983 və 2006-cı illərdə Bakıda nəşr olunmuşdur. Malik Mahmudovun *Xətib Təbrizinin Həyat və Yaradıcılığı* adlı əsəri də sözü gedən mövzuda aparılmıs dəyərli tədqiqatın nəticəsidir. Əsər tanınmış azərbaycanlı ədib, şair, mühəddis, müfəssir Əbu Zəkəriyya Yəhya Təbirizinin həyatı və elmi fəaliyyəti ilə bağlı ən böyük tədqiqatdır.

İranlı tədqiqatçı alim Səid Nəfisinin müəllifi olduğu *Tarixi-Nəzm və Nəsr dər İran və dər Zebane-Farisi* adlı iki cildlik əsər farsca əsər qələmə almış alim, şair, mütəfəkkir və.s görkəmli şəxslərin həyat və elmi yaradıcılığı ilə bağlı dəyərli məlumatları ehtiva edir. Bunların arasında çox sayıda azərbaycanlı da var.

---

[9] Bax: Məhəmməd Əli TƏRBİYƏT, *Danişməndani Azərbaycan*, (Trc. İ. Şəms-Kəndli Q), s. 189, Bakı 1987.
[10] Bax: TƏRBİYƏT, *Danişməndan*, s. 65.
[11] Süheyl ÜNVER, *Selçuklu Tababeti*, s. 66, 93, Ankara 1940.

## ORTA ƏSR AZƏRBAYCAN ŞƏHƏRLƏRİ

Hesab edirik ki, mövzuya Azərbaycan sözünün etimoloji izahı ilə giriş etmək yerinə düşəcəkdir. Dəqiq səbəbini müəyyənləşdirmək çətindir, amma nədən ötrüsə ölkəmizdə nəşr olunan tarix dərsliklərində və tədqiqat əsərlərində tarixçilərimiz məmləkətimizin adının etimoloji izahını "Atropatena" və bunun törəmə kəlmələriylə izah etməyə çalışırlar. Bu gün ali məktəblərdə Azərbaycan tarixi fənni üzrə dərslik kimi istifadə edilən kitabın 16-18-ci səhifələrində "Andirpatianu, Andarpataian, Aturpatakan, Atrpatakan, Adirpatyan, Adərpatyan" və s. bənzər formalarda yazılan terminlər oxucunun zehnində istər-istəməz çaşqınlıq, müəmma meydana gətirir. Bu müəmma daha sonra şübhəyə və inamsızlığa da çevrilə bilir. "Atropatena" Atropata məxsus olan yer, "Atropat" sözü isə "atr" (od, atəş) və "pat" (başçı) kimi izah olunur. Mən burada müəllif və əsər adı qeyd etmək istəmirəm, amma maraqlananlar mövzu ilə bağlı kitabların böyük əksəriyyətində eyni mülahizəyə rast gələ bilərlər. Azərbaycan kəlməsinin izahı asan ikən tarixçilərimizin, rus şərqşünas və tarixçilərinin təsirindən çıxa bilməyərək, özlərini belə çətinə salmalarını anlamaq olmur. V. Bartold yazırdı ki, "İskəndərdən sonra irsi mülk olaraq Atropatın sərəncamına onun keçmişdə sahib olduğu vilayətin bir hissəsi verilmişdi. Beləcə öz adını Atropatdan götürmüş "Kiçik Midiya"nı, yunanlar Atropatena, ermənilər Atrpatakan adlandırmış və buradan Azərbaycan yaranmışdır. Bu sözün başqa bir mənasını axtarmaq üçün heç bir əsas yoxdur. O cümlədən Qafqaz və İran Azərbaycanının qədim atəşpərəstlik və Zərdüşt dini ilə əlaqəsi olması barədə heç bir tarixi məlumat yoxdur"[12]. Göründüyü kimi möhtərəm akademik "bu sözün başqa bir mənasını axtarmaq üçün heç bir əsas yoxdur" deməklə sadəcə elmdə yolverilməz olan ehkamçılığa getməmişdir. O, bunu etməklə həm də "Azərbaycan" adının Makedoniyalı İsgəndərdən o tərəfə əslinin və kökünün olmadığını isbat etməyə çalışmış, hətta bu adın yaranmasında ermənicədəki "Atrpatakan"ın da "müstəsna" rolunu vurğulamışdı. Halbuki irəlidə görəcəyimiz kimi Azərbaycan adının tarixi ən az Nuh (×) tufanı qədər qədimdir. Məlum olduğu kimi Nuh tufanı barədə ən qədim dastan olan Qılqameş dastanında da məlumata rast gəlinir. Təəssüf doğuran xüsus budur ki, tarixçilərimiz (o cümlədən coğrafiyaşünaslarımız,

---

[12] Vasiliy BARTOLD, *Soçineniya*, C. II/1, s. 776, Moskva 1963.

mədəniyyətşünaslarımız və digərləri) rus akademikin bu “tövsiyə”sinə ciddi şəkildə əməl etmişdilər. “Azərabad” sözünü “Atropat” formasına salıb yunanlaşdırmaq, hətta erməniləşdirmək nəyə lazımdır? “Azərbaycan” sözü üç kəlmənin birləşməsindən yedana gəlməkdədir, “*azər*”, “*bad* və ya *abad*” və “*gan*”. İndi bu sözlərin ayrı ayrılıqda hansı mənaları ifadə etdiyinə baxaq. “Azər” məlum olduğu kimi pəhləvi dilində “od, atəş” mənasını ifadə edir. Bundan başqa “azər” [آذر] və ya “azar” [آذار] qədim süryani təqvimində ilin 6-cı və müasir İran təqvimində isə 9-cu aya verilən addır. İslam dini ədəbiyyatında İbrahim (×) peyğəmbərin atası kimi tanınan “Azər” ilə Azərbaycan sözündəki “Azər”i qarışdırmamaq lazımdır. Çünki əvvəla yazılışları fərqilidir, birincisi “azər” [آزر], ikincisi isə “ažər” [آذر] kimi yazılır. Sonra, İbrahim (×) peyğəmbərin atasının adı olan “Azər” yəhudi dini ədəbiyyatında əslində “Athar” və [**תֶּרַח / תָּרַח**] “Terah” kimi qeyd olunur. Bu da ibranicədən tərcümələr vaxtı ərəbcələşərək “Azər” formasına düşmüşdür.

“Azərbad” [آذرباد] və ya “Azərabad” [آذراباد] kəlmələri isə məcusilərin (zərdüştilərin) ali din xadimlərinə verilən ad idi. Mirxond (1433-1498) öz əsərində Azərbad Mahrəspənd adlı bir şəxs haqqında söz açaraq onun azərbaycanlı Zərdüştün[13] 30-cu nəsldən nəvəsi olduğunu, Sasani şahlarından II Şapurun (309-379) hakimiyyəti dövründə yaşadığını qeyd etmişdir[14]. Azərbad Mahrəspənd məhv olmuş Avestanı toplayıb təkmilləşdirməyə çalışmış şəxs kimi tanınmışdı[15]. Əbu Reyhan əl-Biruni isə öz əsərində Babil möbidi olan başqa bir Azərbad haqqında məlumat verməkdədir[16]. Məhəmmədəli Tərbiyət də əl-Biruniyə istinadən əsərində bu şəxs haqqında ətraflı məlumat verir[17]. Buradan belə nəticə çıxarmaq olar ki, “Azərbad” və ya “Azərabad” dini titulu daşıyan şəxslər ən az Zərdüştdən (e.ə. 628-551) etibarən mövcud olmuşdurlar. Hətta ehtimal ki, bu titulu daşıyan din xadimləri hələ Zərdüştdən əvvəl də fəaliyyət göstərmişdilər. “Azərbaycan” adını açıqlayarkən “Azər” sözünün pəhləvi dilində od, atəş mənasını ifadə etdiyini

---

[13] əl-Məs’udi Zərdüştün azərbaycanlı olduğunu qeyd etmişdir. Bax: *Mürucü’z-Zəhəb*, C. I, s. 153. [إنه زرادشت بن بورشف...من أهل أذربيجان]. Bir çox müasir tədqiqatçı da Zərdüştün azərbaycanlı olduğunu bildirmişdir. Bu barədə ətraflı məlumat üçün bax: Abdulla FAZİLİ, *Atropatena er.əv. IV-er. VII əsri*, s. 166, Bakı 1992.

[14] Hamidəddin Muhəmməd ibn Xondşah MİRXOND, *History of the Early Kings of Persia*, (Trc. D. Shea), s. 279-280, London 1832.

[15] FAZİLİ, *həmin əsər*, s. 166.

[16] Əbu Reyhan Muhəmməd ibn Əhməd əl-BİRUNİ əl-Xarəzmi, *Asarü’l-Baqiyə əni’l-Qüruni’l-Xaliyə*, s. 216, Leipzig 1878.

[17] *Danişməndan*, s. 153.

bildirən Yaqut əl-Həməvi, Azərbadın Nuh (vəfatı e.ə. 2892) peyğəmbərin kötükcəsi olduğunu yazır[18]. IX-X əsrlərdə yaşamış coğrafiyaşünas alim İbn Fəqih də Nuh (×) peyğəmbərin nəvəsi əl-Əsvədin nəvəsinin adının Azərbad olduğunu yazır[19]. Yaqut əl-Həməvi ilə İbn Fəqihin verdiyi bu məlumatın doğru olma ehtimalı böyükdür. Belə ki, od zərdüştilikdən əvvəl də bir sıra paqan dinlərdə ehtiramla yanaşılan, bəzən isə ibadət edilən bir obyekt olmuşdur. Hətta səmavi dinlərdə də buna misal ola biləcək hadisələr var. Musa peyğəmbərin (×) gecənin qaranlığında yanan odu görərək ona yaxınlaşması və orada Allahla danışması barədə həm yəhudi[20], həm də İslam dini mənbələrində[21] məlumat verilir. Məhəmmədəli Tərbiyət tarixi mənbələrə istinad edərək azərbaycanlı Zərdüştün ibrani qövmünə mənsub peyğəmbərlərdən İlyasın (×) əshabından olduğunu bildirmişdir[22]. Bütün bunlara istinadən "Azərbad" və ya "Azərabad" adlanan zərdüşti din xadimlərinin hələ çox qədim zamanlardan bəri mövcud olduqlarını söyləyə bilərik. Hətta İslam dininin yaranmasından çox sonra, Abbasilər dövründə də bu titulu daşıyan zərdüşti din xadimləri mövcud olmuşdular[23].

"Gan" və ya "qan" isə yer, ölkə, məmləkət mənasını ifadə edir. Sonu "gan", "qan"la bitən bir sıra yaşayış məntəqəsinin adını çəkmək olar. Məsələn Beyləqan, Mərdəkan[24], Nəməngan[25], Uruzqan[26], Şebergan[27] və s. Beləcə zərdüşti məbədinin (və ya din xadimlərinin) ölkəsi mənasını ifadə edən "Azərbadgan" [آذربادگان] və ya "Azərabadgan" [آذرابادگان] kəlməsi meydana çıxmışdır. Məlum olduğu kimi "Azərabadgan" sözü pəhləvi dilində həmçinin zərdüşti məbədi, atəşkədə mənasını ifadə edir[28]. "Azərbadgan"ın "Azərbaycan"a çevrilməsi isə ərəb dilində "g" səsinin mövcud olmaması ilə əlaqəlidir.

[18] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 81. [أذربيجان مسماة بأذرباذ بن إيران بن الأسود بن سام بن نوح عليه السلام.... وقيل بل أذر اسم النار بالفهلوية]

[19] Əhməd ibn Muhəmməd İBN FƏQİH əl-Həmədani, *Kitabü'l-Büldan*, (Nşr. M. De Goeje), s. 284, Leiden 1885.

[20] Bax: Tövrat, *Xüruc*, III/1-13.

[21] Bax: Qur'ani-Kərim, *Taha surəsi*, 10-cu ayə və sonrası.

[22] *Danişməndan*, s. 152.

[23] Bax: Əbü'l-Həsən Əli əl-MƏS'UDİ, *Tənbih və'l-İşraf*, s. 30, Beyrut 1981. Həmçinin bax: Berthold SPULER, *Vierter Band Iranistik Zweiter Abschnitt Literatur*, s. 44, Leiden 1968.

[24] "Gan" və ya "qan" sonluğu bəzən "kan" formasına düşə bilir.

[25] Naməngan-Özbəkistanın Fərqanə vilayətində şəhərdir.

[26] Uruzqan-Əfqanıstanın eyni adlı vilayətində şəhərdir.

[27] Şebergan və ya Şaburgan-Əfqanıstanın şimalında şəhərdir.

[28] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 81. Həmçinin bax: Mehmet KANAR, *Büyük Farsça-Türkçe Sözlük*, s. 18, İstanbul 1993.

Bu səbəbdən orta əsr ərəbdilli tarixi mənbələrdə Azərbadgan [آذربادگان] sözü Azərbadcan [آذربادجان], daha sonra isə Azərbaycan [آذربيجان] kimi yazılmışdı.

Burada əsasən haqqında bioqrafik məlumat verəcəyimizi şəxslərin mənsub olduqları şəhərlər haqqında qısa məlumat verməklə kifayətlənəcəyik. Bunlardan ilki **Ani** şəhəridir. Ani Azərbaycanın şimali-qərbində, Arranın qərbində, Arpaçayın sol sahilində yerləşən qala-şəhər idi. Bu gün Türkiyə respublikasının Qars vilayətində, Ocaqlı kəndi yaxınlığında yerləşən Ani xarabalıqlarının tarixi çox qədim zamanlara gedib çıxır. Anidə ilk arxeoloji qazıntılar 1892-1917-ci illərdə N. Marr, daha sonra 1965-ci ildə Kamal Balkan və 1989-2005-ci illərdə Beyhan Karamağaralı tərəfindən aparılmışdır. Qazıntılar vaxtı Azərbaycan mədəniyyətinin bariz cizgilərini özündə ehtiva edən çox sayıda tapıntı əldə edilmişdir.

Ani özünün möhkəm qala divarları və istehkamları ilə Ərməniyyə ilə Arran arasında sərhəd zastavası rolunu oynamışdı. İbnü'l-Əsir 1162-ci ilin yay aylarında gürcülərin Aniyə [آنى] hücumu haqqında məlumat verərkən Aninin Arranın şəhərlərindən biri olduğunu qeyd etmişdir[29]. Anidə aşkar edilmiş böyük bir atəşgahın qalıntıları da bu şəhərin qədim Azərbaycan şəhəri olduğunu göstərir. Qalıntıların e.ə. I-IV əsrlərə aid bir atəşpərəstlik məbədinə aid olduğu güman edilir. Şəhər 430-646-cı illər arasında Sasanilərin hakimiyyəti altında olmuşdur. 646-cı ildə isə fəth edilərək xilafətə birləşdirilmişdi. X əsrin ortalarında Abbasilərin zəifləməsi fonunda xilafət ərazisində müstəqil dövlətlərin meydana gəlmişdi. Erməni Baqratuni sülaləsi də regionda güclənməyə başlamışdı. 966-cı ildə Baqratuni çarı III Aşot Anini zəbt edərək şəhərin qala divarlarını möhkəmlətmiş və Ani erməni çarlığının mərkəzinə çevrilmişdi. Daha sonra şəhər qısa müddətə də olsa Bizansın əlinə keçmişdi. Böyük Səlcuqlu sultanı Alp Arslanın Qafqaza hərbi yürüşü vaxtı 1064-cü ildə Ani yenidən fəth edilərək Düveyn Şəddadi əmiri I Əbü'l-Əsvar Şavurun (1049-1067) idarəsinə verilmişdi. Yaşlı Əbü'l-Əsvar oğlu Mənuçöhr bəyi (1064-1118) Ani hakimliyinə təyin etmişdi[30]. Azərbaycan Atabəylərinin (1136-1225) hakimiyyəti dövründə Ani bir neçə dəfə gürcü çarları tərəfindən işğal edilmiş,

---

[29] İzzəddin Əli İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, (Trc. A. Ağırakça-Özaydın A), C. XI, s. 228, İstanbul 1987. [وساروا الى مدينة آني من بلاد اران]

[30] Ani haqqında ətraflı məlumat üçün bax: http://www.ani.gov.tr/tarihce.asp; http://www.kars.gov.tr/trz_ani.htm.

lakin geri alınmışdı. XVII əsrin əvvəllərinə qədər əsasən Azərbaycan hökmdarlarının idarəsi altında olmuş Ani 1605-ci ildə baş vermiş zəlzələ nəticəsində dağılmış, həyat üçün əlverişsiz vəziyyətə düşdüyü üçün əhali tərəfindən tərk edilmişdi.

Farsca "bad" (külək) və "kuh" (dağ) sözlərini birləşməsindən meydana gələn, küləkli dağ mənasını ifadə edən **Bakı** şəhərinin adına orta əsr mənbələrində "Baku", "Bakuh", "Bakuyə" formasında yazılışları ilə rast gəlinir. X əsr müəllifi Şəmsəddin əl-Məqdisi Arran haqqında məlumat verərkən Bakının gölün (Xəzər dənizi-E.N) sahilində, regionun girişində mövcud olduğunu qeyd edir[31]. Bakı hələ orta əsrlərdən etibarən nefti ilə tanınırdı. Yaqut əl-Həməvi və Zəkəriyyə Qəzvini Bakının Şirvan Dərbəndi yaxınlığında yerləşdiyini, burada gündəlik icarə haqqı 1000 dirhəm olan neft quyusunun mövcud olması barədə məlumat vermişdilər[32]. Rəşidəddin Bakuvi də Bakıdakı neft quyuları haqqında məlumat verir. O, Bakının neft yataqlarından gündəlik 200 dəvə yükü neft hasil olunduğunu yazır[33]. *Hüdudü'l-Aləm* müəllifi isə Bakıdan hasil olan neftin ixrac olunduğunu qeyd edir[34]. Ə. Bakuvi bakılıların suiti dərisindən tuluqlar hazırlayaraq hasil edilən nefti bu tuluqlarda başqa ölkələrə göndərdiklərini yazır. O, həmçinin Bakının möhkəm qala divarları ilə əhatə olunduğunu qeyd edir. Müəllif iki qaladan bəhs edərək bunlardan birinin ləpədöyəndə olduğunu və moğolların onu zəbt edə bilmədiklərini yazır[35]. Güman ki, müəllif Qız qalasını yaxud qalıqları indi su altında olan Səbail qalasını nəzərdə tutmuşdur.

Bakı orta əsrlərdə nefti ilə yanaşı liman şəhəri olması ilə tanınmışdı. Həmin dövrdə Xəzər dənizi hərbiləşməmiş, belə demək mümkünsə, sülh dənizi idi. Belə ki, mənbələr bu dənizdə sadəcə ticarət və balıqçı gəmilərinin üzdüyünü qeyd edirlər. Güman ki, Xəzər dənizi müsəlman ölkələri ilə əhatə olunduğu üçün bu qonşu dövlətlər orada hərbi donanma saxlamağa ehtiyac hiss etməmişdilər. Xilafətlə uzun illər boyu müharibə vəziyyətində olan Xəzər xaqanlığı isə hərbi donanmaya malik deyildi. Bu səbəbdən də

---

[31]Şəmsəddin Muhəmməd əl-Bəşşari əl-MƏQDİSİ, *Əhsənü't-Təqasim fi Mərifəti'l-Əqalim*, s. 185, Tehran 2006. [باكوه: على البحيرة هي إحدى فرض الإقليم]

[32]Şihabəddin Yaqut ibn Abdullah ər-Rumi əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s.351, Beyrut (trz); QƏZVİNİ, *Asarü'l-Bilad*, s. 565. [باكويه... فيه عين نفط عظيمة تبلغ قبالتها في كل يوم ألف درهم]

[33] *Təlxisü'l-Asar*, s. 117.

[34] *Hüdudü'l-Aləm*, s. 123.

[35] BAKUVİ, *Təlxisü'l-Asar*, s. 117.

istər Azərbaycan, istərsə də Xəzər sahilindəki digər müsəlman dövlətlər əsrlər boyu Xəzərdən gələ biləcək hər hansı bir hərbi təhlükə gözləməmişdilər. Lakin 914-cü ildə ruslar Xəzər dənizindəki bu əmin-amanlığı pozmuşdular. Əvvəllər 15-20 ticarət gəmisi ilə Azərbaycan, orta Asiya və İranın limanlarına səfər edən rus tacirləri bu yerləri, oradakı şəhərləri, yolları, bu ölkələrin zənginliklərini öyrənmə fürsəti əldə etmişdilər. 914-cü ildə 500 gəminin hər birində 100 nəfər olmaqla 50 mindən çox rus əsgəri Xəzərsahili vilayətlərə qəfil hücum etmişdilər. Həmin vaxt Xəzər dənizinə tökülən İdil (Volqa) çayı Xəzər xaqanlığının nəzarətində olduğu üçün ruslar xaqanın icazəsi ilə gəmilərini Xəzər dənizinə endirə bilirdilər. Bunun müqabilində isə onlar talan etdikləri qənimət mallarının yarısını xaqana verməyi vəd edirdilər. Həmin il Gilan, Deyləm, Təbəristan sahillərinə qəfil hücum edən ruslar yaşayış məntəqələrini zəbt edərək talan edir, əhalini əsir götürürdülər. Yusif ibn Əbu's-Sac ordusunu səfərbər edərək ruslarla vuruşmuş, lakin istənilən nəticəni əldə edə bilməmişdi[36]. Ruslar qarət etdikləri mallar və əsirlərlə Abşeron yaxınlığındakı adalara çəkilmişdilər. Şirvanşah Əli ibn Heysəm əsgərlərini qayıqlara mindirərək həmin adalara hücum etmişdi. Lakin bu dəniz döyüşü rusların qələbəsi ilə bitmişdi. Bir neçə ay bu adalarda qalan rusların dənizdə quldurluq etmələri səbəbiylə Xəzər dənizindəki ticarət iflasa uğramışdı. Nəhayət onlar gəmilərinə minib Xəzər dənizinin şimalına yollanmışdılar. Xəzər xaqanlığına çatanda xaqanın ordusunda xidmət edən muzdlu müsəlman əsgərlər ruslarla vuruşmaq üçün səfərbər oldular. Məs'udi öz əsərində bu hərbiçiləri "əl-Larisiyyə" [اللارسية] adlandırır[37]. Akad. Nailə Vəlixanlının fikrinə görə bunlar xarəzmli müsəlmanlar idilər[38]. Onlar xaqana "müsəlman qardaşlarımıza hücum edib onların qanını tökmüş, qadınları və uşaqları alçaltmış bu milləti bizim öhdəmizə burax"[39] deyərək ruslarla vuruşmaq niyyətində olduqlarını bildirdilər. Xaqan onları bu fikirlərindən daşındırmaq istəsə də bacarmadı, çünki özü də onlardan çəkinirdi. Lakin Xəzər xaqanı rusları ölkəsindəki müsəlmanların onlarla vuruşmaq üçün hazırlaşdıqları barədə xəbərdar etdi. 15 min yaxşı silahlanmış süvari əl-larisi ruslara hücum etdilər. Ruslar gəmilərdən sahilə çıxıb onlarla döyüşə

---

[36] Nailə VƏLİXANLI, *Ərəb Xilafəti və Azərbaycan*, s. 88, Bakı 1993.
[37] Əbü'l-Həsən Əli əl-MƏS'UDİ, *Mürucü'z-Zəhəb və Mə'adini'l-Cəvhər*, (Nşr. M.M. Əbdülhəmid), C. I, s. 79, Beyrut 1973.
[38] VƏLİXANLI, *həmin əsər*, s. 88.
[39] MƏS'UDİ, *Mürucü'z-Zəhəb*, C. I, s. 79-80. [خَلِّنَا وهؤلاء القوم فقد أغاروا على بلاد إخواننا المسلمين، وسفكوا الدماء، وسبوا النساء والذراري]

girişdilər. Üç gün davam edən döyüş müsəlmanların qələbəsi ilə bitdi. Azərbaycan və İrandan sağ qayıda bilmiş 30 min rusun sadəcə 5 mini əl-larisilərin qılıncından canını qurtara bilmişdi. 25 minə yaxını isə öldürülmüş və dənizdə batırılmışdı. 5 min nəfər isə gəmiləri ilə Volqa boyunca şimala üzərək burtasların ölkəsinə (indiki Çuvaşiya) daxil olmuşdular. Burtaslar onlara hücum edib ağır itgi verdirmişdilər. Onların geri qalanlarını isə müsəlman bulğarlar qılıncdan keçirmişdilər[40]. 938-ci ildə ruslar 38 gəmi ilə yenidən Bakı sahillərinə hücum etmişdilər. Şirvanşah Mənuçöhr ibn Yəzidin səyi nəticəsində onların Kür çayı ilə ölkənin içərilərinə doğru soxulmaq cəhdinin qarşısı alınmışdı.

Orta əsrlər Azərbaycan şəhərlərinin ən əhəmiyyətlilərindən biri də **Bərdə** şəhəri idi. Mənbələrdə "Partava", "Firuzabad", "Bərdə" adları ilə şöhrət tapmış bu şəhər Tərtərçayın sol sahilində, 30 $km^2$ ərazidə yerləşmişdi[41]. Həmidullah Qəzvini Bərdənin Makedoniyalı İsgəndər tərəfindən salındığını, şah I Qubadın isə şəhəri əsaslı şəkildə təmir etdiyini yazır[42]. Yaqut əl-Həməvi Bərdə şəhərinin əsasının Sasani şahı I Qubad (488-531) tərəfindən qoyulduğunu yazır. Şəhərin isə farsca "bərdə"-qul, kölə [برده] və "dar"-sahib, malik [دار] sözlərinin birləşməsindən meyadan gəlmiş "Bərdədar" kəlməsindən törədiyini qeyd edir[43]. Qasım Hacıyev öz əsərində Yaqut əl-Həməvinin bu fikri ilə razılaşmadığını qeyd etmişdir[44]. Ərəbdilli mənbələrdə şəhərin adı bəzən [برذعة] Bərza'ə, bəzən də [بردعة] Bərda'ə formasında yazılır. Bu da ərəb dilində "yəhər" və ya "palan" mənasını ifadə edir[45]. Belə görünür ki, Bərdə adının etimoloji baxımdan dəqiq izah etmək xeyli çətindir. Çünki bu şəhərin adı müxtəlif dillərdə qələmə alınmış tarixi mənbələrdə müxtəlif cür yazılmışdır, bu səbəbdən də bir-birindən çox fərqli mənalar ortaya çıxmaqdadır.

---

40 MƏS'UDİ, *Mürucü'z-Zəhəb*, C. I, s. 79-80; VƏLİXANLI, *həmin əsər*, s. 89.
41 Rəşid GÖYÜŞOV, *Azərbaycan Arxeologiyası*, s. 131, Bakı 1983.
42 *Nüzhətü'l-Qülub*, s. 92.
43 YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 270. [برذعة معرب برده دار ومعناه بالفارسية موضع السبي]
44 Qasım HACIYEV, *Bərdə Şəhəri, Coğrafi, Siyasi və Mədəni Tarixi*, s. 24-25, Bakı 2008.
45 Bax: Mevlüt SARI, *Arapça-Türkçe Lugat*, s. 86, İstanbul 1982. Həmçinin bax: X. K. BARANOV, *Arabsko-Russkiy Slovar*, s. 65, Moskva 2007.

Bərdə 647-ci ilin yayında Salman ibn Rəbiə əl-Bahilinin (ا) əmrindəki xilafət orduları tərəfindən fəth edilmişdi[46]. Əməvilərin dövründə xilafət canişinləri Bərdə şəhərində yaşayır, Arranla yanaşı Ərməniyyəni də buradan idarə edirdilər. İnzibati idarə mərkəzi olmaqla yanaşı, ölkədaxili və beynəlxalq ticarət yolları üzərində yerləşməsi xilafət dövründə Bərdənin sürətlə inkişaf edərək Azərbaycanın ən böyük iqtisadi, mədəni və elm mərkəzlərinə çevrilməsi üçün əlverişli zəmin hazırlamışdı. İrəlidə görəcəyimiz kimi bu şəhərdə bütün İslam dünyasında şöhrət tapmış çox sayıda alim yetişmişdi. Bu da onu göstərir ki, Bərdə VII-X əsrlərdə Azərbaycanın, eləcə də xilafətin ən böyük elmi və dini mərkəzlərindən biri olmuşdur. əl-İstəxri Bərdə haqqında "Bərdə şəhəri həqiqətən çox böyük şəhərdir" deyərək onun Dərbənd və Tiflislə birlikdə Arranın ən böyük şəhəri olduğunu qeyd etmişdir[47]. İbn Hövqəl isə onu "Arranın anası" adlandırmış, Bərdənin, İsfəhan və Reydən sonra, regionun ən böyük şəhəri olduğunu bildirmişdi[48]. Şəmsəddin əl-Məqdisi (947-990) Bərdəni bu yerlərin Bağdadı adlandırmışdı[49]. Həmin dövrdə Bərdənin əhalisi 100 mindən çox idi. Şəhərdə 4 böyük bazar, ayrıca sənətkar məhəllələri, bir neçə hamam, məscid, mədrəsə kimi çoxlu dini, ictimai binalar mövcud olmuşdu[50]. Bərdə xilafət dövründə, Babü'l-Əbvab (Dərbənd) və Yəzdiyyə (Şamaxı) ilə birlikdə, zərbxananın fəaliyyət göstərdiyi regionun üçüncü şəhəri idi[51]. Bərdə zərbxanasında qızıl, gümüş və mis pullar kəsilirdi[52]. Əməvilər dövründə Arranda kəsilən ən qədim pul h. 89-cu (707-708) il tarixli gümüş dirhəmdir[53]. Son Əməvi hökmdarı II Mərvan ibn Muhəmməd (744-750) şahzadəlik illərində şərqi Anadolu və Azərbaycan canişini olaraq Bərdədə yaşamışdı. O, burada Xəzər xaqanlığı ilə aparılan müharibələrdə aktiv iştirak etmişdi[54]. Səid ibn Süleym və Əli ibn İsa ibn Mahanın Arranın idarə edilməsində göstərdikləri uğursuzluqdan sonra Harun ər-Rəşid (786-809) Yəzid ibn Məzyəd əş-Şeybanini Arran və Ərməniyyə valisi təyin etmişdi. Bərdəyə gələn

---

[46] Əbü'l-Abbas Əhməd ibn Yəhya BƏLAZURİ, *Fütuhü'l-Büldan*, (Nşr. A. ət-Təbba), s. 285-287, Beyrut 1987; İBNü'l-Ə'SƏM, *Fəthlər Kitabı*, s. 9.
[47] İSTƏXRİ, *Məsalik*, s. 67, 73. [وأما برذعة فإنها مدينة كبيرة جداً]
[48] Əbü'l-Qasım Muhəmməd İBN HÖVQƏL, *Surətü'l-Ərz*, s. 337, Leiden 1939. [ومدينة برذعة فهى أُمّ الرّان ...ولم يكن بين العراق و طبرستان بعد الرّى و اصبهان مدينة أكبر منها]
[49] MƏQDİSİ, *Əhsənü't-Təqasim*, s. 185. [برذعة... هي بغداد هذا الإقليم]
[50] GÖYÜŞOV, *həmin əsər*, s. 131-132.
[51] BÜNYADOV, *həmin əsər*, s. 148; GÖYÜŞOV, *həmin əsər*, s. 132.
[52] GÖYÜŞOV, *həmin əsər*, s. 132.
[53] BÜNYADOV, *həmin əsər*, s. 148.
[54] BÜNYADOV, *həmin əsər*, s. 110; ARTAMONOV, *həmin əsər*, s. 219-224.

Yəzid ibn Məzyəd buradakı inzibati-idari və iqtisadi işləri yoluna qoymuşdu[55]. Bu tarixdən sonra Arran onun nəslindən olan Məzyədilər sülaləsi tərəfindən idarə olunmuş, Bərdə isə bu sülalənin paytaxt şəhərinə çevrilmişdi. VIII-X əsrlər Bərdənin çiçəklənmə dövrü olmuşdur[56]. Xilafətin zəifləyib mərkəzdənqaçma meyllərinin ardığı dövrdə Bərdə Azərbaycan Sacilər dövlətinin (889-942) mərkəzi şəhərlərindən birinə çevrilmişdi. Muhəmməd ibn Əbu's-Sacın (889-901) dövründə Bərdə şəhəri ölkənin inzibati mərkəzi olaraq inkişaf etmişdi[57]. Salarilərin (942-981) hakimiyyətinin ilk illərində isə Bərdə özünün ən fəlakətli günlərini yaşamış, 944-cü il Bərdə tarixinə ağır və müsibətli illərdən biri kimi daxil olmuşdu[58]. X əsrin birinci yarısında bir neçə dəfə Azərbaycan torpaqlarına basqın edən ruslar 944-cü ildə Xəzər xaqanının izni ilə Volqa çayından Xəzər dənizinə keçirdikləri gəmiləri ilə Azərbaycan sahillərinə yanaşmış, Kür çayı ilə üzərək Bərdə şəhərinə yaxınlaşmışdılar. Salarilərin Bərdə valisinin əmri altındakı 5000-dən çox əsgər gəmilərindən enən ruslara hücum etmişdilər. İbn Miskəveyh yazır ki, "onlar (şəhər müdafiəçiləri-E.N) ruslar barədə yanılmışdılar, onları yunan və ermənilər kimi zənn etmişidlər"[59]. İbn Miskəveyhin yazdığından anlaşıldığına görə bir-iki qılınc zərbəsindən sonra onların da yunan və ermənilər kimi arxalarını dönüb qaçacağını zənn etmiş şəhər müdafiəçiləri düşməni lazımınca qiymətləndirmədikləri üçün özlərinə arxayın olmuş, döyüşdən əvvəl zəruri hazırlıq və planlaşdırmanı aparmamışdılar. Bu səbəbdəndir ki, hücumu cəmi bir saat davam etdirə bilmiş, rusların güclü əks hücumu qarşısında Bərdəyə tərəf qaçmağa məcbur olmuşdular. Sadəcə ordudakı deyləmli əsgərlər geri çəkilməyərək hamısı şəhid olana qədər vuruşmuşdular[60]. Ruslar müdafiəsiz qalan Bərdəyə daxil olandan sonra şəhərin istehkamlarında möhkəmlənmişdilər. İbnü'l-Əsir rusların dinc əhaliyə aman verərək

---

[55] İBNü'l-Ə'SƏM, *Fəthlər Kitabı*, s. 65.

[56] VIII-X əsrlər Bərdə şəhərinin tarixi barədə ətraflı məlumat üçün bax: HACIYEV, *Bərdə Şəhəri*, s. 85-109.

[57] VƏLİXANLI, *Ərəb Xilafəti və Azərbaycan*, s. 85; HACIYEV, *Bərdə Şəhəri*, s. 111.

[58] VƏLİXANLI, *həmin əsər*, s. 85.

[59] Əbu Əli Muhəmməd ibn Muhəmməd İBN MİSKƏVEYH, *Təcaribü'l-Üməm*, (Trc. H. Amedroz), C. V, s. 68, London 1921. İbn Miskəveyhin belə bir müqayisə etməsini rusların fiziki cəhətdən yunan və ermənilərdən fərqlənməsindən irəli gəlirdiyini təxmin etmək olar. Ərəb səyyah İbn Fəzlan da Volqa çayı sahillərində ilk dəfə rusları görəndə heyrətlənmişdi. O, "onlardan daha iri insan görməmişdim. Hər biri xurma ağacı kimi ucaboy, sarışın və sağlam insanlar idi" deyə yazır. Bax: *Səyahətnamə*, (Nşr. R. Şeşen), s. 68-69, İstanbul 1995.

[60] *Yenə orada*.

onlara toxunmayacaqlarına dair söz verdiyini yazır[61]. Müəllif qeyd edir ki, buna baxmayaraq bərdəlilər şəhərin rusların əlində qalması ilə heç cür razılaşa bilmir, tez-tez təkbir nərələri ilə onlara hücum edirdilər. Hətta silahsız olanlar da işğalçılara daş ataraq mübarizə aparırdılar. İşğalçılar xalqı müqavimət göstərmək əzmindən daşındırmağa çalışmanın faydasız olduğunu görüb bərdəlilərdən üç gün ərzində şəhəri tərk etmələrini tələb etdilər. Lakin onların əksəriyyətinin Bərdəni tərk etmədiyini görüb dinc əhaliyə hücum etdilər. Onlar əhalinin tamamına yaxınını qırıb mallarını talan etmiş, qadın və uşaqları isə əsir götürmüşdülər. Bu vaxt ətraf əyalətlərdən toplanan könüllülər də Bərdəyə gəlib dörd bir tərəfdən ruslara hücum edirdilər[62]. Salari hömdarı Mərzuban ibn Muhəmməd 30 minlik ordusu ilə aylarla Bərdəni işğaldan azad etmək üçün vuruşmuş, ruslara ağır itgi verdirmişdi. Lakin Bərdə qalasında möhkəmlənmiş rusları heç cür oradan sıxışdırıb çıxarmaq mümkün olmamışdı[63]. Bu vaxt Salari Mərzuban Mosul hakiminin Səlmasa hücum etdiyi xəbərini alaraq rusların Bərdədə mühasirəsini davam etdirmək üçün burada 4000 əsgər qoyaraq özü orudunun əsas hissəsi ilə ölkənin cənubuna üz tutmuşdu. 945-ci ilin isti yay günlərində rusların arasında yayılan yoluxucu xəstəlik onların bir çoxunun qırılmasına səbəb olmuşdu. Nəhayət ruslardan sağ qalanlar aldıqları əsir və qənimətlərlə avqustun 12-də Bərdəni tərk edib gəldikləri yolla geri qayıtmışdılar[64]. Mosul hakimi ölkənin cənubuna basqın etməsəydi bəlkə də işğalçıları tamamən məhv etmək mümkün olardı. Bu hadisədən sonra Bərdə şəhəri bir daha dirçəlib əvvəlki ehtişamına qayıda bilmədi. X əsrin ikinci yarısından etibarən Gəncə əhəmiyyət qazanaraq Azərbaycanın şimalındakı ən böyük siyasi, iqtisadi və mədəniyyət mərkəzinə çevrilməyə başlamışdı.

Orda əsrlərdə Azərbaycanın şimalındakı mühüm şəhərlərdən biri də **Bərdic** idi. Mənbələrin verdiyi məlumatdan məlum olur ki, Bərdic Bərdədən 14 fərsəx aralıda, Kür çayı sahilində mövcud olmuşdu[65]. Yaqut əl-Həməvi Kür çayının bu şəhəri əhatə etdiyini yazır[66]. 14 fərsəxin 79,59 km-ə bərabər olduğunu[67] nəzərə alaraq Bərdicin Kür çayının

---

[61] İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. VIII, s. 350-351.
[62] *Yenə orada*.
[63] İBN MİSKƏVEYH, *Təcaribü'l-Üməm*, C. V, s. 72.
[64] MÜŞTƏRƏK, *Azərbaycan Tarixi,* s. 281, Bakı 1994.
[65] İBNü'l-ƏSİR, *Lübab*, C. I, s. 136; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 269.
[66] *Yenə orada*. [والماء يحيط بها في نهر...الكر]

Kürdəmirlə İmişli rayonları ərazisinə düşən hissəsində mövcud olduğunu söyləyə bilərik. Güman ki, Bərdic Kür çayı üzərindəki liman şəhəri idi. *Hüdudü'l-Aləm* müəllifi Bərdicin rifah və nemətlər şəhəri olduğunu yazır[68]. Bərdə, Beyləqan kimi Arranın mərkəzi və qərb şəhərləri Kür çayı vasitəsi ilə dəniz ticarəti ilə məşğul olduğunu təxmin etmək olar. Çünki İbn Hövqəl Kürün böyük və gəmilərin üzməsi üçün əlverişli çay olduğunu qeyd edir[69]. Bundan başqa əgər rusların böyük bir ordunu gəmilərlə Bərdəyə qədər daşıya bilməsini nəzərə alaraq Bərdicin Kür çayı üzərində ticarət mərkəzi və liman şəhəri olduğunu söyləyə bilərik.

Bir zamanlar kiçik bir qəsəbə olan **Bərzənd** Abbasi xəlifələrindən Mö'təsimin (833-842) hakimiyyəti illərində qazandığı hərbi-strateji əhəmiyyət sayəsində böyük şəhərə çevrilmişdi. Mö'təsimin əmri ilə Babəkin başçılığı altındakı xürrəmi qiyamını yatıran orduya baş komandan təyin edilən Afşin Heydər ibn Kavus Bərzəndi özünə iqamətgah seçmişdi[70]. Bu haqda məlumat verən Yaqut əl-Həməvi Bərzəndin Tiflis yaxınlığında yerləşən bir yaşayış məntəqəsi olduğunu qeyd etmişdir[71]. Görəsən müəllifi nə yanıltmışdı? Bir zamanlar Tiflis ətrafında da eyni adlı yaşayış məntəqəsinin mövcud olması yoxsa başqa bir səbəb? Əbdülkərim əs-Səm'ani Bərzəndin Tiflis yaxınlığında olduğunu zənn etdiyini qeyd edərək bu mövzuda tərəddüd etdiyini biruzə vermişdi[72]. Bu yanılmanın səbəbi məlum deyil, amma Bərzənd şəhərinin indiki Yardımlı rayondan qərbdə, Talış dağlarının ətəklərində yerləşdiyi məlumdur. İbn Xordadbeh Ərdəbildən Xuşş şəhərinə 8 fərsəx (45,48 km), Xuşşdan Bərzəndə 6 fərsəx (34,11 km) məsafə olduğunu qeyd edir[73]. Deməli Bərzənd Ərdəbildən təqribən 80 km şimali-qərbdə yerləşirdi. Bu gün cənubi Azərbaycanda kiçik bir kənd olan Bərzənd ehtimal ki, öz əhəmiyyətini elə xürrəmi üsyanı yatırılandan sonrakı illərdə itirməyə başlamışdı. Belə

---

[67] 1 ərəb fərsəxi=5685 m.
[68]ANONİM, *Hüdudü'l-Aləm minə'l-Məşriq ilə'l-Məğrib*, (Nşr. Y. əl-Hadi), 123, Qahirə 1999. [مدينة نزهة عامرة ذات نعمة]
[69] *Surətü'l-Ərz*, s. 345.
[70] BƏLAZURİ, *Fütuhü'l-Büldan*, s. 461;YAQUT əl-HƏMƏVİ, *Mu'cəm*, C. I, s. 273; Əhməd ibn Muhəmməd İBN FƏQİH əl-Həmədani, *Kitabü'l-Büldan*, (Nşr. M. De Goeje), s. 284, Leiden 1885.
[71] *Yenə orada*. [برزند... بلد من نواحي تفليس]
[72] Əbu Səid Əbdülkərim ibn Muhəmməd əs-SƏM'ANİ, *Kitabü'l-Ənsab*, (Nşr. A. əl-Barudi), C. I, s. 215, Beyrut 1988. [برزند... وظني أنها من نواحي تفليس]
[73] İBN XORDADBEH, *Məsalik*, s. 38

ki, XIII-XIV əsrlərdə yaşamış Həmidullah Qəzvini artıq Bərzəndin əhəmiyyət kəsb etməyən kiçik bir kənd olduğunu qeyd etmişdir[74].

İbn Xordadbeh (öl. 912) Sasani şahı Firuz oğlu I Qubadın Bərdə və Qəbələ ilə yanaşı **Beyləqan** şəhərinin də təməlini qoyduğunu yazır[75]. Q. Əhmədov onun bu yanlışını sonralar digər ərəbdilli coğrafiyaşünas və səyyahların da təkrarladığını bildirir[76]. Həqiqətən də istər antik dövr mənbələri, istərsə də arxeoloji qazıntılar Beyləqanın I Qubaddan əvvəl də mövcud olduğunu sübuta yetirirlər. Beyləqan rayonunun Kəbirli kəndi yaxınlığındakı Örənqala adlanan qədim Beyləqan xarabalıqlarında aparılan qazıntılar şəhərin möhkəm qala divarları ilə əhatə olunduğunu göstərir. İç qalanın (əhmədək) divarlarının uzunluğu 1525 m, xarici qala divarlarının ümumi uzunluğu isə 2400 m. dir. Qala divarlarının içində qalan ümumi sahə 40 ha-dır[77]. Əvvəl xilafət, sonra isə Böyük Səlcuqlular dövründə ticari-iqtisadi, mədəni-elmi baxımdan getdikcə inkişaf edən Beyləqan Azərbaycan Atabəyləri dövründə Azərbaycanın ən böyük şəhərlərindən birinə çevrilmişdi[78]. XII əsrin sonu-XIII əsrin əvvəllərində gürcü və xarəzmlilərin işğalına uğrayan Beyləqan dağıntılara məruz qalmışdı[79]. 1221-ci ilin noyabr ayında Beyləqana yaxınlaşan moğol orduları mühasirəyə aldıqları Beyləqana danışıq aparmaq üçün öz nümayəndələrini göndərmişdilər. Şəhər əhalisi gələn moğol elçisini öldürmüş, bundan sonra moğollar Beyləqana hücum edərək şəhəri zorla ələ keçirmişidlər. Moğollar Beyləqan əhalisini böyük-kiçik, qadın-uşaq ayırmadan hamısını qılıncdan keçirərək dəhşətli qətliam törətmiş, şəhəri demək olar ki, yer üzündən silmidilər[80]. Həmidullah Qəzvini XIV əsrdə bu şəhərin xarabalıqlardan ibarət olduğunu yazmışdır[81].

Strateji baxımdan böyük əhəmiyyətə malik coğrafiyada yerləşdiyi üçün **Dərbənd** hələ qədim zamanlardan özünün qala divarları və istehkamları ilə tanınmışdı. Orta əsr ərəbdilli mənbələr Dərbəndin Sasani şahı Ənuşirvani-Adil tərəfindən inşa edildiyini

---

[74] *Nüzhətü'l-Qülub*, s. 92.
[75] *Məsalik*, s. 39. [وبنى قباذ مدينة البيلقان ومدينة برذعة ومدينة قبَلة]
[76] Qara ƏHMƏDOV, *Qədim Beyləqan*, s. 37, Bakı 1997.
[77] GÖYÜŞOV, *həmin əsər*, s. 126.
[78] Bax: ƏHMƏDOV, həmin əsər, s. 44-79; Ziya BÜNYADOV, *Azərbaycan Atabəyləri Tarixi*, s. 195-197, Bakı 1985;
[79] İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. XII, s. 367.
[80] İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. XII, s. 337-339.
[81] *Nüzhətü'l-Qülub*, s. 92.

qeyd etsələr[82] də arxeoloji qazıntılar hələ e.ə. III minilliyin əvvəllərindən Dərbənd ərazisində qədim yaşayış yeri olduğunu üzə çıxarmışdır[83]. Bu şəhərin ətrafının qala divarları ilə möhkəmləndirilməsinin tarixi isə e.ə. VIII-VI əsrlərə qədər gedib çıxır[84]. Sasanilərin hakimiyyəti dövründə isə Dərbənd yenidən inşa edilərək alınmaz qalaya çevrilmişdi. Ənuşirvan adı ilə məşhur olmuş şah I Xosrov Pərviz (531-579) Dərbəndin yenidən inşa edilib möhkəmləndiriməsində mühüm rol oynamışdı[85]. Sasanilər Dərbədə və ətraf vilayətlərdə çox sayıda farsdilli əhali məskunlaşdırmışdılar. Şimal-cənub yolu üzərində, Qafqazla Xəzər arasındakı dar keçidə nəzarət etdiyi üçün Dərbənd cənubi Qafqazın açarı hesab edilirdi. İnzibati-hərbi əhəmiyyəti ilə yanaşı Dərbənd həm də Xəzər sahillərindəki mühüm limanlardan biri idi. İbnü'l-Verdi Dərbənd qalasının üzərində yerləşdiyi dağdan dənizin içinə doğru uzanan qala divarları üzərində on ədəd qapının[86], yəni nəzarət-buraxılış məntəqəsinin olduğunu qeyd etmişdir. VIII əsrin birinci yarısından etibarən Dərbənd xilafətin şimala açılan qapısına çevrilmişdi. İstər Əməvilər, istərsə də Abbasilər Dərbəndin müdafiə sistemininin möhkəmləndirilməsinə böyük əhəmiyyət vermişdilər. Xilafətin zəiflədiyi dövrlərdə isə Dərbənddə qurulan Haşimi əmirliyi şəhəri və ətraf vilayətləri idarə etmişdi. 988-ci ildə Dərbənd Haşimi əmirliyi Şirvanşahlar dövlətinə birləşdirilmişdi. 1077-ci ildə isə Dərbəndə də Şirvanla birlikdə İraq Səlcuqlu dövlətinə daxil edilmişdi. XII əsrdən XIII ikinci rübünə qədər Dərbənd yenidən müstəqil əmirlik kimi idarə olunmuşdu[87]. Sonrakı əsrlərdə Dərbənd Şivanşahlar dövlətinin şimalındakı ən mühüm iqtisadi, inzibati və mədəni mərkəz olmuşdu.

1130-cu illərin əvvəllərində Dərbəndə olan şafi'i fəqihi və səyyah Əbu Hamid əl-Qırnati (1080-1170) bu şəhərin və ətraf vilayətlərin iqtisadi və ictimai həyatı haqqında dəyərli məlumatlar vermişdir. Səyyahın qeydlərindən məlum olur ki, Dərbənd şəri' elmlərin tədris olunduğu mərkəz olaraq şimali Qafqaz xalqları arasında İslamın yayılmasında müstəsna rol oynamışdı. Dərbənd əmiri Əbü'l-Qasımın qonağı olduğunu yazan Əbu

---

[82] Siracəddin Əbü'l-Həfs Ömər İBNü'l-VERDİ, *Xəridətü'l-Əcaib və Fəridətü'l-Qəraib*, (Nşr. A. Bədravi), s. 114-115, Beyrut 1970; YAQUT əl-HƏMƏVİ, *Mu'cəm*, C. I, s. 211.
[83] GÖYÜŞOV, *həmin əsər*, s. 134.
[84] *Yenə orada*.
[85] BARTOLD, *Soçineniya*, C. III, s. 419-437.
[86] İBNü'l-VERDİ, *Xəridətü'l-Əcaib*, s. 115.
[87] Sara AŞURBƏYLİ, *Şirvanşahlar Dövləti, VI-XVI əsrlər*, s. 188, 239, Bakı 2006.

Hamid əl-Qırnati əmirin onun dərslərində “əl-Muqni”[88] adlı fiqh kitabını oxuduğunu qeyd edir. O, həmçinin qafqazlı müsəlmanlarının dini elmlərə böyük maraq göstərdiyini də yazır. Fiqh dərslərində müxtəlif dillərdə danışan qafqazlıların iştirak etdiyini qeyd edən Əbu Hamid əl-Qırnati əmir Əbü’l-Qasımın dərslərdə onun üçün tərcümanlıq etdiyini bildirir. Qırnati əmirin ərəbcə, farsca, türkcə ilə yanaşı ləkz, təbərsəran, filan, haydaq, qumuq, qalan, sərir, alan (osetin), zərihkəran dillərində də sərbəst danışdığını qeyd etmişdir. Əmirin bacısının evində qonaq ikən qadının qardaşı vasitəsi ilə ona sırf qadınlara aid bir sual verməsini yazan əl-Qırnati sualı cavablandırdıqdan sonra qadının belə bir sualla müraciət etməsinə müsbət münasibətini bildirmiş və Peyğəmbərin (ق) “Ənsarın qadınları nə yaxşı xanımlardır. Həya (utancaqlıq) onların öz dinlərini öyrənmələrinə mane olmur”[89] hədisini xatırlatmışdı[90].

Başqa bir alim, hafiz Əbu Tahir əs-Süləfi İsfəhani (1083-1181) də Azərbaycanın şəhərlərini gəzmiş, o cümlədən Dərbənddə olmuşdu. Hafiz Əbu Tahir burada dövrün tanınmış fəqih və mühəddislərindən olan Əbü’l-Qasım Maymun Dərbəndi ilə görüşüb ondan hədis dinlədiyini yazır[91]. Hafiz Əbu Tahir İsfəhani ilə Əbu Hamid əl-Qırnatinin səyahətləri təqribən eyni dövrə təsadüf edir. Əbu Tahirin hədis dinlədiyi Əbü’l-Qasım Maymun Dərbəndi ilə əl-Qırnatinin haqqında bəhs etdiyi əmir Əbü’l-Qasımın eyni şəxs olub olmadığını müəyyənləşdirmək mümkün olmadı. Lakin hər iki müəllifin qeydləri Dərbəndin bu dövrdə Azərbaycanın mühüm elm və mədəniyyət mərkəzlərindən biri olduğunu deməyə əsas verir.

Orta əsr müsəlman tarixçi və coğrafiyaşünasların əsərlərində bu şəhərin adı “Dərbənd”, “Babü’l-Əbvab” və ya qısaca “əl-Bab” kimi qeyd olunduğu kimi bioqrafiya kitablarında da dərbəndli məşhur şəxsiyyətlərin nisbəsinin “Dərbəndi” və “əl-Babi” kimi yazıldığının şahidi oluruq. Biz burada haqqında məlumat verdiyimiz şəxslərin

---

88 “Kitabü’l-Muqni” Bağdadlı tanınmış şafi’i fəqihi Əbü’l-Həsən Əhməd əl-Məhamilinin (978-1024) əsəridir.

89 Bu hədis üçün bax: Əbu Abdullah Muhəmməd ibn Yəzid İBN MACƏ əl-Qəzvini, *Sünən*, Təharət, Nr. 642, (Trc. H. Hatipoğlu), C. II, s. 549, İstanbul 1983. (نِعْمَ النساءُ نساء الأنصار، لم يكن يمنعهنَّ الحياء أن يتفقهن في الدين)

90 Əbu Hamid Muhəmməd ibn Əbdürrəhman əl-QIRNATİ, *Nuxbətü’l-Əlzən fi Əcaibü’l-Büldan*, (Trc. O. Bolşakov), s. 27-28, Moskva 1971. İspaniyalı ərəb səyyahı və alimi Əbu Hamid əl-Qırnati 1117-1155-ci illərdə Əndəlüsdən Misirə gələrək, Hicaz, İraq, Şam diyarı, İran, Orta Asiya, Azərbaycan, Şimali Qafqaz, Rusiya, Ukrayna və Macarıstan əhatə edən səyahətə çıxmış və səyahət xatirələrini kitablaşdırmışdı.

91 Əbu Tahir Əhməd ibn Muhəmməd əs-Süləfi İSFƏHANİ, *Ərbəinü’l-Büldaniyyə*, (Hzr. A. Rabih), s. 177-178, Dəməşq 1992.

nisbəsini, istinad etdiyimiz mənbədə necə yazılmasından aslı olmayaraq, “Dərbəndi” kimi qeyd etmişik.

Əvvəla onu qeyd edək ki, orta əsr tarixi və coğrafi mənbələrin demək olar ki, tamamına yaxınının Azərbaycan şəhəri kimi göstərdiyi **Düveyn** şəhərinə Azərbaycan tarixçiliyində çox az yer verilmişdi. Azərbaycanın tarixi və siyasi coğrafiyası ilə bağlı qələmə alınmış tədqiqat əsərlərində Düveyn erməni şəhəri kimi qeyd olunmuşdur. Halbuki, aşağıda görəcəyimiz kimi, bir neçəsi istisna olmaqla, tarixi mənbələrin hamısı Düveynin Azərbaycanın qədim şəhərlərindən biri olduğunu açıq-aşkar şəkildə bəyan etməkdədirlər. Əvvəla şəhərin adının yazılışından başlayaq. Azərbaycanlı tarixçilər bu şəhərin adını, bəzi ərəbdilli mənbələrdə yazıldığı formada “Dəbil” [دبيل] kimi qeyd edirlər. Bunu “Dübeyl” kimi də oxumaq mümkündür. Erməni, rus və avropalı tarixçi və şərqşünaslar isə şəhərin adını “Dvin” olaraq yazırlar. Orta əsr ərəbdilli müəlliflərin əksəriyyəti isə şəhərin adını “Düveyn” [دوين] olaraq qeyd edirlər. Ərəb qrafikası ilə hərəkəsiz bunu Dvin kimi də oxumaq mümkündür. Lakin ərəb orfoqrafiyasının xüsusiyyətlərindən irəli gələn tələblərə görə bu yazı məhz “Düveyn” kimi oxunmalıdır. Bir çox orta əsr müəllifləri də bu yazını məhz “Düveyn” [دُوين] kimi oxunacaq şəkildə hərəkələmişdirlər. Şəhərin adının Dəbil deyil, məhz Düveyn kimi yazılıb oxunmasını bizim üçün zəruri edən başqa bir səbəb orta əsrlərdə Hindistan[92] və Suriyada da Dəbil adlı yaşayış məntəqəsinin mövcud olmasıdır[93]. Bəzi mənbələrdə bu şəhərin adının “Düvən”, burada yetişmiş şəxslərin nisbəsinin isə “Düvəni” şəklində qeyd olunduğunu da görürük. Azərbaycanın şəhərlərinə etdiyi elmi səyaət vaxtı Düveynə də gələn Əbu Tahir əs-Süləfi əsərində şəhərin adını Düvən, orada gösüşüb hədis dinlədiyi mühəddisin adını isə Əbu Muhəmməd Əbdürrəhman əd-Düvəni kimi qeyd etmişdir[94]. İbn Xəllikan yazır: “o şəhərdən olanlar əd-Düveyni, həmçinin əd-Düvəni adlanırlar”[95]. *Hüdudü'l-Aləm* müəllifi də bu şəhəri Düvən adlandırır, lakin bolluq, bərəkət və rifah dolu olduğunu bildirdiyi şəhərin Ərməniyyədə olduğunu qeyd edir[96]. İbn Xordadbeh

---

[92] Bu şəhərin adı “Dəybil” idi. İndiki Pakistanın Sind vilayətində, təqribən Heydərabad şəhəri ətrafında yerləşirdi.

[93] Bax: Cəmaləddin Əbdürrəhim əl-ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 252; Beyrut 1987; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 188.

[94] ƏBU TAHİR İSFƏHANİ, *Ərbəinü'l-Büldaniyyə*, s. 73.

[95] *Vəfayatü'l-Əyan*, C. I, s. 259. [ودوين... وينسب إليها الدويني والدوني أيضاً]

[96] *Hüdudü'l-Aləm*, s. 120.

Nəşəva (Naxçıvan) ilə Düveyn arasında 20 fərsəx (113,7 km) məsafə olduğunu yazır[97]. Müasir ölçmə texnologiyaları da indiki Düveyn xarabalıqları ilə Naxçıvan şəhəri arasındakı məsafənin 113-115 km olduğunu göstərir.

Yaqut əl-Həməvi Düveynin Ərməniyyənin Arranla sərhəddindəki şəhər olduğunu yazmışdır[98]. Suriyalı Mixail də Düveyni erməni şəhəri adlandırır[99]. Yaqut əl-Həməvi, əl-İstəxri, *Hüdudü'l-Aləm* müəllifi kimi mənbələr Düveynin erməni şəhəri olduğunu bildirsələr də orta əsr ərəbdilli mənbələrin əksəriyyətində onun Azərbaycan şəhəri olduğu qeyd edilmişidir. Cəmaləddin əl-Himyəri Düveynin Azərbaycanın şimalında, Gürcüstanla sərhəddə yerləşən şəhər olduğunu yazır[100]. İbnü'l-Əsir[101], Süyuti[102], İbn Xəllikan[103], Əbu Bəkr əl-Bağdadi[104] , Əbu Şamə əl-Məqdisi[105] kimi bir çox tarixçi, coğrafiyaşünas və bioqraf Düveynin Azərbaycan şəhəri olduğunu qeyd etmişdirlər.

Düveyni erməni şəhəri hesab edən M. Streck şəhərin adının etimoloji izahının məchul olduğunu qeyd edir[106]. Erməni salnaməçi M. Xorenatsi isə "Dvin" sözünün farsca təpə mənasını ifadə etdiyini bildirmişdir[107]. Xristianlığın cənubi Qafqazda, o cümlədən Azərbaycanda yayılmağa başlamasından sonra, həmin vaxta qədər ehtimal ki, kiçik yaşayış məntəqəsi olan, Düveyn əhəmiyyət qazanmağa başlamışdı. V əsrdən etibarən cənubi Qafqazda xristianlığın əsas təlim mərkəzlərindən biri olan Düveyn Azərbaycanın Sasanilər tərəfindən zəbt olunmasından sonra 428-ci ildə Sasani canişinlərinin inzibati mərkəzinə çevrilmişdi. Həm inzibati, həm də dini mərkəz olan Düveyn sürətlə inkişaf etmişdi. M. Streck şəhərin təməlinin Sasani şahı I Xosrov Pərviz (531-579) tərəfindən qoyulduğunu düşünsə də[108] aparılmış arxeoloji qazıntılar

---

97 İBN XORDADBEH, *Məsalik*, s. 39.ً[نشوى...ثم إلى دبيل  عشرون فرسخا]
98 YAQUT əl-HƏMƏVİ, *Mu'cəm*, C. III, s. 716. [ودبيل أيضا مدينة بأرمينية تتاخم أرّان]
99 MICHEL le SYRIEN, *Chronique*, (J.B. Chabot), C. II, s. 318, C. III, s. 325, Paris 1905.
100 *Nisbə ilə'l-Məvazi*, s. 199. [دُوين بلدةٌ في آخر إقليم أذربيجان من جهة الشمال مجاور بلاد الكرخ]
101 *Lübab*, C. I, s. 517. [الدُويني...هذه النسبة الى مدينة مشهورة من أذربيجان, خرج منها جماعة من العلماء].
102 Cəlaləddin Əbdürrəhman ibn Əbu Bəkr SÜYUTİ, *Lübbü'l-Lübab fi Təhrir'l-Ənsab*, (Nşr. M. Əbdüləziz), s. 91, Beyrut 1991. [الدويني: إلى دُوين مدينة بأذربيجان]
103 *Vəfayatü'l-Əyan*, C. I, s. 259. [ودوين...وهي بلدة في أواخر إقليم أذربيجان]
104 Əbu Bəkr Muhəmməd ibn Əbdülqəni BAĞDADİ, *Təkmilətü'l-İkmal*, (Nşr. Ə. Əbdülqəyyum), C. II, s. 623, Məkkə 1410. [ودوين مدينة بأذربيجان]
105 Şihabəddin Əbu Şamə Əbdürrəhman ibn İsmayıl əl-MƏQDİSİ, *Rəvzəteyn fi Əxbari'd-Dövləteyn*, (Nşr. İ. Zeybəq), C. I, s. 403, Beyrut 1997. [دُوين وهي بلدة من آخر بلاد أذْرَبِيجان مما يلي بلاد الروم]
106 Makxmilian STRECK, "Dvin", İA (MEB), C. IV, İstanbul 1977, ss. 682-683.
107 Movses XORENATSİ, *İstoriya Armenii*, (Trc. Q. Sarkisyan), s. 169, İrəvan 1990.
108 STRECK, *həmin məqalə*.

Düveynin yaşayış məntəqəsi kimi daha əvvəl də mövcud olduğunu göstərmişdir[109]. Ehtimal ki, I Xosrov şəhəri əsaslı təmir etdirmiş, qala divarlarını möhkəmləndirmişdi. Ərəblərin Dvinə ilk hücumu 6 oktyabr 640-cı ildə baş vermişdi[110]. Şəhər müdafiəçilərinin müqavimətini qıran ərəblər Düveynə daxil olmuş və çoxlu qənimətlə şəhəri tərk edib bir qədər aralıda düşərgə salmışdılar. Bir neçə gün sonra yenidən şəhərə hücum edən xilafət ordusu 35 min nəfəri əsir alıb oradan uzaqlaşmışdı[111]. Ehtimal ki, bu kəşfiyyat xarakterli hücumu əl-Cəzirə valisi İ'yaz ibn Ğənəm (ˈ) tərtib etmişdi[112]. Osman ibn Əffanın (ˈ) hakimiyyəti dövründə (644-656) isə Həbib ibn Məsləmə əl-Fıhrinin (ˈ) komandanlıq etdiyi xilafət ordusu Düveyni ikinci dəfə, qalıcı olaraq fəth etmişdi. Şəhər əhalisi ilə əhdnamə bağlayan Həbib ibn Məsləmə cizyə və xərac ödəmələri qarşılığında onların canları, malları, mülkləri və məbədlərinin təhlükəsizliyinə təminat vermişdi[113]. Bu əhdnaməni bizim üçün əhəmiyyətli qılan digər bir xüsus da 640-cı illərdə yazılmış bu tarixi sənəddə tərəflərin kimlərdən ibarət olmasının açıq və aydın şəkildə göstərilməsidir. Əhməd əl-Bəlazuri əhdnamənin mətnini olduğu kimi qeyd etmişdir. Orada deyilir: "Bu yazı Həbib ibn Məsləmə tərəfindən Dübeyl şəhərinin xristianlarına, yəhudilərinə, məcusilərinə, buna şahid olanlara və digərlərinə verilir" [114]. Bu da onu göstərir ki, bu qədim Azərbaycan şəhərində sadəcə xristianlar deyil, müxtəlif dinlərə və millətlər mənsub insanlar yaşamışdılar. Hətta erməni mənbələrinin verdiyi bir məlumat Düveyndə atəşpərətliyin xristianlığa nisbətən daha güclü mövqeyə malik olduğunu düşünməyə əsas verir. Məsələn erməni salnaməçi Vardan yazır ki, Şavasp Artsruni və Vendo adlı iki xristian zadəgan dinlərini dəyişərək məcusiliyi qəbul etmiş və Düveyndə Hörmüzdün şərəfinə atəşgədə inşa etmişdilər[115].

---

[109] Varazdat ARUTYUNYAN, "Arxitekturnıye Pamyatniki Dvina", **ErmSSR EA Xəbərləri**. Nr. 8, İrəvan 1947, ss. 39-47.

[110] YEPİSKOP SEBEOS, *İstoriya*, (Trc. Ct. Malxasyants), s. 57, İrəvan 1939

[111] *Yenə orada*. Erməni salnaməçi Vardan ərəblərin Düveyndən 37 min əsir apardıqlarını yazır. Bax: Vardan ARAVELTSİ, *Vseobşaya İstoriya*, (Trc. M. Emin), s. 86, Moskva 1861.

[112] Bu haqda ətraflı məlumat üçün bax: Elnur NƏSIROV, *Raşidi Xəlifələr Dövründə Azərbaycanın Fəthi*, s. 51, Bakı 2006.

[113] Bu əhdnamə haqqında ətraflı məlumat üçün bax: NƏSİROV, *həmin əsər*, s. 76.

[114] BƏLAZURİ, *Fütuhü'l-Büldan*, s. 323. [هذا كتاب من حبيب بن مسلمة لنصارى أهل دبيل ومجوسها ويهودها شاهدهم وغائبهم]. Bu əhdnamənin mətni üçün həmçinin bax: Muhəmməd HƏMİDULLAH, *Vəsaiqü's-Siyasiyyə*, s. 452, Beyrut 1985.

[115] VARDAN, *həmin əsər*, s. 68.

Sonrakı əsrlərdə Düveyn, haqqında yuxarıda geniş məlumat verdiyimiz, erməni kilsəsinin həyata keçirdiyi qriqoryanlaşdırma və erməniləşdirmə siyasəti nəticəsində əsasən erməni şəhəri kimi tanınmışdı. Xristian məzhəbləri arasındakı ixtilaf Düveyndə açıq mübarizə forması almışdı. M. Kalankatuklu yazır: "Movsesin katolikosluq kürsüsü isə Dəbil şəhərində idi. Bizans erməniləri (diofizitlər-E.N) isə İohanın katolikosluq kürsüsünü də Dəbilin yaxınlığındakı Avanda yerləşdirdilər. Hər iki katolikosluq arasında daim münaqişələr baş verirdi..."[116]. Bizansa qarşı xilafətdən dəstək alan erməni qriqoryan kilsəsi Düveyni özünün məkəzinə çevirmişdi. Qriqoryan kilsə qurultayları bu şəhərdə keçirilirdi[117]. Buna baxmayaraq xilafət dövründə bir müsəlman şəhəri olaraq Düveyn özünün elmi, mədəni və ictimai həyatının canlılığı ilə məşhur olmuşdu. Bunun ən tutarlı dəlili bu şəhərdə çox sayıda azərbaycanlı alimin yetişməsidir. Sacilər və Salarilərin dövründə Azərbaycanın qərbindəki ən böyük şəhərlərdən biri olan Düveyn Şəddadilərin hakimiyyəti dövründə daha da inkişaf etmişdi. X əsr müəllifi əl-İstəxri Düveynin Ərdəbil şəhərindən daha böyük olduğunu yazır[118]. Haqqında məlumat verərkən görəcəyimiz kimi Ərdəbil bu dövrdə 300 mindən çox əhalisi olan böyük şəhər idi. əl-İstəxrinin verdiyi məlumat doğrudursa orta əsrlərdə Düveyn əhalisinin sayının 300-400 min arasında olduğunu söyləmək olar. Azərbaycan Saci hökmdarı Yusif ibn Əbu's-Sac 914-cü ildə itaətdən boyun qaçıran və dikbaşlıq edən Ərməniyyə hakimi I Smbatı yaxalayıb Düveyndə edam etdirmişdi. O, daha sonra Smbatın oğlu Muşeqi, erməni knyazları David və Qurgeni də Düveynə gətirdərək edam etdirmişdi[119]. 1045-ci ildə Düveyndə baş vermiş zəlzələ güclü dağıntı və insan təlefatına səbəb olmuşdu[120]. Böyük Səlcuqlu dövləti və Azərbaycan Atabəyləri dövründə də iqtisadi-ticari və ictimai-mədəni əhəmiyyətini itirməyən Düveyn bir neçə dəfə gürcü çarlarının dağıdıcı hücumuna məruz qalmışdı[121]. 1161-ci ilin avqustunda gürcü çarı III Georgi (1156-1184) əvvəlcə Anini sonra isə Dvini işğal etmişdi. Hər iki şəhərin əhalisinin böyük bir qismi

---

[116] Moisey KALANKATUKLU, *Albaniya Tarixi*, (Trc. Z. Bünyadov), s. 171, Bakı 1993.
[117] Bax: Kirakos QANZAKETSİ, *İstoriya Armenii*, (Trc. L. Xanlaryan), s. 135, Moskva 1976; MICHEL le SYRIEN, *Chronique*, C. II, s. 318; Malachia ORMANIAN, *The Church of Armenia*, (Trc. M. Gregory), s.44, London 1910; VARDAN, *həmin əsər*, s. 88.
[118] *Məsalikü'l-Məmalik*, s. 74. [وأما دبيل فإنها مدينة أكبر من أردبيل]
[119] VARDAN, *həmin əsər*, s. 112.
[120] SMBAT SPARAPET, *Letopis*, (Trc. Qlastyan), s. 25, İrəvan 1974.
[121] İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. XI, s. 228; BÜNYADOV, *Azərbaycan Atabəyləri Dövləti*, s. 52, 98.

gürcülər tərəfindən qılıcdan keçirilmişdi. Anidən 41 min, Dvindən isə 10 min əhali əsir götürülmüşdü. Lakin bu gürcü çarına baha başa gəlmişdi. 1163-cü ilin iyulunda Azərbaycan Atabəyi Şəmsəddin Eldəniz III Georgini məğlubiyyətə uğradaraq Dvini geri almışdı. Bu elə bir ağır məğlubiyyət idi ki, gürcü ordusunun bütün təchizatı, o cümlədən çarın şəxsi əşyaları müsəlmanlar tərəfindən qənimət götürülmüşdü. Azərbaycan ordusunun ikinci hücumunda isə III Georgi əsir düşməkdən canını çətinliklə qutarmışdı. Atabəyin növbəti hərbi əməliyyatlar üçün hazırlaşdığını öyrənən çar "mən sənə nə yararlıdırsa onunla razıyam və nə istəyirsənsə onu yerinə yetirməyə hazıram" deyə xəbər göndərmişdi. Lakin Atabəy Şəmsəddin Eldəniz ona "Mən İraqda qalmayıb, bu ölkəyə ona görə gəldim ki, qoşun toplayam, Tiflisə yürüyəm, onu tutanadək aramsız mühasirədə saxlayam....Mən sizin üzərinizə elə qoşunla gəlmişəm ki, ondan sizi qılınc vurmaqdan və nizə uclarından başqa heç nə qurtara bilməz" deyə cavab vermişdi. Burada baş verən döyüşdə gürcü ordusunu 10 min seçmə döyüşçüsü məhv edilmişdi. Müsəlmanlar hələ bu vaxtadək onlardan hər hansı birisinin və qoşunlarının ala bilməyəcəyi qənimətə yiyələnmişdilər. 1175-cü ilin avqustunda isə Azərbaycan, İraq, Sökmən və Diyarbəkir əmirlərinin birləşmiş ordusu Gürcüstana girmişdi. Axalkələk ilə Trialeti arasındakı ərazini elə talan edib elə dağıltdılar ki, sanki əvvəllər burada heç kim yaşamamışdı[122].

Moğollar 1236-cı ildə, Azərbaycana üçünücü yürüşləri vaxtı, Düveyni elə ağır təxribata uğratmışdılar ki, şəhər bir daha yaşayış məskəni kimi istifadə olunmamışdı. Düveynin xarabalıqları bu gün Ermənistan respublikasında, Qarni kəndi yaxınlığındadır. Xarabalıqlar İrəvanın 18 km cənub-şərqində, Sədərəkin isə 39 km şimal-qərbindədir.

Düveynin həm Azərbaycan, həm də İslam tarixi baxımından əhəmiyyətini artıran bir xüsus da şanına şe'rlər, romanlar yazılıb filmlər çəkilən məşhur qəhrəman Səlahəddin Yusif Əyyubinin əslən bu şəhərdən olmasıdır. Səlahəddin Yusif Əyyubinin atası Nəcməddin Əyyub ibn Şazi ibn Mərvan Düveyndə dünyaya göz açmışdı. Uzun müddət Səlahəddin Əyyubinin xidmətində olmuş Bəhaəddin ibn Şəddad yazır: "Onun (Səlahəddin Əyyubinin-E.N) atası Əyyub ibn Şazi rəhiməullah bizim yanımıza

---

[122] BÜNYADOV, *Azərbaycan Atabəyləri Tarixi*, s. 55-58.

gəlmişdir. O, kərim, həlim, gözəl əxlaq sahibi idi. Düveyndə dünyaya gəlmişdi”[123]. Əbu Şamə əl-Məqdisi də İbn Şəddadla eyni məlumatı vermişdi[124]. Bəhaəddin əl-Cəndi isə Əyyub ibn Şazi haqqında “Azərbaycanın kənarında şəhər olan Düveyndə dünyaya gəlmişdi. O, rəvvadi kürdlərinin hezbaniyyə tayfasındandır” deyir[125]. İbnü’l-Əsir də Əyyub ibn Şazi haqqında “Azərbaycanın Düveyn şəhərindəndir, o, kürd qəbilələrinin ən şərəflilərindən olan rəvvadilərdəndir” yazır[126]. Suriyalı Mixail də Nəcməddin Əyyubun Düveynli kürd olduğunu yazır, lakin müəllif Düveyni erməni şəhəri kimi tanıdır[127]. Erməni tarixçisi Smbat Əyyub ibn Şazinin Düveynli kürd kəndlisi olduğunu yazır[128]. Əbu Bəkr Dəvadari də Əyyub ibn Şazi ibn Mərvanın kürd rəvvadi qəbiləsinə mənsub olduğunu, lakin bu qəbilənin İranın Nəhavənd vilayətində məskun olduğunu yazır[129]. Əbdülməlik əl-Asimi də sultan Səlahəddin Əyyubinin rəvvadi kürdlərindən olduğunu və bu qəbilənin Düveynin xeyrlilərindən olduğunu qeyd etmişdir[130]. Şərəfxan Bidlisi (1543-1599) Misirin Əyyubi hökmdarlarının Azərbaycanın Düveyn şəhərindən olan kürd ravəndi tayfasına mənsub Şazi ibn Mərvanın nəslindən olduqlarını qeyd edir. Müəllif yazır: “bu gün həmin yerdə Çuxursəd vilayətinin Qarni kəndi var, əhalisi bu kəndi tərk etmişdir”[131]. Nəcməddin Əyyub ibn Şazi qardaşı Əsirəddin Şirkuh ibn Şazi ilə birlikdə Düveyndən İraqa gedib Bağdad şıhnəsi[132] Mücahidəddin Bəhruzun xidmətinə daxil olmuşdu. Mücahidəddin Bəhruz Nəcməddin Əyyubun hərbi işdə bacarıq və istedadını görüb onu Tikrit qalası mühafizə dəstəsinə başçı təyin etmişdi. Tikritdə Əsirəddin Şirkuhun mübahisə etdiyi nüfuzlu bir şəxsi vurub öldürməsindən

---

123 Bəhaəddin Yusif ibn Rafi İBN ŞƏDDAD, *Sirətü’s-Sultanü’l-Malikü’n-Nasir Səlahəddin*, (Nşr. A. Schultens), s. 1, Leiden 1755. [وكان والده ايوب بن شاذي رحمه الله واليا بها و كان كريما,اريحيا ,حليما, حسن الاخلاق, مولده بدوين]

124 MƏQDİSİ, *Rəvzəteyn fi Əxbari’d-Dövləteyn*, C. IV, s. 381.

125 Bəhaəddin Muhəmməd ibn Yusif əl-CƏNDİ, *Süluk fi Təbəqati’l-Üləma və’l-Müluk*, (Nşr. M. Həvali), C. I, s. 250, Səna 1995. [...ايوب باصل بلده وبلد أهله يقال لها دوين... وهي في آخر عمل أذربيجان وهم أكراد روادية بطن من اله ذبانية]. Kürd Hezbaniyyə qəbiləsinin Azərbaycan ərazisində yaşaması barədə hələ X əsr müəllifi İbn Hövqəl məlumat verməkdədir. Bax: *Surətü’l-Ərz*, s. 289.

126 İBNü’l-ƏSİR, *Kamil fi’t-Tarix*, C. XI, s. 276. Əsərin ərəbcəsində mətn belədir: [من بلد دوين ، من أذربيجان ، وأصلهما من الأكراد الروادية ، وهذا القبيل هم أشرف الأكراد]

127 MICHEL le SYRIEN, *Chronique*, C. II, s. 318. [ Ayoub étaient fils de Shadî, de la région de Dovin, ville d'Arménie, et de race curde]

128 SMBAT SPARAPET, *Letopis*, s. 107.

129 Əbu Bəkr ibn Abdullah ibn Aybək DƏVADARİ, *Kənzü’d-Dürər və Camiü’l-Ğürər*, (Nşr. S. Ə. Aşur), C. VII, s. 5-6, Qahirə 1972.

130 Əbdülməlik əl-ASİMİ əl-Məkki, *Səmtü’n-Nücumu’l-Əvali fi Ənbai’l-Əvail və’t-Təvali*, (Hzr. A. Ə. Əbdülmövcud-Əvəz Ə. M), s. 286, Beyrut 1998. [السلطان صلاح الدين يوسف بن ايوب بن شاذي الكردي وهم خيار اللأكراد الدوين]

131 Şərəfxan ibn Şəmsəddin BİDLİSİ, *Şərəfnamə*, (Trc. Y. Vasilyeva), C. I, s. 123, Moskva 1967.

132 Şəhər qarnizonunun komandanı.

sonra Mücahidəddin Bəhruz bu iki qardaşdan İraqı tərk etmələrini tələb etmişdi. Qardaşlar uzun zamandan bəri dostluq etdikləri atabəy Nurəddin Mahmud Zənginin (1146-1174) yanına gedərək onun ordusunda xidmət etməyə başlamışdılar. 1099-cu ildə Fatimilər Qüds şəhərini müdafiə edə bilməyərək səlibçilərə təslim etmişdilər. Buna baxmayaraq səlibçilərlə Fatimilər arasındakı müharibələr davam etmişdi. Səlibçilər qarşısında aciz qalan Fatimilər Mosul atabəyi Nurəddin Mahmud Zəngidən kömək istəmişdilər. O, da öz komandanlarından Əsirəddin Şirkuhu ordu ilə Misirə göndərmişdi. Qardaşı oğlu Səlahəddin Yusiflə birlikdə Misirə gələn Əsirəddin Şirkuh Fatimi hökmdarının vəziri olmuş, lakin bir müddət sonra ölmüşdü. Onun yerinə keçən Səlahəddin Yusif gözlənilmədən 1171-ci ildə Fatimi dövlətinin varlığına son qoyaq xütbəni Abbasi xəlifəsinin adına oxutmuş və Misirdə Əyyubilər dövlətinin təməlini qoymuşdu. Səlahəddin Əyyubi (1174-1193) nizam-intizamlı, möhkəm ordu qurmuşdu. Səlahəddin Əyyubi 5 iyul 1187-ci ildə Fələstindəki Təbəriyyə gölü sahilindəki Xuttin kəndi yaxınlığında Qüds səlibçi krallığının ordusunu ağır məğlubiyyətə uğratmışdı. Xuttin döyüşündə səlibçilərin demək olar ki, hamısı məhv edilmişdi. Bu döyüşdən sonra hərbi qüvvəsindən məhrum olan Qüds krallığı da aradan qaldırıldı və Qüds 88 illik işğaldan sonra azad edildi. Qüdsün azad olunması Avropanın xristian krallarını hərəkətə gətirmişdi. Alman imperatoru Fridrix Barbarossa, ingilis kralı "şir ürəkli" ləqəbli Riçard[133], Fransa kralı Filip Avqust 1189-cu ildə birləşmiş orduları ilə yaxın şərqə yürüş etmişdilər. Səlibçilər Fələstindəki Əkkə qalası yaxınlığında sahilə çıxıb qalanı zəbt etmişdilər. Lakin Səlahəddin Əyyubinin ordusu qarşısında məğlubiyyətə uğrayaraq sülh müqaviləsi bağlamağa məcbur olmuşdular[134].

**Əbhər** Zəncan vilayətində, Zəncan şəhərindən 87 km cənubda yerləşən qədim Azərbaycan şəhəridir. Orta əsr ərəbdilli coğrafi mənbələrdə Zəncan bəzən Cibal bəzən də Azərbaycan şəhəri kimi göstərilmişdir. Cəmaləddin əl-Himyəri öz əsərində Zəncanın Azərbaycanın vilayətlərindən biri olduğunu qeyd edir[135]. Yaqut əl-Həməvi Əbhərin Zəncan, Qəzvin və Həmədan arasında yerləşən məşhur şəhər olduğunu yazır.

---

[133] Krallarını məğlub etməsinə baxmayaraq ingilislər 1953-cü ildə istehsalına başladıqları zirehli hərbi texnikaya "Saladin", yəni Səlahəddin adını vermişdilər.
[134] İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. XI, s. 278-280, 422-424, 431-436; İBN ŞƏDDAD, *Sirət*, s. 1-3.
[135] Cəmaləddin Abdullah Təyyib İbn Abdullah İbn Əhməd əl-HİMYƏRİ, *Nisbə ilə'l-Məvazi' və'l-Büldan*, C. I, s. 368, Beyrut (trz). [الزنجان.... بلد من إقليم أذربيجان]

Müəllif şəhərin adının izahını verərkən bəzilərinin "Əbhər" sözünün farsca su uzunqulağı mənasını ifadə etdiyini dediklərini yazır[136]. Lakin deyə bilərik ki, Yaqut əl-Həməvi yanılmışdır. Çünki su uzunqulağı mənasını ifadə etməsi üçün bu bu söz "Əbhər" [أبهر] deyil "Abxər" [آبخر] olmalıdır. Göründüyü kimi bu iki sözün həm tələffüzü, həm də yazılışı fərqlidir. *Hüdudü'l-Aləm*də bu şəhərin adını Əvhər [أوهر] kimi yazımışdır[137]. "Əbhər" ərəb dilindəki "bəhr"-dəniz [بهر] sözünün cəm formasıdır və hərfi tərcüməsi "dənizlər"dir. Şəmsəddin əd-Diməşqi Zəncan və Əbhərin Azərbaycanın şəhərləri olduğunu qeyd edir[138]. Səm'ani Əbhərin Zəncan şəhərindən qərbdə yerləşdiyini və buradan maliki məzhəbinə mənsub çox sayıda mühəddis, sufi və ədibin çıxdığını yazır[139]. *Əcaibü'd-Dünya* müəllifi Əbhər yaxınlığında Heydəriyyə adlı möhkəm bir qala olduğunu, lakin Xarəzmşah Təkişin Eldənizlilərlə müharibəsi vaxtı bu qalanının dağıldıldığını yazır[140]. Həqiqətən irəlidə kitabın bioqrafiyalar qismində də görcəyimizi kimi Əbhər şəhərində yetişmiş alimlərin, daha dəqiq desək Əbhər əhalisinin böyük əksəriyyəti maliki məzhəbində olmuşdular. Halbuki maliki məzhəbi əsasən şimali Afrika və İspaniya müsəlmanları arasında yayılmışdı.

IX-XI əsr müəlliflənin əsərlərində **Əhər**in adına rast gəlinməsə də XII əsrdən etibarən səyyah və coğrafiyaşünaslar bu kiçik Azərbaycan şəhir haqqında məlumat verirlər. Yaqut əl-Həməvinin qeydlərindən XIII əsrin əvvəllərində Əhərin kiçik olmaqla yanaşı abadlıq və bolluq içində bir şəhər olduğunu öyrənirik. O, Əhərin Təbrizlə Ərdəbil arasında olduğunu, Vəravi (indiki Meşkin) şəhərinə isə buradan iki günlük yol olduğunu qeyd edir. Yaqut əl-Həməvi bu şəhərin İbn Bişikan adlı əmir tərəfindən idarə olunduğunu yazır[141]. Bu şəxsin adı əslində İbn Piştəkindir. "Piştəkin" adı, həmçinin Əhər və ətraf vilayətlər haqqında irəlidə, Hacib Fəxrəddin Cəbrayıl Əhəri barəsində məlumat verərkən ətraflı söz açacağıq. Həmidullah Müstəvfi Əhərin soyuq iqlimli, su quyuları və kəhrizlərə malik kiçik şəhər olduğunu yazır. Müəllif şəhər əhalisinin şafi'i

---

136 YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 47.
137 *Hüdudü'l-Aləm*, s. 108.
138 Şəmsəddin Əbu Abdullah Muhəmməd əl-Ənsari əd-DİMƏŞQİ, *Nuxbətü'd-Dəhr fi Əcaibü'l-Bərr və'l-Bəhr*, (Nşr. A. Mehren), s. 184, Leipzig 1923. [ وابهر و زنجان وعما ممّا بلى بلاد اذربيجان]
139 SƏM'ANİ, Katibü'l-Ənsab, C. I, s. 47. [أبهر وهي بلدة بالقرب من زنجان، خرج منها جماعة كثيرة من الفقهاء المالكية والمحدثين والصوفية والأدباء]
140 ANONİM, *Əcaibü'd-Dünya*, (Trc. L. Smirnova), s. 180, Moskva 1993.
141 YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 296.

məzhəbində olduğunu, ətrafındakı 20 kəndlə birlikdə Əhərdən dövlət xəzinəsinə illik 15 min dinar vergi daxil olduğunu qeyd edir[142].

**Ərdəbil** haqqında məlumat verən Həmidullah Müstəvfi bu şəhərin təməlinin kəyani şahlarından Siyavuşun oğlu Keykavus tərəfindən qoyulduğunu yazır[143]. Hələ Sasanilər dövründə inzibati mərkəz olan Ərdəbil Azərbaycanın ən böyük şəhərlərindən birinə çevrilmişdi. Nəhavənd döyüşündən (642) sonra Hüzeyfə ibnü'l-Yəmanın (ا) komandanlıq etdiyi xilafət ordusu Ərdəbili fəth etmişdi. Hüzeyfə ibnü'l-Yəman illik 800 min dirhəm cizyə ödəmək şərti ilə Ərdəbil əhalisi ilə əhdnamə bağlamışdı[144]. Xilafət dövründə baş vermiş xəzər-ərəb müharibələrində xəzərilər tərəfində dağıldılıb əhalisi qılıncdan keçirilən Ərdəbil[145] Salarilər və Sacilər dövründə Azərbaycanın əsas şəhərinə çevrilmişdi. *Hüdudü'l-Aləm* müəllifi Ərdəbilin qala divarları ilə əhatə olunmuş böyük şəhər olduğunu və Azərbaycan hökmdarlarının bu şəhərdə yaşadıqlarını qeyd etmişdir[146]. IX əsrin sonları-X əsrin əvvəllərində Yusif ibn Əbü's-Sac Ərdəbili özünün paytaxt şəhərinə çevirmişdi[147]. İbn Kəsirin verdiyi məlumatdan da Ərdəbilin bu dövrdə xeyli böyük və əhalisi çox olan bir şəhər olduğu nəticəsini çıxarmaq olur. İbn Kəsir Ərdəbildə baş vermiş iki zəlzələdə, 893-cü ildə 150 min və 901-ci ildə də təqribən 150 min, yəni cəmi 300 min insanın öldüyünü yazır[148]. Bu təbii fəlakətlər zamanı şəhər əhalisinin hamısının qırılmadığını nəzər alsaq IX-X əsrlərdə Ərdəbilin əhalisinin 300 mini ötdüyünü söyləyə bilərik.

Həmidullah Qəzvini Ərdəbilin soyuq iqlimə malik olduğunu, Savalan dağından axıb gələn çayın şəhəri su ilə təchiz etdiyini, bu suyun həzm üçün xeyli yararlı olması səbəbiylə ərdəbillilərin qarınqulu olduqlarını yazır. Müəllif həmçinin şafi'i məzhəbində olan şəhər əhalisinin şeyx Səfiyəddin Ərdəbiliyə dərin ehtiramla yanaşdıqlarını yazır[149]. Azərbaycana səyahət etmiş Şəmsəddin əl-Məqdisi (947-990) ərdəbillilərin başqa məzhəbdən olanlara qarşı dözümsüz, eyni zamanda məkrli və qafil insanlar olduğunu

---

142 QƏZVİNİ, *Nüzhətü'l-Qülub*, s. 85.
143 *Həmin əsər*, s. 83.
144 Bu haqda ətraflı məlumat üçün bax: NƏSİROV, *Raşidi Xəlifələr*...., s. 53.
145 ARTAMONOV, *İstoriya Xazar*, s. 213-214; BÜNYADOV, *Azərbaycan VII-IX Əsrlərdə*, s. 108, Bakı 1989.
146 *Hüdudü'l-Aləm*, s. 119-120. [أردبيل...كانت مستقر ملوك آذربيجان]
147 VƏLİXANLI, *həmin əsər*, s. 95.
148 İmadəddin İsmayıl ibn Ömər İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, (Trc. M. Keskin), C. XI, s. 130-131, 155-156, İstanbul 1994.
149 *Nüzhətü'l-Qülub*, s. 83-84.

yazır[150]. *Əcaibü'd-Dünya* müəllifi isə ərdəbillilərin səxavətli və əliaçıq insanlar olduğunu qeyd edir[151]. İbn Miskəveyh Ziyari hökmdarı Vəşmgirin (934-967) səkərdələrindən Ləşkərinin 938-ci ildə Ərdəbilə hücumunu təsvir edərkən cəsur, dözümlü və mətin insanlar olan ərdəbillilərin silahdan istitifadədə mahir olduqlarını və düşmənə əzmlə müqavimət göstərdilərini yazır[152]. Yaqut əl-Həməvi də Ərdəbilə səyahət etdiyini, onun bu şəhəri tərk etməsindən sonra moğolların Ərdəbilə hücum etdiklərini, şəhər əhalisinin igidliklə düşmənə müqavimət göstərdiklərin yazır. Müəllif qeyd edir ki, şəhər müdafiəçiləri iki dəfə moğolların hücumunu dəf etmiş və şəhərə soxulan düşməni geri oturtmuşdular. Üçüncü hücum vaxtı moğollar Ərdəbili zəbt edərək şəhər əhalisinin tamamına yaxınını qılıncdan keçirmişdilər. Belə ki, yalnız gizlənə bilənlər sağ qalmışdılar[153].

Həmidullah Qəzvini **Gəncə** şəhərinin təməlinin h. 39-cu (659) ildə qoyulduğunu qeyd etsə də bu məlumat digər mənbələrlə müqayisə edildikdə özünü doğrultmur[154]. M. Kalankatuklu Gəncənin Arran və Ərməniyyə valisi Muhəmməd ibn Xalid ibn Yəzid tərəfindən 846/7-ci ildə inşa edildiyini yazır[155]. *Şirvan və əl-Bab Tarixi*ndə isə Muhəmməd ibn Xalidin bu şəhəri h. 245-ci (859) ildə bina etdiyi bildirilir[156]. Ehtimal ki, Gəncə başlanqıcda hərbi məqsədlər üçün tikilmiş şəhərcik və ya düşərgə idi. Çünki onun inşa edildiyi dövr cənubi Qafqazda, daha dəqiq desək Gürcüstanda xilafət əleyhinə çıxışların baş verdiyi bir dövr idi. Xalid ibn Yəzid, onun oğlu Muhəmməd və Buğa əl-Kəbir kimi sərkərdələr bu qiyamları yatırmaq üçün Tiflis və onun ətrafında hərbi əməliyyatlar keçirmişdilər[157]. Bu səbəbdən də yaşayış məntəqəsi kimi uzun müddət əhəmiyyət kəsb etmədiyi üçün IX-X əsr coğrafiyaşünasları Gəncə haqqında təfsilatlı məlumat verməmişdirlər[158]. 944-cü ildə Bərdənin ruslar tərəfindən viran edilib xaraba qoyulmasından sonra Gəncə ön plana çıxmış və Azərbaycanın şimalındakı inzibati və

---

150 *Əhsənü't-Təqasim*, s. 186. [أهل مكروغفلة لا ينظرون في العواقب، ولا يعذرون أهل المذاهب]; həmçinin bax: VƏLİXANLI, *həmin əsər*, s. 95.
151 *Əcaibü'd-Dünya*, s. 179.
152 *Təcaribü'l-Üməm*, C. IV, s. 442.
153 *Mu'cəm*, C. I, s. 93.
154 *Nüzhətü'l-Qülub*, s. 93.
155 *Albaniya Tarixi*, s. 197-198.
156 Vladimir MİNORSKİY, *İstoriya Şirvana i Derbenta X-XI vekov*, (Trc. A. Əlizadə), s. 47, Moskva 1963.
157 Bu haqda ətraflı məlumat üçün bax: BÜNYADOV, *həmin əsər*, s. 193 və davamı.
158 BARTOLD, *Soçineniya*, C. III, s. 405.

iqtisadi mərkəzə çevrilməyə başlamışdı. Şəddadilərin paytaxt şəhərinə olduqdan sonra Gəncə daha da sürətlə inkişaf etmiş, təkcə Azərbaycanın deyil, regionun iri iqtisadi-ticari, həmçinin elm və mədəniyyət mərkəzinə çevrilmişdi. Bunu Gəncədə yetişmiş alimlərin təvəllüd və vəfat tarixlərinə diqqət yetirərək də görmək mümkündür. Gəncənin tanınmış elm xadimlərinin böyük əksəriyyəti XI-XIII əsrlərdə yaşamışdılar. Bu da onu göstərir ki, bu əsrlərdə Gəncə özünün ən parlaq dövrünü yaşamışdı. 1053-cü ildə Şəddadi hökmdarı I Əbü'l-Əsvar Şavur ibn Fəzl (1049-1067) Gəncənən ətrafında möhkəm qala divarları tikdirmiş, ona dəmir darvazalar qoydurub qalanın ətrafında dərin xəndək qazdırmışdı[159]. Beləcə Gəncə alınmaz qalaya çevrilmişdi. Gürcü çarlığının güclənməsi fonunda Gəncənin əhəmiyyəti daha da artmışdı. Çünki Gəncə artıq sadəcə Azərbaycanın deyil, bütün İslam dünyasının şimalının təhlükəsizliyinin təminatında mühüm rol oynayırdı. Azərbaycan Atabəylərinin hakimiyyəti dövründə Gəncə tez-tez gürcülərin hücumuna məruz qalırdı. H. 534-cü (1139) ildə baş vermiş güclü zəlzələ Gəncədə böyük dağıntı və insan tələfatına səbəb olmuşdu. İbnü'l-Əsir bu zəlzələ vaxtı Gəncədə 230 mindən çox insanın öldüyünü yazır[160]. Gəncənin düşdüyü ağır vəziyyətdən sui istifadə edən gürcü çarı Demetre şəhərə hücum edərək sağ qalan insanların bir qismini öldürüb bir qismini əsir aparmışdı. Onlar dağıntılar altında qızıl və gümüş axtararaq çoxlu qənimət ələ keçirmişidlər. Lakin ailəsi də bu zəlzələdə vəfat etmiş Böyük Səlcuqluların Arran canişini Qara Sunqur ordusu ilə yetişib Gəncə yaxınlığında gürcü ordusunu ağır məğlubiyyətə uğratmışdı. O, bununla da kifayətlənməyib arxa-arxaya Gürcüstana iki hərbi yürüş etmiş, bol qənimət və əsirlə geri qayıtmışdı. M. Qoş yazır ki, Qara Sunqur gürcüləri dəhşətə gətirib tir-tir əsməyə məcbur etdi[161]. Vali 2-3 il ərzində təbii fəlakətin bütün ziyanını aradan qaldırmış, Gəncə əvvəlki gözəlliyi ilə bərpa edilmişdi[162]. 1220-ci illərdə moğollar bir çox şəhər və ölkələri tutub dağıltıqları halda Gəncəyə hücum etməyə cəsarət etməmişdilər. İbnü'l-Əsir yazır ki: "moğollar Gəncə əhalisinin qəhrəmanlığını, gürcülərə qarşı apardıqları müharibələri eşitmiş, onların xarici hücumlara necə şiddətli müqavimət göstərdiklərini

---

[159] GÖYÜŞOV, *həmin əsər*, s. 141.
[160] *Kamil fi't-Tarix*, C. XI, s. 75-76. Mxitar Qoşa görə bu zəlzələ 30 sentyabr 1139-cu ildə şənbə günü baş vermişdi. *Alban Salnaməsi*, (Trc. Z. Bünyadov), s. 245, Bakı 1993.
[161] QOŞ, *həmin əsər*, s. 246; BÜNYADOV, *həmin əsər*, s. 188-189.
[162] *Yenə orada*.

öyrənmişdilər. Həqiqətən Gəncə son dərəcə möhkəm qala divarlarına sahib idi və buranı ələ keçirmək asan deyildi. Bunu bacarmayacaqlarını anlayan moğollar Gəncəyə xəbər göndərərək pul və paltar tələb etmişdilər. Gəncəlilərin onların istədiklərini verməlırində sonra moğollar oradan getmişdilər"[163]. Azərbaycan Atabəyləri Dövlətinin süqutundan (1225) ölkənin moğolların istilasına uğramasına (1239) qədərki dövrdə Gəncə Cəlaləddin Xarəzmşahın (öl.1231) hakimiyyəti altında olmuşdu.

Antik mənbələrdə adı Fraata kimi çəkilən **Marağa** orta əsrlərdən etibarən indiki adı ilə tanınmağa başlamışdı. Marağa [المَرَاغَةُ] ərəb dilində heyvanların ağnaşdıqları yer mənasını ifadə edir[164]. Güman ki, Əhməd əl-Bəlazurinin nəql etdiyi rəvayət də buna əsaslanır. Müəllif bu yerin əvvəllər Əfrahrud [افراهرود] adlandığını yazır. Azərbaycan və Ərməniyyə valisi Mərvan ibn Muhəmməd burada hərbi düşərgə salmış, orduya məxsus heyvanların ağnaşdığı yer olduğu üçün buranın adı Marağa olaraq qalmışdı[165]. Yaqut əl-Həməvi də eyni rəvayəti öz əsərində qeyd etmişdir[166]. X əsr səyyahı əl-İstəxri bu şəhəri bəyənmiş və onun həqiqətən gözəl şəhər olduğunu, orada bol məhsul yetişdiyini qeyd etmişdir[167]. *Əcaibü'd-Dünya* müəllifi (XIII əsr) Marağadakı Azər Quşəsp adlı atəşgahının məcusilərin ziyarətgahı olduğunu yazır. Çibanı olanlar mehrigan (novruz) günü oraya gedib küldən bir az götürüb bənövşə yağı ilə qarışdırıb yaralarına sürtürlərmiş[168]. İbn Xordadbeh Azər Quşəsp adlı od məbədinin Şiz şəhərində olduğunu yazmışdır[169]. Ehtimal ki, bu Şiz ilə Marağanın bir-birinə çox yaxın olması səbəbiylədir. Əbdürrəşid Bakuvi də Marağa haqqında məlumat verərkən "Orada qədimdən məcuslardan qalan mədrəsələrin (təlim yerləri-E.N) və başqa binaların xarabalıqları var" yazır[170]. Sözü gedən məbəd atəşpərəstlər üçün dinlə yanaşı siyasi əhəmiyyət də kəsb edirdi. Belə ki, taxta yeni oturan Sasani şahları paytaxt Mədaindən piyada gələrək bu məcusi məbədini ziyarət etmək məcburiyyətində idilər[171].

---

163 *Kamil fi't-Tarix*, C. XII, s. 337-339.
164 SARI, *Arapça-Türkçe Lugat*, s. 1429.
165 BƏLAZURİ, *Fütuhü'l-Büldan*, s. 461.
166 *Mu'cəmü'l-Büldan*, C. VI, s. 152. [فكانت دوابه و دواب أصحابه تتمرغ فيها]. Həmçinin bax: VƏLİXANLI, *həmin əsər*, s. 96.
167 *Məsalik*, s. 73.
168 *Əcaibü'd-Dünya*, s. 159.
169 *Məsalik*, s. 38. [والشيز وبها بيت نار أذَرجُشْنَس وهو عظيم القدر عند المجوس]
170 *Təlxisü'l-Asar*, s. 105.
171 Vasiliy BARTOLD, "Azerbaycan ve Ermenistan", (Trc. İ. Aka), **AÜTAD**, VIII/14, Ankara 1963, ss. 77-87.

Moğol hücumu vaxtı Marağa tamamilə dağıldılmış, əhalisi qılıcdan keçirilimişdi. Moğolların Marağaya ilk hücumu 30 mart 1221-ci ildə baş vermişdi. Şəhər xalqının inadla müqavimət göstərməsinə baxmayaraq moğollar Marağanı alıb dəhşətli qətliam törətmişdilər. Onlar aldıqları əsirləri "moğollar getdilər" deyə bağırmağa məcbur edərək gizlənənləri də ortaya çıxarmış və qətlə yetirmişdilər. Beləcə Marağa əhalisinin edmək olar ki, hamısı öldürülmüşdü. Moğollar daşıya bildikləri malları talan etmiş, apara bilmədiklərini isə oda vermişdilər[172].

Həmidullah Qəzvini Marağanın əvvələr Azərbaycanın paytaxtı olduğunu, indi (XIV əsr) isə öz yerini Təbrizə buraxdığını qeyd edir[173]. Müəllif həmçinin yazır: "Buranın əhalisi türk irqinə bənzər ağbənizdir. Əksəriyyəti hənəfi məzhəbinə mənsubdur. Onlar ərəb dili ilə qarışmış pəhləvi (azəri-E.N) dilində danışırlar"[174]. Həmidullah Qəzvini Marağa ətrafında dənli bitkilər, pambıq, üzüm və s. meyvələrin yetişdirildiyini, Marağa şəhəri və vilayətindən dövlət xəzinəsinə illik 255.500 dinar vergi daxil olduğunu yazır. Müəllif həmçinin Nəsrəddin Tusinin Hülagü xanın dəstəyi ilə Marağada inşa etdirdiyi rəsədxanadan da bəhs edir[175].

Yaqut əl-Həməvi qədim yunan coğrafiyaşünası Ptolomeyin (II əsr) **Mərənd** haqqında məlumat verərək bu şəhərin uzunluq və en dairələrini qeyd etdiyini bildirir. O, həmçinin yazır ki, Mərənd Azərbaycanın məşhur şəhərlərindəndir və Təbrizlə arasında iki günlük məsafə var[176]. İbn Xordadbeh Təbriz ilə Mərəndə arasında 10 fərsəx (56,85 km) məsafə olduğunu yazır[177]. Əhməd əl-Bəlazuri (IX əsr) Mərəndin kiçik bir kənd olduğunu, gəlmə yəmənli ərəblərdən Əbu Bəis əl-Əzdinin orada məskunlaşdığını, orada möhkəm divarları olan qala tikdirdiyini, bu yerlərdə ondan sonra oğlu Bəisin və onun oğlu Muhəmməd ibn Bəisin hakim olduqlarını qeyd edir[178]. Muhəmməd ibn Bəis həmçinin Təbriz və Şahi qalalarının da sahibi idi[179]. IX əsrin birinci yarısında xürrəmi üsyanı davam edərkən Muhəmməd ibn Bəis sahib olduğu qala və istehkamları Babəkə

---

[172] İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. XII, s. 332-333.
[173] Həmidullah Mustəvfi QƏZVİNİ, *Nüzhətü'l-Qülub*, (Trc. G. Le Strange), s. 78, London 1919.
[174] *Həmin əsər*, s. 88.
[175] *Yəni orada*.
[176] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. VI, s. 176.
[177] *Məsalikü'l-Məmalik*, s. 68.
[178] BƏLAZURİ, *Fütuhü'l-Büldan*, s. 462.
[179] Seyidağa ONULLAHİ, *XIII-XVII Əsrlərdə Təbriz Şəhəri*, s. 41, Bakı 1982.

təslim etmişdi. Lakin Abbasilərin xürrəmi üsyanını yatırmaqda əzmli olduğunu görüb müttəfiqi Babəkdən ayrılmış və yenidən xilafətin xidmətinə daxil olmuşdu[180]. XIII əsrin əvvəllərində Azərbaycanda olmuş Yaqut əl-Həməvi yazır ki, indi Mərəndin xarabalıqları qalıb və gürcülər Azərbaycana hücum etdikləri vaxt bu şəhərin əhalisini əsir apardıqları üçün indi orada heç kim yaşamır[181]. Belə məlum olur ki, Mərənd bu hücumdan sonra uzun müddət yarıdağılmış vəziyyətdə qalmışdır. Çünki Həmidullah Qəzvini (XIV əsr) Mərəndin böyük şəhər olduğunu, onun qala divarlarının uzunluğunun 8000 addım (6,43 km) olduğunu, lakin indi bu divarların sadəcə yarısının dağılmadan qaldığını yazır. O, həmçinin qeyd edir ki, Mərənd ətrafında 60 kənd var. Mərənd torpaqlarının məhsuldar olduğunu yazan müəllif qeyd edir ki, burada pambıq, üzüm, qaysı və heyva becərilir. Kəndləri ilə birlikdə Mərəndin Elxanilərin xəzinəsinə verdiyi illik verginin miqdarı 24 min dinar olmuşdu[182].

**Miyanə** şəhərində, irəlidə görəcəyimiz kimi, bir çox azərbaycanlı alim yetişmişdir. Bu şəxslər "Miyanəci" nisbəsi ilə tanındıqları üçün, bir çox hallarda, yanlışlıqla şəhərin adı "Miyanəc" kimi qeyd olunmuşdur. Halbuki şəhərin adı Miyanədir. İstər ərəb, istərsə də fars dillərində nisbə tərtib olunarkən dilin qrammatik xüsusiyyətlərinə diqqət yetirilir. Məsələn Gəncə və Baku şəhərlərinin adları saitlə bitdiyi üçün sonuna "i" samiti əlavə olunmur. Əks təqdirdə Gəncəi və ya Bakui kimi əcaib forma meydana çıxa bilər. Araya "vav" [و] samiti əlavə olunaraq Gəncəvi, Bakuvi nisbələri meydana gətirilir. O cümlədən Miyanə sözü də saitlə bitdiyi və bu şəhərə aid edilən nisbə "Miyanəi" ola bilməyəcəyi üçün araya "cim" [ج] samiti əlavə olunaraq "Miyanəci" nisbəsi alınmışdır. Fəqət niyə "vav" deyil "cim" samiti? Düşünürük ki, bu Miyanə sözünün fasrca olması səbəbiylədir və farsca Miyanəgi [میانگی] nisbəsi ərəbcə yazıldığı zaman, bu dildə "g" səsi və hərfinin olmaması səbəbiylə, "c"ya dönmüşdür. Eynən "Azərbaygan" sözünün ərəbcə "Azərbaycan" yazılması kimi. Eyni mülahizəni "Xunəci" nisbəsinə də aid etmək olar. Xunə, yəni qədim azəricədə ev mənasını ifadə edən bu şəhərin adına nisbə tərtib edilərkən "Xunəgi", ərəbcə yazılışı ilə "Xunəci" formasını almışdır. Ümimiyyətlə şəhər adlarından nisbə tərtib edilərkən bəzən həmin şəhərin adının "tanınmaz" hala

---

[180] BÜNYADOV, *həmin əsər*, s. 235, 246.
[181] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. VI, s. 176.
[182] QƏZVİNİ, *Nüzhətü'l-Qülub*, s. 89.

düşdüyünü görürük. Məsələnə əslən İranın Rey şəhərindən olanların "Razi", Mərv şəhərindən olanların isə "Mərvəzi" nisbəsi ilə tanındıqları kimi.

Yaqut əl-Həməvi Miyanə şəhəri haqqında söz açarkən bu şəhərin adının farsca "ara" mənasını ifadə etdiyini, Təbriz ilə Marağa arasında yerləşdiyi üçün bu adla tanındığını, adı çəkilən bu üç şəhərin coğrafi mövqelərinə görə üçbucaq təşkil etdiyini qeyd edir[183]. Deyə bilərik ki, Yaqut əl-Həməvi burada bir qədər yanılıb. Çünki Miyanə Təbriz ilə Marağa arasında yerləşmir. Bu üç şəhər arasında qalan sahə isə həqiqətən üçbucağa bənzəyir. Ola bilsin ki, Miyanə Marağa ilə Ərdəbil[184] və ya Marağa ilə Xalxal arasında yerləşdiyi üçün bu adı almışdı. X əsr coğrafiyaşünasları əl-Məqdisi[185] və əl-İstəxrinin əsərlərində bu şəhərin adı çəkilir. əl-İstəxri Ərdəbildən Miyanəyə 20 fərsəx (113,7 km), Miyanədən Xunəyə 7 fərsəx (39,79 km) məsafə olduğunu yazır[186]. XIV əsr müəllifi Həmidullah Qəzvini isə Miyanənin bir vaxtlar əhəmiyyətil şəhər olduğunu, indi isə böyüklüyünə görə kəndi xatırlatdığını yazır[187]. Ehtimal ki, XIII əsrin əvvəllərində gürcülərin, xarəzmlilərin, sonra isə moğolların Azərbaycana etdikləri dağıdıcı yürüşlərin ağır nəticələri, bir çox şəhər kimi, Miyanədən də yan keçməmişdir.

Bəlazuri əsərində Sasani şahı Ənuşirvanın (I Xosrov) Bəsfürrəcan torpağında Nəşəva, yəni **Naxçıvan** şəhərini bina etdiyini yazır[188]. Həmidullah Qəzvini isə bu şəhərin təməlinin Sasanilərdən Bəhram Çubinin (590-591) qoyduğunu yazır[189]. Ümuniyyətlə orta əsr ərəbdilli mənbələrində Naxçıvan sözünün müxtəlif yazılışlarına rast gəlirik. Bəlazuri, İstəxri, İbn Xordadbeh kimi IX-X əsr müəlliflərinin əsərlərində şəhərin adı daha çox Nəşəva [نَشَوىٰ][190], bu diyarda yetişmiş tanınmış şəxsiyyətlərin isə Nəşəvi [نشوي] nisbəsi ilə tanındığını görürük. Onu da qeyd edək ki, klassik ərəb coğrafiyaşünaslarının əsərlərində şəhərin adı Naxçıvan kimi qeyd olunur, vilayət isə Bəsfürrəcan kimi tanınırdı. Sonrakı əsrlərdə isə Nəxcuvan [نخجوان], Nəqcuvan [نقجوان],

---

183 *Mu'cəmü'l-Büldan*, C. VI, 368. "Miyan" sözü pəhləvi dilində "orta, ara, iç" mənalarını ifadə edir. Bax: Mehmet KANAR, *Büyük Farsça-Türkçe Sözlük*, s. 631, İstanbul 1993.
; S. KLEVTSOVA, *Russko-Persidskiy Slovar*, s. 663, Tehran 1374.
184 BARTOLD, "Azerbaycan ve Ermenistan".
185 *Əhsənü't-Təqasim*, s. 190.
186 *Məsalikü'l-Məmalik*, s. 76.
187 *Nüzhətü'l-Qülub*, s. 88.
188 BƏLAZURİ, *Fütuhü'l-Büldan*, s. 274.
189 *Nüzhətü'l-Qülub*, s. 90.
190 İBN XORDADBEH, *Məsalik*, s. 82; İSTƏŞRİ, *Məsalik*, s. 76; BƏLAZURİ, *Fütuhü'l-Büldan*, s. 247.

Nəqşuvan [نقشوان] formasında da yazıldığının da şahidi oluruq. Belə fərqli yazılışların meydada çıxmasının əsas səbəbi fikrimizcə ərəb dilində "ç" səsinin və hərfinin olmaması, həmçinin şəhərin adının bir qədər uzun olmasıdır. Bu səbəbdən də ərəb müəlliflər şəhərin adını tələffüz etdikləri kimi, "Nəşəva" formasında qeyd etmişdilər.

Naxçıvan Həbib ibn Məsləmə əl-Fıhrinin (ا) başçılıq etdiyi xilafət ordusu tərəfindən döyüşsüz fəth olunaraq xilafətə birləşdirilmişdi. Həbib ibn Məsləmə ilə Naxçıvan ağsaqqalları arasında əhdnamə bağlanmışdı. Əhməd əl-Bəlazuri bu əhdnamənin, yuxarıda haqqında danışdığınız, Düveynlə bağlananla eyni şərtləri ehtiva etdiyini yazır[191]. Yaqut əl-Həməvi deyir: "Nəşəva...Azərbaycanda şəhərdir. Bəzilərinə görə isə Arranın Ərməniyyə ilə həmsərhəd olan şəhəridir. Xalq arasında Naxcuvan və ya Naqcuvan da deyirlər..."[192]. Əbdürrəşid Bakuvi yazır: "Naqcuvan...divarları və içqalası (əhmədək-E.N) olan Azərbaycanda gözəl şəhərdir. Şəhər düzənliyin ortasında yüksək yerdə bina olunub. Bu yerdən Araz çayı görünür. Bağlı-bostanlı, meşəli, meyvəli və çörəkli yerdir. Havası təmiz, suyu şirindir..."[193]. *Əcaibü'd-Dünya* müəllifi isə yazır: "Deyilənlərə görə Sən'ada (Yəmən-E.N) üzümün 70 çeşidi yetişir. Fəqət Naxçıvanda yetişən ləzzətli və zərərsiz üzüm kimisi heç yerdə yoxdur. Nə qədər yeyilsə də zərəri olmur"[194].

Naxçıvan orta əsrlərdə ən parlaq günlərini Azərbaycan Atabəyləri dövündə yaşamışdı. Eldənizli hökmdarları şəhərin abadlığı, iqtisadi, ictimai, elmi və mədəni tərəqqisi üçün böyük işlər görmüşdülər. Bu dövrdə Naxçıvanda bir sıra mühüm əhəmiyyətli binalar, o cümlədən elm ocaqları, mədrəsələr tikilib istifadəyə verilmişdi. Adak. Z. Bünyadov Naxçıvanın Eldənizlilər dövründəki həyatı barədə ətraflı tədqiqat aparmışdır[195]. Azərbaycanın bir sıra şəhərləri kimi Naxçıvan da moğol işğalı vaxtı çoxsaylı insan tələfatı ilə müşayət olunmuş ağır dağıntıya və tənəzzülə məruz qalmışdı. Lakin Həmidullah Qəzvinin verdiyi məlumatlardan moğol işğalının ardınca gələn Elxanilərin hakimiyyəti illərində Naxçıvanın, ətrafındakı Əcnan, Ordubad, Azad və Maku kimi yaşayış məntəqələri ilə birlikdə, dirçəldiyi və yenidən abadlaşdığı məlum olur. Müəllif

---

191 BƏLAZURİ, *Fütuhü'l-Büldan* s. 247. Ətraflı məlumat üçün bax: NƏSİROV, *Raşidi Xəlifələr*....s. 75-76.
192 YAQUT əl-HƏMƏVİ, *Mu'cəm*, C. VI, s. 421, 437.
193 Əbdürrəşid ibn Saleh əl-BAKUVİ, *Təlxisü'l-Asar və Əcaibü'l-Məlikü'l-Qəhhar*, (Trc. Z. Bünyadov), s. 132, Bakı 1992.
194 *Əcaibü'd-Dünya*, s. 101.
195 BÜNYADOV, *Azərbaycan Atabəyləri...*, s. 189-193.

Naxçıvan sözünü "Nəqşi-cahan", yəni aləmin naxışı kimi izah edir və bu yerin əhalisinin şafi'i məzhəbində olduqlarını qeyd edir[196]. H. Qəzvini Naxçıvandakı binaların böyük əksəriyyətinin bişmiş kərpicdən inşa ediliyini, Naxçıvan yaxınlığında Əlincə, Təğmar, Fəğan və Sürmari kimi möhkəm qalaların yerləşdiyini qeyd edir. Qəzvini həmçinin Azad qəsəbəsi sakinlərinin kobud və qəddar təbiətli olduqlarını yazır[197]. XIII əsrdə yaşamış tanınmış sufi şeyxi Əvhədəddin Kirmani də Naxçıvanda səfərdə ikən, şeyx olduğu bilinmədiyi üçün, bir neçə dəfə möhkəmcə döyülmüşdü. Onu döyənlər şeyx olduğunu biləndən sonra dərin peşmançılıq hiss etmiş və onun müridi olmuşdular[198]. *Əcaibü'd-Dünya* müəllifi isə XIII əsrdə Naxçıvan haqqında yazır: "Bu Azərbaycandakı böyük və rifah içindəki şəhərlərdən biridir. Hündürlükdə mövqe tutub və güclü istehkamlarla əhatə olunub. Naxçıvanda çoxlu saraylar, imarətlər və eyvanlar var. Şəhərin yaxınlığındakı qalada mədrəsə, məscid və minarə var. Qalanın içində həmçinin bulaq var. Buradakı bütün binalar bişmiş kərpic və kəcdən inşa edilmişdir. İmarətlərin çoxu üç və dörd mərtəbəlidir və qəsri xatırladırlar. Sünni və şafi'i məzhəbində olan Naxçıvan əhalisi yaraşıqlı və xoşxasiyyətli insanlardır. Onlar cəsur, İslam uğrunda vuruşan, sərrast ox atan, qonaqpərvər və nitq söyləməkdə mahirdirlər"[199].

Orta əsr ərəbdilli müəlliflərin əsərlərində rast gəlinməsə də XIV əsr müəllifi Həmidullah Qəzvini öz əsərində **Qarabağ** və onunla Azərbaycanın digər yaşayış məntəqələri arasındakı məsafələr haqqında məlumat verir[200]. Bu da onu göstərir ki, artıq XIII-XIV əsrlərdə Qarabağ adı coğrafi məkan kimi tarix və coğrafiya kitablarında qeyd olunmağa başlamışdı. V. Bartold moğol işğalından sonrakı dövrdən etibarən Arranın cənub hissəsinin türkcə Qarabağ adı ilə tanınmağa başladığını yazır[201]. Çar Rusiyasının işğalından sonrakı dövrlərdə Qarabağın tarixiylə bağlı əsərlər yazan azrbaycanlı müəlliflər coğrafi məkan kimi Qarabağın hüdudları haqqında məlumat vermişdirlər. Mirzə Camal Cavanşir yazır: "Qədim tarix kitablarının yazdığına görə

196 QƏZVİNİ, *Nüzhətü'l-Qülub*, s. 90-91.
197 *Yenə orada*.
198 Muhəmməd SİVASİ, *Mənaqibi-şeyx Əvhədəddini-Kirmani*, s. 132, Tehran 1369
199 *Əcaibü'd-Dünya*, s. 244.
200 *Nüzhətü'l-Qülub*, s. 173-174.
201 *Soçineniya*, C. III, s. 335.

Qarabağ vilayətinin sərhəddi belədir: cənub tərəfdən Xudafərin körpüsündən Sınıq körpüyə qədər-(sərhəd) Araz çayıdır. İnki Sınıq körpü Qazax, Şəmsəddin və Dəmirçi-Həsənli camaatı arasındadır və Rusiya dövləti məmurları onu rus istilahilə Krasnıy most, yəni Qızıl körpü (Qırmızı körpü-E.N) adlandırırlar. Şərq tərəfdən (sərhəd) Kür çayıdır ki, Cavad kəndindən Araz çayına qovuşaraq gedib Xəzər dənizinə tökülür. Şimal tərəfdən Qarabağın Yelizavetpolla (Gəncə-E.N) sərhəddi Kür çayına qədər-Goran çayıdır və Kür çayı çox yerdən keçib Araz çayına çatır. Qərb tərəfdən Kuşbək, Salvartı və Ərikli adlanan uca Qarabağ dağlarıdır"[202]. Mir Mehdi Xəzani, Rzaqulu bəy Mirzə Camal oğlu kimi müəlliflər də Qarabağın hüdudlarını yuxarıda göstərildiyi kimi qeyd etmişdirlər[203]. Göründüyü kimi Qarabağın şərq və cənub sərhədləri qədim Arranın sərhədləri ilə demək olar ki, eynidir. Yəni Kür və Araz çayları həm orta əsrlərdə Arranın, həm də yaxın çağda Qarabağın təbii hüdudu olmuşdular. Lakin şimal və qərb sərhədlərində bir qədər dəyişiklik var. Bəylərbəyi Ziyadoğlunun 1736-cı ildə Nadirqulu xanın Muğanda şah elan edilməsinə qarşı çıxması səbəbilə Nadir şah (1736-1747) Borçalı mahalını Gəncə bəylərbəyliyindən alıb gürcü Kartli-Kaxeti çarlığına peşkəş etmişdi. Bundan sonra da Arranın Xrami çayından şimalda qalan torpaqları Gürcüstan ərazisi kimi tanınmağa başlamışdı. Bir vaxtlar Araz çayının mənbəyinə qədər uzanan Arranın qərb sərhədləri isə təqribən indiki Azərbaycan-Ermənistan sərhəddini təşkil edən dağ silsilələrinə qədər geriləmişdi. Buradan belə nəticə çıxara bilərik ki, Arranda müsəlman əhalinin sıx yaşadığı hissə Qarabağ adı ilə tanınmağa başamışdı. Xristian əhalinin daha sıx yaşadığı qərbi Arran torpaqları isə Qarabağa aid edilməmişdir. Keçən əsrlər ərzində qriqoryanlaşdırma və erməniləşdirmə prosesi sayəsində Arranın xristian əhalisi erməniləşməyə məruz qalmışdı. XIX əsrin ilk rübündə cənubi Qafqazı işğalı etdikdən sonra Rusiya İran və Osmanlı dövlətləri ərazisindəki erməniləri kütləvi şəkildə Azərbaycanın şimal-qərb bölgələrinə, İrəvan, Naxçıvan və Qarabağa köçürmüşdü. Məqsəd İran və Osmanlı sərhədlərində Rusiya imperyasının etimad göstərdiyi xristian əhalinin sayca çoxluğunu təmin etmək idi. Türkmənçay müqaviləsinin (10 fevral 1928) bağlandığı il sadəcə may ayında 8000 erməni ailəsi qərbi

---

[202] MÜŞTƏRƏK, *Qarabağnamələr*, C. I, s. 107-108, Bakı 1989.
[203] MÜŞTƏRƏK, *Qarabağnamələr*, C. II, s. 98-99, 205-206, Bakı 1991.

Azərbaycana köçürülmüşdü[204]. Rus işğalının ilk 7 ilində köçürmə siyasəti nəticəsində ermənilərin qərbi Azərbaycandakı sayı 57,226 nəfərə çatdırılmışdı[205]. Buna baxmayaraq qərbi Arranda müsəlman türklər hər zaman əhalinin böyük əksəriyyətini təşkil etmişdilər. XIX əsrin birinci yarısında cəmi 11,463 əhalisi olan İrəvanın Şaqar, Təpəbaşı və Dəmirbulaq səmtlərində 7,331 müsəlman türk, 2,369 yerli erməni, 1,715 İrandan köçürülmüş erməni, 45 Anadoludan köçürülmşü erməni, 3 nəfər isə qeyri millətin nümayəndəsi yaşayırdı[206]. Sonrakı dövrlərdə şərqi Arranın dağlıq hissəsi dağlıq Qarabağ, düzənlik hissəsi isə aran Qarabağ adı ilə tanınmağa başlamışdı.

Haqqında IX-X əsr müəlliflərinin məlumat verdikləri **Səlmas** Azərbaycanın qərbində, Anadolu torpaqları ilə səmsərhəd ərazidə yerləşir. Səlmas, Xoy ilə birlikdə, Azərbaycanda İslamın ilk qəbul edildiyi şəhərdir. 639-cu ildə Van gölü ətrafındakı Ərməniyyə torpaqlarının fəth edən İyaz ibn Ğənəm (ʳ) bir müddət sonra Xoy və Səlmas şəhərlərini də ələ keçirmişdi. əl-Vaqidi (747-823) yazır ki, az bir qismi istisna olmaqla Xoy və Səlmas əhalisi İslamı qəbul etmiş və bu dini öyrənmək üçün müsəlmanlardan müəllimlər istəmişdilər[207]. IX-X əsr coğrafiyaşünas və səyyahları Səlmas haqqında, ətraflı olmasa da, məlumat verirlər. Görünür bu dövrdə Səlmas elə də böyük olmayan, ölkənin siyasi, iqtisadi və mədəni həyatında mühüm rol oynamayan şəhər idi. XIII əsr müəllifi Yaqut əl-Həməvi isə Səlmasın moğol işğalçıları tərəfindən demək olar ki, tamamilə dağıldıldığını bildirir[208]. Həmidullah Qəzvininin verdiyi məlumatlardan Elxanilərin hakimilyəti illərində Səlmasın dirçələrək abadlaşdığını öyrənirik. Müəllif şəhərin dağılmış qala divarlarının Elxanilərin vəziri Tacəddin Əlişah Təbrizi tərəfindən bərpa edildiyini və Səlmasın qala divarlarının uzunluğunun 8000 addım (6,43 km) olduğunu yazır. O, Səlmas əhalisinin qatı dindar sünni olduqlarını yazır[209]. Müəllif həmçinin səlmaslılarla qonşuluqda yaşayan kürdlər arasında uzun zamandan bəri davam edən düşmənçilik və müharibənin olduğunu qeyd edir. Düşmənçiliyin nəsldən

---

[204] Sergey QLİNKA, *Opisaniye Pereseleniya Armyan Azerbaydjanskix v Predelı Rossii*, s. 92, Moskva 1831.

[205] İvan ŞOPEN, *İstoriçeskiy Pamyatnik Sostoyaniya Armyanskoy Oblasti v Epoxu Yeyo Prisoyedineniya k Rossiyskoy İmperii*, s. 539-540, St.Peterburq 1852.

[206] ŞOPEN, *həmin əsər*, s. 543-546.

[207] Əbu Abdullah Muhəmməd ibn Ömər əl-VAQİDİ, *Fütuhü'ş-Şam*, (Nşr. Ə. Əbdürrəhman), C. II, s. 169, Beyrut 1997. [وبعث عياض الى خوى و سلماس وما يعلي تلك الأرض فأسلم أهلها إلا القليل وبعث من المسلمين رجالاً يعلّمونهم]. Bu haqda daha ətraflı məlumat üçün bax: NƏSİROV, *Raşidi Xəlifələr...*, s. 51-52.

[208] *Mu'cəmü'l-Büldan*, C. V, s. 234.

[209] QƏZVİNİ, *Nüzhətü'l-Qülub*, s. 87.

nəslə ötürülməsi səbəbiylə bu iki icmanı barışdırmaq mümkün olmamışdır[210]. H. Qəzvini Səlması taxılı və meyvə-tərəvəzi bol olan yer kimi təsvir etmişdir[211]. Ə. Bakuvi də Səlmasın bol taxılı və balı olduğunu yazır[212].

**Sərab** şəhərinin adının mənbələrdə daha çox "Sərav" və ya "Sərəv" kimi yazıldığının şahidi oluruq. Yaqut əl-Həməvi öz əsərində bu şəhərin Ərdəbil mahalında olduğunu qeyd edir. Müəllif Sərabın Təbrizlə Ərdəbil arasında yerləşdiyini, Ərdəbildən Səraba üç günlük yol olduğunu bildirir[213]. Səm'ani də öz əsərində "Sərəv" adlı yaşayış məntəqəsinin iki ayrı yerdə mövcud olduğunu qeyd edir. Müəllif bunlardan birinin İranın Mazəndaran vilayətində, digəri isə Azərbaycanın Ərdəbil vilayətində olduğunu yazır və bu şəhərdə bir çox mühəddisin yetişdiyini bildirir[214]. 1221-ci ilin yay aylarında moğolların hücumuna uğrayan Sərab ağır dağıntı və insan tələfatına məruz qalmışdı[215]. Elxanilərin hakimiyyəti dövründə isə Sərab orta böyüklükdə şəhər idi. Sərab ətrafında 100-ə yaxın kənd var idi. Bu torpaqlarda yüksək keyfiyyətli taxıl yetişirdi[216].

Kiçik bir qəsəbə olan **Sücas** haqqında mənbələrdə çox az məlumat var. Yaqut əl-Həməvi bu qəsəbənin Azərbaycanın şəhərlərindən biri olduğunu və Həmədanla Əbhər arasında yerləşdiyini yazır[217]. Bu kiçik şəhərdən bir çox məşhur alim və ədib, o cümlədən tanınmış sufi şeyxi Rüknəddin Sücasi (öl. 1211) çıxmışdı.

Sücas kimi **Sührəvərd** də mənbələrdə adına az rast gəlinən, lakin yetişdirdiyi mümtaz şəxsiyyətlərlə məşhur olmuş kiçik bir şəhər idi. Sührəvərd Zəncan ətrafında yerləşən qəsəbələrdən biri idi. əl-İstəxri Sührəvərdin Azərbaycanın sərhədyanı qəsəbələrindən biri və Zəncandan 3 fərsəx (17 km) aralı olduğunu yazır[218]. Həmçinin Zəkəriyya Qəzvini, İbnü'l-Əsir və Yaqut əl-Həməvi də Sührəvərdin Zəncan yaxınlığında yerləşdiyini qeyd edirlər[219].

---

[210] *Yenə orada.*
[211] *Yenə orada.*
[212] BAKUVİ, *Təlxisü'l-Asar*, s. 96.
[213] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. IV, s. 66-67.
[214] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 381.
[215] İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. XII, s. 338.
[216] QƏZVİNİ, *Nüzhətü'l-Qülub*, s. 87-88.
[217] *Mu'cəmü'l-Büldan*, C. IV, s. 49.
[218] *Məsalikü'l-Məmalik*, s. 77, 79.
[219] Zəkəriyya Muhəmməd əl-QƏZVİNİ, *Asarü'l-Bilad və Əxbarü'l-İbad*, (Nşr. S.M.Şahmuradi), s. 380, Tehran 1373.; İBNü'l-ƏSİR, *Lübab*, C. II, s. 157; YAQUT əl-HƏMƏVİ, *Mu'cəm*, C. IV, s. 167.

Bu gün artıq Azərbaycanda inzibati ərazi vahidi olan **Şabran** şəhəri haqqında mənbələrin xülasəsinə keçməmişdən əvvəl bu oykonimin etimoloji izahına çalışaq. Məlum olduğu kimi bu məsələ hətta Azərbaycan parlamentində də gündəmə gətirilmiş, lakin qənaətbəxş bir izah ortaya qoyulmamışdı. Bu coğrafi adın fars mənşəli olduğu söylənir, lakin hansı mənanı ifadə etdiyi dilə gətirilmirdi. Şabran adını "şəb" və "ran", güya gecə və məkan sözlərinin birləşməsindən törəyib "gecələmə yeri" kimi əlaqəsiz bir izahla məsələnin üzərindən ötmyə çalışanlar da olmuşdur. Üstəlik bunu edən şəxs farsca "şəb"in qaranlıq mənasını ifadə etdiyini də qeyd etmişdir. Bu elmi işçinin fars dilindən xəbəri olmadığı açıq-aşkar görünür. Belə olmasaydı məqaləsinin adını "Qaranlıq Məkan" qoymazdı. Farsca "şəb" gecə deməkdir, qaranlıq isə [تاريك] "tarik"dir. Bundan başqa şəhərin adı mənbələrdə "Şəbran" deyil, "Şabran" kimi yazılır. Həmçinin "ran" sözü farscada məkan deyil, qıç, bud mənasını, jarqonda isə burada yaza bilməycəyimiz başqa bir mənanı da ifadə edir. Belə mülahizələr yürütmədən əvvəl heç olmasa açıb lüğətə baxmaq lazımdır.

Elə isə nə deməkdir Şabran? Məlum olduğu kimi Azərbaycan və Arran şah I Şapurun (241-272) hakimiyyəti dövründə işğal edilərək Sasani imperiyasının tərkibinə qatılmışdır[220]. Ümumiyyətlə Sasani imperiyasının ərazisi adı çəkilən şahın dövründə işğallar hesabına xeyli genişləndirilmişdir. Bu səbəbdən də şah I Şapurun adı ilə bir sıra toponimlərin bağlı olduğu görünür. Məsələn Əfqanıstandakı Şebergan (Şapurgan), İrandakı Cündşapur, Nişapur kimi toponimlər bu hökmdarın adı ilə bağlıdır. Ərəb dilində "p" səsi olmadığı üçün ərəbdilli mənbələrdə Nişapurun-Nişabur, Cündşapurun-Cündşabur kimi yazıldığının şahidi oluruq. O cümlədən Şabran, daha dəqiq desək Şaburan [شابوران] da farsca Şapuranın [شاپوران] ərəbcələşmiş formasından başqa bir şey deyil. Erməni salnaməçisi Kirakosun əsərində bu şəhərin adı məhz "Şaporan" kimi qeyd olunmuşdur[221]. "Şapur" sözünün sonuna cəm şəkilçisi "an" əlavə edilməklə "Şapurlar" sözü düzəlmişdir. Lakin ola bilsin ki, buradakı "Şapur" şah I Şapurun adı ilə bağlı olmasın. Çünki Şapur sözünün özü də "şah" (hökmdar) və "pur" (oğul) sözlərinin birləşməsindən meydana gəlib. Belədə şəhərin adı "şah oğulları"

---

[220] MÜŞTƏRƏK, *Azərbaycan Tarixi*, s. 173.
[221] QANZAKETSİ, *İstoriya Armenii*, 135.

mənasını ifadə edəcəkdir. Lakin bəzi mənbələrdə bu şəhərin adının Şavuran kimi yazıldığını da görürük. Şavur isə Şapurun deformasiyaya uğramış şəklidir. Məlum olduğu kimi tarixdə Şavur adlı tanınmış şəxslər də olmuşdur, məsələn Şəddadi əmiri Əbü'l-Əsvar I Şavur (1049-1067) kimi. Bu səbəbdən də şəhərin adının I Şapurla bağlı olması daha ağılabatandır.

əl-Bəlazuri (IX-X əsrlər) Şabran və Masqut şəhərlərinin Sasani şahı Ənuşirvan tərəfindən bina edildiyini yazır[222]. İbn Xordadbeh (X) də eyni məlumatı verir[223]. Məqdisi (X əsr) isə Şabranın möhkəm qala divarlarına malik olmayan, xristianların üstünlük təşkil etdiyi şəhər olduğunu qeyd etmişdir[224]. Düşünürük ki, Məqdisi bir qədər yanılmışdır. Şabranda nə vaxtsa xristianların üstünlük təşkil etməsini söyləmək çətindir. Belə ki, şəhərin əhalisi farsdilli və İslamdan əvvəl atəşpərəst olduqları üçün xristian əhalinin burada çoxluq təşkil etməsi mümkün deyil. Şabran haqqında ən geniş məlumatı vermiş Övliya Çələbinin qeydlərində buna işarə ola biləcək bir kəlmə belə yoxdur. Bir zamanlar hakim din olsaydı xristianlıq bir neçə əsrdə izsiz-soraqsız bu şəhərdən yox ola bilməzdi. əl-İdrisi (1100-1165) də Arranın şəhərlərini sadalayarkən bunların arasından Şabranın da adını çəkir[225]. əl-İstəxri (X əsr) də Şabranın Arrandakı şəhərlərdən biri olduğunu bildirir. O, həmçinin Şabranın dəniz sahilində kiçik qala divarları ilə əhatə olunmuş şəhər olduğunu, bu şəhərin bir çox nahiyəsinin, yaxınlıqdakı dağların isə məhsuldar torpaqlara sahib olduğunu yazır[226]. Yaqut əl-Həməvi (XIII əsr) də Şabranın Ənuşirvan tərəfindən inşa edildiyini, Dərbəndlə Şabran arasında 20 fərsəx (113,7 km) məsafə olduğunu yazır[227]. Müasir ölçmə texnologiyaları isə Dərbəndlə Şabran xarabalıqları arasında cəmi 100 km, yəni 17,5 fərsəx olduğunu göstərir. Şəmsəddin Diməşqdi də Şabranın Xəzər dənizi sahilində yerləşən və təməli Ənuşirvan tərəfindən qoyulmuş şəhər olduğunu bildirir[228]. Həmidullah Qəzvini Şabranın şah Ənuşirvan tərəfindən bina edildiyini, bu yerin isti və suyunun həzm üçün

---

[222] *Fütuhü'l-Büldan*, C. I, s. 205. [أنو شروان كسرى بن قباذ فبنى الشابران ومدينة مسقط]. Masqutun indiki Xaçmaz rayonu ərazisindəki Müşkür olduğu güman edilir.
[223] *Məsalikü'l-Məmalik*, s. 90. [وكان أنوشروان بن قباذ لما ملك بني مدينة الشابران ومدينة مسقط]
[224] *Əhsənü't-Təqasim*, s. 185. [شابران: بلا حصن الغلبة فيها للنصارى رأس حد]
[225] Şərif Əbü'l-Həsən Muhəmməd əl-İDRİSİ, *Nüzhətü'l-Müştaq fi İxtiraqi'l-Afaq*, s. 34-35, Riyad 1989.
[226] İSTƏXRİ, *Məsalikü'l-Məmalik*, s. 67.
[227] *Mu'cəmü'l-Büldan*, C. IV, s. 182.
[228] DİMƏŞQİ, *Nüzhətü'd-Dehr*, s. 189.

zərərli olduğunu yazır[229]. Övliya Çələbi isə aşağıda qeyd edəcəyimiz kimi bunun tam əksini yazır. H. Qəzvini həmçinin qeyd edir ki, Şabranda keyfiyyətli taxıl və digər dənli bitkilər yetişir[230]. *Hüdudü'l-Aləm* müəllifi bu şəhərin adını Şavuran [شاوران] kimi qeyd edərək burada əldə edilən məhəng daşının ixrac olunduğunu yazır[231]. Bu əsərin naməlum müəllifi həmçinin qeyd edir ki, Şabran, Dərbənd və Bakı Xursan [خرسان] vilayətinin şəhərləridir[232]. Əbdürrəşid Bakuvi və Sadiq İsfəhani Şabranın Babü'l-Əbvab (Dərbənd) nahiyəsində şəhər olduğunu və çahi-Bijənin də burada olduğunu bildirirlər[233]. Çahi-Bijən, yəni Bijənin quyusu Firdovsinin "Şahnamə"sində də qeyd olunan qədim İran əsatirindəki bir istilahdır. Bu əsatirə görə İran şahı Keyxosrov Turan məmləkətinə sərkərdə Bijəni ordu ilə göndərmiş, Bijən Turan hökmdarı Əfrasiyabın (Alp Ər Tunqa) qızı Mənijəni görüb ona aşiq olmuşdu. Bu səbəbdən də Əfrasiyabın qəzəbinə tuş gəlmiş və bir quyuya atılaraq 7 il orada qalmışdı. Nəhayət Rüstəmi-Zal gəlib onu bu quyudan xilas etmişdi. Böyük ehtimalla bu iki müəllif yanılmışdılar. Bijən quyusu adı ilə məşhur olan zindan Şabranda deyil, Uyğurstandakı Qaraqorum şəhərində idi.

Daha əvvəl yazdığımız kimi Şabran haqqında ən geniş məlumat verən mənbə Övliya Çələbinin (1611-1672) "Səyahətnamə"sidir. Müəllif yazır: "Əvsafi-Şaburan: Şirvan vilayəti hökmündə müzəyyən (bəzədilmiş, gözəl-E.N) bir şəhərdir. Lakin Dəmirqapı vilayətinə aid edilir. Qədim zamanlarda İsfəndiyar şah tərəfindən bina edilmişdir. Sonra Hülagü moğolu gəlib şəhəri yerlə yeksan edib, əhalisini qırıb evlərini yıxmışdır. Sonra şəhər yenidən bərpa edilmişdi. Nəhayət sultan III Muradın (1574-1595) vəziri Özdəmiroğlu Osman paşa Dərbəndi fəth edərkən Şaburan əhalisi də ona itaət etmiş və bu şəhər sancaqbəyliyi məzkəzi olmuşdu....Havasına və suyuna görə Təbrizdən sonra İranda mədh olunan şəhər budur. Şabran şəhəri yetmiş məhəllədən ibarətdir və orada yetmiş mehrab (məscid) var. Məşhur cameləri (cümə məscidləri) bunlardır: Toxmaq xan came, Əfşar xan came və Uzun Həsən came. Uzun Həsən camenin misli bərabəri heç

---

229 QƏZVİNİ, *Nüzhətü'l-Qülub*, s. 93-94.
230 *Yenə orada*
231 ANONİM, *Hüdudü'l-Aləm*, s. 123.
232 *Yenə orada.* Sözü gedən Xursan vilayəti Xorasanın deformasiyaya uğramış forması ola bilər. Çünki Dağıstanın cənubundakı Təbərsəran (indiki adı ilə Tabasaran) vilayəti Təbəristanın təhrifə uğramış formasıdır. Bu haqda A. Bakıxanov da yazmışdır. Bax: *Gülistani-İrəm*, s. 24.
233 BAKUVİ, *Təlxisü'l-Asar*, s. 125; İSFƏHANİ, *Geographical Works*, s. 108.

yerdə yoxdur. Hətta Özdəmiroğlu Osman paşa hər cümə günü böyük bir dəstə ilə Dərbənddən gəlib burada ibadət edərmiş. Bu qədim ibadətgahın divarları buqələmun dərisi kimi rəngdən rəngə bürünür. Mərmərlərindəki oyma naxışlar isə hətta memarlıqda mahir olanları heyrətə salır. Şəhər Müskür vadisində məhsuldar bir məkanda mövcuddur. Şabranın 7 nahiyəsi var və hər biri bir səyyarənin (planet) adı ilə adlandırılmışdır"[234].

Bu gün xarabalıqları Şabran rayonunun Şahnəzərli kəndi yaxınlığında, Şabrançayın iki sahilində təqribən 40-50 hektardan çox sahəni əhatə edən qədim Şabranın[235] indiyə qədər cəmi 4,5 $km^2$ sahəsində arxeoloji qazıntılar aparılmışdır[236]. Şəhərin XVIII əsrə qədər intensiv yaşayış məskəni olduğu məlum olmuşdur[237]. Azərbaycanda IX əsrə aid edilən kanalizasiya sistemi ilk dəfə Şabranda açılmışdır. Şərqin ən böyük zərbxanalarından biri məzh Şabranda yerləşmişdi[238]. XIV-XV əsrlərdə bu zərbxanalarda mis və gümüş pullar zərb olunurdu[239].

Orta əsrlərdə Azərbaycanda **Firuzqubad** və ya Firuzabad adı ilə tanınan iki şəhər var idi. Bunlardan biri Azərbaycanın cənubunda Xalxal şəhərindən 1 fərsəx (5,68 km) aralıda, digəri isə Babü'l-Əbvab (Dərbənd) mahalında yerləşirdi[240]. Dərbənd yaxınlığındakı qala daha çox Firuzqubad kimi şöhrət tapmışdı. Vaxt ötdükcə "Firuzqubad" adı qısalaraq "Quba" formasını almışdı. İbn Xordadbehin (öl. 912) əsərində Firuzqubad şəhərinin adına rast gəlirik, müəllif şəhərin adını Ləkz vilayəti ilə yanaşı çəkir[241]. Həmidullah Qəzvini Firuzqubadı gözəl iqlimli, çoxlu gözəl yerləri olan məkan kimi təsvir etmişdi[242]. Yaqut əl-Həməvi Firuzqubad qalasını şah Ənuşirvanın tikdirdiyini və şəhərin onun atası Firuz oğlu I Qubadın (488-531) şəhərəfinə adlandırıldığını yazır[243]. Düşünürük ki, indiki Quba və **Qusar** rayonları ərazisində bir deyil, bir neçə qala və qəsr mövcud olmuşdur. Çünki "Qusar" adının da ərəbcə "qəsr"

---

[234] Mehmed Zılli ibn Dərviş ÖVLİYA ÇƏLƏBİ, *Səyahətnamə*, (Nşr. Ə. Cəvdət), C. II, s. 305, İstanbul 1314.
[235] GÖYÜŞOV, *həmin əsər*, s. 142.
[236] Tarix DOSTİYEV, "Orta Əsr Şabran Şəhərinin Arxeoloji Təqdimatının Bə'zi Nəticələri", **Azərbaycan Arxeologiyası**, C. I, S. 3-4, Bakı 1999, ss. 60-72.
[237] GÖYÜŞOV, *həmin əsər*, s. 142; DOSTİYEV, *həmin məqalə*.
[238] GÖYÜŞOV, *həmin əsər*, s. 142.
[239] DOSTİYEV, *həmin məqalə*.
[240] YAQUT əl-HƏMƏVİ, *Mu'cəm*, C. V, s. 286.
[241] İBN XORDADBEH, *Məsalikü'l-Məmalik*, s. 39.
[242] *Nüzhətü'l-Qülub*, s. 93.
[243] *Mu'cəm*, C. V, s. 286. Həmiçinin bax: MİNORSKİY, *İstoriya Şirvana i Derbenta X-XI vekov*, s. 214.

[قصر]sözünün cəm forması olan, qəsrlər mənasını ifadə edən "qisar" [قِصَار] sözündən törəmiş olması ehtimalı böyükdür. Qusar sözünün ən hündür, son hədd mənasındakı "qusarə"dən [قُصَارَى][244] meydana gəlmiş olması da mümkündür. Çünki regionda ən hündür relyefə malik yaşayış məntəqəsi Qusardır.

Bu gün Xaçmaz şəhərindən 14 km şərqdə, Xəzər dənizi sahilində yerləşən **Niyazabad** bir zamanlar Xəzər dənizinin qərb sahilindəki ən mühüm limanlardan biri idi. Azərbaycanın cənubundan başlayan ticarət yolu bu liman şəhərindən keçərək Dərbəndə çatırdı[245]. XVIII əsrin birinci yarısında rus səyyahları da Azərbaycana səyahət edərkən bu liman şəhərinə gəlmiş, gündəliklərində Niyazabadı ətraflı təsvir etmişdilər[246]. Türk səyyahı Övliya Çələbi (XVII əsr) bu şəhər haqqında təfsilatlı məlumat verir. Müəllif yazır: "Əvsafi-şəhri-Niyazabad: Şirvan hüdudundadır. Yəzdigərd şah tərəfindən bina edilmişdir. Qədim zamanlarda böyük şəhər imiş. Hələ də mövcud olan binaları bir vaxtların ehtişamından xəbər verir. Moğollar, sonra da dağıstanlı qumuq, qaytaq və.s tayfalar buraya hücum edib təxrib etmişdirlər. Sultan III Muradın böyük komandanı Qoca Fərhad paşa bu şəhərdə qışlamış, sonra ordusu ilə Şirvan tərəfə hərəkət etməmişdən əvvəl Niyazabad qalasını təmir etdirmişdi. Bura Dağıstanla Şirvan arasındadır. Şəhərdə qırx məhəllə və qırx minbər (məscid) var. Şəhərdə cümə camesi, karvansaray, hamam və bazar var. Niyazabad ayrıca sultanlıqdır, minə qədər nökəri (əsgəri-N.Ə), on iki hakimi var. Şəhərin kələntəri Niyazabadda 6000[247] bağ-bağçalı evin olduğunu deyir. Abad, gözəlləri çox, əkinə yararlı torpaqları bol olan yerdir. Lakin şəhərin ortasındakı qala divarları xarabadır. Belə məhsuldar, ab-havası lətif yerdə qalanın olması çox vacib ikən uçub dağılmışdır. Niyazabadda xacə Əhməd Yəsəvinin nəslindən olan Əfşar babanın türbəsi var. Əcəmlərin bu şəxsin təriqətinə inam və ehtiramları vardır. Belə ki, buradakı təkyədə yüzdən çox füqəra (dərviş-E.N) var. Təkyədə gələn gedənə yemək verilir. Bu şəhərin əhalisi hənəfi məzhəbindədir"[248].

---

[244] Bax: BARANOV, *Arabsko-Russkiy Slovar*, s. 641. Həmçinin bax: SARI, *Arapça-Türkçe Lugat*, s. 1233.
[245] Vaqif PİRİYEV, *Azərbaycanın Tarixi-Siyasi Coğrafiyası*, s. 33, Bakı 2006.
[246] Elçin QARAYEV, *Azərbaycan XVIII Əsr Rus və Qərbi Avropa Səyyahlarının Təsvirində*, s. 22-23, Bakı 2005.
[247] Əgər təqribən hər evdə 5 nəfərin yaşadığını nəzərə alsaq XVII əsrdə Niyazabadın 30 mindən çox əhalisi olan orta böyüklükdə bir şəhər olduğunu söyləyə bilərik.
[248] ÖVLİYA ÇƏLƏBİ, *Səyahətnamə*, C. II, s. 292-293.

Arxeoloji qazıntılar vaxtı aşkar edilən zəngin maddi mədəniyyət nümunələri göstərmişdir ki, **Şamaxı** şəhərinin yerində hələ antik dövrdən bəri yaşayış məskəni olmuşdur. VIII-XI əsrlərdə Şamaxı Yəzidiyyə adı ilə və Şirvanşahların inzibati mərkəzi kimi məşhur olmuşdu[249]. Abbasilərin Şirvan canişini Əbu Tahir Yəzid ibn Muhəmməd əş-Şeybani h. 306-cı (918) ildə Şirvan torpağında Yəzidiyyə şəhərini saldırmışdı[250]. Bu dövrdə Yəzidiyyə özünün sikkə zərbxanası ilə məşhur olmuş, eyni zamanda "darü'l-mülk", yəni paytaxt şəhəri kimi şöhrət tapmışdı. XII əsrdə Şamaxıda təxminən 100 minə yaxın əhali yaşamışdı[251]. Orta əsrlərdə Şamaxı yetişdirdiyi elm, mədəniyyət, dövlət xadimləri, sənətkarlarla yanaşı əhalisinin igidliyi və mərdiliyi ilə də məşhur olmuşdu. İbnü'l-Əsir 1221-ci ildə moğolların Şamaxıya hücumu təsvir edərkən yazır: "Moğollar dəvə, inək, keçi, qoyun və.s heyvan leşlərini, bunlarla birlikdə öldürdükləri insanların cəsədlərin üst-üstə yığıb müqavimət göstərən Şamaxı qalasının divarlarını aşmağa çalışmışdılar. Şəhər əhalisi bu döyüşlərdə ciddi müqavimət göstərmiş, üç gün şiddətli və qanlı döyüşlər getmişdi. Çətin vəziyyətə düşən şəhər müdafiəçiləri "istənilən halda bu işin axırında ölüm var və qılınc boynumuza dirənəcək, ən yaxşısı səbrlə düşmənə müqavimət göstərib şərəfimizlə ölək" deyərək moğollarla vuruşmağa davam etmişdilər. Nəhayət moğollar qılınc gücünə Şamaxını ələ keçirə bilmişdilər. Şamaxının işğalı ağır insan itkisi və talanla müşayət olunmuşdu[252].

Orta əsr mənbələrində **Şirvan** həm vilayət həm də şəhər adı kimi qeyd olunmuşdur. Coğrafi məkan olaraq Şirvan adı ilə daha çox Arranın Kür çayından şimalda qalan qismi nəzərdə tutulmuşdur. A. Bakıxanov Şirvan vilayətinin hüdudlarını təsvir edərkən yazır: "Şirvan vilayəti, şərq tərəfdən Xəzər dənizi ilə, cənub-qərbdən onu Muğan və Ermənistan (Arran-E.N) vilayətlərindən ayıran Kür çayı ilə, şimal-qərbdən Qanıq (Alazan) çayı ilə, İlisu nahiyəsindən keçən qeyri-müəyyən xətlə, Qafqaz sıradağları, Kürə və Təbərsəran nahiyələrini Qaziqumuq və Qaytaq məmləkətlərindən ayıran dağ silsiləsi ilə və oradan da, Dərvaq çayı yatağından onun Xəzər dənizinə qovuşduğu yerə

---

[249] GÖYÜŞOV, *həmin əsər*, s. 136-137.
[250] AŞURBƏYLİ, *həmin əsər*, s. 100.
[251] GÖYÜŞOV, *həmin əsər*, s. 137.
[252] İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. XII, s. 340.

qədər uzanan sahə ilə məhduddur"[253]. Bu vilayətin ayrı-ayrı şəhərlərindən yetişən alimlər, irəlidə görəcəyəmiz kimi, Şirvani nisbəsi ilə tanınmışdılar. Yuxarıda qeyd etdiyimiz kimi mənbələrdə Şirvan adı həm də şəhər adı kimi qeyd olunmuşdur. İstəxri, İbn Hövqəl, Zəkəriyyə Qəzvini və Məqdisi kimi orta əsr coğrafiyaşünasları öz əsərlərində Şirvan şəhərinin adını çəkirlər. Şəmsəddin əl-Məqdisi Bərdicdən Şamaxılya 2 mərhələ (90,96 km), Şamaxıdan Şirvan şəhərinə 3 mərhələ (136,44 km), Şirvandan Layicana 2 mərhələ, oradan da Samur çayı üzərindəki körpüyə 2 mərhələ məsafə olduğunu yazır[254]. Həmçinin İbn Hövqəl, əl-İdrisi və əl-İstəxri də eyni məlumatı verirlər[255]. Buradan Şirvan şəhərinin Şamaxıdan şimal-şərq istiqamətində, Şamaxı ilə Şabran arasında olduğunu təxmin etmək olar. Samur çayının 90 km cənubu tam qədim Gilgilçay səddinin olduğu yerə, indiki Siyəzən rayonu ərazisinə düşür. Ehtimal ki, orta əsr müəlliflərinin Layican dedikləri şəhər, güman edildiyi kimi indiki İsmayıllı rayonundakı Lahıc kəndi deyil[256], Gilgilçay səddi üzərində yaşayış məntəqəsi idi. *Hüdudü'l-Aləm* müəllifi də Şirvan, Xursan və Leyzanın (Layican) adını yanaşı çəkərək bunların ayrı-ayrı hökmdarlar tərəfindən idarə olunduğunu qeyd edir[257]. Məlum olduğu kimi Xursan vilayəti Şabran və ətraf ərazilərə verilən ad idi. Mənbədə adlarının birgə qeyd edilməsi bu üç ərazi vahidinin yanaşı olduqlarını söyləməyə əsas verir. Ən əsası isə İdrisi, İbn Hövqəl, İstəxri və Məqdisi kimi orta əsr coğrafiyaşünaslarının qeydlərinə istinadən deyə bilərik ki, Layicanın indiki Lahıc kəndi ilə heç bir əlaqəsi yoxdur. Ən azından ona görə ki, Şamaxıdan Samur körpüsünə getmək üçün şimal-qərb deyil, şimal-şərq istiqamətinə getmək lazımdır. Lahıc kəndinin mövcud olduğu İsmayıllı rayonu isə Şamaxının şimal-qərbindədir. Belə olan halda Gilgilçay səddi üzərindəki Layicanın 90 km cənubu da Bakı şəhəri civarına təsadüf edir. Karvan yollarının, zərurət olmadığı müddətcə, çətin keçilən dağlıq ərazilərdən deyil düzənlik yerlərdən keçdiyini nəzərə alaraq Samur körpüsündən Şamaxıya ancaq Xəzər sahili yolla gedildiyini deyə bilərik. Belə olan halda Samur körpüsünün 4 mərhələ (182 km)

---

253 *Gülüstani-İrəm*, s. 13

254 *Əhsənü't-Təqasim*, s. 188. [من برديج إلى الشماخية مرحلتين ثم إلى شروان 3 مراحل ثم إلى لايخان مرحلتين ثم إلى جسر سمور مرحلتين]

255 İBN HÖVQƏL, Surətü'l-Ərz, s. 238; İDRİSİ, *Nüzhətü'l-Müştaq*, s. 35; İbrahim ibn Muhəmməd İSTƏXRİ, *Məsalikü'l-Məmalik*, s. 76, Leiden 1927.

256 Orta əsr mənbələrindəki Lahicanın (və ya Leyzanın) indiki Lahıc kəndi ilə əlaqələndirilməsi barədə bax: MİNORSKİY, *həmin əsər*, s. 33; AŞURBƏYLİ, *həmin əsər*, s. 98.

257 *Hüdudü'l-Aləm*, s. 123.

cənubu, artıq qeyd etdiyimiz kimi, Bakı şəhəri civarına təsadüf edir. Məqdisinin əsərində həm Bakı, həm də Şirvan şəhərlərinin adını çəkməsi[258] bunların eyni şəhər olmadığını deməyə əsas verir. Güman ki, Şirvan şəhəri Bakı yaxınlığında mövcud olmuşdur.

*Asarü'l-Bilad* müəllifi şah I Xosov Ənuşirvanın bu məmləkəti tikib abadlaşdırdığı üçün onun adı ilə, Şirvan adlandırıldığını qeyd etmişdir[259]. Əbdürrəşid Bakuvi yazır: "Onu (Şirvanı-E.N) Əbuşirəvan abadlaşdırıb və nahiyə onun adını daşıyır"[260]. A. Bakıxanov da Şirvanı Sasani şahı I Xosrov Ənuşirvanın bina etdiyini, bu səbəbdən şəhərin onun adı ilə tanındığını qeyd edir[261]. Müəllif həmçinin yazır: "Bəziləri deyirlər ki, Şirvanın əsli Şirvand, yəni şir olan yer olub, sonra Şirvan olmuşdur"[262]. V. Minorskiy də bənzər bir ehtimalı dilə gətirmişdi[263]. S. Aşurbəyli də V. Minorskinin bu fikrini daha ağılabatan hesab etmiş, hətta Şirvanın "süd ölkəsi" mənasını ifadə edə bilmə ehtimalını da qeyd etmişdir[264]. Bunları əlbəttə ki, bir ehtimal olaraq irəli sürmək mümkündür. Lakin unutmamaq lazımdır ki, farscada yerinə görə həm süd, həm də aslan mənasını ifadə edən "şir" [شير] sözü "Şirvan"ın [شروان] birinci hecası ilə tamam fərqli yazılır. Yəni "Şirvan"ı şir və ya süd ölkəsi kimi mənalarla əlaqələndirmək üçün [شيروان] kimi yazmaq lazımdır. Belədə vurğu ikinci deyil, birinci hecaya düşəcəkdir. Halbuki orta əsr mənbələrinin demək olar ki, heç birində Şirvan sözünün bu cür yazılışına rast gəlinmir. Demək ki, V. Minorskinin ehtimalı heç də ağılabatan deyil. Ənuşirvan [أنوشروان] sözü isə bütün orta əsr ərəb və farsdilli mənbələrdə tam Şirvana uyğun formada yazılır.

Xilafət ordularının Azərbaycana ilk yürüşləri zamanı kiçik bir kənd olan **Təbriz** sonrakı əsrlərdə Azərbaycanın iri şəhərlərindən birinə çevrilmişdi. Abbasilər dövründə Azərbaycana köçürülüb məskunlaşdırılmış ərəb əl-Əzd qəbiləsinə mənsub Rəvvad ibnü'l-Müsənna əl-Əzdi xəlifə Əbu Cə'fər Mənsur (754-775) tərəfindən Təbrizdən Bəzzə qədər olan əraziyə hakim təyin edilmişdi. Rəvvadın oğlu Vəcna kiçik yaşayış məntəqəsi olan Təbrizdə müxtəlif binalar və şəhərin ətrafında istehkamlar tikdirmişdi. Onun

---

258 *Əhsənü't-Təqasim*, s. 28, 185.
259 QƏZVİNİ, *Asarü'l-Bilad*, s. 588.
260 BAKUVİ, *Təlxisü'l-Asar*, s. 125.
261 *Gülüstani-İrəm*, s. 13.
262 *Yenə orada.*
263 MİNORSKİY, *həmin əsər*, s. 34.
264 AŞURBƏYLİ, *həmin əsər*, s. 18.

nəslindən olan Ə'la ibn Əhməd ər-Rəvvadi əl-Əzdi isə Təbriz ətrafında möhkəm qala divarları inşa etdirmişdi. IX əsrin birinci yarısında xürrəmi üsyanı vaxtı Muhəmməd ibn Bəis əl-Əzdi sahib olduğu qala və istehkamları, o cümlədən Təbriz və Şahi qalalarını, Babəkə təslim etmişdi[265]. Xilafətin xürrəmi üsyanını yatırmaqda əzmli olduğunu görən Muhəmməd ibn Bəis 837-ci ildə Babəkin bir qrup silahdaşını təşkil etdiyi ziyafətdə yaxalayıb Bağdada göndərmişdi[266]. Bu hadisədən sonra xürrəmilər ardıcıl olaraq məğlubiyyətə uğramışdılar[267]. 859-cu ildə baş verən şiddətli zəlzələ Təbrizi xarabalığa çevirmişdi. Lakin Tezliklə xəlifə Mütəvəkkilin (847-861) əmri ilə Təbriz yenidən bərpa olunmuşdu[268]. 1042-ci ildə baş vermiş zəlzələ nəticəsində Təbrizin bir hissəsi dağılmış, 40-50 min nəfər həlak olmuşdu. Əbu Mənsur Vəhsudan ibn Məhəmməd ər-Rəvvadi əl-Əzdi Təbrizin yenidən bərpa edilib əvvəlki ehtişamını qaytarmaq üçün böyük səy göstərmişdi[269]. Böyük Səlcuqluların hakimiyyəti illərində də Təbriz bu oğuz imperatorluğunun böyük və abad şəhərlərindən biri olmuşdu. Orta əsrlərdə Təbriz şəhəri özünün ən parlaq və ehtişamlı günlərini şübhəsiz ki, Azərbaycan Atabəylərinin hakimiyyəti illərində yaşamışdı. Eldənizlərin darü'l-mülkü, yəni paytaxtı olan Təbriz bu dövrdə müsəlman şərqinin elm, mədəniyyət, sənət və ticarət mərkəzlərindən biri idi[270]. Elxanilərdən Mahmud Qazan xanın (1295-1304) əmri ilə Təbrizin müdafiə sistemi yenilənmiş, şəhəri əhatə edən qala divarları genişləndirilərək yenidən inşa edilmişdi. Əvvəllər şəhəri əhatə edən qala divarlarının uzunluğu 6000 addım idisə, Mahmud Qazan xanın inşa etdirdiyi qala divarlarının uzunluğu 25.000 addıma bərabər idi[271]. Moğol hücumları vaxtı bacarıqlı dövlət xadimi Şəmsəddin Tuğrayinin səyi nəticəsində dağıntı və qətliamdan xilas olan Təbriz XIV əsrdə tatarların təxribatına məruz qalmışdı. Qızıl Orda hökmdarı Toxtamış xanın ordusu 4 yanvar 1386-cı ildə Təbrizə hücum etmiş, lakin əhalinin ciddi müqavimətinə rast gələrək hücumu dayandırmışdı. Əldə edilmiş sazişə əsasən Təbriz əhalisi 250 tümən qızıl pul ödəyəcək və Toxtamış xan ordusunu şəhərdən uzaqlaşdıracaqdı. Toxtamış xan şəhər

---

[265] Vladimir MİNORSKİY, *Tarixi-Təbriz*, (Trc. Ə. Karəng), s. 10, Tehran 1337.
[266] BÜNYADOV, *Azərbaycan VII-IX Əsrlərdə*, s. 246; ONULLAHİ, *həmin əsər*, s. 41.
[267] *Yenə orada*.
[268] ONULLAHİ, *həmin əsər*, s. 42.
[269] BAKUVİ, *Təlxisü'l-Asar*, s. 87; ONULLAHİ, *həmin əsər*, s. 42.
[270] BÜNYADOV, *Azərbaycan Atabəyləri Dövləti*, s. 198.
[271] QƏZVİNİ, *Nüzhətü'l-Qülub*, s. 79.

müdafiəçilərinin bu razılaşmadan sonra döyüş yerlərini tərk etməsindən sui-istifadə edərək şəhərə qoşun yeritmişdi. Bir həftə boyunca tatarlar Təbrizdə qətl və qarət törətmişdilər. 12 gün sonra Toxtamış xanın ordusu ikinci dəfə Təbrizi zəbt etmişdi. Bu iki hücum vaxtı əhalidən 10 min nəfər öldürülmüş və 100 min nəfərə yaxını əsir edilib aparılmışdı[272]. Qaraqoyunlu hökmdarı Kəmaləddin Qara Yusif (1389-1421) də Təbrizi paytaxt şəhəri kimi seçmişdi. Təbriz onun oğlu Cahanşahın (1438-1467) dövründə də sərhədləri Xorasandan Şam diyarına, İran körfəzindən Qafqaza qədər olan Azərbaycan dövlətinin paytaxtı olmuşdu. Elmi və mədəni tərəqqiyə böyük əhəmiyyət verən, Həqiqi təxəllüsü ilə çox gözəl türkcə və farsca şerlər yazan Cahanşahın özü də yüksək intellekt sahibj hömdar idi. O, Təbrizin tikilib abadlaşması üçün çox iş görmüş, Göy məscid və mədrəsə kompleksini[273] və Müzəffəriyyə mədrəsələrini inşa etdirmişdi. Cahanşah dövrün məşhur alimi Cəlaləddin Dəvvanini Müzəffəriyyə mədrəsəsinə müdərris təyin etmişdi. Cahanşahın xanımı da Təbrizdə böyük bir məscid və mədrəsə inşa etidirmişdi[274]. Azərbaycan Ağqoyunlu imperatorluğu dövründə də Təbriz müsəlman şərqinin böyük elm və mədəniyyət mərkəzlərindən biri olmuşdu. Uzun Həsən mücahidliyi ilə yanaşı elm, mədəniyyət və sənətə böyük diqqət yetirən hökmdar idi. Cəlaləddin Dəvvani özünün "Əxlaqi-Cəlali" adlı əsərini imperator Uzun Həsənə ithaf etmişdi. Alimin "Ərznamə" adlı risaləsi isə Ağqoyunlu dövləti ordusuna həsr olunmuşdu. Tarixçi Əbu Bəkr Tehrani, riyaziyyatçı Mahmud Can, fəqih və ədib Qazi Məsihəddin İsa Savəci, ilahiyyatçı Cəlaləddin Dəvvani, riyaziyyatçı Əli Quşçu, tarixçi İdris Bidlisi, fizik Muhəmməd ibn Mənsur hökmdar Uzun Həsənin yaxın ətrafında olan və Təbrizdə yaşamış dövrün məşhur alimləri idilər[275].

Ağqoyunlular dövründə də Təbriz şəhərində çox sayıda ictimai və iaşə binaları, mədrəsələr, məscidlər, karvansaraylar, hamamlar inşa edilmişdi. XVII əsrdə Təbrizdə olmuş türk səyyahı Övliya Çələbi bu şəhərdə 47 mədrəsə, 7 darü'l-hədis və bir neçə darü'l-qurranın fəaliyyət göstərdyini qeyd etmişdi[276]. Səyyah, Cahanşah mədrəsəsinin

---

[272] ONULLAHİ, *həmin əsər*, s. 67; MÜŞTƏRƏK, *Azərbaycan Tarixi*, s. 350.
[273] MİNORSKİY, *Tarixi-Təbriz*, s. 85.
[274] İsmail Hakkı UZUNÇARŞILI, *Anadolu Beylikleri ve Akkoyunlu, Karakoyunlu Devletleri*, s. 181, 186, Ankara 1988.
[275] UZUNÇARŞILI, *həmin əsər*, s. 225.
[276] ÖVLİYA ÇƏLƏBİ, *Səyahətnamə*, s. 250.

Təbrizin ən gözəl və böyük mədrəsəsi olduğunu qeyd etmişdir[277]. Bu da onu göstərir ki, inşasının üzərindən iki əsrdən çox vaxt keçməsinə baxmayaraq Cahanşah məscid və mədrəsə kompleksi öz ehtişamını qoruyub saxlaya bilmişdi. Lakin Övliya Çələbinin qeydlərindən məlum olur ki, Səfəvilər dövründə Təbrizin, eləcə də Azərbaycanın digər şəhərlərindəki elm ocaqlarında elmi və intellektual səviyyə qat-qat aşağı düşmüşdü. Bunun birinci səbəbi həmin bu dövrün Osmanlı dövlətinin çiçəklənmə dövrünə təsadüf etməsidir. XV əsrin birinci yarısı, xüsusilə də XVI əsrin əvvəllərindən etibarən Misirin də Osmanlı dövlətinə birləşdirilməsindən sonra başda İstanbul olmaqla Anadolunun böyük şəhərləri alimlər, mədəniyyət və incəsənət xadimləri üçün cazibə mərkəzinə çevrilmişdi. İslam dünyasının dörd bir tərəfindən, o cümlədən Azərbaycandan Osmanlı torpaqlarına yüzlərlə alim və mütəfəkkir gedərək buradakı tədris müəssisələrində fəaliyyət göstərməyə başlamışdılar. Bu dövrdə elm xadimlərinin Azərbaycanı tərk etməsinin əsas səbəblərindən biri də Səfəvilərin İran və Azərbaycanda hakimiyyətə gəlməsidir. Səfəvilər ən yaxşı halda təzyiq və təqiblər nəticəsində sünni din xadimləri və alimlərin ölkəni tərk etməsinə nail olurdular. Bir sıra hallarda isə Səfəvilərin şafi'i, hənəfi kimi sünni fiqh məzhəblərinə mənsub alimlərə qarşı törətdikləri qanlı qətliamlar alimlərin öz vətənlərini tərk edərək Osmanlı, Misir Məmlüklü və Şeybanilər dövətlərinə pənah aparmalarına səbəb olurdu. Lakin Səfəvilər şiəliyin dövlətinin rəsmi məzhəbi elan edilməsinindən sonra ciddi bir problemlə qarşılaşmışdılar. Problem ondan ibarət idi ki, Azərbaycanda, eləcə də İranda bu məzhəb sahəsində dini ədəbiyyat və alimlər yox deyiləcək qədər az idi[278]. İbnü'l-Mütəhhərin "Qəvaidü'l-İslam" adlı kitabı xaricində təbliğat xarakterli dini ədəbiyyat yox idi. Bu səbəblə də Səfəvilər Livanın Cəbəli-Amil və İraqın cənub regionlarından şiə ərəb alimlərini Azərbaycana dəvət etmişdilər[279]. Təbrizdə ilk şiə mədrəsəsini XVI əsrin əvvəllərində livanlı Nurəddin Əli əl-Amili əl-Kərəki (öl. 1534) qurmuşdu[280]. Bəhaəddin əl-Amili, şeyx Hüseyn əl-Amili, Mir Əbü'l-Qasım Fəndəriski həmin bu dövrdə xaricdən Təbrizə gəlmiş din xadimləridir[281].

---

[277] *Yenə orada.*
[278] Shahı AHMADOV, *Azerbaycan'da Şiîliğin Yayılma Süreci*, s. 102, Ankara 2005.
[279] *Yenə orada.*
[280] *Yenə orada.*
[281] AHMADOV, *həmin əsər*, s. 102-105.

Azərbaycanın qədim şəhərlərindən olan **Tiflis (Suğdabil)** orta əsrlərdə yetişdirdiyi elm və mədəniyyət xadimləri ilə məşhur olmuşdu. əl-İdrisi (1100-1165)[282], əl-İstəxri (X əsr)[283], Zəkəriyya əl-Qəzvini[284] və *Hüdudü'l-Aləm* müəllifi[285] Tiflisin Arranın şəhərlərindən biri olduğunu qeyd etmişdirlər. Süyuti "ət-Tiflisi" nisbəsi haqqında məlumat verərkən yazır "...Azərbaycanın bəldələrindən olan Tiflisə aid edilir"[286]. İbnü'l-Əsir də Tiflisin Azərbaycanın sonuncu, yəni sərhədyanı şəhərlərindən biri olduğunu qeyd etmişdir[287]. Əslində Azərbaycana məxsus olan Tiflisin Kür çayının cənubunda qalan hissəsidir. İndi olduğu kimi orta əsrlərdə də Tiflis Kür çayı ilə iki qismə ayrılırdı[288]. Çayın cənubunda qalan qismi müsəlman, şimalında qalan hissəsi isə xristian Tiflisi idi. Əbdürrəşid Bakuvi yazır: "Şəhərdən Kür çayı axır. Əhalisi müsəlman və xaçpərəstlərdir. Kürün bir sahilində əzan deyilir, digər isə kilsə zəngləri çalır"[289]. Mənbələrdə şəhərin sol sahili, yəni azərbaycanlılar yaşayan qismi Tiflis deyil, Suğdabil şəhəri kimi tanıdılır. Yaqut əl-Həməvi[290] və Əhməd əl-Bəlazuri Suğdabil şəhərinin Tiflisin cənubunda, Kür çayı sahilində olduğunu, şah I Xosrov Ənuşirvanın (531-579) bu şəhəri bina edib abadlaşdırdığını qeyd edir. Şəhərin Suğdabil adlanması isə I Xosrovun buraya Soğddan (Soqdiana)[291] farsdilli əhalini köçürüb məskunlaşdırması səbəbiylə olmuşdu[292].

Osman ibn Əffanın (ʳ) hakimiyyəti dövründə (644-656) Həbib ibn Məsləmə əl-Fıhri (ʳ) Tiflisi fəth edərək əhalisi ilə cizyə müqabilində əhdnamə bağlamışdı[293]. 722-ci ildə Əməvilərin cənubi Qafqaza təyin etdikləri vali Cərrah ibn Abdullah əl-Həkəmi Tiflis, Girdiman, Samsxa (Cavaxetiya), Şavşat daxil olmaqla Gürcüstan əhalisi ilə Həbib ibn Məsləmə ilə bağladıqları əhdnamənin şərtlərinə uyğun olaraq yeni əhdnamə

---

282 İDRİSİ, *Nüzhətü'l-Müştaq*, s. 34-35.
283 İSTƏXRİ, *Məsalikü'l-Məmalik*, s. 67.
284 QƏZVİNİ, *Asarü'l-Bilad*, s. 476-477.
285 ANONİM, *Hüdudü'l-Aləm*, s. 120-123.
286 SÜYUTİ, *Lübbü'l-Lübab*, s. 43. [التفليسي...مهملة الى تفليس بلد بأذربيجان]
287 İBNü'l-ƏSİR, *Lübab*, C. II, s.218. [التفليسي...هذه النسبة الى تفليس آخر بلدة من بلاد أذربيجان]
288 İBN XORDADBEH, *Məsalikü'l-Məmalik*, s. 477. [بها نهر الكرّ... بمدينة تفليس يشقها ثم بجنزة وشمكور ويجري على بلب بردعة]
289 BAKUVİ, *Təlxisü'l-Asar*, s. 118
290 YAQUT əl-HƏMƏVİ, *Mu'cəm*, C. IV, s. 305. [صغدبيل: مدينة على نهر الكر من جانب الشرقي قبالة تفليس بناها كسرى أنو شروان العادل ...أنزلها قوما من أهل الصغد من أبناء فارس]
291 Qədim Soqdianaya (və ya Suquda) indiki Tacikistan, Özbəkistanın Buxara və Səmərqənd daxil olmaqla Fərqanə vilayəti və Əfqanıstanın şimalı daxil idi.
292 BƏLAZURİ, *Fütuhü'l-Büldan*, s. 275; Həmçinin bax: BÜNYADOV, *Azərbaycan VII-IX Əsrlərdə*, s. 174.
293 BƏLAZURİ, *Fütuhü'l-Büldan*, s. 213, 284.

bağlamışdı[294]. Lakin bu fəth qalıcı olmamış, həm Əməvilər dövründəki daxili ziddiyətlər, həm də cənubi Qafqazda davam edən ərəb-xəzər müharibələri səbəbiylə Tiflisin fəthi gecikmişidi. 736-cı ildə Tiflis xilafətə birləşdirilmişdi. Bu tarixdən etibarən Tiflis xəlifələrin təyin etdikləri valilər tərəfindən idarə edilmişdi. 852-ci ildə Yusif ibn Muhəmməd əhdnamə şərtlərini yerinə yetirməməsi səbəbiylə Ərməniyyə hakimi Aşot oğlu Baqratı həbs edərək Bağdada göndərmişdi. Bu hadisədən sonra Baqratın qardaşı oğlunun ətrafında toplanan bir qrup erməni əyanı qiyam qaldırmış və Yusif ibn Muhəmmədi öldürmüşdülər. Bu işdə onlara bəzi yerli müsəlman əyanlar da kömək etmişdilər[295]. Bu hadisədən sonra xəlifə Mütəvəkkil (847-861) türk komandan Buğa əl-Kəbiri böyük bir ordu ilə cənubi Qafqaza göndərmişdi. Buğa əl-Kəbir qiyamçı erməni əyanlarını məğlub edərək onların çoxunu qılıncdan keçirmişdi. Daha sonra Tiflisə yaxınlaşan Buğa əl-Kəbir əmir Zirək ət-Türkiyə Kür çayını keçib şəhəri tam mühasirəyə almağı tapşırmışdı. Suğdabil hakimi İshaq ibn İsmayıl ibn Şueyb qaladan çıxaraq əmir Zirək ət-Türki ilə danışıq aparmağa cəhd etmişdi. Lakin Zirək ət-Türki onu və oğlunu yaxladıb edam etdirmişdi. Buğa əl-Kəbirin əmri ilə İshaq ibn İsmayılın şam ağacından tikilmiş sarayı və qəsri yandırılmışdı[296]. İshaq ibn İsmayılın babası Şueyb Əməvilərin məvlası olmuşdu. Bu hadisə nəticəsində 853-cü ildə Tiflisdə Şueybilər sülaləsinin hakimiyyəti sona çatmışdı. 853-880-ci illərdə Şeybanilər sülaləsi, 880-1062-ci illərdə isə əmir Cə'fər ibn Əlinin nəslindən olan Cə'fərilər sülaləsi Tiflis müsəlman əmirliyini idarə etmişdilər. 1122-ci ilə qədər Böyük Səlcuqlu dövlətinə aid olan Tiflis həmin il gürcü çarı IV Davidin (1089-1125) ordusu tərəfindən zəbt edilmişdi[297].

Eyni adlı gölün sahilində yerləşən **Urmiyə** şəhəri orta əsr ərəb müəllifləri tərəfindən Zərdüştün vətəni hesab olunurdu[298]. İbn Xordadbeh Urmiyəni Zərdüştün şəhəri adlandırmışdı[299]. Yaqut əl-Həməvi Urmiyənin Azərbaycanın qədim və böyük şəhərlərindən biri olduğunu, həmçinin məcusilərin peyğəmbəri Zərdüştün Urmiyalı

---

294 *Yenə orada*.
295 İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. VII, s. 56-57.
296 Əbu Cə'fər Muhəmməd ibn Cərir TƏBƏRİ, *Tarixi-Təbəri*, C. XIV, s. 6042, Tehran 1383; İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. VII, s. 56-57.
297 BÜNYADOV, *Azərbaycan Atabəyləri Dövləti*, s. 19-20.
298 VƏLİXANLI, *həmin əsər*, s. 98.
299 *Məsalikü'l-Məmalik*, s. 38.[وأُرمية مدينة زردشت]

olduğunu qeyd edir[300]. H. 617-ci (1220) ildə Urmiyədə olduğunu bildirən müəllif Urmiyəni gözəl havası və suyu, bol meyvə və tərəvəzi olan şəhər kimi təsvir edir. Lakin atabəy Özbəyin zəifliyindən ötrü bu şəhərin lazımi qayığını görə bilmədiyini yazır[301]. XI əsrin əvvəllərində Urmiyə gölü ətrafı oğuz qəbilələrinin daha sıx məskunlaşdığı ərazi idi. Həmidullah Qəzvini Urmiyə gölünün şimal-qərbində yerləşən Xoy şəhərini təsvir edərkən Xoyun türklərin diyarı kimi tanındığını qeyd etmişdir[302]. 1030-cu ildə Urmiyə civarından hərəkətə keçən oğuz süvariləri şərqi Anadoluda ermənilərin məskun olduqları ərazilərə ələ keçirərək bol qənimətlə Azərbaycana qayıtmışdılar. İbnü'l-Əsir bu hadisəni təsvir edərkən yazır ki, bu hərbi səfər vaxtı o qədər çox əsir alınmışdı ki, kölə bazarlarında "ən gözəl cariyənin qiyməti 5 dinar idi, oğlan kölələrin isə üzünə baxan yox idi"[303]. Bənzər bir hadisə də 1048-ci ildə baş vermişdi. Həmin ilin sentyabr ayında Böyük Səlcuqluların Azərbaycan valisi İbrahim Yınal Bizans və gürcülərin birləşmiş ordusunu Ərzurum yaxınlığında ağır məğlubiyyətə uğratmışdı. Gürcü ordusunun komandanı Liparit əsir alınmışdı. İbrahim Yınal gürcülərin 300 min dinar əvəzində Liparitin azad edilməsi təklifini rədd etmişdi. İbnü'l-Əsirin yazdığına görə bu döyüşdən sonra İbrahim Yınalın ordusu Azərbaycana 10 min araba qənimət və 100 mindən çox əsirlə qayıtmışdı[304].

Urmiyədən cənubda yerləşən **Uşnuh** Azərbaycanın qədim şəhərlərindən biridir. Yaqut əl-Həməvi bu şəhərdə olduğunu, onun Ərbil yolu üzərində olduğunu, Ərbillə arasında 5 günlük, Urmiyə ilə Uşnuh arasında isə 2 günlük məsafə olduğunu yazır[305]. İbn Hövqəl və əl-İstəxrinin əsərlərində bu şəhərin adı Uşnuhü'l-Azəriyyə kimi qeyd olunmuşdur[306].

İbn Hövqəlin yazdığına görə **Varsan** Beyləqandan daha böyük şəhər idi. Müəllif Varsanın qala divarları ilə əhatə olunduğunu, əhalisinin çox, ərazisinin geniş və əmtəəsinin bol olduğunu, Varsanda mehmanxanaların olduğunu qeyd etmişdir[307].

---

[300] *Mu'cəm*, C. I, s. 154. [وأرمية اسم مدينة عظيمة قديمة بأذربيجان...مدينة زرادشت نبي المجوس]

[301] *Yenə orada*. Həmçinin bax: VƏLİXANLI, *həmin əsər*, s. 98.

[302] *Nüzhətü'l-Qülub*, s. 86-87.

[303] İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. IX, s. 301.

[304] *Yenə orada*, s. 414.

[305] YAQUT əl-HƏMƏVİ, *Mu'cəm*, C. I, s. 203.

[306] İBN HÖVQƏL, *Surətü'l-Ərz*, s. 289; İSTƏXRİ, *Məsalik*, s. 73. Həmçinin bax: VƏLİXANLI, *həmin əsər*, s. 102.

[307] İBN HÖVQƏL, *Surətü'l-Ərz*, s. 299. [ورثان وهي مدينة اكبر من البيلقان وافسح واكثر اهلاً واسواقاً ومتاجر, وبها ما يكون بالمدن الكبار من العمال والفنادق عليها سور]

Məqdisi[308], Məs'udi[309], İdrisi[310], İbn Xordadbeh[311] kimi müəlliflər Varsanın Araz çayı sahilində olduğunu qeyd etmişdirlər. Bəlazuri Varsan şəhərinin Azərbaycan valisi Mərvan ibn Muhəmməd tərəfindən inşa etdirilib, ətrafında möhkəm qala divarları tikdirdiyini və ətrafındakı torpaqları dirçəltdiyin qeyd edir. O, həmçinin Varsanda körpü olduğunu da qeyd etmişdir[312]. Görünür Varsan şəhərinin qala divarları və istehkamları kifayət qədər möhkəm imiş. Çünki 731-ci ildə Varsan qalasını mühasirəyə alan xəzərilər şəhəri uzun müddət mühasirədə saxlasalar da onu ələ keçirə bilməmişdilər. Əməvilərin Azərbaycan valisi Səid ibn Əmr əl-Hərəşinin şəhər müdafiçilərinin köməyinə gəlməsi xəzərilərin oradan uzaqlaşmalarına səbəb olmuşdu[313]. Yaqut əl-Həməvi Varsandan Araz çayı vadisinə 2 fərsəx (11,37 km), Varsanla Beyləqan arasında isə 7 fərsəx (39,79 km) məsafə olduğunu qeyd edir[314]. İbn Hövqəl Beyləqandan Varsana 7, Varsandan Bəlhəbə 7, Bəlhəbdən Bərzəndə 7, Bərzənddən Ərdəbilə 15 fərsəx (85,27 km) məsafə olduğunu yazır[315]. İstəxri də eyni məlumatı verir[316]. İbn Xordadbeh Bərdə ilə Varsan arasında 8 mənzil (181,92 km) məsafə olduğunu qeyd edir[317]. V. Minorskiy belə hesab etmişdir ki, Altan adlı xarabalıqlar Varsan şəhərinə aiddir[318]. N. Vəlixanlı da bu fikirlə razıdır ki, Daşburun dəmir yolu stansiyası yaxınlığındakı Altan xarabalıqları qədim Varsan şəhərinə aiddir[319]. İndiki Saatlı rayonunun Varxan kəndinin adı və coğrafi mövqeyi, yəni Araz çayı kənarında yerləşməsi qədim Varsan şəhərinin bir zamanlar məhz burada yerləşdiyi düşünməyə əsas verir. Varxan kəndi ilə Bərzənd arasındakı 80-90 km-lik məsafədə də mənbələrin verdiyi məlumata təqribən uyğun gəlir. Varxandan bir neçə km aralı, Araz çayının sol sahilində İmişli rayonunun Bəcirəvan kəndinin olması da mənbələrdəki Bacərvan şəhərini xatırladır. Mənbələrin verdiyi məmulatına görə

---

308 *Əhsənü't-Təqasim*, s. 185;
309 Əbü'l-Həsən Əli əl-MƏS'UDİ, *Tənbih və'l-İşraf*, s. 20, Beyrut 1981
310 *Nüzhətü'l-Müştaq*, s. 35.
311 *Məsalikü'l-Məmalik*, s. 54.
312 BƏLAZURİ, *Fütuhü'l-Büldan*, s. 294. [كانت ورثان قنطرة... فبناها مروان بن محمد وأحيا أرضها وحصنها فصارت له ضيعة]
313 Əhməd İBNü'l-Ə'SƏM əl-Kufi, *Fəthlər Kitabı*, (Trc. Z. Bünyadov), s. 27, Bakı 1995.
314 *Mu'cəmü'l-Büldan*, C. V, s. 556-557.
315 *Surətü'l-Ərz*, s. 299.
316 İSTƏXRİ, *Məsalikü'l-Məmalik*, s. 76.
317 İBN XORDADBEH, *Məsalikü'l-Məmalik*, s. 39. [من ورثان إلى برذعَة ثماني سكك]
318 *İstoriya Şirvana i Derbenta X-XI vekov*, s. 109.
319 VƏLİXANLI, *həmin əsər*, s. 103.

Varsanla Bacərvan bir-birinə yaxın şəhərlər olmuşdular[320]. Digər tərəfdən qədim Beyləqanın xarabalıqlarının yerləşdiyi Örənqaladan Daşburuna 38-39 km, Varxan kəndinə isə 68 km məsafə olması V. Minorskinin ehtimalını gücləndirir. Daşburunla Bərzənd kəndi arasındakı məsafə də 70 km-dən bir qədər çoxdur. Bu da V. Minorskinin öz təxminində yanılmadığını göstərir. Bununla belə qədim Varsanın yerinin dəqiq müəyyənləşdirilməsi üçün arxeoloji tədqiqatların aparılması zəruridir.

İlk İslam fütahtı dövründə adına mənbələrdə rast gəlinməyən **Xalxal** haqqında Yaqut əl-Həməvi öz əsərində məlumat vermişdir. Müəllif Qəzvindən 7, Ərdəbildən isə 2 günlük uzaqlıqda olan bu şəhəri Gilan vilayəti ilə həmsərhəd, dağlar qoynunda səfalı və gözəl təbii şəraitə malik bir yer kimi təsvir etmişdi. Yaqut əl-Həməvi Xalxal ətrafındakı dağlarda bir sıra alınmaz qalaların olduğunu bildirmişdir[321]. Ondan bir əsr sonra, XIV əsrin əvvəllərində Xalxal haqqında məlumat verən Həmidullah Qəzvini isə Xalxalın bir vaxtlar kifayət qədər böyük şəhər olduğunu, indi isə yüzə yaxın məzra ilə əhatə olunmuş kəndi xatırlatdığını qeyd edir[322]. Güman ki, Azərbaycanın digər şəhərləri, o cümlədən Avrasiyanın böyük bir qismindəki yaşayış məskənləri kimi, Xalxal da moğol vəhşətindən öz payına düşəni almışı.

Azərbaycanın qərbində, Anadolu torpaqları ilə səmsərhəd ərazidə yerləşən **Xoy** şəhərinin adına ilk dövr müsəlman tarixçilərin əsərlərində rast gəlinir. Yuxarıda qeyd etdiyimiz kimi, Xoy Səlmas ilə birlikdə, Azərbaycanda əhalisi İslamı ilk qəbul edən şəhərdir. 639-cu ildə İyaz ibn Ğənəm (ا) Xoy və Səlmas ətrafındakı ərazilərə hərbi yürüş təşkil etmişdi. əl-Vaqidi (747-823) bu səfər vaxtı Xoy və Səlmas əhalisinin əksəriyyətinin İslamı qəbul etdiklərini qeyd etmişdir[323]. Yaqut əl-Həməvi (XIII əsr) Xoyun möhkəm qala divarları ilə müdafiə olunan, torqağı məhsuldar, bol meyvəli və yaşıllıq içində bir şəhər olduğunu, "əl-xüvəyyiə" adlı ilə məşhur olan paltarın bu şəhərdə tikildiyini qeyd etmişdir[324]. Əbdürrəşid Bakuvi də Xoyu bol sulu, nemətləri çox olan şəhər kimi təsvir etmişdi[325]. Həmidullah Qəzvini Xoy şəhərini təsvir edərkən şəhərin ətrafının 6500

---

320 Bax: İBNü'l-Ə'SƏM, *Fəthlər Kitabı*, s. 20, QƏZVİNİ, *Nuzhətü'l-Qülub*, s. 91.
321 *Mu'cəmü'l-Büldan*, C. III, s. 145.
322 QƏZVİNİ, *Nüzhətü'l-Qülub*, s. 84.
323 VAQİDİ, *Fütuhü'ş-Şam*, C. II, s. 169.
324 YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. III, s. 182. [ينسب إليي الثياب الخوية]
325 *Təlxisü'l-Asar*, s. 121.

addım olduğunu, şəhərə suyun Səlmas ətrafındakı dağlardan axıb gəldiyini yazmışdır[326]. Müəllif həmçinin xoyluların ağ bənizli və zahirən gözəl insanlar olduğunu bildirmiş, Xoyun türklərin diyarı kimi tanındığını qeyd etmişdir[327].

Yaqut əl-Həməvi Azərbaycanın böyük olmayan **Xunə** şəhir haqqında məlumat verərkən Marağa ilə Zəncan arasında, Zəncandan iki günlük məsafədə yerləşən bu şəhərin adını "Xunəc" kimi yazsa da "Xunə" kimi yazılmasının daha doğru olacağını da qeyd etmişdi[328]. Müəllif bu şəhərin həmçinin "kağız istehsalçıları" mənasını ifadə edən Kağezkonan da adlandığını bildirmiş, əhalinin öz şəhərinin Xunə adlandırılmasından xoşlanmadıqlarını yazmışdı[329]. Həmidullah Qəzvini Xunə ilə Ərdəbil arasında 7 fərsəx (39,79 km) məsafə olduğunu qeyd etmişdi[330]. Yuxarıda Xunə adını necə Xunəc formasına düşdüyünü açıqlamışdıq. Xunə, yəni qədim azəricədə ev mənasını ifadə edən bu şəhərin adına nisbə tərtib edilərkən "Xunəgi", ərəbcə yazılışı ilə "Xunəci" formasını almışdır.

*Əcaibü'd-Dünya* müəllifi **Sürmari** haqqında məlumat verərkən deyir: "Sürmari Ərməniyyə ilə sərhəddə, Araz çayı kənarındakı qayanın üzərində yerləşən qaladır. O vilayətdə ondan daha müstəhkəm yer yoxdur. Şəhərdə evlər, binalar, bazarlar mövcuddur. Bu şəhərdə türklər yaşayır. Bol və bərəkətli şəhərdir. Əhalisi cəsur və din uğrunda vuruşan müsəlmanlardır. Şəhərin ətrafındakı yerlər də türklərin əlindədir"[331]. Mənbələrdə "əs-Sürmari" nisbəli alimlərə rast gəlsək də burada bioqrafiyaları haqqında məlumat vermədik. Çünki İbnü'l-Əsir öz əsərində Sürmari adlı digər bir yaşayış məntəqəsinin Buxara yaxınlığında olduğunu qeyd etmiş və "əs-Sürmari" nisbəsini daşıyan şəxslərin oralı olduğunu bildirmişdi[332]. Yaqut əl-Həməvi müasiri olan İbnü'l-Əsirdən fərqli olaraq hər iki Sürmari haqqında məlumat vermiş, bunlardan birinin Tiflislə Əxlat arasında qala, digərinin isə Buxara yaxınlığında kənd olduğunu qeyd etmişdir[333]. Mənbə müəllifləri isə bioqrafiyalarını yazdıqları "əs-Sürmari" nisbəli

---

[326] *Nüzhətü'l-Qülub*, s. 86-87.
[327] *Yenə orada*.
[328] *Mu'cəmü'l-Büldan*, C. III, s. 181.
[329] *Mu'cəmü'l-Büldan*, C. III, s. 180.
[330] *Nüzhətü'l-Qülub*, s. 83.
[331] ANOMİM, *Əcaibü'd-Dünya*, s. 212.
[332] İBNü'l-ƏSİR, *Lübab*, C. II, s. 114.
[333] *Mu'cəmü'l-Büldan*, C. IV, s. 79.

alimlərin hansı Sürmaridən, Azərbaycan yoxsa Türküstan Sürmarisindən olduqların qeyd etmədikləri üçün biz də bunda tərəddüd etdik.

Orta əsr müəllifləri **Zəncan**ın Azərbaycan şəhəri olduğunu qeyd edərək ölkənin cənubunun bu vilayətlə sona çatdığını bildirmişdirlər. Cəmaləddin əl-Himyəri öz əsərində yazır "Zəncan Azərbaycanın bəldələrindən (rayonlarından) biridir"[334]. Əbü'l-Fida öz əsərində Azərbaycanın cənub sərhədlərini qeyd edərkən xəttin Zəncandan Dinəvər, Hulvan, Şəhrəzur, Dəclə sahilinə oradan da Ərməniyyəyə uzandığını yazır[335].

Yuxarıda adlarını sadaladığımız Azərbaycan şəhərləri irəlidə haqqında bioqrafik məlumat verəcəyimiz alimlərin yaşadıqları, yetişdiləri və ya əslən mənsub olduqları şəhərlərdir. Lakin mənbələrdə burada haqqında məlumat verdiklərimizdən başqa onlarla irili-xırdalı orta əsr Azərbaycan şəhərlərinin adlarına rast gəlmək olar. Bulardan Şəki, Qəbələ, Şəmkir (Mütəvəkilliyyə), Ucan, Dehxərriqan, Cabrəvan, Bacərvan, Bəlhəb, Bəzz, Bəsva, Nəriz, Orduabad, Firuzabad, Gəzəc, Novdiz, Dəşti, Şiz (Təxti-Süleyman), Bərzə, Gərgər, İzz, Saysavan, Sincan, Xunalıq (Xınalıq), Xutta, Əndərab, Naftan, Kərnənin adlarını çəkmək olar[336].

---

334 HİMYƏRİ, *Nisbə ilə'l-Məvazi'*, C. I, s. 368. [الزنجان.... بلد من إقليم أذربيجان]

335 İmadəddin ƏBÜ'L-FİDA İsmayıl ibn Əli, *Təqvimü'l-Büldan*, (Nşr. M. Reinaud-De Slane McG.), s. 387, Paris 1840.

336 Bu şəhər, qəsəbə və qalalar haqqında bax: VƏLİXANLI, *həmin əsər*, s. 85-115.

## ORTA ƏSRLƏRDƏ YAŞAMIŞ AZƏRBAYCANLI ALİMLƏR

### Qazi Burhanəddin Əbu Nəsr ibn Məs'ud Anəvi

Qazi Burhanəddin Əbu Nəsr 1143-cü ildə Azərbaycanın şimal-qərbindəki Ani şəhərində dünyaya gəlmişdi. Həmin dövrdə Ani Şəddadi əmirliyinin hakimiyyəti altında idi. Burhanəddin Anəvinin babaları Böyük Səlcuqlu sultanı Alp Arslanın Anini fəthindən (1064) sonra gəlib bu şəhərdə məskunlaşmışdılar. Onun atası Məs'ud, Şəddadi əmirliyinin ordusunda xidmət edən zabit idi. İlk təhsilini Anidə alan Burhanəddin Əbu Nəsr şafi'i fiqhi ilə yanaşı fars dili və ədəbiyyatı, tibb, astronomiya kimi dəqiq elmlər sahəsində də mütəxəssis idi. Xaçpəsətlərin də yaşdığı Anidə xristian teologiyası və İncili öyrənən Burhanəddin Əbu Nəsr gənc yaşlarından etibarən şe'r yazmağa başlamışdı. 1161-ci ildə Anini işğalı vaxtı gürcülərə əsir düşən Burhanəddin Anəvi 6 illik əsarətdən sonra vətənə qayıda bilmişdi[337]. Əsirlikdən qayıdandan sonra Anidən Təbrizə gedən gənc Burhanəddin burada vaiz Mahmud Təbrizinin tələbəsi olmuş, ondan fiqh elminin incəliklərini öyrənmişdi. Ondakı şairlik istedadını görən vaiz Mahmud bu qabiliyyətini müsbət istiqamətdə inkişaf etdirməsini tövsiyə etmişdi. Burhanəddin Anəvi ustadının təşviqi ilə peyğəmbərlərin həyatını nəzm etmişdi. Təbrizdə təhsilini tamamlayan Burhanəddin Anəvi Əxlatşahlar hökmdarı əmir Seyfəddin Bəgtemürün (1183-1193) ölkəsinə gedərək burada yaşamış, əmirin yaxın adamlarından biri olmuşdu. 1188-ci ildə həcc ziyarəti üçün yola çıxan Burhanəddin Anəvi əmir Seyfəddinin elçisi olaraq Bağdadda Abbasi xəlifəsi Nasir Lidinillahla görüşmüşdü. 1207-ci ildə Əxlatşah əmirliyi ləğv edilərək ərazisi Əyyubilər dövlətinə birləşdirilmişdi. Bu hadisədən sonra Konyaya gedən Burhanəddin Anəvi Anadolu Səlcuqlu sultanı İzzəddin I Keykavusun (1211-1220) xidmətinə daxil olmuşdu[338]. Malatya şəhəri qaziliyinə təyin olunan Burhanəddin Əbu Nəsr Anəvi "Ənisü'l-Qülub" adlı farsca əsərini yazıb sultan İzzəddinə təqdim etmişdi. Bu əsərin son qismi "Nəsihətnamə" adlanır. Müəllif burada Burhan təxəllüsü ilə gənc hökmdar İzzəddin I Keykavusa nəsihət və öyüd mahiyyətində şerlər yazmışdı. "Ənisü'l-Qülub" İslam tarixi

---

[337] Mehmed Fuad KÖPRÜLÜ, "Anadolu Selçukluları Tarihinin Yerli Kaynakları", **TTK, Belleten**, C. VII, S. 27, Ankara 1943, ss. 456-483.

[338] KÖPRÜLÜ, *həmin məqalə*.

və əxlaqa dair əsər olsa da bu əsərdə Azərbaycan, Arran və Anadoluda yaşayan oğuzlar haqqında dəyərli tarixi məlumatlar var[339]. "Ənisü'l-Qülub" Anadoludakı farsdilli ədəbiyyatın qiymətli nümunələrindən biridir. Bu əsər Firdovsinin "Şahnamə"si tərzində qələmə alınmışdır və bir növ xəlifələrin tərənnüm edildiyi şahnamədir[340]. "Ənisü'l-Qülub"un məlum olan yeganə nüsxəsi İstanbulda Ayasofiya kitabxanasında saxlanılır. Burhanəddin Anəvinin ölüm tarixi 1214-cü ildən sonraya təsadüf edir.

**Əbu Abdullah Nafi' ibn Əli ibn Yəhya əs-Səravi əl-Azərbaycani**

Şafi'i məzhəbinə mənsub mühəddis və fəqih idi. Əbu Əyyaş Cə'fər ibn Muhəmməd Ərdəbilidən hədis dinləmişdi. Əli ibn Muhəmməd ibn Məhruyə Qəzvini, Əbü'l-Həsən Əli ibn İbrahim əl-Qəttan Qəzvininin tələbəsi olmuş, onların yanında fiqh elmini öyrənmişdi. Əbü'l-Həsən Əhməd ibn Muhəmməd əl-Ətiqi ondan hədis dinləmiş və nəql etmişdi[341]. Əbu Abdullah Nafi' əl-Azərbaycani h. 382-ci ildə (992) həcc ziyarətindən qaydarkən Bağdada gəlmiş və burada hədis dərsləri vermişdi[342]. əs-Səravi (السروي) nisbəsinin haradan, hansı yaşayış məntəqəsindən gəldiyinə dair yuxarıda məlumat vermişdik, bu nisbə cənubi Azərbaycanın Sərab şəhərinə aiddir. Səm'ani alimin h. 400-cü ildən (1010) əvvəl vəfat etdiyini yazır[343].

**Muhəmməd ibn Muhəmməd ibn Hüseyn ibn Əbduk əl-Azərbaycani**

Mühəddis idi. Hədis dinləmək üçün səyahətə çıxmış, Hicaz, İraq, Misir və Şam diyarının mühəddislərindən hədis dinləmişdi. İbnü'l-Müqəyyir, İbn Rəvahə, İbn Qumeyrə, İbn Rəvvac və Səxavi onun hədis dinlədiyi mühəddislərdən idilər. Qüds şəhərində yaşamış və burada hədis dərsləri vermişdi. İbn Xubbaz və İbn Əttar kimi

---

339 KÖPRÜLÜ, *həmin məqalə*.

340 Mikayıl BAYRAM, "Selçuklular Zamanında Anadolu'da Bazı Yöreler Arasındaki Farklı Kültürel Yapılanma ve Siyasi Boyutları", **SÜTAD**, S. 1, Konya 1994, ss. 79-92; Ali ÖNGÜL, "Selçuklularda Eğitim Faaliyetleri ve Yetişen İlim Adamlarına Genel Bir Bakış", **CBÜSBED**, C. I, S. 2, Manisa 2003, ss. 67-78.

341 YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. IV, s. 66-67; Əbu Nəsr Əli ibn Hibətullah İBN MAKULA, *İkmal*, C. II, s. 119, Qahirə 1976; Əbü'l-Fəzl İBNü'l-QEYSƏRANİ, *Ənsabü'l-Müttəfiqə*, s. 22, Bağdad 1970. İbnül-Qeysərani alimin adını digər müəlliflərdən bir qədər fərqli, "Əbu Abdullah Nafi' ibn Əli ibn Bəhr ibn Əmr ibn Hazim" olaraq qeyd etmişdir.

342 Xətib Əhməd ibn Əli əl-BAĞDADİ, *Tarixu-Mədinətü's-Səlam Bağdad*, C. XIII, s. 322, Qahirə 1931.

343 *Yenə orada*.

hədis alimləri onun tələbəsi olmuşdular. Alim h. 682-ci ilin rəcəb ayında (oktyabr 1283) vəfat etmişdi[344].

**Əbu Yə'la Muhəmməd ibn Muhəmməd ibn Saleh ibnü'l-Haruyə əl-Azərbaycani**

Mühəddis, siqa hədis ravisi idi. Azərbaycanda dünyaya gəlmiş, lakin gənclik illəri Bağdadda keçmiş və bu şəhərdə təhsil almışdı. Əbu Cə'fər ibnü'l-Məsləmə, Malik əl-Banyasi kimi mühəddislərdən hədis dinləmiş və nəql etmişdi. Hafiz Muhəmməd ibn Əbdülvahid əd-Dəqqaq, Əbu Qalib Daməğani, şair Əbu Bəkr əl-Ərcani ondan hədis dinləmiş və nəql etmişdilər. Əbu Yə'la Muhəmməd əl-Azərbaycani həmçinin tanınmış ədib və tənqidçi idi. O, nəzm və nəsr tərzində çox gözəl ədəbi əsərlər qələmə almışdı. Bunlardan "Nətayicü'l-Fitnə fi Nəzmi-Kəlilə və Dimnə", "əs-Sadih" adlı əsərlərinin adlarını çəkmək olar. Əbu Yə'la Muhəmməd əl-Azərbaycani İraqi-ərəb və İraqi-əcəmin bir sıra şəhərlərinə səyahət etmişdi. Ömrünün sonlarına doğru Kirmana getmiş və burada h. 509-cu ilin səfər ayında (iyul 1115), 95 yaşında ikən, vəfat etmişdi[345].

**Əbu Bəkr Muhəmməd ibn Musa ibn Saleh əl-Mərəndi əl-Azərbaycani**

Hədis ravisi idi. Səmərqənddə yaşamış, burada hədis nəql etmişdi. Əli ibn Muhəmməd ibn Hatim ibn Dinar əl-Qəumsidən hədis dinləmişdi. Həsən ibn Muhəmməd ibn Səhl əl-Farsi də ondan hədis dinləmişdi. Ölüm tarixi h. 325-ci ildən (937) sonraya təsadüf edir[346].

**Əbü'l-Fəth Saleh ibn Əhməd əl-Azəri**

Mühəddis idi. Əbu Bəkr Əhməd ibn Həccaf əl-Azəri Naxçıvanidən hədis dinləmiş və hədis dərsləri vermişdi[347]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Əbu Abdullah Muhəmməd ibn Musa əl-Azəri**

---

[344] Səlahəddin Xəlil ibn Aybək SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, (Nşr. Z. Mustafa-Arnavut Ə), C. I, s. 183, Beyrut 2000; Şəmsəddin Əbu Abdullah Muhəmməd ibn Əhməd ZƏHƏBİ, *Mu'cəmü'l-Muxtəs bi'l-Mühəddisin*, s. 80, Taif 1988.

[345] Əhməd ibn Əli İBN HƏCƏR əl-Əsqəlani, *Lisanü'l-Mizan*, C. V, s. 283-284, Beyrut 1986.

[346] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV s. 253-254.

[347] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. V, s. 437.

Mühəddis idi. Əbu Bəkr Əhməd ibn Həccaf əl-Azəri Naxçıvanidən hədis dinləmiş və hədis dərsləri vermişdi [348]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Əbu Muhəmməd Həsən əl-Azəri**

XI əsrdə yaşamış azərbaycanlı tarixçi alim idi. Əbu Muhəmməd Həsən əl-Azəri "Müxtəsər ələ Təbəqatü'l-Müluk" və "Əxbaru Müluki-Əcəm və Xüləfa" adlı farsca tarixə dair əsərlərin müəllifi idi. "Əxbaru Müluki-Əcəm və Xüləfa" qədim İran şahlarının tarixi ilə başlayıb Abbasi xəlifəsi Qaim bi-Əmrillahın (1031-1075) hakimiyyəti ilə sona çatmışdır[349]. Alimin ölüm tarixi məlum deyil.

**Əbdülxaliq ibn Əbü'l-Məali ibn Muhəmməd əl-Arrani**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Şam diyarında şeyxü'ş-şüyux Sədrəddin Əbü'l-Həsən ibn Həmmuyənin, sonra isə Mosulda əllamə İmadəddin Əbu Hamid Muhəmməd ibn Yunis Məvsilinin tələbəsi olmuş, onlardan şafi'i fiqhini öyrənmişdi. Təhsilini başa vurduqdan sonra Əxlat şəhərinə getmişdi. Buradakı mədrəsələrdə müdərris və müfti olmuşdu. Əxlatşah hökmdarları ona hörmət və ehtiram bəsləyirdilər. Alim xarəzmlilərin Əxlat və ətraf vilayətləri xarabazara çevirmələrindən[350] sonra bu diyarı tərk edərək Dəməşqə getmiş və h. 15 şəvval 633-cü ildə (21 iyun 1236) burada vəfat etmişdi[351].

---

[348] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. V, s. 437.

[349] Səid NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr dər İran və dər Zebane-Farisi*, C. II, s. 719, Tehran 1344.

[350] Əxlatşahlar və ya Sökəmənlər dövləti 1100-1207-ci illərdə Anadolunun şərqində, Van gölü ətrafında mövcud olmuş türk dövləti idi. Bu dövlətin ərazisinə qismən Azərbaycanın qərb torpaqları da daxil olmuşdu. 1197-ci ildən etibarən bu dövləti Sökmən ailəsinə mənsub məmlük əmirlər idarə etmişdilər. 1207-ci ildə əmir Balabanın ölümündən sonra Əxlat Əyyubilərin əlinə keçmişdi. Lakin Xarəzmşah Cəlaləddin Məngübərtinin bu coğrafiyaya gəlişindən sonra Əxlat Əyyubilərlə Xarəzmşah arasındakı hərbi toqquşmanın mərkəzində qalmışı. 1226-cı ilin dekabrında Əxlat Xarəzmşahın əlinə keçmişdi. 1231-ci ildə Əyyubi və Anadolu Səlcuqlularının müttəfiq orduları Xarəzmşah Cəlaləddini Yassıçəmən döyüşündə ağır məğlubiyyətə uğratmışdılar. Xarəzmşah Cəlaləddin Əxlatın Əyyubilərin əlinə keçəcəyini bildiyi üçün şəhəri oda verib xaraba qoymuşdu. Ehtimal ki, Əbdülxaliq Arraninin Əxlatı tərk etməsi də bu şəhər üçün fəlakətli olan 1220-ci illərə təsadüf etmişdi. Bax: Muhəmməd ibn Əhməd NƏSƏVİ, *Siyrətü's-Sultan Cəlaləddin Məngübərti*, (Nşr. Ə. Həmdi), s. 299-326, Qahirə 1952; İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. XII, s. 417, 427.

[351] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 74; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 87. Yaqut əl-Həməvinin 1229-cu ildə Şam diyarının digər bir şəhəri Hələbdə vəfat etdiyini nəzərə alaraq onun Əbdülxaliq əl-Arrani ilə görüşdüyünü ehtimal etmək olar.

**Mahmud ibn Muhəmməd ibn Əli ibn Mahmud əl-Arrani**

Hülagülərin hakimiyyəti dövründə yaşamış tanınmış azərbaycanlı filoloq və ədəbiyyatşünas idi. O, irəlidə haqqında ətraflı məlumat verəcəyimiz digər bir azərbaycanlı filoloq İbn Hacib Düveyninin əsərlərinə şərh yazmışdı. Bunlardan biri ərəb dilinin morfologiyasına dair "Şərhü'ş-Şafiyyə fi's-Sərf", digəri isə ərəbcənin sintaksisinə dair "Şərhü'l-Kafiyyə fi'n-Nəhv"dir. Ölüm tarixi məlum olmayan Mahmud əl-Arraninin h. 734-cü ildə (1323) həyatda olduğu bilinir[352]. Bu da onun XIII-XIV əsrlərdə yaşadığını göstərir.

**Fəxrəddin Əbu Muhəmməd Osman ibn Muhəmməd ibn Abdullah ibn Bəşşarə əl-Arrani**

Yaşadığı dövrün tanınmış mühəddislərindən biri idi. H. 615-ci ilin səfər ayında (dekabr 1218) Xarəzmə gedərək şeyxü'ş-şüyux Nəcməddin Əbü'l-Cənnab Ömər əl-Xivəgi Xarəzminin[353] tələbəsi olmuş və ondan Muhyəddin Hüseyn Bəğəvinin (öl. 1122) "Şərhü's-Sünnə" adlı çoxcildli hədis külliyatını dinləmişdi[354]. Ölüm tarixi qeyd edilməmişdir. XIII əsrdə yaşamışdır.

**Əhməd ibn İbrahim Bərdəi**

Hənbəli məzhəbinə mənsub hədis ravisi idi. Muhəmməd ibn Əhməd ibn Həsən əl-Səvvafdan hədis dinləmiş və nəql etmişdi. Şeyxülislam Əbu İshaq İbrahim Şirazi də ondan hədis dinləmiş və nəql etmişdi[355]. Ölüm tarixi məlum deyil. XI əsrdə yaşamışdır. Onun nəql etdiyi hədislərdən biri də, adət halına gətirilmədən, namazların bəzən birləşdirilərək qılınmasına aid hədis idi:

Abdullah ibn Abbas (ا) dedi ki, "Rəsulullah (ق) Mədinədə hər hansı bir (təhlükə səbəbiylə meydana çıxan) qorxu və yağışlı hava olmadan zöhr və əsr namazlarının

---

[352] Ömər Rza KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 829-830, Beyrut 1993.

[353] Şeyxü'ş-şüyux Nəcməddin Əbü'l-Cənnab Ömər ibn Əhməd ibn Muhəmməd ibn Abdullah əl-Xivəgi Xarəzmi (1145-1226) Kübrəviyyə təriqətinin qurucusu olub şeyx Nəcməddin Kübra adı ilə tanınmışdı. Şeyx Nəcməddin Kübra təsəvvüfə ilk addımlarını Şeyx Əbu'n-Nəcib Əbdülqahir Sührəvərdinin vasitəçiliyi ilə atmışdı.

[354] Kəmaləddin Əbü'l-Fəzl Əbdürrəzzaq ibn Əhməd İBNü'l-FUVATİ, *Məcməü'l-Adab fi Mu'cəmü'l-Əlqab*, C. IV/3, s. 231, (Nşr. M. Cavad), Dəməşq 1965.

[355] Əbdürrəhman ibn Əlməd ibn Rəcəb əl-HƏNBƏLİ, *Zeyl Təbəqatu'l-Hənabilə*, C. I, s. 278, Qahirə 1952.

arasını birləşdirərək qıldı". Ona "Rəsulullah (ق) bunu hansı səbəblə etdi?" deyə sual verdilər. İbn Abbas "Ümmətini məşəqqətə salmamaq üçün" deyə cavab verdi[356].

**Əbdürrəhman ibn Cə'fər Bərdəi**

Hədis ravisi idi. Əhməd ibn Muhəmməd əl-Müvəffəqidən hədis nəql etmişdi. Əbdürrəhman ibn Cundəb ondan hədis dinləmiş və nəql etmişdi[357]. Təqribən VIII-IX əsrlərdə yaşamışdır.

**Əbu Bəkr Muhəmməd ibn Yəhya ibn Hilal Bərdəi**

Mühəddis, fəzilət sahibi, ədib və şair bir şəxs idi. Bağdadda məskunlaşmış, h. 350-ci (961) ildə Səmərqəndə köçmüşdü. Əbu Bəkr Muhəmməd Fəzl ət-Təbəri, Əbü'l-Hüseyn Muhəmməd ibn İbrahim ibn Şueyb əl-Qazi ət-Təbəri və başqalarından hədis dinləmiş və nəql etmişdi. Hafiz Əbu Sə'd Əbdürrəhman ibn Muhəmməd əl-İdrisi (öl. 1014) ondan hədis dinləmiş və nəql etmişdir[358]. Ehtimal ki, h. 350-ci (961) ildən sonra Səmərqənddə vəfat etmişdir.

**Əbu Cə'fər Əhməd ibn Həsən ibn Muhəmməd Bərdəi**

Hədis ravisi idi. İbn Dəhhan ondan hədis dinləmişdi. Məşhur bioqraf-tarixçi Əli ibn Hibətullah ibn Makula isə h. 454-cü ildə (1062) Misirdə ikən İbn Dəhhandan hədis dinləmişdi[359]. Ölüm tarixi məlum deyil. Əbu Cə'fər Əhməd Bərdəinin XI əsrdə yaşadığı ehtimal olunur.

**Hafiz Əbu Əli Hüseyn ibn Əli ibn Muhəmməd ibn Hüseyn ibn Tahir ibn Xalid ibn İdris ibn Bəkir ibn Həbib ibn Zəhir ibn Asim ibn Müdərrək Bərdəi**

---

356 HƏNBƏLİ, *Zeyl Təbəqatu'l-Hənabilə*, C. I, s. 278. Bu hədis üçün həmçinin bax: MÜSLÜM, *Səhih*, bab: Səlatu'l-Misafirin, Cəmi' Beynu's-Səlateyn, hədis Nr. 50. (جمع رسول الله ﷺ بين الظهر والعصر من غير خوف ولا مطر. فقيل لابن عباس: لِمَ فعل ذلك. قال: كي لا يحرج أمته) İMAM MÜSLÜM-Əbü'l-Hüseyn Müslüm ibnü'l-Həccac əl-Quşeyri Nişapurinin (821-875) *Səhih* adlı hədis külliyatı İslam dünyasında mötəbər 6 hədis kitabından (Kutubi-Sittə) biridir.

357 Şəmsəddin Əbu Abdullah Muhəmməd ibn Əhməd ZƏHƏBİ, *Mizanü'l-E'tidal fi Nəqdü'r-Rical*, C. II, s. 304, Qahirə 1964; İBN HƏCƏR, *Lisanü'l-Mizan*, C. III, s. 321.

358 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 212; Şəmsəddin Əbu Abdullah Muhəmməd ibn Əhməd ZƏHƏBİ, *Müştəbih fi Əsmai'r-Rical*, s. 32, Leiden 1881.

359 İBN MAKULA, *İkmal*, C. I, s. 385.

Böyük hədis hafizlərindən biri idi. Səmərqəndə köçüb bu şəhərdə yaşamışdı. Hədis dinləmək üçün İraq və Xorasanın şəhərlərinə səyahət etmişdi. Əbü'l-Həsən Əli ibn Ömər Darəqutni, Əbu Əmr əl-Müseyyib ibn Muhəmməd əl-Ərğiyani, Əbu Bəkr Əhməd əl-İsmaili, Əbu Əmr Səid ibn Qasım ibn Əla Bərdəi kimi mühəddislərdən hədis dinləmişdi. Əbü'l-Abbas Cə'fər əl-Müstəğruri ondan hədis dinləmiş və nəql etmişdi. Alim h. 349-cu ildə Bərdədə anadan olmuş, h. 406-cı ilin ramazan ayında (fevral 1016) Səmərqənddə vəfat etmişdi[360].

**Əllamə Əbu Abdullah Muhəmməd ibn Yəhya ibn Hişam əl-Əndəlusi Bərdəi**

İbnü'l-Bərdəi ləqəbi ilə məşhur olmuş Əbu Abdullah Muhəmməd Bərdəi ərəb filologiyası və ədəbiyyatı üzrə yaşadığı dövrün ən görkəmli alimlərindən biri idi. Əbu Əli əş-Şülubeyn onun müəllimi olmuşdu. Bundan başqa Əbu Zərr əl-Xuşəni, Əbü'l-Həsən ibn Xüruf, Əbu Əli ər-Rəndi kimi alimlərdən də dərs almışdı. Əbu Abdullah Muhəmməd Bərdəi ərəb ədəbiyyatı, ərəb dilinin qrammatikasına dair bir sıra məqalə və kitabın müəllifi idi. "Məsailü'n-Nəxb", "Fəslü'l-Məqal fi Əbniyyətü'l-Əfa'l", "əl-İfsah bi-Fəvaidü'l-İzah", "əl-İqtirah fi Təlxisü'l-İzah", "Tətəbbəhu bi'ş-Şərhü't-Təmim və'l-İslah", "ən-Nəqz ələ'l-Müməttə'", "Fəslü'l-Məqal fi Təlxis Əbniyyəti'l-Əfal", "Ğarrətü'l-İsbah fi Şərhu Əbyati'l-İzah" onun bu sahədə qələmə aldığı əsərlərdəndir. Bundan başqa o, şe'r və nəsr əsərləri qələmə almışdı. Alim h. 575-ci ildə (1179) anadan olmuş, h. 14 cəmadiəlaxir 646-cı ildə (3 oktyabr 1248) Tunisdə vəfat etmişdi[361].

**Əbu Əli Hüseyn ibn Səfvan ibn İshaq ibn İbrahim Bərdəi**

Mühəddis idi. Muhəmməd ibnü'l-Fərəc əl-Rəzzaq, Muhəmməd ibn Şəddad əl-Müsəmməi, Əbü'l-Abbas əl-Bərəti, Cə'fər ibn Əbi Osman ət-Təyalisi[362], İbn Əbi Dünyadan[363] hədis dinləmiş və nəql etmişdi. Şəmsəddin Zəhəbi onun İbn Əbi Dünyanın

---

360 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 212.

361 SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. V, s. 132; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 772. "əl-Əndəlusi" nisbəsi və "ibnü'l-Bərdəi" ləqəbi ilə tanınması alimin ata və ya babasının Bərdəli olduğunu, özününü isə Əndəlusdə (İspaniyada) dünyaya gəldiyini göstərir.

362 XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. VIII, s. 54.

363 Mühəddis Əbu Bəkr Abdullah ibn Əbi Dünya Muhəmməd ibn Übeyd ibn Süfyan ibn Qeys əl-Qurəşi Bağdadi (823-894).

yaxın dostlu olduğunu qeyd etmişdi[364]. Əbu İmran Musa ibn İmran ibn Musa ibn Hilal Səlmasi[365], Muhəmməd ibn Abdullah ibn Əxi Meymi, Əbu Abdullah ibn Dost, Əbü'l-Hüseyn ibn Buşran, Übeydullah ibn Əbü'l-Fəth ondan hədis dinləmişdi. Əbu Əli Hüseyn Bərdəi "ustadi-əhəd" yəni misli olmayan müəllim ləqəbi ilə və xəlifənin imamı (pişnamazı) kimi tanınmışdı. H. 340-cı ildə (951) Qahirədə vəfat etmişdi[366].

**Hafiz Əbu Əmr Səid ibn Qasım ibn Əla ibn Xalid Bərdəi**

Yaşadığı dövrün böyük hədis hafizlərindən olan Əbu Əmr Səid Bərdəi Türküstanın Taraz[367] şəhərində məskunlaşmışdı. H. 350-ci ildə (961) həcc ziyarətinə getmiş və qayıdarkən Bağdada gəlmişdi. Bağdadda Muhəmməd ibn Hibban əl-Bəsri, İsfahanda Muhəmməd ibn Yəhya ibn Mundəh[368], Abdullah ibn Hüseyn ibn Bəhr əş-Şamati Nişapuri, Muhəmməd ibn Cə'fər əl-Kərabisi Bəlxidən hədis nəql etmişdi. Əbü'l-Həsən Əli ibn Ömər Darəqutni (918-995), Əbu Əli ibn Fudalə ər-Razi, Əhməd ibn Əbdurrəhman əş-Şirazi, Əbu Əli Hüseyn ibn Əli Bərdəi və başqaları ondan hədis dinləmiş və nəql etmişdilər. Həmçinin Muhəmməd ibn İsmayıl əl-Vərraq da Bağdadda ondan hədis nəql etmişdi. Ondan hədis dinləyib nəql etmiş başqa bir tanınmış ravi Əbu Əbdürrəhman Muhəmməd ibn Hüseyn ibn Muhəmməd ibn Musa əl-Əzdi əs-Süləmidir[369] (öl. 1021). Əbu Əmr Səid Bərdəi h. 362-ci ildə (973) Tarazda vəfat etmişdi[370]. İbnü'l-İmad alimin Tarazda, lakin h. 363-cü ildə (974) vəfat etdiyini qeyd etmişdi[371]. Nəql silsiləsində Əbu Əmr Səid Bərdəinin də olduğu hədislərdən biri aşağıdakıdır:

---

364 ZƏHƏBİ, *Müştəbih*, s. 32.

365 Əbü'l-Qasım Əli ibn Həsən İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, (Nşr. M. Əmrəvi), C. XLI, s. 398, C. LXI. s. 187, Beyrut 1995.

366 XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. VIII, s. 54; Cəmaləddin Əbü'l-Məhasin Yusif İBN TAĞRIBİRDİ, *Nücumu'z-Zahirə fi Müluki-Misr və'l-Qahirə*, C. I, s. 424, Qahirə 1930; Əbdülhəyy ibn Əhməd İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb fi Əxbari mən Zəhəb*, C. II, s. 238, Dəməşq 1986; Xətib Əhməd ibn Əli əl-BAĞDADİ, *Əsmai'l-Mübhəmə fi'l-Ənbai'l-Məhkəmə*, s. 78, 80, 200, 300, www.almeshkat.net.

367 Taraz-indiki Qazaxıstanın cənubi-şərqində yerləşən şəhər. Qədim adı Taraz (Talas) olun bu şəhər 1997-ci ilə qədər Cambul adlanmışdı.

368 Əbu Nueym Əhməd ibn Abdullah İSBƏHANİ, *Zikr Əxbaru-İsbəhan*, C. I, s. 300, Leiden 1934.

369 Əbu Bəkr Əhməd ibn Hüseyn ibn Əli əl-BEYHƏQİ, *Məvsusətu-Ricali's-Sünəni'l-Kübra*, s. 75, Qahirə (trz).

370 Şəmsəddin Əbu Abdullah Muhəmməd ibn Əhməd ZƏHƏBİ, *Kitab Təzkərətü'l-Hüffaz*, s. 936-937, Beyrut (trz); SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 215-216; XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. IX, s. 110; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. II, s. 311. İbn Kəsir alimin adını "Əbu Əmr Səid ibn Qasım ibn Xalid Bərdəi" olaraq qeyd etmişdir.

371 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. III, s. 222.

Ayşə (ل) dedi: "Allah Rəsulu (ق) ölüləri söyməyi nəhy (qadağan) etdi"[372].

## Hafiz Əbu Osman Səid ibn Əmr ibn Əmmar əl-Əzdi Bərdəi

Böyük hədis hafizlərindən biri idi. Hədis dinləmək üçün uzun səyahətlərə çıxmışdı. Dəməşqdə Əbu Zur'ə Dəməşqidən[373] hədis dinləmişdi. Əbu Zur'ə Dəməşqi ilə hafiz Əbu Osman Səid Bərdəi yaxın dost idilər. Əbu Osman Səid Bərdəi həmçinin Əbu Yaqub əl-Cürcani, Əbu Səid əl-Əşcə, hafiz Səlim ibnü'l-Həccac, Muhəmməd ibn Yəhya əz-Zıhli, Əbu Zur'ə ər-Razi[374], Əbu Hatim ər-Razi[375], Muhəmməd ibn İshaq əs-Səğanidən hədis dinləmiş və nəql etmişdi. Muhəmməd ibn Yusif ibn İbrahim, Əbu Abdullah Əhməd ibn Tahir ibnü'n-Nəcm əl-Miyanəci, Əbü'l-Qasım Həfs ibn Ömər əl-Ərdəbili, Həsən ibn Əli ibn Abbas, İbrahim ibn Əhməd əl-Meyməzi ondan hədis dinləmiş və nəql etmişdilər. Alim h. 292-ci ildə (905) vəfat etmişdi. Bəziləri onun, Qur'ani-Kərimin məxluq olması kimi, mö'təzilə məzhəbinin fikirlərini mənimsədiyini iddia etmişdilərsə də onu yaxından tanıyan, onun tələbəsi olmuş şəxslər bunun qəti surətdə doğru olmadığını, Əbu Osman Səid Bərdəinin əhli-sünnə mənhəcinə sıx bağlı olduğunu bildirmişdilər[376]. Alimin müəllifi olduğu "Kitabü'z-Züəfa və'l-Kəzzabin və'l-Mətrukin" adlı hədis elminə aid əsərin bir nüsxəsi İstanbulda Köprülü yazma əsərlər kitabxanası, Fazil Əhməd paşa kolleksiyasında saxlanılır.

## Əllamə Əbu Səid Əhməd ibn Hüseyn Bərdəi

Mö'təzili kəlam alimi olan Əbu Səid Əhməd Bərdəi yaşadığı dövrdə həmçinin hənəfi məzhəbinin böyük fəqihlərindən biri kimi tanınmışdı. Gənc yaşlarında vətəndən həcc

---

372 XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. IX, s. 110. Bu hədis üçün bax: BUXARİ, *Səhih*, Cənaiz 97, Riqaq 42; NƏSAİ, *Sünən*, Cənaiz Nr. 52/1910; ƏBU DAVUD, *Sünən*, Ədəb 42/4899. Hədisin "Kütubi-Sittə"dəki mətni belədir: Ayşə (ل) dedi: Allah Rəsulu (ق) buyurdular ki; "Ölüləri söyməyin. Çünki onlar bu dünyada etdikləri əməllərlə birlikdə artıq keçib getmişdirlər". (لا تَسُبُّوا الأَمْوَاتَ فَإِنَّهُمْ قَدْ أَفْضَوْا إِلَى مَا قَدَّمُوا).

373 Əbu Zur'ə Əbdürrəhman ibn Əmr Dəməşqi (öl. 893) tarixçi və hədis hafizi, mühəddis idi. Suriyada yaşamış və orada vəfat etmişdi.

374 Əbu Zur'ə Übeydullah ibn Əbdülkərim ər-Razi (öl. 878)- məşhur hədis hafizlərindən idi. İslam dünyasında mötəbər 6 hədis kitabından (Kutubi-Sittə) birinin müəllifi olan İbn Macə (824-887) özünün "Sünən" adlı hədis kitabını qələmə alandan sonra Əbu Zur'ə ər-Raziyə təqdim etmiş və onun müsbət rəyini almışdı.

375 Əbu Hatim Muhəmməd ibn İdris ibnü'l-Münzir (öl. 890)-məşhur hədis hafizi idi.

376 ZƏHƏBİ, *Kitab Təzkərətü'l-Hüffaz*, s. 936-937; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 411-414; Əbu Abdullah ibn Muhəmməd ibn Əhməd ibn Əbdülhadi DİMƏŞQİ, *Təbəqatu-Üləmai'l-Hədis*, C. II, s. 459, (Nşr. Ə. Buşi-Zeybəq. İ), Beyrut 1997; Cəlaləddin Əbdürrəhman ibn Əbu Bəkr əs-SÜYUTİ, *Təbəqatü'l-Hüffaz*, s. 115, Qahirə 1973.

ziyarəti üçün yola çıxan Əbu Səid Əhməd Bərdəi həccdən sonra Bağdada gəlmiş, burada təhsil almış və məskunlaşmışdı. Əbu Səid Əhməd Bərdəi hənəfi fiqhini Əbu Əli əd-Dəqqaq və Musa ibn Nəsr ər-Razidən öyrənmişdi. Əbu Səid Əhməd Bərdəinin tələbələri arasından Əbü'l-Həsən əl-Kərxi, Əbu Tahir əd-Dəbbas, Əbu Əmr ət-Təbəri kimi kəlam alimləri yetişmişdir. Əllamə Əbu Səid Əhməd Bərdəi "Kitabü'l-Məxaric" adlı əsərin müəllifi idi[377]. Alim h. 317-ci il zilhiccə ayının 8-i (11 yanvar 930) Məkkədə həcc ziyarətini yerinə yetirərkən qərmətilər tərəfindən qətlə yetirilmişdi[378].

**Əbü'l-Həsən Əli ibn Mərdək ibn Əbdüləziz Bərdəi**

Mühəddis, hədis ravisi idi. Bağdadda yaşayıb parça ticarəti ilə məşğul olan Əbü'l-Həsən Əli Bərdəi Bağdadın varlı tacirlərindən biri idi. İbn Kəsir onun böyük sərvət sahibi olmasına baxmayaraq sadə və dəbdəbədən uzaq həyat sürdüyünü qeyd etmişdir. O, çox ibadət edən, zahid və saleh insan idi. Əbü'l-Həsən Əli Bərdəi Əbdürrəhman ibn Əbu Hatim Muhəmməd ər-Razidən hədis dinləmiş və nəql etmişdi. Bir müddət Qəzvində təhsil almış və burada Süleyman ibn Yəzid əl-Famidən hədis dinləmişdi. Əbü'l-Həsən Əli Bərdəi siqa, yəni mötəbər hədis ravilərindən biri idi. Tanınmış mühəddis şərif Əbü'l-Hüseyn Muhəmməd ibn Əli ibnü'l-Mühtədi Billah əl-Haşimi onun tələbələrindən biri olmuş, ondan hədis dinləmişdi. Əbü'l-Həsən Əli Bərdəi h. 387-ci ilin məhərrəm ayında (yanvar 997) vəfat etmişdi[379].

**Əbü'l-Qasım Abdullah ibn Əhməd ibn Yusif Bərdəi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Əbü'l-Qasım Bərdəi adı ilə tanınan alim məşhur mühəddis Əbü'l-Həsən Əli Darəqutninin (öl. 995) yaxın dostu idi. Əbü'l-Qasım Bərdəi həmçinin istedalı şair idi. O, imam Şafi'ini (öl. 819) mədh edən qəsidələr yazmışdı.

---

[377] Zeynəddin Əbü'l-Ədl Qasım İBN QUTLUBUĞA əl-Misri, *Tacü't-Tərcim fi Təbəqatü'l-Hənəfiyyə*, s. 35, Bağdad 1962.

[378] Muhyəddin Əbu Muhəmməd Əbdülqadir İBN ƏBÜ'l-VƏFA əl-Quraşi, *Cəvahirü'l-Muziyyə fi Təbəqatü'l-Hənəfiyyə*, C. I, s. 163-166, Beyrut 1993; Əbu İshaq İbrahim ibn Əli ŞİRAZİ, *Təbəqatü'l-Füqəha*, s. 53, Beyrut 1970; XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. IV, s. 99; Muhəmməd ibn İshaq İBNÜ'n-NƏDİM, *əl-Fihrist*, (Nşr. R. Təcəddüd), s. 212, Beyrut 1978; SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. VI, s. 8; İBN TAĞRIBİRDİ, *Nücumu'z-Zahirə*, C. I, s. 398. Qərmətilər bu qətliamda minlərlə zəvvarı qətlə yetirmiş, Kə'bənin örtüsünü yırtmış və Hacərü'l-Əsvədi (Kə'bədəki qara daş) söküb Bəhreynə aparmışdılar. Hacərü'l-Əsvəd 22 il sonra qərmətilərdən alınıb yerinə qoyulmuşdu. Bu haqda ətraflı məlumat üçün bax: Süheyl ZƏKKAR, *Əxbaru'l-Qəramitə*, s. 52, Qahirə 1982.

[379] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. III, s. 246; İBN KƏSİR, *Biyadə və'n-Niyahə*, C. II, s. 545; Əbdülkərim ibn Muhəmməd ər-RAFİ'İ əl-Qəzvini, *Tədvin fi Əxbari Qəzvin*, (Nşr. Ə. Utaridi), C. IV, s. 89, Beyrut 1978.

Dostu Əbü'l-Qasım Bərdəinin vəfatından mütəəssir olan Əbü'l-Həsən Əli Darəqutni bu münasibətlə bir qəsidə qələmə almışdı. İbnü's-Səlah həmin qəsidənin bir neçə beytini öz əsərində qeyd etmişdi[380]. Əbü'l-Qasım Bərdəinin ölüm tarixini müəyyənləşdirmək mümkün olmamışdır. Darəqutninin müasiri olduğuna görə onun X əsrdə yaşadığını təxmin etmək olar.

**Əbu Hənifə Muhəmməd ibn Əbdürrəhman ibn Malik Bərdəi**

Hədis ravisi idi. Məkkədə yaşamış və bu şəhərdəki mühəddislərdən hədis dinləmişdi. Onun hədis dinlədiyi mühəddislərdən biri də Əhməd ibn Muhəmməd ibn Yunis əl-Yəmami idi[381]. Əbu Hənifə Bərdəinin ölüm tarixi məlum deyil. IX əsrdə yaşamışdır. Nəql silsiləsində Əbu Hənifə Muhəmməd Bərdəinin də olduğu hədislərdən biri aşağıdakıdır:

Abdullah ibn Ömər ibn Xəttab (ا) dedi: Ömər ibn Xəttab (ا) Allah Rəsuluna (ق) "Bizlərdən biri cünub ikən yata bilərmi?" deyə sual verdi. Allah Rəsulu (ق): "Bəli, namaz üçün dəstəmaz alan kimi dəstəmaz alsın (sonra istəsə yatsın)" deyə cavab verdi[382].

**Əbu Bəkr Əhməd ibn Muhəmməd ibn Əli Bərdəi**

Hədis ravisi idi. Tahir ibn İsmayıl ər-Razidən hədis dinləmiş və nəql etmişdi. Əbdülvahid ibn Bəkr də ondan hədis dinləmiş və nəql etmişdi[383]. Yaşadığı dövrü müəyyən etmək mümkün olmamışdır.

**Əbu Zur'ə Muhəmməd ibn Cə'fər ibn Hüseyn ibn Muhəmməd Bərdəi**

Yaşadığı dövrün tanınmış mühəddis və ədiblərindən idi. Xorasanın Nişapur şəhərində məskunlaşmış, bu şəhərdə yaşamışdı. Təqiyəddin Seyrəfini onun siqa hədis ravisi

---

[380] Təqiyəddin Əbu Əmr Osman ibnü's-Səlah ŞƏHRƏZURİ, *Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, (Hzr. M. Ə. Nəcib), C. I, s. 501, Beyrut 1992.

[381] Əbu Bəkr Muhəmməd ibn İbrahim İSFƏHANİ, *Mu'cəmü'ş-Şüyux*, C. I, s. 23, http://www.balligho.com.

[382] ƏBU BƏKR İSFƏHANİ, *Mu'cəmü'ş-Şüyux*, C. I, s. 23. Bu hədis üçün bax: BUXARİ, *Səhih*, 390; MÜSLİM, *Səhih*, 306/2324; TİRMİZİ, *Sünən*, hədis Nr. 120. (أيرقد أحدنا وهو جنب ؟ قال : نعم ، ويتوضأ وضوءه للصلاة).

[383] Əbu Nueym Əhməd ibn Abdullah İSBƏHANİ, *Hilyətü'l-Əvliya və Təbəqatü'l-Əsfiya*, C. VI, s. 199, Beyrut 2007.

olduğunu və Əbu Əhməd ibn Ədiyy, Əbu Bəkr Əhməd əl-İsmaili, Əbü'l-Abbas əl-Mə'dani, Əbu Bəkr əl-Amuli kimi mühəddislərdən hədis dinləyib dərs aldığını qeyd etmişdir. Əbu Zur'ə Bərdəi h. 412-ci ildə (1021) Nişapurda vəfat etmiş və buradakı Şahənbər qəbristanında dəfn edilmişdi. Cənazə namazını oğlu Əbu Bəkr Bərdəi qıldırmışdı[384].

**Əbu Bəkr Muhəmməd ibn Abdullah Bərdəi**

Əbu Bəkr Muhəmməd Bərdəi xarici (xəvaric) məzhəbinin ən məşhur fəqihlərindən biri idi. O, həmçinin mö'təzilə əqidəsinə xas fikirlərin də daşıyıcısı idi. Xəvaric məzhəbinə dair bir sıra əsərlərin müəllifi olan Əbu Bəkr Muhəmməd Bərdəinin qələmə aldığı kitabların bəziləri bunlardır: "Kitabu'l-Mürşid fi'l-Fiqh", "Rədd ələ'l-Müxalifin fi'l-Fiqh", "Təzkirətü'l-Qərib fi'l-Fiqh", "Təbsira lil Mütəəllimin", "İhticac ələ'l-Müxalifin", "Cami' fi Üsulü'l-Fiqh", "Kitabu'd-Dua", "Kitabu'n-Nasix və'l-Mənsux fi'l-Qur'an", "Kitabu'l-Əzkar və't-Təhkim", "Kitabu's-Sunnə və'l-Cəmaə", "Kitabu'l-İmamət", "Təhrimu'l-Musəkkər", "Kitabu'r-Rədd ələ mən qal bi'l-Mutə'ə", "Kitabu'l-İman və'n-Nuzur" və "Kitabu'n-Nakisin"[385]. Əbu Bəkr Muhəmməd Bərdəinin ölüm tarixi məlum deyil. Lakin onun haqqında məlumat verən İbnü'n-Nədim onunla h. 340-cı ildə (951) onunla görüşüb söhbət etdiyini qeyd etmişdir[386]. İbnü'n-Nədim h. 325-ci ildə (937) Bağdadda anadan olmuş və bütün gəncliyini bu şəhərdə keçirmişdi. Müəllif atasının peşəsini davam etdirərək kitabçılıqla məşğul olmuşdu. Əbu Bəkr Muhəmməd Bərdəinin əsərlərini belə dəqiqliklə bilməsi də ehtimal ki, peşəsi səbəbiylə idi. Əbu Bəkr Muhəmməd Bərdəi ilə görüşəndə, yəni h. 340-cı (951) ildə, İbnü'n-Nədim 15 yaşlı yeniyetmə idi və bu görüş, sözsüz ki, Bağdadda baş vermişdi. İbnü'n-Nədimin müasiri və ondan yaşca böyük olduğu üçün Əbu Bəkr Muhəmməd Bərdəinin IX-X əsrlərdə

---

384 Təqiyəddin Əbu İshaq İbrahim ibn Muhəmməd əs-SEYRƏFİNİ, *Müntəxəb min Kitabi's-Siyaqi't-Tarixi-Nişabur*, (Nşr. X. Heydər), s. 26, Beyrut 1414.

385 İBNÜ'n-NƏDİM, *əl-Fihrist*, 240; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 432; Zakir MƏMMƏDOV, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, s. 8-9, Bakı 1986.

386 İBNÜ'n-NƏDİM, *həmin əsər*. Əbu Bəkr Muhəmməd Bərdəi böyük ehtimalla xaricilərin "İbaziyyə" cərəyanına mənsub idi. Çünki bu cərəyan mənsubları, bütün radikallıqlarına rəğmən, başqa xarici qruplara nəzərən digər əqidə və məzhəb mənsublarına qarşı daha loyal münasibət bəsləyirdilər. "İbaziyyə" xarici məzhəbi qruplarından bu günə qədər öz mövcudluğunu qoruyub saxlaya bilmiş yeganə cərəyandır və Omanın rəsmi məzhəbidir. Tanzaniya müsəlmanlarının bir qismi də bu məzhəbə mənsubdurlar.

yaşadığını söyləmək olar. Bağdadlı İsmayıl paşa onun əsərləri haqqında məlumat verdikdən sonra h. 340-cı ildə (951) öldüyünü qeyd etmişdir[387]. Lakin bu zəif ehtimaldır. Əbu Bəkr Muhəmməd Bərdəinin ölümü bu tarixdən sonraya təsadüf etmişdir.

**Əhməd Münəbbih ibn Əbdülməcid ibn Abdullah ibn Əhməd ibn Muhəmməd ibn Musa ibn Əhməd ibn Muhəmməd ibn Behzad ibn Behbud Bərdəi**

Mühəddis idi və Səmərqənddə yaşamışdı. Əhli-sünnə mənhəcinə sıx bağlılığı ilə tanınmış fəzilətli insan idi. Əbu Nueym əl-Əstərəbadi, Əbu Bəkr Muhəmməd ibn Mehdidən hədis dinləmiş və nəql etmişdi. Əbu Sə'd əl-İdrisi h. 370-ci ildən (980) əvvəl onunla Səmərqənddə görüşmüş və ondan hədis dinləyib qeyd etmişdi[388]. Ölüm tarixi məlum deyil. X əsrdə yaşamışdır.

**Əbu Səid Həsən ibn Əli Bərdəi**

Hədis ravisi idi. Muhəmməd ibn Əyyubdan hədis dinləmişdi. Əbü'l-Həsən Əli Darəqutni (öl. 995) ondan hədis dinləmiş və nəql etmişdi[389]. Ölüm tarixi qeyd olunmamışdır. Darəqutninin müasiri olduğu üçün onun da IX-X əsrlərdə yaşadığını təxmin etmək olar.

**Əbu Səid Əhməd ibn Əbdüləziz Bərdəi**

Hənəfi məzhəbinə mənsub fəqih və fətva mərcii idi. Onun və'z məclislərinə insan kütlələri toplaşır, izdiham yaranırdı. Əbu Səid Əhməd Bərdəi h. 18 zilqədə 491-ci ildə (16 oktyabr 1098) vəfat etmişdi[390].

**Əhməd Bərdəi**

---

[387] BAĞDADLI İsmayıl Paşa, *Hədiyyətü'l-Arifin Əsmai'l-Müəllifin və Asarü'l-Müsənnifin*, (Hzr. R. Bilge-İnal M. K), C. II, s. 40-41, İstanbul 1955.
[388] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 212.
[389] XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. VII, s. 385.
[390] İBN ƏBÜ'l-VƏFA, *Cəvahirü'l-Muziyyə*, C. I, s. 191-192; SEYRƏFİNİ, *Müntəxəb*, s. 125.

Ağqoyunluların hakimiyyəti illərində Azərbaycanda yaşamış hənəfi məzhəbinə mənsub mütəkəllim idi. Həyatı haqqında ətraflı məlumat yoxdur. Əhməd Bərdəi Sə'dəddin Təftazaninin əsərinə "Şərhu Əqaidü'n-Nəsəfi" adlı şərh yazmış və bu əsərinin h. 850-ci ildə (1446) bitirmişdi. Ölüm tarixi məlum deyil. XV əsrdə yaşamışdır[391].

**Əllamə Əbü'l-Həsən Muhəmməd ibn Mühəddis Əhməd ibn Əli ibn Əsəd Bərdəi**

Yaşadığı dövrün böyük hədis hafizlərindən biri idi. Hədis dinləmək üçün çox səyahət etmişdi. İraq, Misir və Şam diyarını gəzmişdi. O, İbn Hirarə kimi də tanınırdı. Çünki atası Əhməd ibn Əlinin ləqəbi "Hirarə" idi. Əbü'l-Həsən Muhəmməd Bərdəi Hamid ibn Şueyb, Əbü'l-Qasım Bəğəvi[392], İbn Cəusa, Abdullah ibn Vəhb əd-Dinəvəri, Əbu Əmr ibnü'n-Nəhhas, Əbu Bəkr ibn Əbi Davud, İbn Said və başqalarından hədis dinləmişdi. Onun hafizəsində 30 mindən çox hədis var idi. Həsən ibn Cə'fər ət-Təyyibi ondan hədis dinləmiş və nəql etmişdi. Alim h. 348-ci ildə (959) Qəzvində vəfat etmişdi[393].

**Hafiz Muhəmməd ibn Əhməd ibn Əli əl-Əsədi Bərdəi**

Hədis ravisi idi. Müasiri olan mühəddislər onun səduq[394] ravilərdən biri olduğunu bildirmişdilər. O, hədis elmləri ilə yanaşı fiqh, ərəb dili və ədəbiyyatı sahələrində də öz dövrünün qabaqcıl alimləindən biri idi. Hafiz Muhəmməd Bərdəi İraq, Misir və Şam diyarında Rüqəyyə bint İshaq ibn Musa ibn Cə'fər, İsa ibn Süleyman ibn Əbdülməlik əl-Qurəşi, Hüseyn ibn Mə'mun, Muhəmməd ibn Əbu İmran, Abdullah ibn Vəhb Dinəvəri, Abdullah ibn Muhəmməd Bəğəvi, Yəhya ibn Said, Əbü'l-Həsən ibn Cəusa, Əbu Ərubə

---

[391] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. I, s. 109.

[392] "Bəğəvi" nisbəsi ilə tanınıb əslən Əfqanıstanlı olan bir çox alim yaşamışdır. Bunların ən məhşurlarından biri də Əbü'l-Qasım Abdullah ibn Muhəmməd ibn Əbdüləziz ibn Mərzban Bəğəvidir (829-929). Əbü'l-Qasım Bəğəvi imam Əhməd ibn Hənbəlin (h. 164-241/781-855) tələbələrindən biri olmuşdur.

[393] ZƏHƏBİ, *Kitab Təzkərətü'l-Hüffaz*, s. 971; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. II, s. 247; Təqiyəddin Əhməd ibn Əli əl-MƏQRİZİ, *Kitabü'l-Müqəffai'l-Kəbir*, (Nşr. M. ibn Təlhə), C. V, s. 228-229, Beyrut 1991.

[394] Səduq-lüğət manası "son dərəcə doğru sözlü, çox mötəbər"dir. Hədis elmində ifadə etdiyi məna isə belədir; imam Zəhəbi və İraqiyə görə tə'dil, yəni ədalətlilik keyfiyyətinə görə 3-cü, imam Səxaviyə görə isə 5-ci dərəcədə olan hədis ravisinə "səduq" deyilə bilər. "Səduq"un da dərəcələri var. Daha ətraflı məlumat üçün bax: Abdullah AYDINLI, *Hadis Istılahları Sözlüğü*, s. 132, İstanbul 1987.

Hüseyn əl-Hərrani və Ömər ibn Əbu E'lan əs-Səqəfi kimi mühəddislərdən hədis dinləmiş və nəql etmişdi[395].

**Hafiz Əbü'l-Hüseyn Əhməd ibn Əli ibn Əsəd Bərdəi**

Məşhur hədis hafizi idi. Hirarə ləqəbi ilə tanınırdı. Hədis dinləmək üçün səyahət etmişdi. Müxəllid ibn Malik, Əli ibn Hərb, Əbü'l-Hüseyn ibn Faris, Əhməd ibn Mun'i və başqalarından hədis dinləmiş və nəql etmişdi. Əbü'l-Hüseyn ibn Faris onun hafizliyini təsdiqləmişdi. Hafiz Nəsr ibn Əhməd, Məkki ibn Əbdan və başqaları da ondan hədis dinləmiş və nəql etmişdilər[396]. VIII-IX əsrlərdə yaşamışdır.

**Hafiz Əbu Bəkr Əbdüləziz ibn Həsən Bərdəi**

Yaşadığı dövrün böyük hədis hafizlərindən biri idi. Hədis dinləmək üçün çox səyahət etmiş və öz dövrünün məşhur mühəddislərindən bir çoxunun tələbəsi olmuşdu. Dəməşqdə Muhəmməd ibnü'l-Abbasdan, Misirdə hafiz Muhəmməd ibn Əhməd, Əbu Yaqub İshaq ibn İbrahim Bağdadidən, Mosulda Əhməd ibn Ömər Məvsilidən hədis dinləmiş və nəql etmişdi. Ğəssan ibnü'r-Rəbi', hafiz Əbu Əli Hüseyn ibn Əli, Əbu İshaq İbrahim ibn Muhəmməd əl-Müzəkki, hafiz Əbu Muhəmməd Abdullah ibn Səid ondan hədis dinləmişdilər. Dövrün müşhur mühəddislərindən Əbu Bəkr Muhəmməd ibn İshaq ibn Xuzeymə ilə çox səmimi münasibəti var idi. Alim uzun müddət Xorasanın Nişapur şəhərində yaşamış, h. 318-ci ildə (930) Nişapuru tərk edərək Fəravə şəhərinə gəlmişdi. Fəravə ribatında[397] bir müddət yaşadıqdan sonra alim Nəsa[398] şəhərinə köçmüş və h. 323-cü ildə (935) burada vəfat etmişdi[399].

**Hüseyn ibn Əhməd ibn Kamil Bərdəi**

---

[395] Ağa Bozorg TEHRANİ, *Təbəqatü'l-İ'lami'ş-Şafi'iyyə*, (Hzr. Ə. T. Fənrəvi), s. 212, 214, 234, Beyrut 1971; BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 35-36.

[396] İBN MAKULA, *İkmal*, C. I, s. 176; s. 198, Əhməd ibn Əli İBN HƏCƏR əl-Əsqəlani, *Nüzhətü'l-Əlbab fi'l-Əlqab*, (Nşr. Ə. Sudeyri), s. 198, Riyad 1989.

[397] Ribat-sərhəd qala-zastavası. Fəravə ribatı indiki Türkmənistanın Sərdar rayonu ərazisində yerləşirdi.

[398] Nəsa-qədim Xorasanın şəhərlərindən biri idi. Xarabalıqları Türkmənistanın paytaxtı Aşqabadın 15 km qərbində, Bagir kəndi yaxınlığında yerləşir. Qədim adı Parthaunisa olan şəhər Parfiya kralı I Mitridatın paytaxt şəhəri olmuşdu.

[399] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 411-414; ƏBU NUEYM İSBƏHANİ, *Hilyətü'l-Əvliya*, C. V, s. 63.

Hədis ravisi idi. Hüseyn ibn Abdullah ibnü'l-Xuseybdən hədis nəql etmişdi. Muhəmməd ibn Muhəmməd əs-Səkkak da ondan hədis nəql etmişdi[400]. Yaşadığı dövrü müəyyən etmək mümkün olmamışdır.

**Hafiz Əbu Bəkr Məkki ibn Əhməd ibn Sə'dveyh Bərdəi**

Yaşadığı dövrün böyük hədis hafizlərindən biri idi. Hədis dinləmək məqsədiylə İslam coğrafiyasının bir çox yerlərinə səyahət etmişdi. Dəməşqdə Əhməd ibn Ümeyr, Muhəmməd ibn Yusif əl-Hərəvidən, Trablusda Əbü'l-Qasım Abdullah ibn Hüseyn ibn Əbdürrəhman əl-Bəzzazdan, Bağdadda Əbü'l-Qasım Bəğəvi, Səid ibn Əbdüləziz əl-Hələbi, Əbu Muhəmməd Saəda, Əbu Yə'la Muhəmməd ibnü'l-Fəzl, Əbu Ərubə Hüseyn əl-Hərrani, Əbu Cə'fər ət-Təhavi[401], Əbdülhəkim ibn Əhməd əl-Misri, Muhəmməd ibn Əhməd ibn Rica əl-Hənəfi, Muhəmməd ibn Ümeyr əl-Hənəfidən, Misirdə U'rs ibn Fəhd əl-Məvsilidən hədis dinləmişdi. Ustad Əbü'l-Vəlid Həssan ibn Muhəmməd əl-Fəqih, Hakim Əbu Abdullah, Əbü'l-Fəzl Nəsr ibn Muhəmməd əl-Əttar ondan hədis dinləmiş və nəql etmişdilər. Əbu Bəkr Məkki Bərdəi h. 330-cu ildə (942) Xorasanın Nişapur şəhərinə köçmüş və orada məskunlaşmışdı. H. 350-ci ildə (961) Nişapuru tərk edib Mavərünnəhrə səyahət etmişdi. Xorasanda ikən hədis elminə dair bir neçə əsər qələmə almışdı. H. 354-cü ildə (965) Şaş[402] şəhərində vəfat etmişdi[403]. Nəql silsiləsində Əbu Bəkr Məkki Bərdəinin də olduğu hədislərdən biri aşağıdakıdır:

Abdullah ibn Əmr (ا) dedi: Allah Rəsulu (ق) buyurdular: "Allah elmi insanlar(ın beynindən, zehnindən)dan zorla çəkib almaz. Lakin aralarından alimləri almaqla elmi də alıb aparar. (Cəmiyyətdə) alim qalmayandan sonra insanlar cahilləri özlərinə rəhbər

---

[400] ƏBU NUEYM İSBƏHANİ, *Hilyətü'l-Əvliya*, C. IV, s. 168.

[401] Əslən Misirlə olan imam Əbu Cə'fər Əhməd ibn Muhəmməd ibn Sələmə ibn Əbdülməlik əl-Əzdi ət-Təhavi (853-933) əhli-sünnə alimlərinin məşhurlarından idi. "Əhkamu'l-Qur'an", "Nəvadiru'l-Fiqhiyyə", "Məani'l-Asar" kimi 15-dən çox əsərin müəllifidir. Həmçinin "Əqidətü't-Təhaviyyə" adlı əhli-sünnə əqidəsinə dair əsərin müəllifidir.

[402] Şaş-indiki Özbəkistanın paytaxtı Daşkəndin qədim adı.

[403] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 271; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 212; TEHRANİ, *Təbəqatü'l-İ'lam*, s. 189.

qəbul edərlər. Onlar da savadsızca hökm verərlər, həm özləri yollarını azarlar, həm də insanları yollarından (zəlalətə) sapdırarlar”[404].

**Əbu Talib Səid ibn Muhəmməd Bərdəi**

Hənəfi məzhəbinə mənsub mühəddis və fəqih idi. İmam Əbu Cə’fər Əhməd ibn Muhəmməd Təhavinin yaxın dostlarından idi. Bağdadda imam Təhavidən hədis dinləmiş və nəql etmişdi. Hafiz Əbu Muhəmməd Abdullah ibn Muhəmməd əl-Haris, Əbu Talib Səid Bərdəidən hədis dinləmişdi[405]. Mənbələrdə Əbu Talib Səid Bərdəinin ölüm tarixi qeyd olunmamışdır. İmam Təhavinin (853-933) müasiri olduğuna görə onun da IX-X əsrlərdə yaşadığını söyləmək olar.

**Əbü’l-Həsən Əhməd ibn Ömər ibn Əbdürrəhman Bərdəi**

Mö’təzilə məzhəbi alimlərinin məşhurlarından, fəzilətli və nəcib insan idi. Əbbad ibn Süleymanın tələbəsi olmuşdu. Əbbad ibn Süleyman isə Haşim əl-Fuvatinin yetirməsi idi. Xətib Bağdadi Əbü’l-Həsən Əhməd Bərdəinin Əbu Əli əl-Cübbaidən[406] də dərs aldığını qeyd etmişdir[407]. Əbü’l-Həsən Əhməd Bərdəi Bağdaddakı kəlam alimlərinin qabaqcılı idi. Tez-tez elmi diskussiyalarda iştirak edirdi. Belə diskussiyalardan birində Əbü’l-Abbas Hələbi ona belə bir sual vermişdi: “Fe’ldən əvvəl istitaənin[408] mövcud olmasına dair dəliliniz nədir?”. Əbü’l-Həsən Əhməd Bərdəi cavab verdi: “Allahın kəlamı olan Qur’ani-Kərim”, sonra bu ayəni oxudu: “Cinlərdən olan bir ifrit dedi: “Sən yerindən qalxmamış mən onu sənə gətirərəm. Mən bu işi görməyə çox qüvvətliyəm, etibarlıyam!”[409]. Əbü’l-Abbas Hələbi dedi: “İfrit yalan danışmışdır. Onun sözü dəlil

---

404 İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LX, s. 236. (إِنَّ اللَّهَ لا يَقْبِضُ الْعِلْمَ انْتِزَاعًا مِنَ النَّاسِ , لَكِنْ يَقْبِضُ الْعِلْمَ بِقَبْضِ الْعُلَمَاءِ ، حَتَّى إِذَا لَمْ يَتْرُكْ عَالِمًا ، اتَّخَذَ النَّاسُ رُءُوسًا جُهَّالا ، فَأَفْتَوْا بِغَيْرِ عِلْمٍ ، فَضَلُّوا وَأَضَلُّوا). Bu hədis üçün bax: BUXARİ, *Səhih*, Elm, 34; MÜSLİM, *Səhih*, Elm, 47/ 2673; TİRMİZİ, *Sünən*, Elm, 5/ 2652.

405 İBN ƏBÜ’l-VƏFA, *Cəvahirü’l-Muziyyə*, C. II, s. 224.

406 Əbu Əli Muhəmməd ibn Abdullah Cübbai (850-916) mö’təzilə məzhəbinin əsasını qoymuş nəzəriyyəçi alimlərindən idi.

407 XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. IV, s. 290.

408 İstitaə-hər hansı bir işi görmədən, əməli törətmədən, fe’li işləmədən əvvəl bunu edə biləcək qüdrətə sahib olma. Mö’təzilə məzhəbinə görə insan hər hansı bir işi, əməli etmədən əvvəl bunu edə biləcək qüdrətə malik olmuş olur. Belə ki, insan həmçinin öz əməlinin yaradıcısıdır.

409 *Qur’ani-Kərim*, Nəml surəsi, ayə 39. (قَالَ عِفْرِيتٌ مِنَ الْجِنِّ أَنَا آتِيكَ بِهِ قَبْلَ أَنْ تَقُومَ مِنْ مَقَامِكَ وَإِنِّي عَلَيْهِ لَقَوِيٌّ أَمِينٌ)

kimi qeyri-məqbuldur”. Əbü’l-Həsən Əhməd Bərdəi cavab verdi: “Digər bir çox ayədə Allah yalançıların yalanını üzünə vurub onları təkzib edir”. Sonra bu ayələri oxudu:

“Yəhudilər dedilər: “Allahın əli bağlıdır!” (xəsisdir) Bu dedikləri sözə görə onların öz əlləri bağlandı və lənətə gəldilər. Xeyr, Allahın əlləri açıqdır. İstədiyi kimi lütf edər”[410]. “Bununla belə, onlar (münafiqlər): “Əgər gücümüz çatsaydı, biz də sizinlə bərabər (hərbi) səfərə çıxardıq”, - deyə Allaha and içəcəklər. Onlar (yalandan Allaha and içməklə) özlərini həlak edirlər. Allah isə onların yalançı olduqlarını bilir”[411]. “Onlar, şübhəsiz ki, yalançıdırlar!”[412]. “Onlar isə, şübhəsiz ki, yalançıdırlar!”[413]. “(dedilər ki,) Allah övlad törətmişdir”. Onlar, həqiqətən, yalançıdırlar!”[414].

Sonra Əbü’l-Həsən Bərdəi, Əbü’l-Abbas Hələbiyə dedi: “Amma gördüyün kimi burada Allah və onun elçisi Süleyman (×) ifriti təkzib və onun sözlərini inkar etməmişdilər”. Onun bu çıxışından sonra Əbü’l-Abbas Hələbi diskussiyanı dayandırmışdı[415]. Təəssüf ki, Əbü’l-Həsən Əhməd Bərdəinin yaşadığı dövr və ölüm tarixi ilə bağlı mənbələrdə hər hansı bir qeydə rast gəlmədik. Onun ustadının ustadı olan Haşim ibn Əmr əl-Fuvatinin Abbasi xəlifələrindən Mə’munla (813-833) səmimi münasibəti olmuş və xəlifənin sarayında onunla bir neçə dəfə görüşmüşdü[416]. Bundan başqa Xətib Bağdadinin onun mö’təzilənin məşhur simalarından Əbu Əli Cübbainin (850-916) müasiri olduğunu qeyd etməsini[417] nəzərə alaraq Əbü’l-Həsən Əhməd Bərdəinin də təqribən IX-X əsrlərdə yaşadığını söyləmək olar.

**Əbü’l-Fəvaris Bərdəi**

[410] *Qur’ani-Kərim*, Maidə surəsi, ayə 64. (وَقَالَتْ الْيَهُودُ يَدُ اللَّهِ مَغْلُولَةٌ غُلَّتْ أَيْدِيهِمْ وَلُعِنُوا بِمَا قَالُوا بَلْ يَدَاهُ مَبْسُوطَتَانِ يُنفِقُ كَيْفَ يَشَاءُ)
[411] *Qur’ani-Kərim*, Tövbə surəsi, ayə 42. (لَوْ اسْتَطَعْنَا لَخَرَجْنَا مَعَكُمْ يُهْلِكُونَ أَنفُسَهُمْ وَاللَّهُ يَعْلَمُ إِنَّهُمْ لَكَاذِبُونَ)
[412] *Qur’ani-Kərim*, Ənam surəsi, ayə 28. (وَإِنَّهُمْ لَكَاذِبُونَ)
[413] *Qur’ani-Kərim*, Mu’minun surəsi, ayə 90. (وَإِنَّهُمْ لَكَاذِبُونَ)
[414] *Qur’ani-Kərim*, Saffət surəsi, ayə 152. (وَلَدَ اللَّهُ وَإِنَّهُمْ لَكَاذِبُونَ)
[415] Əhməd ibn Yəhya İBNü'l-MÜRTƏZA, *Kitab Təbəqatü’l-Mu’təzilə*, s. 91, Beyrut 1987; İmadəddin Əbü’l-Həsən QAZİ ƏBDÜLCƏBBAR ibn Əhməd Əstərabadi, *Təbəqatü’l-Mu’təzilə*, s. 300-301, Tunis 1974.
[416] İBNü'l-MÜRTƏZA, *Kitab Təbəqatü’l-Mu’təzilə*, s. 61.
[417] XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. IV, s. 290; İBN HƏCƏR, *Lisanü’l-Mizan*, C. I, s. 181.

Mö'təzilə məzhəbinə mənsub mütəkəllim idi. Dəməşqdə Yəzid ibn Əhməd əs-Süləmidən hədis dinləmiş və nəql etmişdi. Əbu Bəkr ibnü'l-İxşid[418] ondan hədis dinləmişdi[419]. Ölüm tarixi məlum deyil. IX əsrdə yaşamışdır.

**Qalib ibn Muhəmməd Bərdəi**

Hədis ravisi idi. Muhəmməd ibn Məsləmə ibn Varət ər-Razidən hədis dinləmiş və nəql etmişdi. Əbü'l-Qasım Süleyman ibn Əhməd ibn Əyyub ət-Təbəri də ondan hədis dinləmişdi[420]. Onun haqqında məlumat verən Xətib Bağdadi ölüm tarixini qeyd etməmişdir. Lakin Qalib Bərdəinin hədis dinlədiyi Muhəmməd ibn Məsləmə ər-Razinin h. 265-ci ildə (879) vəfat ediyini nəzərə alaraq onun da IX əsrdə yaşadığını təxmin etmək olar. Qalib ibn Muhəmməd Bərdəinin, Muhəmməd ibn Məsləmə ər-Razidən eşidərək nəql etdiyi hədislərdən biri aşağıdakıdır:

Cabir ibn Abdullah (ا) dedi: Allah Rəsulu (ق) belə buyurdular: "Allaha güvənərək və səvabını Allahdan gözləyərək bu üç işi görənə kömək etmək və onu mübarək qılmaq Allahın üzərinə haqq olar: 1. Allaha güvənərək və səvabını Allahdan gözləyərək bir köləni azad edib onu hürriyətinə qovuşdurana kömək etmək və onu mübarək qılmaq Allahın üzərinə haqq olar. 2. Allaha güvənərək və səvabını Allahdan gözləyərək evlənib ailə qurana kömək etmək və onu mübarək qılmaq Allahın üzərinə haqq olar. 3. Allaha güvənərək və səvabını Allahdan gözləyərək ölü, xam torpağı əkin-biçinə yararlı hala gətirib ihya edənə kömək etmək və onu mübarək qılmaq Allahın üzərinə haqq olar"[421].

**Əbu Bəkr Muhəmməd ibn Həsən ibn Həmmad Bərdəi**

---

[418] Əbu Bəkr Muhəmməd ibn Əbi Muhəmməd Tuğac ibn Eltəkin ibn Fəvran əl-Fərqani (öl. 861) Abbasi xəlifələrindən Mö'təsim Billah ibn Harun ər-Rəşidin (833-842) türk komandanlarından biri idi. Onun xəlifəliyi dövründə Misir, Şam və Hicaz vilayətləri ümum-canişini olmuşdu. Bax: Şəmsəddin Əhməd İBN XƏLLİKAN, *Vəfayatü'l-Əyan və Ənba Əbnaü'z-Zaman*, C. V, s. 56-59, Beyrut 1974.

[419] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LVII, s. 135.

[420] XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. XII, s. 332.

[421] XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*. Bu hədis üçün bax: TƏBƏRANİ, *Mu'cəmü's-Səğir*, hədis Nr. 510, C. II, s. 188-189.
(ثلاث من فعلهن ثقة بالله واحتسابا كان حقا على الله ان يعينه وان يبارك له من سعى في بكاك رقبة ثقة بالله واحتسابا كان حقا على الله ان يعينه وان يبارك له ومن تزوج ثقة بالله واحتسابا كان حقا على الله ان يعينه وان يبارك له ومن احيا أرضا ميتة ثقة بالله واحتسابا كان حقا على الله ان يعينه وان يبارك له)

Hədis ravisi idi. Əbdüləziz ibn Abdullah Haşimi, Əhməd ibn Muhəmməd ibn Qalib əl-Bahili, Muhəmməd ibn Hişam ibn Əbi'd-Dumeyk əl-Müsəmlidən hədis dinləmiş və nəql etmişdi. Əbu Həfs ibn Şahin və Əbu Həfs əl-Kinani əl-Muqri ondan hədis dinləmişdilər[422]. Xətib Bağdadi onun ölüm tarixini qeyd etməmişdir. Əbu Həfs ibn Şahinin (öl. 995) müasiri olduğu üçün onun IX-X əsrlərdə yaşadığını təxmin etmək olar.

**Muhəmməd ibn Əbdüləziz ibn Cə'fər ibn Muhəmməd ibn Həsən Bərdəi**

Mühəddis idi. Qazi Əbu Bəkr Muhəmməd Əbhəri[423] (öl. h. 985), Əli ibn Qərqər əd-Dəqqaq, Muhəmməd ibn Abdullah ibn Şuxeyr əs-Seyrəfi, Muhəmməd ibn Əhməd ibn İmran, Əli ibn İbrahim Əttar, Əbu Bəkr ibn Şazan, Əbü'l-Müfəzzəl əş-Şeybani, Əhməd ibn Muhəmməd Meyridən hədis dinləmiş və nəql etmişdi. Muhəmməd ibn Əbdüləziz hədis dinləmək üçün etdiyi səyahətdən vətənə qayıdandan sonra qardaşı Übeydullah ibn Əbdüləziz Bərdəi h. 358-ci ildə (969) Bərdədə ondan hədis dinləmişdi. Muhəmməd ibn Əbdüləziz Bərdəi daha sonra Bağdada getmiş və h. 21 cəmadiələvvəl 421-ci ildə (27 may 1030) burada vəfat etmişdi[424].

**Əbü'l-Qasım Übeydullah ibn Əbdüləziz ibn Cə'fər ibn Muhəmməd ibn Həsən Bərdəi**

Mühəddis, səduq hədis ravisi idi. H. 363-cü ildə (974) anadan olmuşdu. Qardaşı Muhəmməd ibn Əbdüləzizdən, Muhəmməd ibn Übeydullah ibnü'l-Şüxeyr əs-Seyrəfi, Muhəmməd ibn Müzəffər, Əbu Bəkr ibn Şazan, Əbü'l-Fəzl əş-Şeybani, Əbu Bəkr ibn Əbi Musa Haşimidən hədis dinləmiş və nəql etmişdi. Alim h. 434-cü ilin zilhiccə ayında (1043) vəfat etmişdi[425].

**Əhməd ibn Muhəmməd ibn Əbdürrəhim Bərdəi**

---

[422] XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. II, s. 198.

[423] ZƏHƏBİ, *Mizanü'l-E'tidal*, C. III, s. 432

[424] XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. II, s. 353; Əbü'l-Hüseyn Muhəmməd ibn Muhəmməd İBN ƏBİ YƏ'LA, *Təbaqatü'l-Hənabilə*, s. 203, Qahirə 1952; İBN HƏCƏR, *Lisanü'l-Mizan*, C. V, s. 204.

[425] XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. X, s. 384.

Mühəddis idi. Təhsil almaq üçün Əndəlüsə getmiş və buradakı Mursiyyə[426] şəhərində yaşamışdı. Əndəlüs mədrəsələrində Əbü'l-Həsən Əli ibn Muhəmməd ibn Şəfyi' əl-Busti[427], İbn Müvəhhəb və imam Əbü'l-Vəlid Yunis ibn Abdullah ibn Muğis Qurtubi[428] kimi alimlərin tələbəsi olmuş, hədis, fiqh, üsul və ədəbiyyat dərsləri almışdı. Təhsilin başa vurduqdan sonra İspaniyada qalmış və buradakı mədrəsələrdə tədrislə məşğul olmuşdu. Onun tələbələri arasından Əbu Abdullah əl-Əndərəşi[429] (1149-1224) kimi alimlər yetişmişdi[430].

Əhməd Bərdəinin ölüm tarixi məlum deyil. Onun yaşadığı dövrün müəyyənləşdirilməsində də müəyəyyən tərəddüd meydana çıxmışdır. Bu tərəddüd İbn Həcər Əsqəlaninin verdiyi məlumatdan irəli gəlir. İbn Həcərin yazdığına görə Əhməd ibn Muhəmməd Bərdəi Əndəlüsdə, eləcə də bütün İslam dünyasında, tanınmış alim olan imam Əbü'l-Vəlid Yunis Qurtubinin tələsəni olmuşdur. Yenə müəllif Əndəlüs ərəb şe'rinin tanınmış simalarından olan Əbu Abdullah əl-Əndərəşinin Əhməd Bərdəidən dərs aldığını qeyd etmişdir. Əbü'l-Həsən ibn Abdullah ən-Nəbahi öz əsərində Əbü'l-Vəlid Yunis Qurtubinin Əndəlüs Əməvi xəlifələrinin sonuncusu III Hişam ibn Muhəmməd əl-Mərvani tərəfindən h. 419-cu ildə (1028) Əndəlüs baş qaziliyinə təyin olduğunu və alimin h. 429-cu ildə (1038) vəfat etdiyini qeyd etmişdir[431]. Əbu Abdullah əl-Əndərəşi isə 1149-1224-cü illərdə yaşamışdır. Əhməd Bərdəinin bircisinin ölüm, ikincisinin isə təvəllüd tarixi arasında 111 il olan iki ayrı şəxsin müasiri olması mümkün olmadığı üçün düşünürük ki, İbn Həcər əl-Əsqəlani burada xətaya yol vermişdir. Ehtimal ki, Əbu Abdullah əl-Əndərəşi Əhməd Bərdəidən deyil, onun yetişdirdiyi hədis alimlərinin birindən hədis dərsləri almışdı. Çünki adı çəkilən digər iki şəxslə imam

---

[426] Mursiyyə- [مرسية] indiki İspaniyanın cənubi-şərqindəki Murcia şəhəridir. 1492-ci ilə qədər Əndəlüsdəki Qranda əmirliyini mühüm elm və mədəniyyət mərkəzlərindən biri idi.
[427] Öz dövrünü məşhur ədib və şairlərdən biri idi. Əndəlüsün əl-Busta (indi İspaniyada Baza şəhəri) şəhərində doğulub böyümüşdü.
[428] İmam Əbü'l-Vəlid Yunis ibn Abdullah ibn Muğis Qurtubi (öl. 1038) yaşadığı dövrün tanınmış alimlərindən idi. Əslən Əndəlüsün Qurtuba (indi İspaniyada Kordova) şəhərindən olub hədis elmləri sahəsində dərinləşmişdi. İspaniyanın qaziü'l-quzatlığına təyin olunmuş və vəfatına qədər bu vəzifəni icra etmişdi. İmam Əbü'l-Vəlid Yunis Qurtubi təfsir, hədis, fiqh və.s sahələrə dair bir sıra əsərlərin müəllifi idi.
[429] Yaşadığı dövrdə Əndəlüsün tanınmış mühəddislərindən biri olmuşdu. Onun doğulub böyüdüyü Əndərəş indiki İspaniyanın Andaraks şəhəridir.
[430] İBN HƏCƏR, *Lisanü'l-Mizan*, C. I, s. 206.
[431] Əbü'l-Həsən ibn Abdullah ən-Nəbahi əl-ƏNDƏLÜSİ, *Tarixu Quzatu'l-Əndəlus*, s. 95, Beyrut 1983.

Əbü'l-Vəlid Yunis Qurtubi müasir olmuşdurlar. Beləcə Əhməd Bərdəinin X-XI əsrlərdə yaşadığını təxmin etmək olar.

**Əbu Cə'fər Muhəmməd ibn Xalid ibn Yəzid Bərdəi**

Siqa hədis ravisi idi. Məkkədə məskunlaşmışdı. Muhəmməd ibn Səid ibnü'l-Əməş, Əbu Sələmə Übeydullah ibn Xələsə, Asim ibn Rəvvad ibnü'l-Cərrah, Əbu Abdullah Xələf, Ətiyyə ibn Bəqiyyədən hədis dinləmiş və nəql etmişdi. Əbü'l-Qasim Təbərani Misirdə onun hədis dərslərində iştirak etmişdi. Əbu Muhəmməd Abdullah ibn Əbdan əl-Muqri, Əbu Əli Hüseyn ibn Əli Nişaburi (öl. 960) ondan hədis nəql etmişdilər. Alim h. 317-ci il zilhiccə ayının 8-i (11 yanvar 930) Məkkədə həcc ziyarətini yerinə yetirərkən qərmətilər tərəfindən şəhid edilmişdi[432].

**Əbu Bəkr Muhəmməd ibn Abbas ibnü'l-Fəzl əl-Ətrablisi Bərdəi**

Hədis ravisi idi. Əbu Bəkr Muhəmməd Bərdəi Ətrablisdə[433] yaşamış və burada Səid ibn Əmr əs-Səkvənidən hədis nəql etmişdi. Əbdülvəhhab əl-Kilabi, Əbü'l-Qasım Əbdülvahid ibn Əhməd ibnü'l-Əvf əl-Müzəni, Əbü'l-Vəfa Hüffaz ibn Həsən və Əbdüləziz ibn Əhməd ondan hədis dinləmiş və nəql etmişdilər[434]. Ölüm tarixini və yaşadığı dövrü müəyyən etmək mümkün olmamışdır.

**Mövlana Muhyəddin Muhəmməd ibn Muhəmməd ibn Muhəmməd əl-Hənəfi Bərdəi**

Fəzilət sahibi, gözəl əxlaqlı, lütfkar, təvazökar bir şəxs idi. Alim ailəsində böyümüşdü, mənsub olduğu ailədə alimlər yetişmişdi. İlk təhsilini atasından almışdı. Daha sonra Şiraza getmiş və bu şəhərin alimlərinin yanında müxtəlif elm sahələrinə aid biliklərə yiyələnmişdi. Daha sonra Anadoluya getmiş və Bursa şəhərində Əhməd paşa mədrəsəsinin müdərrisi olmuşdu. Bir müddət sultan Yavuz I Səlimin (1512-1520) əmri

---

432 ZƏHƏBİ, *Mizanü'l-E'tidal*, C. I, s. 178; ƏBU NUEYM İSBƏHANİ, *Hilyətü'l-Əvliya*, C. IV, s. 186; Əbu Hatim Muhəmməd İBN HİBBAN ət-Təmimi əl-Busti, *Kitabu's-Suqat*, C. IX, s. 126, Heydərabad 1975; MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. V, s. 620. Qərmətilər tərəfindən həmin bu qətliamda öldülülən digər bir azərbaycanlı alim Əbu Səid Əhməd Bərdəi olmuşdu.

433 Ətrablis və ya Trablis (Tripoli)-Livanın şimalında, Aralıq dənizi sahilində şəhər.

434 İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LIII, s. 301.

ilə İstanbulda saray məmurlarının təlimi ilə məşğul olmuşdu. Sonra Ədirnəyə köçmüş və buradakı mədrəsələrdə dərs vermişdi. Ərəb və fars dillərində təfsir, ərəb dili, fiqh üsulu kimi elm sahələrinə dair bir sıra əsərlər qələmə almışdı. Yazdığı bir qəsidə Yavuz Səlimin o dərəcədə xoşuna gəlmişdi ki, özü də şair olan sultan mükafat olaraq ona 300 qızıl əşrəfi[435], bir samur kürk və hər üç ayda bir 80 aqça ülufə bağışlamışdı. Qazi Bəyzavinin "Ənvarü't-Tənzil və Əsrarü't-Tə'vil" adlı Qur'an təfsirinə haşiyə, Əzudəddin əl-İcinin[436] "Adabü'l-Bəhs" adlı əsərinin şərhinə haşiyə, Seyyid Şərif Cürcaninin "Təcrid"[437]inə yazılmış şərhə haşiyə, "Haşiyə ələ't-Təlvih" alimin əsərlərindən bəziləridir[438]. Əhməd Ədnirəvi onun gözəl xətti olduğunu, fəzilətli, xoş söhbətli, təmiz əqidəli və əxlaq sahibi insan olduğunu qeyd etmişdir[439]. Mövlana Muhyəddin Bərdəi H. 927-ci ildə (1521) Ədirnədə vəfat etmişdi. Onun övladlarından Şəmsəddin Həmdi də "Bərdəizadə" ləqəbi ilə tanınmış şair idi və farsca çox gözəl şerlər qələmə almışdı[440]. Muhyəddin Bərdəinin "Haşiyə ələ şərhi İsağoci li'l-Kati" adlı əsəri İstanbul Köprülü yazma əsərlər kitabxanası və Konya Yusifağa kitabxanasında, "Haşiyə ələ şərhi Adabi'l-Bəhs lil-İci", "Risalətü'l-Kəlamiyyə" və "Şərhu'l-Adabu'l-Əzudiyyə" adlı əsərləri İstanbul Köprülü yazma əsərlər kitabxanasıında saxlanılır.

**İmamü's-Sibt Əbu Bəkr Əhməd ibn Harun ibn Ruh[441] Bərdici**

Yaşadığı dövrün böyük hədis hafizlərindən biri idi. Hədis elmləri sahəsində bütün İslam dünyasında mərci' hesab olunurdu. Bəzi mənbələr onun nisbəsini həm də "Bərdəi" olaraq qeyd edirlər. Əbu Bəkr Bərdici hədis dinləmək üçün uzun səyahətlərə çıxmış, Beyrut, Dəməşq, Hələb, Hums, Qahirə, Hərran, Kufə kimi İslam coğrafiyasının

---

435 Əşrəfi-Osmanlı imperatorluğunda bir neçə növ əşrəfi adlanan qızıl pul zərb edilmişdir. İlk "əşrəfi" (1=3,35 gr qızıl) Yavuz I Səlimin hakimiyyəti illərində, Misirin Osmanlı dövlətinə birləşdirilməsindən sonra, zərb edilmişdi.

436 Qazi Əzudəddin Əbü'l-Fəzl Əbdürrəhman ibn Əhməd ibn Əbdülğəffar əl-İci (1300-1355). Əslən İranın Şiraz vilayətinin İc qəsəbəsindəndir. Şafi'i məzhəbinə mənsub fəqih idi. Fiqh, fiqh üsulu, təfsir, tarix, əxlaq kimi sahələrə dair bir sıra əsərlərin müəllifidir. Ən məşhur əsəri əqidəyə dair qələmə aldığı "Əqaidü'l-Əzudiyyə" adlı əsəridir.

437 Nəsrəddin Tusinin (öl. 1274) "ət-Təcrid fi İlmü'l-Kəlam" adlı əsəridir.

438 KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 98; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 676.

439 Əhməd ibn Muhəmməd ƏDNİRƏVİ, *Təbəqatü'l-Müfəssirin*, s. 176, Beyrut (trz).

440 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s. 89; NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 340; İsaməddin Əhməd TAŞKÖPRÜZADƏ, *Şəqaiqü'n-Numaniyyə fi Üləmai-Dövləti'l-Osmaniyyə*, s. 240-241, Beyrut 1985. Taşköprülüzadə mövlana Muhyəddin Muhəmməd Bərdəinin h. 928 və ya 929-cu illərdə (1522 və ya 1523) vəfat etdiyini qeyd etmişdir.

441 Bəziləri bu adı "Rəvahə" kimi transkripsiya etmişdirlər. "Rəvahə" adı ərəb qrafikası ilə "رواحة" kimi yazılır. Buna görə də "روح" adını Ruh və ya Rəvəh kimi oxumaq daha münasib olacaqdır.

başlıca elm və mədəniyyət mərkəzlərindəki hədis almlərindən dərs almış və hədis dinləmişdi. Bu şəhərlərdə o, Abbas ibn Vəlid əl-Uzri, Yəzid ibn Muhəmməd ibn Əbdüssəməd, Süleyman ibn Bəhr, Süleyman ibn Şueybr əl-Kəttani, Süleyman ibn Seyf əl-Hərrani, Nəsr ibn Əli əl-Cəhzəmi, Yəhya ibn Abdullah əl-Kərabisi, Yusif ibn Səid ibn Müslim, İshaq ibn Səyyar ən-Nəsibi, Əmr ibn Abdullah əl-Əudi, Məhəmməd ibn İshaq əs-Səğani, Əbu Səid Abdullah əl-Əşca əl-Kindi, Əli ibn Əşkab, Harun ibn İshaq əl-Həmədani, Sə'd ibn Əyyub əl-Vasiti, Əbu Zurə' ər-Razi (öl. 878), Bəhr ibn Nəsr əl-Misri kimi mühəddislərdən hədis dinləmişdi. Alim iki dəfə İsfəhana gedərək bir müddət bu şəhərdə[442] sonra isə Nişapurda yaşamış buradakı mühəddislərdən hədis elminə dair bilikləri öyrənmişdi. Nişapurda dövrün məşhur mühəddislərindən Muhəmməd ibn Yəhya əz-Zıhlinin tələbəsi olmuşdu. Daha sonra Bağdadda məskunlaşmış, hədis elmlərinin tədrisi ilə məşğul olmuşdu. Cə'fər ibn Əhməd ibn Sənan əl-Quttan, Əbu Bəkr Muhəmməd ibn Abdullah əş-Şafi'i, Əli ibn Muhəmməd ibn Lü'lu əl-Vərraq, Əbü'l-Qasım Süleyman ət-Təbərani[443], Əbu Əli Muhəmməd ibn Əhməd ibnü's-Səvvaf kimi ravilər də ondan hədis dinləmiş və nəql etmişdilər. Əbü'l-Həsən Əli Darəqutni onu "əs-siqa", yəni mötəbər hədis mənbəyi adlandırmışdı. "əl-Müstədrək" adlı hədis külliyatının müəllifi olan Hakim Nişapurinin ustadı Əbu Əli əl-Hafiz Məkkədə ikən Əbu Bəkr Əhməd Bərdici ilə görüşmüş və ondan hədis dinləmişdi. Alim h. 230-cu ildə (845) anadan olmuş, h. 301-ci ilin ramazan ayında (aprel 914) Bağdadda vəfat etmişdi[444].

Əbu Bəkr Əhməd ibn Harun Bərdici aşağıda mətnini qeyd etdiyimiz məşhur hədisin ravilərindən biridir. Əbu Bəkr Əhməd Bərdici, Humeyd ibn Əyyaş ər-Rəmlidən, o, Muəmməl ibn İsmayıldan, o, Şu'bədən, o, Qatədədən, o, Humeyd ət-Tuveyldən, o, Müaviyyə ibn Qurtdan, o, Ənəs ibn Malikdən (ا), o, dedi: Allah Rəsuludan (ق) eşitdim, dedi ki; "Cənnətə daxil olmuş heç bir kəs, dünyanın bütün nemətləri ona və'd edilsə belə, dünyaya qayıtmaq istəməz. Yalnız şəhid istisna. Cənnətdə gördüyü ikram və təşrif

---

442 ƏBU NUEYM İSBƏHANİ, *Zikr Əxbaru-İsbəhan*, C. I, s. 113.

443 Əbü'l-Qasım Süleyman ibn Əhməd ibn Əyyub ət-Təbərani (873-971) böyük hədis alimlərindən biridir. Hədis elminə dair onlarla əsərin, o cümlədən "Mu'cəmü's-Səğir" adlı hədis külliyatının müəllifi.

444 ZƏHƏBİ, *Kitab Təzkərətü'l-Hüffaz*, s. 746-747; XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. V, s. 194; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 212-213; İBN MAKULA, *İkmal*, C. I, s. 130; Kəmaləddin Ömər ibn Əhməd İBNü'l-ADİM, *Buğyətü't-Tələb fi Tarixi-Hələb*, (Nşr. S. Zəkkar), C. I, s. 404-408, Beyrut 1987; SÜYUTİ, *Təbəqatü'l-Hüffaz*, s. 115; Əbu Muhəmməd Abdullah ibn Muhəmməd ƏNSARİ, *Təbəqatu'l-Mühəddisin bi-İsbəhan və'l-Varidin Əleyha*, s. 267-268, Beyrut 1989; MƏMMƏDOV, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, s. 6-7.

səbəbiylə (şəhid olaraq ölmək ona elə sevdirilir ki) on dəfə daha dünyaya qayıdıb şəhid olmaq istəyər”[445]. Bu gözəl kəlamın sahibinə Allahın səlat və səlamı olsun, onu sonrakı nəsillərə çatdıranlardan biri olduğu üçün Əbu Bəkr Əhməd Bərdicini rəhmətlə yad edirik.

Yaqut əl-Həməvi alimin h. 351-ci ilin ramazan ayında (oktyabr 962) vəfat etdiyini yazır[446]. İbn Kəsir isə onun h. 301-ci ildə (914) vəfat etdiyini, lakin adını “Əbu Bəkr Muhəmməd ibn Harun” olaraq qeyd edir[447]. Alimin ölüm tarixi və adı barədə başqa heç bir mənbədə Yaqut əl-Həməvi və İbn Kəsirin qeyd etdiyinə bənzər məlumata rast gəlinmir.

Əbu Bəkr Əhməd Bərdici hədis elmlərinə dair bir sıra əsərlər qələmə almışdır. Alim “Təbəqatu’l-Əsmai’l-Mufrədə minə’s-Səhabə və’t-Tabiin” adlı əsərin müəllifidir. Dünyanın bir çox kitabxanasında bu əsərin əlyazma nüsxəsi mövcuddur. Əsər Dəməşqdə 1987 və 1990-cı illərdə nəşr olunmuşdur. Əbu Bəkr Əhməd Bərdicinin hədis elminə dair “Cüz’ fihə min Rəvayə əni’n-Nəbi minə’s-Səhabə fi’l-Kəbair” adlı bir digər əsəri isə 2005-ci ildə ər-Riyadda Muhəmməd ibn Türk ət-Türki tərəfindən nəşr edilmişdir.

## Hafiz Əbu Bəkr Firuz Bərdici

Hədis hafizi, həmçinin ərəb filologiyası sahəsində mütəxəssis idi. İbnü’s-Səlah (öl. 1245) “Ülumu’l-Hədis”[448] adlı əsərini qələmə alarkən onun risalələrindən faydalanmışdı[449]. Ölüm tarixi məlum deyil. Təqribən IX-X əsrlərdə yaşamışdır.

## Əbu Əli Həsən ibn Əbü’l-Həsən Bərzəndi

---

[445] İbrahim CANAN, *Kutubi-Sitte, Tercüme ve Şerhi,* C. V, s. 44, Akçağ Yayınları 2004; BUXARİ, *Səhih*, Cihad bölümü, 5/21; MÜSLİM, *Səhih*, Əmarət bölümü, hədis Nr. 1877; TİRMİZİ, *Sünən,* Fəzailu’l-Cihad, hədis Nr. 1643; NƏSAİ, *Sünən*, Cihad bölümü, hədis Nr. 3109. (عن أَنَسَ بْنَ مَالِكٍ رَضِيَ اللَّهُ عَنْهُ عَنْ النَّبِيِّ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ (مَا أَحَدٌ يَدْخُلُ الْجَنَّةَ يُحِبُّ أَنْ يَرْجِعَ إِلَى الدُّنْيَا وَلَهُ مَا عَلَى الْأَرْضِ مِنْ شَيْءٍ إِلَّا الشَّهِيدُ يَتَمَنَّى أَنْ يَرْجِعَ إِلَى الدُّنْيَا فَيُقْتَلَ عَشْرَ مَرَّاتٍ لِمَا يَرَى مِنْ الْكَرَامَةِ))

[446] YAQUT əl-HƏMƏVİ, *Mu’cəmü’l-Büldan*, C. I, s. 410.

[447] İBN KƏSİR, *Bidayə və’n-Nihayə*, C. II, s. 218.

[448] Şeyx Təqiyəddin Əbu Əmr Osman ibn Əbdürrəhman ibnü’s-Səlah Şəhrizuri (1181-1245) tanınmış mühəddis idi. Bir sıra əsərlələrlə yanaşı Ülumu’l-Hədis (Hədis Elmləri) adlı əsərin müəllifi idi.

[449] HİMYƏRİ, *Nisbə ilə’l-Məvazi’*, C. I, s. 61.

Hədis ravisi idi. Təbəristanın Amul şəhərində Əbdürrəhman ibn Quyerş əl-Hərəvidən hədis dinləmişdi. Hafiz Əbu Əhməd Abdullah ibn Ədiy əl-Cürcani (890-976) də ondan hədis dinləmiş və nəql etmişdir[450]. IX-X əsrlərdə yaşamışdır.

**Əbü'l-Həsən Əli ibn Muhəmməd Bərzəndi**

Qari idi. Qur'ani-Kərimin qiraət və təcvidini Əbu Əli Həsən ibn Süleyman əl-Antakidən (öl. 1009) öyrənmişdi[451]. Əbü'l-Həsən Əli Bərzəndinin ölüm tarixi məlum deyil. O, X-XI əsrlərdə yaşamışdır.

**Əbü'l-Qasım Budeyl ibn Əli ibn Budeyl Bərzəndi**

Şafi'i məzhəbinə mənsub fəqih, həmçinin hədis ravisi idi. Bağdadda qazi Əbu Təyyib ət-Təbəri, Əbu Muhəmməd Həsən Cəvhəri və şeyx Əbu İshaq Şirazinin tələbəsi olmuş, ondan şafi'i fiqhini öyrənmişdi. Aşağıda haqqında məlumat verdiyimiz Əbu Mənsur Saleh Bərzəndinin atası idi. Əbu Talib əl-Əş'əri, Əbu İshaq əl-Bərməkidən hədis dinləmiş və nəql etmişdi. Təbriz şəhəri qazisi olan Əbü'l-Qasım Bərzəndi öz sahəsində dərin elmi biliyə malik, xoş söhbətli, ünsiyyətcil insan kimi tanınmışdı. Səduq, yəni doğru sözlü, səmimi və mötəbər mühəddislərindən biri idi. H. 475-ci (1082) ildə vəfat etmişdi[452].

**Əbu Mənsur Saleh ibn Budeyl ibn Əli ibn Budeyl Bərzəndi**

Hədis ravisi idi. Atası Bağdada gəlmiş, burada məskunlaşmış və Əbu Mənsur Saleh Bərzəndi də Bağdadda dünyaya gəlmişdi. Əbü'l-Qənaim Əbdüssəməd ibn Əli əl-Mə'mun, Əbu Mənsur Bəkr ibn Muhəmməd ibn Heydərdən hədis dinləmişdi. Əbü'l-

---

[450] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 215-216.
[451] Şəmsəddin Muhəmməd İBNü'l-CƏZƏRİ, *Qayətü'n-Nihayə fi Təbəqatü'l-Qurra*, s. 741, Beyrut 2006.
[452] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 115, 415; SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. X, s. 36; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 116. Cəmaləddin Əsnəvi, Yaqut əl-Həməvidən fərqli olaraq onun künyəsini "Əbü'l-Qasım" deyil "Əbü'l-Həsən" olaraq qeyd etmişdi.

Qasım ər-Ruveydəşti əl-İsfəhani ondan hədis dinləmiş və nəql etmişdi. Əbu Mənsur Saleh Bərzəndi h. 493-cü il şaban ayında (iyun 1100) Bağdadda vəfat etmişdi[453].

**İmam Şəmsəddin Əbu Tahir Zəki ibn Hüseyn ibn Ömər əl-Xərrəqi[454] Beyləqani**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Şəmsəddin Əbu Tahir Beyləqani 582-ci ildə (1157) Beyləqanda dünyaya göz açmışdı. O, Fəxrəddin ər-Razinin tələbəsi olmuş, ondan elm öyrənmək məqsədiylə doğma şəhərini tərk edərək Xorasana getmişdi. Təhsilini başa vurduqdan sonra Beyləqana qayıtmışdı. Sonra, ehtimal ki, moğolların dağıdıcı hücumları vaxtı, Misirə köçmüş və orada yaşamışdı. Daha sonra Yəmənin Ədən şəhərinə getmişdi. Ədəndə və sonra Məkkədə bir müddət qaldıqdan sonra Misirə qayıtmış və İsgəndəriyyə şəhərində yaşamışdı. O, Misirə qayıdanda onu izdihamlı insan kütləsi qarşılamışdı. Şəmsəddin Əbu Tahir Beyləqani qazilik vəzifəsinə təyin edilmiş və uzun müddət bu işdə çalışmışdı. O, əmisi oğlu Əbu Əhməd Zəki Beyləqaniyə vəfatından sonra ailəsi ilə birlikdə Ədənə köçməyi vəsiyyət etmişdi[455]. Onun ölüm tarixi 1259-1260-cı illərə təsadüf etir.

**Əbu Əhməd Zəki ibn Həsən ibn Ömər Beyləqani**

Şafi'i məzhəbinə mənsub mütəkəllim və fəqih idi. H. 582-ci ildə (1186) anadan olmuşdu. Fiqh üsulu və kəlam elmlərində dərinləşmişdi. Fəxrəddin Razinin[456] tələbələrindən biri olmuşdu. Müəyyəd ət-Tusidən hədis dinləmiş, Fəxrəddin Muhəmməd ibn Əbu Bəkr Nəvqanidən fiqh elmini öyrənmişdi. O, Fəxrəddin Muhəmməd Nəvqaninin yanında Əbu Hamid Qəzzalinin "əl-Vəciz" adlı əsərini oxumuşdu. Bundan başqa imam

[453] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 215-216; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 115, 415; BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 251.

[454] Himyəri "Xərrəq"in Beyləqanda bir məhəllə adı olduğunu qeyd etmişdir. Bax: *Nisbə ilə'l-Məvazi'*, C. I, s. 273.

[455] HİMYƏRİ, *Nisbə ilə'l-Məvazi'*, C. I, s. 143.

[456] Fəxrəddin Əbu Abdullah Muhəmməd ibn Ömər ər-Razi (1149-1209) İranın Rey şəhərində anadan olmuş, Əfqanıstanın Herat şəhərində vəfat etmişdi. Bütün dövrlərin məşhur təfsir alimi, böyük mütəfəkkir idi. Atası Reydə xətib idi, cümə xütbələrini oxuyurdu. Təhsilini dövrün ən tanınmış alimlərindən almışdı. Daha sonra səyahətə çıxmışdı. Xarəzmdə mö'təzilə məzhəbinə mənsub alimlərlə elmi diskussiyalar aparmış, onları dəfələrlə məğlub etmiş, sultan Əlaəddin Xarəzmşah ona böyük ehtiram göstərməsinə baxmayaraq Xarəzmi tərk etməyə məcbur edilmişdi. Guri hökmdarı sultan Qiyasəddin onu öz ölkəsinə dəvət etmiş, Heratda onun üçün mədrəsə tikdirmişdi. Heratda ifrat şiə cərəyanı olan kərramilərlə girişdiyi elmi mübahisələrdə qalib gəldiyi üçün burada da sıxışdırılmış və bir müddət Heratı tərk etməyə məcbur olmuşdu. Lakin Razi özünün dərin biliyi ilə getdiyi hər yerdə hökmdarlarlardan rəğbət görür, ətrafına çox sayıda tələbə kütləsi toplaşırdı. Fəxrəddin Razi müxtəlif elm sahələrinə aid 40-dan çox əsərin müəllifidir. Onun yetişdirmələri arasında çox sayıda azərbaycanlı alim vardı.

Muhəmməd ibn Yəhya Nişapuri və əllamə Qütbəddin İbrahim ibn Əli Əndəlusidən də müxtəlif elm sahələrinə dair bilikləri öyrənmişdi[457]. Əbu Əhməd Zəki Beyləqani həmçinin varlı tacir idi. H. 636-cı ildə (1239) ticarət məqsədiylə Dəməşqə səyahət etmişdi. O, köçüb Yəməndə məskunlaşmış, uzun ömür sürmüş və h. 675-ci ildə (1276) Ədən şəhərində vəfat etmişdi[458]. Ədəndəki mədrəsələrdən birində müdərris olan Zəki Beyləqani vəsərsəlik hüququ sahəsindəki dərin biliyi ilə yanaşı riyaziyyat, fiqh, fiqh üsulu, hədis, cədəl, məntiq kimi elm sahələrində dövrün tanınmış mütəxəssislərindən biri olmuşdu. Ədəndə onun dərslərində çox sayıda tələbə iştirak edirdi. Nurəddin Əbü'l-Həsən Haşimi, Əhməd ibn Muhəmməd əl-Hərrazi, Əbü'l-Xeyr ibn Mənsur Şəmmaxi, İsmayıl əl-Hədrami onun tələbəsi olmuşdular[459]. Yafi'i (öl. 1367) öz əsərində onun sultanla mübahisə etdiyini, bu mübahisədən sonra köçüb Yəməndə məskunlaşdığını qeyd edir. Lakin müəllif onun hansı sultanla və hansı mövzuda mübahisə etdiyini bildirmir. Yafi'i özü əslən Yəmənli idi, gəncliyi və tələbəlik illəri Ədəndə keçmişdi. Ehtimal ki, bu hadisə xeyli məşhur hadisə olmuşdur və Yafi'i təfərrüatına varmadan qısaca bunu öz əsərində qeyd etmişdi. Cəmaləddin Abdullah Himyəri isə onun əmisi oğlu Şəmsəddin Əbu Tahir Beyləqanin vəsiyyətinə əməl edərək, Misir Məmlüklü sultanı Müzəffər Seyfəddin Qutuzun (1259-1260) hakimiyyəti dövründə, özünün və əmisi oğlunun ailəsi ilə birlikdə Misirdən Yəmənə köçdüyünü qeyd etmişdir[460]. Sultan Müzəffər Qutuzun cəmi 1 il hakimiyyətdə qaldığını nəzərə alaraq bu hadisənin də 1259-1260-cı illərdə baş verdiyini təxmin etmək olar. Lakin Himyəri onun və ya əmisi oğlunun hakimiyyət dairələri ilə aralarında hər hansı bir ziddiyət olduğundan söhbət açmır. Bəhaəddin Cəndi öz əsərində Əbu Əhməd Zəki Beyləqani və əmisi oğlunun Misirdəki bəzi fəqihlərlə, xüsusilə də bir qazi ilə, aralarında dərin ziddiyətlər olduğunu, bu səbəbdən bu iki əmi oğlunun müxtəlif vaxtlarda Misiri tərk edərək Yəmənə köçdüklərini qeyd etmişdir. Bundan başqa Bəhaddən Cəndi sultan

---

457 Cəmaliddin Muhəmməd İBNü's-SABUNİ, *Təkmilətü'l-İkmalü'l-İkmal fi'l-Ənsab*, (Nşr. M. Cavad), s. 55, Bağdad 1957; HİMYƏRİ, *Nisbə ilə'l-Məvazi'*, C. I, s. 143. Bəzi mənbələrdə alimin babasının adı "Ömər", bəzilərində isə "İmran" kimi qeyd edilmişdir.

458 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. V, s. 632; Abdullah ibn Əsəd əl-YAFİ'İ, *Miratü'l-Cənan və İbrətü'l-Yəqzan*, C. II, s. 580, Beyrut 1997; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 133. Əsnəvi onun h. 676-cı ildə (1277) vəfat etdiyini qeyd etmişdir.

459 HİMYƏRİ, *yenə orada*; Əhməd ibn Əli İBN HƏCƏR əl-Əsqəlani, *Dürərü'l-Kaminə fi Əyanü'l-miəti's-Saminə*, C. II, s. 84, Heydərabad 1929.

460 HİMYƏRİ, *yenə orada*.

Müzəffər Qutuzun imam Şəmsəddin Əbu Tahir Zəki Beyləqaniyə dərin hörmət bəslədiyini, hətta tez-tez elmi mövzularda onun fikirlərinə müraciət etdiyini, Yəmənə köçəndən sonra da onu yenidən Misirə dəvət etdiyini yazır[461]. Digər tərəfdən Şəmsəddin Əbu Tahir Beyləqaninin hansı səbəbdən belə bir vəsiyyət etdiyi də sual doğurur. Ehtimal ki, sultan Müzəffər Qutuzun ölümündən (1260) sonra Əbu Əhməd Zəki Beyləqani Misir Məmlüklü sarayı tərəfindən göstərilən himayədən məhrum olmuş və Yəmənə getmək məcburiyyətində qalmışdı.

**Müəyyinəddin Əbu Əli Əyyub ibn Əhməd ibnü'l-Əziz Beyləqani**

Təsəvvüf əhlinə mənub mühəddis idi. Çox sayıda hədisi, tarixi hadisəni və şerləri əzbər bilirdi[462]. İbnü'l-Fuvati Müəyyinəddin Əli Beyləqaninin yaşadığı dövr və ya ölüm tarixi haqqında heç bir məlumat verməmişdir.

**Qazi Üməyyədəddin Əbü'l-Fərəc Məs'ud ibn Əhməd ibn Mahmud Beyləqani**

Şafi'i məzhəbinə mənsub fəqih, Beyləqanın əyan və əsilzadə ailəsinə mənsub möhtərəm şəxslərindən biri idi. Bütün Arranda fəziləti, fiqh elmindəki dərin biliyi ilə tanınmışdı. Həmçinin öz dövrünün görkəmli ədibi idi. İbnü'l-Fuvati h. 657-ci ildə (1259) Əhərdə onun ərəbcə yazdığı gözəl bir qəzəli dinlədiyini bildirmiş və həmin qəzəli əsərində qeyd etmişdi[463]:

| | |
|---|---|
| قمر يسيء الى القلوب بحسنه | Ay qəlbləri öz gözəlliyi ilə bəzəyir |
| و بسقم ناظره نسحٌّ و نسقمُ | Baxanın korluğu da buna mane deyil |
| كريم و الغصن الرطيب و نوْره | Ceyran kimi dik duruşun, şux qamətinlə |
| ألحاظه و قواُمه والمبسُم | Diqqətin, baxışın və nurlu təbəssümünlə |
| لا فزتُ يوماً من رضاك بمبهج | Sənin rizanı qazandığım gün sevincdən uçdum |
| ان كنتُ من تعذيب حبك أسأم | Sən mənə sevgimdən ötrü əzab versəndə |

---

461 CƏNDİ, *Süluk fi Təbəqati'l-Üləma və'l-Müluk*, C. I, s. 439-441.
462 BÜNYADOV, "Vidnıye Deyateli Azerbaydjana v Soçinenii İbn al-Fuvati", s. 61-67.
463 Kəmaləddin Əbü'l-Fəzl Əbdürrəzzaq ibn Əhməd İBNü'l-FUVATİ, *Məcməü'l-Adab fi Mu'cəmü'l-Əlqab*, C. IV/2, s. 954-955, (Nşr. M. Cavad), Dəməşq 1963.

Alimin ölüm tarixi qeyd olunmamışdır. Qazi Üməyyədəddin Məs'ud Beyləqani təqribən XII-XIII əsrlərdə yaşamışdır.

**Əbu Cə'fər Muhəmməd ibn Həsən Beyləqani**

Mühəddis idi. Azərbaycan Atabəyləri dövründə müksir[464] mühəddislərdən biri kimi tanınmışdı. O, Qəzvində Əbü'l-Həsən Əli ibn Muhəmməd ibn Quttan əl-Farsinin (öl. 1231) tələbəsi olmuş, ondan hədis dinləmiş və hədis elmlərini öyrənmişdi[465]. Əbu Cə'fər Beyləqaninin ölüm tarixi qeyd olunmamışdır. Alim XII-XIII əsrlərdə yaşamışdır.

**Əbü'l-Məali Əbdülməlik ibn Əhməd ibn Əbdülməlik ibn Əbdikan Beyləqani**

Mühəddis idi. Hədis dinləmək məqsədiylə Xorasan və İraqa səyahət etmişdi. Bağdadda Əbu Cə'fər Muhəmməd ibn Əhməd ibnü'l-Məsləmə, Əbu Bəkr Muhəmməd ibn Əhməd əl-Qazidən, Nişapurda Əbu Bəkr Muhəmməd ibn Yəhya əl-Müzəkkidən hədis elminə dair bilikləri öyrənmiş, hədis dinləmişdi. Əbü'l-Məali Əbdülməlik Beyləqani bəlağətli nitq söyləyir və gözəl xəttələ yazı yazırdı. O, mömin insan idi, çox oruc tutur, çox ibadət edirdi. Alim doğma şəhəri Beyləqanda yaşamış və h. 496-cı ildə (1103) Beyləqanda vəfat etmişdi[466].

**Şeyx Əbü'l-Fəzl Hibətullah ibn Əbü'l-Qasım ibn Hibətullah ibn Yaqub Beyləqani**

Şafi'i məzhəbinə mənsub fəqih və fütuvvət şeyxi idi. H. 521-ci ilin məhərrəm ayında (yanvar 1127) anadan olmuşdu. Həcc ziyarətindən sonra Bağdada gəlmiş və bu şəhərdə qalmışdı. Gözəl əxlaq sahibi, xoşrəftar insan idi. Şeyx Əbu'n-Nəcib Sührəvərdinin dostu idi və fütuvvət təşkilatına onun vasitəsi ilə daxil olmuşdu. Bağdad mühəddislərindən hədis dinləmişdi. Bir neçə dəfə Bağdadı tərk etmiş, sonra yenidən bu şəhərə qayıtmışdı. Fütuvvət təşkilatına mənsub şeyxlər Abbasi xəlifələri tərəfindən müəyyən bir tapşırıqla İslam coğrafiyasının müxtəlif yerlərinə göndərilirdilər. Ehtimal ki, fütuvvət əhlinə

---

[464] Müksir-çox hədis nəql edən mühəddis və ya ravi. Həmçinin nəql etdiyi hədislərin sayı 1000-dən çox olan səhabə də müksir hesab olunur. Daha ətraflı məlumat üçün bax: AYDINLI, *Hadis Istılahları Sözlüğü*, s. 110.

[465] RAFİ'İ, *Tədvin*, C. I, s. 259.

[466] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. II, s. 137-138; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 292-293; SEYRƏFİNİ, *Müntəxəb*, s. 392.

mənsub digər şeyxlər kimi, Əbü'l-Fəzl Hibətullah Beyləqani də müəyyən bir missiyanı icra etmək üçün Bağdadı tərk etmişdi. H. 548-ci ildə (1153) Bağdaddan getmiş, h. 564-cü ildə (1169) yenidən bu şəhərə qayıtmışdı. Təyin olunduğu qazilik vəzifəsini icra etmək üçün yenidən Bağdadı tərk etmiş və h. 599-cu ildə (1203) 3-cü dəfə Bağdada gəlmişdi. Ölüm tarixi h. 604-cü ildən (1208) sonraya təsadüf edir[467].

**Həkim ibn İbrahim ibn Həkim əl-Ləkzi əl-Xınalıqi Dərbəndi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Əslən indiki Quba rayonunun Xınalıq kəndindən olan alim fəziləti, abidliyi, salehliyi və nəcibliyi ilə tanınmışdı. Bağdad Nizamiyyə mədrəsəsində təhsil almış, Əbu Hamid Qəzzalinin[468] tələbəsi olmuşdu. İmam Müvəffəq ibn Əbdülkərim əl-Hərəvidən də dərs almışdı. Bir çox mühəddisdən hədis dinləmişdi. Dinlədiyi hədisləri qeyd edirdi. Ömrünün son iki ilini Buxarada yaşamış və h. 538-ci il şəvval ayının 12-si (17 aprel 1144) vəfat etmişdi[469].

**Hilal ibn Harun ibn Muhəmməd ibn Şərih Dərbəndi**

Mühəddis idi və yaşadığ dövrün tanınmış mühəddislərindən olan Əbu Bəkr Muhəmməd ibn İbrahim İsfəhaninin dostu idi. Əhməd ibn Saleh Qəzvinidən hədis dinləmiş və nəql etmişdi. Mühəddis Əhməd ibn Cə'fər Yəzdi ondan hədis dinləmiş və dinlədiyi hədisləri qeyd etmişdir[470]. Ölüm tarixi məlum deyil. Təqribən XI əsrdə yaşamışdır.

**Əbu Bəkr Muhəmməd ibn Əhməd ibn Hüseyn Dərbəndi**

Mühəddis idi. Qəzvində Əbü'l-Həsən Əli ibn Muhəmməd ibn Quttandan (öl. 1231) hədis dinləmişdi[471]. Ölüm tarixi məlum deyil. XIII əsrdə yaşamışdır.

---

[467] SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. XXVIII, s. 103.

[468] Əbu Hamid Muhəmməd ibn Muhəmməd Qəzzali (1058-1111) əslən Xorasanın Tus şəhərindən idi. Böyük Səlcuqlular dövrünün məşhur alimlərindən və mütəfəkkirlərindən biri olmuşdur. O, şafi'i məzhəbinə mənsub fəqih olsa da kəlam, hədis, əxlaq kimi mövzularda bir sıra əsərin müəllifidir.

[469] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 394-395; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 256.

[470] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 158.

[471] RAFİ'İ, *Tədvin*, C. I, s. 66. Əbdülkərim Rafi'i onun nisbəsini "əl-Babi" kimi qeyd etmişdir.

**Muhəmməd ibn Əbu İmran Dərbəndi**

Yaşadığ dövrün tanınmış hədis alimlərindən biri idi. Təhsil almaq üçün Dərbənddən Bərdəyə getmiş və burada mühəddis İsmayıl ibn Müslüm Xarəzmi ilə görüşüb onun dərslərində iştirak etmişdi. Muhəmməd Dərbəndi Bərdə şəhərindəki bir sıra hədis alimlərindən hədis dinləmişdi. İbn Hirarə ləqəbi ilə tanınmış Bərdəli məşhur hədis hafizi əllamə Əbü'l-Həsən Muhəmməd Bərdəi (öl. 959) Muhəmməd Dərbəndinin tələbələrindən olmuş, ondan hədis dinləyib nəql etmişdi[472]. Ölüm tarixi məlum deyil. IX-X əsrlərdə yaşamışdır.

**Şeyx İmadəddin Əbü'l-Fəzl Muhəmməd ibn Cəbrayıl ibn Əbü'l-Fəvaris ibn Cəbrayıl ibn Əhməd ibn Əli ibn Xalid Dərbəndi**

Mühəddis idi. H. 581-ci ilin rəbiələvvəl ayında (iyun 1185) Qahirədə anadan olmuşdu. Misir və Şam diyarının tanınmış mühəddislərinin tələbəsi olmuşdu. Yaşadığı dövrdə Əyyubilər dövlətində məşhur mühəddislərdən biri olmuş, əl-Müfəzzəl ləqəbi ilə tanınmışdı. Alim h. 17 zilqədə 650-ci ildə (19 yanvar 1253) Qahirədə vəfat etmişdi[473].

**Şeyx İzzəddin Muhəmməd ibn Muhəmməd ibn Adəm ibn İbrahim Dərbəndi**

Dəməşqdə əl-Əməvi camesinin müəzzini idi[474]. Mömin və saleh insan idi. Onun atası şeyx Şəmsəddin Muhəmməd Dərbəndi də Suriyanın tanınmış zöhd əhlindən idi. İzzəddin Muhəmməd Dərbəndi Dəməşqdəki Təvavisiyyə xanəgahında qalır, burada ibadətlə məşğul olurdu. O, həm də ədib və şair idi. Nəzm və nəsr formasında yazılmış bəzi ədəbi əsərlərin müəllifi idi. Şeyx İzzəddin Dərbəndi h. 21 zilhiccə 734-cü ildə (22 avqust 1334) yaşadığı xanəgahda vəfat etmiş və Babü's-Səğir qəbristanında dəfn edilmişdi[475].

**Şeyx Əli ibn Muhəmməd ibn Muhəmməd ibn Adəm ibn İbrahim Dərbəndi**

---

472 BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 58.

473 MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. V, s. 479-450.

474 Səlahəddin Muhəmməd İBN ŞAKİR əl-Kutubi, *Fəvatü'l-Vəfayat*, (Nşr. M. Əbdülhəmid), C. II, s. 174, Qahirə, 1951.

475 Əbdülqadir ibn Muhəmməd ən-NUEYMİ əd-Diməşqi, *Daris fi Tarixi'l-Mədaris*, C. II, s. 130, (Nşr. Şəmsəddin İbrahim), Beyrut 1990.

Şafi'i məzhəbinə mənsub mühəddis idi. Şeyx İzzəddin Muhəmməd Dərbəndinin (öl. 1334) oğlu olan Əli Dərbəndinin təvəllüd tarixi h. 690-cı ildən (öl. 1291) əvvələ təsadüf edir. İlk təhsilini dünyaya gəldiyi Dəməşq şəhərində almışdı. O, da atası kimi bir müddət Dəməşqdəki əl-Əməvi camesinin müəzzini olmuş, sonra elm təhsili üçün səyahətə çıxmışdı. Şeyx Ömər ibnü'l-Qəvvas, şeyx Nəcməddin ibnü'l-Həcci və Əhməd ibnü'l-Əsakirin tələbəsi olmuş onlardan hədis dinləmişdi[476]. Ölüm tarixi məlum deyil. XIII-XIV əsrlərdə yaşamışdır.

**Əbü'l-Qasım Maymun ibn Ömər ibn Muhəmməd Dərbəndi**

Öz dövrünün tanınmış fəqih və mühəddislərindən biri idi. Əbu Həfs Ömər ibn Hüseyn əl-Əzcidən hədis dərsləri almışdı. Hafiz Əbu Tahir əs-Sülənfi İsfəhani (1083-1181) öz əsərində Dərbənddə olarkən Əbü'l-Qasım Maymun Dərbəndi ilə görüşüb ondan hədis dinlədiyini qeyd etmişdi. Yenə Əbu Tahir əs-Sülənfinin qeydlərindən Əbü'l-Qasım Maymunun Dərbənddə fəqih və fətva mərcii olduğunu öyrənirik[477]. Alimin ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır. Hafiz Əbu Tahir əs-Sülənfi öz əsərində Əbü'l-Qasım Dərbəndidən dinlədiyi aşağıdakı hədisi qeyd etmişdir:

Abdullah ibn Əmr ibnü'l-Əs (ا) dedi: Rəsulullah (ق) buyurdular ki: "Arzu və istəkləriniz mənim gətirdiyimə (İslama, Qur'ana) bağlı, tabe olmadıqca sizin heç biriniz iman etmiş sayılmazsınız"[478].

**Əbu İshaq İbrahim ibn Musa ibn Fərəh Dərbəndi**

Hənəfi məzhəbinə mənsub fəqih və mühəddis idi. Alim ailəsində dünyaya gəlmiş və ilk təhsilini atasından almışdı. Daha sonra təhsil almaq üçün səyahətə çıxmış və Xorasana getmişdi. Əfqanıstanın Herat şəhərindəki mədrəsələrdə təhsil almış, Əbü'l-Fəth əl-

---

[476] Əhməd ibn Əli İBN HƏCƏR əl-Əsqəlani, *İbnai'l-Ğumr bi Əbnai'l-Umr*, C. II, s. 73, Heydərabad 1968.
[477] ƏBU TAHİR İSFƏHANİ, *Ərbəinü'l-Büldaniyyə*, s. 177-178; BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 358.
[478] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 358. [لا يؤمن أحدكم حتى يكون هواه تبعاً لما جئت به]. İmam Nəvəvi və Nəsr ibn İbrahim əl-Müktəsi bu hədisin səhih isnadla nəql edildiyini bildirmişdilər. Ətraflı məlumat üçün bax: http://www.taimiah.org/Display.asp?pid=2&t=book17&f=nawa-0041.htm

Hənəfinin tələbəsi olmuşdu[479]. Ölüm tarixi məlum deyil. Təqribən XI-XII əsrlərdə yaşamışdır.

**Yəhya ibn Əhməd ibn Hüseyn Dərbəndi**

Hədis ravisi idi. Muhəmməd ibn Tahir Tarsusidən hədis dinləmiş və nəql etmişdi. Hafiz Əbu Tahir əs-Süləfi (öl. 1181) ondan hədis dinləmiş və nəql etmişdi[480]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Əbu Əmr Osman ibnü'l-Müsəddid ibn Əhməd Dərbəndi**

Şafi'i məzhəbinə mənsub fəqih olan Əbu Əmr Osman Dərbəndi yaşadığı dövrdə Bağdadın tanınmış hüquqşünaslarından biri idi. O, təhsil almaq üçün Bağdada gəlmiş və Nizamiyyə mədrəsəsində təhsil almışdı. Şeyxülislam Əbu İshaq İbrahim Şirazinin[481] tələbəsi olmuş, fiqh elmini ondan öyrənmişdi. İbn Nəqur və Şərif Əbü'l-Hüseyn Muhəmməd ibn Əli ibnü'l-Mühtədi Billah əl-Haşimi kimi Bağdadın qabaqcıl mühəddislərindən hədis dinləmişdi. Bir müddət Xorasanın Nişapur şəhərində yaşamış, bu şəhərin tanınmış mühəddislərindən hədis dərsləri almışdı. Abidliyi, zahidliyi və salehliyi ilə tanınmış Əbu Əmr Osman Dərbəndinin ölüm tarixi h. 500-cü (1107) ildən sonraya təsadüf edir[482].

**Əbü'l-Həsən Muhəmməd ibn Hişam ibn Vəlid ibn Əbdülhəmid Dərbəndi**

Mühəddis idi və İbn Əbu İmran əl-Babi[483] adı ilə məşhur olmuşdu. Əbu Səid Abdullah əl-Əşca əl-Kindi[484] və İbrahim ibn Müslüm əl-Xarəzmi kimi hədis alimlərindən hədis

---

479 SEYRƏFİNİ, *Müntəxəb*, s. 134.

480 BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 359.

481 İmam Əbu İshaq İbrahim ibn Əli Şirazi (1003-1083). Şafi'i məzhəbinə mənsub böyük alimlərdən biri olmuşdur. Əslən İranın Şiraz şəhəri yıxınlığındakı Firuzabad kəndindəndir. Zöhd və vəra' sahibi bir alim idi. Böyük Səlcuqlu sultanlarının vəziri Nizamülmülk ona dərin hörmət və ehtiram bəsləyərdi. Abbasi xəlifəsi Qaim bi-Əmrillah ona xilafətin qaziülquzatlığı vəzifəsini təklif etmiş, lakin Əbu İshaq Şirazi imtina etmişdi. Nizamülmülkün xahişi ilə 1067-ci ildə tədrisə açılan Bağdad Nizamiyyə mədrəsəsində ilk dərsi Əbu İshaq Şirazi vermiş, daha sonra da bu mədrəsənin müdərrisi olmuşdu. Əbu İshaq Şirazi fiqh və fiqh üsuluna dair 10-dan artıq əsərin müəllifidir.

482 ŞƏHRƏZURİ, *Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, C. I, s. 591.

483 Məlum olduğu kimi Dərbənd şəhəri orta əsr ərəbdilli mənbələrdə Babü'l-Əbvab adlandırılırdı. "əl-Babi" nisbəsi də buna uyğun olaraq verilirdi.

484 Bu ravidən hədis dinləmiş digər bir azərbaycanlı mühəddis də, yuxarıda haqqında ətraflı məlumat verdiyimiz, İmamü's-Sibt ləqəbi ilə məşhur olmuş Əbu Bəkr Əhməd Bərdicidir (öl. 914).

dinləmiş və nəql etmişdi. Bir müddət Bərdədə yaşamış və burada hədis dərsləri vermişdi. Müsə'ər ibn Əli Bərdəi İbn Əbu İmran əl-Babidən hədis dinləmiş mühəddislərdən biri idi[485]. İbn Əbu İmran əl-Babinin ölüm tarixi məlum deyil. IX-X əsrlərdə yaşamışdır.

**Əbü'l-Həsən Həbib ibn Fəhd ibn Əbdüləziz Dərbəndi**

Mühəddis idi. Əbu Əmr Osman ibn Muhəmməd ibn Dost, Əbu Nueym Süleyman İsfəhani, Əbü'l-Həsən ibn Bəxtuveyh, Asim ibn İsmayıl, Asim əl-Əhvəl kimi mühəddislərin tələbəsi olmuş, onlardan hədis dinləmişdi. Əbu Bəkr Əhməd əl-İsmaili onun tələbəsi olmuş ondan hədis dinləmiş və nəql etmişdi. Əbu Bəkr Əhməd əl-İsmaili həmçinin hafiz Əbu Əli Hüseyn Bərdəi (öl. 1016), Əbu Zur'ə Muhəmməd Bərdəi (öl. 1021) kimi digər azərbaycanlı mühəddislərin də tələbəsi olmuşdu. Əbü'l-Həsən Həbib Dərbəndinin ölüm tarixi məlum deyil. X-XI əsrlərdə yaşamışdır[486].

**Yusif ibn Muhəmməd Dərbəndi**

Mütəkəllim idi. Öz dövrünün fəziləti ilə məşhur alimlərindən idi. Qəznəvi sultanlarını sarayında xidmət etmişdi. Qəznəvi sultanlarından Xosrov Məlikin (1160-1186) yanında onun xüsusi hörməti var idi, ali dərəcəyə malik idi. Ömrünün sonlarına doğru dünya işlərindən əl çəkib Lahor[487] şəhərində inzivaya çəkilmişdi. Lahorda vəfat etmiş və bu şəhərdə dəfn edilmişdi. Ölüm tarixi məlum deyil. XII əsrdə yaşamışdır[488].

**Hafiz Əbü'l-Vəlid Həsən ibn Muhəmməd ibn Əli ibn Muhəmməd Dərbəndi**

Hədis hafizi idi. Hədis dinləmək üçün çox səyahət etmişdi. Orta Asiyadan Şimali Afrikaya qədər bütün İslam coğrafiyasını gəzmiş və məşhur mühəddislərdən hədis dinləmişdi. Çox hədis əzbərləmişdi. Buxarada Əbu Abdullah Muhəmməd ibn Əhməd ibn Muhəmməd Qəncardan və Əbu Bəkr Əhməd ibn Əli əl-Xətibdən hədis dinləmişdi.

---

[485] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 213. Yaqut əl-Həməvi əsərində alimin nisbəsini "əl-Babi" olaraq qeyd etmişdi.
[486] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 213. Bu alimin də nisbəsi "əl-Babi" olaraq qeyd edilmişdir.
[487] Lahor-indiki Pakistan ərazisində yerləşən şəhər.
[488] Əbdülhəyy ibn Fəxrəddin əl-HÜSEYNİ, *Nüzhətü'l-Xəvatir və Behcətü'l-Məsami' və'n-Nəvazir*, s. 83, Beyrut 1999.

Nişapurda Əbu Muhəmməd Abdullah ibn Yəhya əs-Səkri Bağdadi və Əbü'l-Qasım Həsən ibn Muhməməd əl-Ənbarinin dərslərində iştirak etmişdi. Onun hədis dinlədiyi mühəddislərdən biri də Əbü'l-Hüseyn ibn Buşran idi. Əbu Abdullah Muhəmməd ibn Fəzl əl-Fəzari, Əbü'l-Qasım Zahir ibn Tahir əş-Şəhami hafiz Əbü'l-Vəlid Həsən Dərbəndinin tələbəsi olmuş, ondan hədis dinləmişdilər. Hafiz Əbü'l-Vəlid Həsən Dərbəndi h. 456-cı ilin ramazan ayında (iyun 1064) Səmərqənddə vəfat etmişdi[489].

Şəmsəddin Zəhəbi nəql silsiləsində hafiz Əbü'l-Vəlid Həsən Dərbəndinin də olduğu aşağıdakı hədisi öz əsərində qeyd etmişdir: Huzeyfə ibnü'l-Yəman (ا) dedi: Rəsulullah (ق) buyurdular ki: "Canım əlində olan Allaha and olsun ki, sizlər ya mə'rufu (yaxşılığı) əmr edib münkəri (pisliyi) qadağan edəcəksiniz, ya da Allah sizin üzərinizisə elə bir bəla göndərər ki, sonra ona yalvarsanız da duanız qəbul olmaz"[490]. Tirmizi, Əhməd ibn Hənbəl və Nasirəddin Əlbani bu hədisin səhih olduğunu bəyan etmişdirlər.

**Şeyx Əbü'l-Əsvar Ömər ibn Münəxxil Dərbəndi**

Hədis ravisi idi. Bağdadda yaşamış, yaşının xeyli irəli vaxtlarında burada Əbu Talib ibn Yusifdən hədis dinləmişdi. Daha sonra h. 510-cu (1116-1126) illərdə Dəməşqə gəlmiş və burada hədis nəql etmişdi. Ondan çox az ravi hədis dinləmişdi[491]. Ehtimal ki, bunun səbəbi ravinin artıq xeyli yaşlı olması olmuşdur. Yə'ni hədis nəql etməyə başlayandan sonra uzun yaşamamışdır. Ölüm tarixi məlum olmasa da 1120-1130-cu illərə təsadüf etdiyin təxmin etmək olar.

**Əbdülməlik ibn Əli ibnü'l-Muni Dərbəndi**

Şafi'i məzhəbinə mənsub fəqih və qari idi. Fəzilət sahibi alim kimi tanınmış Əbdülməlik Dərbəndi Hələbdə yaşamış, burada tədris və elmi tədqiqatla məşğul olmuşdu. Əbdülməlik Dərbəndi "Müxtəsər fi'l-Fiqh", "Nüzhətü'n-Nazirin", "Əxlaq və'l-Məvaiz",

---

489 YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. III, s. 238-239; SÜYUTİ, *Təbəqatü'l-Hüffaz*, s. 160; SEYRƏFİNİ, *Müntəxəb*, s. 198.

490 Şəmsəddin Əbu Abdullah Muhəmməd ibn Əhməd ZƏHƏBİ, *Siyəru Ə'lamü'n-Nübəla*, (Nşr. Ş. Arnavud-Hüseyn Ə), C. XVIII, s. 99, Beyrut 1983. Bu hədis üçün həmçinin bax: TİRMİZİ, *Sünən*, Fitən, Nr. 2169. [وَالَّذِي نَفْسِي بِيَدِهِ لَتَأْمُرُنَّ بِالمَعْرُوْفِ وَتَنْهَونَّ عَنِ المُنْكَر، أَوْ لَيُوْشِكَنَّ الله أَنْ يَبْعَثَ عَلَيْكُم عَذاباً مِنْ عِنْدِهِ، ثُمَّ لِتَدْعُنَّهُ فَلاَ يَسْتَجِيْبُ لَكُمْ]

491 İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. XLV, s. 343.

"Dəlailü'l-Mənahic" kimi əsərlərin müəllifi idi. H. 766-cı (1365) ildə dünyaya gəlmiş alim h. 839-cu (1436) ildə Hələbdə vəfat etmişdi[492].

**Hüseyn ibn İbrahim Dərbəndi**

Təbəi-tabiundan olan hədis ravisi idi. Hafiz Əbu Übeydə Hümeyd ət-Təvil əl-Bəsridən (688-760) hədis dinləmişdi. Hafiz Əbu Übeydə Hümeyd isə Rəsulullahın (ﷺ) səhabələrindən Ənəs ibn Maliklə (ؓ) görüşüb ondan hədis dinləmişdi. Hüseyn ibn İbrahim Babü'l-Əbvabda (Dərbənd) hədis dərsləri vermişdi. İsa ibn Muhəmməd ibn Muhəmməd əl-Bağdadi ondan hədis dinləmiş mühəddislərdən biridir[493]. Hüseyn Dərbəndinin ölüm tarixi məlum deyil. VIII-IX əsrlərdə yaşamışdır.

**Şeyx Əbu Muhəmməd Əbdan ibn Zərrin ibn Muhəmməd Düveyni**

Şafi'i məzhəbinə mənsub fəqih və qari idi. Şeyx İbn Əbi Loqma ləqəbi ilə tanınan alim gözdən əlil idi. H. 540-cı ildə (1145) vəfat etmişdi[494].

**Əllamə Cəmaləddin Əbu Əmr Osman ibn Ömər ibn Əbu Bəkr ibn Yunis əl-Kürdi Düveyni**

Şafi'i məzhəbinə mənsub fəqih olan Cəmaləddin Osman Düveyni həmçinin ərəb filologiyası, təcvid[495], fiqh üsulu kimi elm sahələrində də tanınmış mütəxəssis və bu sahələrə dair bir çox əsərin müəllifi idi. Alim h. 571-ci (1175) ildə Misirdə hərbiçi ailəsində dünyaya gəlmişdi və atası əmir İzzəddin Məvsuk Hezbaninin[496] hacibi idi. Bu səbəbdən o, İbnü'l-Hacib adı ilə tanınmışdı. Onun atası Azərbaycanın qədim şəhərlərindən Düveyndə anadan olmuşdu. Cəmaləddin Düveyni uşaqlıq və yeniyetməlik illərində Qahirədə təhsil almış, Qur'ani-Kərimi əzbərləyib hafiz olmuşdu. O, digər şagirdlərdən fenomenal yaddaşı və parlaq zəkası ilə fərqlənmişdi. Qahirədə

---

[492] Xeyrəddin ibn Mahmud ZİRİKLİ, *Ə'lam Qamusü't-Təracim*, C. IV, s. 235-236, Beyrut 1980. Xeyrəddin Zirikli alimin nisbəsini "əl-Babi" olaraq qeyd etmişdir.

[493] İBN HƏCƏR, *Lisanü'l-Mizan*, C. II, s. 218; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 164; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 213. əl-Həməvi alimin nisbəsini "əl-Babi" kimi qeyd etmişdir.

[494] HİMYƏRİ, *Nisbə ilə'l-Məvazi'*, C. I, s. 314; BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 623.

[495] Təcvid-Qur'ani-Kərimin oxunuş qayda və üsullarını öyrədən elm.

[496] Əmir İzzəddin Məvsuk Hezbani Əyyubilər dövləti sultanı Səlahəddin Yusif Əyyubinin (1169-1193) dayısı oğlu və sultanın əmirlərindən biri idi.

imam Əbu Muhəmməd Qasım Şatibidən[497] Qur'an elmlərinə dair bilikləri öyrənmiş, onun yanında "Təysir"i[498] oxumuşdu. Qahirədə Əbü'l-Fəzl Muhəmməd ibn Yusif Qəznəvi, Əbü'l-Cəud, əl-Buseyri, İbn Yasin kimi alimlərdən müxtəlif elm sahələrinə dair bilikləri öyrənmişdi. Daha sonra Dəməşqə getmiş, burada Qasım ibn Əsakir[499], Həmmad əl-Hərrani[500], mühəddisə Fatimə bint Əbü'l-Həsən Sə'dülxeyr əl-Ənsari, Əbu Mənsur əl-Əbyaridən fiqh, hədis, təfsir və filologiya dərsləri almışdı. Təhsilini başa vurduqdan sonra Dəməşqdəki "Zaviyətü'l-Malikiyyə" mədrəsəsində dərs vermişdi[501]. Həmin illərdə filologiya, fiqh və fiqh üsulu sahələrində bir neçə risalə qələmə almışdı. Alim h. 617-ci (1220) ilə qədər Dəməşqdə qalmış, sonra Qahirəyə qayıtmış və bu şəhərdəki əl-Faziliyyə mədrəsəsində dərs vermişdi. Bir neçə il Qahirədə tədrislə məşğul olduqdan sonra İsgəndəriyyəyə getmiş və bu şəhərdəki mədrəsələrdə dərs vermişdi. Onun yetirmələri arasından Cəmaləddin əl-Fazil, Əbu Muhəmməd Əlcəzairi, Əbu Əli ibnü'l-Cəlal, Əbü'l-Fəzl əl-Ərbili, Əbü'l-Həsən ibnü'l-Baqqal, qaziü'l-quzat Şihabəddin Əbu Abdullah Muhəmməd Xoyi (öl. 1294) kimi alimlər çıxmışdı. Əllamə Cəmaləddin Düveyni həm də istedadlı şair idi. İbn Tağrıbirdi onun haqqında məlumat verərkən şerlərindən nümunələr də nəql etmişdi. Cəmaləddin Osman Düveyni h. 26 şəvval 646-cı (11 fevral 1249) ildə İsgəndəriyyədə vəfat etmiş, Babü'l-Bəhr qəbristanında, şeyx Saleh ibn Əbu Şamənin qəbrinin yanında, dəfn edilmişdi[502].

Alimin ən məşhur əsərləri ərəb dilinin qrammatikasına dair qələmə aldığı "Kafiyyə fi'n-Nəhv" və "Şafiyyə fi's-Sərf"adlı iki əsərdir. Bunlardan birincisi ərəb dilinin sintaksisi (nəhv), ikincisi isə morfologiyasına (sərf) aid idi. Türkiyənin əlyazma əsər saxlanılan bütün kitabxanalarında bu iki əsərin bir və ya bir neçə nüsxəsi mövcuddur. Bu da onu göstərir ki, bu əsərlər uzun müddət Osmanlı mədrəsələrində ərəb dili dərslərdində əsas

---

497 İmam Əbu Muhəmməd Qasım ibn Firrə Şatibi (1143-1194) Əndəluslu gözdən əlil alim və bütün Qur'an qiraətçilərin ustadı hesab olunurdu. Başqa bir məşhur qiraət və təcvid alimi "*Qayətü'n-Nihayə*"nin müəllifi İbnü'l-Cəzərinin də müəllimi olmuşdu. Onun müəllifi olduğu "Şatibiyyə" əsəri uzun illər boyu mədrəsələrdə və məktəblərdə Qur'an təcvidi və qiraəti sahəsində dərslik kimi istifadə olunmuşdur.

498 "Təysir fi Qiraəti's-Səb'" Əbu Əmr Osman ibn Səid əd-Dani (981-1053) tərəfindən qələmə alınmış Qur'ani-Kərimin təcvid və tilavət qaydalarına dair əsərdir.

499 Tarixçi və mühəddis Əbü'l-Qasım Əli ibn Əsakirin (öl. 1175) oğlu idi.

500 Əbü's-Səna Həmmad ibn Hibətullah əl-Hərrani (1117-1202) yaşadığı dövrün tanınmış filoloq, şair və ədiblərindən biri olmuşdu.

501 NUEYMİ, *Daris fi Tarixi'l-Mədaris*, C. II, s. 1.

502 Cəmaləddin Əbü'l-Məhasin Yusif İBN TAĞRIBİRDİ, *Mənhəlü's-Safi və'l-Müstəvfi bə'də'l-Vafi*, (Nşr. M. M. Əmin), C. II, s. 161, Qahirə 1984; ZƏHƏBİ, *Siyəru Ə'lamü'n-Nübəla*, C. XXIII, s. 101; İBN XƏLLİKAN, *Vəfayatü'l-Əyan*, C. III, s. 248-250.

dərslik kimi istifadə olunmuşdur. "Kafiyyə fi'n-Nəhv" və "Şafiyyə fi's-Sərf"in Əbdülqəni əfəndi Nuxavi kolleksiyasından əldə edilmiş birər nüsxəsi AMEA Əİ-nun fondunda da mövcuddur[503]. Əllamə Cəmaləddin Osman Düveyninin ərəb filologiyasına dair qələmə aldığı "Əmali", "Qəsidə fi Bəyani'l-Əsmai'l-Müənnəs", "Risalə fi Təhqiqi'l-Məf'ulat", "Vafiyyə fi Şərhi'l-Kafiyyə"[504] adlı əsərləri Ankara Milli kitabxanasında, "Risalə fi's-Sərf" adlı əsəri Türkiyə Çorum Həsən paşa İHK, "Qəsidətü'l-Müvəşşəhə bi'l-Əsmai'l-Müənnəsə" və "İzah Şərhü'l-Müfəssəl" adlı əsərləri Türkiyə Diyarbəkir İHK, "Safiyyə fi Şərhü'ş-Şafiyyə" adlı əsəri Ərzurum İHK, "Mənzumə fi'l-Müzəkkər və'l-Müənnəs" adlı əsəri İstanbul SYEK, "Şərhü't-Təsrif", "Muqribü'l-Kafiyyə", "Şərhu-Şuzuri'z-Zəhəb" adlı əsərləri Türkiyə Kastamonu İHK, "Qəvaidü'l-İ'rab" adlı əsəri Kütahya Vahidpaşa İHK, "Kafiyyə fi'n-Nəhv", "Şafiyyə fi's-Sərf", "Risalə fi Müqəddiməti'l-İ'rab və't-Təsrif" adlı əsərləri Konya BYEK, "əl-Məsalik" və "Vafiyə fi Şərhi'l-Kafiyyə" adlı əsərləri Manisa İHK, "Şəfa bi Tərifi-hüquqi'l-Mustafa" və "Şərhü'l-Kafiyyə" adlı əsərləri Türkiyə VGMK-nin Ankara şöbəsində saxlanılır. Alimin ərəb ədəbiyyatına dair qələmə aldığı "Şərhü'l-Qəsidəti't-Təntəraniyyə" adlı əsəri Konya BYEK, əruz vəzninə dair yazdığı "Hidayətü's-saili'l-qəsdi'l-cəlil fi İlmi'l-xəlil" adlı əsər Kastamonu İHK-də saxlanılır. Cəmaləddin Düveyninin müəllifi olduğu fiqhə dair "Müxtəsər fi Zikri Təbəqatü'l-Hənəfiyyə" adlı əsərin bir nüsxəsi Amasiya vilayəti Beyazıd İHK, "Müxtəsərü'l-Müntəlai'l-Vüsul" adlı əsərin müəyyən etdiyimiz iki nüsxəsindən biri Konya BYEK-də, digəri isə Qahirədə, Misir Milli kitabxanasında, "Üsuli'l-Fiqh" adlı əsəri isə Konya Yusifağa kitabxanasında mühafizə olunur. Həmin kitabxanada "Kitab Müntəhai'l-Vüsul və'l-Əməl fi İlmi'l-Üsul və'l-Cədəl" adlı əsərinin də bir nüsxəsi mövcuddur. "Müxtəsərü'l-Müntəlai'l-Vüsul"un Qahirədəki nüsxəsində Əzudəddin əl-İcinin (öl. 1355) bu əsərə yazdığı şərh də mövcuddur. Alimin fiqh üsuluna dair "Kitab Müntəhai'l-Vüsul və'l-Əməl fi İlmi'l-Üsul və'l-Cədəl" adlı əsəri h. 1326-cı ildə (1908) Misirdə Mustafa əfəndi əl-Məkkəvi tərəfindən nəşr olunmuşdur.

**Əbu Abdullah Muhəmməd ibn Mahmud ibn Əbi Nəsr ibn Fərəc Düveyni**

---

503 Kamandar ŞƏRİFOV, *Əbdülqəni Əfəndi Nuxəvi Xalisəqarızadə Kitabxanasının Kataloqu*, C. I, s. 244-245, 308, Bakı 2009.
504 "Vafiyyə fi Şərhi'l-Kafiyyə" uzun müddət Türkiyənin Tokat vilayəti Zilə İHK-də saxlanmışdır.

Mühəddis idi. H. 544-cü ildə (1149) Azərbaycanın Düveyn şəhərində anadan olmuşdu. Təhsilini davam etdirmək məqsədiylə Misirə getmiş və İsgəndəriyyədə Əbu Tahir əs-Süləfi İsfəhanidən hədis dərsləri almış, hədis dinləmişdi. Bundan başqa Əbu Abdullah əl-Məs'udi, Şərif Əbu Əli Muhəmməd ibn Əsəd əl-Cəvvani və Əbu Yaqub Yusif ibnü't-Tüfeyl kimi Misirin tanınmış hədis alimlərindən hədis dərsləri almışdı. Əbu Abdullah Muhəmməd Düveyni h. 628-ci ilin zilqədə ayında (sentyabr 1231) vəfat etmişdi[505].

**Əbdürrəhman ibn Yəhya Düveyni**

Hədis ravisi idi. Səbbah ibn Müharib, Cuddar ibn Bəkr Düveynidən hədis dinləmiş və nəql etmişdi[506]. Ölüm tarixi məlum deyil.

**Əbü'l-Xeyr Fəxravər ibn Osman ibn Muhəmməd Düveyni**

Mühəddis idi. Əbü'l-Qasım əl-Buseyri, Əbu Yaqub Yusif ibnü't-Tüfeyl və başqalarından hədis dinləmiş, hədis dərsləri almışdı. Cəmaləddin İbnü's-Sabuni (öl. 1282) Əbü'l-Xeyr Düveyni ilə görüşdüyünü və elmi mövzularda fikir mübadiləsi apardığını qeyd etmişdir. Əbü'l-Xeyr Düveyni h. 18 səfər 652-ci ildə (8 aprel 1254) Qahirədə vəfat etmişdir[507].

**Şeyx Kəmaləddin Əbü'l-Fütuh Nəsrullah ibn Mənsur ibn Səhl Düveyni**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Bağdadda məşhur alim və mütəfəkkir Əbu Hamid Qəzzalinin tələbəsi olmuş, ondan şafi'i fiqhini öyrənmişdi. Daha sonra təhsilini davam etdirmək üçün Xorasanın Nişapur, Mərv və Bəlx kimi şəhərlərini gəzmişdi. O, Əbü'l-Həsən Əli ibn Əhməd əl-Mədyəni, Əbu Bəkr Əhməd ibn Səhl əs-Sərrac və Əbu Səid Əbdülvahid əl-Quşeyridən hədis dinləmiş və nəql etmişdir. Qazi Kəmaləddin Şəhrəzuri onun tələbəsi olmuş, onun yanında fiqh və fiqh üsulu oxumuşdu. Əbu Sə'd əs-Səm'ani və başqaları ondan hədis nəql etmişdilər. Şeyx Kəmaləddin Düveyni Xorasanadakı mədrəsələrdə tədrislə məşğul olmuşdu. Səm'ani onun Bəlxdəki Nizamiyyə

505 İBNü's-SABUNİ, *Təkmilətü'l-İkmal*, s. 54.
506 İBN MAKULA, *İkmal*, C. I, s. 384.
507 İBNü's-SABUNİ, *Təkmilətü'l-İkmal*, s. 54.

mədrəsəsinin müdərrisi olduğunu qeyd etmişdir. Alim h. 546-cı ilin ramazan ayında (dekabr 1151) Əfqanıstanın Bəlx şəhərində vəfat etmişdi[508].

**Şueyb ibn Muhəmməd ibn Əhməd ibn Bəzyi' Düveyni**

Hədis ravisi idi. Səhl ibn Suqeyr əl-Əxlatidən hədis dinləmiş və nəql etmişdi. Əbu Bəkr əl-Müfid də ondan hədis dinləmiş və nəql etmişdi[509]. Ölüm tarixini müəyyənləşdirmək mümkün olmamışdır. Lakin onun hədis dinlədiyi Səhl ibn Suqeyrin tabiundan Süfyan ibn Üyeynədən (725-813) hədis dinləyib nəql etdiyini nəzərə alaraq Şueyb Düveyninin IX-X əsrlərdə yaşadığını təxmin etmək olar.

**Əmir Əbu Mənsur Fərəc ibn Kişvarə Düveyni**

Əyyubilər dövlətinin ordusunda xidmət etmiş hərbi bürokratlardan biri idi. Əyyubi ordusu komandanlarından birinin müavini olmuş, əmir rütbəsinə yüksəlmişdi. Əmir Əbu Mənsur Düveyni həmçinin mühəddis idi. O, öz dövrünün məşhur hədis alimlərindən Hafiz Əbu Tahir əs-Sülǝfi İsfəhani (1083-1181), Əbu Tahir ibn Əvf və Əbü'l-Fəth Mahmuddan hədis dərsləri almışdır[510]. Ölüm tarixi məlum deyil. Əbu Tahir əs-Sülǝfinin müasiri olduğunu və aşağıda haqqında məlumat verdiyimiz qardaşının ölüm tarixini nəzərə alaraqa Əmir Əbu Mənsur Düveynin XII-XIII əsrlərdə yaşadığını söyləmək olar.

**Fəridun ibn Kişvarə Düveyni**

Mühəddis və əmir Əbu Mənsur Düveyninin qardaşı idi. O, da qardaşı kimi Hafiz Əbu Tahir əs-Sülǝfinin tələbəsi olmuş, İsgəndəriyyədə ondan hədis dərsləri almışdı. Fəridun

---

[508] İBNü'l-ƏSİR, *Lübab*, C. I, s. 517; BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 263; Əbu İbrahim İsmayıl ibn Cə'fər İBN KƏSİR əl-ƏNSARİ, *Zeyl Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, v. 126a-b, http://www.way2əannah.com; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. III, s. 757; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 218; HİMYƏRİ, *Nisbə ilə'l-Məvazi'*, C. I, s. 314. Cəmaləddin Himyəri əsərində "Əbü'l-Fütuh Nəsr ibn Mənsur əd-Düveyni" (öl. 1132) və "Kəmaləddin Nəsrullah ibn Mənsur əd-Düveyni" (öl. 1151) adlı iki ayrı adam haqqında danışır.
[509] İBN MAKULA, *İkmal*, C. I, s. 384.
[510] İBNü's-SABUNİ, *Təkmilətü'l-İkmal*, s. 54.

Düveyni Misirdə hədis dərsləri vermişdi. Alim h. 4 rəbiəlaxir 617-ci ildə (7 iyun 1220) Qahirədə vəfat etmişdi[511].

**Əbu Muhəmməd Əbdürrəhman ibn Həməd ibn Həsən əs-Süfyani Düveyni**

Yaşadığı dövrün tanınmış mühəddislərindən idi. Azərbaycanın qədim şəhəri Düveyndə[512] hədis dərsləri vermişdi. Hafiz Əbu Tahir əs-Süləfi (öl. 1181) onunla Düveyndə görüşüb söhbət etmiş, hədis dinləmişdi. Hafiz Əbu Tahir onun Əbu Nəsr Əhməd əl-Kəssar Dinəvəridən hədis dinləyib nəql etdiyini qeyd etmişdir. Əbu Muhəmməd Əbdürrəhman Düveyninin ölüm tarixi məlum deyil, XI-XII əsrlərdə yaşamışdır. Hafiz Əbu Tahir, Əbu Muhəmməd Əbdürrəhman Düveynidən eşitdiyi aşağıdakı məşhur hədisi öz əsərində qeyd etmişdir. Əbu Səid əl-Xudri (ا) dedi: Allah Rəsulu (ق) buyurdular ki: "Əzanı eşitdiyiniz vaxt siz də müəzzinin dediyini təkrarlayın"[513].

**Şeyx Əbü'l-Abbas Əhməd ibn Muhəmməd Düveyni**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Misirə getmiş və orada məskunlaşmışdı. Əbü'l-Abbas Əhməd Düveyni yaşadığı dövrdə şafi'i fiqhini böyük alimlərindən biri olmuşdu. O, imam Şafi'inin (/) "əl-Umm"[514] adlı əsərinə dərindən vaqif olan nadir alimlərdən idi. Alimliyi ilə yanaşı Əbü'l-Abbas Düveyni həmçinin mömin, zöhd və vəra' sahibi insan idi. O, çox namaz qılır, çox oruc tutur və daim Qur'an tilavəti ilə məşğul olurdu. O, yumuşaq xasiyyətli, həlim insan idi. Sadə, mötədil həyat tərzi sürmüşdü. Əbü'l-Abbas Əhməd Düveyni məhkəmə hakimlərinin davranış qaydaları, məhkəmə intizamı və mühakimə üsuluna dair "Ədəbü'l-Qəza" adlı əsərin müəllifi idi. Alim h. 373-cü ilin ramazan (fevral 984) ayında vəfat etmişdi[515].

---

[511] İBNü's-SABUNİ, *Təkmilətü'l-İkmal*, s. 54.

[512] Hafiz Əbu Tahir əs-Süləfi alim haqqında məlumat verərkən onun nisbəsini [الدوني] "əd-Düvəni" kimi qeyd etmişdi. "Düveyn" şəhərinin adının orta əsr ərəbdilli tarixi mənbələrdə "Düvən" və bu şəhərə nisbənin də "Düvəni" kimi qeyd olunduğuna rast gəlmək olur. Məsələn bax: İBN XƏLLİKAN, *Vəfayatü'l-Əyan*, C. I, s. 259.

[513] ƏBU TAHİR İSFƏHANİ, *Ərbəinü'l-Büldaniyyə*, s. 73. [اذا سمعتم النداء فقولوا ما يقول المؤذن]. Bu hədis üçün bax: BUXARİ, *Səhih*, Əzan, 13; MÜSLİM, *Səhih*, Səlat, 11/381; ƏBU DAVUD, *Sünən*, Səlat, 36/522; TİRMİZİ, *Sünən*, Səlat, 154/208.

[514] İmam Muhəmməd ibn İdris əş-Şafi'inin (767-819) İslam hüququna dair fikir, bəyan və verdiyi fətvaları ehtiva edən əsəridir. Bu əsər 7 cild halında nəşr edilmişdir.

[515] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 252.

**Əhməd ibn İshaq ibn Abbas ibn Musa ibn Cə'fər əl-Ələvi Düveyni**

Şafi'i məzhəbinə mənsub hədis ravisi idi. Tiflis qazisi Hüseyn ibn Muhəmməd ibn Bəyandan hədis dinləmişdi. Düveyndə yaşamış, burada hədis dərsləri vemişdi[516]. Ölüm tarixi məlum deyil. Təqribən IX-X əsrlərdə yaşamışdır.

**Qazi Əlaəddin Əbü'l-Fəzl Muhəmməd ibn Əbdülməcid ibn Sə'dullah Əbhəri**

Şafi'i fiqhi və təfsir sahələrində dərin biliyə malik alim, ədalətli qazi kimi şöhrət tapmışdı. Həmçinin istedadlı şair idi. İbnü'l-Fuvati onun h. 654-cü ildə (1256) Hülagü xanın Ələmut və Quhistandakı batini-xaşxaşi yuvalarını məhv etməsinin şərəfinə qəsidə yazdığını bildirmiş və həmin qəsidədən bəzi misraları öz əsərində qeyd etmişdir[517]. Ölüm tarixi məlum deyil. XIII əsrdə yaşamışdır.

**Əbu Bəkr Əbdürrəhman ibn Muhəmməd ibn Ələviyyə Əbhəri**

Maliki məzhəbinin tanınmış fəqih və mühəddislərindən biri idi. O, ailə və nikah hüququ sahəsində ixtisaslaşmışdı. Bu sahədə "Məsailü'n-Nikah" adlı əsər qələmə almışdı. Nikah və ailə hüququ məsələlərində imam Malik ibn Ənəsin (/) bəyanlarını ən gözəl şəkildə şərh edən ailmlərdəndi. Bundan başqa o, əqaid sahəsində "Məsailü'l-Xilaf" adlı əsərin də müəllifi idi. Məşhur fəqih Əbu Səid Əhməd Qəzvini onun tələbəsi olmuş, onun yanında hədis və fiqh oxumuşdu[518]. Əbu Bəkr ibn Ələviyyə Əbhərinin ölüm tarixi məlum deyil. VIII-IX əsrlərdə yaşamışdır.

**Həsən ibn Muhəmməd ibn Əsid Əbhəri**

---

[516] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. XLII, s.242.

[517] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1088-1089. Təəssüf ki, bu qəsidəni qələmə alarkən qazi Əlaəddin Əbhəri iki il sonra Bağdadı bundan daha dəhşətli bir aqibətin gözlədiyindən xəbərsiz olmuşdur.

[518] QAZİ İ'YAZ Əbü'l-Fəzl ibn Musa əs-Səbti, *Tərtibü'l-Mədarik və Təqribü'l-Məsalik*, (Nşr. M. S. Naşim), s. 556, Beyrut 1998; Əbu Muhəmməd Fərhun ibn Muhəmməd İBN FƏRHUN Tunisi, *Dibacü'l-Müzəhhəb fi Mə'rifəti Ə'yani-Üləmai'l-Məzhəb*, s. 556, Qahirə 1972.

Hədis ravisi idi. Əmr ibn Əli, Əbu Zur'ə ər-Razi (öl. 878) və Əbu Hatim ər-Razidən (öl. 890) hədis dinləmiş və nəql etmişdi. Həsən Əbhəri h. 293-cü ildə (906) vəfat etmişdi[519].

**Əbu Səid Əbdürrəhman ibn Əbdüləziz ibn Muhəmməd ibn Əbdüləziz Əbhəri**

Şafi'i məzhəbinə mənsub mühəddis idi. Eldənizlərin hakimiyyəti illərində (1136-1225) Azərbaycanın tanınmış hədis alimlərindən biri olan Əbu Səid Əbdürrəhman Əbhərdə İbn Mədəkan ləqəbi ilə tanınmışdı. Hafiz Əbu Tahir əs-Süləfi İsfəhani (öl. 1181) onunla Əbhərdə görüşüb söhbət etmiş, hədis dinləmişdi. Hafiz Əbu Tahirin qeydlərindən Əbu Səid Əbhərinin atası və babasının da tanınmış hədis alimləri olduğu məlum olur[520]. Alimin ölüm tarixi məlum deyi, XII əsrdə yaşamışdır.

**Əbu Tahir Muhəmməd ibn Hüseyn ibn Əbu Tahir ibn Hüseyn ibn Muhəmməd ibn Babək Əbhəri**

Mühəddis idi. Bağdadda təhsil almış, burada Əbü'l-Vəqt əs-Səcizi və hafiz Əbü'l-Əla Həsən ibn Əhməd əl-Əttardan hədis dinləmiş və hədis elmlərini öyrənmişdi. Əbu Tahir Muhəmməd Əbhəri Anadoluya getmiş və burada hədis tədrisi ilə məşğul olmuşdu[521]. Ölüm tarixi məlum deyil. XII-XIII əsrlərdə yaşamışdır.

**Əbü'l-Məkarim Əbdülvaris ibn Əbdülmün'im Əbhəri**

XI əsrdə yaşamış azərbaycanlı ədəbiyyatşünas, filoloq alim Əbü'l-Məkarim Əbhəri öz dövrünün tanınmış ədəbiyyatşünası Əbü'l-Üla ibn Süleyman əl-Məərrinin (973-1057) tələbələri arasından yetişmiş alimlərdən biri idi[522]. əl-Məərrinin tələbəsi olmuş digər bir azərbaycanlı ədib isə irəlidə haqqında bəhs edəcəyimiz Əbu Zəkəriyya Yəhya Xətib Təbrizidir. Əbü'l-Məkarim Əbhəri təhsil almaq üçün Əbhərdən Şam diyarındakı əl-Məərrəyə getmişdi. Burada Əbü'l-Üla əl-Məərrinin yanıda ərəb ədəbiyyatı, həmçinin sərf və nəhv elmlərinin incəliklərinə yiyələnmişdi. Təhsilini başa vurduqdan sonra vətənə qayıdan Əbü'l-Məkarim Əbhəri burada ərəb ədəbiyyatı dərsləri vermişdi. Ədib

---

519 BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 130.

520 ƏBU TAHİR İSFƏHANİ, *Ərbəinü'l-Büldaniyyə*, s. 95.

521 BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 214.

522 Cəmaləddin Əbü'l-Həsən Əli ibn Yusif əl-QIFTİ, *İnbahu'r-Ruvat ələ Ənbahi'n-Nuhat*, (Nşr. M. Ə. İbrahim), C. II, s. 216, Beyrut 1986.

Fəramurz ibn Miyşə əl-Əbhəri onun tələbələrindən biri olmuşdu[523]. Alimin ölüm tarixi məlum deyil.

### Əbu Bəkr Muhəmməd ibn Abdullah ibn Muhəmməd ibn Saleh ibn Ömər ibn Həfs Əbhəri

Maliki məzhəbinə mənsub mühəddis və fəqih idi. H. 289-cu ildə (902) anadan olmuşdu. Hafiz Muhəmməd ibn Əbü'l-Fəvaris[524] və Əbü'l-Həsən Əli ibn Ömər Darəqutni, Əbu Bəkr Muhəmməd ibn Abdullah Əbhərinin "siqa" ravilərdən biri, yəni əmin və mötəbər bir şəxs olduğunu bildirmişdilər. Əbu Bəkr Muhəmməd Əbhəri hədis dinləmək üçün İraq, Suriya və Cəzirəyə səyahət etmişdi. Hərranda Əbu Ərubə Hüseyn ibn Əbi Mə'şər əs-Süləmi əl-Hərranidən, Bağdadda Əbu Bəkr Muhəmməd ibn Muhəmməd əl-Bağəndi, Əbü'l-Qasım əl-Bəğəvi, Abdullah ibnü'l-Hələbi, Muhəmməd ibn Xureym əl-Üqeyli, Muhəmməd ibn Təmmam əl-Bəhrani, Əbu Bəkr Abdullah ibn Əbu Davud əs-Sicistanidən, Kufədə Abdullah ibn Zeydan əl-Bəcəli, Əbu Cə'fər Muhəmməd ibn Hüseyn Əşnanidən hədis dinləmişdi. İbrahim ibn Müxəllid, onun oğlu İshaq ibn İbrahim ibn Müxəllid, Əhməd ibn Əli əl-Bada, Əbu Bəkr Əhməd ibn Muhəmməd əl-Birqani, Muhəmməd ibnü'l-Mə'mun əl-Ənbari, Qazi Əbü'l-Qasım ət-Tənuxi, Əbü'l-Həsən Əli ibn Ömər Darəqutni, qazi Əbu Bəkr Muhəmməd ibn Təyyib əl-Baqqilani (öl. 1013), Əbu Muhəmməd Hüseyn ibn Əli əl-Cəvhəri də ondan hədis dinləmiş və nəql etmişdilər. Abbasi sarayı tərəfindən qazilik vəzifəsi təklif olunsa da Əbu Bəkr Muhəmməd Əbhəri bundan imtina etmiş və tədrislə məşğul olmağa üstünlük vermişdi. Onun dərslərində xüsusilə Əndəlüs və şimali Afrikadan gələn tələbələr çoxluq təşkil edirdilər. Alim hədis və maliki fiqhi sahəsində bir çox əsərlərin müəllifi idi. Onun əsərlərindən bəziləri imam Malik ibn Ənəsin (/) fiqhə dair bəyanlarının şərhinə həsr olunmuşdu. O, hədis və fiqh sahəsindəki dərin biliyi ilə bütün İslam coğrafiyasında tanınmışdı. "Şərhu-Müxtəsəri's-Səğir" və "Şərhu-Müxtəsəri'l-Kəbir" onun qələmə

---

[523] *Yenə orada.*

[524] Əbü'l-Fəth Muhəmməd ibn Əhməd ibn Muhəmməd ibn Fars ibn Əbu Fəvaris Səhl Bağdadi (947-1021) yaşadığı dövrün məşhur mühəddislərindən biri, həmçinin fiqh və bioqrafiya üzrə böyük mütəxəssis idi.

aldığı məşhur əsərlərdir[525]. Onun qələmindən çıxmış digər bir əsər isə "Kitabu-Üsuli'l-Fiqh"dir. Bu əsər X əsrdə maliki məzhəbi üzrə fiqh üsulu sahəsində yazılmış iki əsərdən biridir[526]. Bundan başqa alim "Rədd ələ'l-Muzəni fi Sələsin Məsail" və "Fəzlü'l-Mədinə ələ Məkkə" adlı əsərlərin də müəllifi idi[527]. Əbu Bəkr Muhəmməd Əbhəri mömin, fəzilətli, abid, zahid və saleh insan idi. Elmi tədqiqat və tədris xaricindəki vaxtının çoxunu ibadət və zikrlə keçirirdi. Alim h. 375-ci il şəvval ayında (fevral 986) Bağdadda vəfat etmişdi[528].

**Şeyx Hüccətəddin Əbu Talib Əbdulmuhsin ibn Əbi'l-Umeyd ibn Xalid ibn Əbdulğəffar ibn İsmayıl əl-Xəfifi Əbhəri**

Şafi'i məzhəbinə mənsub fəqih idi. H. 556-cı ildə (1161) anadan olmuşdu. İsfəhan, Bağdad, Dəməşq və Qahirədə təhsil almış, bu şəhərlərin tanınmış mühəddislərindən hədis dinləmişdi. Fəxrəddin əl-Bəvqaninin tələbəsi olmuşdu. O, abid, zahid, doğru sözlü insan kimi tanınmışdı. Çox zikr edər və təhəccüd namazı qılardı. Bir müddət Məkkədə mücavir olaraq qalmışdı. Şeyx Hüccətəddin Əbhəri 624-cü ilin səfər ayında (fevral 1227) vəfat etmişdi[529].

**Əbü'l-Həsən Übeydullah ibn Muhəmməd ibn İshaq ibn Mundə Əbhəri**

Mühəddis idi. H. 384-cü ildə (994) anadan olmuşdu. Atası Əbu Cə'fər Muhəmməd Əbhəridən və yaşadığı dövrün hədis alimlərindən dərs almışdı. Əbü'l-Həsən Übeydullah Əbhəri h. 462-ci ildə (1070) vəfat etmişdi[530].

**Muhəmməd ibn Mə'ruf ibn Musa Əbhəri**

---

[525] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 48-49; MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. VI, s. 107-108.

[526] Tərhib ibn Rübey'an əd-DƏVSƏRİ, "Keşfü'z-Zünun, İzahu'l-Meknun ve Hediyyetü'l-Arifin'de Zikri Geçen Maliki Usul Eserleri", (Trc. M. Gökalp), **FÜİFD**, C. XIII/1, s. 338, Elazığ 2008. X əsrdə maliki məzhəbi fiqhi üzrə üsul sahəsində qələmə alınmış ikinci əsər Əbü'l-Fərəc Əmr ibn Muhəmməd əl-Leysi əl-Bağdadinin (öl. 943) "Lüma' fi Üsuli'l-Fiqh" adlı kitabıdır.

[527] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 455.

[528] SƏM'ANİ, *həmin əsər*, C. I, s. 48-49; MƏQRİZİ, *həmin əsər*, C. VI, s. 107-108; İBN FƏRHUN, *Dibacü'l-Müzəhhəb*, 232-234; QAZİ İ'YAZ, *Tərtibü'l-Mədarik*, s. 551-552.

[529] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. V, s. 504.

[530] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 305.

Hədis ravisi idi. Əbu Əhməd Muhəmməd ibn Yusif və Əbu Cə'fər əl-Bağdadidən hədis dinləmişdi. Yəməndə yaşamış, burada hədis dərsləri vermişdi[531]. Ölüm tarixi məlum deyil. Təqribən X-XI əsrlərdə yaşamışdır.

**Əbu Muhəmməd Abdullah ibn Əhməd ibn Muhəmməd ibn Cəvlə Əbhəri**

Mühəddis və ədib idi. Əbu Əmr Əhməd ibn Muhəmməd ibn Həkim, Abdullah ibn Muhəmməd ibn İsa əl-Xəşşab, Muhəmməd ibn Muhəmməd ibn Yunis əl-Qəzzal əl-Əbhəri və Əbu Əli Əhməd ibn Əli əl-Əbhəridən hədis və ədəbiyyat dərsləri almışdı. Onun tələbələri arasından məşhur alimlər çıxmışdı. Bunlardan Əbdürrəhman ibn Əbi Abdullah ibn Mundə, Mahmud ibn Cə'fər əl-Kəvsəc, Qasım ibn Fəzl ibn Əhməd əs-Səqəfinin adını çəkmək olar[532]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Əbdürrəhman ibn Ömər Əbhəri**

XIV əsrdə yaşamış mühəddis idi. Həyatı haqqında ətraflı məlumat mövcud deyil. "Mişkatü'l-Ənvar fi Ənvai' Ülumü's-Sünnə və'l-Asar" adlı əsərini h. 730-cu ildə (1330) yazıb başa çatdırmışdı[533]. Ölüm tarixi məlum deyil.

**Qazi Əbu Abdullah Muhəmməd ibn Əhməd Əbhəri**

XIII əsrdə yaşamış şafi'i məzhəbinə mənsub fəqih və filoloq idi. Həyatı haqqında ətraflı məlumat mövcud deyil. "Kafiyyətü'n-Nühuz fi Məsailü'l-Əruz" və "Ləvamiü'l-Vəsail fi Mətalii'r-Rəsail" adlı əsərlərin müəllifi olan qazi Əbu Abdullah Əbhəri h. 683-cu ildə (1274) vəfat etmişdi[534].

**Şeyx İmadəddin Əbu Muhəmməd Həsən ibn Muhəmməd Əbhəri**

---

[531] İBN HƏCƏR, *Lisanü'l-Mizan*, C. V, s. 297.
[532] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 85.
[533] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 102.
[534] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 102.

Şeyx İmadəddin Əbhəri “Zəmhərir”[535] ləqəbi ilə tanınmışdı. Hülagü xan Bağdadı işğal etdiyi vaxt (1258) o, da bu şəhərdə idi. İşğaldan sonra Olcaytu xatunun[536] yaxın adamlardan birinə çevrilmişdi. Şeyx İmadəddin Əbhəri h. 672-ci ildə (1273) filosof Nəsirəddin Tusinin (öl. 1274) vasitəçiliyi və istəyi ilə Bağdaddıkı əl-Xilatiyyə təkkəsinin şeyxliyinə təyin olunmuşdu. Onun bu vəzifəyə təyin olunması üçün şeyx Şəmsəddin Muhəmməd ibn Sə’d əl-Yəzdi bu vəzifədən azad edilmişdi. Şeyx İmadəddin təqribən 678-ci ildə (1279) ölmüşdür[537].

**Şeyx İmadəddin Əbdüləziz Əbhəri**

Öz dövrünün tanınmış mühəddis və hənəfi fəqihlərindən idi. Əfqanıstanın Herat şəhərində Sultaniyyə və Şahrux Mirzə mədrəsələrində dərs vermişdi. Eyni zamanda Heratdakı İxlasiyyə xanəgahının şeyxi idi. Heratda tədris və tədqiqatla məşğul olan şeyx İmadəddin Əbhəri müasiri olan məşhur özbək dövlət xadimi və şairi Nizaməddin Əlişir Nəvayinin “Məşkutü’l-Məsabih” adlı əsərinə şərh yazmışdı. Heratın şah İsmayıl Xətai tərəfindən zəbt edilməsindən[538] sonra şeyx Əbdüləziz Əbhəri ona göstərilən təzyiqlərdən yaxa qurtarmaq üçün Heratı tərk edərək Sind vilayətinə[539] getmişdi. Sinddə Kahan adlı kiçik bir qəsəbədə məskunlaşan şeyx Əbdüləziz Əbhəri burada tədris fəaliyyətini davam etdirmişdi. Alim bu qəsəbədə h. 928-ci ildə (1522) vəfat etmişdi[540].

**Əbu Bəkr Muhəmməd ibn Əli ibn Muhəmməd ibn Cəvlə Əbhəri**

---

535 Zəmhərir [زمهرير]-ərəbcədə qışın ən soyuq çağlarına verilən addır. Bu adla adətən 21 dekabrdan-31 yanvara qədərki qış günləri nəzərdə tutulur. Bax: Şəmsəddin SAMİ, *Qamusi-Türki*, s. 687, (Nşr. Ö. F. Akün), İstanbul 1998; Abdullah YEĞİN, *Yeni Lugat*, s. 786, İstanbul 1992. Azərbaycanda, xalq arasında, buna “böyük çillə” də deyilir.

536 Olcaytu xatun-Hülagü xanın arvadlarından biridir. Birinci əri Mengli Teymur öləndən sonra moğol adətlərinə görə onun yaxın qohumu Hülagü xana ərə verilmişdi. Bax: Rəşidəddin Fəzlullah, *Cəmiü’t-Təvarix*, C. I, s. 95, (Trc. L. Xetaqurov), Leninqrad 1952.

537 İBNü’l-FUVATİ, *Məcməü’l-Adab* , C. IV/2, s. 711-712, 813-814.

538 Herat 2 dekabr 1510-cu ildə Şeybanilərlə Səfəvilər arasında baş vermiş Mərv döyüşündən sonra şah İsmayıl tərəfindən zəbt edilmişdi.

539 Sind-indiki Pakistan ərazisində yerləşən böyük bir vilayət idi.

540 HÜSEYNİ, *Nüzhətü’l-Xəvatir*, s. 370; Hacı Xəlifə KATİB ÇƏLƏBİ, *Kəşfü’z-Zünun ən Əsami’l-Kütb və’l-Fünun*, C. II, s. 874, İstanbul 1311. Katib Çələbi alimin adını “Əbdüləziz ibn Muhəmməd ibn Əbdüləziz əl-Əbhəri” olaraq qeyd etmişdir.

Mühəddis idi. Yuxarıda həqqında məlumat verdiyimiz Əbu Muhəmməd Abdullah Əbhərinin əmisi oğlu olan Əbu Bəkr Muhəmməd, hafiz Əbu Bəkr Əhməd ibn Musa ibn Mərduyə və Əbu Abdullah Muhəmməd ibn İbrahim əl-Yəzdi əl-Cürcani kimi hədis alimlərinin tələbəsi olmuşdu. Əbu Bəkr Muhəmməd Əbhəri təhsilini başa vurduqdan sonra hədis elmləri sahəsində tədrislə məşğul olmuşdu. Əbu Sə'd Əhməd ibn Muhəmməd Bağdadi, Əbu Mübarək Əbdüləziz ibn Muhəmməd əl-Adəmi Şirazi, Əbu Tahir Əhməd əs-Süləfi İsfəhani, hafiz Əbu Məs'ud Əbdülcəlil Kütah kimi hədis alimləri Əbu Bəkr Muhəmməd Əbhərinin tələbəsi olmuşdular[541]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**İbrahim ibn Yəhya ibn Həkəm əl-Hüzuri Əbhəri**

Hədis ravisi idi. Hafiz Əbu Davud Süleyman Təyalisi (öl. 819) və Bəkir ibn Bəkkar kimi mühəddislərdən hədis dinləmiş və nəql etmişdi. Oğlu Muhəmməd ibn İbrahim atasından hədis dinləmiş və nəql etmişdi[542]. Ölüm tarixi məlum deyil. VIII-IX əsrlərdə yaşamışdır.

**Əbu Cə'fər Əhməd ibn Muhəmməd ibn Mərzban ibn Azər Əbhəri**

Maliki məzhəbinə mənsub mühəddis idi. Əbu Cə'fər Muhəmməd ibn İbrahim əl-Hüzuri Əbhərinin tələbəsi olmuş, ondan hədis dinləmişdi. Əbü'l-Qasım Əbdürrəhman ibn Mundə, Mütəhhər ibn Əbdülvahid əl-Bəzzani, Əbu Bəkr Muhəmməd ibn Əhməd ibn Macə, Əbu Bəkr Muhəmməd ibn Ömər Tehrani ondan hədis dinləmiş və hədis elmlərini öyrənmişdilər[543]. Ölüm tarixi məlum deyil. Təqribən X-XI əsrlərdə yaşamışdır.

**Müqais ibn Əmr ibn Kə'b ibn Sə'd ibn Zeyd Mənat ibn Təmim Əbhəri**

Maliki məzhəbinə mənsub fəqih idi. Əbu Ərubə Hüseyn əl-Hərrani, Muhəmməd ibn Ömər əl-Bağəndi, Muhəmməd ibn Hüseyn əl-Əşnani, Abdullah ibn Zeydan Kufi, Əbu Bəkr ibn Əbu Davuddan hədis dinləmişdi. İbrahim ibn Müxəllid, onun oğlu İshaq ibn

---

541 BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 86.
542 BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 341.
543 BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 426.

İbrahim ibn Müxəllid, Əbu Bəkr Birqani, Əbü'l-Qasım ət-Tənuxi, Əbu Muhəmməd əl-Cəvhəri ondan hədis dinləmiş və nəql etmişdilər. Maliki fiqhinə dair qiymətli əsərlərin müəllifi idi. Müqais ibn Əbhəri abid, zahid, vəra' sahibi şəxs idi. Ona Bağdad qaziliyi vəzifəsi təklif olunmuş, lakin o, imtina etmişdi. Alim h. 289-cu ildə (902) anadan olmuş, h. 375-ci il şəvval ayında (fevral 986) Bağdadda vəfat etmişdi[544].

**Əbu Abdullah Muhəmməd ibn Əbdürrəhman ibn Muhəmməd ibn Əbdürrəhman ibn Müslüm Əbhəri**

Maliki məzhəbinə mənsub mühəddis və fəqih idi. Misirdə Əbü'l-Bərəkat Hüseyn ibn Yəhya ibn Əbi Mərağədən hədis dinləmiş və hədis elmlərinə dair bilikləri öyrənmişdi. Fəqih Əbü'l-Fəth Nəsr ibn İbrahim əl-Məqdisi ondan hədis dinləmişdi. Dəməşqə getmiş və burada hədis dərsləri vermişdi. Dərslərində tələbələrə əsasən imam Müslümün "Səhih" adlı hədis külliyatını oxudurdu. Alim h. 3 rəbiəlaxir 472-ci ildə (1 oktyabr 1079) Dəməşqdə vəfat etmişdir[545].

**Əbu'r-Rəşid Əhməd ibn Muhəmməd əl-Xəfifi Əbhəri**

Hədis ravisi idi. Bağdadda yaşamış, burada Zahir ibn Tahir əş-Şəhhamidən hədis dinləmişdi. Süleyman ibn Muhəmməd əl-Məvsili ondan hədis dinləmişdi[546]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Seyfəddin Əhməd Əbhəri**

XV əsrdə yaşamış hənəfi məzhəbinə mənsub fəqih və mütəkəllim idi. O, fiqh və kəlam elmlərinə dair bir sıra əsərlərin müəllifi idi. "Haşiyə ələ Şərhi Müxtəsəri'l-Müntəha", "Haşiyə ələ Şərhi Müntəxasi Sual və'l-Əməl", "Şərhu Müxtəsər fi İlmi'l-Əxlaq", "Məvahibü'r-Rəhman fi Məzhəbi'n-Nu'man", "Haşiyə Şərhü'l-İşarat li't-Tusi" adlı əsərlər Seyfəddin Əhməd Əbhərinin qələmindən çıxmışdı. Bu əsərlərin əlyazma nüsxələri Türkiyənin Diyarbəkir İHK, Çorum Həsən paşa İHK, Manisa İHK və Ankara

---

544 YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 69.
545 MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. VI, s. 46; Hibətullah ibn Əhməd ƏKFANİ, *Zeylu-Zeyl Tarixi-Məvlidi'l-Üləma və Vəfayatihim*, (Nşr. A. Həməd), s. 10, Riyad 1409.
546 BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 707.

Milli kitabxanasında saxlanılır. Seyfəddin Əhməd Əbhərinin ölüm tarixi h. 800-cü (1397) ildən sonraya təsadüf edir.

**Şihabəddin Əhməd ibn Muhəmməd Əbhəri**

XV əsrdə yaşamış dilçi alim idi. Onun ərəb dilinin qrammatikasına dair qələmə aldığı "Şərhu Müqəddimətü'l-Əcurrumiyyə"[547] adlı əsərinin əlyazma nüsxələrindən biri Ankara Milli kitabxanada saxlanılır. Şihabəddin Əhməd Əbhəri h. 800-860-cı (1398-1456) illərdə yaşamışdır.

**Qazi Əbu Əli Hüseyn ibn Əbdürrəzzaq Əbhəri**

Şafi'i məzhəbinə mənsub fəqih və Həmədan şəhərinin qazisi olan Hüseyn Əbhəri h. 456-cı (1064) ildə anadan olmuşdu. O, Bağdadda təhsil almış, şeyx Xətib Əli ibn Muhəmməddin tələbəsi olmuş, fiqh elmini ondan öyrənmişdi. O, fəzilət sahibi, saleh və mötəbər insan kimi tanınmışdı. Alim h. 530-cu (1136) ildə vəfat etmişdir[548].

**Əbu Zeyd Şükr ibn Əhməd ibn Həməd əl-Müəddib Əbhəri**

Mühəddis idi. İsfəhanda Əbu Abdullah Qasım ibn Fəzl əs-Səqəfidən hədis dinləmiş və nəql etmişdi. Hafiz Əbü'l-Qasım Əli ibn Əsakir (öl. 1175) onun tələbələrindən olmuş, onun hədis dərslərində iştirak etmişdi[549]. Ölüm tarixi məlum deyil. XII-XIII əsrlərdə yaşamışdır.

**Qazi Fəxrəddin Muhəmməd ibn Xalid ibn Şuheyr Əbu Mənsur əl-Xəfifi Əbhəri**

Şafi'i məzhəbinə mənsub fəqih və qazi idi. Seyyid Ziyaəddin Fəzlullah ibn Əli ibn Abdullah ibn Həsən əl-Həsəni ər-Ravəndinin tələbəsi olmuş və h. 570-ci ildə (1175) icazətini (diplom) ondan almışdı. Qazi Fəxrəddin Əbhəri alim, fəzilətli və saleh insan

---

[547] İbn Əcurrum adı ilə məşhur olmuş Əbu Abdullah Muhəmməd ibn Muhəmməd ibn Davud ibn Əcurrum əs-Sinhəci 1273-1323-cü illərdə yaşamış Mərakeşli ərəb filoloqu idi. Onun dilçilik sahəsində qələmə aldığı "Müqəddimətü'l-Əcurrumiyyə" adlı kitab bu gün də bu sahədə ən samballı əsərlərdən biri hesab olunur. Bu əsərə bir çox filoloq şərh yazmışdır. Azərbaycanlı filoloqlar Şihabəddin Əhməd Əbhəri və Əbu Bəkr Şirvani də bu əsərə şərh yazmışdılar.

[548] İBN KƏSİR əl-ƏNSARİ, *Zeyl Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, v. 112b-113a.

[549] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. III, s. 435.

idi. Qaziliklə yanaşı tədrislə də məşğul olmuşdu. Onun tələbələri arasından bəzi məşhur alimlər yetişmişdi. Bunlardan biri də h. 607-ci ildə ondan icazət almış fəqih Muhəmməd ibn Əbü'l-Kərəm Əbdürrəzzaq ibn Əbu Bəkr ibn Heydər Qəzvinidir. İbn Heydər Qəzvini şeyx Sədrəddin İbrahim ibn şeyx Sə'dəddin Həmmuyənin tələbəsi olmuşdu. Qazi Fəxrəddin Muhəmməd Əbhəri h. 677-ci ilin rəcəb ayında (dekabr 1278) vəfat etmişdir[550].

**Qazi Şəmsəddin Əbu Muhəmməd Əbdülvasi' ibn Əbdülkafi ibn Əbdülvasi' Əbhəri**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. H. 599-cu (1202) ildə Əbhərdə anadan olmuşdu[551]. Bir müddət Qəzvində yaşamış və buranın alimlərindən dərs almışdı. İbn Ruzbeh, Əbu Abdullah Hüseyn ibnü'z-Zübeydi, Əbü'l-Fəth əl-Məndai, Müəyyəd ibnü'l-Əhvətdən hədis və fiqhə dair bilikləri öyrənmişdi. Əbü'l-Fəth Meydanidən müdərrislik icazəti almışdı. Hafiz Yusif ibn Əbdürrəhman əl-Mizzi (öl. 1341) ondan hədis dinləmişdi. Alim h. 690-cı ilin şəvval ayında (oktyabr 1291) Dəməşqdə, əl-Əsədiyyə xanəgahında vəfat etmişdi[552]. Qazi Şəmsəddin Əbhərinin tələbəsi olmuş tanınmış alimlərdən biri də imam Şəmsəddin Zəhəbidir. Zəhəbi müəllimi haqqında məlumat verdikdən sonra ondan dinlədiyi hədislərdən birini qeyd etmişdir: Üsamə ibn Zeyd[553] (ا) dedi: "Allah Rəsulu (ق) məni və (nəvəsi) Həsəni (ا) qucağına alıb demişdi: "Allahım, həqiqətən mən bunları çox sevirəm, sən də bu bunları sev"[554].

**Əbü'l-Hüseyn Əbdülmuhsin ibn Abdullah ibn Əbdülmuhsin Əbhəri**

Şafi'i məzhəbinə mənsub mühəddis və fəqih idi. Bağdadda Nizamiyyə mədrəsəsinin tələbəsi olmuş, Əbü'l-Fəth Əsəd ibn Əbu Nəsr əl-Mihənidən (öl. 1129) fiqh, qazi Əbu Bəkr Muhəmməd ibn Əbdülbaqidən hədis dərsləri almışdı. Təhsilini başa vurduqdan

---

550 İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 321.
551 Şəmsəddin Əbu Abdullah Muhəmməd ibn Əhməd ZƏHƏBİ, *Mu'cəmü'ş-Şüyuxü'l-Mu'cəmi'l-Kəbir*, (Nşr. M. H. Heylə), C. I, s. 426, Taif 1988.
552 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. V, s. 665; NUEYMİ, *Daris fi Tarixi'l-Mədaris*, C. II, s. 110.
553 Üsamə, Rəsulullah Muhəmmədin (ق) oğulluğu Zeyd ibn Harisənin (ا) oğlu idi.
554 ZƏHƏBİ, *Mu'cəmü'ş-Şüyux*, C. I, s. 427. [كان رسول الله يأخُذُني و الحسن فيقُلول, الّلهُم انّي أُحبُّهما فأحبّهُما]. Bu hədis üçün həmçinin bax: BUXARİ, *Səhih*, Mənaqib, 22.

sonra vətənə qayıtmış və burada tədrislə məşğul olmuşdu[555]. Ölüm tarixi məlum deyil. XII əsrdə yaşamışdır.

**Əbu Bəkr Əhməd ibn Muhəmməd ibn Həsən ibn Macə Əbhəri**

Yaşadığı dövrün mühəddisləri arasında siqa hədis ravisi kimi tanınmışdı. Əbu Cə’fər Əhməd ibn Azər əl-Əbhərinin tələbəsi olmuş, ondan hədis dinləmiş və hədis elmlərinə dair bilikləri öyrənmişdi. Bundan başqa o, İsfəhanda təhsil almış və bu şəhərin məşhur hədisçilərinin tələbəsi olmuşdu. İsmayıl ibn Əli əl-Hümami, Əbu Sə’d Əhməd ibn Muhəmməd əl-Bağdadi, Əbü’l-Xeyr Muhəmməd ibn Əhməd Bağban, Mahmud ibn Əbdülkərim Furcə kimi bir mühəddis Əbu Bəkr ibn Əhməd Əbhərinin tələbəsi olmuş, ondan hədis dinləmişdilər. Əbu Bəkr ibn Əhməd Əbhəri h. 482-ci ilin səfər ayında (aprel 1089) vəfat etmişdir[556].

**Qazi Əbu Bəkr Əbdürrəhman ibn Muhəmməd Əbhəri**

Xorasandakı Tus və Əbivərd şəhərlərinin qazisi olmuş, daha sonra Şaş (Daşkənd) qaziliyinə təyin edilmişdi. Həmçinin hədis ravisi idi. Əhməd ibn Muhəmməd ibn Qalib əl-Bəsri, Muaz ibn Nəcdət, Əbu Abdullah əl-Buşnəci, Əbdüssəməd ibn Fəzl əl-Bəlxidən hədis dinləmiş və nəql etmişdi. Lakin onun Xorasan valisi İsmayıl ibn Əhməddən bəzi münkər və mövzu hədisləri nəql etdiyi də eşidilmişdi. Bir müddət Buxarada yaşamışdı. Onun, Xorasanda vəzifə sahibi ikən, insanlara zülm etdiyi və yalançı olduğu deyilirdi. Buna görə də mühəddislər arasında mötəbər hədis ravisi kimi qəbul edilməmişdi. Qazi Əbu Bəkr Əbhəri h. 342-ci ildə (953) Şaşda ölmüşdü[557].

**İbrahim ibn Həccac Əbhəri**

---

[555] BAĞDADİ, *Təkmilətü’l-İkmal*, C. VI, s. 257.
[556] BAĞDADİ, *Təkmilətü’l-İkmal*, C. VI, s. 594.
[557] SƏM’ANİ, *Kitabü’l-Ənsab*, C. I, s. 48-49; İBN HƏCƏR, *Lisanü’l-Mizan*, C. III, s. 338.

Hədis ravisi idi. “Sünən” adlı məşhur hədis külliyatının müəllifi Əbu Davud Süleymanın[558] tələbəsi olmuş, ondan hədis dinləmiş və nəql etmişdi. Ölüm tarixi h. 250-ci (864) ildən əvvələ təsadüf edir[559].

**Hafiz Əbu'ş-Şeyx Muhəmməd ibn Hüseyn Əbhəri**

Hədis hafizi idi. Muhəmməd ibn Musa əl-Hurəşi, Zəkəriyyə ibn Yəhya ibn Ömər ət-Tai və Əbu Bəkr ibn Nafi'dən hədis dinləmiş və nəql etmişdi. Əbu Bəkr əş-Şafi'i və Əbü'l-Qasım ət-Təbərani ondan hədis dinləmişdilər. Hafiz Əbu'ş-Şeyx Əbhəri h. 286-cı ildə (899) Bağdada getmiş və h. 290-cı ildə (903) orada vəfat etmişdi[560].

**Əhməd ibn Həsən ibn Muhəmməd ibn Əhməd ibn Muhəmməd ibn Həsən ibn Macə Əbhəri**

Mühəddis idi. Yuxarıda haqqında bəhs etdiyimiz hədis alimi Əbu Bəkr ibn Əhməd Əbhərinin nəvəsi olan Əhməd ibn Həsən Əbhəri babasından hədis dinləmiş və nəql etmişdi. Alim h. 552-ci ilin zilqədə ayında (dekabr 1157) vəfat etmişdi[561].

**Əsirəddin Müfəzzəl ibn Ömər ibn Müfəzzəl Əbhəri**

Filosof, riyaziyyatçı, astronom və mütəkəllim olan Əsirəddin Əbhəri ilk təhsilini Zəncanda almışdı[562]. Yeniyetməlik illərində Fəxrəddin Razidən dərs alan Əsirəddin Əbhəri Bağdada getmiş və Nizamiyyə mədrəsəsinin tələbəsi olmuşdu. Daha sonra Mosula gedərək burada şeyx Kəmaləddin Musa ibn Yunusun (1156-1242) xidmətinə daxil olmuşdu[563]. 1229-cu ildə Mosuldan Ərbilə gedən Müfəzzəl Əbhəri buradakı Darü'l-Hədisin müdərrisi olmuşdu[564]. Yaxınlaşan moğol təhlükəsi səbəbiylə Ərbili tərk

---

[558] Əbu Davud Süleyman ibn Əş'əs ibn İshaq ibn Bəşir ibn Şəddad əs-Sicistani (817-888). Sicistan qədim Xorasanın vilayətlərindən biridir. İndi Əfqanıstala İran arasında bölünmüş vəziyyətdədir. Əbu Davudun “Sünən” adlı əsəri İslam dünyasında mötəbər 6 hədis kitabından (Kutubi-Sittə) biridir.
[559] ƏNSARİ, *Təbəqatu'l-Mühəddisin*, s. 117.
[560] ƏNSARİ, *Təbəqatu'l-Mühəddisin*, s. 182; BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. III, s. 484.
[561] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. VI, s. 595.
[562] Seyyid İbrahim ZƏNCANİ, *Tarixi-Zəncan; Üləma və Danişməndan*, s. 109, Tehran 1352.
[563] İBN XƏLLİKAN, *Vəfayatü'l-Əyan*, C. V, s. 123.
[564] *Həmin əsər*, s. 123.

edib Şam diyarına getmiş və Dəməşqdə məskunlaşmışdı[565]. Uzun müddət Şam diyarında yaşayan Müfəzzəl Əbhəri daha sonra Anadoluya getmişdi. Onun hansı tarixdə Anadoluya getməsi məlum deyil. Əsirəddin Əbhərinin "Zübdətü'l-Əsrar" adlı əsərinin Konya BYEK-ndəki Nr. 925-ə qeydli nüsxəsinin istinsəx tarixi h. 644-cü (1247) ildir. Buna istinadən onun 1247-ci ildən əvvəl Anadoluya gəldiyini deyə bilərik. Ehtimal ki, o, moğollarla Anadolu Səlcuqluları arasında baş vermiş Kosadağ döyüşündən (1243) əvvəl Anadoluya gəlmişdi. Onun İraqdan Suriyaya moğol təhlükəsi qarşısında getdiyini qeyd etmişdik. Kosadağ döyüşündən sonra isə demək olar ki, bütün Anadolu moğol işğalı təhlükəsiylə qarşı-qarşıya qalmışdı. Belə qarışıq bir vəziyyətdə onun Şam diyarından Anadoluya gəlməsini güman etmək çətindir. Böyük ehtimalla Əsirəddin Əbhəri 1234-1243-cü illər arasında gedib Rum diyarında məskunlaşmışdı.

İranlı tədqiqatçı M. Təqi Rezəvinin Əsirəddin Əbhərinin Anadoluya gələndən sonra İmadəddin Əbü'l-Fida İsmayıl Əyyubi tərəfindən himayə edilməsi barədə fikrinin[566] doğru olma ehtimalı yoxdur. Belə ki, əvvəla İmadəddin Əbü'l-Fida İsmayıl heç vaxt Anadoluda yaşamamışdır. Hətta Anadoluda yaşasaydı belə 1265-ci ildə ölən Əsirəddin Əbhəri ilə görüşə bilməzdi. Çünki İmadəddin Əbü'l-Fida 1273-cü ildə doğulmuş, 1331-ci ildə ölmüşdü.

Daha çox fəlsəfə və məntiq sahələrində əsər qələmə almış Əsirəddin Əbhərinin ən məşhur əsəri "İsağuci"dir. Bu əsər həm də "Risalətü'l-Əsiriyyə fi'l-Məntiq" adı ilə tanınmışdır[567]. Qədim yunan filosofu Porfirinin (Porphyrius) də "Esagogie" (Kateqoriyalara Giriş) adlı əsəri var idi. Bu əsər Abbasi xəlifələrindən Mənsurun istəyi ilə yunancadan ərəb dilinə tərcümə edilmişdi[568]. Əsirəddin Əbhərinin adı çəkilən əsərinin dünyadakı əlyazma əsər kitabxanalarında yüzlərlə nüsxəsi mövcuddur. Çünki bu əsər uzun müddət mədrəsələrdə məntiq sahisəndə dərslik kimi istifadə olunmuşdu. Alimin fəlsəfə və məntiqə dair digər əsərləri bunlardır: "Tənzilü'l-Əfkar fi Tə'dili'l-Əsrar", "Kəşfü'l-Həqayiq fi't-Təhriri'd-Dəqaiq", "Risalətü'l-Bahirə fi Məqalətü'z-

---

[565] Əli Əsğər HƏLƏBİ, *Tarixi-Fəlasifəyi-İran, Əz Ağaze-İslam ta İmruz*, s. 598, Tehran (Trz).

[566] Muhəmməd Təqi REZƏVİ, *Əhval və Asar Xacə Nasirəddini-Tusi*, s. 184-186, Tehran 1354.

[567] Mirzə M. Əli MÜDƏRRİS, *Reyhanətü'l-Ədəb*, C. I, s. 74, Təbriz (Trz).

[568] Macit FAHRİ, *İslam Felsefesi Tarihi*, s. 27-29, İstanbul 1998.

Zahirə", "Kitab Bəyanü'l-Əsrar", "Təlxisü'l-Həqayiq", "Zübdətü'l-Əsrar", "Təhzibü'l-Nükhət", "Risalə fi Fəsadü'l-Əbhas", "Risalə Müştəmilə ələ Səməni Əşərə Məs'ələtin fi'l-Kəlam", "Mərasidü'l-Məqasid", "Hidayətü'l-Hikmə". Astronomiyaya dair əsərləri bunlardır: "Risalə fi İlmü'l-Astrolab", "Müxtəsər fi İlmü'l-Hey'ə", "Zicü'ş-Şamil", "Dirayətü'l-Əflak", "Zicü'l-İxtiyari", "Zicü'l-Müləxxəs", "Müləxxəs fi Sən'əti'l-Məcisti". Həndəsəyə dair əsərləri bunlardır: "İslahu Kitabü'l-Ustukusat fi'l-Həndəsə li'l-Uqlidis", "Risalə fi Bərqari'l-Məqtu'".

Əsirəddin Əbhəri ilə Nasirəddin Tusi arasında xoş münasibətlər olduğu və onların məktublaşdıqları məlumdur. Əsirəddin Əbhəri "Tənzilü'l-Əfkar fi Tə'dili'l-Əsrar" adlı əsərini N. Tusiyə göndərmiş, o, da bu əsərə "Tə'dilü'l-Me'yar fi Nəqdi Tənzilü'l-Əfkar" adlı şərh yazmışdı[569].

XIII-XIV əsrlərə aid Anadolunun yerli tarixi mənbələrində münəccim Əsirəddin adlı bir şəxs haqqında danışılır. "Müsamərətü'l-Əxbar" müəllifi bu şəxs haqqında yüksək fikirlər bəyan edərkən[570] İbn Bibi münəccim Əsirəddinin fitnə və məkrdə tayı-bərabəri olmadığını qeyd edir[571]. İbn Bibi münəccim Əsirəddinə mənfi münasibətinin səbəbini açıqlayarkən bir hadisədən söhbət açır. Sabiq yüksək rütbəli dövlət məmurlarından Tacəddin Mu'təzin oğlu Zeynəddin moğollarla məktublaşdığı üçün Anadolu Səlcuqlularının səltənət naibi Cəlaləddin Qaratayın (öl. 1254) əmri ilə həbs edilmişdi. Münəccim Əsirəddin bunu eşidən kimi daha ətraflı xəbər almaq üçün divana getmişdi. Divan məmurları münəccim Əsirəddindən çəkinirdilər. Çünki bu şəxsin fitnə və məkrdə tayı-bərabəri yox idi. Zeynəddin 3-4 gün sonra əmir Cəlaləddin Qaratayın göstərişi ilə Antaliya qalasına aparılaraq oradakı zindanda həbs edilir. Moğolların yanında olan Səlcuqlu elçiləri Konyaya qayıdanda münəccim Əsirəddini Arranda gördüklərini bildirirlər. O, moğol komandanı Baycu noyanın yanına gedərək Zeynəddinin həbsi ilə əlaqəli təfsilatlı məlumat vermiş, bunun müqabilində qiymətli hədiyyələr almışdı. Zeynəddin Baycu noyanın tələbi ilə Antaliyadakı zindandan Konyaya gətirilmişdi. Daha sonra sərbəst buraxılan Zeynəddin Baycu noyanın yanına

---

569 REZƏVİ, *həmin əsər*, s. 186.

570 AQSARAYİ, *Müsamərətü'l-Əxbar*, s. 419.

571 Hüseyn ibn Muhəmməd İBN BİBİ, *Əvamirü'l-Əlaiyyə fi Umuri'l-Əlaiyyə*, (Nşr. A. S. Erzi), s. 273, Ankara 1956.

getmişdi[572]. Burada sözü gedən münəccimin Əsirəddin Əbhəri olduğunu dəqiqləşdirmək çətindir. Lakin qeyd etmək lazımdır ki, onun yaxın dostu Nasirəddin Tusi moğol Elxanilərə sədaqətlə xidmət etmişdi. Həmin bu dövrdə Anadoluda Əsirəddin adlı ikinci bir münəccim, astronom yaşamamışdır.

**Əbu Abdullah Muhəmməd ibn Əhməd ibn Əmr Əbhəri**

əs-Siqa, yəni mötəbər hədis ravisi idi. Bir müddət İsfəhanda yaşamış və İsfəhanın tanınmış hədis alimlərinin tələbəsi olmuşdur. Bəsrədə Nəsr ibn Əli və Əbi'r-Rəbyi' əs-Səmtidən hədis dinləmiş və nəql etmişdi. Aşağıdakı hədisin raviləri arasında Əbu Abdullah Muhəmməd Əbhəri vardır: Allah Rəsulu (ق) buyurdular ki; "Allah İmranın qızı Məryəmi, Fironun xanımı Asiyəni və Musanın bacısı Külsümü cənnətdə mənə zövcə olaraq verməyə hökm etdi"[573]. Əbu Abdullah Muhəmməd Əbhəri H. 315-ci ildə (927) vəfat etmişdi[574].

**Hüseyn ibn Muhəmməd ibn Əsid Əbhəri**

Hədis ravisi idi. Əhməd ibn Sabit ər-Razi, Səid ibn Ənbəsə ər-Razi, Əmr ibn Əli əl-İsfəhanidən hədis dinləmiş və nəql etmişdi. H. 293-cü ildə (906) vəfat etmişdi[575].

**Qazi Muhyəddin Əbu Salim Əhməd ibn Əbu'n-Nəcm ibn Muhəmməd ibn Əbdülmün'im əl-Üseydi Əbhəri**

Mühəddis və eyni zamanda Əbhər şəhərinin qazisi idi. Əbu Əli Həsən ibn Əhməd əl-Muqri və Əbu Bəkr Əhməd əz-Zəncaninin tələbəsi olmuş, onlardan hədis, fiqh dərsləri və icazətnamə almışdı. Muhyəddin Əbhərinin ölüm tarixi h. 600-cü (1204) ildən sonraya təsadüf edir. İbnü'l-Fuvatinin yazdığına görə alim Əbhərdə vəfat edərkən yaşı 100-ü

---

[572] *Yenə orada*.

[573] İBN MACƏ, *Sünən*, Nikah babı, s. 311. (يا عائشة أما تعلمين أن الله زوجني في الجنة مريم بنت عمران وكلثم أخت موسى وامرأة فرعون). Bəzi mühəddislər, məsələn şeyx Nasirəddin Əlbani, bu hədisin, münkər hədis olduğunu bildirmişdilər. Bax: http://arabic.islamicweb.com/Books/albani.asp?id=1113. Münkər hədis, yəni ravilərindən birinin zəif olduğu hədisdir. Daha doğrusu zəif bir ravinin siqa raviyə müxalif olaraq nəql etdiyi hədisdir.

[574] ƏNSARİ, *Təbəqatu'l-Mühəddisin*, s. 273.

[575] ƏNSARİ, *Təbəqatu'l-Mühəddisin*, s. 274.

ötmüşdü[576]. Cəmaləddin Əsnəvi, irəlidə haqqında ətraflı məlumat verəcəyimiz, 1012-1107-ci illərdə yaşamış Əbu Bəkr Əhməd əz-Zəncaninin qazi Muhyəddin Əbhərinin müəllimi olduğunu qeyd etmişdir[577]. 1107-ci ildə vəfat etmiş bir şəxsin tələbəsi olduğuna görə görünür vəfat edərkən Muhyəddin Əbhərinin yaşı 100-ü xeyli ötübmüş.

**Qazi Muhyəddin Əbu't-Təyyib Muhəmməd ibnü'l-Mükərrəm ibn Məs'ud ibn Həmmad əl-Əyyadi Əbhəri**

Yaşadığı dövrün tanınmış fəqihlərindən və alimlərindən biri olmuşdur[578]. İbnü'l-Fuvati alimin yaşadığı dövr və ya ölüm tarixiylə bağlı heç bir məlumat verməmişdir.

**Müəddib İzzəddin Əbü'l-Fəzl Muhəmməd ibn Əbdürrəhman ibn Muhəmməd Əhəri**

Onun atası Şəmsəddin Əbdürrəhman dövrünün tanınmış alimlərindən idi və köçüb Təbrizdə məskunlaşmışdı. İzzəddin Əbü'l-Fəzl Əhəri öz atasının yanında təhsil almışdı. O, gözəl xəttlə yazı yazırdı. İzzəddin Əbü'l-Fəzl Əhərinin Təbriz şəhərində əyan və zadəgan uşaqlarının təhsil aldıqları şəxsi məktəbi var idi. Tarixçi İbnü'l-Fuvati onunla iki dəfə görüşdüyünü qeyd etmişdir. Birinci dəfə Əhərdə şeyx Cəlaləddin Əbdülhəqq Əhərinin yanında, ikinci dəfə isə 1266-cı ildə Təbrizdə xətib Şihabəddin əl-Həddadi Təbrizinin evində[579]. İbnü'l-Fuvati İzzəddin Əhərinin ölüm tarixini qeyd etməmişdir. Güman ki, o, İbnü'l-Fuvatidən (öl. 1323) sonra vəfat etmişdir.

**Hacib Fəxrəddin Cəbrayıl ibn Əhməd Peykər Əhəri**

İbnü'l-Fuvati onun hacıblər nəslinə mənsub olduğunu və hacib "Təşkin əl-Kəbir"in[580] oğlu olduğunu qeyd edir. Hacib Fəxrəddin Cəbrayılın Nurəddin Mikayıl adlı bir qardaşı da var idi. Hacib Fəxrəddin Azərbaycanın Əhər, Əvrab, Mincarun qalalarının və bu qalaların ətrafındakı ərazilərin hakimi idi. O, vəzir Rəbibəddin Əbü'l-Qasım

---

576 BÜNYADOV, "Vidnıye Deyateli Azerbaydjana v Soçinenii İbn al-Fuvati", s. 61-67.
577 ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 301-302.
578 BÜNYADOV, *həmin məqalə*.
579 BÜNYADOV, *həmin məqalə*.
580 [تشكين الكبير]

Harunun yaxın dostu idi. Onun ölümündən sonra Şəmsəddin Əlişir haciblik vəzifəsində təyin olunmuşdu[581].

İbnü'l-Fuvatinin "Məcməü'l-Adab"ını təhqiq edib nəşrə hazırlayan Dr. Mustafa Cavad bu adı şərh edərkən "bu ad Nuştəkin adını xatırladır və Nuştəkin Əbu Nəsr ibn Cuheyrin xidmətində olan əmirlərdən biri idi" deyə qeyd etmişdir. Azərbaycanın coğrafiyası və tarixi ilə tanış olmaması naşiri yanıltmışdır. Burada sözü gedən şəxsin adı əslində "Təşkinü'l-Kəbir" deyil Piştəkindir. Bu şəxs və onun nəsli haqqında Nəsəvi öz əsərində ətraflı və maraqlı məlumat verir. Nəsəvinin yazdığına görə sultan Muhəmməd Xarəzmşah (1200-1220) İran, İraqi-Əcəm və Azərbaycanın bir qismini işğal edib atabəy Özbəyin (1211-1225) ordusu məğlub edəndən sonra atabəyin vəziri Rəbibəddin Əbü'l-Qasım Harunu və atabəyin əmirlərindən məlik Nüsrətəddin Muhəmməd ibn Piştəkini (öl. 1231) əsir almışdı[582]. Muhəmməd Xarəzmşah hər gün Həmədan şəhərinin meydanında topağac (polo) oynayır, əsir vəziri və əmirləri də meydanda ayaq üstə dayanıb ona tamaşa etməyə məcbur edirdi. Bunula o, əslində əsirləri alçaltmaq məqsədi güdürdü. Belə günlərdən birində sultan Muhəmmədin gözünə məlik Nüsrətəddin Muhəmmədin qulaqlarındakı iri sırğalar sataşdı. Bu halqavari sırğaların hər biri bilərzik böyüklüyündə idi. Sultan məlik Nüsrətəddinə yaxınlaşıb "bunlar nədir belə?" deyə soruşmuşdu. Məlik Nüsrətəddin isə belə cavab vermişdi: "Böyük Səlcuqlu sultanı Alparslan (1063-1072) gürcü çarının (IV Baqrat) ordusunu məğlub etdiyi vaxt (1064) əsir alınmış gürcü komandanları onun hüzuruna gətirilmişdilər. Sultan onları edam etdirməyib canlarını bağışladı, sonra da onları Böyük Səlcuqlu dövlətinə xidmət etmələri şərtiylə əsirlikdən azad etdi. Onların hər biri üçün bir cüt qızıl sırğa düzəltdirib üstünə öz adını yazdırdı və onların qulaqlarına taxdırdı. Səlcuqlu dövləti zəiflədiyi vaxt həmin məmlüklər itaətdən imtina etdilər. Sadəcə mənim babam İslamı qəbul etdi. O, Allaha itaət və sultana sədaqətdən ötrü peşman olmadı". Onun bu sözləri Muhəmməd Xarəzmşahı mütəəssir etdi, sultanın qəlbi riqqətə gəldi və onu əsirlərin arasından ayırdı. Hətta öz əli ilə ona xələt geyindirdi. Sonra ondan Azərbaycanda haranın hakimi olduğunu soruşdu. Məlik

---

581 İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 140.

582 Bu haqda daha ətraflı məlumat üçün bax: BÜNYADOV, *Azərbaycan Atabəyləri Dövləti*, s. 110; İbrahim KAFESOĞLU, *Harezmşahlar Devleti Tarihi*, s. 203, Ankara 1992.

Nüsrətəddin "Əhər və Ləvla qalalarının" deyə cavab verdi. Sultan sahib olduğu mülklərin və üstəlik Sərab şəhərinin də hakimliyini ona verdiyinə dair fərman imzaladı"[583]. Göründüyü kimi məlik Nüsrətəddin Muhəmməd ibn Piştəkin babasının gürcü ordu komandanı olduğunu, əsir düşüb, sonra azad edildiyini və İslamı qəbul edərək Əhər və ətraf vilayətlərin hakimi olduğunu bildirmişdir. İbnü'l-Fuvati isə hacib Fəxrəddin Cəbrayılın atasının adının "Təşkinü'l-Kəbir", yəni böyük Təşkin (yəni Piştəkin) olduğunu yazmışdır. Ehtimal ki, əlyazmada "Biştəkinü'l-Kəbir" və ya "Bişkinü'l-Kəbir" yazılmışdır. Çünki ərəb dilində "p" səsi və bunu ifadə edən hərf yoxdur. Naşir isə bunu "Təşkin" kimi oxumuşdur. Ərəb orfoqrafiyasının xüsusiyyətlərindən irəli gələn dolaşıqlığın Dr. Mustafa Cavadı yanıltdığını düşünürük. Əmir Piştəkinin Əhərdən başqa sahib olduğu, Nəsəvinin Ləvla, İbnü'l-Fuvatinin isə Əvrab olaraq qeyd etdikləri, qala isə indiki Meşkin şəhəridir ki, Əhərlə Ərdəbil arasında yerləşir. Meşkin isə "Piştəkin"in[584] vaxt keçdikcə deformasiyaya uğramış şəklidir. Həmidullah Müstəvfi (öl. 1350) Azərbaycan coğrafiyası haqqında məlumat verərkən "Pişkin" maddəsində belə yazır: "Bu şəhərin əvvəlki adı Vəravi idi. Lakin sonra gürcü Pişkin buraya canişin təyin olundu və şəhər onun adı ilə adlandırıldı"[585]. Həmidullah Müstəvfinin "Pişkin" adlandırdığı gürcü canişin isə bu şəhərin hakimlərinin babası böyük Piştəkindən başqası deyildir[586].

İbnü'l-Fuvatinin qeydlərindən hacib Fəxrəddin Cəbrayıl Əhərinin atabəy Özbəyin (1211-1225) vəziri Rəbibəddin Əbü'l-Qasım Harunun müasiri olduğu məlum olur. Elə isə hacib Fəxrəddinin XII-XIII əsrlərdə yaşadığını təxmin etmək olar. Ehtimal ki, məlik

---

583 *Siyrətü's-Sultan Cəlaləddin Məngübərti*, s. 60-61.

584 Fikrimizcə bu ad məhz "Piştəkin" olaraq oxunmalıdır. Sözü gedən şəxsin gürcü ordusunun əsir düşmüş hərbi komandanı olduğunu nərzərə alaraq belə demək olar. "Piştəkin" iki ayrı sözün, farsca ön, qabaq, qabaqcıl, rəhbər, öndəki mənasını ifadə edən "piş" və türkcə şahzadə, bəyzadə mənasını ifadə edən "təkin" (əslində "tegin" və ya "tigin") sözlərinin birləşməsindən meydana gəlmişdir. Türk və İslam tarixində əsirlikdən əmirliyə və hökmdarlığa yüksəlmis çox sayıda mənşəcə türk olan şəxsə rast gəlmək olar. Məsələn bunlardan Alptəkin, Səbüktəkin, Savtəkin, Ənuştəkin, Böritəkin, Bəgtəkini nümunə göstərmək olar. Fikrimizcə burada sözü gedən Piştəkin də gürcü ordusunda xidmət edən və məşəcə türk olan sərkərdə idi. Çünki sözü gedən dövrdə gürcü ordusunda çox sayıda qıpçaq türkü xidmət etmişdir. Məlik Nüsrətəddinin də dediyi kimi onun ulu babası Səlcuqlu dövlətinin zəifləməsindən sui-istifadə edərək itaətdən boyun qaçırmamış, əksinə İslamı qəbul etmişdi. Fikrimizcə onu belə bir addıma sövq edən şey Azərbaycanda məzh öz irqdaşları arasında olması olmuşdur. "Piş" və "Tegin" sözləri üçün bax: KANAR, *Büyük Farsça-Türkçe Sözlük*, s. 154; Orhan Güdül KUTALMIŞ, *Türkçe İnsan Adları ve Anlam-kökenleri*, s. 249, 252. http://www.kitablar.org/details.php?book_id=1008

585 Həmidullah Əhməd ibn Əbu Bəkr əl-MÜSTƏVFİ, *Nüzhətü'l-Qülub*, s. 85, (Nşr. G. Le Strange) London 1919.

586 Piştəkinlər sülaləsi haqqında bax: İ. P. PETRUŞEVSKİY, *Oçerki po İstorii Feodalnıx Otnoşeniy v Azerbaydjane i Armenii v XVI-XIX vv*, s. 79, Leninqrad 1949.

Nüsrətəddin Muhəmməd hacib Fəxrəddin Cəbrayıl Əhərinin və ya onun qardaşı Nurəddin Mikayılın oğlu idi.

**Şeyx Fəxrəddin Əbü'l-Həsən Əli ibn Yunis ibn Mahmud Əhəri**

Təsəvvüf əhlinə mənsub mühəddis idi. İbnü'l-Fuvati onun yaşadığı dövrün böyük təsəvvüf alimlərindən biri olduğu qeyd etmişdir. Alim h. 664-cü ildə (1266) Marağaya gəlmiş və bu şəhərdə yaşamışdır. O, daim sükut edir[587], sadəcə ondan nəsə soruşulanda cavab verirdi[588]. Ölüm tarixi qeyd olunmamışdır.

**Şeyx İmadəddin Əbü'l-Fəzl Fəzlullah ibn Hüseyn ibn Əbdüləziz Əhəri**

Mühəddis və təsəvvüf əhlinə mənsub şeyx idi. Şeyx İmadəddin Fəzlullah alim, zahid və saleh insan idi. O, Əhərdəki məşhur təsəvvüfçü şeyxlərin nəslindən idi. Ömər ibn Əbü'l-Hüseyn əl-Əştəridən hədis dərsləri almışdı. Onun Əhərin Babi-Kaşan səmtində möhkəm divarlarla əhatə olunmuş zaviyəsi var idi. İbnü'l-Fuvati h. 659-cu ildə (1261) bu zaviyəni gördüyünü qeyd etmişdir. Şeyx İmadəddin Fəzlullah Əhəri həcc üçün yola çıxmış, Bağdada, oradan da Məkkəyə getmişdir. Həcc ziyarətindən sonra bir müddət Məkkədə qalmış və hədis dərsləri vermişdi. Onun dərslərini dinləmiş tələbələr arasında mühəddis Rüknəddin Əbü'l-Qasım Əbdürrəhman əl-Məkki də olmuşdur[589]. Ölüm tarixi qeyd olunmamışdır. XII-XIII əsrlərdə yaşamışdır.

**Şeyx Şihabəddin Mahmud ibn Əhməd Əhəri**

Şafi'i məzhəbinə mənsub fəqih və fütüvvət şeyxi idi. h. 580-ci ilin şaban ayında (noyabr 1184) dünyaya gəlmişdi. Azərbaycan Atabəylərinin hakimiyyəti dövründə Azərbaycanın tanınmış alim, zahid və abidlərindən biri olan şeyx Şihabəddin Mahmud Azərbaycan mədrəsələrində təhsil alandan sonra təhsilini davam etdirmək üçün təqribən h. 606-cı ildə (1209) Bağdada getmişdi. Bağdadda azərbaycanlı şeyx

---

[587] Bu bir növ susma orucu olmalıdır. Şeyx Fəxrəddin Əli Əhəri hədis alimi olduğu üçün dilin insanın başına bəla olan iki əsas bədən üzvündən biri olduğu haqqındakı çoxsayılı hədisləri sözsüz ki, yaxşı bilirdi.

[588] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 263.

[589] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 806-807.

Rüknəddin Şücasi ilə tanış olub ona intisab etmiş, müridi olmuşdu. Şeyx Şihabəddin Mahmudun "Eşqnamə" adlı əsəri olduğu bilinir. Şeyx Şihabəddin Mahmud Əhəri h. 665-ci ildə (1267) vəfat etmiş və Əhərdəki öz xanəgahında dəfn edilmişdi. Bu gün qəbrinin mövcud olduğu məqbərə, məscid və xanəgah təqribən XIII əsrin axırlarında inşa edilmiş, sonrakı əsrlərdə bir neçə dəfə əsaslı təmir edilmişdi.

**Cəlaləddin Abdullah ibn Abdullah Ərdəbili**

Hənəfi məzhəbinə mənsub fəqih idi. İraqın tanınmış alimlərindən dərs almış, təhsilini başa vurandan sonra Qahirəyə getmişdi. əl-Əşrəf mədrəsəsinin müdərrisi olmuşdu. Həmçinin Misirdə qaziəsgər[590] idi. H. 807-ci ilin ramazan ayında (mart 1405) Qahirədə vəfat etmişdi[591].

**Əbu Zur'ə Əbdülvəhhab ibn Muhəmməd ibn Əyyub Ərdəbili**

Hənəfi məzhəbinə mənsub fəqih idi. Çox ibadət edən, zahid bir şəxs idi. İranın Fars vilayətində h. 415-ci il rəcəb ayının 5-i (11 sentyabr 1024) vəfat etmişdi[592].

**Şeyx Müinəddin Əbu Cə'fər Ömər ibn Muhəmməd ibn Xıdır Ərdəbili**

Təsəvvüf şeyxi və tarixçi idi. Mosulda anadan olmuş və bu şəhərdə böyümşüdü. Daha sonra Suriyaya gedərək burada məskunlaşmış və h. 570-ci ildə (1175) Dəməşqdə vəfat etmişdi. Atabəy Nurəddin Mahmud Zəngi[593] (1146-1174) şeyx Müinəddin Ömər Ərdəbiliyə dərin hörmət və ehtiram bəsləyir, onu himayə edirdi. Müinəddin Ömər Ərdəbili Muhəmməd peyğəmbərin (ق) dövündəki İslam tarixinə dair "Vəsilətü'l-Mütəəbbidin fi Sirəti Seyyidi'l-Mürsəlin" adlı əsərin müəllifi idi[594].

**Qazi İmadəddin Əhməd ibn İsmayıl Ərdəbili**

---

590 Qaziəsgər və ya qaziüləsgər-hərbi işlər üzrə hakim.
591 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VII, s. 736-737.
592 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 68.
593 İmadəddin Zənginin Mosulda qurduğu Zəngilər dövləti (1127-1234) onun ölümünən (1146) sonra oğulları arasında bölüştürülmüşdü. I Seyfəddin Ğazi və Qütbədin Məvdud Mosul atabəyi, Nurəddin Mahmud isə Hələb atabəyi olmuşdu.
594 BAĞDADLI, *İzahü'l-Məknun*, C. II, s. 454; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 573.

Qazi İmadəddin Əhməd Ərdəbil şəhərinin qazilərinin nəslindən idi. Onun mənsub olduğu ailə raşid xəlifələrdən Ömər ibn Xəttab (ﺭ) və Əli ibn Əbu Talibin (ﺭ) öz dəsti-xəttləri ilə yazdıqları məktublara sahib idi və nəsildən nəslə ötürərək bu məktubları mühafizə edirdilər. Qazi İmadəddin Əhməd, Şihabəddin Sührəvərdi[595] və mühəddis Əbü'l-Xeyr Qəzvininin (1118-1194) tələbəsi olmuşdu. O, Əbü'l-Xeyr Qəzvinidən Muhyəddin Hüseyn Bəğəvinin (öl. 1122) "Şərhü's-Sünnə" adlı çoxcildli hədis külliyatını dinləmişdi[596].

**Şeyx Cəmaləddin Abdullah Ərdəbili**

Hənəfi məzhəbinə mənsub fəqih idi. Elmi ilə yanaşı fəziləti və salehliyi ilə də məşhur olmuşdu. Misirdə Sürqatmışiyyə mədrəsəsində müəllim işləmiş, daha sonra Canıbəkiyyə mədrəsəsinə müdərris təyin olunmuşdu. Cəmaləddin Abdullah vəfatına qədər bu mədrəsədə dərs vermişdi. Alim h. 869-cu ilin şaban ayında (aprel 1465) vəfat etmişdi. Vəfatından sonra Canıbəkiyyə mədrəsəsi müdərrisliyinə onun yetişdirdiyi alimlərdən şeyx Xeyrəddin əl-Şunişi təyin olunmuşdu[597].

**Cəmaləddin Muhəmməd ibn Əbdülqəni Ərdəbili**

Öz dövrünün məşhur filoloq və ədəbiyyatşünaslarından biri idi. Qənizadə ər-Rumi adı ilə tanınan alim həmçinin hənəfi məzhəbinə mənsub fəqih və müfəssir idi. "ər-Rumi" nisbəsi ilə tanınması onun Anadoluda yaşadığı ehtimalını gücləndirir. Cəmaləddin Muhəmməd Ərdəbili h. 980-1036-cı (1572-1627) illərdə yaşamışdır. Alim "Haşiyə ələ Ənvari't-Tənzil li'l-Bəyzavi", "Ənvar fi'l-Fiqhü'ş-Şafi'i", "Şərhü'l-Unmuzəc fi'n-Nəhv" adlı əsərlərin müəllifi idi. Bu sonuncu əsəri Əbu'l-Qasım Carullah Zəməxşərinin ərəb filologiyasına dair "Unmuzəc fi'n-Nəhv" əsərinə yazmış şərh idi[598]. Türkiyənin əlyazma

---

[595] Buradakı şəxsin şeyx Şihabəddin Ömər Sührəvərdi (öl. 1234) yoxsa "məqtul" ləqəbli filosof Şihabəddin Yəhya Sührəvərdi (1155-1191) olduğunu dəqiqləşdirmək mümkün olmamışdır. Ehtimal ki, söhbət şeyx Şihabəddin Ömər Sührəvərdidən gedir.

[596] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 656-657.

[597] Şəmsəddin Əbü'l-Xeyr Muhəmməd ibn Əbdürrəhman əs-SƏXAVİ, *Zəvu'l-Lami' fi Üləmai'l-Qərnü't-Tasi'*, C. II, s. 463, Əmman 1992.

[598] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 417; ZİRİKLİ, *Ə'lam*, C. VI, s. 298; KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 270. Katib Çələbi və ona istinadən Xeyrəddin Zirikli Cəmaləddin Ərdəbilinin h. 647-ci ildə (1249) vəfat etdiyini qeyd etmişdirlər. Fikrimizcə Katib Çələbi yanılmışdır, burada Ömər Rza Kəhhalənin verdiyi məlumat daha doğrudur.

əsər kitabxanalarında Cəmaləddin Ərdəbilinin "Şərhu Unmuzəc fi'n-Nəhv"inin yüzlərlə nüsxəsi mövcuddur. Paris milli kitabxanasında isə əsərin dörd nüsxəsi saxlanılır[599]. Bu da əsərin uzun müddət mədrəsələrdə dərslik kimi oxudulduğunu göstərir.

**Qazi Kəmaləddin Musa ibn Abdullah ibn Mahmud ibn İsmayıl Ərdəbili**

Şafi'i məzhəbinə mənsub fəqih idi. O, Mosulda seyyid Rüknəddinin tələbəsi olmuş, ondan fiqh elmini öyrənmişdi. İbnü'l-Fuvati onun h. 714-cü (1315) ildə Sultaniyyədəki əl-Qazaniyyə mədrəsəsinin müdərrisi olduğunu yazmışdır. Müəllif həmçinin qeyd edir ki, o, qazi Kəmaləddin Ərdəbilidə vəzir Rəşidəddin Qəzvininin "Cəmiü't-Təvarix" adlı əsərini görmüş və bu əsərlə ilk dəfə belə tanış olmuşdu[600]. Qazi Kəmaləddin Ərdəbilinin ölüm tarixi məlum deyil. XIII-XIV əsrlərdə yaşamışdır.

**Şeyx Sənanəddin Ərdəbili**

Təsəvvüf əhlindən xəlvətiyyə təriqətinə mənsub şeyx idi. Təsəvvüf yoluna mürşidi şeyx Çələbi Xəlifə[601] vasitəsi ilə qədəm qoymuşdu. İstanbuldakı ilk xəlvətiyyə xanəgahı olan Qoca Mustafa paşa xanəgahında irşad, mənəvi tərbiyə və ibadətlə məşğul olmuşdu. Çələbi Xəlifə bu xanəgahın ilk şeyxi olmuşdur. Şeyx Sənanəddin Ərdəbili zahid və abid insan idi. H. 951-ci ildə (öl. 1554) qaldığı zaviyədə vəfat etmişdi[602]. O, sufilərin rəqs və səma mərasimlərinə dair "Risalə fi Dövranü's-sufiyyə" adlı əsəri ərəb dilindən türkcəyə tərcümə etmişdir. Bu tərcümənin bir nüsxəsi Qahirədə, Misir milli kitabxanası türkcə əlyazmalar bölməsində saxlanılır.

**Əbü'l-Qasım Hibətullah ibn Abdullah ibn Əhməd ibn Cə'fər əl-Kəmmuni Ərdəbili**

---

Çünki onun təfsirinə şərh yazdığı qazi Nasirəddin Bəyzavi 1289-cu ildə vəfat etmişdi. 1249-cu ildə ölmüş bir şəxsin özündən 40 il sonra vəfat edəcək alimin əsərinə şərh yazması mümkün deyil. Bundan başqa, yuxarıda qeyd etdiyimiz kimi, Cəmaləddin Ərdəbili həmçinin "Qazizadə" soyadı ilə tanınmışdır. Bu cür soyadlarına daha çox Osmanlı imperatorluğundakı alim və bürokratlarda rast gəlinir.

599 Mac Guckin DE SLANE, *Catalogue des Manuscrits Arabes*, s. 650, 652, Paris 1883-1895.

600 BÜNYADOV, "Vidnıye Deyateli Azerbaydjana v Soçinenii İbn al-Fuvati", s. 61-67.

601 Çələbi Xəlifə və Camal əl-Xəlvəti kimi adlarla tanınmış şeyx Hamidəddin Muhəmməd Ağsarayi (öl. 1494) Xəlvətiyyə təriqətinin tanınmış şeyxlərindən idi.

602 TAŞKÖPRÜZADƏ, *Şəqaiqü'n-Numaniyyə*, s. 317.

Yaşadığı dövrdə şafi'i məzhəbinin tanınmış fəqihlərindən biri idi. Qəzvin mədrəsələrində hədis və fiqh dərsləri almışdı. Qəzvində fəqih Əbu Zur'ə Abdullah ibn Hüseyn ibn Əhməd, qazi Əbdülcabbar ibn Əhməd[603] kimi alimlərdən dərs almışdı[604]. Əbü'l-Qasım Hibətullah Ərdəbilinin ölüm tarixi məlum deyil. X-XI əsrlərdə yaşamışdır.

**İshaq ibn Əhməd Ərdəbili**

Hənəfi məzhəbinə mənsub mütəkəllim idi. Sultan IV Muradın hakimiyyəti dövründə (1623-1640) Osmanlı imperatorluğunun tanınmış kəlam alimlərindən biri idi. O, İbn Nuceym kimi məşhur olmuş kəlam alimi Zeynəddin ibn İbrahim əl-Misrinin (1562) "əl-İşbah və'n-Nəzair" adlı əsəninə şərh mahiyətində yazılmış "Risalə ələ'l-İşbah və'n-Nəzair" adlı əsərin müəllifi idi. İshaq Ərdəbili h. 1055-ci ildə (1645) vəfat etmişdir[605].

**Şeyx Əlaəddin Əli ibn Qasım Ərdəbili**

Şafi'i məzhəbinə mənsub qari idi. Fələstinin əl-Xəlil şəhərində yaşamışdı. Kəmaləddin ibn Əbi Şərifin tələbəsi olmuşdu. O, Qur'ani-Kərimin tərtillə oxunması, qiraətdə təcvid qaydalarına riayət edilməsində öz dövrünün mahir qarilərindən idi. Bundan başqa ərəb dilinin qrammatikası, fəraiz, fiqh və riyaziyyat sahələrində də dərin biliyə malik idi. İmam Şatibinin qiraət məktəbinin davamçılarından biri hesab olunurdu. Alim h. 896-cı ilin rəbiələvvəl ayında (yanvar 1491) əl-Xəlildə vəfat etmişdi[606].

**Cəmaləddin Abdullah ibn Muhəmməd Həsən ibn Xıdır əl-Gürani Ərdəbili**

Şafi'i məzhəbinə mənsub müfəssir və mütəkəllim idi. Güran[607] qəsəbəsində dünyaya gəldiyi üçün həmçinin əl-Gürani nisbəsi ilə tanınırdı. Kəlam sahəsindəki dərin elmi

---

603 Qazi İmadəddin Əbdülcabbar Əbü'l-Həsən ibn Əhməd Əstərabadi (öl. 1024) mö'təzilə məzhəbinin tanınmış alimlərindən biri idi.

604 RAFİ'İ, *Tədvin*, C. IV, s. 134.

605 KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. I, s. 339.

606 SƏXAVİ, *Zəvu'l-Lami'*, C. III, s. 97.

607 Ərəbcə [كوران], farscada isə [گوران] formasında yazılan bu yer adını Güran, Kuran və ya azərbaycan türkcəsinə uyğun şəkildə Goran kimi oxumaq mümkündür. Güran adı ilə iki yaşayış məntəqəsi bilinir. Bunlardan biri İranın İsfərayin şəhəri ətrafındakı, digəri isə yenə də İrandakı Şəhrizur yaxınlığındakı kənddir. Lakin məlum olduğu kimi Azərbaycanda da, Goranboy rayonunda, Goran adlı yaşayış məntəqəsi var. Cəmaləddin Abdullah Ərdəbilinin Goranda anadan olması da mümkündür. əl-Gürani nisbəsi ilə məşhur olan başqa bir alim mövlana Şəmsəddin Əhməd ibn İsmayıl Güranidir (öl. 1488). Osmanlı tarixində qısaca Molla Gürani kimi tanınan kürd mənşəli bu alim

biliyi və fəziləti ilə şöhrət tapmışdı. Dəməşqdə Səidü's-Süəda xanəgahının şeyxliyinə təyin olunmuş, burada tələbələrə təfsir dərsləri vermiş, əl-Məzhəriyyə təfsirini oxutmuşdu. Alim h. 894-cü (1489) ildə Suriyada vəfat etmişdi[608].

**Əllamə Tacəddin Əbü'l-Həsən Əli ibn Abdullah ibn Əbu Bəkr Ərdəbili**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Ərdəbildə doğulub böymüşdü. Daha sonra Təbrizə gedərək bu şəhərin mədrəsələrində təhsil almışdı. Təhsil almaq məqsədiylə İranın Şəhrizur şəhərinə gedərək bir müddət burada yaşamışdı. Daha sonra Azərbaycana qayıdaraq Marağa və Sultaniyyədəki mədrəsələrdə təhsil almış, buradakı alimlərdən müxtəlif elm sahələrinə dair bilikləri öyrənmişdi. O, Qütbəddin Mahmud Şirazi və Şəmsəddin ibnü'l-Müəzzindən hədis, Rüknəddin əl-Hədisidən ərəb filologiyası və fiqh, Nizaməddin ət-Tusidən xitabət və bəyan, seyyid Burhanəddin Übeydullahdan hikmət və məntiq, Əlaəddin Ne'man əl-Xarəzmidən xilaf, Kəmaləddin Həsən İsfəhanidən hesab, həndəsə və astronomiya, Səlahəddin Musadan cəbr, şeyxüzzaman Siracəddin Həmzə Ərdəbilidən fiqh dərsləri almışdı. Həmçinin şeyx Fəxrəddin Carullah əl-Cəndəraninin yanında Muhyəddin Hüseyn Bəğəvinin (öl. 1122) hədis elmlərinə dair "Şərhü's-Sünnə" və "əl-Məsabih" adlı əsərlərini oxumuşdu[609]. Səlahəddin Səfədi Tacəddin Əli Ərdəbilinin şeyx Rüknəddin Sücasi, şeyx Qütbəddin Əbhəri, şeyx Şihabəddin Ömər Sührəvərdi kimi azərbaycanlı fütuvvət ərbabının əsərlərini oxuduğunu və onların mənəvi irsinin davamçısı olduğunu qeyd etmişdir[610]. Tacəddin Əli Ərdəbili təhsilini başa vurduqdan sonra Bağdada getmişdi. Bir müddət Bağdadda qaldıqdan sonra həcc ziyarəti üçün Hicaza səyahət etmişdi. Həcc ziyarətindən sonra h. 722-ci ildə (1322) Misirə gedərək Qahirədə əl-Hüsamiyyə-Toruntayi[611] mədrəsəsinin müdərrisi olmuşdu. Yaşadığı dövrdə Misir Məmlüklü dövlətində fiqh, fiqh üsulu,

---

sultan Fateh II Mehmedin (1451-1481) şahzadəlik illərində müəllimi və tərbiyəçisi olmuşdu. Müasir dövrdə isə İranda yaşayan əlillahiləri "goran" adlandırırılar. Lakin bunun əl-Gürani nisbəsi ilə bir əlaqəsi ola biləcəyi ehtimalı yoxdur.

[608] Cəlaləddin Əbdürrəhman ibn Əbu Bəkr SÜYUTİ, *Nəzmü'l-İqyan fi İ'yanü'l-Əyan*, s. 99, Beyrut 2001.

[609] Səlahəddin Xəlil ibn Aybək SƏFƏDİ, *Ə'yanü'l-Əsr və Ə'vanü'n-Nəsr*, C. III, 407-408, Dəməşq 1998.

[610] *Yenə orada*.

[611] Hüsaməddin Toruntay-Misir Məmlüklü sultanı Mənsur Seyfəddin Qələvunun (1279-1290) hakimiyyəti dövründə səltənət naibi olmuşdu. Türk mənşəli bu dövlət xadimi öz adı ilə tanınan mədrəsəni də həmin dövrdə inşa etdirmişdi.

təfsir, hədis və ərəb filologiyası üzrə qabaqcıl alimlərindən biri kimi tanınmışdı. Bundan başqa o, tibb, cədəl, riyaziyyat, həndəsə və məntiq elmlərində də dərin biliyə malik idi. Əl-Hüsamiyyə mədrəsəsində onun dərslərində çox sayıda tələbə iştirak edirdi. Tacəddin Əli Ərdəbili müxtəlif elm sahələrinə dair bir sıra əsərlərin müəllifi idi. Bunlardan biri də İbn Hacib Düveyninin əsərinə yazdığı "Şərhu-Kafiyyə"[612] adlı şərhdir. Onun qələmə aldığı bir digər əsər "Haşiyə ələ Şərhü'l-Haviü's-Səğir"[613] adlanır. "Müxtəsər Ulumü'l-Hədis li İbnü's-Səlah" də Tacəddin Əli Ərdəbilinin qələmindən çıxmış hədis elmlərinə dair əsərdir. O, həmçinin riyaziyyata dair "Təzkirə fi'l-Hisab" adlı əsərin də müəllifi idi. Alim h. 746-cı ilin ramazan ayında (yanvar 1346) Qahirədə vəfat etmişdi[614].

**Əbü'l-Fəzl Mahmud ibn Əhməd ibn Muhəmməd Ərdəbili**

Şafi'i məzhəbinə mənsub fəqih və mütəkəllim idi. Bağdadda Nizamiyyə mədrəsəsndə təhsil almışdı. Təhsilini başa vurandan sonra Bağdadda qalmış və Kəmaliyyə mədrəsəsində müdərris olmuşdu. Tədrislə məşğul olduğu dövrdə Bağdadda əl-Qəsr camesində təşkil olunan elmi diskussiyalarda iştirak edirdi. Əbü'l-Fəzl Mahmud Ərdəbili h. 625-ci (1228) ildə Bağdadda evinin həyətindəki quyuya yıxılaraq ölmüşdü[615].

**İbrahim ibn Cəbrayıl Ərdəbili**

Mühəddis idi. Qəzvində təhsil almış, Əli ibn Muhəmməd ibn Məhruyə Qəzvini və Əbü'l-Həsən Əli ibn Muhəmməd ibn Quttandan (öl. 1231) hədis dinləmişdi[616]. Ölüm tarixi məlum deyil. XIII əsrdə yaşamışdır.

**Vəfa ibn İbrahim Ərdəbili**

---

612 Bu əsərin tam adı belədir "Məbsutü'l-Əhkam fi Təshih ma Yətə'lləq bi'l-Kəlm və'l-Kəlam min Şərhu-Kafiyyə İbnü'l-Hacib".

613 əl-Haviü's-Səğir-Şeyx Nəcməddin Əbdülğəffar Qəzvininin (öl. 1266) şafi'i fiqhinə dair qələmə aldığı əsərdir.

614 Təqiyəddin Əhməd ibn Əli əl-MƏQRİZİ, *Kitabu's-Süluk fi Mərifəti-Düvəl və'l-Müluk*, C. II, s. 122, Beyrut 1997; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 466; SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. III, 407-408; BAĞDADLI İsmayıl Paşa, *İzahü'l-Məknun fi'z-Zeyli ələ Kəşfü'z-Zünun*, (Nşr. M. R. Kilisli-Yaltkaya Ş), C. II, s. 269, İstanbul 1945.

615 ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 73; Tacəddin Əbdülvəhhab ibn Əli əs-SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, (Nşr. M. ət-Tənnahi-əl-Hülv Ə), C. VIII, s. 203, Qahirə 1976.

616 RAFİ'İ, *Tədvin*, C. II, s. 112.

Mühəddis idi. Qəzvin və Tustər şəhərlərində təhsil almış, Xəlil ibn Əbdülcabbar və Əbu Sə'd Əhməd ibn Əbdülvacid ibn Əhməd Kirmanidən hədis dinləmişdi[617]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**İsmayıl ibn Əhməd ibn Muhəmməd əl-Bədri Ərdəbili**

XIV əsrdə Şam vilayətində yaşamış fəqih idi. İsmayıl Ərdəbili dua və zikrlərə dair "Ənisü'l-Qülub və Qayətü'l-Mətlub" adlı əsərin müəllifi idi. Ölüm tarixi bilinmir. H. 863-cü ildə (1362) həyatda olmuşdu[618].

**Tacü's-Səidi Mir Əbü'l-Fəth Muhəmməd ibn Əmin əs-Səidi Ərdəbili**

XV əsrdə Osmanlı imperatorluğunda yaşamış hənəfi məzhəbinə mənsub əxlaq nəzəriyyəçisi, mütəkəllim və riyaziyyatçılardan idi. Türk riyaziyyatçı və astronom Səlahəddin Musa Qazizadə Ruminin (öl. 1437) tələbəsi olmuşdu. Mir Əbü'l-Fəth Ərdəbili bir sıra əsərlərin müəllifi idi. "Haşiyə ələ Şərhu li'r-Risalətü'l-Əzudiyyə fi Adabü'l-Bəhs", "Haşiyə ələ Şərhu li'Əşkalü't-Tə'sis fi'l-Həndəsə", "Haşiyə ələ Kuçək", "Risalə fi Məqulati'l-Əşr", "Haşiyə ələ Şərhü't-Təbrizi", "Haşiyə ələ Qismü'l-Məntiq" Muhəmməd əs-Səidi Ərdəbilinin qələmindən çıxmış əsərlərdir. Qazizadə Rumi Şəmsəddin Muhəmməd ibn Əşrəf əs-Səmərqəndinin "Əşkalü't-Tə'sis fi'l-Həndəsə" adlı əsərinə şərh yazmış, Mir Əbü'l-Fəth Ərdəbili də bu şərhə haşiyə yazmışdır. "Haşiyə ələ Şərhu li'r-Risalətü'l-Əzudiyyə fi Adabü'l-Bəhs" isə tanınmış azərbaycanlı alim mövlana Muhyəddin Muhəmməd Qarabağinin (öl. 1535) Əzudəddin əl-İcinin əsərinə yazdığı şərhə yazılmış haşiyədir. Bu əsərin nüsxələrindən biri AMEAƏİ-nun fondunda mövcuddur[619]. Türkiyənin əlyazma əsər kitabxanalarında bir neçə nüsxəsi mövcud olan "Haşiyə ələ Qismü'l-Məntiq" Sə'dəddin Təftazaninin (öl. 1390) "Təhzibü'l-Məntiq və'l-Kəlam" və Cəlaləddin Dəvvaninin (öl. 1502) buna yazdığı "Şərhu Təhzibü'l-Məntiq" adlı əsərindəki məntiq elminə dair qismlərə yazılmış haşiyədir[620]. Onun məntiqə dair məşhur əsərlərindən biri də "Haşiyə ələ Risalətü'l-

---

[617] RAFİ'İ, *Tədvin*, C. IV, s. 198.
[618] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. I, s. 359.
[619] ŞƏRİFOV, *Əbdülqəni Əfəndi...*, s. 138-139.
[620] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. I, s. 142.

Hənəfiyyə"dir. Bu əsərin Türkiyə əlyazma əsər kitabxanalarında yüzlərlə nüsxəsi var. Bu da həmin əsərin uzun müddət mədrəsələrdə dərslik kimi istifadə olunduğunu göstərir. "Haşiyə li'r-Risalətü'l-Əzudiyyə fi Adabü'l-Bəhs"in əlyazma nüsxələrindən biri Paris milli kitabxanasında saxlanılır[621]. Alimin ölüm tarixi məlum deyil. H. 875-ci ildə (1470) həyatda olduğu bilinir. 1502-ci ildə vəfat etmiş Cəlaləddin Dəvvaninin əsərinə haşiyə yazdığına görə ölüm tarixini XV əsrin sonu-XVI əsrin əvvəllərinə təsadüf etmiş olmalıdır.

**Əbu Muhəmməd Cə'fər ibn Muhəmməd ibn Cə'fər Ərdəbili**

Hədis ravisi idi. Bağdadda hafiz Nəsr Ərdəbilidən hədis dinləmiş və nəql etmişdi. H. 342-ci ildə (953) hədis dərsləri almaq üçün İsfəhana getmişdi. Hafiz Əbu Bəkr Əhməd ibn Musa ibn Mərduyə ondan hədis dinləmiş və dinlədiyi hədisləri qeyd etmişdi[622]. Ölüm tarixi məlum deyil. X əsrdə yaşamışdır.

**Əbü'l-Hüseyn Yaqub ibn Musa Ərdəbili**

Bağdadda yaşamış siqa hədis ravilərindən idi. Əhməd ibn Tahir ibn Nəcm Miyanəci, Səid ibn Əmr Bərdəi, Əbu Zur'ə Razidən hədis dinləmiş və nəql etmişdi. Əbü'l-Həsən Əli ibn Ömər Darəqutni, Əbu Bəkr əl-Birqani ondan hədis dinləmişdilər. Əbü'l-Həsən Yaqub Ərdəbili əs-siqa, əmin və mötəbər hədis ravisi idi. O, fəzilət sahibi, şafi'i fiqhini dərindən bilən alimlərdən idi. Alim h. 381-ci ilin rəbiəlaxir ayında (iyun 991) Bağdadda vəfat etmişdi[623].

**İbrahim ibn Muhəmməd ibn Əbdürrəhman ibn Vəsiq Ərdəbili**

Azərbaycan Atabəyləri dövrünün (1136-1225) məşhur qarilərindən biri, həmçinin şafi'i fəqihi idi. H. 567-ci ildə (1172) anadan olmuşdu. Əbu'r-Rəbyi' Süleyman ibn Zərqun, Əbu İdris əl-Xəulani kimi alimlərin tələbəsi olmuş, onlardan icazət (diplom) almışdı.

---

621 DE SLAEN, *həmin əsər*, s. 242.

622 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 68; ƏBU NUEYM İSBƏHANİ, *Zikr Əxbaru-İsbəhan*, C. I, s. 250.

623 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 68; İzzəddin Əli İBNü'l-ƏSİR, *Lübab fi Təhzibü'l-Ənsab*, C. I, s. 41, Bağdad (trz).; ŞİRAZİ, *Təbəqatü'l-Füqəha*, s. 45; XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. XIV, s. 295.

İmad ibn Zəhran əl-Məvsili, Sur ibn Zuheyr əl-Kufti kimi dövrün tanınmış qariləri onun tələbəsi olmuşdular. İbrahim Ərdəbili h. 654-cü ilin rəbiəlaxir ayında (may 1256) Misirin İsgəndəriyyə şəhərində vəfat etmişdi[624]. Ehtimal ki, alim moğolların dağıdıcı hücumları vaxtı Azərbaycanı tərk edib Məmlüklər ölkəsinə getmişdi.

**Mövlana Kəmaləddin Hüseyn ibn Əbdülhəqq Ərdəbili**

Osmanlı dövlətində yaşamış hənəfi məzhəbinə mənsub fəqih və mütəkəllim idi. Cəlaləddin Dəvvaninin tələbəsi olmuş və ustadının "Risalə fi İsbati'l-Vacib" adlı əsərinə şərh yazmışdı. Bundan başqa o, "Haşiyəələ Təcridi'l-Kəlam"[625], "Haşiyətü'l-Haşiyə ələ Şərhi Mətailü'l-Ənvar", "Haşiyə ələ Şərhu Müntəhaü's-Sual"[626], "Haşiyə ələ Şərhi't-Təcridi'l-Əqaidi'l-Cədid"[627] adlı əsərlərin də müəllifi idi. Mövlana Hüseyn Ərdəbili h. 950-ci ildə (1543) vəfat etmişdi[628]. Onun müəllifi olduğu "Şərhu Risalə fi İsbati'l-Vacib"in əlyazma nüsxələri Türkiyənin Ankara Milli kitabxanasında, Kastamonu İHK və Kütahya Vahid paşa İHK-də saxlanılır. "Haşiyə ələ Şərhi't-Təcridi'l-Əqaidi'l-Cədid"in bir nüsxəsi isə Manisa İHK mövcuddur.

**Əbu İmran Musa ibn Bədəl Ərdəbili**

Mühəddis idi. H. 479-cu ildə (1086) Nişapura gəlmiş və buradakı alimlərdən hədis dərsləri almışdı. Onun hədis dinlədiyi alimlərdən biri də Zahir ibn Tahir əş-Şəhhami idi[629]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Şeyx Rüknəddin Əbu Yəzid Muhəmməd ibn Əhməd ibn Muhəmməd ibn Hilal ibn İbrahim Ərdəbili**

---

624 İBN HƏCƏR, *Lisanü'l-Mizan*, C. I, s. 78.

625 "ət-Təcrid fi İlmü'l-Kəlam" və ya qısaca "Təcridü'l-Kəlam" Nəsrəddin Tusinin (öl. 1274) əsəridir.

626 "Müntəhaü's-Sual və'l-Əməl" İbn Hacib Düveyninin fiqh üsuluna dair əsəridir. Əzudəddin əl-İci bu əsərə şərh yazmışdır. Kəmaləddin Ərdəbili isə bu şərhə haşiyə yazmışdır.

627 "Təcridü'l-Əqaid", "Təcridü'l-Kəlam" Nəsrəddin Tusinin (öl. 1274) əsərləridir. Cəlaləddin Dəvvani bu əsərlərə şərh yazmışdır.

628 KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 1037; NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 393.

629 SEYRƏFİNİ, *Müntəxəb*, s. 497.

Şafi'i məzhəbinə mənsub fəqih idi və künyəsi Bayəzid (Əbu Yəzid) ilə Qahirədə məşhur olmuşdu. Təqribən h. 801-ci ildə (1399) Ərdəbildə anadan olmuşdu. Şəmsəddin Səxavinin qeydlərinə görə Rüknəddin Muhəmməd Ərdəbili uzun boylu, iri cüssəli və sağlam bədənli şəxs olmuşdur. İlk təhsilini vətənində almış, Mövlana Mahmud əl-Mərzbanidən ərəb dilini öyrənmişdi. Daha sonra Anadoluya gedərək Sivasdakı mədrəsələrdən birində təhsil almış, Əfzələddin İznikinin[630] tələbəsi olmuş, ondan hənəfi fiqhini və fiqh üsulunu öyrənmişdi. Muhəmməd əl-Əyzcanidən isə kəlam dərsləri almışdı. Daha sonra Osmanlı ölkəsinə getmiş və Şəmsəddin əl-Fənarinin[631] tələbəsi olmuşdu. Onun yanında "Şərhü'l-Məvaqif"[632], "Şərhü'l-Məqasid"[633] və "Kəşşaf"[634] adlı əsərləri oxumuşdu. Daha sonra Anadoludan Misirə getmiş və Qahirədə Bərquqiyyə mədrəsəsində İbn Həcər əl-Əsqəlaninin[635] (öl. 1449) tələbəsi olmuşdu. Rüknəddin Muhəmməd Ərdəbili təhsilini başa vurduqdan sonra bir müddət Qahirədəki Qövsiyyə mədrəsəsində dərs vermişdi. Daha sonra Misir Məmlüklü sultanı Zahir Seyfəddin Çaxmaq (1438-1453) onu Fələstinin əl-Xəlil şəhərindəki Məscidi-Xan mədrəsəsinə müəllim təyin etmişdi. Lakin müdərris İbnü'l-Xeyr əz-Zəftavi həsədi səbəbiylə Rüknəddin Muhəmməd Ərdəbili ilə yola getməmiş və alim bu mədrəsəni tərk etmişdi. Rüknəddin Muhəmməd Ərdəbili fiqh və digər elm sahələrinə dair bir sıra əsərlərin müəllifi idi. Bunlardan "Təhrirü'l-Fətəva fi Şərhü'l-Havi", "Mürşidü'l-İbad fi'l-Əvqat və'l-Əvrad"[636], "Şərhü'l-Minhəcü'l-Əsli", "Şərhü'l-Havi" və "Şərhü'l-Məsabihü's-

---

[630] Əfzələddin Fəzlullah ibn Hüseyn əl-Hənəfi İzniki Osmanlı imperatorluğunun tanınmış alimlərindən biri olmuşdu.
[631] Şəmsəddin Fənari əfəndi Osmanlı dövlətinin ilk şeyxülislamı olmuşdur (1424-1431). Onun nəvəsi Muhyəddin Fənarizadə isə 1543-1545-ci illərdə Osmanlı dövlətinin 14-cü şeyxülislamı olmuşdur.
[632] Bu əsər Seyyidü'ş-Şərif Əli Cürcaninin əsəridir. Seyyidü'ş-Şərif Əbü'l-Həsən Əli ibn Muhəmməd ibn Əli Cürcani (1340-1413) İranın Əstərabad (Cürcan) şəhərində dünyaya gəlmişdi. Hənəfi məzhəbinə mənsub fiqh, kəlam və təfsir alimi idi. Onun qələmə aldığı əsərlərdən biri də Əzudəddin əl-İcinin kəlam elminə dair "əl-Məvaqif" adlı əsərinə yazdığı şərhdir. Bu şərh o qədər gözəl və anlaşılan üslubda yazılmışdı ki, "Şərhü'l-Məvaqif" adı ilə əsərin özündən daha məşhur olmuşdu.
[633] "Şərhü'l-Məqasid" Sə'dəddin Təftazaninin öz əsərinə yazdığı şərhdir. "əl-Məqasid" Sə'dəddin Təftazani tərəfindən kəlam elminə dair qələmə alınmış əsərlərdən biridir. Sə'dəddin Məs'ud ibn Ömər Təftazani (1322-1390) əslən Xorasanın Təftazan qəsəbəsindəndir. Əzudəddin əl-İcinin tələbəsi olmuş, "əl-Məqasid"i də ustadının "əl-Məvaqif"i üslubunda qələmə almışdı.
[634] "əl-Kəşşaf ən Həqaiqü't-Tənzil"-Carullah Əbü'l-Qasım Mahmud ibn Ömər Zəməxşərinin (öl. 1144) məşhur Qur'ani-Kərim təfsiridir. Zəməxşər qəsəbəsi Xarəzmdə, indiki Özəbəkistanın Xivə və Urgənc şəhərləri yaxınlığında yerləşirdi. Carullah Zəməxşəri əməldə hənəfi, etiqadda mö'təzilə məzhəbinə mənsub idi. "Kəşşaf"dan başqa bir çox əsərin müəllifidir.
[635] Şihabəddin Əbü'l-Fəzl Əhməd ibn Əli ibn Muhəmməd ibn Həcər Əsqəlani (öl. 1449) mühəddis, bioqraf və tarixçi. Əslən Fələstinin Əsqəlan (indi İsrailin işğalı altındadır və Aşkelon adlanır) şəhərindəndir.
[636] BAĞDADLI, *İzahü'l-Məknun*, C. I, s. 97; C. II, s. 297.

Sünnə”ni sadalamaq olar[637]. O, bir müddət Misir Məmlüklü dövlətində məmur olmuş, daha sonra Misirdən Hindistana getmişdir[638]. Alimin müasiri olan Şəmsəddin Səxavi Hindistana gedəndən sonra ondan heç bir xəbər alınmadığını qeyd etmişdir. Təvəllüd tarixini və müasiri olan insanların ölüm tarixlərini nəzərə alaraq alimin XV əsrin sonlarında vəfat etdiyini deyə bilərik.

**Şeyx Bədrəddin Muhəmməd ibn Bədəl ibn Muhəmməd ət-Təbrizi Ərdəbili**

Şafi'i məzhəbinə mənsub qari və Qur'an hafizi idi. Bədrəddin Təbrizi ərəb dili və ədəbiyyatı üzrə də dərin biliyə malik alimlərdən idi. O, Əbu Muhəmməd Şatıbinin qiraət və təcvidə dair “Qayətü'n-Nihayə”, Nasirəddin Bəyzavinin fiqh üsuluna dair “Minhəcü'l-Vüsul”, kəlam elminə dair “Təvaliü'l-Ənvar” və hədis elmlərinə dari “Şərhu-Məsabihü's-Sünnə” adlı əsərlərini dərindən bilirdi. Misirdə onun dərslərinə izdihamlı tələbə kütləsi toplaşırdı. Ölüm tarixi məlum deyil. XV əsrdə yaşamışdı[639].

**Qazi Əbu Əmr Məs'ud ibn Əli ibn Hüseyn ibn İshaq Ərdəbili**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. İbnü'l-Mülhi adı ilə tanınan qazi Əbu Əmr Məs'ud Ərdəbili h. 10 məhərrəm 421-ci ildə (17 yanvar 1030) anadan olmuşdu. O, təhsil almaq üçün Dəməşqə getmiş, bu şəhərdə Əbu Cə'fər ibnü'l-Məsləmə, onun oğlu Əbu Əli ibnü'l-Məsləmə, Əbu Əli ibn Vəşşah, Əbü'l-Qənaim ibnü'l-Mə'mun, Əbü'l-Qasım Yusif ibn Muhəmməd əl-Mehrvanidən hədis dinləmiş və nəql etmişdi. Nəsr ibn İbrahim ondan hədis dinləmiş və nəql etmişdi. Bundan başqa qazi Əbü'l-Müfəzzəl[640], Əbü'l-Fəth Nəsrullah ibn Muhəmməd, Əbu Muhəmməd ibn Tavus[641], hafiz Əbu Tahir Əhməd əs-Süləfi İsfəhani[642] ondan hədis nəql etmişdilər. Qazi Əbu Əmr Məs'ud Ərdəbili Rəvvadilərin hakimiyyəti dövründə bir müddət Ərdəbil şəhərinin qazisi olmuşdu. Təvəllüd tarixi məlum olsa da ölüm tarixini müəyyən etmək mümkün

---

637 KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 108.
638 SƏXAVİ, *Zəvu'l-Lami'*, C. III, s. 421.
639 SƏXAVİ, *Zəvu'l-Lami'*, C. III, s. 454. Burada adı çəkilən alimlər və əsərləri haqqında irəlidə ətraflı məlumat veriləcəkdir.
640 Bu şəxs İbn Əsakirin babası idi.
641 İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LVIII, s. 11-12; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. II, s. 223-224.
642 Şəmsəddin Əbu Abdullah Muhəmməd ibn Əhməd ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'd-Dübeysi*, s. 341,

olmamışdır. XI əsrdə yaşamışdır. Nəql silsiləsində Əbu Əmr Məs’ud Ərdəbilinin də olduğu hədislərdən biri aşağıdakıdır:

Abdullah ibn Abbas (ا) dedi: Bir gecə xalam Maymunənin[643] yanında qaldım. Allah Rəsulu (ق) yatdı. Gecə yarısı oyanıb dəstəmaz aldı, səkkiz rəkat namaz qıldı, sonra üç rəkat vitr namazı qıldı, sonra yerinə uzandı. Daha sonra qalxıb iki rəkat namaz qıldı, sonra (məsciddə camaata sübh namazının fərzini qıldırmaq üçün evdən) çıxdı[644].

Hafiz Əbu Tahir əs-Süləfi İsfəhani Ərdəbildə qazi Əbu Əmr Məs’udla görüşmüş və onunla həmsöhbət olmuşdu. Hafiz Əbu Tahir öz əsərində qazi Əbu Əmr Məs’uddan dinlədiyi aşağıdakı hədisi öz əsərində qeyd etmişdi: Əbu Hüreyrə (ا) dedi: Allah Rəsulu (ق) buyurdular ki: “Ey Əbu Hüreyrə, Qur’anı öyrən və insanlara öyrət. Ölümündən sonra, insanların Kə’bəni təvaf etdiyi kimi, mələklər də sənin qərbrinin ətrafında dövr edərlər. Əgər qiyamət günü sirat körpüsünü bir göz qırpımında keçib cənnətə daxil olmaq istəyirsənsə, insanlara sünnəmi öyrət ki, Allahın dinində yenilik (bid’ət) peyda edilməsin”[645].

## Hafiz Əbü’l-Qasım Həfs ibn Ömər Ərdəbili

Yaşadığı dövrün məşhur hədis hafizlərindən biri idi. Hədis dinləmək üçün çox səyahət etmişdi. Güclü hafizəyə malik olan Əbü’l-Qasım Ərdəbili siqa, yəni mötəbər hədis ravisi idi. Əbu Hatim Razi, Yəhya ibn Əbu Talib, Əbu Qilabə Əbdülməlik ibn Muhəmməd Rəqaşi, İbrahim ibn Dəyzildən hədis dinləmişdi. Əhməd ibn Tahir Miyanəci, Yəhya ibn Muhəmməd əl-Cə’davi, Əhməd ibn Əli ibn Lal və başqaları da

---

643 Maymunə bint Haris-Allah Rəsulunun (ق) xanımlarından idi.

644 İbn Əsakir bu hədisi öz əsərində qeyd edəndən sonra hafiz Əbu Həfs Ömər İbn Şahinin (öl. 995).bu hədisin qərib hədis, yəni ravisinin hədisin nəqlində tək qaldığı hədislərdən biri, olduğunu dediyini də qeyd etmişdir. Bax: *Tarixu-Mədinəti-Diməşq*, C. LVIII, s. 12. Abdullah ibn Abbasdan (ا) bununla eyni mövzuda olub və demək olar ki, eyni mənanı ifadə edən başqa bir hədis külliyatlarda qeydi olunmuşdur. Məsələn: BUXARİ, *Səhih*, Kitabü’l-Vitr, Nr. 2; İMAM MALİK, *Muvatta’*, Namaz/Təhəccüd, Nr. 11; MÜSLİM, *Səhih*, Müsafir Namazı/Təhəccüd, Nr. 763. (أن عبد الله بن
وأهله في طولها فنام رسول الله صلى الله الوسادة واضطجع رسول الله ﷺ وهي خالته قال فاضطجعت في عرض ميمونة زوج النبي أنه بات ليلة عند أخبره عباس
ثم قرأ العشر الآيات الخواتم من وسلم فجلس يمسح النوم عن وجهه بيده استيقظ رسول الله صلى الله عليه عليه وسلم حتى إذا انتصف الليل أو قبله بقليل أو بعده بقليل
ذهبت فقمت إلى جنبه فوضع رسول الله فقمت فصنعت مثل ما صنع ثم ابن عباس إلى شن معلق فتوضأ منه فأحسن وضوءه ثم قام يصلي قال سورة آل عمران ثم قام
ركعتين ثم ركعتين ثم ركعتين ثم ركعتين ثم ركعتين ثم ركعتين ثم أوتر ثم اضطجع حتى أتاه المؤذن فصلى رأسي وأخذ بأذني اليمنى يفتلها فصلى ﷺ يده اليمنى على
خفيفتين ثم خرج فصلى الصبح ركعتين ).

645 ƏBU TAHİR İSFƏHANİ, *Ərbəinü’l-Büldaniyyə*, s. 156. [يَا أَبَا هُرَيْرَةَ ، عَلِّمِ النَّاسَ الْقُرْآنَ وَتَعَلَّمْهُ ، فَإِنَّكَ إِنْ مُتَّ وَأَنْتَ كَذَلِكَ زَارَتِ الْمَلَائِكَةُ قَبْرَكَ كَمَا يُزَارُ الْبَيْتُ الْعَتِيقُ ، وَعَلِّمِ النَّاسَ سُنَّتِي وَإِنْ كَرِهُوا ذَلِكَ ، وَإِنْ أَحْبَبْتَ أَنْ تُوقَفَ عَلَى الصِّرَاطِ طَرْفَةَ عَيْنٍ حَتَّى تَدْخُلَ الْجَنَّةَ فَلَا تُحْدِثْ فِي دِينِ اللَّهِ حَدَثًا بِرَأْيِكَ]

ondan hədis dinləmiş və nəql etmişdilər. Əbü'l-Qasım Həfs Ərdəbili hədis elminə dair bir sıra əsərlərin müəllifi idi. Alim h. 339-cu ildə (950) vəfat etmişdi[646].

Şəmsəddin Zəhəbi nəql silsiləsində hafiz Əbü'l-Qasım Həfs Ərdəbilinin də olduğu bir hədisi "Siyər"ində qeyd etmişdir: Ənəs ibn Malik (ا) dedi: Rəsulullah (ق) belə dua etdi: "Allahım, məni yoxsul yaşat, yoxsul olaraq canımı al və qiyamət günü yoxuslların arasında həşr elə". Xanımı Ayşə (ا) belə dua etməsinin səbəbini soruşanda O, belə cavab verdi: "Çünki yoxsullar zənginlərdən qırx il əvvəl cənnətə daxil olacaqlar. Ey Ayşə! Yoxsulları sev, onlara yaxın ol ki, Allah da qiyamət günü səni cənnətə yaxın etsin"[647].

Şəmsəddin Zəhəbi imam Buxarinin bu hədis haqqında "münkər hədisdir"[648] dediyini qeyd etmişdir. Tirmizi isə bu hədisi öz külliyatında qeyd etsə də hədis haqqında "bu qərib hədisdir"[649] demişdir. Doğrusu bu hədisin doğruluğu, yəni uydurma olmadığı haqda tərəddüd etməmək çətindir. Bu hədisdə yoxsulluğa, yoxsul olmağa və yoxsul yaşamağa təşviq var. Halbuki ilk dövr müsəlmanlarının, yəni səhabənin həyatına diqqət yetirəndə biz tamamilə başqa bir mənzərənin şahidi oluruq. Raşid xəlifələr dövründə səhabənin mühüm əksəriyyəti böyük sərvət sahibi olmuşdular[650]. Maddi varlıq və zənginliklərinin bu qədər artmasına baxmayaraq onların üstün insani və əxlaqi keyfiyyətlərində bir azalma olmamışdı. Zəngin olduqları qədər əliaçıq, comərd və alicənab idilər. Süfyan Səvrinin dediyi kimi "dünya malı onların qəlblərində deyil, əllərində idi".

---

646 ZƏHƏBİ, *Kitab Təzkərətü'l-Hüffaz*, s. 850-851; SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. XIII, s. 65; SÜYUTİ, *Təbəqatü'l-Hüffaz*, s. 128; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. II, s. 235.

647 ZƏHƏBİ, *Siyəru Ə'lamü'n-Nübəla*, C. XV, s. 153. [اللَّهُمَّ أَحْيِنِي مِسْكِيناً، وَاحْشُرْنِي فِي زُمْرَةِ المَسَاكِين........]. Bu hədis üçün həmçinin bax: TİRMİZİ, *Sünən*, Zöhd, Nr. 2352; İBN MACƏ, *Sünən*, Zöhd, Nr. 4126. İbn Macənin "Sünən"ində bu hədis Əbu Səid əl-Xudridən (ا) nəql olunmuşdu.

648 Münkər hədis-Ravilərindən birinin zəif olduğu hədisdir. Daha doğrusu zəif bir ravinin siqa raviyə müxalif olaraq nəql etdiyi hədisdir.

649 Qərib hədis-Başlanğıcda tək, sonrakı ravi təbəqələrində isə bir çox şəxs tərəfindən nəql edilmiş hədisə deyilir. Qərib hədisin səhih, həsən və zəif olması mümkündür.

650 Məsələn bu hədisi nəql etdiyi yazılan Ənəs ibn Malik (ا) evləndiyi xanıma 4000 dirhəm (1 dirhəm=2,975 gr gümüş pul) mehr ödəyəcək qədər varlı insan idi. Əbdürrəhman ibn Əvf (ا) vəfat edərkən qoyduğu mirasın dəyəri 3.200.000 dinar (1 dinar=4,25 gr qızıl pul) idi. Bunun 1.320.000 dinarı nəğd pul idi. Osman ibn Əffanın (ا) mirasının dəyəri 30.500.000 dirhəm idi. Əhli-beytdən imam Həsən ibn Əli ibn Əbu Talib (ا) evləndiyi bir xanıma 100 kəniz və 100.000 dirhəm mehr ödəyə biləcək qədər varlı idi. Bu insanlar zəngin olduqları qədər əliaçıq idilər. Məsələn imam Həsən ibn Əli ibn Əbu Talib (ا) hər il 100.000 dirhəm sədəqə paylayırdı. Borc istəyən bir qohumuna 130.000 dirhəm bağışlamışdı. Osman ibn Əffan (ا) hər cümə günü bir kölə satın alıb azad edirdi. İqta payı olan böyük bir bağı bacanağı Əli ibn Əbu Talibə (ا) bağışlamışdı. Təlhə ibn Übeydullahda (ا) olan 50.000 dirhəm alacağını bağışlamışdı. Əbdürrəhman ibn Əvf (ا) Təbük səfərinə gedən ordunun təchiztı üçün əmlakının yarısını bağışlamışdı. İmkansız insanların ehtiyacı üçün 500 cins at bağışlamışdı. Daha ətraflı məlumat üçün bax: Cengiz KALLEK, *Asrı-Saadette Yönetim Piyasa İlişkisi*, s. 231-281, İstanbul 1997.

**Rəis Fələkəddin Əbu'n-Nəsr Cüneyd ibn İsmayıl ibn Əli ibn İsmayıl Ərdəbili**

Azərbaycan Atabəylərinin hakimiyyəti dövründə (1136-1225) yaşamış dövlət xadimi və alim idi. H. 606-cı ildə (1210) həcc ziyarətindən qayıdarkən bir müddət Bağdadda qalmışdı. Bağdadda ikən tarixçi Əbu Abdullah Muhəmməd Dübeysi onunla görüşmüşdü. Rəis Fələkəddin Ərdəbili tarixçi Dübeysiyə h. 535-ci ilin rəbiəlaxir ayında (noyabr 1140) anadan olduğunu demişdi. Alim h. 615-ci ildə (1218) Ərdəbildə vəfat etmişdi[651].

**Əbdülməlik ibn Əbdüləziz ibn Hibətullah ibn Bəndar Ərdəbili**

Mühəddis idi. H. 549-cu ildə (1154) Ərdəbildə anadan olmuşdu. Əbü'l-Məali əl-Ləhhas və Əhməd ibn Muhəmməd ər-Rəhbi kimi alimlərdən hədis dərsləri almışdı. İraqda yaşamış, tədris və tədqiqatla məşğul olmuşdu. Əbdülməlik Ərdəbili h. 615-ci ildə (1218) İraqın Ərbil şəhərində vəfat etmişdi[652].

**Şəmsəddin Muhəmməd ibn Əbdülkərim ibn Muhəmməd Ərdəbili**

Şəmsəddin Muhəmməd Ərdəbili alim ailəsində böyümüşdü. Misir Məmlüklülərinin tanınmış dövlət xadimlərindən miraxur Canıbək onun babasından fiqh dərsləri almışdı. Şəmsəddin Muhəmməd Ərdəbili gənc ikən h. 886-cı ildə (1482) həcc ziyarətinə getmiş və Məkkədə mücavir olaraq qalmışdı. Bu vaxt Məkkədəki alimlərin yanında imam Buxarinin "Səhih" adlı hədis külliyatını oxuyub başa çatdırmışdı[653]. Şəmsəddin Səxavi onun ölüm tarixini qeyd etməmişdir. 1480-ci illərdə tələbə olduğuna görə ehtimal ki, Şəmsəddin Ərdəbili, Səxavidən (öl. 1497) sonra vəfat etmişdir.

**Muhəmməd ibn Cəmaləddin ibn Dərviş Ərdəbili**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. Hələbdə yaşamışdı. Təhsil almaq məqsədiylə Qahirəyə getmiş burada Əbdülqadir ibnü'l-Əbardan fiqh dərsləri almışdı.

[651] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 494.
[652] ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'd-Dübeysi*, 247.
[653] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. IV, s.109.

Şəmsəddin Səxavi onun müəllimi olduğunu və bir müddət dərslərində iştirak edərək hədis dinlədiyini qeyd etmşdir. H. 889-cu ilin rəcəb ayında (avqust 1484) Hələbə qayıtmışdı. Ölüm tarixini qeyd etmədiyi üçün Şəmsəddin Səxavidən (öl. 1497) sonra vəfat etdiyini təxmin etmək olar[654].

**Əllamə İzzəddin Yusif ibn İbrahim Ərdəbili**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Yaşadığı dövrün tanınmış alimlərindən biri idi. O, qələmə aldığı əsərlərlə məşhur olmuşdu. Alim fiqhə dair "Ənvar li Əməlü'l-Əbrar" adlı əsərin müəllifi idi. Onun bu əsərinə çox sayıda şəhr və haşiyə yazılmışdır[655]. Bu əsərin nüsxələrindən biri AMEAƏİ-nun fondunda saxlanılır[656]. Bundan başqa Paris milli kitabxanasında[657], Qahirədə Misir milli kitabxanasında və ər-Riyadda Kral Səud universitetinin kitabxanasında da "Ənvar li Əməlü'l-Əbrar"ın nüsxələri mövcuddur. Türkiyədə Ankara milli kitabxanası, Konya BYEK və Diyarbəkir İHK-də "Ənvar li Əməlü'l-Əbrar"ın ondan çox nüsxəsi mühafizə edilir. Əllamə İzzəddin Ərdəbilinin digər bir əsəri əl-Bəğəvinin "əl-Məsabih"[658] adlı əsərinə yazdığı üç cildlik şərhdir. Alim uzun müddət Ərdəbildə yaşamış, daha sonra Misirə köçmüşdü. Misir Məmlüklü hökmdarları ona böyük hörmət və ehtiram göstərmişdilər. İzzəddin Ərdəbili həm də mahir xəttat və şair idi. Onun gözəl şerləri var idi[659]. İbn Hacər Əsqəlani, Yusif ibn İbrahim Ərdəbilinin yaşadığı əsrdə "şeyxü'l-məşriq", yəni bütün şərqin şeyxi ləqəbi ilə tanındığını qeyd etmişdir[660]. Alim h. 779-cu ildə (1377) Misirdə vəfat etmişdir[661].

**Əbü'l-Qasım Yusif ibn Muhəmməd ibn Yusif Ərdəbili**

---

[654] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. V, s. 44.
[655] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 281-282.
[656] ŞƏRİFOV, *Əbdülqəni Əfəndi...*, s. 61.
[657] DE SLANE, *həmin əsər*, s. 204.
[658] Muhyəddin Əbu Muhəmməd Hüseyn ibn Məsud ibn Muhəmməd Bəğəvi (1044-1122). Məşhur mühəddis və müfəssirlərdən biri idi. Muhyi's-Sünnə, yəni "sünnəni dirçəldən" ləqəbi ilə tanınırdı. Əllamə İzzədin Ərdəbili onun "Məsabihü's-Sünnə" adlı əsərinə şərh yazmışdır.
[659] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VI, s. 734.
[660] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. III, s. 128; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. IV, s. 139.
[661] İBNü'l-İMAD, *yenə orada*. Katib Çələbi alimin ləqəbini "Cəmaləddin" kimi qeyd etmiş və onun h. 799-cu ildə (1397) vəfat etdiyini yazmışdır. Bax: *Kəşfü'z-Zünun*, C. I, s. 281.

Hədis ravisi idi. Misirdə yaşamış və burada hədis nəql etmişdi. Onun hədis dinlədiyi mühəddislərdən Əbu İshaq ibn Səid ibn Abdullah ət-Tuceybinin adını çəkmək olar. Əbu Tahir Əhməd ibn Muhəmməd əs-Süləfi Misirdə ondan hədis dinləmiş və qeyd etmişdir[662]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır. Nəql silsiləsində Əbü'l-Qasım Yusif Ərdəbilinin də olduğu xəbərlərdən biri aşağıdakıdır:

Abdullah ibn Məs'ud (ﺍ) dedi ki: "(Cümə namazlarında imamın) namazı uzun qıldırıb, xütbəni qısa oxuması o, şəxsin (İslam dinini yaxşı bilib, dində) anlayışlı olduğunu göstərir"[663].

**Mövlana Zəhirəddin Əbdülkəbir ibn Üveys ibn Muhəmməd Lətifi Ərdəbili**

Hənəfi məzhəbinə mənsub fəqih, tarixçi və xəttat idi. Səid Nəfisi onun həmçinin istedadlı şair olduğunu və Lətifi təxəllüsü ilə farsca gözəl şerlər yazdığını qeyd etmişdir[664]. İbnü'l-İmad mövlana Zəhirəddin Ərdəbilinin Qazizadə ləqəbi ilə tanındığını qeyd edir. Zəhirəddin Ərdəbili Azərbaycanda təhsil almış, dövrün qabaqcıl alimlərinin tələbəsi olmuşdu. Osmanlı sultanı Yavuz I Səlim (1512-1520) Çaldıran döyüşü və Təbrizin zəbtindən sonra geri qayıdarkən Zəhirəddin Ərdəbilini də özü ilə aparmışdı. Zəhirəddin Ərdəbili alim, kamil, ünsiyyətcil, vüqar, heybət, fəsahət və bəlağət sahibi şəxs idi. Ələlxüsus inşa, yəni katiblik və şe'r sənətində mahir olan mövlana Zəhirəddin Ərdəbili həmçinin gözəl xətlə yazı yazan hüsnxətt ustası idi. Osmanlı xəzinəsindən ayda 80 aqça[665] maaş alan Zəhirəddin Ərdəbili, İbn Xəllikanın[666] çoxcildli "Tarix" adlı əsərini iki cild halında ixtisarla ərəbcədən farscaya tərcümə etmişdi. Birinci cildi h. 926-cı (1520), ikinci cildi isə h. 928-ci (1522) ildə İstanbulda

---

[662] Əbu Tahir Əhməd ibn Muhəmməd əs-Süləfi İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, s. 455, Məkkə (trz).

[663] ƏBU TAHİR İSFƏHANİ, *yenə orada*. Burada bu söz Allah Rəsulunun (ﻕ) səhabələrindən olan Abdullah ibn Məs'udun (ﺍ) sözü kimi qeyd olunub. İmam Müslümün "Səhih" adlı hədis külliyatında isə Əmmar ibn Yasir (ﺍ) bu sözü Allah Rəsulundan (ﻕ) eşidərək nəql etmişdi. Hər iki mənbə də bu əsər Əbu Vail və əl-Ə'məş kanalı ilə ötürülmüşdür. Müsüm, Səhih, Cümə Nr. 869-da: (إن طول صلاة الرجل وقصر خطبته مئنة من فقهه); ƏBU TAHİR İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, Nr. 1554-də: (إن طول الصلاة وقصر الخطبة مينه من فقه الرجل)

[664] NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 254. Fikrimizcə S. Nəfisi burada xətaya yol vermişdir. Çünki aşağıda da görəcəyimiz kimi mövlana Zəhirəddin Ərdəbilinin atası şeyx Üveys Ərdəbili də "Lətifi" təxəllüsü ilə şerlər yazmışdır. M. Ə. Tərbiyət şeyx Üveys Ərdəbilinin yazdığı şerlərdən bir nümunəni də öz əsərində qeyd etmişdir.

[665] Aqça-Osmanlı imperatorluğunun gümüş pulu. Qanuni I Süleymanın (1520-1566) dövründə zərb edilmiş aqçaların maksimum ağırlığı 0,85 gr olmuşdur.

[666] Şəmsəddin Əhməd ibn Muhəmməd ibn Xəllikan (öl. 1281) fəqih, tarixçi, ədəbiyyatçı, bioqraf və filoloq idi. Onun "Vəfayatü'l-Əyan və Ənba Əbnaü'z-Zaman" adlı tarixi bioqrafiya əsəri həmçinin "Tarixi-İbni Xəllikan" adı ilə də tanınmışdı.

tərcümə edib bitirmişdi[667]. Bundan başqa mövlana Zəhirəddin Ərdəbili farsca "Qəzəvati-sultan Səlim" adlı kitabın da müəllifi idi. Bu kitabda Yavuz I Səlimin Misirə hərbi səfəri (1517) barədə dəyərli məlumtalar olmalıdır. Çünki mövlana Zəhirəddin Ərdəbili bu yürüşdə sultan I Səlimlə birlikdə iştirak etmişdi[668]. İbnü'l-İmad, Zəhirəddin Ərdəbilinin xütbələrində imamiyyə məzhəbinə meyl etdiyini və səhabənin xütbə vaxtı mədh edilməsinin vacib olmadığını bildirməklə Səfəvilərin təbliğatını apardığını qeyd edir. O, həmçinin Zəhirəddin Ərdəbilinin Əhməd paşa ilə Səfəvilər arasında əlaqələrin qurulması üçün vasitəçilik etdiyini yazır. Bu fəaliyyəti Zəhirəddin Ərdəbilinin h. 930-cu ilin rəbiəlaxir ayının 15-i (20 fevral 1524) Qahirədə boynu vurularaq edam edilməsinə səbəb olmuşdu[669].

Burada bəzi məsələlərə aydınlıq gətirməyə ehtiyac var. Yuxarıda adı çəkilən Əhməd paşa mənşəcə gürcü olan yüksək rütbəli Osmanlı bürokratı, sonralar "xain" ləqəbi ilə məşhur olan Əhməd paşadır. Əhməd paşa bəzi yüksək rütbəli saray bürokratları ilə birlikdə sultan Yavuz I Səlimin son, sultan Qanuni I Süleymanın isə ilk vəziriəzəmi olan Piri Mehmed paşanın əleyhinə aparılan kampaniyanı idarə edənlərdən biri idi. Saray intriqaları nəticəsində Piri Mehmed paşa könüllü istefaya getmişdi. Uzun müddət Rumeli bəylərbəyi olmuş[670] Əhməd paşa bu vaxt ikinci vəzir idi, lakin vəziriəzəm olmaq həvəsində idi. Bunun üçün əlindən gələn hər şeyi etmişdi, lakin sultan I Süleyman gözlənilmədən özünün xüsusi işlər rəisi olan İbrahim paşanı vəziriəzəm təyin etdi. Əhməd paşa bu hadisədən sonra təkidlə boş olan Misir vilayəti canişinliyinə təyin olunmasını istədi. Bəd xasiyyəti və məkirliliyi ilə hamını bezdirən Əhməd paşanın bu vəzifəyə təyin olunması və saraydan uzaqlaşmasına heç kim etiraz etməmişdi. Tarixçi İbrahim Peçevinin sözü ilə desək "cümlə divan əhli əlindən, dilindən aciz və nalan olmuşlar idi"[671]. Hadisələrin sonrakı inkişafı onu göstərir ki, Əhməd paşa İstanbuldan mümkün qədər uzağa, Misir vilayətinə getmək istəməklə əvvəlcədən edəcəyi qiyamı planlaşdırmışdı. O, 1523-cü ilin avqust ayında Qahirəyə çatıb vəzifəsinin icrasına başlamışdı. Misir bu tarixdən cəmi 6 il əvvəl, 1517-ci ildə Osmanlı imperatorluğunun

---

[667] NƏFİSİ, *yenə orada*; NİŞANCI Mehmed paşa, *Hadisat*, s. 192, İstanbul 1983.
[668] NƏFİSİ, *yenə orada*.
[669] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s. 99.
[670] NİŞINCI, *Hadisat*, s. 229.
[671] İbrahim PEÇEVİ, *Tarixi-Peçevi*, C. I, s. 80, İstanbul 1281.

əlinə keçmişdi. Burada hələ də əvvəlki dövlətin tərəfdarları var idi. Əhməd paşa tezliklə buradakı köhnə Məmlüklü əmirləri ilə yaxın əlaqə qurdu və 1524-cü ilin yanvar ayında qiyam qaldıraraq özünü Misir sultanı elan etdi. Lakin onun səltənəti uzun çəkmədi. Onun özünə vəzir təyin etdiyi Osmanlı ordusunun sabiq zabiti Mehmed bəy Qazizadə İstanbuldan aldığı təlimata əsasən Əhməd paşaya qarşı hərbi çevriliş həyata keçirdi. Əhməd paşa qaçmış, lakin bir müddət sonra yaxalanıb 1524-cü ilin avqust ayında edam edilmişdi. İbrahim Peçevi "Qanuni sultan Süleymanın hakimiyyəti dövründəki şeyxlər və alimlər" başlığı altında üstün biliyi və bacarıqlarını sadalayaraq Mövlana Zəhirəddin Ərdəbili haqqında da məlumat verir və onun xain Əhməd paşa ilə birlikdə edam edildiyini qeyd edir[672]. Taşköprüzadə də öz əsərində alimi mədh edərək üstün bilik və bacarıqlarını sadalamışdır[673]. Nişancı Mehmed paşa da onun Qazizadə Əcəm adı ilə tanındığını, şe'r və münşəat sahəsində ustad oludğunu bildirmişdir[674]. İbrahim Peçevi, Taşköprüzadə və Nişancı Mehmed paşa kimi rəsmi Osmanlı tarixçilərinin heç biri Zəhirəddin Ərdəbilinin məzhəb və əqidə baxımından hər hansı bir dəyişikliyə uğradığını qeyd etmir və onun sırf siyasi məsələdən ötrü edam edildiyini yazırlar. Ehtimal ki, Zəhirəddin Ərdəbili Osmanlı dövlətinin şərqdəki ən böyük rəqibi olan Səfəvilərin Əhməd paşaya yardımını təmin etməyə çalışmışdı. İbrahim Peçevi (öl. 1650) ilə İbnü'l-İmad (öl. 1679) demək olar ki, eyni dövrdə yaşamışdılar. Lakin İbrahim Peçevinin uzun müddət Osmanlı sarayında mailiyyə məmuru işlədiyini nəzərə alaraq onun hadislərədən daha dəqiq və ətraflı xəbərdar ola biləcəyini düşünmək olar.

**Şeyx Üveys ibn Muhəmməd Lətifi Ərdəbili**

Yuxarıda haqqında bəhs etdiyimiz mövlana Zəhirəddin Əbdülkəbir Ərdəbilinin atası idi. O, şafii məzhəbinə mənsub fəqih idi. Ağqoyunlular dövründə 5 il Ərdəbil şəhərinin qazisi olmuşdu. Şeyx Üveys Ərdəbili həm də bacarıqlı həkim və istedadlı şair idi. O, Ərdəbildəki mədrəsələrdə dərs vermişdi. Şeyx Üveys Ərdəbili tibbə dair "Risalə dər

---

672 PEÇEVİ, *Tarixi-Peçevi*, C. I, s. 50.
673 TAŞKÖPRÜZADƏ, *Şəqaiqü'n-Numaniyyə*, s. 281, Beyrut 1985.
674 NİŞINCI, *Hadisat*, s. 229.

İlmi-Tibb" adlı risalənin müəllifi idi[675]. Ölüm tarixi məlum deyil. Təqribən XV-XVI əsrlərdə yaşamışdır.

**Şərəfəddin Musa ibn Əhməd Ərdəbili**

Şafi'i məzhəbinə mənsub fəqih idi. O, Ərihada[676] məskunlaşıb uzun müddət bu şəhərdə yaşadığı üçün daha çox şeyx Musa əl-Ərihavi kimi tanınmışdı. Şərəfəddin Musa Ərdəbili alim, zahid, fəzilət sahibi insan idi. O, h. 916-cı ilin zilhiccə ayında (mart 1511) Hələbdə vəfat etmiş və orada dəfn edilmişdi[677].

**Şeyx Nurəddin Əbu Muhəmməd Fərəc ibn Muhəmməd İbn Əhməd ibn Əbü'l-Fərəc Ərdəbili**

Şafi'i məzhəbinə mənsub fəqih və mütəkəllim idi. Təbriz mədrəsələrindən birində təhsil almış, Zəməxşərinin çoxcildli "Kəşşaf" adlı Qur'an təfsirini oxumuşdu. Təbrizdə şeyx Fəxrəddin Əhməd ibn Həsən əl-Carbərdinin tələbəsi olmuşdu. Təhsilini başa vurandan sonra Dəməşqə getmişdi. Dəməşqdə Zahiriyyə və Baraniyyə mədrəsələrdən dərs vermişdi. Daha sonra bu şəhərdəki Nasiriyyə, Caruxiyyə və Cəvaniyyə mədrəsələrində də tədrislə məşğul olmuşdu. Qayınatası şeyx Nəcməddin ibn Şəhhamın ölümündən sonra əl-Qəsr xanəgahnın şeyxliyi də ona tapşırılmışdı[678]. Elmi tədqiqatla da məşğul olan alim, qazi Nasirəddin Abdullah Bəyzavinin "Minhəcü'l-Vüsul" və Muhyəddin Yəhya Nəvəvinin "Minhəcü'l-Fiqhi" adlı əsərinə şərh yazımşdı. Onun qazi Bəyzavinin əsərinə yazdığı şərh "Həqaiqü'l-Üsul fi Şərhu Minhəcü'l-Vüsul"[679], Nəvəvinin əsərinə yazdığı şərh isə "Şərhu Qit'əti min Minhəcü't-Talibin" adlanırdı[680]. O, himmət və fəzilət sahibi insan idi. Bütün namazlarını məsciddə, camaatla qılardı. Alim, yoluxduğu taun xəstəliyi[681] səbəbiylə, h. 749-cu ilin cəmadiəlaxir ayının 13-cü günü (8 sentyabr 1348),

---

675 TƏRBİYƏT, *Danişməndan*, s. 340; Charles Ambrose STOREY, *Persian Literature, A Bio-Bibliographical Survey*, C. II/2, s. 228-229, London 1971.

676 Əriha-İordaniyada, paytaxt Əmmandan 60 km cənubda, Ölü dənizdən 22 km şərqdə yerləşən şəhər.

677 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s. 40.

678 İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 248; NUEYMİ, *Daris fi Tarixi'l-Mədaris*, C. I, s. 172.

679 BAĞDADLI, *İzahü'l-Məknun*, C. I, s. 169.

680 KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 618.

681 1348-ci ilin yay və payız aylarında bütün orta şərq regionunu bürüyən şiddətli taun epidemiyası yayılmış, təqribən 10 milyondan çox insan bu epidemiya səbəbiylə ölmüşdü. Həmin dövr üçün bu böyük rəqəm idi. İbn Kəsir

günorta saatlarında Caruxiyyə mədrəsəsində vəfat etmiş və Dəməşqin Babu's-Səğir səmtində dəfn edilmişdi[682].

**Şeyx Şəmsəddin Muhəmməd ibn Əbdu Ərdəbili**

Hənəfi məzhəbinə mənsub fəqih idi. Anası onu kiçik yaşlarında şeyx Muhəmməd əl-Kəvakibi əl-Hələbinin yanına aparmış və övladının tərbiyəsini şeyxə həvalə etmişdi. Şəmsəddin Ərdəbili şeyx Muhəmməd əl-Kəvakibinin yanıda yetişmişdi. O, zahid, çox ibadət edən, saleh əməl sahibi, səxavətli və son dərəcə təvazökar insan idi. Şəmsəddin Ərdəbili h. 865-ci il cəmadiəlaxir ayında (mart 1461) anadan olmuş, h. 950-ci ilin şəvval ayında (yanvar 1544) Hələbdə vəfat etmişdi[683].

**Mövlana İlyas ibn Əbih Ərdəbili**

Riyaziyyatçı və astronom idi. Baburi sultanlarından Nasirəddin Muhəmməd Humayun şah (1530-1540) İrandakı sürgün həyatından qayıdarkən İlyas Ərdəbili də onunla birlikdə Kabilə gəlmişdi. Humayun şahın oğlu Əkbər şahın (1556-1605) hakimiyyəti illərində də Qucəratda[684] tədris və tədqiqatla məşğul olmuşdu. Lakin sonralar bəzi fitnəkar insanların hərəkətləri nəticəsində ona qarşı münasibət dəyişmişdi. Nəcticədə İlyas Ərdəbili Hinditanı tərk edərək Məkkəyə getmiş, həcc ziyarətindən sonra doğma şəhəri Ərdəbilə gələrək ömrünü burada başa vurmuşdu[685]. Ölüm tarixi məlum deyil. XVI əsrdə yaşamışdır.

**Şeyx Əbdüləziz Ərdəbili**

Mühəddis və fəqih idi. Yaşadığı dövrün ən görkəmli alimlərindən biri olmuşdu. Dəməşqdə təhsil almış, şeyxülislam Təqiyəddin Əhməd ibn Teymiyyə əl-Hərrani (1263-1328), Burhanəddin ibnü'l-Bərkəc, Cəmaləddin Yusif əl-Mizzi və Şəmsəddin Zəhəbi

---

həmin ilin sentyabr ayında Dəməşqdə hər gün bu xəstəlik səbəbiylə ölmüş 200 adamın dəfn edildiyini, kəfən və cənazə taxtası qıtlığı yarandığını qeyd etmişdir. Bax: *Bidayə*, C. XIV, s. 348-354.

[682] SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. X, s. 238-240; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 87; SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. IV, s. 36-37.

[683] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s. 99.

[684] Qucərat-Hindistanın qərbində, Hindistan-Pakistan sərhəddində, Ərəbistan dənizi sahilində yerləşən vilayət.

[685] HÜSEYNİ, *Nüzhətü'l-Xəvatir*, s. 313.

kimi tanınmış alimlərin tələbəsi olmuşdu. Daha sonra Hindistana getmiş və Dehli sultanlarından Muhəmməd şah Tuğluqun (1325-1351) himayəsində bu ölkədə yaşamışdı. Muhəmməd şah Tuğluq şeyx Əbdüləziz Ərdəbiliyə dərin hörmət və ehtiram bəsləyirdi. Şeyx Əbdüləziz Ərdəbili sultana Abdullah ibn Abbas (ǀ), onun nəslindən olan Abbasi xəlifələrinin fəaliyyətləri haqqında[686] danışmış, onun bu söhbətləri sayəsində sultanın qəlbində Abbasilərə qarşı ehtiram oyanmışdı[687]. Sultan Muhəmməd şah Tuğluq tez-tez şeyx Əbdüləziz Ərdəbilinin hədis məclislərində iştirak edirdi. Belə məcləslərdən birində sultan şeyxə hədis elmi ilə bağlı bir sual vermişdi. Şeyx Əbdüləziz Ərdəbili hafizəsindən nəql etdiyi sayısız hədislərlə sultanın sualına dolğun cavab vermişdi. Bunun müqabilində Muhəmməd şah ona 1000 qızıl dinar[688] bağışlamışdı[689]. Şeyx Əbdüləziz Ərdəbilinin ölüm tarixi məlum deyil. XIV əsrdə yaşamışdır.

**Qari İbrahim ibn Əhməd ibn Muhəmməd ibn Əhməd Ərdəbili**

Mühəddis və qari idi. H. 687-ci ildə anadan (1288) olmuşdu. Təhsilini davam etdirmək üçün Məkkəyə getmiş və burada Nəcməddin ət-Təbəridən[690] "Cami'ü'l-Üsul"u[691] dinləmişdi. Həmçinin Təqiyəddin əz-Zəfəraninin yanında "əl-Məsabih"i[692], Cəmaləddin əl-Mətərinin yanında "əş-Şəfa"nı[693] oxumuşdu. İbrahim ibn Əhməd Ərdəbili, Əbdürrəhman ibn Ömər əl-Qəbabinin tələbəsi olmuş, Qur'an təcvid və tilavətinə dair icazətini ondan almışdı. O, həmçinin təbib idi[694].

---

[686] Abbasi xilafətinə 1258-ci ildə moğolların Bağdadı işğalı ilə son qoyulsa da bu nəslə mənsub şəxslər Misirdə Məmlüklüləri tərəfindən himayə edilir və xəlifə olaraq tanınırdılar. Ehtimal ki, şeyx Əbdüləziz Ərdəbili bir növ diplomatik missiya yerinə yetirmiş, Dehli sultanları ilə Misir Məmlüklüləri arasındakı əlaqələrin möhkəmlənməsinə xidmət göstərmişdi.

[687] HÜSEYNİ, *Nüzhətü'l-Xəvatir*, s. 170; Muhəmməd ibn Abdullah İBN BATTUTA, *Rıhlə*, C. II, s. 37, Qahirə 1322.

[688] Dinar- 4,25 gr qızıl pul. Şeyx Əbdüləziz Ərdəbili təqribən 4,25 kg qızıl almışdı.

[689] HÜSEYNİ, *Nüzhətü'l-Xəvatir*, s. 170; İBN BATTUTA, *Rıhlə*, C. I, s 115-116.

[690] Nəcməddin Əbu Əli Muhəmməd ibn Muhəmməd ət-Təbəri əl-Məkki (öl. 1330) yaşadığı dövrün tanınmış mühəddislərindən idi.

[691] "Cami'ü'l-Üsul li-Əhadisi'r-Rəsul"- Əbu Səadət Mubarək ibn Muhəmməd İbnü'l-Əsir əl-Cəzəri əş-Şafi'inin (öl. 1209) hədis üsulu sahəsində qələmə aldığı əsərdir.

[692] "Məsabihü's-Sünnə"-Hüseyn ibn Məs'ud əl-Fərra əl-Bəğəvinin (öl. 1122) hədis sahəsində qələmə aldığı əsərdir. Bu əsərə bir neçə şərh yazılmışdır. Bunlardan birinin müəllifi də şeyx Təqiyəddin Əbdülmu'min ibn Əbu Bəkr əz-Zəfəranidir.

[693] "əş-Şəfa bi-Tərifi-Hüquqi'l-Mustafa"-Qazi İ'yaz ibn Musa əl-Yəhsəbinin (öl. 1149) hədis sahəsində əsəridir.

[694] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. I, s. 4; Təqiyəddin Əhməd ibn Əli MƏQRİZİ, *Dürərü'l-Uqudu'l-Fəridə fi Təracimü'l-Ə'mali'l-Müfidə*, (Hzr. A. Dərviş-əl-Misri M), C. I, s. 78, Dəməşq 1995.

**Əbu Abdullah İsa ibn Malik ibn Bişr Ərməniyyi**

Əslən Ərməniyyədən olan azərbaycanlı mühəddis idi. Misirdə yaşamış, buranın alimlərindən hədis elmlərinə dair bilikləri öyrənmişdi. Daha sonra Qəyravanda[695] məskunlaşmış və orada hədis elminə dair bir sıra əsərlər qələmə almışdı. "əl-Hədis" və "Safir" Əbu Abdullah İsa Ərməniyyinin iki məşhur əsəridir[696]. Yaşadığı dövr haqqında hər hansı bir məlumat yoxdur.

**Əbu Yaqub Fərqəd ibn Yaqub əs-Səbxi Ərməniyyi**

Mühəddis, hədis ravisi idi. İraqın Bəsrə şəhərinə yaşamışdı. Həsən əl-Bəsri və Səid ibn Cübeyrdən hədis dinləmiş və nəql etmişdi. Bir çox iraqlı mühəddis də onun tələbəsi olmuş, ondan hədis dinləmişdilər. Yaşlandığı dövrdə yaddaşında problemlər meydana gəlmiş, buna görə də o, hədis nəql etməkdən əl çəkmişdi. Əbu Yaqub Fərqəd Ərməniyyi Bəsrədə h. 131-ci ildə (749) baş vermiş taun epidemiyasından əvvəl vəfat etmişdi[697].

**Əhməd ibn Süleyman Ərməniyyi**

Siqa hədis ravisi idi. İmam Malik ibn Ənəsin (/) tələbələrindən biri olmuş və ondan hədis dinləmişdi. Əhməd ibn Süleyman Əbu Hüreyrə (ا) və Abdullah ibn Ömərdən (ا) mərfuən hədis nəql etmişdi. İbrahim ibn Müxəllid də Əhməd ibn Süleyman Ərməniyyidən hədis dinləmiş və nəql etmişdi[698]. Ölüm tarixi məlum deyil. İmam Malik ibn Ənəsin (öl. 795) müasiri olduğunu nəzərə alaraq VIII-IX əsrlərdə yaşadığını təxmin etmək olar.

**Şeyx Əbu Səlah Ərməniyyi**

XII-XIII əsrlərdə Misirdə, Əyyubilər dövlətində yaşamış azərbaycanlı tarixçi, coğrafyaşünas və sosioloq alimdir. Həyatı haqqında ətraflı məlumat yoxdur. Onun

---

[695] Qəyravan-indiki Tunis şəhəri.
[696] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 74-75; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 156. Yaqut əl-Həməvi bu şəxsin adını "Əbu Abdullah İsa ibn Malik ibn Şimr Ərməniyyi" olaraq qeyd etmişdir.
[697] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 394-395.
[698] İBN HƏCƏR, *Lisanü'l-Mizan*, C. I, s. 139.

müəllifi olduğu "Tarix" adlı əsərin bilinən yeganə nüsxəsi Paris milli kitabxanasında saxlanılır. Əsər Səlahəddin Yusif Əyyubinin (1169-1193) Misirdə hakimiyyətə gəldiyi 564-cü ildən (1169) başlayaraq Misirin coğrafiyası, yaşayış məntəqələri, əhalisi və tarixi haqqında çox dəyərli məlumatları ehtiva edir. Xüsusilə də bu əsərdə Misirin xristian əhalisi, monastır və kilsələri barədə nadir məlumatlar mövcuddur. Əsər tamamlanıb başa çatdırılmamışdır[699]. Güman ki, şeyx Əbu Səlahın vəfatı buna mane olmuşdur. Ölüm tarixi məlum deyil.

**Əminəlmülk Hüseyn ibn Muhəmməd ibn Hüseyn Gəncəvi**

Mühəddis idi. Hədis dinləmək üçün səyahətə çıxmış, Əbdülvəhhab ibn Məndə və ən-Nə'alidən hədis dinləmişdi[700]. Ölüm tarixi məlum deyil.

**Şeyx İmadəddin Əbu Abdullah Muhəmməd ibn Yusif ibn Əbdülmün'im Gəncəvi**

Təsəvvüf əhlinə mənsub, fəzilət sahibi, əsilzadə şəxs idi. Şeyx İmadəddin Gəncəvi həm də istedadlı şair idi. İbnü'l-Fuvati əsərində onun şerlərindən nümunələr qeyd etmişdir[701]. Ölüm tarixi məlum deyil. Təqribən XIII-XIV əsrlərdə yaşamışdır.

**Müfti Sənanəddin Yusif ibn Hüsaməddin ibn İlyas Gəncəvi**

Hənəfi məzhəbinə mənsub müfəssir və fəqih idi. Onun adı və nisbəsi müxtəlif tarixi mənbələrdə bir-birindən fərqli qeyd olunmaqdadır. Məsələn M. Sürəyya onun Gəncəli olduğunu qeyd etmişdir[702]. Nişancı Mehmed paşa və İdrisi Bidlisi onun nisbəsini "Bərdəizadə" olaraq qeyd etmişdilər[703]. Taşköprülüzadə onun nisbəsini "Əcəmi" olaraq qeyd etmiş və "O, Bərdənin qəsəbələrindən olan Gəncədən idi" yazmışdı[704]. Katib Çələbi isə onun Seyyid Şərif Cürcaninin "Şərhü't-Təcrid"[705] adlı əsərinə haşiyə

---

[699] DE SLANE, *həmin əsər*, s. 84.
[700] ZƏHƏBİ, *Müştəbih*, s. 121; HİMYƏRİ, *Nisbə ilə'l-Məvazi'*, C. I, s. 209.
[701] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 856.
[702] Mehmed SÜREYYA, *Sicil-i Osmani*, (Hzr. N. Akbayar), C. V, s. 1514, İstanbul 1996.
[703] NİŞANCI, *Hadisat*, s. 160; Şərəfxan ibn Şəmsəddin BİDLİSİ, *Şərəfnamə*, (Trc. Y. Vasilyeva), C. II, s.120, Moskva 1976.
[704] TAŞKÖPRÜZADƏ, *Şəqaiqü'n-Numaniyyə*, s. 184-185.
[705] "ət-Təcrid fi İlmü'l-Kəlam" və ya qısaca "Təcridü'l-Kəlam" adı ilə tanınan əsərin müəllifi Nəsrəddin Tusi (öl. 1274) idi. Nəsrəddin Tusinin əqaidə dair mülahizələrini ifadə etdiyi bu əsərdə "imamət" mövzusu əhəmiyyətli yer

yazdığını qeyd etdikdən sonra nisbəsini "ət-Təbriziyü'l-Gəncəvi" olaraq qeyd etmişdi[706]. Bəzən müəlliflərin bir-birinə zidd bu qeydlərindən alimin Bərdə şəhərində dünyaya gəlib ilk təhsilini də orada aldığı qənaəti hasil edilmişdir[707]. Lakin həmin qeydlərə diqqət yetirəndə Sənanəddin Yusifin ata və babalarının Bərdəli olduğu, özünün isə Gəncədə anadan olub ilk təhsilini orada aldığı, daha sonra isə təhsilini Təbriz şəhərində davam etdirdiyi nəticəsini çıxarmaq olar. Təbriz həmin dövrdə Azərbaycan Ağqoyunlular dövlətinin həm paytaxtı, həm də elm və mədəniyyət mərkəzi idi. Alimin müasirləri olan Nişancı Mehmed paşa (öl. 1571) və İdris Bidlisi (öl. 1521) onun haqqında məlumat verərkən nisbəsini "Bərdəizadə" yəni Bərdəlinin oğlu, Bərdəlinin övladı kimi qeyd etmişdilər[708]. Bu da Sənanəddin Yusifin ata-babalarının Bərdəli olduğu, özünün isə Gəncədə doğulub böyüdüyünü göstərir. Katib Çələbinin onun haqqında məlumat verərəkən nisbəsini "ət-Təbriziyü'l-Gəncəvi" yazmasının səbəbi isə Sənanəddin Yusifin müəllifi olduğu əsərləri yazarkən əsəri hansı şəhərdə yazımşdırsa həmin şəhəri nisbə olaraq istifadə etməsindən irəli gəlir. İrəlidə ətraflı məlumat verəcəyimiz kimi Sənanəddin Yusif uzun müddət Türkiyənin Amasiya şəhərində yaşamış və bu şəhərin müftisi olmuşdu. Alimin Türkiyədəki əlyazma əsər kitabxanalarında saxlanılar əsərlərinin böyük əksəriyyətində nisbəsi "əl-Amasi" olaraq qeyd edilmişdi. Bu onun həmin əsərləri Amasiyada qələmə aldığını göstərir. Görünür "Haşiyə ələ Şərhi't-Təcrid"i Təbrizdə qələmə almış və nisbəsini də özü "ət-Təbriziyü'l-Gəncəvi" kimi yazmışdır. Bununla yanaşı onu da qeyd edim ki, Katib Çələbi onun "Haşiyətü'ş-Şərhi'l-Fəraiz" adlı əsəri haqqında məlumat verərkən adını "Sənanəddin

---

tutmuşdur. Tusi burada "imamət" mövzusunu şiəlik nöqteyi-nəzərindən dəyərlindirmişdi. Tusidən sonra onun bu əsərinə həm şiə, həm də sünni alimlər tərəfindən çox sayıda şərh, haşiyə və tə'liqat yazılmışdır. Nəsrəddin Tusinin bu əsərdəki əqidəvi mülahizələrinin çürüdülməsi babında qələmə alınmış əsərlərdən Şəmsəddin Əbü's-Səna Mahmud İsfəhaninin (öl. 1349) "Təşyidü'l-Qəvaid fi Şərhi Təhriri'l-Əqaid", Seyyid Şərif Cürcaninin "Haşiyə ələ Şərhi't-Təcrid", Əli Quşçunun (öl. 1474) "Şərhü't-Təcrid", Ağqoyunlu dövrü alimlərindən Cəlaləddin Muhəmməd Dəvvaninin (1426-1502) "Rəsilü'l-Cəlaliyyə" adlı əsərlərinin adını çəkə bilərik. Osmanlı imperatorluğunun ilk dövrlərində bunlardan ən məşhuru Seyyid Şərif Cürcaninin "Haşiyə ələ Şərhi't-Təcrid" adlı əsəri olmuşdur. Başda Fateh II Mehmed olmaqla Osmanlı sultanları bu əsərin mədrəsələrdə dərslik kimi tələbələrə oxudulmasını təmin etmişdilər. Osmanlı imp-ğu alimlərindən bir çoxu bu əsərə haşiyə yazmışdılar. Bunlardan biri Sənanəddin Yusif Gəncəvi, digəri isə onun müasiri və "Haşiyətü'l-Haşiyə ələ Şərhi't-Təcrid"in müəllifi olan Xətibzadə Mehmed Qastamonidir (öl. 1495). Taşköprülüzadənin bəyan etdiyinə görə (bax: *Şəqaiqü'n-Numaniyyə*, s. 185) Sənanəddin Yusif Gəncəvi, Xətibzadənin bu haşiyəsindəki bəzi fikirlərini tənqid etmişdir.

706 KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. II, s. 1083.

707 Bilal DƏDƏYEV, "Osmanlı Eğitimine Katkıda Bulunan Bazı Azerbaycan Müderrisleri", **Journal of Qafqaz University**, S. 26, Bakı 2009, s. 215-223.

708 NİŞANCI, *yenə orada*; BİDLİSİ, *yenə orada*.

Yusif əl-Bərdəi" olaraq qeyd etmişdir[709]. Şübhəsiz ki, Katib Çələbinin gördüyü Sənanəddin Yusifə aid əlyazmanın özündə alimin adı məzh belə yazılmışdı. Həcc ziyarəti üçün getdiyi Məkkədə qaldığı müddətdə türkcə qələmə aldığı "Məcmu' fih Kitaban" adlı əsərində isə müəllifin adı "Sənanəddin Yusif əl-Məkki" kimi qeyd edilmişdi. Bu əsərin əlyazma nüsxəsi Səudiyyə Ərəbistanında, Kral Səud Universiteti kitabxanasında saxlanılır və surəti şəxsi kitabxanamda mövcuddur. Aşağıda da görəcəyimiz kimi Sənanəddin Yusifin qələmindən çıxmış əsərlərin böyük əksəriyyəti özündən əvvəlki və ya özünün müasiri olan alimlərin əsərlərinə yazdığı haşiyələrdən ibarətdir. Bu onun "əl-Muhaşşi", yəni haşiyəçi, haşiyə yazan ləqəbi ilə tanınmasına səbəb olmuş, haqqında məlumat verən bir çox müəllif onun bu ləqəbini adının önünə yazmışdır.

Bağdadlı İsmayıl paşa onun h. 893-cü ildə (1488) anadan olub h. 996-cı ildə (1588) vəfat etdiyini qeyd etmişdir[710]. Alim haqqında məlumat verən digər mənbələrin heç birində belə məlumat yoxdur və bu tamamilə yanlışdır. Yanıldığının ən əsas dəlili elə İsmayıl paşanın öz əsərindəki başqa bir qeyddir. İsmayıl paşa Sənanəddin Yusifin oğlu Muhəmməd Çələbi haqqında məlumat verərkən onun İstanbul Süleymaniyyə mədrəsəsində müdərris ikən h. 989-cü ildə (1581) vəfat etdiyini qeyd etmişdir[711]. Muhəmməd Çələbinin müdərris (rektor) ola biləcək yaşa çatmasına rəğmən atasının ondan daha uzun ömr yaşadığını təxmin etmək xeyli çətindir. H. 893 (1488) tarixi böyük ehtimalla alimin Azərbaycandan Anadoluya gəliş tarixidir. Bu sultan II Bayəzdin (1481-1512) hakimiyyəti illərinə təsadüf edir. Bu tarix Ağqoyunluların hakimiyyəti dövrünün sonlarına təsadüf edir ki, bu da Azərbaycan tarixinin ən qarışıq və daxili çəkişmələrə səhnə olan dövrlərindəndir. Bu zaman bir çox tanınmış alim vətəni tərk edərək Azərbaycandan ətraf müsəlman məmləkətlərinə getmişdilər. Sənanəddin Yusif Osmanlı məmləkətinə gələndən sonra Bursadakı mövlana Xosrov mədrəsəsində dərs vermişdi. Sonra İznikdəki bir mədrəsəyə müdərris, daha sonra isə Amasiya müftiliyinə

---

709 KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 276.

710 BAĞDADLI, *Hədiyyətü'l-Arifin*, C. II, s. 564. Bursalı Mehmed Tahir də mütfi Sənanəddin Yusifin ölüm tarixi və yeri haqqında səhv məlumat vermişdir. Mehmed Tarihə görə alim h. 986-cı (1578) ildə İstanbulda vəfat etmişdir. Bax, *həmin əsər*, C. II, s. 54-55. Ümuniyyətlə mənbələrdəki bir-birinə zidd məlumatlar "Sənanəddin Yusif Amasyəvi" adlı iki ayrı şəxsin təqribən eyni dövrdə Osmanlı dövlətində yaşadığı fikrini oyadır.

711 BAĞDADLI, *Hədiyyətü'l-Arifin*, C. II, s. 252.

təyin olunmuşdu. Amasiya müftisi olduğu dövrdə həmçinin Amasiyadakı sultan Bayəzid mədrəsəsinin müdərrisi olmuşdu[712]. Əbdizadə Hüseynin bildirdiyinə görə "Mədrəsəyi-Sultaniyyə" kimi tanınan, 891-ci ildə (1486) Amasiyada sultan II Bayəzd tərəfindən inşa etdirilmiş bu mədrəsənin belə bir xüsusiyyəti var idi ki, Amasiya müftiliyinə təyin olunan şəxs həm də bu mədrəsənin müdərrisliyinə təyin olunurdu[713]. Yəni belə demək mümkündürsə, müfti-müdərris hər gün məşğul olub həll etdiyi fiqhi məsələlərin həm praktika və həm də nəzəriyyəsini tələbələrə göstərmək fürsəti əldə etmiş olurdu.

Müfti Sənanəddin Yusifin ölüm tarixi haqqında iki əsas mülahizə mövcuddur. M. Sürəyya onun h. 922-ci ildə (1516) vəfat etdiyini qeyd etmişdir[714]. Amasiya şəhərinin tarixini yazmış Əbdizadə Hüseyn Hüsaməddin isə onun h. 913-cü ilin əvvələrində (may-avqust 1507) yatağında qəflətən öldüyünü qeyd etmiş və ölümünün müəmmalı olduğuna eyham vurmuşdu. Bununla bağlı Hüseyn Hüsaməddin maraqlı bir əhvalat yazmışdır ki, xülasəsini burada nəql etmək yerinə düşəcəkdir. Əvvəla onu deyim ki, son dövr Osmanlı tarixçilərindən olan H. H. Əbdizadənin (öl. 1939) əsərini tədqiq edərkən onun ümumiyyətlə azərbaycanlılara qarşı münfi münasibət bəslədiyinin şahidi oldum. Belə ki, "Tarixi-Amasiya" adlı əsərinin III cildinin 4-7 səhifələrini, "h. 736-cı ildə Amasiya Əyanı və Azərilər" başlığı altında, azərbaycan türklərinə olan mənfi münasibətinin açıqlamasına sərf edərək, əsassız iddialar ortaya atmışdır. Buna görə də onun müfti Sənanəddin Yusif Gəncəvi haqqında verdiyi məlumatlara da ehtiyatla yanaşmaq lazım olduğu fikrindəyəm. Çünki müəllifin özünün şəxsi qənaətlərini tarixi hadisələrə əks etdirmə ehtimalı böyükdür. Beləliklə Əbdizadə sultan II Bayəzidin hakimiyyəti illərində oğullarından şahzadə Əhmədin Amasiya canişini oluduğunu və əcəmlərin, yəni iranlıların şahzadə üzərində dərin təsirə malik olduqlarını yazır. Müəllif burada "əcəm" məfhumuna azərbaycanlıları da daxil etməkdədir. Bu nüfuz və təsir nəticəsində başı şah İsmayıl Səfəvinin göndərdiyi hədiyyələrə və əyləncəyə qarışmış şahzadə, şah İsmayılın Ərzincanı tutub talan etməsinə, hətta Amasiya yaxınlığındakı Toqada qədər gəlib çıxmasına lazımi əhəməyyət verməmiş və bu

---

712 TAŞKÖPRÜZADƏ, *yenə orada*.
713 Hüseyn Hüsaməddin ƏBDİZADƏ, *Tarix-i Amasya*, C. I, s. 292, İstanbul 1327-1330.
714 SÜREYYA, *yenə orada*.

ərazilərin müdafiəsini təşkil etməmişdi. Əbdizadənin yazdığına görə bunun ən böyük səbəbkarı əcəmlər idi. Bu acınacaqlı vəziyyəti görən amasiyalı şair Fəğani İshaq Çələbi bir şer yazaraq Amasiyadakı əcəmləri həcv, şahzadəni isə tənqid etmişdi. Əbdizadənin yazdığına görə əcəmlər şairin bu həcvini "həzm" edə bilməmiş və ondan qisas almaq qərarına gəlmişdilər. Fəğani İshaq Çələbi şahzadə Əhmədin oğlu şahzadə Muradın yaxın adamlarından, həmsöhbətlərindən biri idi. Nəticə çıxarmağı oxucunun öz ixtiyarına buraxaraq Əbdizadənin qeydini olduğu kimi iqtibas edirəm: "Əcəmlər sultan Əhmədin ən ziyadə etimad etdiyi bir zat ilə Fəğaninin şahzadə Murad bəyə əlaqəsi və sui-niyyəti olduğunu icad və iftira edərək sultan Əhmədi inandırmışlardı". "Əlaqə və sui-niyyət" deyərkən şübhəsiz ki, uşaqbazlıq nəzərdə tutulmuşdu. Çünki, müəllifin yazdığına görə, bu söz şahzadə Əhmədin qəzəbinə elə səbəb olmuşdu ki, o, məsələni araşdırtmağa belə ehtiyac görmədən şair Fəğanini edam etdimişdi. Fəğani xalq arasında sevilən şair idi. Bundan başqa o, Amasiyadakı nüfuzlu ailələrdən birinə mənsub idi. Xalq onun qohumu olan Amasiya qazisi Müslihzadə Əbdürrəhman əfəndiyə öz əqrəbasını qoruya bilmədiyi üçün tənə etdi. Qazi Müslihzadə insanların bu acı və tikanlı sözlərindən ötrü xəstələnib yatağa düşdü və vəfat etdi. Qazinin Muhəmməd, Mahmud və Seyyidi adlı oğulları isə Amasiyanı tərk edib, şahzadə Yavuz Səlimin canişin olduğu, Trabzona getmişdilər. Fəğani hadisəsi şahzadə Əhmədin Amasyada nüfuzunun sarsılmasına səbəb olmuşdu. Fəğaninin nüfuz sahibi qohumları yuxarıda haqqında danışdığımız xəbəri şahzadə Əhmədə kimin çatdırdığını araşdırmışdılar. Belə məlum olmuşdu ki, bunu şahzadəyə müfti Sənanəddin Yusif Gəncəvi çatdırmışdır. Qısa müddət sonra, h. 913-cü ilin əvvələrində (may-avqust 1507) müfti Sənanəddin Yusif Gəncəvi yuxuda ikən qəflətən ölmüşdü[715]. Osmanlı tarixində şahzadə Yavuz Səlimlə qardaşı şahzadə Əhməd arasındakı mübarizə məlum idi. Hər iki qardaş ataları II Bayəziddən sonra Osmanlı taxtına oturmaq istəyirdi. Yavuz Səlim hələ şahzadəliyi və Trabzon canişinliyi dövründə qızılbaş təhlükəsinə qarşı sərt mövqeyi və amansızlığı ilə tanınmışdı. Osmanlı dövlətinin yüksək rütbəli mülki və hərbi məmurları hələ II Bayəzid sağ ikən ikiyə ayrılaraq bir qismi şahzadə Əhmədi, digər qismi isə şahzadə Səlimi dəstəkləmişdilər. Qızılbaş meylli məmurların bir çoxu şahzadə Əhmədin

---

[715] Hüseyn Hüsaməddin ƏBDİZADƏ, *Tarix-i Amasya*, C. III, s. 253-254, İstanbul 1927.

tərəfində idilər. Lakin tale Yavuz Səlimin üzünə gülmş, bu şahzadə həm dövlət xadimləri arasında tərəfdarlarının çoxluğu, həm də üstün şəxsi keyfiyyətləri baxımından taxta namizədlik məsələsində qardaşı Əhmədi üstələmişdi. Əbdizadənin nəql etdiyi bu hadisədə şair Fəğani, qazi Müslihzadə və müfti Sənanəddin Gəncəvi də iki qardaş arasındakı bu taxt-tac mübarizəsinin qurbanı olmuşdular. Əks təqdirdə, qəhərindən öldüyü zənn edilən qazi Müslihzadənin oğullarının Amasiyanı tərk etmələrini, üstəlik Yavuz Səlimin canişin olduğu Trabzona getmələrini başqa cür izah etmək çətindir.

Burada bir məsələyə də toxunmaq yerinə düşəcəkdir. Əbdizadə Hüseyn yaşadığı dövrlə tədqiq etdiyi tarixi dövrü bir-biri ilə qarışdırmışdır. Daha doğrusu o, tədqiq etdiyi dövrdə Azərbaycanın ictimai vəziyyətindən bixəbər olmuşdur. Həmin dövrdə şah İsmayılın tərəfdarlarının çoxu Əbdizadənin zənn etdiyi kimi əcəmlər, yəni İran və Azərbaycan əhalisi deyildi. Əksinə şah İsmayılın ordusundakıların böyük əksəriyyəti məhz Anadolunun yarıköçəri qızılbaşları idi ki, Azərbaycan və İranda əhaliyə qanlı divan tutmuşdular. Həsən Can İsfəhani[716], İdris Bidlisi kimi, Əbdizadənin ifadəsi ilə desək "əcəm" olan, şəxslər isə sultan Yavuz I Səlimi qızılbaş hərəkatına qarşı təşviq edən şəxslər olmuşdular. Qısacası həmin dövrdə Osmanlı-Səfəvi mübarizəsinin təməlində nə milli, nə irqri, nə də coğrafi amil yatmırdı. Məsələ tamamən siyasi və məfkurəvi mübarizə idi.

Müfti Sənanəddin Yusif Gəncəvi yaşadığı dövrün böyük alimlərindən idi. O, təfsir, fiqh, əxlaq və filologiya sahisəndə bir sıra əsərlərin müəllifi idi. Alimin müəllifi olduğu "Haşiyə ələ Bəyzavi"nin nüsxələrindən biri İstanbul Millət kitabxanasında saxlanılır. Bu haşiyə qazi Bəyzavinin Qur'ani-Kərimin Ənam surəsindən Kəhf surəsinə qədər olan 11 surəsinə və Ayətü'l-Kürsiyə yazdığı təfsirə yazılmışdır. Həmin kitabxanada Sənanəddin əfəndinin eyni adlı başqa bir əsəri də mövcuddur. Bu nüsxə isə qazi Bəyzavinin Qur'anın Kərimin Ənamdan Kəhfə qədərki 11 surəsinə, həmçinin Mülk, Müzzəmmil, Müddəsir, Duhə, İnşirah, Tin, Ələq, Qədr, Bəyyinə, Zilzal, Adiyət surələrinə yazdığı təfsirə haşiyədir. Bu haşiyələr onun qazi Bəyzavi təfsinə yazdığı tam haşiyənin ayrı-ayrı hissələridir. Həmin kitabxanada alimin kəlam elminə dair

---

716 Məşhur Osmanlı tarixçisi, "Tacü't-Təvarix"in müəllifi Xacə Sə'dəddinin atasıdır.

“Tə’yinü’l-Mərahim” adlı əsərinin də bir nüsxəsi mövcuddur. Bu əsərin digər nüsxələri isə İstanbuldakı Atif əfəndi əlyazma əsərlər kitabxanası, Nuriosmaniyyə əlyazma əsərlər kitabxanasında saxlanılır. Alimin “Haşiyə ələ Ənvari’t-tənzil və Əsrari’t-Təvil” adlı əsərinin nüsxələri Atif əfəndi və Konya BYEK-də mövcuddur. Bu qazi Bəyzavi təfsirinin tamamına yazılmış haşiyədir. Sənanəddin əfəndinin “Təfyinü’l-Məkarim” adlı əsərinin müəyyən edə bildiyimiz yeganə nüsxəsi Manisa İHK-də saxlanılır. Onun “Mənasiki-Həcc” adlı əsərinin əlyazma nüsxəsi Ankara Milli kitabxasında, “Müntəxabu İğasəti’l-Ləhfən fi Məsaidi’ş-Şeytan li-İbnü’l-Qəyyim əl-Cəvziyyə” adlı ərəbcə və “Nuru’l-Hüda” adlı türkcə qələmə aldığı mənəvi tərbiyə və İslam əxlaqına dair əsərləri İstanbul Köprülü əlyazma əsərlər kitabxanasında, “Haşiyə ələ Şərhi’l-Məvaqif” adlı əqidəyə və kəlama dair əsərinin iki nüsxəsi isə Diyarbəkir İHK-də saxlanılır. Burada adlarını sadaladıqlarımızdan başqa Katib Çələbi alimin vərəsələki hüququna dair “Haşiyə li-Şərhi’l-Fəraiz”, münazirə (elmi diskussiya) qaydalarına dair “Risalə fi Ababü’l-Bəhs”, astronomiyaya aid “Risalə fi’l-Hey’ə” kimi əsərlərinin olduğunu da qeyd etmişdir[717]. Sənanəddin Yusif Gəncəvi həkim Kəmaləddin Məs’ud Şirvaninin[718] (öl. 1499) təbib Şəmsəddin Səmərqəndinin (öl. təqribən 1204) əxlaq fəlsəfəsinə dair “Adabü’l-Fazil” adlı əsərinə yazdığı şərhə haşiyə yazmışdır. Bu haşiyənin bir nüsxəsi Paris milli kitabxanasında saxlanılır[719].

**İbrahim ibn Muhəmməd Gəncəvi**

Şafi’i məzhəbinə mənsub fəqih və mühəddis idi. Yaşlandığı vaxt dinləyib əzbərlədiyi hədisləri unutmamaq üçün qələmə almışdı. İslam dinini təbliğ etmək məqsədiylə Gəncəni tərk etmiş və 2 il davam edən səyahətə çıxmışdı. Bu səyahət vaxtı vəfat etmişdi[720]. Ölüm tarixi h. 385-ci (995) ildən əvvələ təsadüf edir.

---

[717] KATİB ÇƏLƏBİ, *Kəşfü’z-Zünun*, C. I, s. 276, 1039, 1107.

[718] Həkim Kəmaləddin Məs’ud Şirvani haqqında ətraflı məlumat üçün bax: s. ???

[719] DE SLANE, *həmin əsər*, s. 412.

[720] İBN MAKULA, *İkmal*, C. I, s. 125; SƏM’ANİ, *Kitabü’l-Ənsab*, C. I, s. 408; ŞƏHRƏZURİ, *Təbəqatü’l-Füqəhai’ş-Şafi’iyyə*, C. I, s. 319. İbnü’s-Səlah Şəhrəzuri, Əbü’l-Həsən Əli Darəqutninin (öl. 995) özünün “əl-Mu’təlif” adlı əsərində İbrahim ibn Muhəmməd Gəncəvinin əzbərindəki hədisləri qələmə aldığını yazdığını bildirməkdədir. Ehtimal ki, Darəqutni, haqqında məlumat verdiyi, bu mühəddisdən sonra vəfat etmişdir. Yaxud da onun müasiri olmuşdur.

**Əbu Məs'ud Əhməd ibn İbrahim ibn Muhəmməd ibn Əhməd ibn İbrahim ibn Musa ibn Abdullah Gəncəvi**

Mühəddis idi və mənsub olduğu ailədən bir çox hədis alimi çıxmışdı. O cümlədən atası da mühəddis idi. Əbu Əmr ibn Mənduyə və Əbü'l-Qasım İsmayıl əl-İsmailidən hədis dinləmişdi[721]. Mənbələrdə bu haqda dəqiq məlumata rast gəlməsək də, fikrimizcə yuxarıda haqqında bəhs etdiyimiz İbrahim ibn Muhəmməd Gəncəvi onun atası idi. Ölüm tarixi məlum deyil. Təqribən XI əsrdə yaşamışdır.

**Əbu Abdullah Əhməd ibn Muhəmməd ibn Əhməd Gəncəvi**

Mühəddis idi. Uzun müddət İsfəhanda yaşamış bu şəhərdəki hədis alimlərindən dərs almışdı. Əbu Bəkr Muhəmməd Bağdadi öz əsərində İsfahanda olarkən onunla görüşdüyünü qeyd etmişdi. Bağdadinin bildirdiyinə görə Əbu Abdullah Əhməd Gəncəvi İsfəhanda Əbu Muhəmməd Əbdürrəhman əd-Düveyninin tələbəsi olmuş və ondan Nəsainin "Sünən" adlı hədis küliyyatını dinləmişdi. Əbu Abdullah Gəncəvinin müəllimlərindən biri də Əbü'l-Qasım Hibətullah İsfəhani olmuşdur[722]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Əbdülvəhhab ibn Əhməd ibn Muhəmməd Gəncəvi**

Atası kimi mühəddis olan Əbdülvəhhab Gəncəvi yuxarıda haqqında bəhs etdiyimiz Əbu Abdullah Əhməd Gəncəvinin oğlu idi. Əbu Bəkr Bağdadi onun alim, saleh və mömin bir gənc olduğunu, Əbu Əli əl-Həddad kimi İsfəhanın tanınmış hədis alimlərinin yanıdan təhsil aldığını qeyd etmişdir. Əbdülvəhhab Gəncəvi tədrislə məşğul olmuş və hədis dərsləri vermişdir. Lakin o, gənc yaşlarında, atasından əvvəl vəfat etmişdir[723]. Təəssüf ki, Bağdadi onun ölüm tarixini qeyd etməmişdir. XII əsrdə yaşadığı təxmin olunur.

**Qazi Tahir Gəncəvi**

---

[721] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. II, s. 346.
[722] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 482.
[723] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 482.

Şafi'i məzhəbinə mənsub fəqih idi. Gəncə əyanlarından olan qazi Tahir Gəncəvi fiqh və ədəbiyyat sahəsində yaşadığı dövrdə Gəncənin ən tanınmış alimlərindən biri idi. O, Əbü'l-Qasım Əli ibn Əbdürrəhman Nişapuridən hədis dinləmiş, Əbü'l-Fəzl Şaban ibn Əli ibn Muhəmməd Bərdəidən isə fiqh elmini öyrənmişdi. İsfəhanda Böyük Səlcuqlu imperatorluğunun məşhur vəziri Nizamülmülkün hüzurunda olmuşdu. Vəzirin təşəbbüsü ilə Gəncə qaziliyinə təyin edilmişdi. Tarixçi və siyasi xadim əmir Əbu Nəsr Əli ibn Makula (öl. 1082) Gəncədə olduğu vaxt onunla görüşmüşdü[724]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Şeyx Əbu Zəkəriyyə Yəhya ibn Mənsur Gəncəvi**

Şafi'i məzhəbinə mənsub mühəddis, zahid və abid şəxs idi. Həmçinin Qur'an hafizi olan şeyx Əbu Zəkəriyyə Gəncəvi öz dövrünün mahir qarilərindən biri idi və çox gözəl səslə Qur'an oxuyurdu. O, İran, İraq və Xorasanın şəhərlərini gəzərək bu yerlərin tanınmış alimlərinin dərslərində iştirak etmişdi. Nişapurda təhsil almış, burada Zeynü'l-İslam ləqəbi ilə məşhur olan Əbu Nəsr Əbdülkərim ibn Həvazin əl-Quşeyri Nişapurinin (öl. 1072) tələbəsi olmuşdu. O, daha sonra Zeynü'l-İslam Quşeyrinin yaxın dostlarından birinə çevrilmişdi. Nişapurdan həcc ziyarəti üçün Hicaza getmiş, həccdən qayıdarkən İsfəhanda Böyük Səlcuqlu sultanlarının vəziri Nizamülmülklə görüşmüşdü. Nizamülmülklə şeyx Əbu Zəkəriyyə Gəncəvinin yaxın münasibəti var idi. Şeyx Əbu Zəkəriyyə Gəncəvi h. 496-cı ilin ramazan ayında (iyun 1103) vəfat etmişdi[725].

**Əbu Sə'd Muhəmməd ibn Yəhya ibn Mənsur Gəncəvi**

Şafi'i məzhəbinə mənsub fəqih olan Əbu Sə'd Gəncəvi yuxarıda haqqında bəhs etdiyimiz şeyx Əbu Zəkəriyyə Yəhya Gəncəvinin oğlu idi. Gəncliyi Xorasanın Nişapur şəhərində keçmiş, ehtimal ki, burada dünyaya gəlmişdi. Əbu Hamid Əhməd ibn Əbdus və Əbu Əli Nəsrullah ibn Əhməd Xoşnamın tələbəsi olmuşdu. Tarixçi alim Əbü'l-Qasım Əli ibn Əsakir (öl. 1175) Əbu Sə'd Muhəmməd Gəncəvinin Mərv şəhərində tədrislə məşğul olduğunu qeyd etmişdir. İbn Əsakir və digər bir tarixçi alim Əbu Sə'd

---

724 ƏBU TAHİR İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, s. 131.
725 SEYRƏFİNİ, *Müntəxəb*, s. 533.

Səm'ani, Muhəmməd ibn Yəhya Gəncəvinin tələbəsi olmuş, ondan hədis dinləmişdilər[726]. Əbu Sə'd Muhəmməd Gəncəvi h. 11 şəvval 549-cu ildə (18 dekabr 1154) Nişapurda oğuz türkləri tərəfindən qətlə yetirilmişdi[727]. Böyük Səlcuqlu dövlətinə qarşı qiyam qaldıran Orta Asiyadakı oğuz türkləri 1153-cü ilin aprel ayında sultan Səncəri (1118-1157) girov götürmüş, 1154-cü ilin noyabr və dekabr aylarında Xorasanın Mərv, Nişapur, Tus və Məşhəd kimi bir sıra şəhərlərini zəbt edərək qətl və qarətlə məşğul olmuşdular[728]. Əbu Sə'd Muhəmməd Gəncəvi də bu iğtişaşlar vaxtı qətlə yetirilmişdi.

**Əbü'l-Əla Müvəffəq ibn Yəhya ibn Mənsur Gəncəvi**

Mühəddis və yuxarıda haqqında bəhs etdiyimiz Əbu Sə'd Muhəmməd Gəncəvinin qardaşı idi. Nişapurda yaşamış, burada İsmayıl ibn Hüseyn əl-Fəraizi, Əbu Abdullah Muhəmməd ibn Mahmud ər-Rəşidi kimi dövrün tanınmış mühəddislərindən dərs almış, hədis dinləmişdi. Təhsilini başa vurduqdan sonra tədrislə məşğul olmuşdu. Tarixçi alim Əbu Sə'd Səm'ani, alimin öz oğlu Əbdürrəhim ibn Müvəffəq Gəncəvi ondan hədis dinləmişdilər. Ölüm tarixi məlum deyil XI-XII əsrlərdə yaşamışdır[729].

**Əllamə Əbu Həfs Ömər ibn Osman ibn Hüseyn ibn Şueyb Gəncəvi**

Mühəddis, müfəssir və ədəbiyyatçı idi. O, mömin və fəzilət sahibi insan kimi tanınmışdı. Bağdad və Həmədanda təhsil almışdı. Əbü'l-Müzəffər əl-Əbivərdidən ərəb ədəbiyyatını öyrənmiş[730], Əbu Muhəmməd Əbdürrəhman əd-Düveyninin yanında Nəsainin "Sünən" adlı hədis küliyyatını oxumuşdu. Daha sonra alim İraqdan Xorasana getmiş, burada Şeyxü's-sələfi ləqəbi ilə tanınan Müsəddid ibn Muhəmməd Gəncəvidən hədis elmlərinə dair dərslər almış, hədis dinləmişdi[731]. Təhsilini başa vurduqdan sonra

---

726 Əbü'l-Qasım Əli ibn Həsən İBN ƏSAKİR, *Mu'cəmü'ş-Şüyux*, (Nşr. S. əş-Şihabi), s. 280, Dəməşq 1980. İbn Əsakir 1134-cü ildə təhsil almaq məqsədiylə vətəni Suriyadan yola çıxmış, Azərbaycan, İran və Xorasanın elm mərkəzlərini gəzərək buralardakı alimlərin dərslərini dinləmişdi.

727 BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s.482.

728 SEVİM-MERÇİL, *Selçuklu Devletleri Tarihi*, s. 224.

729 BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s.483.

730 BÜNYADOV, "Novıye Materialı o Vidnıx Deyatelyax Azerbaydjana ve Epoxu Srednevekovya", s. 59-60; BÜNYADOV, *Azərbaycan Atabəyləri Tarixi*, s. 231.

731 ZƏHƏBİ, *Müştəbih*, s. 121; QIFTİ, *İnbahu'r-Ruvat*, C. II, s. 329-330.

Sərəxs[732], Mərv[733] və Nişapur[734] şəhərlərində hədis dərsləri vermiş və bir çoxları ondan hədis dinləmişdilər. Öz oğlu Əbdürrəhman ibn Ömər Gəncəvi, mühəddis və tarixçi İbn Sə'd Səm'ani ondan hədis dərsləri almışdılar. Əbü'l-Həfs Ömər Gəncəvi hədis elminə dair bəzi əsərlərin də müəllifi idi. Cəlaləddin Süyuti və Əhməd Ədnirəvi onun çox gözəl üslubda qələmə alınmış Qur'ani-Kərim təfsirinin də müəllifi olduğunu qeyd etmişdilər. Bağdadlı İsmayıl paşa da həmin əsər haqqında "bu təfsirin misli bərabəri yoxdur" deyə qeyd etmişdir[735]. Alim h. 550-ci ilin rəbiələvvəl ayının 14-ü (18 may1155) Mərv şəhərində vəfat etmişdi[736].

**Qazi Fələkəddin Əbü'l-Həsən Əli ibn Abdullah Gəncəvi**

Gəncə şəhərinin şafi'i məzhəbinə mənsub qazisi olmuşdur. Fələkəddin Əli Gəncəvi həmçinin ədib və şair idi[737]. Ölüm tarixi məlum deyil. Təqribən XII-XIII əsrlərdə yaşamışdır.

**Əbu Bəkr Muhəmməd ibn Əbdürrəhman ibn Yəhya Gəncəvi**

H. 481-ci ildə (1088) Dəməşqdə hədis dərsləri verməyə başlamışdı. O, Əbu Tahir Abdullah ibn Əhməd əs-Süleytidən hədis nəql etmişdi. Əbü'l-Qasım ibn Sabir ondan hədis dinləmiş və dinlədiyi hədisləri qeyd etmişdi. Əbu Bəkr Muhəmməd Gəncəvinin ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır[738].

**Şeyx Müsəddid ibn Muhəmməd Gəncəvi**

Mühəddis və fəqih idi. "Şeyxü's-sələfi" ləqəbi ilə tanınmışdı. Əli ibn İsa əl-Bəqqilanidən hədis dinləmiş və nəql etmişdi. Əbü'l-Həfs Ömər ibn Osman ibn Şueyb Gəncəvi və Əbu

---

[732] Sərəxs-İranın şimali-şərqində, Türkmənistanla sərhəddə yerləşən şəhər.
[733] Mərv-Türkmənistan ərazisində yerləşir, indi Marı adlanır.
[734] Nişapur-İranın şimali-şərqində yerləşən şəhər.
[735] BAĞDADLI, *İzahü'l-Məknun*, C. I, s. 151.
[736] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. II, s. 346; ƏDNİRƏVİ, *Təbəqatü'l-Müfəssirin*, s. 82-83; Cəlaləddin Əbdürrəhman ibn Əbu Bəkr əs-SÜYUTİ, *Təbəqatü'l-Müfəssirin*, s. 30, Qahirə 1972; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 408; Əbu Bəkr Muhəmməd ibn Əbdülqəni İBN NÖQTƏ Bağdadi, *Təqyid li-Mə'rifəti-Ruvatü's-Sünən və'l-Əsanid*, s. 227, Beyrut 2001.
[737] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 505.
[738] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LIV, s. 106.

Müzəffər ibnü's-Səm'ani ondan hədis dinləmişdilər. Şeyxü's-sələfi Gəncəvi h. 550-ci ildə (1155) Mərv şəhərində vəfat etmişdi[739].

**Qazi Ümdətəddin Əbu Mənsur Vəhvuzan ibn Abdullah ibn Amir əs-Səqurbati Gəncəvi**[740]

Mühəddis, fəqih, xətib və ədib idi. İbnü'l-Fuvati başqa bir tarixçi Mühibbəddin Əbu Abdullah İbnü'n-Nəccara istinadən onun Gəncə yaxınlığındakı Səqurbat qəsəbəsindən olduğunu qeyd etmişdir. Qazi Ümdətəddin Gəncədə təhsil almış, qazi Əbu Əli Həsən ibn Muhəmməd Nəiminin tələbəsi olmuşdu. H. 502-ci ilin rəbiələvvəl ayında (oktyabr 1108) həcc ziyarətindən qayıdarkən Bağdada gəlmiş və bir müddət burada qalaraq hədis dərsləri vermişdi. Xeyrəddin Əbü'l-Xeyr Hezarəsb ibn Əvəz əl-Hərəvi (öl. 1121) onun tələbələri arasından yetişmiş alimlərdən biri idi. Qazi Ümdətəddin Gəncəvi h. 505-ci ildən (1111) sonrakı yaxın tarixlərdə Gəncədə vəfat etmişdi[741].

**Muhəmməd ibn Muhəmməd ibn Əbu Bəkr ibn Əbdürrəhman Gəncəvi**

Mühəddis və həkim idi. H. 675-ci ildə (1276) anadan olmuş və Dəməşqə gedib orada məskunlaşmışdı. İbn Qəvvas və Tacəddin əl-Fizaridən hədis dinləmişdi. Bacarıqlı həkim kimi şöhrət tapmışdı. H. 731-ci ilin zilqədə ayında (avqust 1331) vəfat etmişdi[742].

**Yəzid ibn Ömər ibn Cənzət Gəncəvi**

Hədis ravisi idi. Bağdadda yaşamış, Rəbyi' ibn Bədr və Ömər ibn Əli əl-Məqdisidən hədis nəql etmişdi. Abbas ibn Muhəmməd ibn Hatim əd-Duri (öl. 884), İsa ibn

---

[739] ZƏHƏBİ, *Müştəbih*, s. 121; HİMYƏRİ, *Nisbə ilə'l-Məvazi'*, C. I, s. 209.

[740] Bu şəxsin adına və nisbəsinə aydınıq gətirmək yerinə düşəcəkdir. Güman edirik ki, milliyətcə ərəb olan İbü'l-Fuvati, mükəmməl farsca (ŞEŞEN, *həmin əsər*, s. 237) və böyük ehtimalla türkcə də bilməsinə baxmayaraq, uzun müddət yaşadığı Azərbaycandakı bəzi şəxs və coğrafi adları yazarkən imla xətalarına yol vermişdir. Mərhum akad. Ziya Bünyadov haqlı olaraq İbnü'l-Fuvatinin [السقورباطي] "əs-Səqurbati" olaraq qeyd etdiyi bu nisbəni "əs-Saqurabadi" kimi oxumuş və əsərində qeyd etmişdi (bax: *Azərbaycan Atabəyləri Dövləti*, s. 184). Lakin İbnü'l-Fuvatinin alimin [وهوزان] "Vəhuzan" olaraq qeyd etdiyi adı mərhum akademikin əsərində "Varzuqan" kimi yazılmışdır.

[741] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 894.

[742] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 2.

Abdullah Təyalisi də ondan hədis dinləmiş və nəql etmişdilər[743]. Ölüm tarixi məlum deyil. IX əsrdə yaşamışdır.

**Əbü'l-Fəzl İsmayıl ibn Əli ibn İbrahim Gəncəvi**

Mühəddis və şafi'i məzhəbinə mənsub fəqih idi. H. 498-ci ildə (1105) Gəncədə dünaya gələn Əbü'l-Fəzl İsmayıl h. 514-cü ildə (1120) təhsil almaq üçün Bağdada getmişdi. Bağdadda Əbü'l-Bərəkat Hibətullah ibn Muhəmməd ibn Əli əl-Buxari, Muhəmməd ibnü's-Səmərqəndi, Əbü'l-Həsən Muhəmməd ibn Mərzuq əz-Zəfərani, Əbü's-Səud Əhməd ibn Əli, Həsən ibn İshaq əl-Baqrihi, Əbu Nəsr Əhməd ibn Muhəmməd ət-Tusidən hədis dinləmiş, hədis elmlərinə dair biliklərə yiyələnmişdi. Şeyx Cəmaləddin Əbü'l-Həsən ibn Əli ibnü'l-Müslim və Əbü'l-Fəth əl-Müəssisidən fiqh dərsləri almışdı. Həmçinin İraqın əl-Ənbar şəhərində Xəlifə ibn Məhfuzdan da dərs almışdı. Zəhəbi onun h. 566-cı ildə (1171) Dəməşqə gələrək burada hədis dərsləri verdiyini qeyd etmişdir. Əbü'l-Fəzl İsmayıl Gəncəvi h. 588-ci ilin cəmaziələvvəl ayında (may 1192) Dəməşqdə vəfat etmişdi[744].

**Qaziü'l-quzat Əlaəddin Əbdürrəhim ibn Muhəmməd ibn Əhməd ibn Fəzlullah ibn Əbdülhəmid Marağİ**

H. 662-ci ilin rəbiələvvəl ayında (yanvar 1264) Marağada alim ailəsində dünyaya gəlmişdi. Onun atası və babaları yaşadığı dövrün tanınmış elm adamlarından olmuşdular. Əlaəddin Əbdürrəhim Marağİ Bağdada getmiş və bu şəhədə yaşamışdı. Elxanilər dövründə İraq qaziü'l-quzatlığına təyin olunmuşdu. O, İraqda özünün dərin elmi, fəziləti və ədalətliliyi ilə şöhrət tapmışdı. Buna görə də İraqda heç bir qazi, hakim və alim onun bu vəzifəyə təyininə etiraz etməmişdi. Bu vəzifəni icra etdiyi dövrlərdə haqqında heç bir şikayət edilməmişdi. İbnü'l-Fuvati h. 715-ci ilin ramazan ayında (dekabr 1315) Bağdadda baş qazi Əlaəddin Əbdürrəhim Marağİ ilə görüşdüyünü

743 YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. II, s. 346; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 408.

744 YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. II, s. 346; ZƏHƏBİ, *Müştəbih*, s. 121-122; ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'-Dübeysi*, s. 137; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 180-181; Əsnəvi onun h. 587-ci ilin cəmaziələvvəl ayında (iyun 1191) vəfat etdiyini qeyd etmişdir.

yazmışdır[745]. Müəllif onun ölüm tarixini qeyd etməmişdi. Ehtimal ki, o, İbnü'l-Fuvatidən (öl. 1323) sonra vəfat etmişdi.

**Şeyx Üveys ibn Əmr ibn Əli Marağī**

Mühəddis idi. Bağdadda şərif Əbü'l-Hüseyn Muhəmməd ibn Əli ibnü'l-Mühtədi Billah əl-Haşimidən hədis dinləmiş və nəql etmişdi. Vaiz Əbu Bəkr Muhəmməd ibn Kəmmar ibn Nasir əl-Həddadi Marağī onun tələbələrindən olmuş, ondan hədis dərsləri almışdı[746]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Əllamə Bəhaəddin Əbdülvəhhab ibn Əbdülvəli ibn Əbdüssəlam Marağī**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Təqribən h. 700-cü (1300) ildə anadan olmuşdu. Fiqh, fiqh üsulu və kəlam kimi ilahiyyat elmlərində dərinləşmişdi. Onun müasiri olduğu bioqraflar Bəhaəddin Marağīnin fiqh üsulu sahəsində yaşadığı dövrün ən böyük mütəxəssisi olduğunu qeyd etmişdirlər. O, Qahirədə şeyx Təqiyəddin əs-Sübki və şeyx Əlaəddin Qonyəvi Təbrizinin tələbəsi olmuşdu. "əl-Haviü's-Səğir"[747] əsərini əzbərləmişdi. Təhsilini başa vurduqdan sonra Misirdən Suriyaya getmiş və orada məskunlaşmışdı. Bəhaəddin Marağī dərin mühakimə qabiliyyətinə, parlaq zəkaya və müstəsna hafizəyə malik bir insan idi. O, Qur'ani-Kərimin tilavəti ilə çox məşğul olur, çox ibadət edirdi. Mehriban və ünsiyyətcil insan kimi tanınan alimin kəlam və fiqh elmi sahəsində qələmə aldığı bəzi əsərləri var idi. Bunlardan biri də "Münqizü'z-Zələl fi İlm və'l-Əməl" adlı əsər idi. O, həmçinin "Şərhu Müntəhi's-Sul və Əməl fi İlmi'l-Üsul" adlı kəlam elminə dair əsərin də müəllifi idi. Bəhaəddin Marağī h. 764-cü ilin şəvval ayında (iyul 1363) Dəməşqdə taun epidemiyası vaxtı xəstəliyə yoluxaraq vəfat etmişdi[748].

---

[745] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1026-1027.
[746] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 154.
[747] əl-Haviü's-Səğir-Şeyx Nəcməddin Əbdülğəffar Qəzvininin (öl. 1266) şafi'i fiqhinə dair qələmə aldığı əsərdir.
[748] SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. X, s. 70; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. III, s. 31; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VI, s. 696; Təqiyyəddin Muhəmməd İBN RAFİ', *əl-Vəfayat*, s. 83, Dəməşq 1986; BAĞDADLI, *İzahü'l-Məknun*, C. II, s. 374; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. IV, s. 49-50. Bağdadlı İsmayıl paşa alimin atasının adını, digər müəlliflərdən fərqli olaraq, "Əbdülvəli" deyil "Əbdürrəhman" kimi qeyd etmişdir. Ömər Rza Kəhhalə isə onun adının "Harun" olduğunu bildirmişdi. Halbuki alim haqqında məlumat verən mənbələrin heç birində belə bir qeyd yoxdur.

**Əbu Abdullah Muhəmməd ibn Vəfa ibn Əbdüsseyyid Maraği**

Mühəddis idi. Əbü'l-Fəzl ibnü'l-Həddadın tələbəsi olmuş, ondan hədis dinləmişdi. Şam diyarında hədis tədrisi ilə məşğul olmuşdu. H. 16 şaban 689-cu ildə (23 avqust 1290) Dəməşqdə vəfat etmişdi[749].

**Vaiz Muhəmməd ibn Kəmmar əl-Həddadi Maraği**

Mühəddis idi. Üveys ibn Əmr Marağı, qazi Əbü'l-Fərəc Tərrasi, vaiz Əbu Abdullah Hüseyn ibn Muhəmməd, Əbu Səid Mənsur ibn Abdullah Marağı kimi dövrün tanınmış hədis alimlərinin tələbəsi olmuşdu. Ondan hədis dinləyib nəql etmiş mühəddislərdən Ömər əl-Qurəşinin adını çəkmək olar. Vaiz Muhəmməd Marağı h. 572-ci ildə (1176) vəfat etmişdi[750].

**Əbu Bəkr Əhməd ibn Muhəmməd ibn Əli Marağı**

Hədis ravisi idi. Misirdə və Dəməşqdə yaşamış, Rəbyi' ibn Süleymandan hədis dinləmiş və nəql etmişdi. Onun müasiri olan mühəddislər Əbu Bəkr Əhməd Marağini siqa, yəni mötəbər hədis ravisi adlandırmışdılar. O, hədis sahəsində bir neçə dəyərli əsərin müəllifi idi. Əbu Bəkr Əhməd Marağı h. 338-ci ildə (949) vifat etmişdi[751].

**Fəxrəddin Əbu Əbdülvəhhab İlyas ibn Abdullah əz-Zahiri Marağı**

Mühəddis idi. Təqribən 600-cü ildə (1204) Marağada dünyaya gəlmişdi. Moğol istilası vaxtı vətəni tərk edərək Bağdada getməyə məcbur olmuşdu. Bağdadda xəlifə əz-Zahir (1225-1226) və əl-Müstə'sim Billahın (1242-1258) hakimiyyətləri dövündə Abbasilərin sarayında xidmət etmişdi. Bağdadda Zeynəddin Əbü'l-Həsən Muhəmməd ibnü'l-Qətiyyinin tələbəsi olmuş və onun yanında imam Buxarinin "Səhih"ini oxumuşdu.

[749] MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. VII, s. 408.
[750] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 123.
[751] İBN TAĞRIBİRDİ, *Nücumu'z-Zahirə*, C. I, s. 423; Əbu Muhəmməd Əbdüləziz KƏTTANİ, *Zeyl Tarixi-Məvlidi'l-Üləma və Vəfayatihim*, (Nşr. A. Həməd), s. 69, Riyad 1409.

Həmçinin başqa mühəddislərdən də dərs almışdı. H. 685-ci ilin cəmaziələvvəl ayında (iyul 1286) Bağdadda vəfat etmişdi[752].

**Əbu Yaqub Yusif ibn Adəm ibn Əbu Abdullah ibn Adəm Maraği**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. H. 511-ci ildə (1117) doğulmuşdu. Əbu Abdullah əl-Fəravinin tələbəsi olmuş, ondan imam Müslümün "Səhih" adlı hədis külliyatındakı hədisləri və şərhini dinləmişdi. Əbu Bəkr Əbdürrəzzaq ibn Əbdülqadir əl-Ceyli Bağdadda ondan hədis dinləmişdi. Həmçinin fəqih Hilal ibn Məhfuz ər-Rəsi'ni də ondan hədis dinləmiş və nəql etmişdi. Əbu Yaqub Yusif Marağı Dəməşqdə hədis dərsləri verərkən onun dərslərində çox sayıda tələbə toplaşırdı[753]. Alim h. 569-cu ilin rəbiələvvəl ayında (oktyabr 1173) vəfat etmişdi[754].

**Qazi Əbdüllətif ibn Nuri Marağı**

Şafi məzhəbinə mənsub fəqih idi. Mühəddis Muhəmməd ibn Əsəd Həfdənin tələbəsi olmuş, ondan "Şərhü's-Sünnə"ni[755] dinləmişdi. Bir müddət Mərənd şəhərində tədrislə məşğul olmuşdu. Burada onun yetişdirdiyi tələbələr arasından hafiz Bədrəddin Əbü'l-Xeyr Bədəl Təbrizi[756] (öl. 1238) kimi alim çıxmışdır. Əbdüllətif Marağı Azərbaycan Atabəyləri (1136-1225) dövündə Təbriz şəhəri qaziliyinə təyin olunmuşdur[757]. Ölüm tarixi məlum deyil. XII-XIII əsrlərdə yaşamışdır.

**Əbu Bəkr Marağı**

Əbu Bəkr Marağı Mədinədə Məscidi-Nəbəvinin abadlıq işlərindən məs'ul idi. H. 654-cü ilin ramazan ayının ilk gecəsi (21-22 sentyabr 1256), təravih namazından sonra o, əlindəki çıraqla məscidin şimali-qərb hissəsindəki zirzəmiyə enmiş, lakin ehtiyatsızlıq

---

752 İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 123-124.
753 İBN NÖQTƏ, *Təqyid li-Mərifəti-Ruvat*, s. 285; ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'd-Dübeysi*, s. 373.
754 ZƏHƏBİ, *Siyəru Ə'lamü'n-Nübəla*, C. XX, 591.
755 Muhyəddin Hüseyn Bəğəvinin (öl. 1122) çoxcildli hədis külliyatı. Əbu Bəkr Muhəmməd Bağdadi bu qədər dəqiq məlumat verdiyinə görə ehtimal ki, "Şərhü's-Sünnə"nin həmin nüsxəsini, yəni əllamə Əbu Mənsur Tusinin tələbəsi Əbü'l-Kərəm Təbriziyə oxuduğu nüsxəsini görmüşdü. Çünki əlyazma əsərlərin ilk səhifələrində qiraət və səmə' qeydəlir olur. Yəni həmin nüsxənin nə vaxt kim tərəfindən oxunduğu və dinləndiyi mədrəsələrdə qeyd olunurdu.
756 Bax: səh. ???
757 BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 337.

ucbatından çıraq əlindən düşmüşdü. Bununla da yanğın başlamışdı. Yanğın elə qısa müddət ərzində böyümüşdü ki, insanlar onun qarşısını ala bilməmişdilər. Yanğın tezliklə məscidin tavanını bürümüş və bütün məscid yanıb kül olmuşdu. Belə ki, divarlar və sütunlardan başqa heç nə qalmamışdı. Hətta məscidin qurğuşun lövhələrdən düzəldilmiş dam örtüyü də ərimişdi. Əbu Bəkr Marağinin özü də bu faciədə yanıb ölmüşdü. Yanğın hətta Allah Rəsulunun (ﷺ) məqbərəsinə də sıçramış və məqbərənin damının bir qismi yanmışdı[758]. İbn Kəsir yazır ki, bu hadisə sanki sonrakı illərdə baş verəcək fəlakətləri xəbər vermişdi. Çünki bu hadəsədən təqribən iki il sonra moğollar Bağdadı zəbt etmiş, dəhşətli qırğın törətmiş və şəhəri oda vermişdilər. Əbu Şamə isə öz əsərində həm bu hadisə, həm də Bağdadın başına gələn fəlakət haqqında nə't yazmışdı.

### Ədib Fəxrəddin Əbü'l-Məali Əhməd ibn İsa ibn Əbü'l-Həsən Marağİ

Ədəbiyyatçı və şair idi. Marağanın əsilzadə ailələrindən birinə mənsub idi. Bağdadda yaşamış və yaşadığı dövrün alim və fəzilət sahibi şəxslərindən biri kimi tanınmışdı. Dostu İbn Cükeynanın[759] vəfatından mütəssir olaraq bir nə't yazmışdı. İbnü'l-Fuvati bu nə'ti oxumuş və bir neçə beytini öz əsərində qeyd etmişdir[760].

### Fəxrəddin Əbü'l-Qasım Əhməd ibn Muhəmməd ibn Muhəmməd ibn Həsən Marağİ

Riyaziyyatçı alim idi. Qardaşlarının ən kiçiyi olan Fəxrəddin Əbü'l-Qasım Marağİ gözəl simalı, xoşrəftar, səxavətli, ismətli, yumuşaq xasiyyətli, gözəl nitq qabiliyyətinə malik olan bir şəxs idi. Qardaşları ilə birgə mövlana Rəxidəddin ər-Razinin tələbəsi olmuş, daha sonra mövlana Nəcməddin Əhməd ibnü'l-Bəvvabdan[761] riyaziyyat dərsləri almışdı. Təhsilini başa vurduqdan sonra h. 681-ci ilin şaban ayında (noyabr 1282) Elxani

---

758 YAFİ'İ, *Miratü'l-Cənan*, C. II, s. 542; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIII, s. 338; Şihabəddin Əbu Şamə Əbdürrəhman ibn İsmayıl əl-MƏQDİSİ, *Təracim Ricali'l-Qərneynü's-Sadis və's-Sabi'*, s. 194, Beyrut (trz). Burada göstərdiyimiz mənbələrdən sadəcə Yafi'i ehtiyatsızlıq ucbatından yanğın çıxaran şəxsin adını qeyd etmişdir.

759 Əbu Muhəmməd Həsən ibn Əhməd ibn Cükeyna ət-Tahiri (öl. 1134) Abbasilər dövrünün məşhur şair və ədiblərindən biri olmuşdu.

760 İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 94-95.

761 Nəcməddin Əhməd ibn Əli ibn Əbü'l-Fərəc yaşadığı dövrün məşhur riyaziyyat, həndəsə və astronomiya alimi idi və İbnü'l-Bəvvab əl-Bağdadi adı ilə tanınmışdı. O, Marağaya gəlib burada elmi tədqiqat və tədrislə məşğul olmuşdu. Ehtimal ki, Elxanilər dövründə Marağada Nəsrəddin Tusinin (1274) təşəbbüsü ilə qurulmuş elmi tədqiqat mərkəzində çalışmışdı.

şahzadəsi Arqunun xidmətinə daxil olmuşdu. Arqun xanın hakimiyyəti illərində (1284 - 1291) müxtəlif vəzifələrə təyin olunmuşdu. Bir müddət Bağdad gedərək burada maliyyə müfəttişi olaraq çalışmışdı. Fəxrəddin Əbü'l-Qasım Marağı h. 721-ci ilin zilhiccə ayında (yanvar 1322) Anadoluda, Sivas şəhərində qətlə yetirilmiş və cənazəsi Marağaya gətirilərək burada dəfn edilmişdi[762].

**Əbu Abdullah Hüseyn ibn Cə'fər Marağı**

Hənəfi məzhəbinə mənsub fəqih və mütəkəllim idi. "Təklif fi Füruü'l-Fiqhi'l-Hənəfi", "Hürufü's-Səbə' fi'l-Kəlam" adlı əsərlərin məülləifi olan Əbu Abdullah Hüseyn Marağı h. 389-cu ildə (999) vəfat etmişdi[763].

**Xətib Eynəddin Əbü'l-Fəzl Əhməd ibn Fəzlullah ibn Ömər əs-Sacusani Marağı**

XII-XIII əsrlərdə Azərbaycanın görkəmli fəqih, xətib və katiblərindən biri olmuşdur. İbnü'l-Fuvati onun çox yazı yazdığını, Marağa şəhərinin xətibi olduğunu və onun haqqında öz dostu Səfiyəddin Əbu Muhəmməd əs-Sacusani Marağıdən eşitdiyini qeyd etmişdir[764]. Ölüm tarixi məlum deyil.

**Hafiz Kəmaləddin Əbü'l-Fəzail Əbdülqadir ibnü'l-Qeybi Marağı**

Xəttat, bəstəkar, musiqişünas alim və şair idi. H. 20 zilqədə 754-cü ildə (17 dekabr 1353) ildə Marağada dünyaya gəlmişdi. 4 yaşında məktəbə getmiş, 8 yaşında Qur'ani-Kərimi əzbərləyərək hafiz olmuşdu. 10 yaşında isə qrammatika dərsləri alaraq ərəb dilini öyrənmişdi. O, Azərbaycandakı mədrəsələrdə təhsilini başa vurduqdan sonra gənc yaşlarında istedadlı alim kimi tanınmışdı. Sultan Üveys Cəlayirin (1356-1374) sarayında mülazim[765] kimi işə başlamış, daha sonra sultan Əhməd Cəlayirin (1382-1410) sarayında

---

[762] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 102-103. Əmir Çobanın oğlu Timurtaş (Dəmirdaş) Elxanilərin Diyari-Rum (Anadolu) canişini idi. 1322-ci ildə özünü "Mehdi" elan edərək Elxanilərə qarşı qiyam qaldırmış, Anadolunun şərqindəki bir çox şəhər və qəsəbələri talan edərək dağıltmışdı. Onun bu qiyamı daha sonra yatırılmışdı. Bu hərc-mərclik vaxtı Anadoludakı bir sıra Elxani dövlət məmurları qətlə yetirilmişdilər. Böyük ehtimalla Fəxrəddin Əbü'l-Qasım Marağı də qiyamçılar tərəfindən qətlə yetirilmişi.

[763] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C.I, s. 608, 819; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. I, s. 606.

[764] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1120.

[765] Mülazim-mədrəsəni yeni bitirmiş tələbələrin ilk işi, stajerlik.

məmur olmuşdu. Bu illərdə Təbrizdə və Bağdadda yaşamışdı. H. 795-ci (1393) ildə Bağdadı zəbt edən əmir Teymur hafiz Kəmaləddin Marağini özü ilə Səmərqəndə aparmışdı. Əmir Teymurdan sonra onun oğulları Miranşah və Şahruxun sarayında xidmət edən hafiz Kəmaləddin Marağı h. 837-ci (1434) ildə Əfqanıstanın Herat şəhərində vəba xəstəliyinə yoluxaraq vəfat etmiş və orada dəfn edilmişdi. Hafiz Kəmaləddin Marağı müxtəlif elm sahələrinə dair bir sıra əsərin müəllifi idi. Bunlardan "Camiü'l-Əlhan"ı oğlu Nurəddin Əbdürrəhman üçün yazmışdı. "Məqasidü'l-Əlhan" adlı əsərini 12 ramazan 821-ci ildə (12 oktyabr 1418) yazıb başa çatdırmışdı. Bu əsərin alimin öz dəsti-xətti ilə yazılmış nüsxəsi Tehranda, Astan Qüdse-Rəzəvi kitabxanasında saxlanılır. İstanbuldakı Nuriosmaniyyə kitabxanasında isə alimin "Məqasidü'l-Əlhan fi Talifü'l-Nəğm və'l-Əvzan", "Camiü'l-Əlhan", "Risalə fi Fəvaidü'l-Əşərə", "Şərhu-Ədvar" adlı musiqişünaslığa dair əsərləri mühafizə edilir. Bunlardan sonuncusu tanınmış azərbaycanlı musiqişünas alim Səfiyəddin Əbdülmömin Urməvinin (öl. 1293) musiqiyə dair "Risalətü'l-Ədvar fi Həlli'l-Əvtar" adlı əsərinə yazılmış şərh idi. Hafiz Kəmaləddinin musiqiyə dair digər bir əsəri "Kənzü'l-Əlhan fi İlmü'l-Ədvar" adlanır. Hafiz Kəmaləddin Marağı musiqiyə dair əsərlərini farsca qələmə almışdı. O, həmçinin istedadlı şair idi, türkcə və farsca çox gözəl şe'rlər yazmışdı[766].

**Qazi Sədrəddin Əbu Bəkr Muhəmməd ibn Abdullah ibn Əbdürrəhman Marağı**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Yaşadığı dövrün əyanlarından, fəzilətli və nüfuzlu şəxslərindən biri idi. h. 538-ci ildə (1143) Bağdada getmiş və buradakı mədrəsələrdə təhsil almışdı. Şeyx Əbü'l-Bərəkat İsmayıl ibn Əbi Sə'din tələbəsi olmuş, onun hədis dərslərində iştirak etmişdi. 77 yaşında sonuncu dəfə həcc ziyarətinə getmişdi. Qazi Sədrəddin Marağı həmçinin sərvət sahibi varlı şəxs idi. O, həmişə bahalı libas geyir və öz geyimi ilə fərqlənirdi. Xeyriyyəçiliyi ilə məşhur olmuş qazi Sədrəddin Marağı çox sayıda xeyriyyə qurumları təsis etmiş, xalqın istifadəsi üçün öz əmlakını vəqf etmişdi. Alim h. 570-ci ildə (1175) vəfat etmişdi[767].

---

[766] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 1513; NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. II, s. 777; TƏRBİYƏT, *Danişməndan*, s. 88; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 193

[767] ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'd-Dübeysi*, 33.

**Qazi Muhyəddin Əbu Muhəmməd Həsən ibn Muhəmməd ibn Abdullah Marağі**

Şafi'i məzhəbinə mənsub fəqih idi. O, yuxarıda haqqında bəhs etdiyimiz qazi Sədrəddin Əbu Bəkr Muhəmməd Marağinin oğlu idi. O, özünün mədrəsəsini təsis etmiş və orada şafi'i fiqhini tədris etmişdi. Şair Müəyyinəddin Təntərani qazi Muhyəddin Marağinin şərəfinə qəsidə yazaraq onu mədh etmişdi[768]. Alimin ölüm tarixi məlum deyil. XII-XIII əsrlərdə yaşamışdır.

**Müəyyinəddin Əbu Muhəmməd İsmayıl ibn Muhəmməd ibn İsmayıl ət-Təntərani Marağі**

Şafi'i məzhəbinə mənsub fəqih və ədib idi. Öz dövrünün görkəmli ədib və alimlərindən olan Müəyyinəddin Marağі ərəb və fars ədəbiyyatının, nəzm və nəsrinin nadir bilicilərindən idi. O, marağalı qazi Sədrəddin Əbu Bəkr və onun oğlu qazi Muhyəddin Əbu Muhəmmədin yaxın adamlarından biri idi. Müəyyinəddin Marağі h. 613-cü ilin səfər ayında (iyun 1216) vəfat etmişdi[769].

**Əmir İzzəddin Əbü'l-Haris Arslan-Apa ibn Atabəy ət-Türki Marağі**

XII-XIII əsrlərdə yaşamış azərbaycanlı dövlət xadimi idi. O, ədalətli əmir kimi məşhur olmuşdu. Sərab qazisi şeyx Kəmaləddin Əhməd Marağі onu öz şe'rlərində tərənnüm etmişdi. Əmir İzzəddin Arslan-Apa h. 605-ci (1209) ildə Təbriz yaxınlığındakı Vazrukan adlı yerdə Əhər hakimi Nüsrətəddin Piştəkinlə döyüşdə qətlə yetirilmişdi. Əmir İzzəddin Arslan-Apa Marağadakı "əl-Qazi" mədrəsəsini inşa etdirmişdi. Bu mədrəsənin kitabəsində belə yazılmışdı: "əş-Şafi'i (/) fiqhdə, təbirdə, döyüşdə və gücdə bütün insanların imamıdır. İslamda xilafət Abbasilərə məxsus olduğu kimi, imamət də ona (imam əş-Şafi'iyə (/)-E.N) məxsusdur"[770].

**Katib Eynəddin Əbu Əli Bədəl ibn Əli ibn Abdullah Marağі**

---

768 BÜNYADOV, "Vidnıye Deyateli Azerbaydjana v Soçinenii İbn al-Fuvati", s. 61-67.
769 BÜNYADOV, *həmin məqalə*.
770 BÜNYADOV, *həmin məqalə*.

XI-XII əsrlərdə, Eldənizlərin hakimiyyəti illərində Azərbaycanın dövlət xadimlərindən biri olmuşdur. Marağada katib vəzifəsində işləmişdi. Katib Eynəddin Maraği həmçinin istedadlı şair idi. İbnü'l-Fuvati öz əsərində onun ərəbcə yazdığı qəzllərdən bəzi misraları qeyd etmişdi. Katib Eynəddin Maraği h. 525-ci ildə (1131) Marağada vəfat etmişdi[771].

**Əbu Bəkr Muhəmməd ibn Musa ibn Həbşun Maraği**

Şam vilayətinin əmiri-sahili[772] olan Əbu Bəkr Muhəmməd Maraği həmçinin hədis ravisi idi. O, Dəməşq və Səyda[773] şəhərlərində yaşamışdı. Muhəmməd ibn Hısn ibn Xalid əl-Alusi, Muhəmməd ibn Süfyan ibn Musa əs-Səffar, Muhəmməd ibn Əli ət-Təmimi, Əbu Nəsr Fəth ibn Əfləh Tarsusidən hədis dinləmiş və nəql etmişdi. Əbdülvəhhab əl-Meydani, Əbu Məs'ud Saleh ibn Əhməd əl-Manihi, Əbu Abdullah Hüseyn ibn Cə'fər əl-Cürcani, Əbü'l-Hüseyn ibn Cuməy'i[774] də ondan hədis dinləmiş və nəql etmişdilər. Əbu Bəkr Muhəmməd Maraği h. 362-ci ilin məhərrəm ayında (oktyabr 972) vəfat etmişdir[775]. İbn Əsakir əsərində, nəql silsiləsində Əbu Bəkr Muhəmməd Marağinin də adının olduğu bir neçə hədis qeyd etmişdir. Bunlardan biri də Cabir ibn Abdullahın (ا) adından uydurulmuş, Darəqutni, Zəhəbi kimi mühəddislərin haqqında "hədis deyil", "heç bir şeydir"[776], "mətrukdur" dedikləri[777], aşağıdakı sözdür:

Cabir ibn Abdullah (ا) dedi ki, Allah Rəsulu (ق) buyurdular ki; "(Me'rac gecəsi) cənnətin qapısın üzərində "Lə iləhə illallah, Muhəmməd rəsul Allah" yazıldığını gördüm"[778].

**İmadəddin Əbu Muhəmməd Yunis ibn Muhəmməd ibn Yunis ibn Məs'ud Maraği**

---

[771] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1121-1122.

[772] Şam vilayəti, yəni indiki Suriya, İordaniya, Fələstin, Livan və İsrail dövlətlərinin mövcud olduğu torpaqların, Aralıq dənizi sahillərinin idarəsi və təhlükəsizliyinin təmini ilə məşğul olan hərbi-inzibati idarəçiyə əmiri-sahil deyilirdi.

[773] Səyda-Livan ərazisində, Aralıq dənizi sahilində yerləşən indiki Sidon şəhəri.

[774] Şeyx Əbü'l-Hüseyn Muhəmməd ibn Əhməd ibn Muhəmməd ibn Əhməd ibn Əbdürrəhman ibn Yəhya ibn Cuməy'i əl-Ğəssani əs-Səydavi (917-1012) məşhur mühəddislərdən biri olmuşdur. "əl-Mu'cəm" adlı hədis kitabının müəllifidir.

[775] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LVI, s. 72; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV, s. 241-242.

[776] "Leysə bi-şey"-(heç bir şeydir) hədisin nəql silsiləsindəki 3 və ya 4-cü dərəcədəki ravi haqqında istifadə olunan ifadə. Nəql silsiləsində belə bir ravinin olduğu hədis qəti surətdə qəbul edilmir. Bax: AYDINLI, *Hadis Istılahları Sözlüğü*, s. 89.

[777] ZƏHƏBİ, *Mizanü'l-E'tidal*, C. I, s. 607, C. II, s. 207.

[778] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LVI, s. 72. (رأيت على باب الجنة مكتوبا لا إله إلا الله محمد رسول الله).

XIV əsrdə Azərbaycanın tanınmış qarilərindən idi. Hafiz Cəmaləddin Əbu Bəkr Əhməd ibn Əli əl-Bacəsəri əl-Qəlanisinin tələbəsi olmuş, h. 700-cü ilin məhərrəm ayında (sentyabr 1300) Qur'ani-Kərim təcvidi və qiraətinə dair icazətini (diplomunu) ondan almışdı[779].

**Əbu Əyyub Yəhya ibn Malik əl-Əzdi Marağİ**

Tabiundan[780] olan hədis ravisi idi. Mühəddislər onu əs-siqa, yəni mötəbər hədis ravisi adlandırmışdılar. Abdullah ibn Əmr, Səmurə ibn Cundəb və başqalarından hədis dinləmiş və nəql etmişdi. Qatədə[781] və Sabit ondan hədis dinləmişdilər[782]. Ölüm tarixi məlum deyil. VII-VIII əsrlərdə yaşamışdır.

**Əlaəddin Əli ibn Əhməd ibn Muhəmməd əl-Buxari Marağİ**

Ədib, şair, filoloq və astronom idi. H. 607-ci ildə (1209) Azərbaycana gələrək Marağa şəhərində məskunlaşmışdı. İstedadlı natiq, gözəl xitabət qabiliyyətinə malik idi. Ərəb və fars dillərində yüksək fəsahət və bəlağətlə çıxış edirdi. Bir sıra nəzm və nəsr əsərlərinin müəllifi idi. Bir müddət Marağa rəsədxanasıda da tədqiqatla məşğul olmuşdu. Filosof Nəsirəddin Tusi (öl. 1274) onu elm məcləslərinə dəvət edirdi. H. 687-ci ildə (1288) Marağada vəfat etmişdi[783].

**Şeyx Zeynəddin Əbu Həfs Ömər ibn Həsən ibn Məzyəd ibn Ümeylə ibn Cəmiə' ibn İ'ydan əl-Mizzi Marağİ**

Yaşadığı dövrün müsnid[784] mühəddislərindən idi. H. 18 rəcəb 679-cu ildə[785] (13 noyabr 1280) anadan olmuşdu. Fəxrəddin əl-Buxarinin[786] yanında Tirmizinin "Sünən" və Əbu

---

[779] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 885.
[780] Tabiun-Allah Rəsulunun (ﷺ) səhabələri ilə görüşüb onlardan İslamı öyrənmiş nəsilə deyilir.
[781] İmam Qatədə ibn Diamə əş-Şeybani əl-Bəsri (680-735). Tabiun dövrünün məşhur alimlərindən idi.
[782] ZƏHƏBİ, *Mizanü'l-E'tidal*, C. IV, s. 257; İBNü'l-QEYSƏRANİ, *Ənsabü'l-Müttəfiqə*, s. 47; HİMYƏRİ, *Nisbə ilə'l-Məvazi'*, C. I, s. 586.
[783] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1038.
[784] Müsnid-nəql etdiyi hədisə vaqif olub-olmamağından aslı olmayaraq hədisin mətnini isnadı, yəni ravi silsiləsi ilə birlikdə nəql edən mühəddis.
[785] İbnü'l-Cəzəri onun h. 680-ci ilin şaban ayında (noyabr 1281) anadan olduğunu qeyd etmişdir. Bax, *Qayətü'n-Nihayə*, s. 480.

Davudun "Sünən" adlı hədis külliyatlarını oxumuşdu. Misirdə yaşamış, burada İbn Ümeylə adı ilə tanınmış və tədrislə məşğul olmuşdu. Bu ölkədə ondan hədis dinləyən çox sayıda tələbə var idi. Tirmizinin "Şəmailü'n-Nəbi" və "Sünən"[787], Təbəraninin "Camiü's-Səğir"[788] adlı hədis kitablarındakı hədisləri, o cümlədən Yusif əl-Mizzi və İbnü'z-Zahirinin kitablarındakı hədisləri təxric[789] və təfərrüd[790] edən şeyx Zeynəddin Ömər Marağı bir müddət Dəməşqdə Atabəkiyyə mədrəsəsində hədis dərsləri vermişdi. İbnü'l-Cəzəri şeyx Zeynəddin Ömər Marağinin hədis isnadı elmi ilə yanaşı Qur'ani-Kərim qiraəti və təcvidi sahəsində də tanınmış mütəxəssis olduğunu qeyd etmişdir. Qur'ani-Kərim qiraəti sahəsində o, çox sayıda tələbə yetişdirmişdi. Qiraət dərslərində İbnü'l-İzz əl-Qəlanisinin "İrşad" və "əl-Kifayə"[791], İbn Mehranın "əl-Qayə"[792], İbn Mücahidin "əs-Səb'ə"[793] adlı əsərlərindən istifadə edirdi[794]. Şeyx Zeynəddin Ömər Marağı h. 778-ci ildə (1376) Misirdə vəfat etmişdi[795]. "əl-Mizzi" nisbəsindən onun Dəməşq yaxınlığındakı Mizzə qəsəbəsində doğulub böyüdüyünü təxmin etmək olar. Ehtimal ki, 1341-ci ildə Dəməşqdə vəfat etmiş məşhur hədis alimi Yusif ibn Əbdürrəhman əl-Mizzi ilə görüşmüş və ya onun tələbəsi olmuşdu.

**Şeyx Fəxrəddin Əhməd ibn Yusif ibn Rüstəm ibn Tavan Marağı**

---

786 Mühəddis Fəxrəddin Əbü'l-Həsən Əli ibn Əhməd ibnü'l-Buxari.

787 Əbu İsa Muhəmməd ibn İsa ibn Səvrə ibn Musa ibn Zəhhak TİRMİZİ (824-892). Tirmiz şəhəri Özbəkistan ərazisində, Əfqanıstanla sərhəddə yerləşir. Onun "Sünən" adlı əsəri İslam dünyasında mötəbər 6 hədis kitabından (Kutubi-Sittə) biridir.

788 Süleyman ibn Əhməd ibn Əyyub əş-Şami ət-Təbərani (873-971). Məşhur mühəddislərdən biridir. O, "Camiü's-Səğir" adlı hədis külliyatından başqa hədis elminə dair bir sıra əsərlərin müəllifidir.

789 Təxric-hər hansı bir kitabındakı hədislərin hər birinin ayrı-ayrılıqda istinadlarını, mənbəini müəyyənləşdirmək, əgər varsa digər istinadlarını və mənbələrini göstərməyə deyilir. Daha ətraflı məlumat üçün bax: AYDINLI, *Hadis Istılahları Sözlüğü*, s. 147.

790 Təfərrüd-bu kəlmə də "təxric" kimi hədis elminə aid bir istilahdır. Hər hansı bir hədisi nəql edən şəxslərin sayı (qərib və ya fərd olduğunu) və hədisin səhihliyinin müəyyənləşdirilməsi ilə bağlı termindir. Daha ətraflı məlumat üçün bax: AYDINLI, *həmin əsər*, s. 153.

791 İbnü'l-İzz Muhəmməd ibn Hüsyen ibn Bəndar əl-Vasıti əl-Qəlanisi (1044-1127) məşhur qiraət və təcvid alimlərindən idi. "İrşadü'l-Mübtədi və Təzkirətü'l-Müntəhi" və "Kifayətü'l-Kəbir fi'l-Qiraətü'l-Əşr" onun bu sahədə qələmə aldığı əsərlərdir.

792 Əhməd ibn Hüseyn ibn Mehran Nişapurinin Qur'an qiraət və təcvidinə dair "əl-Qayə fi'l-Qiraə" adlı əsəri.

793 Əhməd ibn Musa ibn Mücahidin (öl. 936) "əs-Səb'ə fi'l-Qiraə" adlı əsəri.

794 İBNü'l-CƏZƏRİ, *Qayətü'n-Nihayə*, s. 480.

795 İBN TAĞRIBİRDİ, *Nücumu'z-Zahirə*, C. III, s. 496; İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 150; NUEYMİ, *Daris fi Tarixi'l-Mədaris*, C. I, s. 104. İbnü'l-Cəzəri alimin h. 778-ci ilin rəbiələvvəl ayının 28-i (15 avqust 1376) vəfat etdiyini və Dəməşqin Mizzə qəsəbəsində dəfn edildiyini qeyd etmişdir. Bax: *Qayətü'n-Nihayə*, s. 480.

Təsəvvüf əhlinə mənsub şeyx idi. Şeyx Fəxrəddin Əhməd Marağadakı ən zəngin daşınmaz əmlak sahibi idi. Sultanlar və əmirlər ona hörmət və ehtiram bəsləyirdilər. O, baş qazi (qaziü'l-quzatü'l-məmalik) Mövlana Nizaməddin Əbü'l-Məkarim Əbdülməlik ibn Muhəmməd ibn Əhməd Marağinin babası idi. Mövlana Nizaməddin Əbü'l-Məkarim Marağı h. 664-cü ildə (1266) anadan olmuşdu[796].

**Hacib Müqərrəbəddin Əbü'l-Müzəffər Yusif ibn Rüstəm ibn Tavan əs-Sitari Marağı**

Azərbaycan Atabəylərinin hakimiyyəti dövründə yaşamış dövlət xadimi idi. Yuxarıda haqqında bəhs etdiyimiz şeyx Fəxrəddin Əhməd Marağı onun oğlu idi. Valilər və hökmdarların yanında böyük hörmət sahibi olan hacib Əbü'l-Müzəffər Yusif Marağinin[797] ölüm tarixi məlum deyil.

**Bədrəddin Davud ibn Gülbək ibn Əli Marağı**

Filosof və mütəfəkkir idi. Xüsusən cədəl və xilaf elmlərində yaşadığı dövrün ən görkəmli alimi idi. Katib Çələbi onun Bədr ət-Təvil, yəni uzun Bədrəddin, ləqəbi ilə tanındığını qeyd etmişdir. Onun ən məşhur əsəri şeyx Rüknəddin Əbu Hamid Muhəmməd ibn Muhəmməd Səmərqəndinin (öl. 1121) məntiq elminə dair "İrşad fi İlmü'l-Xilaf və'l-Cədəl" adlı əsərinə yazdığı şərhdir[798]. Bu əsərin Türkiyədəki yeganə nüsxəsi Manisa İHK-də saxlanılır. İmadəddin ibn Kəsir onun cədəl və xilaf sahəsində böyük mütəxəssis olduğunu qeyd etmiş, lakin buna baxmayaraq dini duyğuları zəif, namaz qılmayan və faydasız işlərlə məşğul olan adam kimi tövsif etmişdi. Səlahəddin Səfədi tanınmış məntiqçi alim əllamə Seydəddin Əbu'r-Ruh İsa əl-Hənəfi Bağdadinin (öl. 1306) Bədrəddin Marağinin tələbələrindən olduğunu qeyd etmişdir[799]. Bədrəddin Davud Marağı h. 12 cəmadiəlaxir 660-cı ildə (3 may 1262) vəfat etmişdi[800].

---

[796] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 111. Nəvəsinin təvəllüd tarixini nəzərə alaraq şeyx Fəxrəddin Əhməd Marağinin Azərbaycan Atabəyləri Dövləti (1136-1225) və Xarəzmşah Cəlaləddinin (öl. 1231) Azərbaycandakı hakimiyyəti illərində yaşadığını, bu dövlətlərə mənsub sultan və əmirlər tərəfindən himayə gördüyünü təxmin etmək olar.

[797] BÜNYADOV, "Vidnıye Deyateli Azerbaydjana v Soçinenii İbn al-Fuvati", s. 61-67.

[798] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 132; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. I, s. 702.

[799] SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. III, s. 714.

[800] İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIII, s. 413; Bədrəddin Mahmud ƏYNİ, *İqdü'l-Cüman fi Tarixi Əhlü'z-Zəman*, s. 89, Qahirə 1987.

**Məryəm bint Kəmaləddin Əbü'l-Fəzl ibn Muhəmməd ibn Əbu Bəkr ibn Hüseyn Maraği**

Mühəddisə idi. Mədinədə yaşamış burada hədis elmlərini öyrənmiş və tədrislə məşğul olmuşdu. Ölüm tarixi məlum deyil. XV-XVI əsrlərdə yaşamışdır[801].

**Ümmü'l-Hüseyn bint Kəmaləddin Əbü'l-Fəzl ibn Muhəmməd ibn Əbu Bəkr ibn Hüseyn Maraği**

Mühəddisə idi. Məryəm Marağinin bacısı olan Ümmü'l-Hüseyn Marağı Mədinədə Şəmsəddin Səxavidən (öl. 1497) hədis dinləmişdi. Ölüm tarixi məlum deyil. XV-XVI əsrlərdə yaşamışdır[802].

**Əbü'l-Fəzl Cə'fər ibn Səqr ibn Səlb Marağı**

Hədis ravisi idi. Yaşadığı dövrün bir sıra tanınmış mühəddislərindən hədis dinləmişdi. Onun hədis dinlədiyi mühəddislərin arasında Muhəmməd ibn Əhməd ibn İsmət ər-Rəmli də var idi. Əbü'l-Fəzl Cə'fər Marağı Misin Fustat şəhərində yaşamış və bu şəhərin cümə camesində hədis dərsləri vermişdi[803]. Ölüm tarixi məlum deyil. IX-X əsrlərdə yaşamışdır. Nəql silsiləsində onun da olduğu hədislərdən biri aşağıdakıdır:

Abdullah ibn Ömər (ا) dedi: Allah Rəsulu (ق) buyurdular ki: "Cümə namazına gələn qüsl alsın"[804].

**Qazi Muhəmməd ibn Yəhya ibn Müslim Marağı**

Hənəfi məzhəbinə mənsub fəqih idi. H. 470-ci ildə (1078) Marağada anadan olmuşdu. Fəzilətli və saleh insan kimi tanınmışdı. Əbu Nəsr Əqtanın imam Qudurinin[805] əsərinə

---

[801] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. III, s. 459.
[802] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. III, s. 469.
[803] ƏBU BƏKR İSFƏHANİ, *Mu'cəm*, C. II, s. 242.
[804] ƏBU BƏKR İSFƏHANİ, *yenə orada*. Bu hədis üçün bax: BUXARİ, *Səhih*, Cümə 3; TİRMİZİ, *Sünən*, Cümə 355/493; NƏSAİ, *Sünən*, Cümə 7/1359. (من أتى الجمعة فليغتسل)
[805] Əbü'l-Hüseyn Əhməd ibn Muhəmməd əl-Quduri (973-1037) hənəfi məzhəbinin məşhur alimlərindən biri və bir sıra əsərlərin müəllifidir. Qjljmj aldığı əsərlərdən biri də "Müxtəsərü'l-Quduri" adlanır. Bu əsərə bir neçə şərh

yazdığı şərhi ən gözəl şəkildə izah və tədris edən alimlərdən idi. H. 563-cü ildə (1168) vəfat etmişdi[806].

**Hafiz Əbü'l-Fəth Muhəmməd ibn Cə'fər ibn Muhəmməd Marağİ**

Hədis hafizi, mühəddis və filoloq idi. O, öz dövrünün ərəb dilinin qrammatikası üzrə tanınmış mütəxəssislərdən idi. Bəlağət və fəsahət sahib olan hafiz Əbü'l-Fəth Muhəmməd Marağİ ərəb dilində mükəmməl nitq qabiliyyətinə malik idi. Bağdadda yaşayırdı. Əbu Cə'fər Əhməd ibn Abdullah ibn Müslim ibn Quteybədən hədis dinləmiş və nəql etmişdi. Qazi Əbü'l-Hüseyn əl-Mühamili h. 371-ci ildə (981) ondan hədis dinləmişdi[807]. Cəmaləddin Qıfti Iraq Büveyhi hökmdarlarından İzzüddövlə Əbu Mənsur Bəxtiyar əd-Deyləminin (966-978) Əbü'l-Fəth Muhəmməd Marağidən dərs aldığını qeyd edir[808]. Ehtimal ki, bu fars mənşəli və şiə məzhəbli hökmdar Əbü'l-Fəth Marağidən ərəb dili və ədəbiyyatı dərsləri almışdı. Əbü'l-Fəth Muhəmməd Marağinin müəllifi olduğu əsərlərdən aşağıdakıların adlarını sadalamaq olar: "Kitabu'l-Bəhcət ələ Misal", "Kitabü'l-Kamil", "Kitabu'l-İstidrak"[809], "Muxtarü'l-Əxbar" və "Kitabü'l-Xəlili"[810]. Bağdadlı İsmayıl paşa alimin h. 371-ci ildə (981) vəfat etdiyini qeyd etmişdir[811].

**Əbü'l-Fəth Muhəmməd ibn Hüseyn Marağİ**

Azərbaycan Qaraqoyunlular dövləti dövründə yaşamış tanınmış mühəddis idi. İbn Həcər Əsqəlaninin "Fəthü'l-Bari"[812] adlı hədis külliyatını "Müxtəsərü'l-Fəthü'l-Bari" adı ilə ixtisar etmişdi. Əbü'l-Fəth Muhəmməd Marağİ h. 759-cu ildə (1455) vəfat etmişdir[813].

---

yazılmışdır. Əbu Nəsr əl-Əqta da bu əsərə "Təshihi-Quduri" adlı bir şərh yazmışdı. Bu əsər mədrəsələrdə hənəfi fiqhinə dair dərsliklərdən biri kimi istifadə olunmuşdu.

[806] İBN ƏBÜ'l-VƏFA, *Cəvahirü'l-Muziyyə*, C. III, s. 397,

[807] Şihabəddin Yaqut ibn Abdullah ər-Rumi əl-HƏMƏVİ, *İrşadü'l-Ərib*, s. 1480, Dəməşq 1980.

[808] QIFTİ, *İnbahu'r-Ruvat*, C. III, s. 87.

[809] İBNÜ'n-NƏDİM, *əl-Fihrist*, s. 88.

[810] BAĞDADLI, *İzahü'l-Məknun*, C. II, s. 190, 284.

[811] *Həmin əsər*, C. II, s. 190.

[812] "Fəthü'l-Bari" İbn Həcər Əsqəlaninin (1449) imam Buxarinin "Səhih" adlı külliyatındakı hədislərə yazdığı şərhdir.

[813] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 262.

**Əbu Abdullah Xıdır ibn Muhəmməd ibn Mütəvəyyih Maraği**

Hədis ravisi idi. Uzun məddət Bağdadda yaşamış, daha sonra Tunisdə getmiş və orada məskunlaşmışdı[814]. Ölüm tarixi məlum deyil. Təqribən IX-X əsrlərdə yaşamışdır.

**Əbü'l-Fütuh Nəsr ibn Muhəmməd ibn İbrahim əl-Azərbaycani Maraği**

Əbu Hamid Qəzzalinin tələbələrindən və onun elmi irsinin davamçılarından idi. Əl-Əqsa məscidini ziyarət etmiş, sonra Dəməşqə gələrək bir müddət burada yaşamışdı. Dəməşqdə dərslər və söhbət məclisləri təşkil edərək Əbu Hamid Qəzzalinin elm və təfəkkür tərzini təbliğ etmişdi. Əbu Səd Əbdülkərim ibn Muhəmməd ibn Mənsur daha sonra Əbu Hamid Qəzzali haqqında ondan eşitdiklərini qələmə almışdı[815]. Ölüm tarixi məlum deyil. Əbu Hamid Qəzzali ilə görüşdüyünə görə onun XI-XII əsrlərdə yaşadığını təxmin etmək olar.

**Əbu Muhəmməd Cə'fər ibn Muhəmməd ibn Haris Maraği**

Yaşadığı dövrün tanınmış mühəddislərindən idi. Hədis dinləmək məqsədiylə səyahətə çıxmış və İslam coğrafiyasının bir çox şəhərlərini gəzmişdi. O, hədis dinləmək üçün Bağdad, Nişapur, Bəsrə, Kufə, Hələb, Mosul və Məkkəyə səyahət etmiş və buradakı mühəddislərdən hədis dinləmişdi. Əbu Muhəmməd Cə'fər Marağİ altımış il boyunca dinlədiyi hədisləri həm əzbərləmiş, həm də qeyd etmişdi. O, doğru sözlü, sadiq və dürüst insan kimi tanınmışdı. Bağdadda Əbu Bəkr Cə'fər ibn Muhəmməd əl-Farabi, Abdullah ibn Muhəmməd ibn Naciyyə, Əbu Bəkr Muhəmməd ibn Yəhya əl-Mərvəzidən, Bəsrədə Əbu Xəlifə əl-Qazi, Zəkəriyyə ibn Yəhya əs-Sacidən, Kufədə Abdullah ibn Muhəmməd ibn Səvvad əl-Haşimidən, Əhvazda Abdullah ibn Əhməd əl-Cəvaliqidən, Tustərdə Əhməd ibn Yəhya ibn Zuheyrdən, Məkkədə Müfəzzəl ibn Quteybədən, Mosulda Əbu Yə'la Əhməd ibn Əli əl-Məvsilidən, Hələbdə Əbü'l-Həsən Əli ibn Əbdülhəmid əl-Qəzairidən (öl. 925) hədis dinləmişdi. Bundan başqa o, Cəmahir ibn Muhəmməd əz-Zəmləkani, Cə'fər ibn Muhəmməd əl-Qəyravani, Mənsur ibn

---

[814] XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. VIII, s. 337.
[815] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. IV5, s. 62.

İsmayıl əl-Fəqih, Əbü'l-Abbas əd-Dəğuli, Əli ibn Əbdan kimi ravilərdən də hədis dinləmişdi. Hafiz Əbu Əli, hafiz Əbu Abdullah əl-Hakim, Əbdürrəhman ibn Muhəmməd əs-Sərrac, hakim Əbu Əhməd ibn Muhəmməd, Əbü'l-Fəzl Abbas ibn Əbkəcur, Əbu Əbdürrəhman əs-Süləmi, Əbu Bəkr əl-Muqri kimi hədis raviləri də ondan hədis dinləmişdilər. Alim h. 26 rəcəb 356-cı ildə (7 iyul 967) vəfat etmişdi[816].

**Əbü'l-Həsən Əli ibn Əhməd ibn Əbdürrəhman Marağî**

Mütəkəllim idi. Şeyx Bədrəddin əl-Faruqi onun tələbəsi olmuşdu. Onun atası Əbü'l-Qasım Əhməd də alim idi və saleh insan kimi tanınmışdı. H. 716-cı ildə (1316) vəfat etmişdi[817].

**Qazi İmadəddin Əbü'l-Fərəc Məs'ud ibn Əbu Muhəmməd ibn Əbdülhəmid Marağî**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Elm, hikmət və fəzilətdə öz dövrünün üstünü idi. Hələ gənc yaşlarından gözəl əxlaqlı alim və mətəfəkkir kimi məşhur olmuşdu. Marağa şəhərinin qaziliyinə təyin olunmuş, fəqət h. 646-cı ildə (1248) gənc yaşlarında vəfat etmişdi. Onun ölümündən sonra bu vəzifəyə Qütbəddin Əbü'l-Xeyr Əhməd Marağî təyin olunmuşdu[818].

**Əbu Bəkr Muhəmməd ibn Əli ibn Əbdülmün'im Marağî**

Şafi'i məzhəbinə mənsub fəqih və hədis ravisi idi. Dəməşqdə Əbu Saleh Əbdüssəməd ibn Əbdürrəhman əl-Həməvidən (öl. 1145) hədis nəql etmişdi. O, bir müddət Dəməşqdəki Bəzzan mədrəsəsində dərs vermişdi. Daha sonra Dəməşqi tərk edib Bağdada getmiş və burada fiqhlə məşğul olmuşdu. Ölüm tarixi məlum deyil. XII əsrdə yaşamışdır[819].

---

[816] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. VI, s. 153; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV, s. 241-242; İBNü'l-ADİM, *Buğyətü't-Tələb*, C. VIII, s. 211.
[817] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 74.
[818] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 863.
[819] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LIV, s. 375.

**Əbu'n-Nəcib Muhəmməd ibn Mənsur ibn Muhəmməd Maraği**

Mühəddis idi və h. 438-ci ildə (1046) Dəməşqdə yaşamış, burada hədis nəql etmişdi. Dəməşqdə Əbu Əli ibn Əbu Nəsr, Rişa ibn Nəzif, Misirdə Əbu Cə'fər Müslüm ibn Əli ibn Həsən əl-Ələvi, Əbü'l-Hüseyn ibn Muhəmməd ibn Hüseyn ibnü't-Tüffaldan hədis dinləmişdi. Nəsr ibn İbrahim, Əbu Muhəmməd Abdullah ibn Hüseyn ən-Nəhhas ondan hədis dinləmiş və nəql etmişdi[820]. Əbu'n-Nəcib Muhəmməd Maraği h. 456-cı ildə (1064) vəfat etmişdir. Onun, nəql silsiləsində olduğu, hədislərdən bir aşağıdakıdır:

Əbu Hureyrə (ا) dedi: Allah Rəsulu (ق) buyurdular ki; "Vəziyyətə görə bir dirhəm sədəqə(nin səvabı) yüz min sədəqə(nin səvabını)ni keçə bilər. Oradakılar "bu necə ola bilər ey Allahın Rəsulu?" dedilər. O, "İki dirhəmi olan şəxs bunlardan birini təsəddüq etsə, digər şəxsin isə sərvəti olsa və oradan yüz min dirhəm infaq etsə (necə olar?)" deyə cavab verdi"[821].

**Fəxrəddin Əbü'l-Leys Muhəmməd ibn Əbdülməlik ibn Əbi'l-Haris ibn Süheym Maraği**

Astronom və mühəndis idi. H. 533-cü ildə (1139) Marağada anadan olmuşdu. O, Nəsrəddin Tusinin Hülagü xana təqdim etdiyi alimlərdən biri idi. Onunla birlikdə Fəxrəddin əl-Əxlati, Müəyyidəddin əl-U'rzi, Nəcməddin əl-Qəzvini də dövrün məşhur alimlərindən idilər. Bu dörd alim astronomiya, həndəsə, riyaziyyat və metodologiya üzrə böyük mütəxəssislər idilər. Fəxrəddin Əbü'l-Leys Maraği öz ixtisas sahəsinə dair bir neçə əsərin müəllifi idi. O, Mövlana Nəcməddin Əhməd ibnü'l-Bəvvabla da görüşür və onunla dostluq edirdi. Fəxrəddin Əbü'l-Leys Maraği saleh insan idi və nəfs tərbiyəsi ilə də məşğul olurdu. O, yuxarıda adı çəkilən alimlərlə bir yerdə böyük ehtimalla Marağada filosof Nəsirəddin Tusinin təşəbbüsü ilə açılmış rəsədxana və elmi mərkəzdə fəaliyyət göstərmişdir. Alim h. 667-ci ilin səfər ayında (oktyabr 1268) vəfat etmişdir[822].

---

820 İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LVI, s. 35; MƏQDİSİ, *Kitabü'l-Müqəffa*, C. VII, s. 300-301.

821 Bu hədis üçün bax: CANAN, *Kutubi-Sitte, Tercüme ve Şerhi*, C. X, s. 21; NƏSAİ, *Sünən*, Zəkat, hədis nr. 2480. (سبق درهم مائة ألف قالوا يا رسول الله وكيف سبق درهم مائة ألف قال رجل له درهمان أخذ أحدهما فتصدق به ورجل له مال كثير فأخذ من عرضه مائة ألف)

822 İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 339.

**Müdərris Fəxrəddin Əbü'l-Fəzl Muhəmməd ibn Muhəmməd Marağİ**

Bağdadda yaşamış və buradakı əs-Siqatiyyə hədis mədrəsəsinin müdərrisi olmuşdu. İbnü'l-Fuvati (öl. 1323) öz müəllimi Tacəddin Əli ibn Əncəbin onun bu vəzifəyə divan tərəfindən təyin olunduğunu qeyd etdiyin bildirmişdir. Ehtimal ki, Tacəddin Əli "divan" deyərkən Abbasi sarayını nəzərdə tutmuşdur. İbnü'l-Fuvati müdərris Fəxrəddin Marağinin zərif, nəzakətli, lütfkar və zarafatcıl insan olduğunu bildirmişdir. H. 652-ci ildə (1254) həcc ziyarətinə getmiş və qayıdarkən yolda xəstələnmişdi. Bu xəstəlik səbəbiylə də h. 653-cü ilin rəbiələvvəl ayında (aprel 1255) vəfat etmişdi[823].

**Əbü'l-Həsən Əli ibn Həskuyə ibn İbrahim Marağİ**

Şafi'i məzhəbinə mənsub fəqih, filoloq və ədəbiyyatşünas idi. Bağdadda şeyxülislam Əbu İshaq Şirazinin tələbəsi olmuş və onun yanında fiqh oxumuşdu. O, Əbu İshaq Şirazi və xətib Əbu Muhəmməd Abdullah ibn Muhəmməd ibn Hezarmərddən hədis dinləmişdi. İbnü's-Səlah Şəhrəzuri belə yazır: "Məndə şeyx Əbu İshaq Şirazinin müəllifi olduğu "əl-Lüma' fi Üsulü'l-Fiqh" adlı kitab var. Bu nüsxəni Əli ibn Həskuyə Marağİ öz dəsti xətti ilə yazmışdır". İbnü's-Səlah həmçinin bu nüsxənin üzərində "466-cı ildə (1074) oxundu" deyə qiraət qeydinin olduğunu bildirmişdi. Bu məlumatdan Əli ibn Həskuyə Marağinin həmin tarixdə tələbə olduğunu təxmin etmək olar[824]. Əbü'l-Həsən Əli Marağİ uzun müddət Bağdadda yaşadıqdan sonra Mərvə köçmüş və vəfatına qədər bu şəhərdə yaşamışdı. Alim h. 516-cı ilin məhərrəm ayında (mart 1122) Mərvdə vəfat etmişdi[825].

**Əbu Abdullah Hüseyn ibn Harun ibn Xüzeymə Marağİ**

Hədis ravisi idi. Nəsa şəhərində yaşamışdı. H. 322-ci ildə (934) həcc ziyarətindən qayıdarkən Bağdada gəlmiş və burada Həsən ibn Süfyan Nəsaidən hədis nəql etmişdi[826]. Xətib Bağdadi onun ölüm tarixini qeyd etməmişdir. X əsrdə yaşamışdır.

---

823 İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 374.
824 ŞƏHRƏZURİ, *Təbəqati'l-Füqəhai'ş-Şafi'iyyə*, C. II, s. 607.
825 SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VII, s. 118; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. II, s. 227; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV, s. 241-242; İBN KƏSİR əl-ƏNSARİ, *Zeyl Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, v. 110a.
826 XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. VIII, s. 146.

**Fələkəddin Əbu Abdullah Şahməlik ibn Abdullah Maraği**

Palazpuş[827] ləqəbi ilə tanınan Fələkəddin Şahməlik Marağa hakimi idi. O, himmət və izzət sahibi, ədalətli və insaflı insan idi. Marağa əhalisinin və rəyyətin qeydinə qalırdı. Fələkəddin Şahməlik çox ibadət edən, zöhd və təqva sahibi şəxs idi. O, təsəvvüf əhli ilə yoldaşlıq edir, onlar kimi dəbdəbədən uzaq, sadə yun libas geyirdi[828]. İbnü'l-Fuvati onun ölüm tarixi barədə məlumat verməmişdir. Ehtimal ki, Fələkəddin Şahməlik Maraği Azərbaycan Atabəyləri dövründə (1136-1225) Marağa və Ruindej hakimi olan Əhmədili ailəsinə mənsub idi. Bizi bu düşüncəyə sövq edən mənbələrdə Marağa hakimi olmuş Fələkəddin adlı bir şəxsin adının çəkilməsidir. İbnü'l-Əsir öz əsərində h. 570-ci ildə (1174-1175) baş vermiş hadisələrdən bəhs edərkən həmin il Eldənizli hökmdarı Muhəmməd Cahan Pəhləvanın (1175-1186) Marağa şəhərini mühasirəyə aldığını, bunun səbəbinin isə bu şəhərin hakimi İbn Ağsunqurun[829] ölümündən sonra onun yerinə varisi Fələkəddinin keçməsi olduğunu qeyd etmişdir[830]. Təəssüf ki, müəllif bu şəxsin adını və künyəsini yazmayaraq sadəcə ləqəbini qeyd etməklə kifayətlənmişdir. Fikrimizcə burada sözü gedən şəxs Fələkəddin Şahməlik Marağidən başqası deyildir.

**Şeyx Şəmsəddin Muhəmməd ibn Muhəmməd ibn Əhməd ibn Əbü'l-Qasım Maraği**

Yaşadığı dövrdə Misirin maliki məzhəbinə mənsub məşhur fəqihlərindən biri olmuşdu. Fiqlə yanaşı ərəb filologiyası, fəraiz, tarix və sosiologiya elmlərini sahəsində də mütəxəssis idi. O, öz dövrünün dərin zəkası və fəziləti ilə tanınmış mütəfəkkirlərdən

[827] İbnü'l-Fuvati bunu [بلاس بوش] (bəlas buş) olaraq qeyd etmişdir ki, bu da özlüyündə ərəb dilində heç bir məna ifadə etmir. Ərəb dilində "p" səsi və hərfi olmadığı üçün qeyr-ərəb dillərdəki, içində "p" səsi olan kəlmələr, "b" ilə yazılır. Bunu nəzərə alaraq bu ifadəni Palazpuş olaraq oxumağı və qeyd etməyi məqsədəuyğun gördük. Palazpuş fars dilində palaz geyən, palaza bürünən mənasını ifadə edir. Onun bu ləqəblə tanınmasının səbəbi isə fikrimizcə təsəvvüf əhlinə mənsub şəxslər kimi yun paltar, yun xələt geyməsi olmuşdur. Məlum olduğu kimi palaz da yundan toxunur.

[828] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 501.

[829] 1134-1174-cü illərdə Marağa və Ruindej hakimi olmuş Nüsrətəddin Arslan-Apa ibn Ağ-Sunqur Əhmədili nəzərdə tutulur. Mərhum akademik Ziya Bünyadov bu şəxsdən sonra yerinə Əlaəddin Körpə Arslanın (1174-1208) keçdiyini qeyd etmişdir. Bax: *Azərbaycan Atabəyləri Dövləti*, s. 237.

[830] *Kamil fi't-Tarix*, C. II, s. 339; BÜNYADOV, *həmin əsər*, s. 72.

biri idi. İbn Seyyidü'n-Nas[831] və onun müasiri alimlərin tələbəsi olmuş, hədis, fiqh və digər elmələr dair bilikləri mənimsəmişdi. Həmçinin Qahirədə sosiologiya və tarix fəlsəfəsi elminin banisi Vəliyəddin Əbdürrəhman ibn Xəldunla (1332-1409) dəfələrlə görüşərək onun tarix və digər ictimai elmlərə dair fikirlərindən faydalanmışdı. Şeyx Şəmsəddin Muhəmməd Maraği fiqh, hədis, tarix, siyasət və sosiologiya sahələrinə dair bir çox kitab və risalə qələmə almışdı. Alim h. 17 zilhiccə 811-ci (3 may 1409) ildə vəfat etmişdi[832].

**Əllamə Burhanəddin Əbü's-Səna Mahmud ibn Abdullah ibn Əbdürrəhman ibn Muhəmməd Maraği**

Şafi'i məzhəbinə mənsub mühəddis idi. H. 605-ci ildə (1209) anadan olmuşdu. Hələb şəhərində qazi Zeynəddindən və Əbü'l-Qasım ibn Rəvahədən hədis dinləmişdi. Burhanəddin Mahmud Maraği abid, zahid, saleh, sidq və vəra' sahibi alim idi. O, həm zahirən yaraşıqlı insan idi, həm də gözəl əxlaqa malik idi. Dəfələrlə qazi və şeyxü'ş-şüyux vəzifələri təklif olunsa da o, imtina etmiş və elm tədrisi ilə məşğul olmuşdu. Dəməşqdə Fələkiyyə və Əkziyyə mədrəsərərinin müdərrisi, həmçinin fətva mərcii idi. Yusif əl-Mizzi[833], Elməddin Birzali[834], Şəmsəddin Zəhəbi və İbnü'l-Əttar ondan hədis dinləmiş və hədis elmlərinə dair bilikləri öyrənmişdilər. H. 681-ci ilin rəbiülaxir ayında (iyul 1282) Dəməşqdə vəfat etmişdi[835]. Şəmsəddin Zəhəbi müəllimi Burhanəddin Mahmud Marağinin həyatı və elmi fəaliyyəti haqqında məlumat verdikdən sonra ondan dinlədiyi hədislərdən birini öz əsərində qeyd etmişdi. Həmin hədisdə Hüzeyfə ibnü'l-Yəman (ا) deyir: Allah Rəsulu (ﷺ) buyurdular ki: "Sizdən əvvəlki ümmətlərdən birinə mənsub bir şəxs ölüb cənnətə daxil olduğu vaxt ondan soruşacaqlar "cənnətə

---

[831] Hafiz Fəthəddin Əbü'l-Fəth Muhəmməd ibn Muhəmməd əl-İşbili (1273-1334) əslən Əndəlusun İşbiliyyə (indiki İspaniyada Sevilla) şəhərindən idi. Yaşadığı dövrün tanınmış mühəddis, fəqih və üsul alimi idi. İbn Seyyidü'n-Nas ləqəbi ilə tanınmışdı. "Sirətü'n-Nəbəviyyə" adlı əsəri məşhurdur.
[832] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. IV, s. 278, 389.
[833] Yusif ibn Əbdürrəhman əl-Mizzi (1256-1341). Tanınmış mühəddis və bioqraf idi.
[834] Elməddin Qasım ibn Muhəmməd əl-Birzali (1267-1338). Tanınmış mühəddis, tarixçi və bioqraf.
[835] Təqiyəddin Əbu Bəkr ibn Əhməd ibn Muhəmməd İBN QAZİ ŞUHBƏ əd-Diməşqi, *Təbəqatü'ş-Şafi'iyyə*, (Nşr. H. Əbdüləlim Xan), C. II, s. 61, Heydərabad 1978; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. V, s. 644; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIII, s. 503; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. II, s. 251; NUEYMİ, *Daris fi Tarixi'l-Mədaris*, C. I, s. 124, 328; İBN TAĞRIBİRDİ, *Nücumu'z-Zahirə*, C. III, s. 58. İbn Tağrıbirdi Burhanəddin Mahmud Marağinin h. 682-ci ilin rəbiəlaxir ayında (1283) vəfat etdiyini qeyd edir.

girmək üçün dünyada hansı əməli işlədin?" O, belə cavab verəcək "Mən insanlara ticarət malı satardım, maddi darlıqda olanlara möhlət verər, vəziyyətləri düzələnə qədər borclarını ödəmələri üçün onları gözləyərdim, nəğd satarkən də alacağımın bir qismini bağışlayardım". Bundan ötəridir ki, uca Allah onu bağışlamışdı"[836].

### Əllamə Tacəddin Əbü'l-Cəvab Musa ibn Muhəmməd ibn Məs'ud əş-Şafi'i Marağı

Şafi'i məzhəbinə mənsub fəqih idi. Kəskin zəka sihibi olan Tacəddin Marağı fiqhlə yanaşı, fiqh üsulu və ərəb filologiyası üzrə tanınmış mütəxəssis idi. H. 669-cu ilin (1271) sonlarından etibarən Dəməşqdəki İqbaliyyə mədrəsəsində müdərrislik etmiş, hədis dərsləri vermişdi. Alim h. 693-cü ildə (1294) vəfat etmiş və Babü's-Səğir qəbristanında dəfn edilmişdi. Vəfat edərkən yaşı 70-i ötmüşdü[837].

### Bəhaəddin Yusif ibn Musa ibn Muhəmməd ibn Məs'ud Marağı

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis olan Bəhaəddin Marağı yuxarıda haqqında bəhs etdiyimiz Tacəddin Musa Marağinin oğlu idi. Səlahəddin Səfədi müasiri olan Yusif Marağini gənc, fəzilətli və dərin zəka sahibi alim kimi tövsif etmişdi. Yusif Marağı həm də istedadlı şair idi. Səlahəddin Səfədi, Elməddin Qasım əl-Birzalinin (öl. 1338) onun haqqında "bizim ustadlarımızdan hədis dinləmişdi" dediyini qeyd edir. Bəhaəddin Yusif Marağı h. 699-cu ilin şəvval ayında (iyun 1300) vəfat etmişdir[838].

### İmam Əbu Turab Əbdülbaqi ibn Yusif ibn Əli ibn Saleh ibn Əbdülməlik ibn Harun ən-Nərizi[839] Marağı

---

836 ZƏHƏBİ, *Mu'cəmü'ş-Şüyux*, C. II, s. 329. [أَنَّ رَجُلا مَاتَ فَدَخَلَ الْجَنَّةَ ، فَقِيلَ لَهُ : مَا كُنْتَ تَعْمَلُ ؟ فَإِمَّا ذَكَرَ وَإِمَّا ذُكِّرَ ، فَقَالَ : إِنِّي كُنْتُ أُبَايِعُ النَّاسَ ، فَكُنْتُ أُنْظِرُ الْمُعْسِرَ ، وَأَتَجَوَّزُ فِي السِّكَّةِ أَوْ فِي النَّقْدِ ، فَغُفِرَ لَه] . Bu hədis üçün həmçinin bax: İBN ƏBDÜLBƏRR, *İsarətü'l-Fəvaid*, s. 463. Həmçinin bu hədisin təxrici üçün bax: http://www.islamweb.net/hadith/hadithServices.php

837 İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 18; NUEYMİ, *Daris fi Tarixi'l-Mədaris*, C. I, 120; ƏYNİ, *İqdü'l-Cüman*, s. 277.

838 SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. V, s. 369-370.

839 Nəriz [نريز]- Urmiyə gölünün cənubi-qərbində qəsəbədir. Muhəmməd ibn Əhməd əl-Əbbadinin (öl. 1066) əsərini təhqiq edən Dr. Əhməd Ömər Haşim və Dr. M. Muhəmməd Əzb imam Əbu Turab Əbdülbaqinin nisbəsini "əl-Marağı əl-Bərbəri" kimi qeyd etmişdilər. Bax: *Zeyl Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, s. 41, Qahirə (trz). Bu xətaya əl-Əbbadinin əsərinin əlyazma nüsxəsini təqhiq edib nəşrə hazırlayakan "ən-Nərizi"ni [النريزي] "əl-Bərbəri" [البربري] kimi oxumalarından irəli gəlmişdir. Belə bir xətanın meydana gəlməsi isə ərəb orfoqrafiyasının xüsusiyyətlərindən irəli gəlir. Görünür müstənsix əlyazmada hərflərin nöqtələnməsi işinə lazımi diqqəti göstərməmişdir. Təhqiqatçıları isə

Şafi'i məzhəbinə mənsub mühəddis və fəqih idi. Fəzilət, gözəl əxlaq sahibi, xoşrəftar insan olan imam **Ə**bu Turab **Ə**bdülbaqi Marağİ h. 401-ci ildə (1011) Marağada dünyaya gəlmiş, uzun müddət Nişapurda yaşamışdı. Daha sonra Bağdada getmiş və burada Qazi Əbu Təyyib ət-Təbərinin tələbəsi olmuş, ondan fiqh elmini öyrənmiş və icazətnaməsini almışdı. Daha sonra Nişapura qayıtmış və bu şəhərin müftisi olmuşdu. Bağdadda Əbu Əli Həsən ibn Əhməd Şazan əl-Bəzzaz, Əbu Abdullah ibnü'l-Mühamili Bağdadi, Əbü'l-Qasım Əbdülməlik ibn Buşran Bağdadidən hədis dinləmişdi. Nişapurda Əbu Səd Ömər in Əli Daməğani, Daməğanda[840] Əbü'l-Qasım Əbdülkərim ibn Muhəmməd ibn Mənsur, Mərvdə Əbu Həfs Ömər ibn Muhəmməd əl-Fərğuli, Nəvqanda[841] Əbu Sə'd Muhəmməd ibn Əbü'l-Abbas əl-Xəlili, Əbu Bəkr Muhəmməd ibn Əhməd, İsfəhanda Əbü'l-Qasım İsmayıl ibn Muhəmməd imam Əbu Turab Əbdülbaqi Marağidən hədis nəql etmişdilər. Alim 492-ci ilin zilqədə ayında (oktyabr 1099) vəfat etmişdi[842].

### Hafiz Əhməd ibn Osman ən-Nərizi Marağİ

Yaşadığı dövrün tanınmış mühəddislərindən, hədis hafizlərindən biri idi. O, Əhməd ibnü'l-Heysəm əş-Şə'rani və Yəhya ibn Əmr ibn Fəzlan ət-Tənuxi kimi dövrün məşhur mühəddislərindən hədis dinləmiş və nəql etmişdi[843]. Ərəb şairi Vəlid ibn Übeyd əl-Bihtəri (öl. 898) onun şanına şe'r yazaraq mədh etmişdir. Alimin ölüm tarixi məlum deyil, təqribən IX əsrdə yaşamışdır.

---

digər təbəqat və bioqrafiya kitabaları ilə müqayisə etməyə ehtiyac duymamışdırlar. Yaqut əl-Həməvi isə Nəriz haqqında məlumat verərkən bu qəsəbənin Ərdəbilin bəldələrindən biri olduğunu qeyd etmişdir. (*Mu'cəm*, C. VI, s. 429). Belə görünür ki, Yaqut əl-Həməvi yanılmışdır. Çünki Nəriz qəsəbəsi Urmiyə gölünün cənubunda yerləşir və Marağaya daha yaxındır. Bundan başqa bəzi tədqiqatçılar Nəriz qəsəbəsi ilə Şiraz yaxınlığındakı Neyriz [نيريز] qəsəbəsini qarışdırırlar. Halbuki bunlar ayrı-ayrı yaşayış məntəqələridir. Nəriz və Neyriz haqqında bax: İBNü'l-ƏSİR, *Lübab*, C. III, s. 306, 340.

840 Daməğan-İranın şimalında, Xəzər dənizinin cənubi-şərqində yerləşən şəhər.

841 Nəvqan- Xorasanın qədim şəhərlərindən biri idi. İranın şimali-şərqində, Məşhəd şəhəri ətrafında yerləşirdi.

842 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV, s. 241-242; SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, c.5, s. 59; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. III, s. 441; YAFİ'İ, *Miratü'l-Cənan*, C. II, s. 195; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. II, s. 223; İBN TAĞRIBİRDİ, *Nücumu'z-Zahirə*, C. II, s. 214; ANONİM, *Mu'cəmü'ş-Şüyux minə'r-Rical və'n-Nisa*, v. 3b-4a, **KSU** Library, Nr. 3065; İBN ƏBÜ'l-VƏFA, *Cəvahirü'l-Muziyyə*, C. II, s. 356-357. İbn Əbü'l-Vəfa alimin h. 491-ci ildə (1098) vəfat etdiyini qeyd etmişdir. Digər tərəfdən sadəcə bu müəllif, Əbu Turab Əbdülbaqi Marağini hənəfi məzhəbinə mənsub alim kimi təqdim etmişdir. Digər mənbələr isə onun şafi'i məzhəbinə mənsub mühəddis olduğunu yazırlar.

843 YAQUT əl-HƏMƏVİ, *Mu'cəm*, C. VI, s. 429.

**Şeyx Kəmaləddin Əbü'l-Qasım Ömər ibn İlyas ibn Yusif Maraği**

Mühəddis idi. H. 643-cü ildə (1245) Azərbaycanda anadan olmuşdu. O, Buxarinin "Səhih" adlı hədis külliyatını şeyx İzzəddin əl-Hərraninin, Tirmizinin "Sünən" adlı hədis külliyatını isə Muhəmməd ibn Tərcəmin yanında oxumuşdu. Təbriz qazisi Nasirəddin Bəyzavinin yanında onun müəllifi olduğu "Minhəcü'l-Ğayə" adlı əsəri oxumuşdu. Azərbaycanda qalıb burada tədris və elmi fəaliyyətlə məşğul olan alim h. 680-ci illərdə (1281), ehtimal ki, Elxanilərin hakimiyyəti dövründə moğol zülmü səbəbiylə meydana gələn dəhşətli fəlakətlər səbəbiylə, vətəninin tərk edərək Dəməşqə getmişdi. Təqribən 65 yaşından sonra Misirə getmiş, 15 il orada yaşamışdı. Yaşı 80-i ötdüyü vaxt Qüdsə gəlmiş və 3 il burada yaşayıb əl-Əqsa məscidində ibadətlə məşğul olmuşdu. H. 729-cu ildə (1329) isə yenidən Dəməşqə getmişdi. Şam vilayəti və Misirdə olduğu vaxtlarda da tədrislə məşğul olmuşdu. Məşhur alimlərdən Şəmsəddin Zəhəbi (öl. 1347) onun tələbəsi olmuşdu. Həmçinin Nəsrəddin Tusi (öl. 1274) də Azərbaycanda ikən onun dərslərini dinləmişdi. Alim 80 yaşlarında Dəməşqdə vəfat etmişdi[844].

**Fəxrü'l-Quzat Əbu Cabir Əbdülhəmid ibn Muhəmməd ibn Ömər Maraği**

Şafi'i məzhəbinə mənsub müctəhid alim, fəqih idi. İbnü'l-Fuvati yazır: "mən onun qələmə aldığı "Mənaqibü'l-İmamü'ş-Şafi'i"[845] adlı əsəri gördüm. Bu əsərdə belə bir hikmətli söz yazılmışdı"[846]:

الكذاب لا يفلح ابداً و الحسود لا يموت الا كمدا

"əl-Kəzzəb lə yəfləh əbədən, əl-Həsud lə yəmut əkmədən"

"Yalançı əbədiyyən iflah olmaz (yalanı tərk etməz), paxıl da qəmsiz ölməz"

Təəssüf ki, İbnü'l-Fuvati alimin ölüm tarixi və ya yaşadığı dövr haqqında heç bir məlumat verməmişdir. Ehtimal ki, Fəxrü'l-Quzat Maraği Azərbaycan Atabəyləri dövründə, XII-XIII əsrlərdə yaşamışdır.

**Şeyx Təqiyəddin Muhəmməd ibn Ömər ibn İlyas Maraği**

---

[844] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 148.
[845] İmam Muhəmməd ibn İdris əş-Şafi'inin (767-819) həyat hekayəsi.
[846] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 205.

Şafi'i məzhəbinə mənsub mühəddis idi. H. 674-cü ilin zilhiccə ayında (may 1276) Qüdsdə anadan olmuş, bu şəhərdə böyümüşdü. Zeynəb bint Şəkurun tələbəsi olmuş, ondan hədis dinləmişdi. Dəməşqdə Atabəkiyyə mədrəsəsinin müdərrisi idi. H. 761-ci ilin rəbiələvvəl ayında (fevral 1360) vəfat etmişdi[847].

**Qazi Səfiyəddin Əbü's-Səfa Xəlil ibn Əbu Bəkr ibn Muhəmməd Sədiq Marağî**

Hənbəli məzhəbinə mənsub müsnid mühəddis, fəqih və qari idi. Təvəllüd tarixi h. 590-cı (1194-1204) illərə təsadüf edir[848]. O, İbnü'l-Hərastani və İbn Məlaibdən hədis dinləmiş, Təqiyəddin ibn Masəveyhdən Qur'ani-Kərim qiraət və təcvidini öyrənmiş, Müvəffəqəddin Dəməşqi və Seyf əl-Amidinin[849] yanında fiqh elminə yiyələnmişdi. Daha sonra Qahirədə qazi müavini vəzifəsinə təyin olunmuşdu. Səfiyəddin Xəlil Marağî çoxyönlü alim idi. O, həmçinin xilaf (müqayisəli hüquq) və tibb elmləri ilə də məşğul olmuşdu. Onun yetirmələri arasından bir çox məşhur alim çıxmışdır. Bunlardan İbnü'z-Zahiri, hafiz Yusif əl-Mizzi, Əbu Həyyan əl-Əndəlusi, hafiz Qütbəddin Əbdülkərim ibn Münir əl-Hələbi, Bədrəddin Muhəmməd ibnü'l-Cəvhəri, şeyx Əbu Bəkr ibnü'l-Cə'bəri və Əbdülkərim əl-Məzkurun adlarını sadalamaq olar. Alim h. 17 zilqədə 685-ci ildə (3 yanvar 1287) Qahirədə vəfat etmiş və Məqabiri-Babu'n-Nəsrdə dəfn edilmişdi[850].

**Şərəfəddin Muhəmməd ibn Xəlil ibn Əbu Bəkr ibn Muhəmməd Marağî**

Səfiyəddin Əbü's-Səfa Xəlil Marağînin oğlu idi. Atasından və başqa alimlərdən hədis dinləmiş, hədis elmlərinə dair biliklərə yiyələnmişdi. Mühəddis olan Şərəfəddin Muhəmməd Marağî həm də Dəməşqdəki Səlahiyyə xanəgahının müəzzini idi[851]. Ölüm tarixi məlum deyil. XIII-XIV əsrlərdə yaşamışdır.

---

847 İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 387; NUEYMİ, *Daris fi Tarixi'l-Mədaris*, C. I, 105.

848 Cəlaləddin Əbdürrəhman ibn Əbu Bəkr SÜYUTİ, *Hüsnü'l-Mühazirə fi Əxbari-Müluk Misr və'l-Qahirə*, s. 272, Beyrut 1997; İBNü'l-CƏZƏRİ, *Qayətü'n-Nihayə*, s. 224.

849 Seyfəddin Əbü'l-Həsən Əli ibn Əbu Əli ibn Muhəmməd ibn Salim Amidi (öl. 1234) hənbəli məzhəbinə mənsub fəqih idi. Həmçinin hədis, kəlam və tibb alimi idi. H. 551-ci ildə (1156) Türkiyənin Diyarbəkir (Amid) şəhərində anadan olmuşdu. Müxtəlif elm sahələrinə aid 30-a yaxın əsərin müəllifidir.

850 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. V, s. 653; İBNü'l-CƏZƏRİ, *Qayətü'n-Nihayə*, s. 224; Şəmsəddin Əbu Abdullah Muhəmməd ibn Əhməd ZƏHƏBİ, *Mə'rifəti'l-Qurrai'l-Kibar*, s. 132, Qahirə 1967.

851 İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 290.

**Qazi Zeynəddin Əbu Bəkr ibn Hüseyn ibn Ömər ibn Muhəmməd ibn Yunis ibn Əbi Fəxr Əbdürrəhman ibn Nəcməddin əl-Osmani Marağı**

Şafi'i məzhəbinə mənsub fəqih idi. H. 728-ci ildə (1328) anadan olmuşdu. O, bir çox alimdən dərs almış və hədis dinləmişdi. Həmçinin Əbü'l-Abbas ibnü'-Şıhnənin tələbəsi olmuş, icazətini (diplom) ondan almışdı. Hafiz Yusif əl-Mizzi, Elməddin əl-Birzali kimi hədis alimlərinin tələbəsi olmuş, o cümlədən Şam vilayətinin Dəməşq, Həma və Hələb şəhərini gəzərək buradakı alimlərdən dərs almışdı. Şeyx Təqiyəddin Sübki[852], Moğultay[853] və şeyx Şəmsəddin Əbü'l-Məali Muhəmməd ibn Əhməd ibnü'l-Ləbandan hədis dinləmiş və hədis elmlərinə dair bilikləri öyrənmişdi. O, həmçinin şeyx Zeynəddin Əbu Hamid Muhəmməd ibn Miskin əl-Misrinin (öl. 1348) yanında "ət-Tənqih"i[854], şeyx Cəmaləddin Əbdürrəhim əl-İsnainin yanda isə "əl-Minhəc"i[855] oxumuş, onlardan fiqh və fiqh üsulu elmlərini öyrənmişdi. Təhsilini başa vurduqdan sonra Mədinəyə getmiş və təqribən bir il burada mücavir olaraq qalmışdı. Daha sonra Qahirəyə qayıtmış və burada tədqiqat və tədrislə məşğul olmuşdu. Zeynəddin Əbu Bəkr Marağı h. 809-cu ildə (1406) Mədinə şəhəri qaziliyinə təyin olunmuşdu. O, burada özünün bir sıra əsərlərini qələmə almışdı. Qazi Zeynəddin Əbu Bəkr əl-Osmani Marağı, Ömər ibn Şəbbənin (öl. 262/876) müəllifi oluğu "Tarixu-Mədinə" əsərini ixtisar etmiş, Muhyəddin Yəhya Nəvəvinin "Minhəcü'l-Fıqhi" adlı əsərinə isə şərh yazmışdı. "Təhqiqü'n-Nüsrə bi-Təlxis Məalim Darü'l-Hicrə" adlı əsər də onun qələmindən çıxmışdı[856]. Bağdadlı İsmayıl paşa Zeynəddin Əbu Bəkr Marağının "Mürşidü'n-Nasik ilə Mə'rifəti'l-Mənasik" adlı əsərinin, yuxarıda qeyd etdiyimiz, "Tarixu-Mədinə"nin müxtəsəri olduğunu bildirmişdir. İsmayıl paşa və Ömər Rza alimin "Vafi bi-Təkmilətü'l-Kafi" adlı bir əsərin də müəllifi olduğunu qeyd etmişdirlər[857]. Zeynəddin

---

[852] Təqiyəddin Sübki-məşhur fəqih, tarixçi və bioqraf alim Tacəddin Əbdülvəhhab Sübkinin (1327-1370) böyük qardaşı idi.

[853] Moğultay ibn Qılınc ibn Abdullah əl-Bəqraci (1291-1361). Məşhur mühəddis və tarixçi. Atası Anadolu türklərindən idi və Misir Məmlüklü ordusunun zabiti olmuşdu.

[854] "Tənqihü'l-Füsul fi Üsul"-Fəxrəddin Razinin fiqh üsuluna dair əseridir.

[855] "Minhəcü'l-Vüsul ilə İlmə'l-Üsul" Təbriz qazisi Nasirəddin Abdullah ibn Ömər əl-Bəyzavinin fiqh üsuluna dair əsəridir.

[856] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 494; ZİRİKLİ, *Ə'lam*, C. II, s. 87. Katib Çələbi və Xeyrəddin Zirikli qazi Zeynəddin Marağının h. 816-cı ildə (1414) vəfat etdiyini qeyd etmişdirlər.

[857] BAĞDADLI, *İzahü'l-Məknun*, C. II, s. 298, 450; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. I, s. 437.

Əbu Bəkr Marağİ Mədinə şəhərinin qazisi ikən Allah Rəsulunun (ﷺ) məqbərəsinin təmiri üçün təşəbbüs göstərmiş və bu işin təşkilatçılarından biri olmuşdur. Daha sonra o, Mədinə qaziliyi vəzifəsindən azad edilmişdi. Alim h. 815-ci ilin zilhiccə ayında (mart 1413) Mədinə şəhərində vəfat etmişdi[858].

**Əllamə Şərəfəddin Əbü'l-Fəth Muhəmməd ibn Əbu Bəkr ibn Hüseyn ibn Ömər əl-Osmani Marağİ**

Şafi'i məzhəbinə mənsub mühəddis və fəqih idi. H. 775-ci ilin axırlarnda (1374) Mədinə şəhərində dünyaya gəlmişdi. Mədinə qazisi Zeynəddin Əbu Bəkr əl-Osmani Marağinin (öl. 1413) oğlu idi. Əllamə Şərəfəddin Muhəmməd atasından, şeyx Siracəddin əl-Bəlqini, şeyx Kəmaləddin əl-Dumeyri kimi alimlərdən fiqh və hədis dərsləri almışdı. Əllamə Şərəfəddin Muhəmməd "Müxtəsəru Fəthü'l-Bari"[859], "Şərhü'l-Minhəc" kimi əsərlərin müəllifi idi. Əllamə Şərəfəddin Muhəmməd ahıl yaşlarında insanlarla ünsiyyətdən uzaqlaşmış, uzlət həyatı yaşayaraq evindən nadir hallarda çıxmışdı. Alim h. 859-cu ilin məhərrəm ayında (1455) Mədinədə vəfat etmişdi[860].

**Şeyx Zeynəddin Əhməd ibn Əbu Bəkr ibn Hüseyn ibn Ömər əl-Osmani Marağİ**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Mədinədə, alim ailəsində dünyaya gəlmişdi. Atası qazi Zeynəddin Əbu Bəkr əl-Osmani Marağİ (öl. 1413) və qardaşı əllamə Şərəfəddin Əbü'l-Fəth Muhəmməd ibn Əbu Bəkr əl-Osmani Marağİ də fiqh və hədis alimi idilər. Şəmsəddin Səxavi əllamə Şərəfəddin Əbü'l-Fəth Muhəmməd Marağinin onun müəllimlərindən biri olduğunu və "zənnimcə Zeynəddin Əhməd yaşca böyük idi" deyə qeyd etmişdir. Zeynəddin Əhməd Marağİ atasının və şeyx Süleyman ibn Əhməd əl-

---

[858] MƏQRİZİ, *Dürərü'l-Uqud*, C. I, s. 164; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VII, s. 764.

[859] "Fəthü'l-Bari"-mühəddis, tarixçi və bioqraf Şihabəddin Əhməd ibn Həcər Əsqəlaninin (öl. 1449) qələmə aldığı hədis elminə dair əsərdir. Bu əsər imam Buxarinin "Səhih" adlı hədis külliyatının şərhidir.

[860] SÜYUTİ, *Nəzmü'l-İqyan*, s. 112. Əllamə Şəmsəddin Muhəmməd Marağinin ölüm tarixinin doğruluğuna dair tərəddüdüm var. Belə ki, onun bioqrafiyasını yazan "Nəzmü'l-İqyan" müəllifi Cəlaləddin Əbdürrəhman Süyutinin özü h. 855-ci ildə (1451) ölmüşdür. Yəni müəllifin özündən sonra ölmüş bir şəxsin ölüm tarixini qeyd etməsi mümkün deyil. Bu nəşr vaxtı baş vermiş texniki xətadan qaynaqlana bilər. Cəlaləddin Süyutinin ölümündən sonra əsərində düzəlişlər edilməsi ehtimalı bir o qədər də mümkün görünmür. Çünki aşağıda gördüyümüz kimi əllamə Şəmsəddinin qardaşı şeyx Nasirəddin Muhəmməd Marağinin ölüm tarixi qeyd olunmamışdır. Demək ki, Cəlaləddin Süyuti vəfat edərkən bu şəxs hələ həyatda idi. Yəni əsərə düzəliş edən olubsa şeyx Nasirəddinin də ölüm tarixini qeyd etməyi unutmamalı idi. Buna görə də əllamə Şəmsəddin Marağİ böyük ehtimalla "Nəzmü'l-İqyan" müəllifi Cəlaləddin Əbdürrəhman Süyutidən əvvəl vəfat etmişdi.

İraqi və İbn Hatim əl-Heysəminin tələbəsi olmuşdu[861]. Ölüm tarixi məlum deyil. XV əsrdə yaşamışdır.

**Şeyx Nasirəddin Əbü'l-Fərəc Muhəmməd ibn Əbu Bəkr ibn Hüseyn ibn Ömər əl-Osmani Maraği**

Şafi'i məzhəbinə mənsub mühəddis idi. Qazi Zeynəddin Marağinin oğlu, əllamə Şəmsəddin Muhəmməd Marağı və şeyx Zeynəddin Əhməd Marağinin kiçik qardaşı idi. Atasından və Mədinənin digər tanınmış alimləridən dərs almışdı[862]. Ölüm tarixi məlum deyil. XIV-XV əsrlərdə yaşamışdır.

**Ümmü'l-Hüseyn Fatimə bint Cəmaləddin Əbü'l-Yəman Muhəmməd ibn Əbu Bəkr ibn Hüseyn Marağı**

Mühəddisə idi. Alim ailəsində dünyaya gəlmiş Ümmü'l-Hüseyn Fatimə Marağı fəqih Zeynəddin Əhməd ibn Əbu Bəkr əl-Osmani Marağinin həyat yoldaşı idi. Atası şeyx Cəmaləddin Əbü'l-Yəman Muhəmməd Marağı yaşadığı dövrün tanınmış şafi'i fəqih və mühəddislərindən biri idi. Fatimə Marağı atasından hədis və fiqh dərsləri almışdı. Əmisi oğlu şeyx Muhəmməd ibn Əbu'r-Rəcc Marağidən də Qur'ani-Kərim qiraət və təcvid qaydalarını öyrənmişdi. Hədis dərsləri vermişdi. Fatimə Marağı h. 878-ci ildə (1473) vəfat etmişdi[863].

**Zeynəddin Muhəmməd ibn Əbu Bəkr ibn Muhəmməd ibn Əbu Bəkr ibn Hüseyn ibn Ömər əl-Osmani Marağı**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. Əllamə Şərəfəddin Əbü'l-Fəth Muhəmməd Marağinin nəvəsi idi. H. 858-ci ildə (1454) anadan olmuşdu. Ailəsi Mədinədə yaşamış və o, uşaq yaşlarında atasını itirmişdi. Atasının vəfatından sonra onun təlim və tərbiyəsi ilə babası və nənəsi Fatimə bint Cəmaləddin Əbü'l-Yəmən Muhəmməd Marağı məşğul olmuşdular. Gənc yaşlarında Hindistana getmiş və h. 889-

---

861 SƏXAVİ, *Zəvu'l-Lami'*, C. I, s. 162.
862 SÜYUTİ, *Nəzmü'l-İqyan*, s. 112.
863 SƏXAVİ, *Zəvu'l-Lami'*, C. V, s. 446.

ci ilə qədər (1484) orara yaşamış və təhsil almışdı. Daha sonra Anadoluya getmiş və h. 894-cü ildə (1489) vəfat edənə qədər orada yaşamışdı[864].

**Ümmü't-Təyyib Ayşə bint Əbu Bəkr ibn Hüseyn ibn Ömər əl-Osmani Marağı**

Mühəddisə idi. Qazi Zeynəddin Əbu Bəkr əl-Osmani Marağinin (öl. 1413) qızı, fəqih Zeynəddin Əhməd, əllamə Şərəfəddin Muhəmməd və şeyx Nasirəddin Muhəmmədin bacısı idi. Əvvəlcə atasından sonra isə h. 767-ci ildə (1366) şeyx İzzəddin ibn Cəmaədən hədis dərsləri almış, onun yanında imam Buxarinin "Səhih"ini oxumuşdu. Daha sonra şeyx Səlahəddin ibn Əbi Əmr, İbn Ümeylə, İbnü'l-Həbəl, Bəhaəddin ibn Xəlil və əl-Hərravi kimi hədis alimlərinin dərslərində iştirak etmişdi. Təhsilini bitirdikdən sonra hədis nəql etmiş, onun dərslərini çox sayıda tələbə dinləmişdi. Bunlardan biri də şeyx Təqiyyəddin ibn Fəhd idi. Ölüm tarixi məlum deyil. XIV-XV əsrlərdə yaşamışdır[865].

**Sədrəddin Muhəmməd ibn Davud ibn Həsən Marağı**

Astronom və mütəkəllim idi. İbn Yunisin[866] astronomiyaya dair "Müxtəsəru't-Tənbih" adlı əsərinə şərh yazmışdı[867]. Ölüm tarixini və yaşadığı dövrü müəyyən etmək mümkün olmamışdır.

**Şəmsəddin Muhəmməd ibn Daniyal ibn Yusif Marağı**

Misirin tanınmış ədiblərindən və münşilərindən biri idi. Təsəvvüf əhlindən idi. Misirdə yaşamış, Əmir Saların[868] yaxın adamlarından biri olmuşdu. H. 12 cəmadiəlaxir 710-cu ildə (5 noyabr 1310) ölmüşdü[869].

---

[864] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. III, s. 485.
[865] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. V, s. 446.
[866] Əbü'l-Həsən Əli ibn Əhməd ibn Yunis əs-Sədəfi (950-1009) misirli məşhur astronom. Astronomiyaya dair bir sıra əsərin müəllifi olmuşdur. Onun günəş və ay tutulmalarına dair hazırladığı dəqiq cədvəl ölümündən sonra uzun illər istifadə olunmuşur.
[867] SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. IX, s. 98.
[868] Misir Məmlüklülərinin sərkərdələrindən olan Əmir Salar moğolların məğlub edildiyi Mərcü's-Səfər (20 aprel 1303) döyüşünün qəhrəmanlarından idi.
[869] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 293.

**Şərəfəddin Əli ibn Əbdülqadir Maraği**

Kəlam alimi idi. Azərbaycanda təhsil almışdı. O, həmçinin fiqh, üsul, ərəb dili, astronomiya və tibb elmləri ilə də məşğul olmuşdu. Şərəfəddin Əli Marağı mö'təzilə məzhəbinə meyl etmiş, "Mənahic fi'l-Üsul" və "Kəşşaf" adlı əsərləri dərindən öyrənmişdi. Lakin daha sonra mö'təzili fikirlərindən imtina etmiş və tövbə edərək təsəvvüfə meyl etmişdi. O, bir müddət Dəməşqdəki Sümeysatiyyə xanəgahında qalmış, daha sonra Xanəgahi-Xatuna köçərək burada ibadətlə məşğul olaraq ömrünü başa vurmuşdu. Təqiyəddin ibn Mufəlləh və Nəcməddin ibn Həcci onun tələbəsi olmuşdular. Alim h. 788-ci ilin rəbiülaxir ayında (may 1386) 60 yaşında vəfat etmişdi[870].

**Şərəfşah ibn Məlikdad əş-Şərif əl-Abbasi Marağı**

Bağdadda, Nizamiyyə mədrəsəsində təhsil almışdı. Hələ tələbəlik illərində parlaq zəkası və idrakı ilə öz üstünlüyünü sübut etmişdi. Məzun olandan sonra məşhur fəqihlərdən biri kimi tanınmışdı. Fiqhlə yanaşı məntiq elmi sahəsində də özünün dərin biliyi ilə seçilən Şərəfşah Marağı dialektik məsələlərə dair bir sıra əsərlərin müəllifi idi. Alim h. 543-cü ildə (1148) Nişapurda vəfat etmişdi[871].

**Şeyx Şihabəddin Əhməd ibn Muhəmməd ibn İbrahim ər-Rumi Marağı**

Hənəfi məzhəbinə mənsub fəqih idi. Dəməşqdə Muiniyyə və Xatuniyyə mədrəsələrinin müdərrisi olan[872] şeyx Şihabəddin Əhməd Marağı əl-Əməvi camesində hənəfi camaatının imamlığını da icra edirdi. Şeyx Şəhabəddin Əhməd Marağı həm də məşhur qari idi, çox gözəl və şirin səslə Qur'an oxuyardı. Şam vilayətinin səltənət naibi əmir Cəmaləddin Əfrəm Ağquş[873] şeyx Şihabəddin Əhməd Marağıyə böyük hörmət bəsləyir

---

[870] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VI, s. 756.
[871] İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. I, s. 75.
[872] NUEYMİ, *Daris fi Tarixi'l-Mədaris*, C. I, 113. Muiniyyə mədrəsəsi Hələb atabəylərindən Nurəddin Muhmud Zəngi (1146-1174) tərəfinən 1160-cı, Xatuniyyə mədrəsəsi isə onun arvadı Xatun bint Muinəddin Azər tərəfindən 1185-ci ildə inşa edilib istifadəyə verilmişdi. Daha ətraflı məlumat üçün bax: NUEYMİ, *həmin əsər*, C. I, s. 507, 588, C. II, s. 149.
[873] Mənşəcə qıpçaq türkü olan əmir Cəmaləddin Əfrəm Ağquş Misir Məmlüklü ordusunda xitmət etmiş komandanlardan biri olmuşdur. Mənbələrdə mömin, çox ibadət edən, xeyriyyəçi şəxs kimi tanıdılan əmir Cəmaləddin Əfrəm həm də cəsur mücahid idi. O, başçılıq etdiyi hərbi birləşmə ilə Əyn Calut döyüşündə (3 sentyabr 1260) fərqənmiş, moğol ordusunun baş komandanı Kətbuğanı şəxsən yaxalayıb öldürmüşdü. Məmlüklü sultanı Nasirəddin Muhəmməd Qəlavun (1293-1294, 1299-1309 və 1310-1341) onu Şam vilayətinə naibü's-səltənə təyin

və onun arxasında namaz qılmaq üçün tez-tez əl-Əməvi camesinə gəlirdi. Əmir Cəmaləddin Əfrəm bəzən də piyada şeyx Şihabəddinin zikr və ibadətlə məşğul olduğu zaviyəyə gedib onunla görüşür, söhbət edirdi. Bu zaviyə Dəməşqin Böyük Meydan adlanan səmtinin şimali-şərq qismində yerləşirdi. Şeyx Şihabəddin Marağı h. 717-ci ilin məhərrəm ayında (mart 1317) vəfat etmiş və Sufiyyə qəbristanında dəfn edilmişdi[874].

**Şeyx Şərəfəddin Əbü'l-Abbas Əhməd ibn Əhməd ibn Muhəmməd ibn İbrahim Marağı**

Hənəfi məzhəbinə mənsub fəqih və Şeyx Şihabəddin Əhməd Marağinin oğlu idi. İbnü'ş-Şihabi ər-Rumi adı ilə tanınmışdı. Atasının vəfatından sonra Dəməşqdə Muiniyyə və Məşixiyyə mədrəsələrinin müdərrisi olmuşdu. Həmçinin əl-Əməvi camesində hənəfi camaatının imamı və Xatuniyyə xanəgahının şeyxi idi. Atasından sonra onun şeyxi olduğu bu xanəgahda ibadət, irşad və mənəvi tərbiyə ilə məşğul olmuşdu. İki dəfə, ehtimal ki, qardaşını görmək üçün, Misirə səyahət etmişdi. H. 26 səfər 742-ci ildə (10 avqust 1341) Dəməşqdə vəfat etmiş və Sufiyyə qəbristanında dəfn edilmişdi[875].

**Şeyx İmadəddin Əbu İshaq İbrahim ibn Əhməd ibn Muhəmməd ibn İbrahim Marağı**

Hənəfi məzhəbinə mənsub fəqih və mühəddis idi. Şeyx Şihabəddin Əhməd Marağinin oğlu və Şərəfəddin Əbü'l-Abbas Marağinin qardaşı idi. Atasının həmçinin "ər-Rumi" nisbəsi daşıması səbəbiylə İbnü'r-Rumi ləqəbi ilə tanınmışdı. Əhməd ibn Hibətullah ibn Əsakirdən hədis dinləmişdi. Qardaşından əvvəl bir müddət əl-Əməvi camesində hənəfi camaatının imamı və Xatuniyyə xanəgahının şeyxi olmuşdu. Sonra Qahirədəki

---

etmişdi. Bax: İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIII, s. 492; Səlahəddin Xəlil ibn Aybək SƏFƏDİ, *Tuhfətü'z-Zəviə'l-Əlbab*, (Nşr. İ. S. Xülusi-Səmsam Z. H), C. II, s. 200-201, 208-215, Dəməşq 1991.

874 SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. I, s. 316-317; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 156; İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. I, s. 116. Şeyx Şihabəddin Əhməd Marağinin həmçinin "ər-Rumi" nisbəsi daşıması ehtimal ki, onun Anadoluda (Rum diyarı) anadan olması səbəbi ilədir.

875 İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. I, s. 44; İBN RAFİ', *əl-Vəfayat*, s. 38.

xanəgahlardan birinin şeyxliyinə təyin edildiyi üçün Misirə getmişdi. H. 29 şəvval 741-ci ildə (16 aprel 1341) Qahirədə vəfat etmişdi[876].

**Əbu Bəkr Muhəmməd ibn Əli Marağİ**

Yaşadığı dövrün tanınmış filoloqlorandan biri olan alim Mosulda yaşamışdı. İbnü'n-Nədim onun zəkası və elmi biliyi sayəsində Əbü'l-Abbasın[877] sarayındakı alimlər sırasına daxil olduğunu qeyd etmişdir. O, tanınmış alim Əbu İshaq İbrahim ibn Muhəmməd əz-Züccac Bağdadinin (855-923) müəllimi olmuşdu. Ərəb dilinin qrammatikasına dair "Müxtəsər fi'n-Nəhv" adlı əsərin müəllifi idi. Onun bir digər əsəri də "Şəvahidü's-Sibəveyh və Təfsiruhə"[878] adlı əsərə yazdığı şərh idi[879]. Ölüm tarixi məlum deyil. Ömər Rzanın qeyd etdiyinə görə alim h. 311-ci ildə (923) həyatda olmuşdur[880]. Buna görə onun IX-X əsrlərdə yaşadığını söyləmək olar.

**Əbu İshaq İbrahim ibn Əhməd ibn Abdullah ibn Muhəmməd Marağİ**

Yaşadığı dövrün tanınmış mühəddislərindən biri idi. Hədis dinləmək üçün Azərbaycan, İran, İraq, Hicaz, Xorasanın şəhərlərini gəzmiş və bir çox alimdən hədis dinləmişdi. Qəzvində İbrahim ibnü'l-Müəbbər və Əbu Əli Hüseyn ibn Muhəmməd ibn Şueyb əl-Ənsari Qəzvinidən hədis dərsləri almışdı. Əbu İshaq İbrahim Marağİ "Müxtəsər fi Səvabü'l-Əmal" adlı əsərin müəllifi idi. Alim h. 480-ci (1087) ilin

[876] İBN RAFİ', *əl-Vəfayat*, s. 30.
[877] Təssüf ki, İbnü'n-Nədim bu Əbü'l-Abbasın kim olduğunu qeyd etməmişdir. Haqqında məlumat verdiyinə görə Əbu Bəkr Marağİ, İbnü'n-Nədimdən (937-1010) ya əvvəl ya da onunla eyni dövrdə İraqda yaşmışdır. Elə isə buradakı Əbü'l-Abbas Abbasi xəlifələrindən biridir. Çünki həmin dövrdə İraq Abbasilərin hakimiyyəti altında idi. 37 Abbasi xəlifələsindən 8-i "Əbü'l-Abbas" künyəsi daşımışdı. Bunlardan 3-ü İbnü'n-Nədimdən sonra (öl. 1010) yaşamışdılar. Əbu Bəkr Muhəmməd Marağinin tələbəsi Əbu İshaq əz-Züccac Bağdadinin (855-923) yaşadığı dövrlə müqayisə edərək burada adı çəkilən Əbü'l-Abbasın aşağıda adı çəkilən iki Abbasi xəlifəsindən biri olduğunu söyləmək olar: Əbü'l-Abbas Əhməd əl-Mu'təməd Ələllah (869-892) və Əbü'l-Abbas Əhməd əl-Mu'təzid Billah (892-901). Sözü gedən Abbasi xəlifələri ilə bağlı ətraflı məlumat üçün bax: İmadəddin ƏBÜ'L-FİDA İsmayıl ibn Əli, *Kitabü't-Tibrü'-Məsbuk fi Təvarixi'l-Müluk*, (Nşr. M. Əzəb) , s. 49, 52, Qahirə 1990.
[878] Bu şərh Sibəveyh ləqəbi ilə tanınmış iranlı alim Əbu Bişr Əmr ibn Osman əl-Qənbər əş-Şirazinin (767-809) əsərinə yazılmışdır. Əbu Bişr Sibəveyh öz dövrünün məşhur dilçi alimlərindən və mühəddislərindən biri idi. O, ərəb dilinin qrammatik qaydalarının müəyyənləşdirilməsi, ərəb filologiyasının təlim və tədrisi metodologiyasının təməlini qoymuş alimlərdən biri hesab olunur.
[879] YAQUT əl-HƏMƏVİ, *İrşadü'l-Ərib*, s. 1546; İBNÜ'n-NƏDİM, *əl-Fihrist*, s. 88; QIFTİ, *İnbahu'r-Ruvat*, C. III, s. 196.
[880] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 548.

ortalarında Rey şəhərində vəfat etmişdi[881]. Fikrimizcə Əbu İshaq İbrahim Maraği aşağıda haqqında məlumat verdiyimiz Əbü'l-Leys Kəsir Marağinin atası idi.

**Əbü'l-Leys Kəsir ibn İbrahim ibn Əhməd ibn Abdullah Marağı**

Mühəddis idi. Qazi Əbü'l-Fəth Müzəffər ibn Muhəmməd əl-Əssardan hədis dinləmiş və nəql etmişdi. Əbu Tahiri Əhməd əs-Süləfi İsfəhani Rey şəhərində onunla görüşmüş və söhbət etmişdi[882]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Hafiz Əbü'l-Qasım Əli ibn Əhməd ibn Muhəmməd ibn Həsən ibn Abdullah ibn Muhəmməd ibnü'l-Leys Marağı**

Yaşadığı dövrün məşhur hədis hafizlərindən biri idi. H. 326-cı ilin rəcəb ayında (may 938) Bəlxdə doğulmuş və bu şəhərdə böyümüşdü. O, siqa, mötəbər hədis ravisi kimi tanınırdı. İlk olaraq atasından, daha sonra isə Əbu Səid Heysəm ibn Kuleyb əş-Şaşi, Əbü'l-Fəzl Muhəmməd ibn Əhməd əs-Süləmi, Əbu Bəkr Muhəmməd ibn Əhməd ibn Həbib, Əbu Muhəmməd Abdullah ibn Muhəmməd, Əbu Cə'fər Muhəmməd ibn Muhəmməd ibn Cəmil Bağdadidən hədis dinləmişdi. Alim Xorasan və Türküstan ellərini gəzmiş, Bəlx, Buxara, Nəsəf və Səmərqənddə hədis dərsləri vermiş və hədis nəql etmişdi. Əbü'l-Qasım Əli Marağı, Əbü'l-İsa Tirmizinin "Şəmailü'n-Nəbi" adlı əsərindəki hədisləri qəribü'l-hədis[883] baxımından təhqiq etmişdir. Alim h. 28 səfər 411-ci ildə (23 iyun 1020) Buxarada vəfat etmişdi[884].

**Əhməd ibn Muhəmməd Mərəndi**

Müfəssir olan Əhməd Mərəndi həmçinin fəraiz elmi, vərəsəlik hüququ sahəsində də mütəxəssis idi. Məlum olmayan səbəbdən əlil olan alim tutulduğu ağır xəstəlikdən iztirab çəkmiş və h. 549-cu ildə (1154) vəfat etmişdi. Səlahəddin Səfədi onun "əz-

---

[881] RAFİ'İ, *Tədvin*, C. II, s. 101.
[882] ƏBU TAHİR İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, s. 341.
[883] Qəraibü'l-Hədis, hədis elmlərindən biridir. Daha çox hədis mətinlərinin ərəb dilinin filoloji qaydaları baxımından tədqiq edilməsinə deyilir.
[884] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV, s. 241-242.

Zureyr" yəni "kor" ləqəbi ilə tanındığını qeyd etmişdi[885]. Əhməd ibn Muhəmməd Mərəndi ehtimal ki, mübtəla olduğu göz xəstəliyi səbəbiylə əlil olmuşdu.

**Şeyx İmadəddin Əbu Abdullah Muhəmməd ibn Hişam ibn Əbü'l-Heca' Mərəndi**

Şafi'i məzhəbinə mənsub fəqih, mühəddis və müfəssir idi. O, xüsusilə Qur'ani-Kərimin ayələrini Rəsulullahın (s.ə.s) hədisləri ilə şərh etmək sahəsində ixtisaslaşmışdı. İbnü'l-Fuvati onun qələmə aldığı və ayələrin hədislərlə şərh edildiyi bir təfsir risaləsini oxuduğunu və orada Qur'ani-Kərimin Mümtəhinə surəsi 6-cı (Ola bilsin ki, Allah sizinlə düşmənçilik etdiyiniz kimsələr arasında dostluq yaratsın. Allah hər şeyə qadirdir. Allah bağışlayandır, rəhm edəndir!)[886] ayəsini Əli ibn Əbu Talibin (ا) Rəsulullahdan (ق) nəql etdiyi bu hədislə şərh etmişdir: "Düşməninlə orta yollu düşmənlik et (ona nifrətdə və düşmənçilikdə ifrata varma) ki, bir gün dostuna çevrilə bilər"[887]. Təəssüf ki, İbnü'l-Fuvatin alimin ölüm tarixi və yaşadığı dövr haqqında məlumat verməmişdir. İmadəddin ibnü'l-Əbü'l-Heca' Mərəndi təqribən XII-XIII əsrlərdə, Eldənizlilərin hakimiyyəti illərində (1136-1225) yaşamışdır.

**İmam Əbu Bəkr Muhəmməd ibn Muhəmməd Mərəndi**

Yaşadığı dövrün tanınmış fəqihlərindən və şafi'i alimlərindən biri idi. Əbdülkərim Qəzvini onu "alim, müttəqi imam" kimi sözlərlə vəsf etmişdi. Əbu Bəkr Muhəmməd Mərəndi Qəzvindəki Əmir Əli əl-Hüsami mədrəsəsinin müdərrisi idi. Qəzvindən yetişmiş bir çox məşhur alim onun tələbəsi olmuşdu. Bunlardan biri də imam Əbu Süleyman əz-Zübeyri idi. İmam Əbu Bəkr Muhəmməd Mərəndi bir çox qəzvinli əyan və əşraf ailəsinin övladının təlim və tədrisi ilə məşğul olmuşdu. O, güclü xitabət qabiləyyətinə malik idi. Əbdülkərim Rafi'i h. 580-ci (1184) ildə imam Əbu Bəkr

---

885 SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. VIII, s. 100.

886 [عَسَى اللَّهُ أَنْ يَجْعَلَ بَيْنَكُمْ وَبَيْنَ الَّذِينَ عَادَيْتُمْ مِنْهُمْ مَوَدَّةً وَاللَّهُ قَدِيرٌ وَاللَّهُ غَفُورٌ رَحِيمٌ]

887 İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 854. Bu hədis üçün bax: Muhəmməd ibn İsmayıl BUXARİ, *Ədəbü'l-Müfrəd*, C. II, s. 664-665, (Nşr. A. F. Yavuz), İstanbul 1974. [أبغض بغيضك هونا ما عسى أن يكون حبيبك يوما ما]. Müsəlmanın dostluğunun da, düşmənliyinin də Allah üçün olmalı olduğuna dair çox sayıda hədis var. İmam Təbəri də bu ayəni şərh edərkən bu gün İslama və müsəlmanlara düşmən olanın, əgər Allah murad edərsə, bir gün İslamı qəbul edib müsəlman olamasının mümkün olduğunu bəyan edildiyini yazmışdır, yoxsa müsəlmanların kafirlərə qarşı sevgi və dostluq hissləri bəsləmələrinin mümkün olmadığı Qur'anın bir çox aysində bildirilmişdir.. Bax: Əbu Cə'fər Muhəmməd ibn Cərir TƏBƏRİ, *Camiü'l-Bəyan fi Təfsiri'l-Qur'an*, C. VIII, s. 257, İstanbul 1996.

Mərəndinin xütbələrinin qeyd edildiyi kitabı gördüyünü bildirməkdədir. Müəllif bu kitabın alimin tələbəsi Əbu Süleyman əz-Zübeyri tərəfindən qələmə alındığını qeyd etmişdir. Əbdülkərim Rafi'i alimin xütbələrindən birini öz əsərində nəql etmişdir[888]. İmam Əbu Bəkr Mərəndinin ölüm tarixi məlum deyil. Təqribən XI-XII əsrlərdə yaşamışdır.

**Əbu Abdullah Muhəmməd ibn Musa Mərəndi**

Hədis ravisi və Əbu Nueym Cürcaninin[889] vərraqı[890] idi. O, Qəzvində yaşamış, İbrahim ibn Hüseyn Həmədanidən hədis dinləmiş və nəql etmişdi. Qəzvində yetişmiş bir çox alim ondan hədis dinləmişdi. Muhəmməd ibn Əbu Xəlil və Əbdürrəhman ibn Əbu Hatim hədis ravisi olaraq onu yüksək qiymətləndirmişdilər. Əbu Abdullah Muhəmməd Mərəndi vərraq olduğu üçün kitabların üzünün köçürülməsi işi ilə də məşğul olurdu. Onun qələmindən 500 cilddən çox kitab çıxmışdı[891]. Ölüm tarixi məlum deyil. IX-X əsrlərdə yaşamışdır.

**Hafiz İbrahim Muhəmməd ibn Musa Mərəndi**

Əbu Abdullah Muhəmməd Mərəndinin oğlu idi. Hədis hafizi və atası kimi vərraq idi. O, da atası kimi çox sürətli yazı yazması ilə tanınmışdı[892]. Ölüm tarixi məlum deyil. X əsrdə yaşamışdı.

**Əbu Abdullah Muhəmməd ibn Abdullah ibn Bəndər ibn Abdullah ibn Muhəmməd ibn Kəka Mərəndi**

Mühəddis idi. Əbü'l-Həsən Əli Darəqutni, İbn Şahin[893], fəqih Əbu Həsən Əli ibn Muhəmməd əl-Qəssar, Əbu Nəsr Əbdürrəhman ibn Əhməd Həmədani, Əbü'l-Qasım

---

888 RAFİ'İ, *Tədvin*, C. II, s. 17.

889 Hafiz Əbu Nueym Əbdülməlik ibn Muhəmməd ibn Ədiyy Cürcani Əstərabadi (856-935). Yaşadığı dövrün böyük hədis hafizlərindən biri idi.

890 Vərraq-kitab və.s dəftərxana ləvazımatının ticarəti ilə məşğul olan şəxs.

891 YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. V, s. 176-177.

892 HİMYƏRİ, *Nisbə ilə'l-Məvazi'*, C. I, s. 588.

893 Hafiz Əbu Həfs Ömər ibn Əhməd ibn Osman ibn Əhməd ibn Muhəmməd ibn Əyyub ibn Şahin Bağdadi (öl. 995). Böyük hədis hafizlərindən biri idi. Hədis və təfsir sahələrində bir sıra əsərlərin müəllifi idi.

Musa ibn İsa Sərrac, Əbü'l-Həsən əl-Hərbi, Əbu Həfs əl-Kinani və daha onlarla mühəddisdən hədis dinləmiş və nəql etmişdi. H. 433-cü ildə (1042) həcc ziyarətindən qayıdarkən Dəməşqdə gəlmiş və burada hədis dərsləri vermişdi. Əbdüləziz əl-Kinani, Əbü'l-Qasım ibn Əbü'l-Əla, Əbu Mənsur Hibətullah ibnü's-Səqr Mərəndi, Əbu Həsən Əli ibn Həsən ibn Hərur və başqaları da ondan hədis dinləmişdilər[894]. Əbu Abdullah Muhəmməd Mərəndinin ölüm tarixi məlum deyil. XI əsrdə yaşamışdır. İbn Əsakir öz əsərində onun nəql etdiyi hədislərdən aşağıdakını qeyd etmişdir:

Ənəs ibn Malik (ا) dedi: Allah Rəsulu (ق) buyurdular ki; "Kim şəhid olmağı sədaqətlə (səmimi olaraq) istəsə Allah ona şəhidlik verilər. Hətta (düşmənin silahı) ona isabət etməsə belə"[895].

**Muhyəddin Əbu Nəsr Əhməd ibn İbrahim ibnü'l-Hümami Mərəndi**

Mühəddis idi. H. 477-ci (1084) ildə Qəzvində təhsil almış, bu şəhərdə Əbü'l-Fəth ər-Raşidi, Əbu Mənsur əl-Muqri kimi alimlərdən hədis dərsləri almışdı[896]. Hafiz Əbu Tahir əs-Süləfi (öl. 1181) Azərbaycanda olarkən Xoy şəhəri yaxınlığında Muhyəddin Əhməd Mərəndi ilə görüşüb söhbət etmişdi[897]. Muhyəddin Əhməd Mərəndinin ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Əbu Bəkr ibn Muhəmməd ibn Hüseyn əs-Səylani Mərəndi**

XII əsrdə yaşamış şafi'i məzhəbinə mənsub alim idi. Həyatı haqqında ətraflı məlumat yoxdur. "Fəzlü'l-Füqəra ələ'l-Əğniya", "Nəcatü'z-Zakirin" və "Xəvf və Rəca" Əbu Bəkr əs-Səylani Mərəndinin müəllifi olduğu farsca əsərlərdir. Bu əsərlərin əlyazma nüsxələri Ankara Milli kitabxanada mövcuddur. Onun Azərbaycan türkcəsində qələmə aldığı "Zadü'l-İbad" adlı təsvvüfə dair əsərin bilinən yegan nüsxsi İstanbulda, Topqapı muzeyində saxlanılır.

**Vəzir Fəxrəddin Əbü'l-Fəth Əli ibn Hüseyn ibn Muhəmməd ər-Rəvəki Mərəndi**

---

[894] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LIII, s. 331; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. V, s. 176-177.
[895] İBN ƏSAKİR, *yenə orada*. (من طلب الشهادة صادقا أعطيها ولم تصبه). Bu hədis üçün bax: MÜSLİM, *Səhih*, İmarat, 46/1908.
[896] RAFİ'İ, *Tədvin*, C. II, s. 137.
[897] ƏBU TAHİR İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, s. 22.

İbnü'l-Fuvati onun Anadolu Səlcuqlu dövlətində vəzir olduğunu bildirməkdədir. Müəllifin yazıdığına görə Fəxrəddin Əbü'l-Fəth Mərəndi[898] Anadolu Səlcuqlu sarayının sahibi-divanı Muinəddin Süleyman Pərvanə (öl. 1277) ilə birlikdə h. 666-ci ildə (1268) Marağaya gəlmiş və onlar Marağa rəsədxanasının olduğu dağın ətəyindəki çadırlarda qalmışdılar. İbnü'l-Fuvati həmin vaxt özünün də Marağada olduğunu yazır. Müəllif Anadoludan gələn bu rəsmi heyətin daha sonra Elxanlı hökmdarı Abaqa xanla (1262-1282) görüşmək üçün yola çıxdığını bildirmişdir. O, rəsmi heyətin qiymətli hədiyyələrlə moğol xanının hüzuruna getdiklərini, həyiyyələr arasında şahinlər, qatırlar və başqa qiymətli quşların da olduğunu, bu heyətin oradakı fəqirlərə qarşı xeyli səxavitli davranaraq çoxlu dirhəm sədəqə verdiyini yazmışdır[899]. Müəllif Fəxrəddin Əbü'l-Fəth Mərəndinin ölüm tarixini qeyd etməmişdir.

**Əbu Bəkr ibn İshaq ibn Hüseyn ibn Xalid Mərəndi**

Hənəfi məzhəbinə mənsub fəqih idi. H. 712-ci ildə (1311) anadan olmuşdu. Zahid və abid bir insan olan Əbu Bəkr Mərəndi təsəvvüf əhlinə mənsub idi. O, Qahirədəki Nasiriyyə xanəgahında fiqh dərsləri verir, həmçinin mənəvi tərbiyə və irşadla məşğul olurdu[900]. Ölüm tarixi məlum deyil. XIV əsrdə yaşamışdır.

**Nemətullah ibn Muhəmməd ibn Mənsur Mərəndi**

Mühəddis idi. Mərəndin cümə məscidində hədis dərsləri vermişdi. O, Əbu Mənsur Hibətullah ibnü's-Səqr Mərəndinin tələbəsi olmuş, ondan hədis dinləmişdi. Əbu Mənsur Hibətullah ibnü's-Səqr Mərəndi isə Mərəndli məşhur mühəddis Əbu Abdullah Muhəmməd ibn Kəka Mərəndinin tələbəsi olmuşdu[901]. Nemətullah Mərəndinin ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

---

[898] (Ph) Doktorluq dissertasıyam Anadolu Səlcuqlu tarixi bağlı olduğu üçün sözü gedən dövrün tarixi mənbələri ilə yaxından tanış olub tədqiq etmə fürsətim olmuşdur. Həmin bu dövrdə Anadolu Səlcuqlu dövlətində "Mərəndi" nisbəsi ilə tanınmış sadəcə bir şəxsə rast gəlmişdik, bu da Baba Mərəndi ləqəbli dövlət və din xadimi qazi Məcdəddin Mərəndidir. Bunun xaricində, sözü gedən dövrdə, xüsusən də sahibi-divan Muinəddin Süleyman Pərvanənin ətrafında "Mərəndi" nisbəli başqa bir məşhur şəxsin olduğuna dair mənbələr heç bir məlumat vermirlər.

[899] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 244-245.

[900] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. V, s. 230.

[901] İBN ƏSAKİR, *Mu'cəmü'ş-Şüyux*, s. 308.

**Hüseyn ibn Abdullah Mərəndi**

Hədis ravisi idi. Əbu Abdullah əl-Hakim ibnü'l-Bəyi'dən hədis dinləmiş və nəql etmişdi. Hüseyn Mərəndi h. 433-cü ildə (1042) Qüdsdə vəfat etmişdi[902].

**Əbü'l-Fərəc Hibətullah ibn Nəsr ibn Əhməd Mərəndi**

Mühəddis, hədis ravisi idi. Təhsil almaq məqsədiylə Bağdada getmişdi. Bağdadda Əbu Əmr Əbdülvahid ibn Muhəmməd ibn Mehdi əl-Farsinin tələbəsi olmuş, ondan hədis dinləmişdi. Hafiz Əbü'l-Fityan Ömər ibn Əbdülkərim ibn Sədveyh ər-Rəvasi ondan hədis dinləmişdi. Ölüm tarixi 460-cı ildən (1068) sonraya təsadüf edir[903].

**Əbü'l-Vəfa Xəlil ibn Muhsin ibn Muhəmməd Mərəndi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. O, gözəl əxlaqlı, xoşrəftar, saleh insan idi. Bağdadda Nizamiyyə mədrəsəsində təhsil almış, Əbu İshaq Şirazinin tələbəsi olmuşdu. Əbu Hüseyn Əhməd ibn Muhəmməd əl-Bəzzaz, Əbu Nəsr Muhəmməd ibn Muhəmməd əz-Zeynəbi və başqalarından hədis dinləmişdi. Bioqraf və tarixçi Əbu Sə'd Əbdülkərim Səm'ani qeyd edir ki, "mənim dostlarım və yaşıdlarımdan bir çoxu onun tələbəsi olmuş, ondan hədis dinləmişdilər". Alim h. 512-ci ilin cəmadiəlaxir ayında (oktyabr 1118) Bağdadda vəfat etmiş və Şuniziyyə qəbristanında dəfn edilmişdi[904].

**Əbu Həfs Ömər ibn Əbdülməcid Mərəndi**

Qari idi Əbü'l-Qasım əs-Süheylin tələbəsi olmuş, ondan Qur'ani-Kərimin qiraət və təcvidini öyrənmiş, həmçinin ərəb filologiyasına dair dərslər almışdı. Əbu Həfs Ömər Mərəndi yaşadığı dövrdə qiraət və ərəb dilinin qrammatisi sahəsində tanınmış

---

902 KƏTTANİ, *Zeyl Tarixi-Məvlidi*, s. 181.

903 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV s. 253-254.

904 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV s. 253-254; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. II, s. 226; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. V, s. 176-177. YAQUT əl-HƏMƏVİ, Əbü'l-Vəfa Xəlil Mərəndinin h. 612-ci ildə (1215) vəfat etdiyini yazır. Lakin onun Əbu İshaq Şirazinin (öl.1083) tələbəsi olduğunu, başqa sözlə onunla görüşdüyünü nəzərə alaraq bunun mümkün olmadığını deyə bilərik.

mütəxəssilərdən biri idi. O, qrammatikaya dair "Şərhü'l-Cəməl"[905] adlı əsərin müəllifi idi. Alim h. 616-cı ilin rəbiəlaxir ayında (iyun 1219) 73 yaşında vəfat etmişdi[906].

**Hafiz Əbu İshaq İbrahim ibn Muhəmməd ibnü'l-Əzhər Mərəndi**

Hədis hafizi, qari və xətib idi. Əli ibn Cabir əl-Əzdi Məvsili, İshaq ibn Səyyar ən-Nüseybidən hədis dinləmiş və nəql etmişdi. Əbü'l-Müfəzzəl əş-Şeybani, Əbu Muhəmməd Əhməd ibn Abdullah əl-Muzəni əl-Hərəvi və başqaları ondan hədis dinləmiş və nəql etmişdilər. Hafiz Əbu İshaq İbrahim Mərəndi Böyük Səlcuqlu sultanlarının vəziri Nizamülmülkün (öl. 1092) dostu idi, vəzir ona böyük hörmət bəsləyirdi[907]. Əbu İshaq İbrahim Mərəndi hədis sahəsində bir əsər qələmə almışdı. O, həmçinin Qur'an qiraəti və təcvidinə dair "Qərətu Əynü'l-Qurra fi'l-Qiraət" adlı əsərin müəllifi idi[908]. Ölüm tarixi məlum deyil. XI əsrdə yaşamışdır.

**Xətib Əbu Muhəmməd Abdullah ibn Nəsr ibn Əbdüləziz ibn Süveyd Mərəndi**

Ədəbiyyatçı və hədis ravisi idi. H. 482-ci il rəbiələvvəl ayında (may 1089) Mərənddə anadan olmuşdu. Ərəb dili və ədəbiyyatı üzrə yaşadığı dövrün ən məşhur mütəxəssislərindən biri idi. Bağdad Nizamiyyə mədrəsəsində Muhəmməd əl-Əbivərdinin[909] tələbəsi olmuş və ərəb ədəbiyyatını ondan öyrənmişdi. Şair idi və gözəl şer yazırdı. O, həmçinin mahir xəttat idi. Bir müddət Bağdadda qalmış, sonra Mərvə getmiş və 15 il bu şəhərdə yaşamışdı. Daha sonra Mərvərruda[910] getmiş, burada çox az müddət yaşmış və h. 10 məhərrəm 541-ci ildə (21 iyun 1146) vəfat etmişdi[911].

---

905 Əndəlusulu ərəb filoloq və ədibi Əbu Muhəmməd Abdullah ibn Muhəmməd ibnü's-Seyyid əl-Bətlyusinin (1052-1127) ərəb dili qrammatikası və morfologiyasına dair "İslahü'l-Cəməlü'l-Vaqi' fi'l-Cəməl li'l-Züccaci" adlı əsərinə bir çox şərh yazılmışdır. Bunlardan biri də Əbu Həfs Ömər Mərəndi tərəfindən qələmə alınmışdır.

906 İBNü'l-CƏZƏRİ, *Qayətü'n-Nihayə*, s. 483.

907 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV s. 253-254; İBN MAKULA, *İkmal*, C. II, s. 420; MƏQDİSİ, *Kitabü'l-Müqəffa*, C. I, s. 292.

908 BAĞDADLI, *İzahü'l-Məknun*, C. II, s. 147.

909 Muhəmməd ibn Əhməd ibn Muhəmməd əl-Əbivərdi (öl. 1113). Əslən Xorasanın Əbivərd qəsəbəsindəndir. Yaşadığı dövrdə ərəb dili və ədəbiyyatı üzrə böyük mütəxəssis və şair olmuşdur. "Divan"ı və başqa əbədi əsərləri vardı.

910 Mərvərrud-indiki Əfqanıstan ərazisində, Özəbəkistanla sərhəddə, Herat şəhərinin şimali-şərqində yerləşən qəsəbə. Mərvərrud şəhəri və nahiyəsi üçün bax: BAKUVİ, *Təlxisü'l-Asar*, s. 104.

911 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV s. 253-254; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. II, s. 234; İBN KƏSİR əl-ƏNSARİ, *Zeyl Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, v. 123a; Kəmaləddin Əbü'l-Bərəkat Əbdürrəhman İBNü'l-ƏNBARİ, *Nuzhətü'l-Əlba fi Təbəqatü'l-Üdəba*, s. 297-298, Zərqa 1985.

**Vaiz Əbü'l-Bəqa Həmkan ibn Əli ibn Həmkan Mərəndi**

Mühəddis, həmçinin Təbriz şəhəri cümə məscidinin vaizi idi. Şeyx Əbü'l-Məhasin Əbdüləziz ibn Əli ibn Yəhyadan hədis dinləmişdi. Tarixçi İbn Əsakir (öl. 1175) 1134-cü ildə çıxdığı səyahət vaxtı Təbrizə gəlmiş və onun elm söhbətlərində iştirak etmişdi[912]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**İmadəddin Əbu Zülfiqar Muhəmməd ibnü'l-Əşrəf Zülfiqar ibn Muhəmməd Mərəndi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. H. 596-cı ildə (1200) Mərənddə anadan olmuşdu. Fəzilət sahibi, zahid insan idi. Babası İmadəddin Əbu's-Səmsam Mərəndi və Zeynəddin Əbü'l-Həsən Muhəmməd ibnü'l-Qətiyyinin tələbəsi olmuş, onlardan fiqh və hədis dərsləri almışdı. Zeynəddin Qətiyyinin yanında imam Buxarinin "Səhih" adlı hədis külliyatını oxumuşdu. H. 630-cu ilin şaban (may 1233) ayında Bağdada gəlmişdi. Əvvəlcə əl-Xilatiyyə təkkəsində dərs vermiş, h. 631-ci ilin rəcəb ayında (aprel 1234) Müstənsiriyyə mədrəsəsinin açılışından sonra bu mədrəsəsədə şafi'i fiqhi dərsləri vermişdi. Daha sonra h. 648-ci ildə (1250) tikilib istifadəyə verilən Vasitdəki hədis mədrəsəsində dərs vermişdi. Bağdadın moğollar tərəfindən işğalından (1258) bir il sonra bağlı olan Müstənsiriyyə mədrəsəsi yenidən açılmışdı. Moğol işğalı və idarəsi altındakı Bağdadda fəaliyyət göstərən bu mədrəsəninin müdərrisliyinə İmadəddin Əbu Zülfiqar Muhəmməd Mərəndi təyin olunmuşdu. İmadəddin Əbu Zülfiqar Muhəmməd Mərəndi h. 680-ci ildə (1281) Bağdadda vəfat etmişdi[913].

**Qazi Məcdəddin Baba Mərəndi**

Məcdəddin Mərəndi XIII əsrdə Şam diyarı və Anadoluda yaşamış fəqih və fütuvvət şeyxi idi. O, Anadolu Səlcuqlu sultanı Rüknəddin IV Qılıncarslanın (1259-1266) hakimiyyəti dövründə Şamdan Anadoluya gəlmişdi[914]. Anadoluya gələndən sonra

[912] İBN ƏSAKİR, *Mu'cəmü'ş-Şüyux*, s. 81.
[913] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 818-819.
[914] Feridun ibn Ahmed SİPEHSALAR, *Menâkıb-ı Hazreti Hüdavendigâr*, (Çev. M. Biharî), s.76, İstanbul 1331.

sultan Rüknəddinin yaxın adamlarından birinə çevrilən Məcdəddin Baba Mərəndi[915] Ağsaray şəhəri qaziliyinə təyin olunmuşdu[916]. Tarixçi Kəriməddin Ağsarayi Məcdəddin Baba Mərəndini alim, zahid və ədalətli qazi kimi təsvir etmişdi[917]. Şeyx Şihabəddin Ömər Sührəvərdi "Risalətü'l-Fütuvvə" adlı əsərində Baba Mərəndini "şeyxlərin şeyxi, tədqiqatçı alimlərin sultanı" kimi ifadələrlə vəsf etmişdi[918]. Qazi Məcdəddin Baba Mərəndinin ölüm tarixi məlum deyil.

**Əbu Abdullah Muhəmməd ibn Muhəmməd ibn Muhəmməd Miyanəci**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Saleh əməlli, xoşrəftar və mehriban insan kimi tanınmışdı. Əbu Abdullah Kəsir ibn Səid Bağdadinin tələbəsi olmuş və ondan hədis dinləmişdi. Əbu Sə'd Əbdülkərim Səm'ani öz əsərində Əbu Abdullah Muhəmməd Miyanəci ilə Məkkəyə gedərkən yolda tanış olub yoldaşlıq etdiyini, Məkkədə ikən ondan bəzi bilikləri öyrənib yazdığını qeyd edir. Bu həcc ziyarətindən sonra Əbu Abdullah Muhəmməd Miyanəci İraqa gəlmiş, h. 533-cü ildə (1139) isə doğma şəhərinə qayıtmışdı[919]. Ölüm tarixi məlum deyil. XII əsrdə yaşamışdır.

**Əlaəddin Əli ibn Hüseyn ibn Abdullah Miyanəci**

XIII əsrdə yaşamış şafi'i məzhəbinə mənsub fəqih idi. Əlaəddin Əli Miyanəci həmçinin istedadlı şair idi. İbnü'l-Fuvati öz ərəsində onun haqqında məlumat verərkən ərəbcə yazdığı şerlərdən bir neçə misranı da qeyd etmişdi[920].

**Qazi Əbu Bəkr Yusif ibn Qasım ibn Yusif ibn Faris Miyanəci**

Şafi'i məzhəbinə mənsub siqa mühəddis idi. Doğma şəhəri Miyanədə Muhəmməd ibn Abdullah əs-Səmərqəndinin dərslərində iştirak etmiş, ondan hədis dinləmiş və nəql etmişdi. Daha sonra Suriyaya getmiş və Dəməşqdə məskunlaşmışdı. Bir müddət

[915] ƏFLAKİ, *Ariflerin Menkıbeleri*, C. II, s. 157-160.
[916] AQSARAYİ, *Müsamərətü'l-Əxbar*, s. 490
[917] *Yenə orada.*
[918] Abdülbaki GÖLPINARLI, *Yunus Emre ve Tasavvufu*, s. 9, İstanbul 1992.
[919] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV s. 379-380.
[920] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1048.

Dəməşq qazisinin müavini olmuşdu. Sonra hədis dinləmək müqsədi ilə Şam, Cəzirə, İraq və Xorasan diyarlarına səyahət etmişdi. Əbi Xəlifə, Zəkəriyya əs-Saci və İmran əl-Cəvaliqi kimi mühəddislərdən hədis dinləmişdi. Əbü'l-Həsən Muhəmməd ibn Örf əd-Dəməşqi və Muhsin ibn Muhəmməd əl-Hüseyni də ondan hədis dinləmiş və nəql etmişdilər. Onun qardaşı oğlu Əbu Saleh Əhməd Miyanəci (öl. 1039) də yaşadığı dövrün tanınmış hədis alimlərindən biri olmuşdu. Qazi Əbu Bəkr Miyanəci h. 376-cı ilin şaban ayında (dekabr 986), təqiribən 90 yaşında vəfat etmişdi[921]. O, hədis elmi sahəsində "Əmali fi'l-Hədis" adlı əsərin müəllifidir[922].

**Əbu Məs'ud Saleh ibn Əhməd ibn Qasım Miyanəci**

Hədis ravisi idi. Əbü'l-Həsən Əli ibn Ömər Darəqutni (918-995) və onun müasiri olan mühəddislərdən hədis dinləmiş və nəql etmişdi. Əbu Məs'ud Saleh Miyanəci uzun müddət Məkkədə yaşamışdı. Burada Əbu Mə'şər Əbdülkərim ibn Əbdüssəməd əl-Muqri ət-Təbəri ondan hədis dinləmişdi[923]. Ölüm tarixi məlum deyil. X-XI əsrlərdə yaşamışdı.

**Hafiz Əbu Abdullah Əhməd ibn Tahir ibn Nəcm Miyanəci**

Yaşadığı dövrün böyük hədis hafizlərindən biri idi. Hədis dinləmək məqsədiylə uzun səyahətlərə çıxmışdı. Əbu Müslim əl-Kəcci, Abdullah ibn Əhməd ibn Hənbəl, Yəhya ibn Muhəmməd əl-Hinnayi, hafiz Əbu Bəkr Əhməd ibn Harun Bərdici, hafiz Əbu Osman Səid ibn Əmr Bərdəidən hədis dinləmiş və nəql etmişdi. Bir müddət Hələbdə qalmış və bu şəhərin qazisi Əbu İshaq İbrahim ibn Cə'fər ibn Cabirdən hədis dərsləri almışdı[924]. Abdullah ibn Əbu Zur'ə əl-Qəzvini, Əbu Bəkr Yusif ibn Qasım Miyanəci**,** Yaqub ibn Yusif Ərdəbili, Əhməd ibn Hüseyn Marağİ və Əhməd ibn Faris əl-Lüğəvi ondan hədis dinləmişdilər. Əhməd ibn Faris əl-Lüğəvi müəllimi haqqında demişdi:

---

[921] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV s. 379-380; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. III, s. 255; Şəmsəddin Muhəmməd ibn Əli İBN TOLON əs-Sahili, *Səğru'l-Bəssam fi zikri mən Vəlyə Qəza'u'ş-Şam*, s. 40-41, Beyrut 1956; KƏTTANİ, *Zeyl Tarixi-Məvlidi*, s. 109. Əbdüləziz Kəttani alimin h. 375-cı ilin şaban ayında (dekabr 985) vəfat etdiyini qeyd etmişdir.

[922] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. IV, s. 176.

[923] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV s. 379-380; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. VI, s. 366; İBNü'l-QEYSƏRANİ, *Ənsabü'l-Müttəfiqə*, s. 50.

[924] İBNü'l-ADİM, *Buğyətü't-Tələb*, C. II, s. 211.

"Mən ömrümdə onun misli bərabəri ola biləcək hədis alimi görmədim". Alimin ölüm tarixi h. 350-cı (961-971) illərə təsadüf edir. O, doğma şəhəri Miyanədə vəfat etmişdi[925]. İbnü'l-Adim öz əsərində hafiz Əbu Abdullah Əhməd Miyanəci haqqında ətraflı məlumat verdikdən sonra onun nəbəvi tibbə aid nəql etdiyi bir hədisi də qeyd etmişdir: Əbu Hüreyrə (ا) dedi: Rəsulullah (ق) buyurdular: "Yerarmudu (insanların əkib becərməsinə ehtiyac olmadan yayılmış) mannı kimi bir ruzidir, suyu göz xəstəliyi üçün şəfadır, əcvə[926] xurması isə cənnət meyvələrindəndir, zəhərlənməyə qarşı faydalıdır"[927].

**Qazi Əbu'l-Həsən Əli ibn Həsən ibn Əli Miyanəci**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Dərin biliyi və fəzilətli şəxsiyyəti ilə tanınmışdı. Bağdadda təhsil almış, qazi Əbu Təyyib ət-Təbərinin və Əbu İshaq Şirazinin tələbəsi olmuş, bu iki alimdən fiqh elmini öyrənmişdi. O, şairliyi ilə yanaşı ərəb ədəbiyyatı və kəlam elmləri sahəsində də mütəxəssis idi. Əbü'l-Həsən Əli ibn Ömər Qəzvini, Əbu Muhəmməd Həsən əl-Xəllal, Əbü'l-Hüseyn Əhməd ən-Nuridən hədis dinləmişdi. Əbu'l-Həsən Əli Miyanəci Həmədan şəhəri qaziliyinə təyin olunmuşdu. H. 471-ci ilin şəvval ayında (aprel 1079) məsciddə sübh namazını qılarkən batıni-xaşxaşi sui-qəsdçilər tərəfindən qətlə yetirilmişdi[928].

**Qazi Əbu Bəkr Muhəmməd ibn Əli ibn Həsən ibn Əli Miyanəci**

Şafi'i məzhəbinə mənsub mühəddis və fəqih olan Əbu Bəkr Muhəmməd Miyanəci zahirən yaraşıqlı insan olmaqla yanaşı kəskin zəkalı, saleh və fəzilətli insan idi. Əbü'l-Fəzl Əhməd ibn İsa Dinəvərinin tələbəsi olmuş, ondan hədis dərsləri almışdı. Bundan başqa o, Həmədanın qabaqcıl hədis alimlərdən də hədis dinləmiş və hədis elmlərinə

---

[925] İBN ƏBDÜLHADİ, *Təbəqatu-Üləma*, C. III, s. 124; ZƏHƏBİ, *Kitab Təzkərətü'l-Hüffaz*, s. 931-932; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV, s. 379-380; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. III, s. 229; İBNü'l-QEYSƏRANİ, *Ənsabü'l-Müttəfiqə*, s. 50.
[926] Əcvə xurması Mədinə şəhərində yetişən xurma növüdür. Yerarmudu isə dünyanın bir çox yerində, o cümlədən Azərbaycanda yetişir və müalicəvi bitki kimi şöhrət tapmışdır. Xalqa arasında bu bitkini "yeralması" və ya "dombalan" da adlandırırlar (latınca: Helianthus tuberosus). Yerarmudunun müalicəvi əhəmiyyəti haqqında ətraflı məlumat üçün bax: http://az.wikipedia.org/wiki/Yerarmudu
[927] İBNü'l-ADİM, *Buğyətü't-Tələb*, C. II, s. 211. [الكماة من المن وماؤها شفاء للعين، والعجوة من الجنة وهي شفاء للسقم]. Bu və bənzəri hədislər üçün bax: İBN MACƏ, *Sünən*, Tibb, 8/3454.
[928] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. V, s. 368; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV, s. 379-380; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. II, s. 215-216; HİMYƏRİ, *Nisbə ilə'l-Məvazi'*, C. I, s. 620.

dair biliklərə yiyələnmişdi. Atası qazi Əbu'l-Həsən Əli Miyanəcinin qətlə yetirilməsindən sonra Həmədan şəhəri qaziliyi vəzifəsinə təyin olunmuş və bir müddət bu vəzifəni icra etmişdi. O, şeyxülislam Əbu İshaq İbrahim Şirazinin (öl. 1074) yaxın dostlarından biri idi[929]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Əynü'l-Quzat Əbu'l-Məali Abdullah ibn Muhəmməd ibn Əli ibn Hüseyn ibn Əli Miyanəci**

Şafi'i məzhəbinə mənsub fəqih idi. h. 490-cı ildə (1097) anadan olmuşdu. Qazi Əbu'l-Həsən Əli Miyanəcinin nəvəsi və qazi Əbu Bəkr Muhəmməd Miyanəcinin oğlu idi. Babası və atasından sonra Həmədan qazisi vəzifəsini icra etmişdi. Əbu'l-Məali Abdullah Miyanəci həm də mütəkəllim, ədib və şair idi. O, Əbü'l-Fütuh Əhməd ibn Muhəmməd Qəzzalinin[930] (öl. 1126) tələbəsi olmuş, həmçinin Ömər Xəyyamdan (öl. 1131) da dərs almışdı. İbnü'l-Fuvati və Beyhəqi onun haqqanda "o, fəlsəfə ilə sufiliyin sintezini yaratmışdı" demişdirlər[931]. Neo-platonist (yeni əflatunçu) fəlsəfi cərəyanın davamçılarından olan Əynü'l-quzat öz əsərlərində məşşai (aristotelçi) fəlsəfi cərəyanın təmsilçilərinin fikirlərini cəsarətlə tənqid edirdi. Bu cür çıxışları ilə tezliklə rəqiblərinin diqqət və tənqidlərini öz üzərinə çəkmişdi. Onu hüluliyyə[932] etiqadında olmaqda təqsirləndirmişdilər[933]. Onun elmi irsini araşdırmış müasir tədqiqatçılar da Əynü'l-quzatın Muhyəddin ibnü'l-Ərəbidən (1165-1240) yarım əsr əvvəl vəhdəti-vücud doktrinasını meydana çıxardığı fikrindədirlər[934]. Əynü'l-quzat Miyanəcinin İraq

---

929 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV, s. 379-380; ŞƏHRƏZURİ, *Təbəqati'l-Füqəhai'ş-Şafi'iyyə*, C. I, s. 230.

930 Hüccətülislam Əbu Hamid Qəzzalinin (1058-1111) kiçik qardaşı idi.

931 İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1131-1132; Zəhirəddin Əli ibn Zeyd BEYHƏQİ, *Tətimmət Səuanü'l-Hikmə*, v. 43b, AMEA Əİ Fondu, Nr: Fp-744.

932 Hüluliyyə lüğətdə hər hansı bir şeyin başqa bir şeyin içində həll olması, əriməsi, iki ayrı şeyin bütünləşməsi mənasını ifadə edir. Dini-etiqadi anlayış olaraq hüluliyyə, qısaca desək, xaliq ilə məxluqatı, yəni yaradan ilə yaradılmışları eyniləşdirən əqidədir. Məsələn budistlər Buddanın Tanrı ilə bütünləşdiyinə, daha doğrusu, Tanrının Buddanın vücudunda təcəlli etdiyinə inadıqları üçün onun bütünə sitayiş edirlər. Xristianlıqda Tanrının İsa (×) peyğəmbərdə və Müqəddəs Ruh dedikləri varlıqda təcəlli tapdığına inanıldığı üçün onlar Tanrı ilə eyniləşdirilir və təslisə (üçlü birliyə) etiqad edilir. Hülul etiqadı panteist fəlsəfənin əsasını təşkil edir. Panteist düşüncə tərzi isə ümumiyyətlə bütün politeist, çoxtanrılı dinlərin, yəni bütpərəstliyin, bənzətmə yerində isə, onurğa sütununu təşkil edir. Bu etiqad həmçinin zərdüştilikdə, məzdəkilikdə və xürrəmilikdə də var idi. Hüliliyyə İslamın tövhid anlayışına qəti surətdə zidd inancdır. Sufizmdəki "fəna fillah" inancı hüluliyyənin yontularaq İslami qılığa büründürülmüş formasıdır. Hüluliyyəyə dair ətraflı məlumat üçün bax: Təqiyəddin Əbü'l-Abbas Əhməd İBN TEYMİYYƏ, *Hüseyn b. Mansur el-Hallac*, (Trc. M. Bayram), s. 15-22, Konya (trz).

933 TƏRBİYƏT, *Danişməndan*, s. 84.

934 MƏMMƏDOV, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, 21.

Səlcuqlu sultanı II Toğrulun (1131-1135) vəziri Əbü'l-Qasım Dərgəzini ilə münasibətləri pis idi, vəzir onu xoşlamırdı. Onun ətrafındakı vəziyyətin gərginliyini fürsət bilən vəzir alimin əsərləri əsasında şikayət hazırlayıb Bağdad qazilərinə təqdim etmişdi. Əynü'l-quzat Miyanəcinin bəzi fikirləri cəbriyyə[935] məzhəbinin etiqadi əsasları ilə üst-üstə düşürdü. Məsələn o, Qur'andakı iman və zəlalət məfhumlarının rəmzi xarater daşıdığını iddia edirdi. Onun fikirlərinə görə bədbəxtlik olmasaydı xoşbəxtlik, günah olmasaydı səvab olmazdı. Küfrlə iman da beləcə bir-birinin tamamlayıcısı olduğu üçün Peyğəmbərin (ق) imanı ilə iblisin zəlaləti də bir-birinin tamamlayıcısı idi. Bu da o mənaya gəlir ki, əslində küfr olmasa idi iman da olmazdı[936]. Belə görünür ki, onun fikirlərinin formalaşmasında müəllimi Əhməd Qəzzalinin böyük rolu olmuşdu. Çünki Əhməd Qəzzalinin (öl. 1126) "Tövhidi şeytandan öyrənməyən kafirdir" sözü yaşadığı dövrün sünni fəqihləri tərəfindən böyük qəzəblə qarşılanmış, etirazlara və şikayətlərə səbəb olmuşdu. İfrat sufizmdə şeytan qüsursuz Allah aşiqi hesab olunur, çünki o, Allahın əmr etməsinə baxmayaraq ondan başqasına, yəni Adəmə, səcdə etməmiş və ifrat mistiklərin dili ilə desək şeytan "sənin tərəfindən lənətlənmək, qovulmaq üzümü səndən başqasına tərəf çevirməkdən mənim üçün min dəfə daha yaxşıdır" söyləmişdi[937]. Əynü'l-quzat Miyanəci məhkəmənin qərarı ilə h. 7 cəmaziyəaxir 525-ci ildə (7 may 1131) Həmədanda edam edilmişdi[938]. Şübhəsiz ki, Əynü'l-Quzat Miyanəcini edam kürsüsünə qədər aparan, vəzir Əbü'l-Qasım Dərgəzininin siyasi intirqaları deyil, onun özünün sahib olduğu əqidə idi. Bu əqidə Hüseyn ibn Mənsur əl-Həllac (öl. 922), Şihabəddin Yəhya Sührəvərdi (öl. 1191), Şəmsi-Təbrizi (öl. 1247), Fəzlullah Nəimi Əstərabadi (öl. 1401), İmadəddin Nəsimi (öl. 1417) kimi daha bir çox şəxsin ömrünü edam və ya sui-qəsdlə başa vurmalarına səbəb olmuşdu.

---

[935] Cəbriyyə etiqadi məzhəblərdən biridir. Etiqadi məsələlərdə "cəbr" feeli, yəni insanın gördüyü işi, əməli, tamamən insanın iradəsindən ayıraraq Allaha aid etməkdir. Cəbriyyə məzhəbi iki qola ayrılmışdılar: xalis və mötədil. Xalis cəbriyyəçilərə görə insan heç bir feel və iradəyə sahib deyil. Yəni bütün əməl və feellərin sahibi Allahdır. Məsələn xalis cəbriyyəçilərə görə "bina tikildi" demək əslində "binanı Allah tikdi" deməkdir. Bu bir növ insanı Allah qarşısındakı məsuliyyətdən də azad edir. Çünki işlənən günahları da əslində insan işləməmiş olur. Daha ətraflı məlumat üçün bax: Muhəmməd ibn Əbdülkərim ŞƏHRİSTANİ, *Miləl və'n-Nihal*, (Trc. M. Öz), s. 85, İstanbul 2008.

[936] ULUDAĞ-BAYBURTLUGİL, Nurettin, "Aynü'l-Kudat Hemedanî" , **İA** (TDV), C. IV, İstanbul 1991, s. 280-282.

[937] Annamarie SCHİMMEL, *İslamın Mistik Boyutları*, (Trc. E. Kocabıyık), s. 195, İstanbul 2001.

[938] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. IV, s. 365-366; ULUDAĞ-BAYBURTLUGİL, *həmin məqalə*, s. 280-282; Məhəmməd Əli Tərbiyət onun asılaraq edam edildiyini yazır: *yenə orada*.

Əynü'l-quzat Abdullah Miyanəci "Risalətü'l-Yəminiyyə"[939], "Zübdətü'l-Həqaiq fi Kəşfü'd-Dəqaiq", "Tərcüməyi-Kənzü'l-Həqaiq fi Kəşfü'd-Dəqaiq", "Təşbihü'l-Mü'min bi'l-Mədinə"[940] kimi bir neçə əsərin müəllifi idi. Onun məlum olan bir digər əsəri isə "Şəqvai'l-Qərib əni'l-Ətvan ilə Üləmai'l-Büldan" idi[941].

**Əbu Bəkr Əhməd ibn Həccaf əl-Azəri Naxçıvani**

Mühəddis idi. Dəməşqdə təhsil almış və buradakı alimlərdən hədis dinləmişdi. Daha sonra hədis dinləmək üçün səyahətə çıxmışdı. Bəəlbəkdə[942] Əbu Dəhdah və Əbu's-Səriy Muhəmməd ibn Davuddan, Hərranda[943] Əbü'l-Həsən Muhəmməd ibn Əhməd əl-Vaqifidən, Tunisdə Əbü'l-Abbas ibn Vəşadan hədis dinləmişdi. Bundan başqa onun hədis dinlədiyi ravilər arasında Əbu Cə'fər Muhəmməd ibn Hüseyn ibn Yəzid və Əbu Übeydullah Muhəmməd ibn Yəzid də var idi. Əbü'l-Abbas Əhməd ibn Hüseyn Naxçıvani, Əbü'l-Həsən Abdullah, Əbu Saleh Şueyb Təbrizi (öl. 1109), Muhəmməd ibn Əhməd ibn Kürdan, Əbü'l-Fəth Saleh ibn Əhməd əl-Azəri, Əbu Abdullah Muhəmməd ibn Musa əl-Azəri ondan hədis dinləmişdilər[944]. Ölüm tarixi məlum deyil. XI əsrdə yaşamışdır.

**Muhəmməd ibn Həsən Naxçıvani**

Şafi'i məzhəbinə mənsub mühəddis və fəqih idi. Hədis dinləmək üçün bir sıra şəhərlərə səyahət etmişdi. İranın Hulvan şəhərində Əbü'l-Həsən Əli ibn Əhməd ibn Musa Dəməşqidən hədis dinləmişdi. H. 388-ci (998) ildə Qəzvində Rəbiə ibn Əli əl-İclidən hədis dərsləri almışdı[945]. Ölüm tarixi məlum deyil, X-XI əsrlərdə yaşamışdır.

**Şeyxü'l-İslam Əlaəddin Əbu Abdullah Muhəmməd ibn İsa ibn Əli Naxçıvani**

---

939 KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 1108.
940 KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 287.
941 MƏMMƏDOV, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, s. 21.
942 Bəəlbək-indiki Livan ərizisində yerləşən şəhər.
943 Hərran-Türkiyənin cənubi-şərqində şəhər.
944 YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. V, s. 437.
945 RAFİ'İ, *Tədvin*, C. I, s. 99.

XIII əsrdə yaşamış, Azərbaycanda qazilik və hakimlik kimi vəzifələrdə çalışmışdı. Yaşadığı dövrdə şafi'i fiqhinin böyük alimlərindən biri kimi tanınmışdı. İbnü'l-Fuvati onu "şeyxü'l-məşayixü'l-İslam", bütün şeyxlərin şeyxi kimi vəsf etmişdi. Şeyxü'l-İslam Əlaəddin Naxçıvani həmçinin görkəmli ədib idi və ərəbcə çox gözəl qəzəllər yazırdı[946]. Ölüm tarixi məlum deyil.

**Əbu Hatim Əbdürrəhman ibn Əli ibn Yəhya ibn Muhəmməd ibnü'r-Rəvvas Naxçıvani**

Mühəddis idi. Übeyd ibn Muhəmməd ibn Übeyd əl-Məşriqi və Buceyd ibn Muhmməd ibn Buceyddən hədis dinləmiş və nəql etmişdi. Xudadad ibn Asim Naxçıvani də ondan hədis dinləmişdi. Həmçinin vaiz Əbu Tahir İbrahim Səlmasi də onun tələbəsi olmuş, ondan hədis dinləmişdi[947]. Ölüm tarixi məlum deyil. X-XI əsrlərdə yaşamışdır.

**Muhəmməd ibn Əli Naxçıvani**

Mühəddis idi. Əbdülkərim Rafi'i onu "əl-ğazi" ləqəbi ilə tanıtmışdır. Müəllifin qeydindən Muhəmməd Naxçıvaninin hərbiçi, mücahid olduğu məlum olur. Ehtimal ki, Muhəmməd ibn Əli Naxçıvani Azərbaycan Atabəylərinin ordusunda xidmət etmişdir. Çünki onun yaşadığı dövr Eldənizlərin hakimiyyəti illərinə təsadüf edir. Rafi'i həmçinin Muhəmməd Naxçıvaninin mömin və saleh insan kimi tanındığını yazmışdır. Muhəmməd Naxçıvani h. 591-ci ildə (1195) Qəzvində bu şəhərin qazisi Hüseyn ibn Əhməd ibn Bəhramdan hədis dərsləri almışdı[948].

**Təbib Fəxrəddin Əhməd ibn Qəribşah[949] ibn Əli ibn Cəbrayıl Naxçıvani**

---

[946] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1093.
[947] İBN MAKULA, *İkmal*, C. I, s. 426; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV, s. 426; İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LVIII, s. 376.
[948] RAFİ'İ, *Tədvin*, C. I, s. 165.
[949] Mərhum akademik Ziya Büyadov əsərində onun adını "Əhməd ibn Ərəbşah" olaraq qeyd etmişdir. (bax: *Azərbaycan Atabəyləri Dövləti*, s. 229). Mərhum akademikin istinad etdiyi İbnü'l-Fuvatinin əsərində isə şəxsin adı [أحمد بن عريب شاه] "Əhməd ibn Əribşah" (yaxud "Əhməd ibn Ureybşah") kimi qeyd edilmişdir. Özü özlüyündə "Əribşah" və ya "Ureybşah" bir ad kimi məna ifadə etmir. Bu adın [أحمد بن غريب شاه] "Əhməd ibn Qəribşah" kimi oxunması daha münasibdir. Fikrimizcə əlyazma təhqiq edib çapa hazırlanarkən [غ] "ğəyn" hərfinin üzərindəki nöqtə ya oxunmamış ya da texniki xəta səbəbiylə [ع] "əyn" olaraq çap edilmişdir. Yəni buradakı yanlışlıq ərəb orfoqrafiyasının xüsusiyyətlərindən irəli gələn dolaşıqlıqdan başqa bir şey deyil. Adlardakı bənzər bir oxunuş xətasını irəlidə də

Yaşadığı dövrün tanınmış həkimlərindən biri, həmçinin ədib idi[950]. Ölüm tarixi məlum deyil. Təqribən XII-XIII əsrlərdə yaşamışdır.

**Təbib Nəcməddin Əhməd ibn Əbu Bəkr ibn Muhəmməd Naxçıvani**

Yaşadığı dövrün tanınmış həkim, mütəfəkkir və dövlət xadimi olan Nəcməddin Naxçıvani təqribən 1215-1222-ci illərdə Naxçıvanda dünyaya gəlmişdi[951]. O, uzun səyahətlərdən sonra Anadoluya gedib orada yaşamışdı. İbnü'l-İbri onun Naxçıvanda təhsilini başa vurduqdan sonra Anadoluya getdiyini yazır[952]. İbn Bibi onu "imami-müəzzəm", böyük lider adlandırmış və Nəcməddin Naxçıvanini bütün fənnlərdə və elmlərdə dalğalanan dənizə, işıq saçan qəndilə və yağış dolu buluda bənzətmişdi[953]. Tarixçi yazırdı: "O, (Nəcməddin Naxçıvani-E.N) əqli və nəqli elmlərdə mahir idi, şəriət və hikmət elmlərini özündə toplamışdı"[954]. Anadolu Səlcuqlu dövlətinin səltənət naibi Cəlaləddin Qaratay Nəcməddin Naxçıvaniyə vəzirlik vəzifəsini təklif etmişdi. Nəcməddin Naxçıvani dövlət məmurlarının illik maaş miqdarlarının yarıya qədər azaldılması şərti ilə bu təklifi qəbul etmişdi. O, moğol təhlükəsi ilə qarşı-qarşıya qalan Anadolu Səlcuqlu dövlətinin xəzinəsinin iri dövlət məmurları tərəfindən talan edildiyinin fərqində idi. Mülki və hərbi məmurların etirazına rəğmən Cəlaləddin Qaratay bu şərti qəbul etmişdi. Nəcməddin Naxıçıvani vəzirlik etdiyi beş il ərzində korrupsiyanın kökünü kəsməyə müvəffəq ola bilmədiyini görüb istefa etmişdi. İstefasından sonra Anadoluda çox qalmayan Nəcməddin Naxçıvani Suriyaya gedib Hələb şəhərində yaşamışdı[955]. Nəcməddin Naxçıvani güman ki, Cəlaləddin Qaratayın vəfatından (11 noyabr 1254) sonra Anadolunu tərk etmişdi.

---

təqdim edəcəyik. Fikrimizcə bunun əsas səbəbi əsəri təhqiq edərək çapa hazırlamış Dr. Mustafa Cavadın Azərbaycan tarixi və mədəniyyətinə dərindən bələd olmamasıdır. Əslində naşirdən belə bir şeyi gözləmək də əbəs olardı. Çünki İbnü'l-Fuvatinin əsəri bütün İslam coğrafiyasını əhatə etmiş bioqrafik ensklopediyadır və naşirin belə böyük və rəngarəng coğrafiyadakı bütün ölkələrin tarixini və mədəniyyətini bilməsi xeyli müşkül olardı.

[950] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 95

[951] Muhəmməd Bağer XANSARİ, *Rəvzətü'l-Cənnat fi Əhvali'l-Üləma və'Sə'adat*, C. I, s. 77, Tehran 1306.

[952] Əbü'l-Fərəc Qriqoriy İBNü'l-İBRİ, *Tarixu Müxtəsərü'd-Düvəl*, s. 172, Beyrut 1992.

[953] İBN BİBİ, *Əvamirü'l-Əlaiyyə*, s. 294-295.

[954] *Yenə orada*.

[955] İBN BİBİ, *Əvamirü'l-Əlaiyyə*, s. 296.

Hələbdə məskunlaşandan sonra Nəcməddin Naxçıvani guşənişin həyatı sürərək nadir hallarda evindən çıxır, insanlarla ünsiyyətdən uzaq dururdu[956]. O, İbn Sinanın əsərlərini oxumuş və bəzi məsələlərdə İbn Sinanı tənqid etmişdi. Digər bir azərbaycanlı alim Əfzələddin Xunəci onun İbn Sinaya bu tənqidi münasibətini "Kəşfü'l-Əsrar" adlı əsərində tənqid etmişdi[957]. İbnü'l-İbri Nəcməddin Naxçıvanidə tənasüx məzhəbinə qüvvətli meyl olduğunu qeyd etmişdir[958]. Bu Nəcməddin Naxçıvaninin fəlsəfənin işraqi metodunu mənimsədiyini göstərir. Ehtimal ki, İbn Sinanın timsalında məşşai fəlsəfəni tənqid etməsi və guşənişin həyat tərzini seçməsi də onun işraqi fəlsəfi cərəyana mənsubiyytindən irəli gəlirdi. Ömrünün son günlərini Hələbdə keçirmək istəməsinin səbəbi də alimin işraqi fəlsəfəyə qüvvətli bağlılığı ola bilər. Çünki bu fəlsəfi cərəyanın banihisi hesab olunan, əl-Məqtul ləqəbi ilə tanınan, Şihabəddin Yəhya Sührəvərdi (öl. 1191) də ömrünü Hələb zindanında başa vurmuşdu. İşraqiliyin güclü simalarından Nəsimi də ömrünü başa vurmaq üçün Hələbi münasib bilmişdi. Nəcməddin Naxçıvani 1302-ci ildə Hələbdə vəfat etmişdi.

"Zübdətü'n-Nəqz və Lübabü'l-Kəşf", "Şərhü'l-İşarat və't-Tənbihat", "Lübabü'l-Məntiq və Xülasətü'l-Hikmə", "Nəqz Qəvaidü'l-İşarat", "Kəşf Təmvihü'ş-Şifa və'n-Nəcat" Nəcməddin Naxçıvaninin məlum olan əsərləridir[959]. O, həmçinin "Həll Şükulü'l-Qanun fi't-Tibb" adlı əsərin müəllifi idi. Bu əsər Əbu Əli ibn Sinanın (öl. 1037) "Qanun fi't-Tibb" adlı əsərindəki bəzi məsələlərin izahına həsr olunmuşdu. Təbib Əhməd Naxçıvaninin bu əlyazma əsəri Paris milli kitabxanasında saxlanılır[960]. Nəcməddin Naxçıvaninin "Şərhü'l-İşarat və't-Tənbihat" adlı əsərinin əlyazma nüsxələrindən biri İstanbul Nuriosmaniyyə, digəri isə Köprülü əlyazma əsərlər kitabxanasında saxlanılır. Manisa İHK-ndə isə alimin "Zübdətü'n-Nəqz və Lübabü'l-Kəşf" adlı əsərinin əlyazma nüsxəsi mövcuddur.

**Təbib Əkmələddin Müəyyəd ibn Əbdüllətif Naxçıvani**

---

[956] İBNü'l-İBRİ, *Tarixu Müxtəsərü'd-Düvəl*, s. 172.
[957] *Yenə orada;* MƏMMƏDOV, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, s. 37.
[958] İBNü'l-İBRİ, *Tarixu Müxtəsərü'd-Düvəl*, s. 172. [و كان شديد الميل إلى مذهب التناسخ]
[959] MƏMMƏDOV, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, s. 37-38.
[960] DE SLANE, *həmin əsər*, 524; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. I, s. 112.

XIII əsrin tanınmış həkimlərindən biri olan, Bəy Həkim adı ilə şöhrət tapmış Əkmələddin Naxçıvani Anadolu Səlcuqlu dövlətində sərtəbib, yəni səhiyyət naziri vəzifəsini icra etmişdi[961]. Əkmələddin Naxçıvani mövlana Cəlaləddin Ruminin sadiq müridlərindən biri olmuşdu. "Mənaqibü'l-Arifin"də onunla bağlı bir neçə rəvayət qeyd edilmişdir. Əhməd Əflaki onu "Əsrin Hippokratı, Rum həkimlərinin ulularından biri, mislilsiz mövlana Əkmələddin Təbib" kimi tanıtmaqdadır[962]. Onun əslən Azərbaycanın Naxçıvan diyarından olduğu Cəlaləddin Ruminin oğlu Sultan Vələdin (öl. 1312) "Divan"ındakı bir qəsidədən məlum olur. "Divan"dakı 41 beytlik №387 qəsidənin 1-dən 22-ci beytə qədər olan hissəsi müvəşşəhdir. Yəni beytlərin başlanğıc hərfləri ilə, şaquli olaraq, "Əkmələddin Müəyyəd Naxçıvani" adı oxunmaqdadır[963]. Carl Brockelmann isə onun atasının adının Əbdüllətif olduğunu müəyyən etmişdir[964].

Cəlaləddin Ruminin "Məktubat"ındakı XIV, XCIII və CXXII nömrəli məktublar Əkmələddin Naxçıvaniyə yazılmışdır. XCIII məktub "Hünərvər, gözəl etiqadlı, özü doğru oğlumuz, təbiblərin fəxri, həkimlərin tacı, Əkməlü'l-Həqq və'd-Din" cümləsi ilə başlayır. Mövlana Cəlaləddin Rumi bu məktubda Konyadakı "Fəxrəddin Arslandoğmuş" mədrəsəsinin baş müdərris vəzifəsinin yaxın vaxtlarda boşalacağı, "Qaratay" mədrəsəsinin müdərrisi Şəmsəddin Mardininin bu vəzifəyə təyin ediləcəyini, "Qaratay" mədrəsəsinin bəzi tələbələrinin isə onun yerinə təyin olunacaq şəxsin onları sıxışdıracağından əndişəli olduqlarını yazır. Məktubun sonunda isə Cəlaləddin Rumi özünün və Hüsaməddin Çələbinin "Qaratay" mədrəsəsi baş müdərrisliyinə Əfsəhəddin Mü'id adlı şəxsin təyin olunmasını çox arzu etdiklərini yazmış, Səlcuqluların səhiyyə nazirinə "bu işi də siz görə bilərsiniz" deyə müraciət etmişdir[965].

Yuxarıda Əkmələddin Naxçıvaninin Bəy Həkim ləqəbi ilə tanındığını qeyd etimişdik. Hal-hazırda Konyanın Bəy Həkim məhəlləsindəki məscid, bir vaxtlar daha geniş ərazini əhatə edirdi və yanında xəstəxana binası da mövcud olmuşdu[966]. Məscidin divarlarına

---

[961] ÜNVER, *Selçuklu Tababeti*, s. 92-93.
[962] Əhməd ƏFLAKİ, *Ariflerin Menkıbeleri*, (Trc. T. Yazıcı), C. I, s. 117, İstanbul 1989.
[963] SULTAN VƏLƏD, *Divan*, (Nşr. F.N.Uzluk), s. 230-232, Uzluk Basımevi 1941.
[964] Carl BROCKELMANN, *Geschıchte der Arabıschen Lıtteratur*, E.S, C. I, s. 54, Leiden 1937.
[965] Mövlana Cəlaləddin RUMİ, *Mektuplar*, (Trc. Ə. Gölpınarlı), s. 137-138, İstanbul 1963.
[966] ÜNVER, *Selçuklu Tababeti*, s.66.

indi də diqqətlə baxıldıqda bir vaxtlar onun bitişiyində başqa bir binanın olduğunun müşahidə etmək mümkündür. Osmanlı sultanı Fateh II Mehmedin (1451-1481) dövründə bu bina Bəy Həkim vəqfinin nəzdində olmuşdur. Konyanın müxtəlif yerlərində Bəy Həkim vəqfinə aid mülklər var idi[967].

Mövlana Cəlaləddin Rumi ölüm döşəyində ikən yanında təbib Qəzənfər Təbrizi ilə birlikdə təbib Əkmələddin Naxçıvani də var idi[968]. Buradan öyrənirik ki, 1274-cü ildə Əkmələddin Naxçıvani hələ həyatda idi. Alimin məlum olan tək əsəri İbn Sinanın "Qanun fi't-Tibb"inə yazdığı şərhdir. İnşaallah bu əsər gələcəkdə tərəfimizdən nəşr ediləcəkdir. Əkmələddin Naxçıvaninin İbn Sinaya duyduğu heyranlığın həddi onun bu sözlərindən məlum olur: [باتّفاق حکماء ماضی و حالی اعتقاد آنست که اگر بعد از حضرت مصطفی پیغمبر آمدی و ممکن بودی حقیقت ابن سینا خواست بودی][969] "Keçmiş və indiki hükəmanın (filosofların) ittifaq etdikləri qətaət budur ki, əgər həzrəti Mustafadan (Muhəmməd ق) sonra peyğəmbərin gəlməsi mümkün olsaydı bu əlbəttə ki, İbn Sina olacaqdı". Əkmələddin Naxçıvaninin ölüm tarixi 1274-cü ildən sonraya təsadüf edir. O, Konyada vəfat etmiş və Bəy Həkim məscid və xəstəxanasının yanındakı türbədə dəfn olunmuşdu.

### Təbib Kəmaləddin Əbü'l-Fəzl Muhəmməd ibn Əbü'l-Fəzail Naxçıvani

Yaşadığı dövrün dərin bilikli həkimlərindən biri, xəstəliklərin təşxisi, müayinəsi və mücalicəsi işində böyük mütəxəssis idi. Kəmaləddin Naxçıvani Əhərə gələrək fütuvvət şeyxi Qütbəddin Əhərinin müridi olmuşdu. Burada o, dərvişlər kimi xirqə geymiş və şeyx Qütbəddinin zaviyəsində yaşamışdı. İbnü'l-Fuvati onu ehtiramla yad edərək yazır ki, özünün moğol əsiriyindən azad edilməsində Kəmaləddin Naxçıvaninin xidməti olmuşdu[970]. İbnü'l-Fuvati yeniyetməlik illərində Bağdadın işğalı (1258) vaxtı moğollara əsir düşmüşdü. Təəssüf ki, İbnü'l-Fuvati həkim Kəmaləddin Naxçıvaninin ölüm tarixini qeyd etmir. Müasiri olduğuna görə onun da XIII-XIV əsrlərdə yaşdığını təxmin etmək olar.

---

[967] Feridun Nafız UZLUK, *Fatih Devrinde Karaman Eyaleti Vakıfları Fihristi*, s. 29, Ankara 1958.
[968] RUMİ, *Mektuplar*, (Önsöz qismi), s. 228.
[969] ÜNVER, *Selçuklu Tababeti*, s. 66.
[970] BÜNYADOV, "Vidnıye Deyateli Azerbaydjana v Soçinenii İbn al-Fuvati", s. 61-67.

**Şeyx Muhyəddin Əbu Abdullah Muhəmməd ibn Abdullah ibn Əhməd Naxçıvani**

Şafi'i məzhəbinə mənsub fəqih idi. İbnü'l-Fuvati onun əslən Tuslu olduğunu, onu h. 705-ci (1306) ildə Arranda sultanın (ehtimal ki, Elxani hökmdarı Olcaytunun (1304-1316)-E.N) düşərgəsində gördüyünü, burada Muhyəddin Naxçıvaninin şafi'i fəqihlərinin rəisi Raziyəddin ibn Əli ibn Təus əl-Hüseyni ilə görüşdüyünü qeyd edir. İbn Fuvati həmçinin Naxçıvanda daşınmaz əmlak və sərvət sahibi olan şeyx Muhyəddin Naxçıvaninin tanınmış şeyxlərin nəslindən olduğunu yazmışdır[971].

**Əbu Musa Harun ibn Həyyan Naxçıvani**

Hədis ravisi idi. Əbdürrəhman ibn Abdullah əd-Dəşkətidən hədis dinləmiş və nəql etmişdi. Əbu İshaq İbrahim ibn Ğəniyy əl-Ərvəmi ondan hədis dinləmişdi[972]. Ölüm tarixi dəqiq məlum deyil. Təqribən 860-870-ci illərdə vəfat etmişdir.

**Əbu Bəkr Əhməd ibn Muhəmməd ibn Əli ibn Əhməd ibn Amir Naxçıvani**

Şafi'i məzhəbinə mənsub mühəddis idi. H. 362-ci (973) ildə Qəzvinə gələrək burada hədis dərsləri vermişdi. Əbu Bəkr Əhməd Naxçıvani Qasım ibn İsmayıl əl-Mühamili, Hüseyn ibn İsmayıl əl-Mühamili, Əbü'l-Həsən Muhəmməd əl-Müseysidən hədis dinləmiş və nəql etmişdi. Əbdülkərim Rafi'i öz əsərində nəql silsiləsində Əbu Bəkr Naxçıvaninin də olduğu aşağıdakı hədisi qeyd etmişdir. Abdullah ibn Ömər (ا) dedi: Allah Rəsul (ق) buyurdular ki: "Qədəri (qəzavüqədəri) inkar edən küfr etmişdir"[973].

**Şeyx Səlahəddin Həsən ibn Ömər Bulğari Naxçıvani**

Şeyx Səlahəddin Həsən Naxçıvani Azərbaycanın tanınmış təsəvvüf şeyxlərindən idi. O, h. 603-cü (1206) ildə Naxçıvanda anadan olmuşdu. Yeniyetməlik illərində atası vəfat edən Səlahəddin Naxçıvani anası və qardaşı ilə birlikdə Azərbaycanın Xoy şəhərinə gedərək orada məskunlaşmışdı. 23 yaşında o, anasını da itirmişdi. Bundan 2 il sonra,

---

[971] BÜNYADOV, *həmin məqalə*.

[972] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV, s. 426.

[973] RAFİ'İ, *Tədvin*, C. II, s. 43. [ابن عمر، يقول: قال رسول الله ﷺ، من كذب بالقدر فقد كفر بما جئت به]. Əbu'ş-Şüca Şiruyə əd-Deyləminin "Firdəvsü'l-Əxbar" adlı hədis külliyatında demək olar ki, eyni mətin Əbu Hüreyrə (ا) yolu ilə nəql olunmuşdur. Həmçinin bax: Müttəqi əl-HİNDİ, *Kənzü'l-Ümmal fi Sünən*, Nr. 12/664.

1231-ci ildə moğol noyanı Cormağunun[974] Azərbaycanı işğalı vaxtı Səlahəddin Naxçıvani moğollara əsir düşmüşdü. O, təqribən yeddi il moğolların əlində əsir olmuş, əsirlikdən azad olduqdan sonra doqquz il Bolqar[975] ölkəsində yaşamışdı. Bu səbəblə də Bulğari nisbəsi ilə tanınmışdı. Bu illərdə təsəvvüfə meyl etmişdi. Səid Nəfisi onun fütuvvət şeyxi Əbu'n-Nəcib Sührəvərdinin dostlarından biri olduğunu yazır[976]. Lakin Əbu'n-Nəcib Sührəvərdinin h. 563-cü ildə (1168), yəni şeyx Səlahəddin Naxçıvaninin təvəllüdündən 38 il əvvəl vəfat etdiyini nəzərə alaraq bunun mümkün olmadığını söyləyə bilərik. Ehtimal ki, şeyx Səlahəddin Naxçıvani təsəvvüfdə fütuvvət əhlinin yolunu mənimsəmişdi və Əbu'n-Nəcib Sührəvərdinin də daxil olduğu bir məşayix silsiləsinə intisab etmişdi. Fikrimizcə şeyx Səlahəddin Naxçıvani kübrəviyyə təriqəti şeyxi Sə'dəddin Həmmuyənin (öl. 1254) müridlərindən biri olmuş və fütuvvət məşrəbini də bu yolla mənimsəmişdi. Çünki yenə Səid Nəfisi şeyx Səlahəddin Naxçıvaninin şeyx Sə'dəddin Həmmuyənin "Risaləyi-Qəlbü'l-Münqəlib" adlı əsərini ərəbcədən farscaya tərcümə etdiyini bildirmişdir[977]. Şeyx Səlahəddin Naxçıvani Bolqar ölkəsindən Məvəraünnəhrə gəlmiş və üç il Buxarada yaşamışdı[978]. Daha sonra təqribən h. 648-ci (1250) ildə Azərbaycana gəlmiş və h. 672-ci (1273) ildə Azərbaycandan İrana gedərək 24 il Kirmanda yaşamışdı. H. 697-ci ilin cəmadiələvvəl ayında (fevral 1298) Azərbaycana qayıtmış və Təbrizdə yaşamışdı. Şeyx Səlahəddin Naxçıvani h. 2 rəbiələvvəl 698-ci ildə (8 dekabr 1298) Təbrizdə vəfat etmiş və Surxab qəbristanında dəfn edilmişdi. Şeyx Səlahəddin Naxçıvani, yuxarıda haqqında bəhs etdiyimiz, tərcümə əsəri ilə yanaşı farsca qələmə aldığı təsəvvüfi şerlərin də müəllifi idi[979].

### Şeyx Baba Nemətullah ibn Əbü'l-Fəzl Mahmud Naxçıvani

[974] Cormağun noyanın əmri altındakı ordular moğolların Azərbaycana ikinci yürüşü vaxtı Xarəzmşah Cəlaləddin Məngübərtini məğlub etmiş, bir sıra şəhərləri, o cümlədən Xoyu işğal etmişdilər. Cormağun Noyanın Azərbaycana yürüşü haqqında daha ətraflı məlumat üçün bax: Timothy MAY, *Chormaqan Noyan: The First Mongol Military Governor in the Middle East*, s. 29-94, Indiana 1996.
[975] Bolqar ölkəsi-Xəzər dənizinin şimalında, Volqa çayı hövzəsində yaşamış bolqar türklərinin ölkəsi.
[976] NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. II, s.744.
[977] NƏFİSİ, *yenə orada.*
[978] TƏRBİYƏT, *Danişməndan*, s. 388.
[979] TƏRBİYƏT, *yenə orada*, s. 388; NƏFİSİ, *yenə orada.*

Hənəfi məzhəbinə mənsub müfəssir və təsəvvüf şeyxi idi. Baba Nemətullah Anadoluda, indiki Konya vilayətinin Ağşəhir qəsəbəsində yaşamış və burada "Əlvan Ağşəhri" kimi tanınmışdı. Baba Nemətullah abid, zahid, xoşrəftar və həlim insan idi. Osmanlı imperatorluğunda yaşamış təfsir alimlərinin ən məşhurlarından biri olmuşdu. Onun Qur'ani-Kərimin təfsirinə dair yazdığı risalələr asan anlaşılan idi və gözəl üslubda qələmə alınmışdı. Əsərlərini ərəb, fars və türk dillərində qələmə alan Baba Nemətullah həmçinin filoloq idi. Onun tərtib etdiyi farsca-türkcə lüğət Konya Yusifağa kitabxanasında saxlanılır. "Təfsiri-cüzi'n-Nəbə" alimin Qur'ani-Kərimin Nəbə surəsinə yazdığı təfsirdir. Bu əsərin bir nüsxəsi İstanbul Atif əfəndi kitabxanasındadır. Onun "Risalə fi't-Təsəvvüf" adlı əsərinin bir nüsxəsi İstanbul Nuriosmaniyyə kitabxanasında mövcuddur. Baba Nemətullahın "Şərhu-risaleyi-Əsrari'n-Nöqtəyi-Bəsmələ" adlı adlı təfsirə dair əsərinin h. 923-cü ildə (1516) Təbrizdə üzü köçürülmüş nüsxəsi Türkiyə Əskişəhir İHKdır. Alimin təfsir sahəsindəki ən tanınmış əsəri "Fəvatihü'l-İlahiyyə və'l-Miftahü'l-Qeybiyyə"dir. Türkiyənin əlyazma əsər kitabxanalarında bu əsərin bir çox nüsxəsi mövcuddur. Ən qədim nüsxəsi isə Baba Nemətullahın öz dəsti-xətti ilə h. 902-ci ildə (1497) yazdığı İstanbul Topqapı muzeyi kitabxanası, sultan III Əhməd bölməsində saxlanılır. "Fəvatihü'l-İlahiyyə" 1908-ci ildə İstanbulda iki cild olaraq çap olunmuşdur. Bundan başqa Baba Nemətullah "Hidayətü'l-İxvan", şeyx Mahmud Şəbüstərinin "Gülşəni-Raz" adlı əsərinə şərhin, qazi Nasirəddin Bəyzavinin "Ənvarü't-Tənzil və Əsrarü't-Tə'vil" adlı Qur'an təfsirinə h. 900-cü ildə (1495) yazdığı haşiyənin də müəllifi idi. Alim h. 920-ci ildə (1514) Aqşəhirdə vəfat etmişdir və məzarı Baştəkkə yolu yaxınlığındadır[980].

**Əbü'l-Qasım Qanət ibn Əli ibn Əhməd Naxçıvani**

[980] TAŞKÖPRÜZADƏ, *Şəqaiqü'n-Numaniyyə*, s. 214; ƏDNİRƏVİ, *Təbəqatü'l-Müfəssirin*, s. 170-171; KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. II, s. 381, 669, 1233; NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 282. Ədnirəvi digər alim haqqında məlumat verən digər müəlliflərdən fərqli olaraq onun "İbn Əlvan ər-Rumi" ləqəbi ilə tanındığını və 902-ci ildə (1497) vəfat etdiyini qeyd etmişdir.

Mühəddis idi. H. 591-ci (1195) ildə Qəzvində bu şəhərin qazisi Hüseyn ibn Əhməd ibn Bəhramdan və digər başqa alimlərdən hədis dərsləri almışdı[981]. Ölüm tarixi məlum deyil.

**Əbu Səid Sələmə ibn Bəndar ibn Hüseyn əl-Ərməniyyi Naxçıvani**

Əslən Ərməniyyədən olan azərbaycanlı mühəddis idi. Naxçıvanda yaşamış, daha sonra Bağdada getmiş və orada Əbu Bəkr Süfyan ibn Səid əl-Misri, Muhəmməd ibn Əli ibn Əbü'l-Hədid əl-Misri, Bəkr ibn Əhməd ət-Tunisi, Muhəmməd ibn Ömər əd-Dəməşqidən hədis dinləmiş və nəql etmişdi. Əbü'l-Həsən Muhəmməd ibn Əhməd əl-Bəzzaz Bağdadi ondan hədis dinləmişdi[982]. Ölüm tarixi məlum deyil. IX-X əsrlərdə yaşamışdır.

**Şeyx Şəmsəddin Əbu Abdullah Muhəmməd ibn İbrahim ibn Muhəmməd ibn Əbdürrəhman Naxçıvani**

Şafi'i məzhəbinə mənsub mühəddis idi. İbrahim ibn Əli ibn Muhəmməd ibnü'l-Hübubi, Əli ibn Muhəmməd ibn Harun, Əli ibn Ömər Vani, Əbü'l-Abbas Əhməd ibn Muhəmməd Məqdisi, Əbdürrəhim ibn Əbdülmühsin əl-Minşavi və Əbü'l-Həsən Əli ibn İsa ibnü'l-Qəyyimdən[983] hədis dinləmişdi. Şeyx Şəmsəddin Muhəmməd Naxçıvani zahirən xoş simalı olmaqla yanaşı, ləyaqətli, cəsur və dərin zəka sahibi insan idi. Qahirədəki "Səidü's-Süəda" xanəgahının şeyxi idi və burada hədis tədrisi, irşad və mənəvi tərbiyə ilə məşğul olmuşdu. Şeyx Şəmsəddin Naxçıvani H. 21 məhərrəm 738-ci ildə (19 avqust 1337) şeyxi olduğu xanəgahında vəfat etmiş və Sufiyyə qəbristanında dəfn edilmişdi[984].

**Şeyx Şəmsəddin Əbu Abdullah Muhəmməd ibn Əhməd ibn Muhəmməd Naxçıvani**

---

981 RAFİ'İ, *Tədvin*, C. IV, s. 76.
982 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV, s. 426.
983 Bu şəxs məşhur mühəddis Şəmsəddin ibnü'l-Qəyyim əl-Cəvziyyə (öl. 1350) deyil, başqasıdır.
984 İBN RAFİ', *əl-Vəfayat*, s. 9; MƏQRİZİ, *Kitabü'l-Müqəffə*, C. V, s. 99.

Şafi'i məzhəbinə mənsub fəqih idi. h. 645-ci ildə (1247) Anadoluda, Ağsaray şəhərində anadan olmuşdu. Təhsil almaq məqsədiylə Anadoludan Misirə getmişdi. Misirdə şeyx Şəmsəddin əl-İsbəhaninin tələbəsi olmuş, ondan fiqh və fiqh üsulu dərsləri almışdı. Təhsilini bitdikdən sonra Misirdəki əl-Fəyyum mədrəsəsində tədrislə məşğul olmuşdu. Daha sonra Bəybarsiyyə xanəgahı şeyxliyinə təyin olunmuş, burada irşad və mənəvi tərbiyə ilə məşğul olmuşdu. Bu xanəgah Qahirədən şimalda, Nil deltasında yerləşirdi. Şeyx Şəmsəddin Naxçıvani bütün Misirdə xeyirxah, fəzilətli və saleh insan kimi tanınmışdı. O, h. 13 zilqədə 722-ci ildə (23 noyabr 1322) vəfat etmişdi. Cənazəsi Qahirə yaxınlığındakı Babü'n-Nəsr adlanan yerə gətirilmiş və cənazə namazını Misirin baş qazisi Bədrəddin Muhəmməd ibn Cəmaə qıldırmışdı. Alim Babü'n-Nəsrdəki əs-Sufiyyə qəbristanında dəfn edilmişdi[985].

**Əbü'l-Abbas Əhməd ibn Hüseyn ibn Nəbhan Naxçıvani**

Hədis ravisi idi. Əbu Bəkr Əhməd ibn Həccaf əl-Azəri Naxçıvanidən hədis dinləmiş və nəql etmişdi. Hədis hafizi Əbu Abdullah Naxçıvani və Əbu Hatim Əbdürrəhman ibnü'r-Rəvvas Naxçıvani də Naxçıvanda onun dərslərində iştirak etmiş və ondan hədis dinləmişdilər[986]. Ölüm tarixi məlum deyil. Təqribən X-XI əsrlərdə yaşamışdır.

**Əbü'l-Fəzl Xudadad ibn Asim ibn Bəkran Naxçıvani**

Yaşadığı dövrün tanınmış mühəddislərindən idi. O, Gəncədə kitabxana xəzinədarı işləmişdi. Bağdad və bir sıra digər şəhərlərdə olmuş, buradakı ravilərdən hədis dinləmişdi. Əbdülkərim ər-Rafi'inin yazdığına görə Əbü'l-Fəzl Xudadad Naxçıvani bir müddət Qəzvində olmuş və burada mühəddis İbrahim ibn Hümeyr əl-Xiyaricidən hədis dinləmişdi[987]. Onun hədis dinlədiyi mühəddislərdən Əbu Nəsr Əbdülvahid ibn Hubeyrə Qəzvini, Həsən ibn Əli, Əbu Müslim Əbdürrəhman Nəhavəndi, Əbu Saleh Şueyb ibn Saleh Təbrizinin adlarını sadalamaq olar. Əbü'l-Müfərrəc ibn Əbu Abdullah Naxçıvani ondan hədis dinləmişdir. Məşhur bioqraf və tarixçi Əli ibn Hibətullah ibn

[985] MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. V, s. 279.
[986] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. V, s. 437; İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LVIII, s. 376.
[987] RAFİ'İ, *Tədvin*, C. III, s. 22.

Makula (öl. 1082) öz əsərində Gəncədə onun tələbəsi olduğunu və ondan hədis dinlədiyin qeyd etmişdi[988]. Əbü'l-Fəzl Xudadad Naxçıvaninin ölüm tarixi məlum deyil. XI əsrdə yaşamışdır.

"Mu'cəmü'l-Büldan" xaricində alim haqqında məlumat verən bütün mənbələr onun adını "Xudadad" olaraq qeyd edirlər. Sadəcə Yaqut əl-Həməvi öz əsərində alimin adını "Həddad" olaraq qeyd etmişdir. Mərhum akademik Ziya Bünyadov da onun adını, Yaqut əl-Həməviyə istinadən, "Həddad ibn Bəkran Naxçıvani" olaraq qeyd etmişdir[989].

**Şeyx Əli ibn Əhməd əs-Səudi Naxçıvani**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Qahirədə yaşamış, bu şəhərin Babü'l-Qunturə səmtindəki zaviyədə irşadla məşğul olmuşdu. H. 19 ramazan 740-cı ildə (19 mart 1340) vəfat etmişdi. Onun cənazə mərasimi xeyli izdihamlı olmuşdu. Qahirə əhalisi ilə yanaşı, şəhərin bütün qaziləri və fəqihləri onun dəfnində iştirak etmişdilər[990].

**Hafiz Əbu Abdullah Naxçıvani**

əl-Mişkani ləqəbi ilə tanınan alim yaşadığı dövrün məşhur hədis hafizlərindən biri idi. O, həmçinin şafi'i məzhəbi üzrə fəqih idi. Əbü'l-Abbas Əhməd ibn Hüseyn ibn Nəbhan Naxçıvanidən hədis dinləmiş və nəql etmişdi[991]. Ölüm tarixi məlum deyil. XI əsrdə yaşamışdır.

**Əbü'l-Müfərrəc ibn Əbu Abdullah Naxçıvani**

Hədis ravisi idi. Hafiz Əbu Abdullah Naxçıvaninin oğlu idi. Atasından və Əbü'l-Fəzl Xudadad Naxçıvanidən hədis dinləmiş və nəql etmişdi[992]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

---

[988] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV, s. 426; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. II, s. 156, C. VI, s. 437; İBN MAKULA, *İkmal*, C. I, s. 142, C. II, s. 459.

[989] Bax: BÜNYADOV, *Azərbaycan Atabəyləri Tarixi*, s. 231. "Həddad" ərəb dilində dəmirçi mənasını ifadə edir. "Xudadad" isə kifayət qədər yayğın addır və fars dilində "Allahın verdiyi, Allahverdi" mənasını ifadə edir.

[990] İBN RAFİ', *əl-Vəfayat*, s. 29.

[991] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. V, s. 437; ƏBU TAHİR İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, s. 379.

[992] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. V, s. 437; ƏBU TAHİR İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, s. 379-380.

**Fəxrəddin Əbü'l-Qasım Əli ibn Nəmim ibn Xələf Naxçıvani**

Qari idi. Həmçinin hədis dərsləri vermişdir[993]. Ölüm tarixi və ya yaşadığı dövr haqqında İbnü'l-Fuvati heç bir məlumat verməmişdir.

**Əbu Abdullah Muhəmməd ibn Yusif Naxçıvani**

Qari idi. Qur'ani-Kərimin qiraət və təcvidini Əbu Bəkr ibnü'l-Cəndi və digər alimlərdən öyrənmişdi. Qahirədəki Zahiriyyə və Bəybarsiyyə mədrəsələrində "sədrü'l-qurra"[994], yəni Qur'an qiraəti dərsləri verən müəllimlərin başçısı idi. Misirdə onun qiraət dərslərində çox sayıda tələbə iştirak edirdi. Alim h. 811-ci ilin şaban ayında (yanvar 1409) vəfat etmişdi[995].

**Şihabəddin Əhməd ibn Həsən ibn Əli ibn Abdullah Naxçıvani**

Hənəfi məzhəbinə mənsub fəqih idi. Mədinədə yaşamışdı. H. 891-ci ildə (1486) Qahirəyə getmiş, buradakı alimlərin yanında müxtəlif elmi biliklərə yiyələnmiş, daha sonra Mədinəyə qayıtmışdı. Mədinədə hərameynin hənbəli qazisi Şərif əl-Muhyəvinin yanında imam Buxarinin "Səhih" adlı hədis külliyatını oxumuşdu. Daha sonra Şəmsəddin Marağinin tələbəsi olmuşdu. Mədinə şəhərində yaşayıb elmi fəaliyyət və tədrislə məşğul olan Şihabəddin Əhməd Naxçıvani təqribən h. 920-ci ildə (1514) bu şəhərdə vəfat etmişdi[996].

**Şeyx Şihabəddin Əhməd ibn Mahmud ibn Muhəmməd əl-Cə'fəri Naxçıvani**

Şeyx seyyid Şihabəddin Əhməd şafi'i məzhəbinə mənsub fəqih idi. Dəməşqdəki Sümeysatiyyə xanəgahının şeyxi olmuş, burada fiqh dərsləri ilə yanaşı mənəvi tərbiyə

---

[993] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 239.

[994] Müasir təhsil sistemi ilə müqayisə edəcək olsaq bu "Qur'an qiraəti kafedrası müdürlüyü" kimi vəzifədir deyə bilərik.

[995] İBNü'l-CƏZƏRİ, *Qayətü'n-Nihayə*, s. 734.

[996] Şəmsəddin Əbü'l-Xeyr Muhəmməd ibn Əbdürrəhman əs-SƏXAVİ, *Tuhfətü'l-Lətifə fi Tarixi'l- Mədinətü'ş-Şərifə*, C. I, s. 67, Qahirə 1958.

və irşadla da məşğul olmuşdu. Şeyx Şihabəddin Əhməd h. 781-ci ilin şəvval (yanvar 1380) ayında vəfat etmişdi[997].

**Vəzir Fəxrəddin Əbü'l-Fəzl Muhəmməd ibn Deyləmşah ibn Muhəmməd Naxçıvani**

Əsilzadə və vəzir ailəsində yetişmiş şəxs idi. Eldənizlilərin hakimiyyəti dövründə (1136-1225) Naxçıvanda divanü'l-istifada[998] qulluq etmişdir. Lakin o, bütün var-dövlətini, vəzifəsini və dünya işlərini buraxaraq Əhərə getmişdi. Burada sufi şeyxi Qütbəddin Əbdülqadir ibn Həmzə Əhərinin xidmətinə daxil olmuş və onun əlindən xirqə geyərək təsəvvüf yoluna qədəm qoymuşdu. İbnü'l-Fuvati Fəxrəddin Əbü'l-Fəzl Naxçıvanini h. 659-cu (1261) ildə Əhərdə gördüyünü, onun kafirlərin (ehtimal ki, moğol əsgərlərini nəzərdə tutur) əlindən qaçdığını qeyd etmişdir. İbnü'l-Fuvati yazır: "onu daha sonra h. 670-ci ildə (1272) Marağada gördüm. Nəsirəddin Tusi (öl. 1274) onunla görüşmüş, ona ehtiramını bildirmiş və onu təqdir etmişdi". İbnü'l-Fuvatinin bildirdiyinə görə Fəxrəddin Əbü'l-Fəzl Naxçıvani həmçinin şair idi və farsca gözəl şerlər deyirdi. Fəxrəddin Əbü'l-Fəzl Naxçıvani h. 678-ci ilin rəcəb ayında (noyabr 1279) vəfat etmişdi[999].

**Fəxrəddin Hinduşah ibn Səncər ibn Abdullah əs-Sahibi Naxçıvani**

XIII-XIV əsrlərdə yaşamış azərbaycanlı tarixçi, dövlət xadimi, siyasət nəzəriyyəçisi, filoloq və ədib idi. Naxçıvanın Gilan qəsəbəsində dünyaya gəlmişdi. Bu qəsəbənin qalıqları indi Xaraba-Gilan adlanır və Ordubad rayonun Kələntər-Dizə kəndi yaxınlığında yerləşir[1000]. Hinduşah Naxçıvani Bağdadda, Müstənsiriyyə mədrəsəsində təhsil almış, daha sonra bu mədrəsədə dərs vermişdi. O, qardaşı Seydəddin Mahmud Naxçıvani ilə birlikdə Elxanilərin sarayında qulluq etmişdi. Elxanilərin vəzirlərindən sahibi-divan Əlaəddin Ətaü'l-Mülk Cüveyni və onun oğlu Şəmsəddin Muhəmmədlə yaxın münasibətləri səbəbiylə "əs-Sahibi" ləqəbi ilə tanınmışdı. H. 674-cü (1275) ildə

---

[997] İBN HƏCƏR, *İbnai'l-Ğumr*, s. 64.

[998] Divanü'l-İstifa-Maliyyə nazirliyi. Müstəvfi-maliyyə müfəttişi. Fəxrəddin Əbü'l-Fəzl Naxçıvani "vəzir" titulu daşıdığı üçün böyük ehtimalla sahibi-divanü'l-istifa (baş müstəvfi), yəni maliyyə naziri olmuşdur.

[999] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 325.

[1000] Xaraba-Gilan haqqında ətraflı məlumat üçün bax: Bəhlul İBRAHİMOV, "Qorodişe Xaraba-Qilan", **İrs Jurnalı**, № 1 (19), Bakı 2006, ss. 24-27.

Seyfəddin Mahmud Naxçıvani Elxanilər tərəfindən Kaşan[1001] hakimliyinə, qardaşı Hinduşah Naxçıvani isə onun naibliyinə, köməkçiliyinə təyin olunmuşdu. Ömrünün son illərində isə Hinduşah Naxçıvani Luristan atabəylərindən Nüsrətəddin Əhməd ibn Yusifşahın (1295-1330) sarayında işləmişdi. Alimin ölüm tarixi h. 730-cu (1330) ildən sonraya təsadüf edir. Hinduşah Naxçıvani müxtəlif elm sahələrinə dair bir neçə əsərin müəllifi idi. Bunlardan ən məşhuru onun h. 724-cü (1324) ildə yazıb başa çatdırdığı və Luristan atabəyi Əhmədə ithaf etdiyi "Təcaribü's-Sələf" adlı farsca əsərdir. Bu əsər əslində dövlət xadimi və tarixçi Səfiyəddin Muhəmməd İbnü't-Tiqtəqənin (1262-1309) "Münyətü'l-Füzəla fi Təvarixi'l-Xüləfa və'l-Vüzəra" adlı əsərinin ərəbcədən farscaya tərcüməsidir. İbnü't-Tiqtəqə bu əsərini Mosul hakimi əmir Fəxrəddin İsaya ithafən qələmə almışdı. Tarix, siyasət, dövlət idarəçiliyi və rəsmi protokol qaydaları haqqında olan bu əsər "Kitabü'l-Fəxri" adı ilə tanınmışdı. Lakin "Təcaribü's-Sələf" Hinduşah Naxçıvaninin əlavələri və şərhləri ilə "Kitabü'l-Fəxri"dən bir neçə dəfə daha iri həcmli hala gəlmişdi. Hinduşah Naxçıvaninin digər bir əsəri isə "Sihahü'l-Əcəmiyyə" adlı farsca-türkcə lüğətdir. Bu əsərin əlyazma nüsxələrindən biri Konya BYEK-də saxlanılır. Hinduşah Naxçıvani ədəbiyyatşünaslığa dair h. 730-cu (1330) ildə yazıb bitirdiyi "Məvaridü'l-Ədəb" adlı əsərin və farsca şerlərin toplandığı "Divan"ın müəllifi idi[1002].

**Şəmsəddin Muhəmməd ibn Hinduşah ibn Səncər Naxçıvani**

Hinduşah Naxçıvaninin oğlu və atasının elmi irsinin layiqli davamçısı olan Muhəmməd Naxçıvani Elxanilərin vəzirlərindən Rəşidəddin Fəzlullahın (öl. 1318) oğlu Qiyasəddin Muhəmmədin (öl. 1336) münşisi, katibi olmuşdu. Elxanilərin hakimiyyətinin sona çatmasından (1357) sonra təcrübəli dövlət xadimi kimi Cəlayiri hökmdarı sultan Üveys (1356-1374) tərəfindən saraya cəlb olunmuşdu. Cəlayirilər dövründə bir müddət dövlətin baş qazisi (qaziü'l-quzat) vəzifəsində çalışmışdır. Şəmsəddin Muhəmməd Naxçıvani özünün "Dəsturü'l-Katib fi Təyinü'l-Məratib" adlı dövlət təşkilatı və idarəetməyə dair əsəri ilə şöhrət tapmışdır. O, bu əsəri sultan Üveysə təqdim etmişdi.

---

[1001] Kaşan-İranda, Qumla İsfəhan arasında, Tehranın təqribən 190 km cənubunda yerləşən şəhər.
[1002] BAĞDADLI, *İzahü'l-Məknun*, C. II, s. 383; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. IV, s. 67; NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 184; TƏRBİYƏT, *Danişməndan*, s. 391.

Elxani hömdarı Əbu Səid Bahadır (1316-1335) Şəmsəddin Naxçıvaninin dövlət işlərindəki bacarıq və istedadını görərək ona bu mövzuda təfsilatlı bir əsər yazmağı tapşırmışdı. Lakin rəsmi işlərin çoxluğu səbəbiylə bu əsərin yazılıb başa çatdırılması xeyli vaxt aparmışdı. Buna görə də müəllif əsərini Cəlayirilərin hakimiyyəti illərində bitirə bilmişdi. Əsər axıcı və rahat dillə qələmə alınmışdı. Əsərdə torpaq mülkiyyət formaları, torpaqdan istifadə, kənd təsərrüfatının idarə edilməsi, kəndlilərin iqtisadi vəziyyətinin yaxşılaşdırılması, vergilər və onların yığılması, ədiliyyə sistemi, şəhərlərdəki ictimai-mədəni vəziyyət, ticarət və sənətkarlığın inkişaf etdirilməsi, məskun və köçəri əhalinin iqtisadi problemləri, emar fəaliyyətləri, şəhərsalma, körpülər, kanallar və yolların inşası, ordu nizamı, dövlət təşkilatı, məmurların iyerarxik nizamının qorunması, tanınmış elm və dövlət xadimləri, zadəganlar, iri bürokratlar, məşhur şəxsiyyətlər haqqında dəyərli məlumatlar verilmişdir. Əsərin maraqlı qismlərindən biri də "Dər icabəti-təyine-münhiyan və cəsusan" başlığı altında kəşfiyyat-istixbarat fəaliyyətlərinin əhəmiyyəti və təşkili haqqında Şəmsəddin Naxçıvaninin fikir və mülahizələrdir. O, bu mövzudakı fikir və mülahizələrini altı alt başlıqda izah etmişdir. Bu əsər eyni zamanda yazıldığı dövr üçün dəyərli tarixi mənbədir[1003]. Bu səbəblədir ki, "Dəsturü'l-Katib" Nizamülmülkün "Siyasətnamə"si və Rəşidəddin Fəzlullahın "Camiü't-Təvarix"i ilə bir səviyyədə tutulur[1004]. Əsərin dünyada 6 əlyazma nüsxəsinin olduğu bilinir. Bunlardan biri Ankarada, Milli kitabxanada, bir digəri isə İstanbulda, Köprülü yazma əsərlər kitabxanasında saxlanılır. "Dəsturü'l-Katib"in bütün əlyazma nüsxələri tədqiq edilərək hazırlanmış rusca mətni 1964 və 1976-cı illərdə Ə. Əlizadə tərəfindən Moskvada iki cild halında nəşr olunmuşdur. Şəmsəddin Muhəmməd Naxçıvani "Sihahü'l-Furs" adlı farsca-türkcə lüğətin də müəllifi idi. Alim h. 778-ci (1376) ildə vəfat etmişdir.

**Mövlana Muhəmməd ibn İdris Naxçıvani**

---

1003 NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 184; TƏRBİYƏT, *Danişməndan*, s. 391; Mustafa UYAR, "Hinduşah Nahçıvani'ye Ait Düstur el-Katib fi Ta'yin el-Meratib Adlı Eserde Casusluk Anlayışı", **AÜTAD**, XXIV/39, Ankara 2005, ss. 281-289. Dos. Dr. Mustafa Uyar mühüm bir səhvə yol vermişdir. "Dəsturü'l-Katib" Hinduşah Naxçıvani deyil, onun oğlu Muhəmməd ibn Hinduşah Naxçıvani tərəfindən qələmə alınmışdır.

1004 "Naxçıvanın Görkəmli Şəxsiyyətləri", http://shexsiyyetler.nakhchivan.az/meh_naxcivani.html

Təsəvvüf əhlinə mənsub alim idi. Təqribən XV-XVI əsrlərdə Osmanlı dövlətində yaşamış mövlana Muhəmməd Naxçıvaninin həyatı haqqında ətraflı məlumat yoxdur. O, mənəviyyat, tərbiyə, irşad və İslam əxlaqına dair "Füsul Mə'rifətü't-Təlbis və Üsuli't-Təmyiz beynə't-Təsəvvüf və't-Tədlis", "Tə'rifü't-Təlbis və Təbyidi-İblis" və "Tərcüməyi-Əxlaqi-Muhsinin" adlı əsərlərin müəllifi idi[1005]. Bunlardan ilk ikisi ərəbcə, sonuncusu isə türkcə qələmə alınmışdır. "Füsul Mə'rifət"in bilinən tək nüsxəsi Türkiyədə, Kastamonu İHK, "Tə'rifü't-Təlbis"in məlum olan yeganə nüsxəsi isə Konya BYEK-də saxlanılır.

**Qazi Sadiq Muhəmməd Naxçıvani**

Hənəfi məzhəbinə mənsub fəqih idi. Bir müddət Osmanlı mədrəsələrində müdərrislik etmişdi. H. 1011-ci ildə (1602-1603), Osmanlı imperatorluğunun Azərbaycandakı hakimiyyəti dövründə[1006], Gəncə şəhəri müftiliyinə təyin olunmuşdu. Osmanlı-Səfəvi müharibəsinin yenidən qızışdığı bir vaxtda, h. 1011-ci ilin ramazan ayında (mart 1603), İstanbula getmişdi. 1015-ci ildə (1606) Kiprdə Lefkoşa şəhəri mollalığına və qaziliyinə təyin olunmuşdu. Daha sonra Kiprdəki vəzifəsindən azad edilmişdi. Qısa müddət Filibə[1007] müftisi olan Sadiq Muhəmməd Naxçıvani daha sonra Bolqarıstanın Sofiya şəhəri müftiliyinə təyin olunmuşdu. Alim h. 1027-ci ilin rəcəb ayında (iyun 1618) vəfat etmişdi[1008].

**Molla Əbü'l-Hüda ibn Mahmud Naxçıvani**

Hənəfi məzhəbinə mənsub fəqih və mütəkəllim idi. Mövlana Muhyəddin Talışi, Molla Məzyəd Qaramani, İbnü'ş-Şair kimi alimlərdən dərs almışdı. Hələbə getmiş və bir müddət orada yaşamışdır. Şam vilayətindəki Kənaviyyə, Atabəkiyyə və Baraniyyə mədrəsələrində dərs vermişdi. Əbü'l-Hüda Naxçıvani həm də şair idi. O, farsca və

---

[1005] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 547; C. II, s. 359.

[1006] 12 il davam edən Osmanlı-Səfəvi müharibəsi 21 mart 1590-cı ildə İstanbulda bağlanan sülh müqaviləsi ilə nəticələnmişdi. Bu müqavilə ilə Kür və Araz çaylarından şimaldakı Azərbaycan torpaqları Osmanlı imperatorluğunun əlinə keçmiş, Şirvan və Dərbənd vilayətləri adı ilə 13 il Osmanlı idarəsində qalmışdı. Gəncə 1 sentyabr 1588-ci ildə Osmanlı ordusunun əlinə keçmişdi.

[1007] Filibə-Bolqarıstanın mərkəzində yerləşən, Osmanlı imperatorluğu dövründə türk və müsəlman əhalinin sıx yaşadığı şəhər idi. İndi Plovdiv adlanır.

[1008] SÜREYYA, *Sicil-i Osmani*, C. V, s. 1418

ərəbcə çox gözəl şerlər yazırdı. İnsanlarla az ünsiyyət saxlamağa çalışır, vaxtının çoxunu elmi tədqiqatla və ibadətlə keçirir, çox namaz qılırdı. Alim h. 939-cu ildə (1533) Əyntabda[1009] vəfat etmişdi[1010].

**Sə'dəddin Məs'ud ibn Osman ibn Məs'ud ibn Osman ibn Əli əl-Hərrani Naxçıvani**

Mühəddis idi. H. 550-ci (1155) illərdə Hərranda doğulmuş, bu şəhərdə böyümüşdü. Əbdülqəni ibn Süleyman ibn Bünyan, Nəcib əl-Hərrani və İbn Ərəfədən hədis dinləmişdi. İbn Rəfi' onunun tələbəsi olmuş, ondan hədis dinləmişdi[1011]. Ölüm tarixi məlum deyil.

**Əbu Abdullah Hüseyn ibn Cə'fər ibn Muhəmməd ibn Cə'fər ibn Davud ibn Həsən Səlmasi**

Mühəddis və siqa hədis ravisi idi. Bağdadda yaşamış, Əli ibn Muhəmməd ibn Əhməd ibn Keysan ən-Nəhvi, Əbdüləziz ibn Cə'fər əl-Xərəqi, Əbu Həfs ibnü'z-Zəyyat, Əbu Bəkr Muhəmməd ibn Abdullah əl-Bəhri, Əbu Ömər ibn Muhəmməd ibn Abbas ibn Həmmuyə, Əbu Həfs Ömər ibn Əhməd ibn Şahin, Əbü'l-Həsən Əli ibn Ömər Darəqutnidən hədis dinləmiş və nəql etmişdi. Hafiz və xətib Əbu Bəkr Əhməd ibn Əli ondan hədis dinləmiş və dinlədiyi hədisləri qeyd etmişdi. Xətib Əbu Bəkr Əhməd ibn Əli hədis alimlərinin Əbu Abdullah Hüseyn Səlmasini siqa, əmin və mötəbər hədis ravisi kimi tanıdıqlarını qeyd etmişdi. Əbu Abdullah Hüseyn Səlmasi Bağdadda Əbü'l-Hüseyn Muhəmməd ibn Əli əl-Vərraq, qazi Əbü'l-Qasım Əli ibn Həsən Tənuxi, Əbu Mənsur Əbdülkərim əl-Mütərrəz kimi tanınmış hədis alimlərinin müasiri olmuşdu[1012]. Əbu Abdullah Hüseyn Səlmasi həm də varlı tacir və xeyriyyəçi idi. O, çox sədəqə verir və fəqir insanların qayğısına qalırdı. Malik olduğu mal və əmlakın bir hissəsini kasıb və saleh insanlara paylamışdı. Əbu Abdullah Hüseyn Səlmasi isə h. 446-cı ilin cəmadiələvvəl ayının başında (8-18 avqust 1054) həcc ziyarətindən qayıdarkən Suriyada

---

[1009] Əyntab-və ya Anteb, Türkiyənin cənubi-şərqində, Suriya sərhəddində şəhər. İndi Qaziantep adlanır.
[1010] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s. 134.
[1011] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. III, s. 56.
[1012] XƏTİB BAĞDADİ, *Əsmai'l-Mübhəmə*, s. 18-19.

vəfat etmişdi[1013]. İbn Tağrıbirdi və İbnü'l-Cəvzi öz əsərlərində dövrün sultanının Bağdadda olarkən tacirlərdən və varlı insanlardan, ehtimal ki, hərbi səfər üçün, borc pul aldığını, Əbu Abdullah Hüseyn Səlmasinin də sultana 10 min dinar borc verdiyini qeyd edirlər[1014]. Lakin belə bir hadisənin baş verməsi, hadisələrin tarixi baxımından, mümkün görünmür. Sözü gedən iki mənbə dövrün sultanının adını qeyd etmirlər. Lakin həmin dövrdə Bağdada gələn sultan Böyük Səlcuqlu sultanı Muhəmməd Toğrul bəydən (1040-1063) başqası ola bilməzdi. Sultan Toğrul bəy Bağdada h. 25 ramazan 447-ci ildə (17 dekabr 1055) daxil olmuş[1015] və Abbasi xilafətini Büveyhi hegemoniyasından azad etmişdi. Yuxarıda qeyd etdiyimiz kimi Əbu Abdullah Hüseyn Səlmasi isə həcc ziyarətindən qayıdarkən 446-cı ilin cəmadiələvvəl ayının başında (8-18 avqust 1054) vəfat etmişdi. Buna görə də Əbu Abdullah Hüseyn Səlmasi ilə Sultan Toğrulun Bağdadda görüşmələri mümkün görünmür. Əgər belə bir hadisə həqiqətən də baş vermişdirsə, Əbu Abdullah Hüseyn Səlmasinin 10 min dinar borc verdiyi sultan ehtimal ki, onun yaşadığı dövrdə İraqda hakimiyyətdə olan Büveyhi hökmdarlarından Məlik Rəhim (1048-1055) olmuşdur. Lakin burada da bir tutarsızlıq var. Belə ki, şafi'i məzhəbinə mənsub, siqa bir mühəddisin imamiyyə etiqadını mənimsəmiş bir hökmdara borc verməsini ehtimal etmək çətindir. Çünki bu dövrdə Məlik Rəhim sultan Toğrula qarşı mübarizə aparırdı. Sultan Toğrul, Abbasi xəlifəsi Qaim bi-Əmrillahın (1031-1075) dəstəyi ilə İran və İraqdakı Büveyhi hakimiyyətinə son qoymuşdu. Əbu Abdullah Hüseyn Səlmasi həm mühəddis, həm də tacir olduğu üçün onun bu vaxt Səlcuqluların idarəsində olan İrana getdiyini və burada sultan Toğrulla görüşdüyünü ehtimal etmək olardı. Lakin İbnü'l-Cəvzi hadisənin məhz Toğrul bəyin Bağdada gəlişindən sonra baş verdiyini bildirir. Dr. Mehmet N. Özdemir, İbnü'l-Cəvziyə

---

[1013] XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. XIII, s. 156; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 394; İBN TAĞRIBİRDİ, *Nücumu'z-Zahirə*, C. II, s. 156; Əbü'l-Fərəc Əbdürrəhman ibn Əli İBNü'l-CƏVZİ, *Müntəzəm fi't-Tarixi*'l-Müluk və'l-Üməm, (Nşr. M. Ə. Əta-Əta M. Ə), C. VIII, s. 161, Beyrut 1992. Buradakı mənbələrdən sadəcə Xətib Bağdadi alimin həcc ziyarətindən vəfat etdiyi ayı qeyd etmişdir. Digərləri onun h. 446-cı ildə həcc ziyarətindən qayıdarkən vəfat etdiyini yazmış, lakin bunun həmin ilin hansı ayında baş verdiyini qeyd etməmişdirlər.
[1014] İBNü'l-CƏVZİ, *Müntəzəm fi't-Tarix*, C. VIII, s. 161; İBN TAĞRIBİRDİ, *Nücumu'z-Zahirə*, C. II, s. 156.
[1015] İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. IX, s. 462-463; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XII, s. 166-167.

istinadən, bu məlumatı heç bir tənqidi araşdırma aparmadan öz məqaləsində qeyd etmişdir[1016].

**Əbu İmran Musa ibn İmran ibn Musa ibn Hilal Səlmasi**

Mühəddis idi. Hədis dinləmək üçün çox səyahət etmişdi. Onun babası Musa ibn Hilal Səlmasi də tanınmış hədis ravisi idi[1017]. Dəməşqdə Əbü'l-Həsən ibn Cəusa, Əbu Təyyib Əhməd ibn İbrahim, Məkhula əl-Beyrutidən, Hələbdə Əbu Bəkr Muhəmməd ibn Bərəkətdən hədis dinləmişdi. Bundan başqa o, Bağdad, Kufə, Rey, Rəqqə, Nusəybin, Rəmlə və Həma şəhərlərini gəzmiş və burada Muhəmməd ibn Müxəllid əl-Əttar, Cə'fər ibn Muhəmməd əl-Xuldi kimi ravilərdən hədis dinləmişdi. Əbu Müzəffər Mihnəd ibn Müzəffər ibn Həsən Səlmasi, şərif Əbü'l-Qasım əz-Zeydi əl-Hərrani, Muhəmməd ibn Əhməd ibn Səfvət əl-Məsisi ondan hədis dinləmişdilər. İbn Əsakir onun hədis dinlədiyi və ondan hədis dinləmiş onlarla ravinin adını qeyd etmişdir. Alim h. 380-ci il rəbiülaxir ayında (iyul 990) Səlmasda vəfat etmişdi[1018].

**Şərəfəddin Əbü'l-Qasım İbrahim ibn Abdullah ibn Əbu Əyyub Səlmasi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. H. 828-ci ildə (1425) Səlmas şəhərində anadan olmuşdu. Ağqoyunlu imperatoru Uzun Həsənin (1453-1478) hakimiyyəti dövründə Təbriz şəhəri qaziliyinə təyin olunmuş, həmçinin bu şəhərdə müxtəlif fənnlərdən dərs vermişdi. O, həmçinin bir sıra əsərlərin də müəllifi idi. Şəmsəddin Səxavi, Şərəfəddin Əbü'l-Qasım Səlmasi ilə h. 886-cı ildə (1482) Məkkədə, həcc ziyarəti vaxtı tanış olduğunu qeyd etmişdir. Şərəfəddin Əbü'l-Qasım burada Şəmsəddin Səxavidən müsəlsəl hədislərə[1019] dair qısa müddətli dərs almışdı[1020].

---

[1016] Mehmet Nadir ÖZDEMİR, "Abbasi Halifeleri İle Büyük Selçuklu Sultanları Arasındakı Münasebetler", **SÜTAD**, S. 24, Konya 2008, ss. 315-369.

[1017] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. IV, s. 106.

[1018] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. VII, s. 187; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. IV, s. 106. Yuxarıda adları sadalanan şəhərlərdən Nusəybin Türkiyənin (Suriya sərhəddində), Rəmlə, Rəqqə, Həma isə Suriyanın şəhərləridir.

[1019] "Müsəlsəl hədis" üçün bax: AYDINLI, *Hadis Istılahları Sözlüğü*, s. 114-115.

[1020] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. I, s. 43.

**Şeyx Əlaəddin Əbu Abdullah Muhəmməd ibn Osman ibn Əhməd Səlmasi**

Şafi'i məzhəbinə mənsub fəqih, Qur'ani-Kərim hafizi idi. Bağdadda Nəzamiyyə mədrəsəsində fiqh dərsləri vermişdi. O, gözəl əxlaqlı, saleh və xoşrəftar insan idi. H. 616-cı ildə (1219) Bağdaddakı "əl-Qərənfilitin" Darü'l-Qur'anı[1021] şeyxliyinə təyin olunmuşdu[1022]. Ölüm tarixi məlum deyil. XII-XIII əsrlərdə yaşamışdır.

**Əbu Muhəmməd Həsən ibn Muhəmməd ibn Cə'fər ibn Davud ibn Həsən Səlmasi**

Hədis ravisi olan alim yuxarıda haqqında məlumat verdiyimiz Əbu Abdullah Hüseyn Səlmasinin əmisi idi. Hüseyn ibn Muhəmməd ibn Übeyd əl-Əskəridən hədis dinləmiş və nəql etmişdi. Əli ibn Əhməd əs-Sə'tri ondan hədis dinləmişdi. Əbu Muhəmməd Həsən Səlmasi h. 419-cu ilin səfər ayında (mart 1028) Mədinədə vəfat vəfat etmişdi[1023].

**Əbu Nəsr Muhəmməd ibn Həsən ibn Muhəmməd ibn Cə'fər ibn Davud ibn Həsən Səlmasi**

Səduq hədis ravisi idi. Əbu Muhəmməd Həsən Səlmasinin oğlu, Əbu Abdullah Hüseyn Səlmasinin əmisi oğlu idi. Əbu Tahir Muhəmməd ibn Əbdürrəhman əl-Müxəllis, Muhəmməd ibn Əli ibnü'n-Nəzir əd-Diybacidən hədis dinləmiş və dinlədiyi hədisləri qeyd etmişdi. Çox az hədis nəql etmişdi. Əbu Nəsr Muhəmməd Səlmasi h. 444-cü ilin rəiülaxir ayında (avqust 1052) vəfat etmişdi[1024].

**Əbu Tahir Muhsin ibn Cə'fər ibn Muhəmməd ibn Cə'fər ibn Davud ibn Həsən Səlmasi**

Siqa, yəni mötəbər hədis ravisi və fəqih idi. Bağdadda yaşayırdı. Əbu Abdullah Hüseyn ibn Cə'fər Səlmasinin qardaşı idi. O, qardaşından 10 yaş kiçik olduğunu deyirdi. Əli ibn Ömər əl-Hərbi, Əbu Həfs Ömər ibn Əhməd ibn Şahin, Əbu Tahir Muhəmməd ibn Əbdürrəhman əl-Müxəllisdən hədis dinləmiş, dinlədiyi hədisləri qeyd etmişdi. Bir

---

[1021] Müasir təhsil sistemi ilə müqayisə edəcək olsaq bu "Qur'an Elmləri Kafedrası Müdürlüyü" kimi vəzifədir deyə bilərik.

[1022] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1091.

[1023] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 394.

[1024] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 394-395.

müddət Əbu Hamid əl-İsfərayini[1025] ilə həmsöhbət olmuş, ondan şafi'i fiqhini öyrənmişdi. Alim 436-cı ilin şəvval ayında (may 1045) Bağdadda vəfat etmiş və cənazə namazını qardaşı Əbu Abdullah Hüseyn Səlmasi qıldırmışdı[1026].

**Əbü'l-Qasım Cə'fər ibn Muhsin ibn Cə'fər ibn Muhəmməd ibn Cə'fər ibn Davud Səlmasi**

Əbu Tahir Muhsin Səlmasinin oğlu, mühəddis və tarixçi idi. Bağdadda doğulub böyümüş, bu şəhərdəki tanınmış alimlərin tələbəsi olmuşdu. Atasından, həmçinin Əbu Muhəmməd Həsən əl-Xəllaldan hədis dinləmişdi. Tarixçi İbn Əsakir onun Bağdad şəhərinin tarixinə dair əsər qələmə aldığını bildirmişdi[1027]. Ölüm tarixi məlum deyil. XI əsrdə yaşamışdı.

**Əbu Qalib Səid ibn Muhsin ibn Cə'fər ibn Muhəmməd ibn Cə'fər ibn Davud Səlmasi**

Əbu Tahir Muhsin Səlmasinin oğlu, Əbü'l-Qasım Cə'fər Səlmasinin qardaşı idi. Mühəddis olan Əbu Qalib atasından hədis dinləmişdi. H. 440-cı ildə (1048) isə əmisi Əbu Abdullah Hüseyn ibn Cə'fər Səlmasidən hədis dərsləri almışdı[1028]. O, hədis elminə dair bir əsərin müəllifi idi. Ölüm tarixi məlum deyil. XI əsrdə yaşamışdır.

**Hacib Əbü'l-Fütuh Əhməd ibn Muhsin ibn Cə'fər Səlmasi**

Abbasi xəlifələrinin divanındakı haciblərdən[1029] biri idi. Xəlifə II Müqtəfi Billahın (1136-1160) hakimiyyəti dövründə baş haciblik vəzifəsinə təyin edilmiş, lakin daha sonra bu vəzifədən azad edilmişdi. Sarayda vəzir Əbü'l-Qasım Əli Zeynəbinin dərslərini

---

[1025] Əbu Hamid Əhməd ibn Muhəmməd İsfərayini (öl. 1016). Şafi'i məzhəbinə mənsub müctəhid alim idi. Əslən Xorasanın İsfərayin (Nişapur şəhərinin şimali-qərbində) qəsəbəsindən olub Bağdadda böyümüş və təhsil almışdı.

[1026] XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. XIII, s. 156; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 394-395.

[1027] İBN ƏSAKİR, *Mu'cəmü'ş-Şüyux*, s. 57.

[1028] İBN ƏSAKİR, *Mu'cəmü'ş-Şüyux*, s. 99.

[1029] Haciblik orta əsr müsəlman dövlətlərində mühüm saray vəzifələrindən biri idi. Haciblərin əsas işi əhalinin mülki məsələlərlə bağlı şikayətlərini dinləyərək qeyd etmək və bu şikayətləri dövlət başçısına çatdırmaq idi. Hansı məsələ ilə bağlı, kimin dövlət başçısının qəbuluna daxil olacağını da hacibləri müəyyənləşdirirdilər. Bu mənada haciblərin bir növ "ictimaiyyətlə əlaqələr" funksiyasını yerinə yetirdiklərini demək olar.

dinləmiş, saray protokolu və divan qaydalarını öyrənmişdi. H. 558-ci ildə (1163) vəfat etmişdi[1030].

**Əlaəddin Əbu Abdullah Muhəmməd ibn Əhməd ibn Muhəmməd Səlmasi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Bağdada getmiş və Nizamiyyə mədrəsəsində təhsil almışdı. Burada fiqh, fiqh üsulu sahəsində ixtisaslaşmışdı. Abid və zahid insan kimi tanınmışdı. Qur'an hafizi idi və çox tilavət edərdi. Saatlarla zikr etməklə məşğul olurdu. H. 638-ci ilin zilqədə ayının 4-ü (17 may 1241) vəfat etmişdi[1031].

**Xətib Qiyasəddin Əbu Mənsur Muhəmməd ibnü'l-Mübarək ibn İbrahim Səlmasi**

XIII əsrdə yaşamış Azərbaycanın bacarıqlı xətibi, şafi'i fəqihi, Qur'an hafizi idi. Bağdada gedərək bu şəhərdəki mədrəsələrdə təhsil almışdı. Bağdada mühəddislərindən hədis dinləmiş və hədis elmlərinə dair biliklərə yiyələnmişdi[1032].

**Şeyx İmaməddin Əbü's-Səud Sə'dullah ibn Hüseyn Səlmasi**

Hənəfi məzhəbinə mənsub fəqih və qari idi. H. 812-ci ildə (1409) Azərbaycandakı mədrəsələrdə təhsil almış, daha sonra təhsilini davam etdərmək üçün Misirə getmişdi. Qahirədə Sə'dəddin ibnü'd-Deyrinin tələbəsi olmuşdu. Şəmsəddin ibn Nəccardan Qur'ani-Kərimin qiraəti və təcvidini öyrənmişdi. Qur'an hafizi idi. Bir müddət Qahirədəki Berdibək camesinin imamı olmuş, daha sonra Qüdsdəki Məscidü'l-Əqsanın hənəfi camaatına imamlıq etmişdi. Sonra isə Dəməşq qazisinin müavini vəzifəsinə təyin olunmuşdu. H. 3 cəmadiələvvəl 890-cı ildə (18 may 1485) Qüdsdə vəfat etmişdi. Sə'dullah Təbrizi fəzilətli, nəcib, işində ədalətli və mömin insan idi. Bu kimi şəxsi keyfiyyətləri səbəbiylə Qüds və Dəməşq əhalisi onu sevir və ehtiram göstərirdilər[1033]. Şeyx İmaməddin Sə'dullah Səlmasinin h. 847-ci ildə (1444) öz dəsti-xətti ilə Qur'ani-

---

[1030] SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. VII, s. 199.
[1031] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1085.
[1032] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1213.
[1033] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 138.

Kərimin təcvid və tilavət qaydalarına dair qələmə aldığı bir risalənin nadir nüsxəsi Paris milli kitabxanasında mühafizə edilir[1034].

**Əbü'l-Həfs Ömər ibn Yusif ibn Hüseyn Səlmasi**

Hədis ravisi idi. Əhməd ibn Muhəmməd ibn Ömərdən hədis dinləmiş və nəql etmişdi. Hibətullah ibnü'l-Mübarək əs-Suqti[1035] də ondan hədis dinləmişdi[1036]. Ölüm tarixi məlum deyil. XI əsrdə yaşamışdır.

**Əbu Bəkr Muhəmməd ibn Osman ibn Həsən ibn İbrahim ibn Həsnuyə[1037] əl-Bəzzaz Səlmasi**

Mühəddis idi. h. 549-cu ilin rəcəb ayında (sentyabr 1154) Bağdadda dünyaya gəlmiş, bu şəhərdə böyümüş və təhsil almışdı. "əl-Bəzzaz" ləqəbindən özünün və ya ata-babalarından birinin parça taciri olduğunu təxmin etmək olar. Bağdadda mühəddis Əbü'l-Vəqt əs-Səcizinin tələbəsi olmuş, imam Buxarinin "Səhih"ini və bu əsərin şərhini oxumuş, ondan hədis elmini öyrənmişdi. Əbu Bəkr Muhəmməd Səlmasi h. 617-ci ilin rəbiəlaxir ayında (iyun 1220) Bağdadda vəfat etmişdi[1038].

**Əllamə Əbü'l-Həsən Müzəffər ibn Həsən ibn Mihnəd Səlmasi**

Mühəddis idi. Bağdadda və İraqın digər şəhərlərində Osman ibn İsmayıl əs-Sukkəri Bağdadi kimi mühəddislərdən hədis dərsləri almışdı. Onun hədis dinlədiyi ravilər arasında Əbü'l-Həsən ibn Cəusa, Əbu Bəkr ibn Ziyad Nişapuri də olmuşdur. Əbü'l-Həsən Müzəffər Səlmasi h. 359-cu ildə (970) İsfəhana gəlmiş və burada tələbələrə hədis dərsləri vermişdi. Hafiz Əbu Bəkr Əhməd ibn Musa, Əbü'l-Abbas Əhməd Naxçıvani, Əbu Bəkr Əhməd ibn Cərir ibn Hübeyş Süleymani ondan hədis dinləmişdilər[1039]. Oğlu Əbu Müzəffər Mihnəd Səlmasi də ondan hədis dinləmişdi. Ondan atasının məzhəbi

---

1034 DE SLANE, *həmin əsər*, s. 146-147.
1035 Əbü'l-Bərəkat Hibətullah ibnü'l-Mübarək əs-Suqti Bağdadi (öl. h. 509/1115) məşhur hədis alimlərindəndir.
1036 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 394-395; İBN HƏCƏR, *Lisanü'l-Mizan*, C. IV, s. 262.
1037 [حسنويه] – Bu ad Həsənveyh olaraq da oxuna bilər.
1038 ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'd-Dübeysi*, s. 49.
1039 İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LVIII, s. 376-377; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 394-395.

soruşulanda o, Əbü’l-Həsən Müzəffər Səlmasinin hədis əhlinin məzhəbindən və səhabə ilə tabiunun mənhəcinə mənsub olduğunu demişdi. Əbü’l-Həsən Müzəffər Səlmasi h. 381-ci ildə (991) Uşnuh[1040] şəhərində həbsxanada vəfat etmiş və cənazəsi Səlmasa aparılıb orada dəfn edilmişdir[1041]. İbn Əsakir onun hansı səbəbdən həbsxanaya düşdüyünü qeyd etmir. İbn Əsakir öz əsərində[1042] Əbü’l-Həsən Müzəffər Səlmasinin nəql etdiyi hədislərdən ikisini qeyd etmişdir:

Abdullah ibn Məs’ud (ا) dedi: Rəsulullah (ق) buyurdular ki; “Ölülərinizi saleh insanların arasında dəfn ediniz. Çünki yaşayan (hər hansı bir şəxs) özünün pis qonşusundan əziyyət gördüyü kimi ölü də pis qonşusundan əziyyət görür”[1043].

Ənəs ibn Malik (ا) dedi: Rəsulullah (ق) buyurdular ki; “(Dəfn edilmək üçün aparılan) cənazəni (məzara qədər) üç şey müşayət edər. Bunlardan ikisi geri qayıdar, biri isə qalar. Onu (ölünü) ailəsi, mal-dövləti və əməli müşayət edər. Ailəsi və mal-dövləti qayıdar, əməli qalar”[1044].

**Əbu Müzəffər Mihnəd ibn Müzəffər ibn Həsən ibn Mihnəd Səlmasi**

Mühəddis idi. Əbü’l-Həsən Müzəffər Səlmasinin oğlu idi və atasından hədis dinləmişdi. Həmçinin Əbu İmran Musa ibn İmran ibn Musa ibn Hilal Səlmasidən hədis dinləmiş və nəql etmişdi[1045]. Ölüm tarixi məlum deyil. X-XI əsrlərdə yaşamışdır.

**Qazi Əbu Bəkr Əhməd ibn Hureyz ibn Əhməd ibn Xumeyyis ibn Əhməd ibn Hüseyn ibn Musa Səlmasi**

Yaşadığı dövrün tanınmış mühəddislərindən idi. Onun hədis dinlədiyi və hədis elmlərinə dair bilikləri öyrəndiyi alimlərdən Əbu Əli Hüseyn ibn Muhəmməd ibn Yusif əl-Lihyani, Əbü’l-Qasım Təyyib ibn Yəmən, fəqih İsa ibn Süleyman, Yusif ibn Hüseyn, Abdullah ibn Muhəmməd ibn Həbbabə, hafiz Əbu Həfs Ömər ibn Şahin Bağdadi (öl.

---

1040 Uşnuh və ya Uşnu Azərbaycanın şəhərlərindəndər. Urmiyə gölünün cənubi-qərbində yerləşir.
1041 İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LVIII, s. 377.
1042 İBN ƏSAKİR, *yenə orada*.
1043 Əbu’ş-Şüca Şiruyə ibn Şəhrdar ibn Şiruyə əd-DEYLƏMİ, *Firdəvsu’l-Əxbar*, C. I, s. 102, Dəməşq 1997. (ادفنوا موتاكم وسط قوم صالحين فإن الميت يتأذى بجاره كما يتأذى الحي بجار السوء)
1044 MÜSLİM, *Səhih*, bab: Zöhd, hədis Nr. 2960. (يتبع الميت إلى قبره أهله وماله وعمله فيرجع اثنان أهله وماله ويبقى عمله)
1045 YAQUT əl-HƏMƏVİ, *Mu’cəmü’l-Büldan*, C. IV, s. 106.

995), Əbu Bəkr ibn Şazan, Əbu Bəkr ibn İsmayıl əl-Vərraq, Əbu İshaq İbrahim ibn Əhməd Təbərinin adını sadalaya bilərik. Qazi Əbu Əmr Əhməd ibn Hureyz Səlmasinin yetişdirdiyi tələbələr arasından Əbü'l-Həsən ibn Əbü'l-Hədid, Əbü'l-Qasım ibn Əbü'l-Əla, Əbu Abdullah ibn Əbü'l-Hədid, Əbü'l-Qasım Ömər ibn Əhməd Amidi kimi hədis alimləri çıxmışdı. Salmasda onun tələbəsi olmuş mühəddislərdən Mahmud ibn Səadə Səlmasinin (öl. 1116) adını çəkə bilərik. Alim h. 428-ci ildə həcc ziyarətinə gedərkən ramazan ayında (18 iyun-17 iyul 1037) Hələb və Dəməşqdə qalmışdı. Bu şəhərlərdə qaldığı müddətdə hədis dərsləri vermişdi. Ölüm tarixi məlum olmayan alim X-XI əsrlərdə yaşamışdır. Hələb şəhərinin tarixini qələmə almış İbnü'l-Adim Hələbdə qaldığı müddətdə Əbu Bəkr Əhməd ibn Hureyz Səlmasinin dərslərini dinləmiş, öz əsərində Əbu Əli Hüseyn ibn Muhəmməd ibn Yusif əl-Lihyaninin ondan eşitdiyi bir hədisi qeyd etmişdir:

Abdullah ibn Abbas (ا) dedi: Allah Rəsulu (ق) buyurdular: "Sərxoşluq verən hər (maddə) şey haramdır"[1046].

**Əbü'l-Qasım Hureyz ibn Əhməd ibn Hureyz ibn Əhməd ibn Xumeyyis ibn Əhməd ibn Hüseyn Səlmasi**

Mühəddis idi. Yaşadığı dövrün fəziləti, təmiz əqidəsi və bəlağəti ilə məşhur imamlarından biri olan alim Səlmas şəhərinin qazisi mühəddis Əbu Bəkr Əhməd ibn Hureyz Səlmasinin oğlu idi[1047]. Doğma şəhəri Səlmasda dərs verən mühəddis Mütəhhər ibn Muhəmməd əl-İsfəhanidən hədis dinləmiş və nəql etmişdi. Mühəddis Əbü'l-Bərəkat Hibətullah ibnü'l-Mübarək əs-Suqti ondan hədis dinləmişdi[1048]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Əbu Yə'la Hureyz ibn İshaq ibnü'l-Müəmmil Səlmasi**

---

[1046] İBNü'l-ADİM, *Buğyətü't-Tələb*, C. I, s. 186. Müəllif burada həmin hədisin ərəbcə mətnini belə qeyd etmişdir: [كل مسكر حرام]. Eyni mənanı ifadə edən nisbətən fərqli mətnli [كُلُّ شَرابٍ أَسْكَرَ فَهُوَ حَرَامٌ] hədis xanım Ayşə (ل), Abdullah ibn Əmr (ا) və Əbu Musa əl-Əş'əri (ا) silsiləsi ilə də nəql olunmuşdu. Bax: CANAN, *Kutubi-Sitte, Tercüme ve Şerhi*, C. VIII, s. 124.

[1047] ƏBU TAHİR İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, s. 361.

[1048] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 394-395.

Hədis ravisi idi. Bağdadda Muhəmməd ibn Əli ibn Səxrdən hədis dinləmişdi. Hibətullah ibnü'l-Mübarək əs-Suqti də ondan hədis dinləmiş və nəql etmişdi[1049]. Ölüm tarixi məlum deyil. Təqribən X əsrdə yaşamışdır.

**Kəmaləddin Əbü'l-Həsən Nemətullah ibn Ömər ibn Əbü'l-Həsən Səlmasi**

Səlmas şəhərinin hakimi və bu şəhərin adlı-sanlı əyanlarından biri olan Nemətullah Səlmasi həmçinin mühəddis idi. Qazi Əbu Muhəmməd Abdullah ibn Əhməd ibn Hureyz Səlmasi[1050] ondan hədis dinləmişdi[1051]. Hafiz Əbu Tahir əs-Süləfi (1083-1181) Səlmasda olarkən Kəmaləddin Səlmasi ilə görüşüb söhbət etmiş, ondan hədis dinləmişdi. Hafiz Əbu Tahir onun gözəl xətti olduğunu bildirmiş, onu xeyirxah, mehriban və alicənab insan kimi təsvir etmişdi[1052]. Ölüm tarixi qeyd olunmur. XI-XII əsrlərdə yaşamışdır.

**Əbü'l-Qasım Mahmud ibn Səadə ibn Əhməd Səlmasi**

Mühəddis idi. Onun ulu babası Musa ibn Hilal Səlmasi (öl. 990) də mühəddis olmuşdu. Musa ibn Hilal Səlmasi Ömər ibn Şəbbə[1053] və onun yoldaşlarından hədis dinləmiş və nəql etmişdi. Yaxın qohumlarından Əbu İmran Musa ibn İmran ibn Musa ibn Hilal Səlmasi də mühəddis olmuşdu. Mahmud ibn Səadə Səlmasi ilə görüşüb ondan hədis dinləyən Əbu Tahir Əhməd əs-Süləfi İsfəhani onun Səlmas qazisi Əbu Bəkr Əhməd ibn Hureyz Səlmasi, İsmayıl ibn Əbdürrəhman əs-Sabuni Nişapuridən hədis dinləyib nəql etdiyini qeyd etmişdir. Mahmud ibn Səadə Səlmasi yaşlı vaxtlarında hədis dərsləri vermək üçün səyahətə çıxmışdı. Azərbaycan, Arran, Şirvan, hətta Dərbənd və ətrafındakı şəhərləri gəzmiş, buralarda hədis dərsləri vermişdi. Alim h. 510-cu ildə (1116) Səlmasda vəfat etmişdi[1054].

---

[1049] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 248.

[1050] Bu şəxs yuxarıda haqqında bəhs etdiyimiz qazi Əbu Bəkr Əhməd ibn Hureyz Səlmasinin oğlu və Əbü'l-Qasım Hureyz ibn Əhməd Səlmasinin qardaşı idi.

[1051] İBNü's-SABUNİ, *Təkmilətü'l-İkmal*, s. 127; BÜNYADOV, "Vidnıye Deyateli Azerbaydjana v Soçinenii İbn al-Fuvati", s. 61-67.

[1052] ƏBU TAHİR İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, s. 234.

[1053] Ömər ibn Şəbbə ən-Numeyri əl-Bəsri (öl. 876) mühəddis və tarixçi idi. O, "Tarixu-Mədinə" adlı əsərin müəllifi idi. Bu kitabda Allah Rəsulu (ﷺ) və Raşid xəlifələr dövründə Mədinə şəhərinin tarixi öz əksini tapmışdı.

[1054] ƏBU TAHİR İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, s. 361; ƏBU TAHİR İSFƏHANİ, *Ərbəinü'l-Büldaniyyə*, s. 102.

**Şeyx Sədidəddin Muhəmməd ibn Hibətullah ibn Abdullah Səlmasi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. O, öz dövrünün məşhur alimlərindən idi və Bağdadda İmadəddin Muhəmməd ibn Yunis və onun qardaşı Kəmaləddin Musa ibn Yunisin tələbəsi olmuşdu. Fiqh elminə dair bir sıra əsərlərin müəllifi olan şeyx Sədidəddin Muhəmməd Səlmasi Bağdad Nizamiyyə mədrəsəsində əvvəlcə müid (aspirant), sonra isə müdərris olmuşdur. Sədidəddin Muhəmməd Səlmasi**,** Əbu Hamid Qəzzalinin[1055] elmi irsinin davamçılarından idi. O, Əbu Hamid Qəzzalini mədh etmiş və bir alim kimi onu yüksək qiymətləndirmişdi. Şeyx Sədidəddin Muhəmməd Səlmasi Bağdadda fətva mərcii idi. Alim h. 574-ci ilin şaban ayında (yanvar 1179) vəfat etmişdi[1056].

**Vaiz Əbu Tahir İbrahim ibn Əhməd ibn Muhəmməd ibn Əhməd Səlmasi**

Müfəssir idi. Təfsirlə yanaşı hədis və ərəb ədəbiyyatı sahəsində də mütəxəssis idi. O, mömin, vəra' və sidq sahibi insan idi. Hafiz Şəmsəddin Muhəmməd Davudi və Cəlaləddin Süyuti vaizlik sənətində yaşadığı əsrdə onun misli olmadığını qeyd etmişdilər. Əbu Tahir İbrahim Səlmasi hədis mətnlərinin istandı sahəsində də dərin biliyə malik idi. Əbü'l-Qasım ibn Ələyyək Nişapuridən və Əbu Hatim Əbdürrəhman ibnü'r-Rəvvas Naxçıvanidən hədis dinləmişdi. Hibətullah ibnü's-Səqti də ondan hədis dinləmişdi. Alim 433-cü ildə (1042) anadan olmuş, 496-cı ilin cəmadiəlaxir ayında (mart 1103) Xoy şəhərində vəfat etmişdir[1057].

**Vaiz Əbu Zəkəriyyə[1058] Yəhya ibn İbrahim ibn Əhməd ibn Muhəmməd Səlmasi**

---

[1055] Əbu Hamid Muhəmməd ibn Muhəmməd Qəzzali (1058-1111) əslən Xorasanın Tus şəhərindən idi. Böyük Səlcuqlular dövrünün məşhur alimlərindən və mütəfəkkirlərindən biri olmuşdur. O, şafi'i məzhəbinə mənsub fəqih olsa da kəlam, hədis, əxlaq kimi mövzularda bir sıra əsərin müəllifidir.

[1056] İBN XƏLLİKAN, *Vəfayatü'l-Əyan*, C. IV, s. 237; YAFİ'İ, *Miratü'l-Cənan*, C. II, s. 375; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. II, s. 84; SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VII, s. 12; İBN KƏSİR əl-ƏNSARİ, *Zeyl Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, v. 139a.

[1057] Şəmsəddin Muhəmməd ibn Əli DAVUDİ, *Təbəqatü'l-Müfəssirin*, C. I, s. 3, Qahirə (trz); SÜYUTİ, *Təbəqatü'l-Müfəssirin*, s. 5; İBN MAKULA, *İkmal*, C. I, s. 426; İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LVIII, s. 376.

[1058] İbnü'l-Cəvzi onun künyəsinin "Əbu Zəkəriyyə", İbn Əsakir və İbnü'l-Adim isə "Əbu Bəkr" olaraq qeyd etmişdirlər. İbnü'l-Cəvzi və İbn Əsakir Yəhya ibn İbrahim Səlmasini tələbəsi olmuş və onu yaxından tanımışdılar. Elə

Yaşadığı dövrün məşhur hədis alimlərindən idi. Vaiz Əbu Tahir İbrahim ibn Əhməd ibn Muhəmməd Səlmasinin (öl. 1103) oğlu idi. H. 474-cü ildə (1081) anadan olmuşdu. Alim ailəsində dünyaya gələn Yəhya Səlmasi h. 481-ci ildə (1088) hədis dərsləri almağa, hədis dinləməyə başlamışdı. Atasından və Səlmasın tanınmış alimlərindən müxtəlif elm sahələrinə dair dərslər alan Yəhya Səlmasi təhsilini davam etdirmək üçün doğma şəhərini tərk edərək səyahətə çıxmışdı. Mərənd, Xoy və Mosulun məşhur mühəddislərindən hədis elmələrini öyrənmişdi. Mosulda Əbü'l-Vəfa Xəlil ibn Şaban ibn İbrahim, Əbu Bəkr Muhəmməd ibn Qasım Şəhrəzuri, Əbü'l-Qasım Nəsr ibn Muhəmməd ibn Səfvan əl-Məvsili, Xoyda Əbu Abdullah Muhəmməd ibnü'l-Hadi ibn Əhməd əd-Dəqiqi, Mərənddə Əbü'l-Fəzl Nemətullah ibn Muhəmməd əl-Əbdəvi Mərəndinin tələbəsi olmuşdu. H. 548-ci ildə (1153) Dəməşqə getmiş və tədrislə məşğul olmuşdu. Əbu Zəkəriyyə Yəhya Səlmasinin tələbələri arasından hafiz Əbü'l-Qasım Əli ibn Həsən ibn Əsakir (öl. 1175), hafiz Əbü'l-Fərəc Əbdürrəhman ibn Əli ibnü'l-Cəvzi (öl. 1201), mühəddis Əbü'l-Fəzl Muhəmməd ibn Nasir əs-Səllami Bağdadi kimi alimlər yetişmişdi. O, əqidədə səhabə və tabiunun mənhəcinə sıx bağlı olan alim idi. "Kitabu'l-Əvvəli Səmah" və "Kitab fihi Mənazilu'l-Əimməi'l-Ərbəə" alimin ən məşhur əsərləridir[1059]. "Kitab fihi Mənazilu'l-Əimməi'l-Ərbəə" 1999-cu ildə Beyrutda nəşr olunmuşdur. İbn Həcər Əsqəlani onun raşid xəlifələrdən Əli ibn Əbu Talibin (ʳ) həyatına dair "Mənaqibi-Əli ibn Əbu Talib" adlı bir əsərin də müəllifi olduğunu qeyd etmişdir[1060].

Əbu Zəkəriyyə Yəhya Səlmasi h. 548-ci ildə (1153) Dəməşqə etmiş və buradakı mədrəsələrdə dərs verməyə başlamışdı. Sonra Bağdada getmiş və oradakı məscidlərdən birində vaiz olmuşdu. Daha sonra qəflətən Bağdadı tərk edib getmiş və uzun müddət sonra Bağdada qayıtmışdı. Onun yenidən məscidlərdən birində vaizlik üçün müraciətinə müsbət cavab verilməmişdi. Əbu Zəkəriyyə Yəhya h. 540-cı ildə (1145)

---

isə belə bir ziddiyət necə meydana çıxmışdır? Ehtimal ki, Yəhya ibn İbrahim Səlmasinin həm Zəkəriyyə, həm də Bəkr adlı oğlu olmuş və o, hər iki künyə ilə çağırılmışdı. Yəhya ibn İbrahim Səlmasinin əsərində (bax: *Mənazilu'l-Əimməti'l-Ərbəə*, s. 7) öz künyəsini "Əbu Zəkəriyyə" olaraq qeyd etdiyini nəzərə alaraq biz də burada onun bu künyəsini qeyd etdik.

[1059] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LXIV, s. 44; Əbu Zəkəriyyə Yəhya ibn İbrahim SƏLMASİ, *Mənazilu'l-Əimməti'l-Ərbəə*, (Nşr. M. Ə. Qədəh), s. 16-27, Mədinə 2002.

[1060] İBN HƏCƏR, *Lisanü'l-Mizan*, C. VI, s. 193.

doğma şəhəri Səlmasa qayıtmış və burada tədrislə məşğul olmuşdu. O, h. 550-ci ilin şaban ayında (oktyabr 1155) Səlmasda vəfat etmişdi[1061].

**Qazi Əlaəddin Mənsur ibn Mahmud ibn Yusif ibnü'l-Əzizi Sərabi**

Elxanilərin hökmdarlarından Olcaytu (1304-1306) və Əbu Səid Bahadırın (1316-1335) hakimiyyəti illərində Azərbaycanda Sərab şəhərinin qazisi olmuşdur. İbnü'l-Fuvati h. 716-cı ildə (1316) Elxanilərin paytaxtı Sultaniyyədə olarkən qazi Əlaəddin Mənsur Sərvi ilə görüşdüyünü qeyd etmişdir[1062]. Ölüm tarixi məlum deyil. XIII-XIV əsrlərdə yaşamışdır.

**Qazi Muhyəddin Əbü'l-Xeyr Muhəmməd ibn Əhməd ibnü'l-Əziz Yınal əl-Marağı Sərabi**

Elxanilərin hakimiyyəti dövründə Sərab şəhərinin şafi'i qazisi olmuşdu. H. 672-ci ilin rəbiəlaxir ayında (oktyabr-noyabr 1273) Səraba gələn İbnü'l-Fuvati burada qazi Muhyəddin Əbü'l-Xeyr Sərabi ilə görüşdüyünü, xəstələndiyi vaxt qazi Muhyəddin Sərabinin onun qayğısına qaldığını, ondan çox diqqət, xeyirxahlıq və mərhəmət gördüyünü qeyd edir. İbnü'l-Fuvati qazi Muhyəddin Sərabinin ona mütaliə üçün ərəb və farsca yazılmış maraqlı kitablar gətirdiyini qeyd edir[1063]. Alimin ölüm tarixi qeyd olunmamışdır.

**Şeyx Rüknəddin Əbü'l-Qənaim Qənimət ibn Müfəzzəl Sücasi**

XII-XIII əsrlərdə yaşamış fütuvvət şeyxi idi. O, şeyx Qütbəddin Əbhərinin müridi və xəlifəsi olmuşdu. Şeyx Qütbəddin Əbhərinin mürşidi isə məşhur şeyx Əbu'n-Nəcib Əbdülqahir Sührəvərdi (öl. 1178) idi. Şeyx Rüknəddin Sücasi Bağddada yaşamış və buradakı "Dərəcə" xanəgahında mənəvi tərbiyə və irşadla məşğul olmuşdu. "Dərəcə" xanəgahını Abbasi xəlifəsi Müstərşid Billahın (1118-1135) vəziri Cəlalüddövlə Həsənin

---

[1061] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LXIV, s. 45; İBNü'l-CƏVZİ, *Müntəzəm fi't-Tarix*, C. X, s. 164-165; İBNü'l-ADİM, *Buğyətü't-Tələb*, C. IV, s. 212.
[1062] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1107.
[1063] BÜNYADOV, "Vidnıye Deyateli Azerbaydjana v Soçinenii İbn al-Fuvati", s. 61-67.

oğlu Şərəfüddövlə Əli tikdirmişdi. Bu xanəgah Dəclə çayının qərb sahilində yerləşirdi. 1211-ci ildə Şeyx Rüknəddin Sücasinin vəfatından sonra onun yerinə şeyx Əvhədəddin Kirmani keçmişdir[1064].

**Əbu Zeyd Ziyad ibn Həsən ibn Hüseyn ibn Əhməd ibn Mənsur Sücasi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Təhsil almaq üçün h. 580-ci (1184) ildən sonra Qəzvin şəhərinə getmiş, orada fiqh və hədis dərsləri almışdı[1065]. Ölüm tarixi məlum deyil. XII-XIII əsrlərdə yaşamışdır.

**Ömər ibn Muhəmməd ibn Səid Sücasi**

Mühəddis idi. H. 587-ci (1191) ildə Qəzvində olmuş, burada mühəddis imam Əhməd ibn İsmayıldan hədis dərsləri almışdı[1066].

**Əbu Cə'fər Muhəmməd ibn Əli ibn Muhəmməd ibn Abdullah ibn Səid Sücasi**

Yaşadığı dövrün tanınmış ədiblərindən biri idi. Hafiz Əbu Tahir əs-Süləfi Azərbaycana səyahət edərkən Sücasda onunla görüşüb söhbət etmişdi. Əbu Cə'fər Muhəmməd Sücasi bir sıra ədəbi əsər və gözəl şe'rlərin müəllifi idi[1067]. Ölüm tarixi məlum deyil, təqribən XI-XII əsrlərdə yaşamışdır.

**Abdullah ibn Ruzbeh Sührəvərdi**

Tabiundan olan hədis ravisi idi. İslamı qəbul etmiş ilk azərilərdən biri olan Abdullah ibn Ruzbeh, Əli ibn Əbu Talibdən (ا) hədis nəql etmişdi. Böyük ehtimalla Əli ibn Əbu Taliblə (ا) görüşmüşdür. Əbu Sə'd İsmayıl ibn Əli ibnü'l-Məsni, Abdullah ibn Ruzbehdən nəql etmişdi. Buna baxmayaraq Əbu Sə'd İbnü'l-Məsni və digər mühəddislər onun siqa, yəni mötəbər ravi olduğu haqda tərəddüd etmişdilər. Abdullah ibn Ruzbeh Sührəvərdinin ölüm tarixi məlum deyil. Əli ibn Əbu Taliblə (ا /öl.661)

---

[1064] Mikail BAYRAM, *Şeyh Evhaü'd-Din El-Kirmanî ve Menâkıb-Nâmesi*, s. 7-9, 129-130, Konya 2006.
[1065] RAFİ'İ, *Tədvin*, C. III, s. 28.
[1066] RAFİ'İ, *Tədvin*, C. III, s. 454.
[1067] YAQUT əl-HƏMƏVİ, *Mu'cəm*, C. IV, s. 49.

görüşdüyünü nəzərə alaraq onun VII-VIII əsrlərdə yaşadığını təxmin etmək olar. Əbü'l-Fəzl Əbdürrəhim İraqi onun nəql etdiyi aşağıdakı hədisi öz əsərində qeyd etmişdir:

Əli ibn Əbu Talib (ا) dedi: Rəsulullah (ق) buyurdular ki: "Nə xoşbəxtdir məni görənlər (səhabə), məni görənləri görənlər (tabiun) və onları görənlər (təbəi-tabiun)" [1068].

**Muhəmməd ibn Muğirə Sührəvərdi**

Hədis ravisi idi. Yəhya ibn Həsən əl-Mədayini və Əyyub ibn Süveyd ər-Rəmlidən (öl. 809) hədis dinləmiş və Abdullah ibn Cabirdən (ا) mərfuən hədis nəql etmişdi[1069]. Muhəmməd ibn Muğirənin ölüm tarixi məlum deyil. VIII-IX əsrlərdə yaşamışdır.

**Cəmaləddin Əbdürrəhman ibn Əbdülmahmud ibn Əbdürrəhman ibn Muhəmməd ibn Ömər ibn Muhəmməd Sührəvərdi**

Məşhur fütuvvət şeyxi Şihabəddin Ömər Sührəvərdinin (1144-1234) kötükcəsi idi. Elxanilərin vəziri Rəşidəddin Fəzlullahın (öl. 1318) qızı ilə evli olan Cəmaləddin Sührəvərdi Bağdadda yaşamışdı. İraqın vəqflər naziri[1070] vəzifəsinə təyin olunmuşdu. O, öz şanına şe'rlər yazdıracaq qədər lovğa, özündən razı, təkəbbürlü gənc idi. Üstəlik vəzifədə olduğu müddətdə çox haqsızlıq və zorakılıq etmiş, haqsız qazanc əldə etmişdi. İbn Həcər Əsqəlaninin təbiri ilə desək "təqvası az, günahı çox" idi. H. 737-ci ildə (1336) qayını İbn Rəşidəddinlə birlikdə qətlə yetirilmişdi[1071].

---

1068 Əbü'l-Fəzl Əbdürrəhim ibn Hüseyn İRAQİ, *Zeyl Mizanü'l-Etidal*, (Nşr. M. Müəvvəz-Əbdülmövcud A. Ə), s. 134, Beyrut 1995. [طُوبَى لِمَنْ رَآنِي ، وَلِمَنْ رَأَى مَنْ رَآنِي ، وَلِمَنْ رَأَى مَنْ رَأَى مَنْ رَآنِي] . "Məni görənlər, məni görənləri görənlər...." deyərək İslamın ilk üç nəsli, yəni səhabə, tabiun və təbəi-tabiun nəzərdə tutulur. Hədisdə bu üç nəslin fəziləti və üstünlüyü bəyan edilir. Bu hədis 6 mötəbər hədis külliyatlının (Kutubi-Sittə) heç birinə daxil edilməmişdir. Bununla yanaşı səhabə və tabiunun fəziləti və üstünlüyü barədə Kutubi-Sittədə çox sayıda hədis mövcuddur. Yuxarıda da qeyd etdiyim kimi, bəzi mühəddislər Abdullah ibn Ruzbeh Sührəvərdinin siqa hədis ravisi olmadığı haqda (ليس بثقة) fikir bəyan etmişdirlər. Yuxarıda mətninin tərcüməsini qeyd etdiyimiz hədis, Ənəs ibn Malikdən (ا) nəqlən, Təbəraninin "Mu'cəmü's-Səğir" (C. I, s. 16) və imam Əhməd ibn Hənbəlin "Müsnəd"ində (C. V, s. 245) mövcuddur. Bu hədisin isnad və təxrici üçün bax: http://www.islamweb.net/hadith/display_hbook.php

1069 İBN HƏCƏR, *Lisanü'l-Mizan*, C. V, s. 298.

1070 (ناظر أوقاف العراق)

1071 İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. I, s. 425. Son Elxani hökmdarı Əbu Səid Bahadır 1335-ci ildə oğlan övladı olmadan ölmüşdü. Beləcə Hülagü xanın nəslindən olan moğol əyanlar arasında Elxani taxtı uğrunda mübarizə başlamışdı. Burada mübarizə aparan əsas bir neçə qrup var idi ki, bunların da birinə vəzir Qiyasəddin Muhəmməd Rəşidi başçılıq edirdi. O, Hülagü xanın qardaşı Ərikbuğanın nəvəsi Arpa xanı Elxani taxtına oturtmaq istəyir, onun hərbi dəstəyinə və sivil bürokratlara arxalardı. Digər tərəfdə isə əsasən köçəri moğol hərbi feodallarının dəstəklədiyi, Elxanilərdən Baydu xanın (öl. 1295) nəvəsi, Musa xan var idi. Bu iki qrupun hərbi qüvvələri arasında 29 aprel 1336-cı ildə Marağa yaxınlığında baş vermiş döyüş Musa xanın qələbəsi ilə bitmişdi. Nəticədə əsir düşmüş vəzir Qiyasəddin Muhəmməd öz atasının, vəqflər naziri Cəmaləddin Əbdürrəhman Sührəvərdi isə qaynatasının qədərini palaşaraq, Arpa xanla birlikdə, bu döyüşdən bir neçə ay sonra, edam edilmişdilər. Lakin Elxani taxtı Musa xana da qismət

**Əbdülmahmud ibn Əbdürrəhman ibn Muhəmməd ibn Ömər ibn Muhəmməd Sührəvərdi**

Fütuvvət əhlində mənsub vaiz idi. Məşhur fütüvvət şeyxi Şihabəddin Ömər Sührəvərdinin nəticəsi olan Əbdülmahmud Sührəvərdi Bağdadda yaşamış, babası şeyx İmadəddin Əbu Cə'fər Muhəmməd Sührəvərdinin müridi olmuşdu. Əbdülmahmud Sührəvərdi mömin və saleh insan idi. Bağdad məscidlərindən birində vaizlik edirdi. H. 714-ci ilin rəcəb ayında (1314) vəfat etmişdi [1072].

**Qazi Əbu Cə'fər Muhəmməd ibn Abdullah ibn Muhəmməd ibn Əmmuyə ibn Sə'd Sührəvərdi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Şeyx Əbu'n-Nəcib Əbdülqahir Sührəvərdinin qardaşı idi. Əsid əl-Meyhəninin tələbəsi olmuş, ondan fiqh elmini öyrənmişdi. Əbu Cə'fər Muhəmməd Sührəvərdi mahir natiq idi, onun və'zləri böyük maraqla dinlənirdi. Şəhrəzur qaziliyinə təyin olunmuş və h. 539-cu ildə (1144) Şəhrəzurda batıni-xaşxaşi sui-qəsdçilər tərəfindən qətlə yetirilmişdi[1073].

**Şeyx Şərəfəddin İsa ibn Muhəmməd ibn Qaraca ibn Süleyman Sührəvərdi**

Təsəvvüf əhlinə mənsub şeyx, həmçinin vaiz və şair idi. Çox gözəl və dərin mənalı şerlər yazardı. H. 729-cu ilin rəbiəlaxir ayında (fevral 1329) vəfat etmişdi[1074].

**Şeyx İmadəddin Muhəmməd ibn Ömər ibn Əbdürrəhman ibn Muhəmməd ibn Ömər Sührəvərdi**

---

olmadı. Tezliklər moğol Cəlairilər sülaləsi Musa xanı məğlub edərək hakimiyyəti ələ keçirdilər. Bu hadislər haqqında daha ətraflı məlumat üçün bax: İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 202; Əbdüssalam Əbdüləziz FƏHMİ, *Tarixu'd-Dövləti'l-Moğoliyyə fi İran*, s. 234-236, Qahirə 1981; MÜŞTƏRƏK, *İstoriya İrana s Drevneyşix Vremyon do Kontsa XVIII veka*, s. 217, Leninqrad 1958; MÜŞTƏRƏK, *Azərbaycan Tarixi*, s. 326-327.

[1072] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 44.

[1073] SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, c.6, s.66.

[1074] İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 240.

Əslən Zəncanın Sührəvərd qəsəbəsindən olan İmadəddin Muhəmməd Sührəvərdi Bağdadda böyümüş, bu şəhərdə təhsil almışdı. Onun atası şeyx Şərəfəddin Ömər Sührəvərdi "əl-Hədisi" ləqəbi ilə tanınmış məşhur hədis alimi idi. O, atasından Əbu Davud Təyalisinin[1075] "Müsnəd" adlı hədis külliyatını dinləmişdi. İbnü'l-Fuvatinin yazdığına görə h. 691-ci ildə (1291) şeyx Əfifəddin Əbu Muhəmməd Əbdüssəlam ibn Muhəmməd əl-Bəsrinin tələbəsi olmuşdu[1076]. Ölüm tarixi qeyd edilməmişdir.

**Əbu Nəsr Əhməd ibn Firuzan Sührəvərdi**

Mühəddis idi. H. 472-ci (1079) ildə Qəzvində Əbu Mənsur Nəsr ibn Əbdülcabbar əl-Qərai, Əbu Əli Hüseyn ibn Musa ibn Bəhram kimi mühəddislərdən hədis dinləmişdi[1077]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Muhəmməd ibn Əli ibn Əhməd ibnü'l-Əğər Sührəvərdi**

Mühəddis idi. H. 686-cı ilin rəcəb (avqust 1287) ayında anadan olmuşdu. Rəşid ibn Əbü'l-Qasım əl-Əvarif Sührəvərdi və Sührəvərddəki digər alimlərdən hədis dinləmişdi. Bağdada gəlmiş və burada müxtəlif sahələrə dair dərslər vermişdi. H. 760-cı ildə (may 1359) Bağdadda vəfat etmişdi[1078].

**Vaiz Əbu'r-Rza Əbdurrəhim ibn Əbdulqahir ibn Abdullah ibn Əmmuyə Sührəvərdi**

Bağdaddakı məscidlərdən birinin vaizi idi. Əbu'n-Nəcib Əbdülqahir Sührəvərdinin oğlu, Əbu Muhəmməd Əbdullətif Sührəvərdinin böyük qardaşı idi. Ölüm tarixi h. 560-cı (1165-1175) illərə təsadüf edir[1079].

**Şeyx Ziyaəddin Əbu'n-Nəcib Əbdülqahir ibn Abdullah ibn Muhəmməd ibn Əmmuyə Sührəvərdi**

---

[1075] Hafiz Əbu Davud Süleyman ibn Davud əl-Farisi Təyalisi (750-819) yaşadığı dövrün tanınmış hədis alimlərindən biri, "Müsnəd" adlı hədis külliyatının müəllifi idi.
[1076] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 841.
[1077] RAFİ'İ, *Tədvin*, C. II, s. 219.
[1078] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 357.
[1079] SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VII, s. 87.

Şafi'i məzhəbinə mənsub fəqih idi. Onun soy kökü I xəlifə Əbu Bəkr əs-Sıddiqə (ﷺ) çıxır. Təqribən h. 490-cı ilin səfər ayında (fevral 1097) Zəncan yaxınlığındakı Sührəvərd qəsəbəsində anadan olmuşdu. İlk təhsilini vətənində aldıqdan sonra Azərbaycandan Bağdada getmiş və buradakı Nizamiyyə mədrəsəsində təhsil almışdı. Əsid ibn Əbu Nəsr əl-Meyhəninin tələbəsi oluş, ondan fiqh elmini öyrənmişdi. Əbu Əli Muhəmməd ibn Səid ibn Nəbhandan hədis dinləmişdi. Əbu Səd Əhməd ibn Muhəmməd Bağdadinin yanında hədis külliyatlarını oxumuşdu. Təhsilini başa vurandan sonra Bağdadda qalmış və bu şəhərdə yaşamışdı. Bağdadda fətva mərcii idi. Fiqh, fiqh üsulu, təfsir və hədis mövzularında yaşadığı dövrün ən böyük alimlərindən biri idi. İki il məzun olduğu Nizamiyyə mədrəsəsinin müdərrisi olmuşdu. Daha sonra özünün inşa etdirdiyi bir mədrəsədə tədrislə məşğul oldu. O, zöhd və vəra' sahibi insan idi. İnsanlarla az ünsiyyətdə olur, daha çox tək qalıb zikr və ibadətlə məşğul olurdu. Şeyx Əbun'-Nəcib Əbdülqahir Sührəvərdi bir sıra əsərlərin müəllifi idi. Bunların ən məşhurlarından biri də "Adabü'l-Müridin" adlı əsər idi[1080]. "Adabü'l-Müridin"in ərəbcə əlyazma nüsxələri Türkiyədə Konya BYEK, Ankara Milli kitabxana və Manisa İHK-də saxlanılmaqdadır. "Qəribü'l-Məsabih" şeyx Əbu'n-Nəcib Sührəvərdinin qələmə aldığı bir digər əsərdir[1081]. Alim h. 563-cü ilin cəmaziəlaxir ayında (mart 1168) vəfat etmiş və Bağdadda öz mədrəsəsinin həyətində dəfn edilmişdi[1082].

**Əbu Muhəmməd Abdullah ibn Əbdülqahir ibn Abdullah Sührəvərdi**

Fütuvvət əhlinə mənsub şeyx, zahid və abid insan olan Əbu Muhəmməd Abdullah Sührəvərdi yuxarıda haqqında danışdığımız şeyx Ziyaəddin Əbu'n-Nəcib Sührəvərdinin oğlu idi. Öz əmisi oğlu şeyxü'ş-şüyux Şihabəddin Əbu Həfs Ömər Sührəvərdinin müridi olmuş, onun mənəvi tərbiyəsində yetişmişdi. Şihabəddin Ömər Sührəvərdinin müridliyinə daxil olmamışdan əvvəl o, bütün dünyəvi işlərdən əl

---

[1080] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 101.
[1081] MƏMMƏDOV, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, s. 18-19.
[1082] İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. II, s. 2-3; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. III, s. 32-33; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XII, s.459; İBNü'l-CƏVZİ, *Müntəzəm fi't-Tarix*, C. X, s.225.

çəkmiş, sahib olduğu var-dövləti xeyriyyə qurumlarına bağışlamış, vəqf etmişdi. Əbu Muhəmməd Abdullah Sührəvərdi h. 630-cu (1233) ildə vəfat etmişdi[1083].

**Qazi Əbu Muhəmməd Əbdüllətif ibn Əbdulqahir ibn Abdullah ibn Muhəmməd Əmmuyə Sührəvərdi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. H. 534-cü ildə (1140) Bağdadda anadan olmuşdu. Yuxarıda haqqanda bəhs etdiyimiz Əbu'n-Nəcib Əbdülqahir Sührəvərdinin oğlu idi. Fiqh elmindəki ilk təhsilini atasından almışdı. Əbü'l-Bədr əl-Kərxi, Əbü'l-Qasım Əli ibnü's-Səbbağ, Əbü'l-Fəzl Muhəmməd ibn Ömər Urməvidən hədis dinləmişdi. Daha sonra Xorasan və Mavəraünnəhrə getmiş və bu yerlərin ən məşhur alimlərindən dərs almışdı. Təhsilini başa vurandan sonra Bağdada qayıtmışdı. Bir müddət Bağdadda qaldıqdan sonra Şam vilayətinə getmiş və Əyyubi hökmdarı Səlahəddin Yusif Əyyubi (1169-1193) ilə birlikdə səlibçilərə qarşı hərbi səfərlərdə iştirak etmişdi. Sultan Səlahəddin onu səlbiçilərin işğalından təmizlənmiş bütün ərazilərin qazisi vəzifəsinə təyin etmişdi. Bu vəzifəni icra edərkən qazi Əbu Muhəmməd Əbdüllətif Sührəvərdi Əkkə şəhərində yaşamışdı. Əbu Muhəmməd Əbdullətif Sührəvərdi bir müddət bu vəzifəni icra etdikdən sonra Bağdada qayıtmışdı. Daha sonra Ərbil şəhərinə köçmüş və ömrünün sonuna qədər bu şəhərdə yaşamışdı. Alim h. 610-cu ilin cəmadiələvvəl ayında (oktyabr 1213) Ərbildə vəfat etmişdi[1084].

**Əbü'ş-Şüca' Faris ibn Hüseyn ibn Faris ibn Hüseyn ibn Qərib ibn Bəşir əz-Zıhli Sührəvərdi**

Siqa hədis ravisi, mühəddis idi. Bağdadda yaşayırdı. Hədis elmi ilə yanaşı ərəb dili və ədəbiyyatı sahəsində də böyük mütəxəssis idi. Həmçinin şair idi, gözəl şerlər yazırdı. O, fəzilətli və saleh insan idi. Əbu Əli Həsən ibn Əhməd ibn Şazan əl-Bəzzaz, vaiz Əbü'l-Qasım Əbdülməlik ibn Muhəmməd ibn Buşrandan hədis dinləmişdi. Əbu Bəkr Muhəmməd ibn Əbdülbaqi əl-Ənsari, Əbü'l-Qasım İsmayıl ibn Əhməd Səmərqəndi,

---

[1083] Kəmaləddin Əbü'l-Fəzl Əbdürrəzzaq ibn Əhməd İBNü'l-FUVATİ, *Həvadisü'l-Camiə' və't-Təcaribü'n-Nafiə'*, (Nşr. M. Cavad), s. 22, Bağdad 1351.

[1084] SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VIII, s.165; ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'd-Dübeysi*, 262.

Əbü'l-Bərəkat Əbdülvəhhab ibnü'l-Mübarək əl-Ənmati, Əbü'l-Fəzl Muhəmməd əs-Səlami, Əbü'l-Fərəc Əbdülxaliq ibn Əhməd əl-Yusifi, Əbu Həfs Ömər ibn Zəfər əl-Məğazili ondan hədis dinləmiş və nəql etmişdilər. Alim 407-ci ilin rəbiəlaxir ayında (sentyabr 1016) vəfat etmişdi[1085].

**Əbu Qalib Şüca' ibn Faris ibn Hüseyn ibn Faris əz-Zıhli Sührəvərdi**

Yaşadığı dövrün tanınmış hədis hafizlərindən idi. H. 430-cu ildə (1039) Azərbaycanda anadan olmuşdu. Künyə, ata və baba adlarını müqayisə edilməsi onun yuxarıda haqqında yazdığımız mühəddis Əbü'ş-Şüca' Faris ibn Hüseyn Sührəvərdinin oğlu olduğu fikrini oyandırır. Lakin Əbü'ş-Şüca' Faris Sührəvərdi (öl. 1016) Əbu Qalib Şüca' Sührəvərdinin anadan olmasından 23 il əvvəl vəfat etdiyi üçün bu mümkün deyil. Bununla belə onların eyni nəslə mənsub olduqlarını söyləmək mümkündür. Ehtimal ki, Əbü'ş-Şüca' Faris Sührəvərdi Əbu Qalib Şüca' Sührəvərdinin babası idi**.** Əbu Qalib Şüca' Sührəvərdi Bağdadda gedib bu şəhərdə yaşamışdı. Əbu Talib Muhəmməd ibn Muhəmməd ibn əl-Bəzzar, Əbu Muhəmməd Həsən əl-Cəvhəri, Əbu Talib Muhəmməd ibn Əli ibnü'l-Fəth əl-Əş'aridən (öl. 1059) hədis dinləmişdi. İsmayıl ibn Səmərqəndi, Əbdülvəhhab əl-Ənmati, Əbu Tahir Əhməd əs-Süləfi İsfəhani, həmçinin öz oğlu və qardaşı Əbu Hamid ibn Faris əz-Zıhli ondan hədis dinləmişdilər. Alim h. 3 cəmaziələvvl 507-ci ildə (15 oktyabr 1113) Bağdadda vəfat etmişdi[1086].

**Şeyxü'ş-şüyux Şihabəddin Əbu Həfs Ömər ibn Muhəmməd ibn Abdullah ibn Əmmuyə əl-Bəkri Sührəvərdi**

Şafi'i məzhəbinə mənsub fəqih və fütüvvət təşkilatının şeyxü'ş-şüyuxu, baş şeyxi idi. Rəsulullahın (ق) I xəlifəsi Əbu Bəkrin (ا) nəslindən idi. H. 539-ci ildə (1144) anadan olmuşdu. Bağdada gəlmiş və burada məskunlaşmışdı. Əmisi Əbu'n-Nəcib Sührəvərdi, Muhəmməd ibnü'l-Bəttə, Hibətullah əş-Şibli və Əbdülqadir Gilanidən (1078-1167) dərs

---

[1085] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. III, s. 32-33.
[1086] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. III, s. 32-33; İBN ƏBDÜLHADİ, *Təbəqatu-Üləma*, C. IV, s. 11-13.

almışdı[1087]. Seyyid Əbü'l-Qasım əd-Dəbusidən fiqh elmini öyrənmişdi. Əbu Muhəmməd Rizqullah ibn Əbdülvəhhab ət-Təmimi, Əbü'l-Həsən Asim ibn Həsən əl-Kərxidən hədis dinləmişdi. Ömər ibn Əbü'l-Həsən Bistami ondan hədis dinləmiş və onun tələbələrindən biri olmuşdu[1088]. Mənbələrin qeyd etdiyi təvəllüd və ölüm tarixlərindən əmisi Əbu'n-Nəcib Sührəvərdi vəfat edərkən Şihabəddin Ömərin 24 yaşlı gənc olduğu məlum olur. Bu yaşına qədər əlbəttə ki, tədris və seyri-süluk (təsəvvüfi təlim mərhələləri) gördüyü ehtimalı böyükdür. Lakin "Mənaqibi-şeyx Əvhəddüddini-Kirmani" adlı mənaqibnamənin müəllifi Muhəmməd Sivasinin yazdığına görə Ziyaəddin Əbu'n-Nəcib vəfatından bir müddət əvvəl xəlifəsi, eyni zamanda yeznəsi olan şeyx Qüdbəddin Əbhəriyə belə demişdi: "qardaşımın oğlu Şihabəddin hələ ki, 15 yaşlı uşaqdır, onunla bağlı qüsura yol vermə, mən səni necə irşad etmişəmsə sən də onu irşad et. Onun təhsili üçün əlindən gələni hər şeyi et. Görürəm ki, o, böyük qabiyyət və qüvvətli hafizəyə malikdir. Mənə ondan daha əziz heç kim yoxdur, bu iş üçün də səndən daha müşviq heç kim yoxdur"[1089]. Mənaqibnamədə həm də Əvhədəddin Kirmani ilə şeyx Şihabəddin Ömər Sührəvərdinin yaxın dost olduğunu görürük. Belə ki, şeyx Əvhədəddin Kirmani uzaq səfərlərə çıxanda azyaşlı qızı Aminə xanımı Bağdadda şeyx Şihabəddin Ömərin evində qoyurdu. Aminə xanım Şihabəddin Ömər Sührəvərdinin tələbələrindən və müridələrindən biri olmuşdu[1090].

Abbasi xəlifəsi Nasir Li-Dinillah (1180-1225) şeyx Şihabəddin Öməri fütuvvət təşkilatının, eləcə də bütün xilafətin şeyxü'ş-şüyuxluğuna təyin etmişdi[1091]. Şeyx Şihabəddin Ömər həmçinin mahir diplomat idi və xəlifənin şəxsi təmsilçisi olaraq bəzi diplomatik fəaliyyətlərdə olmuşdu. O, 1221-ci ildə xəlifənin səfiri olaraq Konyaya getmiş, Anadolu Səlcuqlu sultanı Əlaəddin I Keyqubadla (1220-1237) Gəvalə qalasında görüşmüş və danışıqlar aparmışdı[1092]. Onun 1217-ci ildə xəlifənin adından Xarəzmşah

---

[1087] Əbdürrəhman CAMİ, *Nəfəhatü'l-Üns min Həzəratü'l-Qüds*, s. 297, İstanbul 1279; ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'd-Dübeysi*, s. 287; MƏMMƏDOV, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, s. 25.
[1088] CAMİ, *Nəfəhat*, s. 527.
[1089] BAYRAM, *Şeyh Evhaü'd-Din El-Kirmanî ve Menâkıb-Nâmesi*, s. 153.
[1090] *Həmin əsər*, s. 154-155
[1091] CAMİ, *Nəfəhat*, s. 527.
[1092] ƏFLAKİ, *Ariflerin Menkıbeleri*, C. I, s. 13-15.

Əlaəddin Muhəmmədlə (1200-1220) apardığı danışıqlar isə Xarəzmşahın uzlaşmaz mövqeyi səbəbiylə uğursuzluqla nəticələnmişdi[1093].

İbn Kəsirin yazdığına görə xəlifənin əmri ilə h. 605-ci ildə (1208) şeyx Şihabəddin Ömər Sührəvərdi tutduğu bütün vəzifələrdən, o cümlədən vaizlikdən azad etmiş, irşadla məşğul olduğu xanəgah əlindən alınmışdı. Buna səbəb şeyx Şihabəddinin xəlifənin elçisi olaraq Misirə gedib Əyyubi sultanı Məlik Adillə (1200-1218) görüşəndən sonra sultanın ona verdiyi çox qiymətli hədiyyələr və xeyli miqdarda nəğd pulla Bağdada qayıtması olmuşdu. Lakin şeyx ona verilən bütün hədiyyələri və nəğd pulu Bağdadın yoxsullarına paylamış, belə ki, özü müflis vəziyyətə düşmüşdü[1094]. Şeyx Şihabəddin Ömər Sührəvərdi daha sonrakı illərdə xəlifənin elçisi sifəti ilə müxtəlif ölkələrə getdiyinə görə xəlifənin onu yenidən əvvəlki vəzifəsinə qaytadığını düşünmək olar. Şeyx Şihabəddin Ömər Sührəvərdi h. 632-ci ilin rəbiəlvvəl ayında (dekabr 1234) vəfat etmiş[1095] və Bağdadın Şünuziyyə qəbristanında dəfn edilmişdi[1096].

"Əvarifü'l-Məarif", "Kənzü'l-İbad fi Şərhi'l-Əvrad", "Cəzbü'l-Qülub ilə Müvasilatü'l-Məhbub", "Ədlətü'l-Əyan və'l-Burhan", "İ'lamü'l-hədi və Əqidə Ərbabü't-təqi", "əz-Zəxair", "Risalə fi's-Süluk", "Risalətü'l-Asimiyyə", "Əsmai'l-Ərbəinü'l-İdrisiyyə", "Rəşfə'n-Nəsaihü'l-İmaniyyə və Kəşfü'l-Fəzaihi'l-Yunaniyyə", "Risalətü'l-Fütuh"[1097], "Risalətü's-Seyr və't-Təyr"[1098], "əl-Vəsiyyə", "Mənasik", "Munisü'l-Uşşaq"[1099], "Risalətü'r-Rahiqü'l-Məxtum" onun qələmə aldığı əsərlərdir[1100]. Bundan başqa o, Qur'ani-Kərimin təfsirinə dair "Nuğbəti'l-Bəyan fi Təfsiri'l-Qur'an" əsərin də müəllifidir[1101]. Şeyx Şihabəddin Ömər Sührəvərdi həmçinin bir sıra irili xırdalı risalə və tərcümənin müəllifidir. Şeyx Şihabəddin həm də istedadlı şair idi. Şihabəddin Ömər

---

[1093] KAFESOĞLU, *həmin əsər*, s. 216-217.

[1094] İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIII, s. 141-143. Əbu Bəkr ibn Abdullah ibn Aybək DƏVADARİ şeyx Şihabəddin Ömər Sührəvərdinin xəlifə Nasir li Dinillah (1180-1225) tərəfindən h. 604-cü ildə (1207-1208) Əyyubi sarayına səfir göndərildiyini qeyd etmişdir. Lakin şeyxin Əyyubi hökmdarından hədiyyə aldıb-almadığına dair heç bir şey yazmamışdır. Bax: *Kənzü'd-Dürər və Camiü'l-Ğürər*, C. VII, s. 164, (Nşr. S. Ə. Aşur), Qahirə 1972.

[1095] İbnü'l-Fuvati onun h. 632-ci ilin məhərrəm ayında (oktyabr 1234) vəfat etdiyini qeyd etmişdir. Bax: *Məcməü'l-Adab*, C. IV/2, s. 840.

[1096] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. III, s. 33. Həmidullah Müstəvfiyə görə alimin məzarı Bağdadın Babü't-Təlha qəbristanındadır. Bax: *Tarixi-Qozidə*, s. 669-670, (Nşr. A. Nəvayi), Tehran 1364.

[1097] Alimin "Əsmai'l-Ərbəinü'l-İdrisiyyə", "Rəşfə'n-Nəsaihü'l-İmaniyyə və Kəşfü'l-Fəzaihi'l-Yunaniyyə" və "Risalətü'l-Fütuh" adlı əsərlərinin birər nüsxəsi İstanbul Köprülü yazma əsərlər kitabxanasında saxlanılır.

[1098] Bir nüsxəsi İstanbul Nuriosmaniyyə kitabxanasında saxlanılır.

[1099] Bu əsərin iki əlyazma nüsxəsi İstanbul Millət kitabxanasında saxlanılır.

[1100] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 101, 109, 159, 201, 1073, 1079, 1112; C. II, s. 1017.

[1101] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 583; C. II, s. 1165.

Sührəvərdinin qələmə aldığı, indiyə qədər bilinməyən, "Risalə fi Şərhi-Ma'nii'l-Fəqr və Nəshü'-Füqəra" adlı əsəri bizim tərəfimizdən müəyyən edilmişdir[1102].

**Şeyxü's-şüyux İmadəddin Əbu Cə'fər Muhəmməd ibn Ömər ibn Abdullah ibn Əmmuyə əl-Bəkri Sührəvərdi**

Məşhur fətüvvət şeyxi Şihabəddin Əbu Həfs Ömər Sührəvərdinin (öl. 1234) oğlu idi. H. 618-ci ildə (1221) Ümmü'n-Nasir təkkəsinin şeyxi Rəziyəddin İsa ibn Abdullah əş-Şəhrbaninin vəfatından sonra onun yerinə bu vəzifəyə təyin olunmuşdu. Atası şeyx Şihabəddin Əbu Həfs Ömərin vəfatından (1234) sonra onun yerinə Bağdaddakı əl-Mə'muniyyə təkkəsinin şeyxliyinə və bütün xilafətin şeyxü'ş-şüyuxluğuna təyin olunmuşdu. H. 640-cı ildə (1242) Abbasi xəlifəsi Müstə'sim Billahın (1242-1258) elçilik heyətinin başçısı olaraq Anadoluya getmiş və Anadolu Səlcuqlu sultanı Qiyasəddin II Keyxosrovla (1237-1246) görüşmüşdü. Bu diplomatik missiyanı yerinə yetirəndən sonra Bağdada qayıtmışdı. Bir müddət sonra Bağdaddakı əl-Əzudi xəstəxanasının idarəçiliyinə təyin olunmuş, lakin h. 650-ci ildə (1252) könüllü istefaya getmişdi[1103]. Ölüm tarixi məlum deyil.

**Şeyx Əizz ibn Ömər ibn Muhəmməd ibn Abdullah Sührəvərdi**

Mühəddis və fütuvvət şeyxi idi. Bağdadda yaşamış, Əbu Əli Muhəmməd ibn Səid ibn Nəbhandan hədis dərsləri almışdı. Şeyx Ömər ibn Əbu Bəkr ibn Cabir olun yetişdirdiyi mühəddislərdən biri idi. Şeyx Əizz Sührəvərdi h. 11 məhərrəm 657-ci ildə (30 dekabr 1161) vəfat etmişdi[1104].

**Şeyx Əbu Abdullah Muhəmməd ibn Əizz ibn Ömər ibn Muhəmməd ibn Abdullah əl-Bəkri Sührəvərdi**

Şafi'i məzhəbinə mənsub mühəddis və təsəvvüf şeyxi idi. Yuxarıda haqqında bəhs etdiyimiz şeyx Əizz Sührəvərdinin oğlu idi. İsmayıl ibnü's-Səmərqəndi və Əbu Sə'd

---

[1102] Əsər Konya BYEK, Nr. 198/27-də saxlanılır.
[1103] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 839-840.
[1104] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 144.

Əhməd ibn Muhəmməd Bağdadidən hədis dərsləri almışdı. Şeyx Əbu Abdullah Muhəmməd Sührəvərdi h. 517-ci ildə (1123) anadan olmuş, h. 607-ci ilin şəvval ayında (aprel 1211) Bağdadda vəfat etmişdi[1105].

**Şeyx Əsəd ibn Muhəmməd ibn Əizz ibn Ömər ibn Muhəmməd Sührəvərdi**

Şafi'i məzhəbinə mənsub mühəddis və təsəvvüf şeyxi idi. Yuxarıda haqqında məlumat verdiyimiz şeyx Əbu Abdullah Muhəmməd Sührəvərdinin oğlu idi. Mühəddis Muhəmməd ibn Mahmud ibnü'n-Nəccar (öl. 1245) onun tələbələrindən olmuş, ondan hədis dərsləri almışdı. Şeyx Əsəd Sührəvərdi h. 547-ci ildə (1152) anadan olmuş, h. 614-cü ilin rəcəb ayında (oktyabr 1217) vəfat etmişdi[1106].

**Fəxrəddin Əbu Abdullah Muhəmməd ibn Əbdülvaris ibn Ömər əl-Bəkri Sührəvərdi**

Mühəddis idi. Rəsulullahın (ﷺ) I xəlifəsi Əbu Bəkrin (ؓ) nəslindən idi. Şeyxü'ş-şüyux Şihabəddin Əbu Həfs Ömər Sührəvərdinin (öl. 1234) əqrəbası idi. İbnü'l-Fuvati Fəxrəddin Əbu Abdullah Sührəvərdinin onun müəllimlərimdən İzzəddin Əli ibn Muhəmməd ibn Əhməd Sührəvərdinin babası olduğunu qeyd etmişdir. Fəxrəddin Əbu Abdullah Sührəvərdi atası qazi Vəcihəddin Əbdülvaris və Əbü'l-Vəqt Əbdüləvvəlin tələbəsi olmuş, onlardan hədis dərsləri almıdı. Fəxrəddin Əbu Abdullah Sührəvərdi gözəl əxlaqlı və xoşrəftar insan idi. H. 606-cı ilin şəvval ayında (aprel 1210) vəfat etmiş və Bağdaddakı əs-Sultan camesinin yanında dəfn edilmişdi[1107].

**Şeyx Əbü'l-Kərəm Mübarək ibn Həsən Sührəvərdi**

Hədis ravisi və fəqih idi. Bağdadda doğulub böyümüşdü. Bir sıra əsərlərin müəllifi olan şeyx Əbü'l-Kərəm Mübarək xeyirxah, saleh əməlli, xoşrəftar insan idi. O, Əbü'l-Qənaim ibn Mə'munun tələbəsi olmuş, fətva verə biləcəyinə dair icazətnaməni ondan almışdı.

---

[1105] ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'd-Dübeysi*, 16.
[1106] ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'd-Dübeysi*, 143.
[1107] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 341.

İsmayıl ibn Rizqullah ət-Təmimidən hədis dinləmişdi. Alim h. 550-ci ilin zilhiccə ayında (fevral 1156) vəfat etmişdi[1108].

**Əbu Zəkəriyyə Yəhya ibn Abdullah ibn Əizz ibn Ömər Sührəvərdi**

Mühəddis idi. Əmiləri şeyx Muhəmməd ibn Əizz Sührəvərdi və Ömər ibn Əizz Sührəvərdidən hədis dərsləri almışdı. H. 616-cı ildə (1219) Bağdadda vəfat etmişdi[1109].

**Şihabəddin Əbü'l-Fütuh Yəhya ibn Həbəş ibn Əmirək Sührəvərdi**

Şihabəddin Yəhya Sührəvərdi 1155-ci ildə Sührəvərd qəsəbəsində dünaya gəlmişdi[1110]. Qazi Nurullah onun şeyxü'ş-şüyux Şihabəddin Ömər Sührəvərdinin (1145-1234) bacısı oğlu olduğunu qeyd edir[1111]. Lakin digər mənbələrdə bunu təsdiqləyən mahiyyətdə heç bir məlumat yoxdur. Fiqh, fiqh üsulu, kəlam, astronomiya və cədəl kimi elm sahələrində öz dövrünün tanınmış alimlərindən olan Yəhya Sührəvərdi Marağada Fəxrəddin Razi ilə birlikdə, şeyx Məcdəddin Cilinin tələbəsi olmuşdu[1112]. Marağada tələbə ikən sufilərin söhbət məclislərində iştirak edən Yəhya Sührəvərdinin təsəvvüfə meyli artmışdı[1113]. Bunun Yəhya Sührəvərdinin həyatının sonrakı dövrlərində və işraq fəlsəfəsinin təşəkkülündə mühüm rolu olmuşdu. Təhsilini başa vurduqdan sonra bir müddət Azərbaycan, Arran və Şirvanın şəhərlərini gəzən gənc Şihabəddin Yəhya buradakı alim, mütəfəkkir və təsəvvüf ərbabı ilə görüşüb söhbət etmişdi[1114]. Daha sonra vətəni tərk edərək Anadoluya getmişdi. Yəhya Sührəvərdi burada Artuqlu əmiri İmadəddin Əbu Bəkrin (1184-1204) həmayəsinə daxil olaraq Diyarbəkirədə yaşamışdı. Diyarbəkirdə yaşadığı müddətdə şərqi Anadolunun elm və mədəniyyət mərkəzləri

---

1108 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. IV, s. 409.

1109 ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'd-Dübeysi*, 382.

1110 Rzaqulu Xan HİDAYƏT, *Riyazü'l-Arifin*, s. 211, Tehran 1305; QƏZVİNİ, *Asarü'l-Bilad*, s. 264; BAKUVİ, *Təlxisü'l-Asar*, s. 75; İsaməddin Əhməd TAŞKÖPRÜZADƏ, *Mövzuatü'l-Ülum*, C. I, s. 326-329, Beyrut 1985. Şihabəddin Yəhya Sührəvərdinin künyəsi, təvəllüd və ölüm tarixləri haqqında mənbələrdə bir-birindən fərqli məlumatlara rast gəlmək mümkündür.

1111 Qazi Seyyid Nurullah ŞUŞTƏRİ, *Məcalisü'l-Mu'minin*, v. 345a, **AMEA Əİ** Fondu, Nr. D 106/10083. [خواهرزادئی شهاب الدین عمر سهروردی بود] Qazi Şuştəri ehtimal ki, Yəhya Sührəvərdini, Əbu'n-Nəcib Sührəvərdinin qardaşı oğlu Şihabəddin Ömər Sührəvərdi ilə qarışdırmışdır.

1112 YAFİ'İ, *Miratü'l-Cənan*, C. III, s. 329-331.

1113 HƏLƏBİ, *Tarixi-Fəlasifəyi-İran*, s. 502.

1114 Şihabəddin Yəhya SÜHRƏVƏRDİ, *Məcmuate-Müsənnifati-Şeyx İşraq*, C. II, s. 231, (Nşr. Corbin.H), Tehran 1373; Ahmet Kamil CİHAN, "Şihabeddin Sühreverdî'nin Eserleri", **EÜSBED**, S. 11, Kayseri 2001, ss. 56-66.

olan Məyyəfariqin, Mardin və Hərran şəhərlərinə səyahət etmişdi[1115]. Mardində dövrün məşhur alimlərindən Fəxrəddin Mardini ilə tanış olmuş və bir çox elmi mövzuda onunla fikir mübadiləsi aparmışdı. Fəxrəddin Mardini onun haqqında belə demişdi: "Bizim dövrümüzdə (elmi biliyinə görə) onun tayı-bərabərini tapmaq olmaz, lakin mən onun natəmiz olmasından və düşkünlüyündən ötrü narahatam. Ağlının azlığı onun axırına çıxacaq"[1116]. Şihabəddin Yəhyanın geyiminə və zahiri görkəminə əhəmiyyət verməməsi ilə bağlı Zəkəriyyə Qəzvini də öz əsərində bir hadisəni nəqli etmişdir. Müəllif yazır ki, Qəzvin fəqihlərindən birinin dediyinə görə o, Anadoluda olduğu vaxt qaldığı mehmanxanada Şihabəddin Yəhya ilə tanış olmuşu. Şihabəddin Yəhyanın əynində qara rəngli paltar, başında qara rəngli qələnsut varmış. Şihabəddin Yəhya səma' (sufilərə məxsus rəqs) etdikdən sonra gəlib oturmuş və hadisəni nəql edən şəxs ona "bu əynindəkindən başqa paltar geymirsən?" deyə sual vermişdi. Şihabəddin Yəhya bu suala yarımağız cavab verəndə qəzvinli fəqih ona bir neçə dəfə təkidlə "paltarını yu" demişdi[1117]. Diyarbəkirdən Anadolu Səlcuqlularının hakimiyyəti altındakı Sivasa gedən Yəhya Sührəvərdi bir müddət orada yaşamışdı[1118]. O, Anadoluda ikən Səlcuqlu sultanı İzzəddin II Qılıncarslanın (1155-1192) oğulları şahzadə Nəsrəddn Börkyaruqşah, Qütbəddin Məlikşah və Rüknəddin Süleymanşahın müəllimi olmuşdu[1119]. Qısa müddət üçün Azərbaycana qayıdan Yəhya Sührəvərdi yenidən Anadoluya getmişdi. Lakin orada da çox qalmayıb Şam diyarına getmək istəmişdi. Sultan İzzəddin II Qılıncarslanın bunu ona məsləhət görməməsinə rəğmən Yəhya Sührəvərdi Anadolunu tərk edərək Hələbə getmişdi[1120]. Şihabəddin Yəhyanın Anadoludan Suriyaya hansı tarixdə getdiyini müəyyənləşdirmək çətindir. İranlı tədqiqatçılar onun Şam diyarına 1183-cü ildə getdiyini güman etməkdədirlər[1121]. İbnü'l-Əsirin öz əsərində qeyd etdiyi bir hadisəni nəzərə alaraq onun Rüknəddin Süleymanşahın şahzadəliyi dövründə, bu şahzadə hələ Toqat məliki belə deyilkən,

---

[1115] Hilmi Ziya ÜLKEN, *İslam Felsefesi, Kaynakları ve Tesirleri*, s. 188-189, İş Bankası Yay. 1967.
[1116] Müvəffəqəddin Əbü'l-Abbas İBN ƏBİ USEYBİYƏ, *Uyunü'l-Ənba fi Təbəqatü'l-Ətibba*, s. 641-642, Beyrut (trz).
[1117] QƏZVİNİ, *Asarü'l-Bilad*, s. 264.
[1118] ÜLKEN, *İslam Felsefesi*, s. 188-189. Ehtimal ki, Sivasda Səlcuqlu şahzadəsi Qütbəddin Məlikşahın himayəsində yaşamışdı. Sivas məliki Qütbəddin Məlikşah 1189-cu ilin oktyabrında Konyaya gedib yaşlı atasına təzyiq göstərərək özünü vəliəhd şahzadə elan etdirmişdi.
[1119] *Yenə orada*.
[1120] *Yenə orada*.
[1121] Bax: HƏLƏBİ, *Tarixi-Fəlasifəyi-İran*, s. 503; ZƏNCANİ, *Tarixi-Zencan*, s. 77.

Suriyaya getdiyini deyə bilərik. İbnü'l-Əsir ona çatan xəbərlərə görə şahzadə Rüknəddin Süleymanşahın etiqadının pozuq olduğunu, onun fəlsəfi cərəyanlardan birinə mənsub olduğunu, bu firqəyə mənsub olmaqla ittiham edilənlərin şahzadəyə pənah apardıqlarını qeyd etmişdir[1122]. İbnü'l-Əsirə görə şahzadə Rüknəddin "bu tayfa" ilə xoş rəftar edir, onlara lütf və ehsan edirdi. Müəllif yazır: "fəqət o, ağıllı idi və xalqın ona nifrət etməməsi üçün öz etiqadını gizlədirdi"[1123]. İbnü'l-Əsir daha sonra aşağıdakı hadisəni nəql edir: "Rüknəddin Süleymanşahın yaxın adamlarından olan bir şəxs zındıqlığı və fəlsəfi bir cərəyana mənsub olması ilə tanınırdı. O, sultanın yaxın adamlarından biri idi. Bir gün bir fəqih həmin adamla elmi münazirəyə girişdi. Həmin şəxs öz fəlsəfi etiqadından danışmağa başlayanda fəqih ayağa qalxıb şahzadə Rüknəddin Süleymanşahın hüzurunda onu sillələdi və ağır sözlər dedi. Rüknəddin Süleymanşah müdaxilə etmədən səssizcə danışılanları dinləyirdi. Fəqih çıxıb gedəndən sonra həmin adam şahzadə Rüknəddinə "belə bir adam sənin hüzurunda mənə qarşı hörmətsizlik edib həddini aşır, lakin sən səsini belə çıxarmırsan" dedi. Şahzadə Rüknəddin ona belə cavab verdi: "Əgər mən də danışmağa başlasaydım ikimiz də öldürülərdik. Sənin hər istədiyini açıq-aşkar bəyan etmən mümkün deyil". Bu hadisədən sonra həmin filosof onun yanından çıxıb getdi"[1124].

Maraqlıdır ki, İbnü'l-Əsir 1188-ci ildən sonra Şihabəddin Yəhya Sührəvərdini edam etdirən sultan Səlahəddin Əyyubinin (1174-1193) xidmətində olduğu və bu tarixdən 1206-cı ilə qədər Yəhya Sührəvərdinin edam edildiyi Hələbdə yaşadığı halda[1125] haqqında danışdığı bu "zındıqlığı və fəlsəfi bir cərəyana mənsub olması" ilə tanınan şəxsin adını açıq-aydın yazmamışdır. İbnü'l-Əsirin haqqında danışdığı bu şəxsin Şihabəddin Yəhya olması ehtimalı çox qüvvətlidir. Yuxarıda qeyd etdiyimiz kimi Yəhya Sührəvərdi sultan İzzəddin II Qılıncarslanın digər iki oğlu ilə birlikdə Rüknəddin Süleymanşahın müəllimi olmuşdur. Bu vaxt Rüknəddin Süleymanşah hələ ki, hökmdar deyildi, daha sərbəst hərəkət edəcəyi Toqat məlikliyinə isə atası tərəfindən 1186-cı ildə təyin edilmişdi. Atasının sarayında şahzadə ikən hələ ki, heç kimdən

---

1122 İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. XII, s. 163.
1123 *Yenə orada.*
1124 *Yenə orada.*
1125 ŞEŞEN, *Müslümanlar'da Tarih-Coğrafya Yazıcılığı*, s. 138.

çəkinməyəcək bir vəziyyətdə deyildi. Himayə etdiyi sözü gedən filosofu da güman ki, bu səbəbdən müdafiə etməkdən çəkinmişdi.

İbn Bibi Anadolu Səlcuqlu dövlətinin səltənət naibi Cəlaləddin Qaratayın qardaşı əmir Kəmaləddin Kamyarın fəlsəfə və filosoflara qarşı böyük marağı olduğunu, bu sahədə Şihabəddin Yəyanı böyük alim kimi tanıdığını qeyd etmişdir[1126]. Mənbələrdə Şihabəddin Yəhyanın həmçinin simya elmində də mahir olduğu barədə məlumatlara rast gəlinir[1127]. Bununla yanaşı onunla bağlı bəzi əcaib hadisələr də mənqibə halına gətirilərək təbəqat və təzkirə kitablarında qeyd edilmişdir. Bu mənqibələrin birində yazıldığına görə bir qrup tələbəsi ilə birlikdə Dəməşqdən səyahətə çıxan Şihabəddin Yəhya yolda qoyun otaran tərəkəmələrə rast gəlmişdi. O, tələbələrindən birinə 10 dirhəm pul verərək qoyun alması üçün tərəkəmələrin yanına göndərir. Tələbə tərəkəmələrdən birinə 10 dirhəm verərək sürüdən bir qoyun seçib götürür. Bir qədər sonra başqa bir tərəkəmə arxadan onlara yetişərək qoyunu satanın qiymətlərdən xəbərsiz olduğunu, 10 dirhəmə bundan daha kiçik qoyun ala biləcəklərini deyir. Şihabəddin Yəhya tələbələrə qoyunu götürüb getmələrini tapşırır, özü isə tərəkəmə ilə danışıb onu razı salmağa çalışır. Həqiqətən o, çobanı dilə tutaraq razı sala bilmişdi. Lakin bir müddət sonra tərəkəmə yenidən qoyunun ucuza getdiyi fikrinə qapılaraq onların arxasınca yollanmışdı. Şihabəddən Yəhyanı çağırsa da o, dönüb arxaya baxmayaraq yoluna davam etmişdi. Nəhayət arxadan ona yetişən tərəkəmə Şihabəddin Yəhyanın qolundan tutub özünə tərəf çəkmişdi. Çəkilən qol qopub tərəkəmənin əlində qalmış, qorxuya qapılan çoban qopan qolu ataraq qaçmağa başlamışdı. Şihabəddin Yəhya bir damla qan belə axmayan qolunu yerdən alıb yerinə qoymuş və tələbələri ilə birlikdə yola davam etmişdilər[1128]. Bir dəfə də güya insanlar Şihabəddin Yəhyanın suyu dibi görünənə qədər iki yerə böldüyünü görmüşdülər[1129]. Hətta Şihabəddin Yəhyanın

---

[1126] İBN BİBİ, *Əvamirü'l-Əlaiyyə*, s. 478. Bu iki qardaş mənşəcə rum, yəni Anadolu yunanı idilər. Ailələri İslamı qəbul etmiş və türkləşmişdi.

[1127] Əlişir NƏVAYİ, *Nəsayimü'l-Məhəbbə min Şəmayimü'l-Fütuvvə*, (Nşr. K. Eraslan), s. 382-383, İstanbul 1979; CAMİ, *Nəfəhat*, s. 658-659.

[1128] YAFİ'İ, *Miratü'l-Cənan*, C. III, s. 329-330; CAMİ, *Nəfəhat*, s. 658-659; TAŞKÖPRÜZADƏ, *Mövzuatü'l-Ülum*, C. I, s. 326-329.

[1129] QƏZVİNİ, *Asarü'l-Bilad*, s. 264.

Məkkədə ikən Hira mağarasına gedərək orada yaşadığını, "qum, fə-ənzir"[1130] [قُمْ فأَنْذِر] yəni "qalx və insanları xəbərdar et" əmri gələnə qədər oradan çıxmayacağını bildirdiyi də deyilirdi[1131]. Sufizmin mənqibə kitablarında bu qəbildən olan, fizika, tibb kimi elmlərin qanunlarına, yəni sünnətullaha[1132] meydan oxuyan nağılvari hekayələrə tez-tez rast gəlmək mümkündür. Lakin məsələ burasındadır ki, bu cür mənqibələrin yayılması hələ yaşadığı dövrdə Şihabəddin Yəhya haqqındakı ictimai rəyin birmənalı olmamasına yol açmışdı. Hələbdə yaşadığı vaxt insanların bir qismi onu təkfir edib kafirliklə ittiham edərkən, digər bir qismi də onu kəramət sahibi övliyaullahdan biri, yəni Allah dostu, xalis mömin hesab edirdi[1133]. Hələb əhalisinin Şihabəddin Yəhyanı təkfir etdiklərini Şəms-Təbrizinin sözlərindən də anlamaq mümkündür. Şəms-Təbrizi Konyadakı söhbədlərinin birində deyirdi: "Şam diyarında o köpəklər Şihaba açıq-aşkar kafir deyirdilər..."[1134].

Anadoludan Suriyaya gedən Şihabəddin Yəhya Hələbdəki Həlaviyyə mədrəsəsində dərs verməyə başlamışdı. Burada şeyx İftixarəddin adlı bir şəxslə tanış olmuş və onun vasitəsi ilə Hələb məliki, Əyyubi şahzadəsi əz-Zahirlə tanış olmuşdu[1135]. Qısa müddətdə məlikü'z-Zahirin[1136] hörmətini qazanan Şihabəddin Yəhya Əyyubi şahzadəsinin hüzurunda tərtib edilən elmi diskussiyalarda iştirak etməyə başlamışdı. O, dərin

---

[1130] Bu Qur'ani-Kərimin Müddəssir surəsinin 2-ci ayəsidir. Allah Rəsulu (ﷺ) Hira mağarasında ikən ona vəhy edilmişdir. Bu əmrlə İslamın gizli dəvət dövrü qapanıb açıq təbliğ dövrü başlamışdı. Maraqlıdır, əgər Şihabəddin Yəyya Sührəvərdi də həqiqətən belə bir əmr gözləyibsə, kimdən gözləyib?

[1131] Təqiyəddin Əbü'l-Abbas Əhməd İBN TEYMİYYƏ, *İman Üzerine*, (Trc. S. Uçan), s. 126, İstanbul 1994.

[1132] Qur'ani-Kərimin bəzi ayələrində Allahın təbiətdə yaratdığı qanunlardan danışılır. Buna Mülk surəsi 3, Əhzab surəsi 62-ci ayələri nümunə göstərə bilərik. Əhzab surəsi 62-ci ayədə deyilir: [ وَلَنْ تَجِدَ لِسُنَّةِ اللهِ تَبْدِيلا] "Sən sünnətullahda (Allahın qoyduğu qayda-qanunda) əsla dəyişiklik görməzsən!". Buradakı "qayda-qanun"un Allahın yaratdığı təbiət qanunları kimi də təfsir olunmuşdur. Yəni əgər su 100 $C^0$-yə qədər isidilibsə o mütləq qaynamalıdır. Çünki 100 dərəcə suyun qaynama tempraturudur. Bu, qanundur. Eləcə də əgər insanın toxumaları zədələnərkən qopubsa o mütləq qanamalıdır. Burada sadəcə peyğəmbərlər istisna təşkil edir. Çünki onlar insanlara "mən Allahın sizə göndərdiyi elçiyəm" deyərkən sübut istəniləcəyi təqdirdə, insanların hər gün şahidi olmadıqları, təbiətdəki qanunları aşan, sadəcə və sadəcə Allahın, yəni o qanunları yaradanın, qüdrətinin yetə biləcəyi bir hadisə ilə üzləşmələri lazım gəlirdi ki, həmin şəxsin Allahın adından yalan danışmadığı məlum olsun.

[1133] YAFİ'İ, *Miratü'l-Cənan*, C. III, s. 329-330; NƏVAYİ, *Nəsayimü'l-Məhəbbə*, s. 382-383; CAMİ, *Nəfəhat*, s. 658-659.

[1134] ƏFLAKİ, *Ariflerin Menkıbeleri*, C. II, s. 93. Mənbələrdə Şihabəddin Yəhyanın 1191-ci ildə Hələb zindanında həbsdə olduğu vaxt Şəms adlı gənc bir tələbəsinin də onunla birlikdə olduğu barədə məlumatlar var. Bax: ÜLKEN, *İslam Felsefesi*, s. 207. Bu şəxsin Şəms-Təbrizi olduğunu ehtimal edirik. Çünki Şəms-Təbrizinin "Məqalat"ında qeyd edilmiş söhbətlərindən də onun Şihabəddin Yəhya Sührəvərdi ilə şəxsən tanış olduğu məlum olur. Bax: *Məqalati-Şəmsi-Təbrizi*, (Nşr. Ə. Xoşnüvis), s. 258, 349-350, Tehran 1349.

[1135] ZƏNCANİ, *Tarixi-Zəncan*, s. 76.

[1136] Məlikü'z-Zahir ğazi (öl. 1216)-Əyyubi hökmdarı sultan Səlahəddin Yusif Əyyubinin (1169-1193) oğlu idi. Əyyubi hökmdarı əmisi Məlik I Adilə (1200-1218) bağlı olaraq Hələb şəhəri və ətraf vilayətləri idarə etmişdi. Məlikü'z-Zahir yeniyetməlik yaşlarından Hələb hakimi olmuş və gənc yaşlarında vəfat etmişdi. Ətraflı məlumat üçün bax: ƏBÜ'l-FİDA, *Kitabü't-Tibrü'-Məsbuk*, s. 73.

mühakimə qabiliyyəti və inandırıcı dəlilləri ilə rəqiblərini üstələməyi bacarırdı. Belə diskussiyalardan birində Hələbin fəqih və kəlam alimləri ilə qızğın mübahisəyə girişən Yəhya Sührəvərdi məlikü'z-Zahirin ehtiramını qazanmışdı[1137]. Hələbdə tez-tez mütəkəllimlər, fəqihlər və məşşai filosofların iştirak etdikləri münazirə məclislərində iştirak edərək özünün işraqi-fəlsəfi fikirlərini müdafiə edən Yəhya Sührəvərdi qısa müddətdə mütəkəllim və fəqihlərin hədəfinə çevrildi. Şam diyarı üləması Şihabəddin Yəhyanı batini əqidəli olmaqla və küfrlə suçlayaraq sultan Səlahəddin Əyyubiyə şikayət etdilər. Onlar sultan Səlahəddin Əyyubidən onun Misirə aparılıb orada nəzarətdə saxlanmasını və Suriyaya gəlməsinin qadağan edilməsini xahiş etmişdilər. Əks təqdirdə şahzadə məlikü'z-Zahirin əqidəsinin pozulacağından və Hələbdə fitnə qopacağından əndişə etdiklərini bildirmişdilər. Səlahəddin Əyyubinin əmri ilə Şihabəddin Yəhya Sührəvərdi 1191-ci ildə məhkəməyə verilmiş, məhkəmə onu təqsirli bilərək edama məhkum etmişdi. Vəzir Qazi əl-Fazil[1138] məhkəmənin qərarını təsdiqləyərkən üzərinə öz xətti ilə belə yazmışdı: "Şihabəddin Yəyha Sührəvərdinin qətli vacibdir. O, buna artıqlaması ilə layiqdir"[1139]. Hələb zindanına həbsə göndərilən Şihabəddin Yəhya Sührəvərdi 1191-ci ildə burada ölmüşdü. Onun necə edam edildiyi ilə bağlı mənbələrdə müxtəlif məlumatlar var. Lakin bunlardan daha səhih olanı, Əbu Yə'la Yafi'i və İbn Əbi Usəybiyyənin qeyd etdikləri kimi, onun öz istəyi ilə ac və susuz qalaraq ölməsidir[1140]. Şihabəddin Yəhya Sührəvərdi həyatda ikən də uzun müddət ac və susuz qalaraq riyazət edirdi[1141]. Hətta bu səbəbdən arıqlayaraq bədəni çox zəif olmuşdu. Görünür ölümü də belə qəbul etmək istəmişdi.

---

[1137] İBN ƏBİ USEYBİYƏ, *Təbəqatü'l-Ətibba*, s. 641-642; MƏMMƏDOV, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, s. 66-67; ZƏNCANİ, *Tarixi-Zəncan*, s. 84.

[1138] Qazi əl-Fazil ləqəbi ilə tanınan Əbdürrəhim ibn Əli ibn Muhəmməd əl-Ləxmi əl-Beysani (1135-1200) yaşadığı dövrün məşhur fəqih, ədib və dövlət xadimlərindən biri olmuşdu. Fələstinin Qəzza bölgəsinin Əsqəlan şəhərində dünyaya gələn qazi əl-Fazil Misirdə təhsil almış, Səlahədin Əyyubinin dövlət divanında müxtəifi vəzifələri icra etmiş, nəhayət sultan tərəfindən vəzirlik vəzifəsinə təyin edilmişdi.

[1139] İBN ƏBİ USEYBİYƏ, *Təbəqatü'l-Ətibba*, s. 642; ZƏNCANİ, *Tarixi-Zəncan*, s. 84.

[1140] YAFİ'İ, *Miratü'l-Cənan*, C. III, s. 331; İBN ƏBİ USEYBİYƏ, *Təbəqatü'l-Ətibba*, s. 642. Görünür məhbusların ölüm aclığı elan etməsinin tarixi xeyli qədimdir. Güman ki, bunu ilk edən də Şihabəddin Yəhya Sührəvərdi olmuşdur.

[1141] HƏLƏBİ, *Tarixi-Fəlasifəyi-İran*, s. 504. Riyazət-yemək, içmək və digər dünyə nemətlərini tərk etmək. Az yemək və içməklə nəfsi tərbiyə etmək. Riyazət oruc tutmaqdan fərqli bir şeydir. Riyazət nəticəsində qeybdən ilham aldığını, həqiqətlərin kəşfinə məzhər olduğunu iddia edənlər də olmuşdur. Güman ki, riyazət sahiblərinin gözünə "qeybdən sadir olan həqiqət" kimi görünənlər uzun müddət ac və susuz qalmağın nəticəsində meydana gələn qarabasmalar və halusunyasiyalar olmuşdur.

Yəhya Sührəvərdi, 24-ü müasir dövrə qədər gəlib çatmamış, irili-xırdalı 102 əsərin müəllifi idi. Bilinən 78 əsərdən 26-sı, əksəriyyəti İranda olmaqla, nəşr olunmuşdur[1142]. Yəhya Sührəvərdi həmçinin şair idi. Onun farsca şerlərini ehtiva edən bir məcmuə Konya Mövlana muzeyi kitabxanasında saxlanılır[1143]. Şihabəddin Yəhya əsərlərinin mühüm bir qismini Anadoluda yaşadığı dövrdə qələmə almışdı. Artuqlu əmiri İmadəddin Əbu Bəkrə ithafən yazdığı "Əlvahü'l-İmadi" adlı əsərinin ən qədim nüsxələrindən biri Konya Yusifağa kitabxanası Nr. 4866/3-də saxlanılır. Onun "Risalətü't-Təyr", "Yəzdan Şenaxt"[1144] (Nr. 12053), "Tuhfətü'l-Əhbab" (Nr. 7342) adlı əsərləri İranda, Astanqüdse Rezəvi kitabxanasında[1145], h. 691-ci (1292) il istinsəx tarixli "Hikmətü'l-İşraq" və "Heyakilü'n-Nur" adlı əsərləri isə İstanbulda, Köprülü kitabxanasında[1146] mühafizə edilməkdədir. Onun Səlcuqlu şahzadəsi Nəsrəddn Börkyaruqşaha ithafən qələmə aldığı "Pərtəvnamə" adlı əsəri Qahirə Milli kitabxanası Nr. 194, "Risaleyi-Həqiqətü'l-Eşq ya Munisü'l-Üşşaq" adlı risaləsi isə Nr. 510-da saxlanılır[1147].

Bundan başqa Şihabəddin Yəhya Sührəvərdinin ərəbcə və farsca qələmə aldığı əsərlərinin bəziləri aşağıdakıladır: "əl-Mütarixət", "ət-Təlvihat", "əl-Ləma'at", "əl-Müqavəmat", "Rəmzü'l-Mumi", "Məbdə' və'l-Məad bi'l-Farisiyyə", "Bustanü'l-Qülub", "Təvariqü'l-Ənvar", "Tənkiha fi'l-Üsul", "Kitab fi't-Təsəvvüf yu'raf bi'l-Kəlima", "Barikatü'l-İlahiyyə", "Nəğəmatü's-Səmaviyyə", "Raqimü'l-Qüds", "Kitabi-Zənd", "Etiqadü'l-Hükəma", "Kitabü's-Səbr", "Risalə fi halətü't-Tufliyyə", "Risalətü'l-Me'rac", "Ruzi ba camaate-Sufiyan", "Əqle-Sorx", "Avaze-Pəre-Cəbrail", "Qürbətü'l-Qəribiyyə", "Səfire-Semurğ", "Lüğəte-Muran", "Risalətü't-Təsvir ayət imn Kitabullah və xəbəri-Rəsulullah", "Qayətü'l-Mübtəda"[1148].

Şihabəddin Yəhya Sührəvərdinin öz dövrünün böyük mütəfəkkirlərindən biri olduğunu onun müasiri olmuş alimlərin bir çoxu təsdiq etmişdirlər. İşraq fəlsəfəsi onun

1142 CİHAN, *həmin məqalə*.

1143 Abdülbaki GÖLPINARLI, *Mevlana Müzesi Yazmalar Kataloğu*, C. I, s. 165, Ankara 1967.

1144 Möhtərəm prof. Mikayıl Bayram "Yəzdan Şenaxt"ın Əxi Əvrən Nəsirəddin Mahmud Xoyiyə aid olduğunu müəyyən etmişdir, bax: *Ahi Evren ve Ahi Teşkilatı'nın Kuruluşu*, s. 68-69.

1145 MÜŞTƏRƏK, *Fehriste-Kitabxaneyi-Astanqüdse-Rezəvi*, C. XI, s. 294 ,340, Tehran 1926.

1146 MÜŞTƏRƏK, *Fihris Mahtutat-ı Mektebet-i Köprülü*, (Nşr. E. İhsanoğlu), C. II, s. 331, 361, İstanbul 1986.

1147 MÜŞTƏRƏK, *A Title Catalogue of Persian Manuscripts in the National Library Till 1963*, C. I, s. 38, 125, Kahire 1966.

1148 MƏMMƏDOV, *həmin əsər*, s. 68-69; CİHAN, *həmin məqalə*.

əsərləri və düşüncələrində yenidən canlanma fürsəti tapmşdır. Buna görə də o Şeyxü'l-İşraq adlandırılmışdır. İşraq fəlsəfəsinin mənşəi qədim yunan filosofu Platona (Əflatun) qədər gedib çıxır. Platondan sonra bu fəlsəfi cərəyan Misirdə yayılmış və inkişaf etmişdi. İşraq fəlsəfəsi Bizansın rəsmi dairələri tərəfindən təqib edildiyi üçün bu düşüncə VI əsrin ortalarında mühacirət edən neoplatonist (yeniəflatunçu) filosoflar tərəfindən İrana gətirilmişdir[1149]. Platon və ustadı Sokrat da bu fəlsəfənin təməlini qoyarkən qədim İran mütəfəkkirlərinin düşüncələrindən faydalanmışdılar. Platon öz akademiyasındakı mühazirələrində Zərdüştdən tez-tez rəğbətlə söz açardı[1150]. Abbasilər dövründə yunan filosoflarının əsərləri ərəbcəyə tərcümə edildikdən sonra neoplatonist cərəyan müsəlman məmləkətlərində, ələlxüsus İranda yayılmaq üçün yeni fürsət əldə etmiş oldu[1151]. Neoplatonist fəlsəfəyə maraq xüsusilə Abbasilərdən xəlifə Mə'munun (813-833) hakimiyyəti illərində zirvəyə çatmışdı. Bu dövrdə sufizm də bu təmayülə paralel olaraq və onun təsirində inkişaf edirdi[1152]. Şihabəddin Yəhyanın İşraq nəzəriyyəsinin platonist fəlsəfə ilə sufizmin xəlitəsindən ibarət olması bundan irəli gəlir. Şihabəddin Yəhyanın aristotelçi məşşai filosoflarla həqiqəti idrak metodunda ixtilaf etdikləri əsas məsələ buradan irəli gəlir. Məlum olduğu kimi məşşai (peripatetik) fəlsəfə varlıqları üç əsas hissəyə ayırır: vacib, mümkün və qeyri-mümkün. İşraq fəlsəfəsində isə əşya ya nurdur ya da zülümət. Nur ikiyə ayrılır, zatı ilə qaim olan nur, zatından qeyri ilə qaim olan nur. İşraqiyyə eynən zülüməti də beləcə iki qismə ayırır. Beləliklə işraqiyyəyə görə əşya üç deyil, dörd əsas hissəyə ayrılır. İşraqi fəlsəfə məşşailərin əşyanın ya cövhər ya da a'raz olduğu, ya özünü idrak etdiyi, ya da öz varlığından qafil olduğu fikrinə qarşı çıxmaqdadır. İşraqiyyəyə görə əşya "nuri-mücərrəd"dir. Özünü dərk edib qavradıqca ondan yeni şeylər südur olur ki, bunu da "nuri-a'raz" adlandırırdılar[1153].

Məşşai fəlsəfə həqiqəti ortaya çıxaran, dəqiq biliyi əldə edən yol olaraq özünün burhani metodunu, yəni qəti əqli dəlillərə əsaslanan isbat metodunu qəbul edir[1154]. İşraqi

---

1149 Zəbihullah SƏFA, *Tarixi-Ədəbiyyat dər İran*, C. II, s. 998-999, Tehran 1339.

1150 *Həmin əsər*, s. 333, 999.

1151 *Həmin əsər*, s. 999.

1152 ZƏNCANİ, *Tarixi-Zəncan*, s. 84; SƏFA, *Tarixi-Ədəbiyyat dər İran*, C. II, s. 999

1153 HƏLƏBİ, *Tarixi-Fəlasifəyi-İran*, s. 508.

1154 İsmayıl Hakkı İZMİRLİ, *İslam'da Felsefe Akımları*, (Nşr. N.A. Özalp), s. 24-25, İstanbul 1995.

fəlsəfədə isə həqiqi elm, bilik Yəhya Sührəvərdinin "Hikmətü'l-İşraq"ında qeyd etdiyi kimi bu biliyi əldə etmək istəyən şəxsin "riyazət və zövqləri vasitəsi" ilə əldə edilə bilər[1155]. İşraqi fəlsəfənin metodu naməlum müəllif tərəfindən türkcə qələmə alınmış, Konya BYEK Nr. 1792-də saxlanılan məcmuədəki bir əsərdə belə açıqlanır: "Cənabi-Sührəvərdinin fəlsəfəsindəki məbdə'i-hərəkət üsuli-mükaşəfədir. Yəni fəlsəfəyi-zövqiyyədir. Mükaşəfəyə istinad edir. Əql təriqi insanı həqiqətə irsal edəməz. Əql məhəlli-ixtilafdır. Həqiqətdə mükaşəfə əsasdır. Bu əsasla gedilsə yekdigərinə ixtilaf edilməz. İxtilaf ancaq dəlilə aid qalar. Həqiqətdə ixtilaf mümkün deyil. Zira həqiqət dəyişməz"[1156].

Ardıcılları və fikirdaşları şeyxü'l-İşraqın əsərlərini və düşüncələrini nə qədər təvil etməyə, yozmağa çalışsalar da bu əsərlərin məcusiliyin, zərdüştiliyin güclü təsiri altında qalmış şəxs tərəfindən qələmə alındığı açıq-aşkar özünü biruzə verir. Onun "Pərtəvnamə", "Həyakilü'n-Nur", "Əlvahi-İmadi", "Rəsaili-İrfani", "Risalətü't-Təyr", "Avaze-Pəre-Cəbrail", "Əqle-Sorx", "Ruzi ba camaate-sufiyan", "Fi halətü't-Tufliyyə", "Fi həqiqətü'l-Eşq ya Munisü'l-Uşşaq", "Lüğəte-Muran", "Səfire-Semurğ", "Bustanü'l-Qülub ya Rəvzətü'l-Qülub", "Yezdan-Şenaxt" kimi farsca əsərləri Seyyid Hüseyn Nəsr və Henry Corbin tərəfindən "Məcmuate-Asari-Farisi Şeyx İşraq" adı ilə 1970-ci ildə Tehranda iki cild halında nəşr edilmişdir. Buradakı əsər və məqalələrdə Şihabəddin Yəhyanın ciddi şəkildə qədim İranın din, mədəniyyət və fəlsəfəsinin təsirində olduğu görülür. Belə ki, o, özünün "Kitabi-Zənd" adlı məqaləsində Platonu "rəisü'l-hikmə", Zərdüştü isə "imami-kamil və hakim" adlandırmaqdan çəkinməmişdir[1157]. Şihabəddin Yəhya "Hikmətü'l-İşraq" adlı əsərində "işığın və zülmətin zəmin təşkil etdiyi təməl üzərində" qurduğu fəlsəfəsini rəmzlər və simvollar vasitəsiylə izah etmişdir. Müəllif deyir: "Əgər istifadə etdiyim rəmzləri anlamasanız, məni qınamayın. Bilin ki, bir çox hikmət sahibi öz fikirlərini nadanların tə'nəsindən qorunmaq üçün rəmz və işarələrlə izah etmişdir. Bəsirət sahibləri anlayarlar"[1158]. Lakin bu rəmzlər demək olar ki, müəllifin özündən başqa heç kimin anlaya bilməyəcəyi növdəndir. İşin maraqlı tərəfi isə Yəhya

---

[1155] HƏLƏBİ, *Tarixi-Fəlasifəyi-İran*, s. 504.
[1156] ANONİM, *Həyakilü'n-Nur Müəllifi Şeyx Sührəvərdi Həzrətlərinin Fəlsəfəsi*, v. 259a, **KBYEK**, Nr. 1792.
[1157] ÜLKEN, *həmin əsər*, s. 192.
[1158] HƏLƏBİ, *Tarixi-Fəlasifəyi-İran*, s. 504.

Sührəvərdinin bu rəmz və işarələrin demək olar ki, hamısını qədim İran əsatirləri və zərdüştilikdən götürməsidir. Bununla yanaşı onun əsərlərində israiliyyatın, yəni qədim yəhudi dini hekayələrinin də təsirini görmək mümkündür. Məsələn "Əqle-Sorx" (Qırmızı Ağıl) adlı əsərində bir dostu şeyxü'l-İşraqdan soruşur: "quşlar bir-birlərinin danışığını başa düşürlərmi?". O, "bəli" deyə cavab verir. Dostu bunun dəlilini tələb edəndə o, güya başına gəlmiş bir əhvalatı ona nəql edir. Həmin əhvata görə bir gün quşlar şeyxü'l-İşraqı naməlum bir aləmə aparırlar. Orada şeyxü'l-İşraq ağ saqqallı, qırmızı üzlü bir gənclə rastlaşır və ona "ey gənc!" deyə xitab edir. Həmin şəxs ona belə xitab etməyin yanlış olduğunu deyir və özünü belə tanıdır: "Mən həqiqətin oğluyam. Həm də gənc deyil, nurani bir qocayam, gəldiyim yer Qaf dağıdır, sən də əvvəlcə oradan gəlmisən, fəqət unutmusan". Şeyxü'l-İşraqın "üzün niyə qırmızıdır" sualına həmin şəxs "axşamın başlaması qırmızıdır, səhərin başlaması qırmızı, günəş batarkən qırmızıdır, doğarkən qırmızı. Qəndilin alovunun çıxışı nur bəyazıdır, ən üstü qara tüstü, bu ikisinin arası qırmızıdır. Qürub və tülu'nun hər isisinin arası qırmızılıqdır, fəqət bir tərəfi qara (gecə), digər tərəfi isə bəyazdır (gündüz)" deyə cavab verir. Şeyxü'l-İşraq ondan əziyyətdən qurtulmanın yolunu soruşur. O, deyir "dirilik bulağını tap, o bulağın suyu ilə yuyun və beləcə Davudun zirehi bədənini örtsün, Bilarəkin qılıncının zərbəsindən qorunarsan". Sonra aralarında belə bir dialoq baş verir: Şeyxü'l-İşraq: "Dirilik bulağı haradadır?". Əqle-Sorx: "Zülümətdədir, oraya getmək üçün Xıdırın çarıqlarını geyməlisinə". Şeyxü'l-İşraq: "Zülümətin əlaməti nədir?". Əqle-Sorx: "Qaradır və sən özün də zülümətsən, fəqət fərqində deyilsən". Şeyxü'l-İşraq: "Sənin bu aləmdə nə işin var?". Əqle-Sorx: "Mən səyyaham və bu aləmdə yeddi əcaibə rast gəldim. Bunların ilki mənim vətənim olan Qaf dağıdır, ikincisi gecəni aydınladan cövhərdir, üçüncüsü on iki iş yeridir, dördüncüsü Davudun zirehidir, beşincisi Bilarəkin qılıncıdır, altıncısı dirilik bulağıdır, yeddincisi budaqlarında hər cür meyvənin yetişdiyi Tuba ağacıdır. Simurğ quşunun yuvası bu ağacın başındadır. Zal anadan olanda saçı və üzü ağappaq olduğu üçün atası Sam onu aparıb səhraya atmışdı. Simurğ Zalı alıb aparmış və böyütmüşdü"[1159]. Sonra Şihabəddin Yəhya bu qədim İran əsatirini təfərrüatı ilə yazır.

---

[1159] Şihabəddin Yəhya SÜHRƏVƏRDİ, *Məcmuate-Asari-Farisi Şeyx İşraq*, C. II, s. 226-239, (Nşr. S.H.Nasr-Corbin.H),

“Ruzi ba camaate-sufiyan” (Sufilərin arasında bir gün) adlı əsərində isə Şihabəddin Yəhya özünün yaradılış fəlsəfəsini belə açıqlayır: “Xoda (tanrı) fələkləri yaradandan sonra, fələyin təzyinatı üçün nuru ilk fələyə göndərmişdir. Lakin lətifliyindən ötrü fələki-əvvəl onu daşıya bilməmişdir. Çünki fələk yaradılışı etibarı ilə varlıqla yoxluq arasındadır. Bir yandan “vücud”a qonşudur, digər yandan isə “ə’dm”ə. Bəs bu ikisinin arasında nə var? Ona əşya demək olarmı? Surətinə görə o, naçizə (əşya olmayana) daha yaxındır. Amma keyfiyyət baxımından digər əşyadan daha çox əşya xüsusiyyətlərinə malikdir. Məsələn hava, sən onu nəzərə almırsan. Lakin onda hərəkət qüvvəsi mövcuddur. Zərrələri daşıya bilir. Bu onun lətifliyindən irəli gəlir. Nur ikinci fələyə çatı və onu cüzlərə ayırdı. Bu cüzlərdən ulduzlar meydana gəldi. Bu parçalanmadan geri qalanlar üçüncü fələyə çatdılar. Bunladan da Zühal (Saturun) ulduzu meydana çıxdı. Bu parçalanmadan geri qalanlar dördüncü fələyə çatdı. Bunladan da Müştəri (Yupiter) ulduzu meydana çıxdı. Eynən beləcə Mərrix (Mars), sonra Afitab (Günəş), ondan Zöhrə (Venus), ondan Utarid (Merkuri), ondan da Ay meydana çıxdı”[1160].

“Səfire-Semurğ” (Simurğun Naləsi) adlı risaləsində Yəhya Sührəvərdi ilahi eşq mövzusuna toxunaraq məsələni belə izah edir: “Mənsur Həllac deyir: “iki şəxs arasındakı sevgi, məhəbbət o vaxt möhkəm olur ki, onların arasında açılmamış heç bir sirr qalmasın”. Kamil insan o insandır ki, Haqq-Təalaya bənzəməyə çalışaraq kamil elmi onun sifətlərindən əldə etsin. Lazımdır ki, insan maarifləndikcə onun vücudu da şərəflənsin. Lakin mütəkəllimlərin və digər üsul əhlinin yolu budur ki, insan Tanrını sevməməlidir. Çünki sevgi sevgiliyə meyli zəruri edir. Hər növ də ancaq öz növünə meyl edə bilər. İnsanın Tanrıya olan sevgisi yalnız ona itaət etməkdən ibarətdir. Lakin əhli-mərifət sübut etmişdir ki, sevgi və ləzzəti cinsiyyətlə inhisar etmək yanlışdır. Məsələn insan gözəl rəngi və ya həyatı da sevə bilər. Halbuki bunlar onunla eyni növdən deyillər. Bundan başqa Haqqın sevgisi heyvani bir qüvvədən meydana gələn sevgi də deyildir. Bəlkə Rəbbaniyyət nöqtəsindədir ki, bütün həqiqətlərin mərkəzi oradır. Bu sevgidə cinsiyyət şərt deyildir. Bu cür eşqdə murada çatma və şövq də

---

Tehran 1970.

[1160] *Həmin əsər*, s. 244-245.

yoxdur. Çünki məşuqun camalına çatdığın vaxt arzun və istəyin qalmaz, sevgin bitər. İlahi eşqin ləzzəti bundadır ki, kamala çatıb əşyanın sirrini əldə edirsən"[1161].

"Həyakilü'n-Nur" (Nurdan Heykəllər) adlı əsərində isə Yəhya Sührəvərdi insanın ruhu ilə bağlı müxtəlif fikirləri maqayisə edərək öz nöqteyi-nəzərini açıqlayır: "Bəzi insanlar deyirlər ki, "nəfsi-natiqə" (danışan nəfs, ruh) cism deyildir və onu ilahi mənşəli hesab edirlər. Bu zənləri onları Xodadan (tanrıdan) uzaqlaşdırır. Çünki Tanrı təkdir, nəfs isə çox. Hər şəxsin ayrı bir nəfsi vardır. Bunların ilahi mənşəli olması birinin bir şeyi bildiyi vaxt digərlərini də bilməsini zəruri edir. Nəfsi-natiqə ilahi mənşəlidirsə necə olur ki, bədənin əsiri olur, şəhvətin qucağına düşür və göylərin hökmü (qədər) ona təsir edir? Başqa bir güruh isə nəfsi-natiqənin Tanrının bir hissəsi olduğunu deyir. Bu tamamilə sapğın bir zəndir. Çünki onlar özləri deyirlər ki, Tanrı cism deyildir. Elə isə necə olur ki, o, hissələrə ayrılır, bunu kim edə bilir? Başqa bir güruh isə nəfsi-natiqənin qədim və əzəl olduğunu deyir ki, bu da batil bir fikirdir. Nəsfi-natiqə hədisdir (yaradılmışdır) və yenidir, Tanrı onu bədəndə yaratmışdır. Nə əvvəl, nə də sonra. Necə ki, hazır bir fitili başqa bir od və ya qəndillə yandıranda həmin qəndil və oddan heç bir şey azalmır"[1162]. Göründüyü kimi bu "ənəl-həqq" deməyin dolaylı yoludur. Burada şeyxü'l-İşraq kəlam alimlərinin və vəhdəti-vücudçuların fikirlərini öz aləmində çürüdərək ruhun keyfiyyət və necəliyinə dair fikirlərini açıqlamışdır.

**Əbu Bəkr Muhəmməd ibn Aşir ibn Məruf Şirvani**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. Mömin və saleh insan olan Əbu Bəkr Muhəmməd ibn Aşir fiqh elmini İlkiya əl-Hərrasidən[1163] öyrənmişdi. Əbu Bəkr Muhəmməd Şirvani Əbü'l-Xeyr Mübarək ibn Hüseyn əl-Qəssal əl-Müqri və Hibətullah ibn Mübarəkdən hədis dinləmişdi. Bioqraf-tarixçi Səm'ani, Əbu Bəkr Muhəmməd Şirvaninin tələbəsi olduğunu, ondan hədis dinlədiyini və dinlədiyi hədislərin az bir qismini yazdığını öz əsərində qeyd etmişdi. Əbu Bəkr Muhəmməd Şirvani Bağdadda

---

[1161] *Həmin əsər*, s. 328-329.

[1162] *Həmin əsər*, s. 89-91.

[1163] İlkiya əl-Hərrasi adı tanınmış Əbü'l-Həsən Əli ibn Muhəmməd ibn Əli əl-Amuli ət-Təbəri (1058-1110) əslən İranın Mazəndaran (Təbəristan) vilayətinin Amul şəhərindən idi. Yaşadığı dövrün böyük təfsir, fiqh və üsul alimlərindən biri idi. Onlarla əsərin müəllifi idi. "Əhkamü'l-Qur'an" adlı təfsiri əsərlərinin ən məşhurudur. Nizamiyyə mədrəsəsinin baş müdərrisi (rektor) olmuşdu.

yaşayır, Nizamiyyə mədrəsəsində dərs verirdi. Alim h. 539-cu ilin şəvval ayında (aprel 1145) vəfat etmişdi[1164].

**Qazi Məcdəddin Əbü'l-Məcd ibn Səncər ibn Muhəmməd Şirvani**

Şafi'i məzhəbinə mənsub fəqih olan qazi Məcdəddin Şirvani öz dövrünün tanınmış alimlərindən biri idi. O, Şirvan qazisi olmaqla yanaşı həm də buradakı mədrəsələrdən birində müdərris idi. İbnü'l-Fuvati h. 673-cü (1275) ildə onunla görüşdüyünü və qazi Məcdəddin Şirvaninin köçüb Təbrizdə yaşadığını qeyd etmişdir[1165]. Ölüm tarixi qeyd edilməmişdir.

**Muhyəddin İsa ibn Əbü'l-Məcd Şirvani**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Anadoluya getmiş və orada yaşamışdı. O, güman ki, yuxarıda sözü gedən qazi Məcdəddin Əbü'l-Məcd Şirvaninin oğlu idi. İbnü'l-Fuvati onun tanınmış qazi, əyan və zadəgan ailəsinə mənsub olduğunu bildirmişdi. İbnü'l-Fuvati h. 716-cı ilin cəmadiəlaxir ayında (avqust 1316) görüşdüyü Muhyəddin İsa Şirvaninin alicənab və fəzilətli şəxs olduğunu qeyd etmişdir[1166].

**Şeyx Müəyyinəddin Əbü'l-Fəzl Bəxtiyar ibn Mühənna ibn Əbdürrəhman Şirvani**

XIII əsrdə yaşamış azərbaycanlı mütəfəkkir, ədəbiyyatşünas və filosof idi. İbnü'l-Fuvati onunla h. 662-ci (1264) ildə Marağada görüşdüyünü yazır. Müəllif həmçinin bildirir ki, şeyx Əbü'l-Fəzl Bəxtiyar Şirvani Nəsrəddin Tusi ilə də görüşmüş, daha sonra Marağa yaxınlığındakı hərbi düşərgəyə gedərək orada Hülagü xanla da görüşmüşdü. Şeyx Müəyyinəddin Şirvani h. 665-ci ilin rəbiələvvəl ayında (dekabr 1266) Təbrizdə ölmüşdü[1167].

---

1164 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. III, s. 88-89; SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, c.6, s. 82; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. IV, s. 223; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 257; ŞƏHRƏZURİ, *Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, C. I, s. 226. İbnü's-Səlah Şəhrəzuri və Cəmaləddin Əsnəvi onun nisbəsini "Dərbəndi əş-Şirvani" olaraq qeyd etmiş və alimin əslən Dərbənd şəhərindən olduğunu bildirmişdir.

1165 BÜNYADOV, "Vidnıye Deyateli Azerbaydjana v Soçinenii İbn al-Fuvati", s. 61-67.

1166 BÜNYADOV, *həmin məqalə*.

1167 BÜNYADOV, *həmin məqalə*.

**Əbdürrəhman ibn Osman ibn Əmir Şirvani**

Mütəkəllim idi. Səxavi onun dəniz yolu ilə Məkkəyə, həcc ziyarətinə gəldiyini qeyd etmişdi. Həmin dövrdə Xəzərin okeanlara çıxışı olmadığı üçün ehtimal ki, Əbdürrəhman Şirvani Kiçik Asiya və ya Misirin limanlarından gəlmi ilə Məkkəyə getmişdi. Səxavi bəzi tələbələrin ondan müəyyən məsələlərə dair biliklər öyrəndiklərini, özünün isə Əbdürrəhman Şirvani ilə hədis isnadı və terminologiyası barədə mübahisə edərək ona üstün gəldiyini qeyd edir. Bundan başqa Səxavi "o yerin (Şirvanın) insanları hədis elmində az şey bilirlər" deyə bir qeyd də etmişdir[1168]. Əbdürrəhman Şirvaninin ölüm tarixi məlum deyil. XV əsrdə yaşamışdır.

Doğrusu Şəmsəddin Səxavinin kəlam sahəsində ixtisaslaşmış bir alimlə hədis elmində diskussiyaya girişib belə bir nəticə çıxarmasına heyrətlənməmək mümkün deyil. Əslində Şəmsəddin Səxavi yaşadığı dövrdə İslam dünyasının ən qabaqcıl tənqidçilərindən biri olmuşdur. O, ustadı İbn Həcər Əsqəlani xaric, ərəb və qeyri-ərəb, demək olar ki, tanıdığı bütün alimləri tənqid etmişdir. Buna görə tez-tez öz müasiri olan alimlərin qəzəbinə tuş gəlmişdi. Cəlaləddin Əbdürrəhman Süyuti (öl. 1451) onun bu tərz tənqidçiliyini tənqid edən "Qavi fi Tarixi-Səxavi" adlı risalə qələmə almışdı[1169].

**Əbü'l-Həsən Muhəmməd ibn Nuh ibn Sabir ibn Əhməd ibn Nuh ibn Osman ibn Nafi' Şirvani**

Mühəddis idi. Əbu Əli Saleh ibn Muhəmməd, Hamid ibn Səhl, Nəsr ibn Əhməd Bağdadi və Səhl ibn Şazəveyhdən[1170] hədis dinləmiş və nəql etmişdi[1171]. Ölüm tarixi məlum deyil. VIII-IX əsrlərdə yaşayıb.

**Əbü'l-Qasım Bəkir ibn Əmr Şirvani**

---

[1168] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 248.
[1169] ŞEŞEN, *həmin əsər*, s. 224.
[1170] Əbu Harun Səhl ibn Şazəveyh Buxari (öl. 815) mühəddis idi.
[1171] İBN MAKULA, *İkmal*, C. II, s. 122.

Hədis ravisi idi. Buxarada yaşmışdı. Zəkəriyyə ibn Yəhya ibn Əsəd, Muhəmməd ibn İsa Mədaini, İshaq ibn Muhəmməd ibnü's-Səbbah Cərcərayidən hədis dinləmişdi. H. 314-cü ilin ramazan ayında (noyabr 926) vəfat etmişdi[1172].

**Şeyx Burhanəddin İbrahim ibn Muhəmməd ibn İbrahim Şirvani**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Fiqhlə yanaşı fəraiz, kəlam və riyaziyyat elmlərində də dərin biliyə malik idi. H. 865-ci ildə (1461) Qahirəyə, daha sonra Qırmızı dəniz yolu ilə Misirdən həcc ziyarətinə getmişdi. Şeyx Burhanəddin Şirvani fiqhə dair bəzi əsərlərin müəllifi idi[1173]. Ölüm tarixi məlum deyil.

**Şeyx Əkmələddin Əli ibn İbrahim ibn Muhəmməd əz-Zühri Şirvani**

Hənəfi məzhəbinə mənsub fəqih və təsəvvüf əhlinə mənsub nəqşibəndi şeyxi idi. Şeyx Əkmələddin Əli əfəndi Şirvani fəzilət, vəra sahibi, zahid insan idi. O, h. 1078-ci ildə (1667) Şirvandan Hicaza getmiş və Mədinə şəhərində məskunlaşmışdı. Osmanlı şeyxülislamlarından seyyid Feyzullah əfəndi[1174] onun dayısının oğlu idi. "Əqsəü'l-Mətalib", "Mühimmatü'l-Mə'rufi'l-Vacibə", "Camiü'l-Mənasik", "Xülasətü't-Təvarix", "Dəlilü'l-Zairin və Ənisü'l-Mücavirin" adlı əsərlərin müəllifi olan[1175] şeyx Əkmələddin Əli Şirvani Mədinədə fətva mərcii, müfti idi. O, h. 1118-cı ilin cəmadiəlaxir ayında (sentyabr 1706) Mədinədə vəfat etmişdi[1176].

**Şeyx Muhəmməd ibn Əli ibn İbrahim əz-Zühri Şirvani**

Şeyx Əkmələddin Əli Şirvaninin oğlu, hənəfi məzhəbinə mənsub fəqih idi. H. 1112-ci ildə (1700) Mədinədə anadan olmuşdu. Mədinə qazisi olan əmisi əllamə Yusif Şirvaninin tələbəsi olmuş, onun yanında hənəfi fiqhini oxumuşdu. Cəmaləddin

---

[1172] İBN MAKULA, *İkmal*, C. II, s. 82.

[1173] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 78.

[1174] Seyyid Feyzullah əfəndinin babaları Təbrizli idilər. O, iki dəfə Osmanlı şeyxülislamlığına təyin olunmuşdu. Birinci dəfə 1688-ci ildə təyin olunub cəmi 18 gün bu vəzifədə qalmışdı. İkinci dəfə isə 1695-1703-cü illərdə şeyxülislam olmuşdu. Ümuniyyətlə 175 Osmanlı şeyxülislamından 6-sı onun mənsub olduğu ailədən çıxmışdır. Seyyid Feyzullah əfəndinin atası seyyid Mehmed ibn Pir Mehmed ibn Əhməd ibn şeyx Cüneyd Təbrizi, Ərzurum müftisi olmuşdu. Bax: SÜREYYA, *Sicil-i Osmani*, C. II, s. 533-534; C. VI, s. 1760.

[1175] BAĞDADLI, *İzahü'l-Məknun*, C. I, s. 56, 215, 237; C. II, s. 391.

[1176] Muhəmməd Xəlil əl-MURADİ, *Sülukü'd-Dürər fi Əyanü'l-Qərni's-Sani Əşər*, C. II, s. 5, Beyrut 1997; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 389.

Abdullah ibn Salim əl-Bəsri, şeyx Muhəmməd Əbu Tahir ibn İbrahim Gürani, şeyx Əbu Təyyib əs-Sindi, şeyx Muəhmməd ibn Təyyib Məğribi kimi alimlərdən hədis, fiqh, fiqh üsulu, təfsir və kəlam dərsləri almışdı. Muhəmməd Muradinin yazdığına görə o, təsəvvüfə meyl etmiş və şeyx Yusif ibn Muhəmməd ibn Nasirə müridlik edərək Nasiriyyə[1177] təriqətinə mənsub olmuşdu. Osmanlı sarayı tərəfindən Mədinə müftiliyinə təyin olunmuş şeyx Muhəmməd Şirvani çox ibadət edən, zahid və abid şəxs idi. O, 10 şəvval 1179-cu ildə (21 mart 1766) Mədinədə vəfat etmişdi[1178].

**Şeyx Əli ibn Muhəmməd ibn Əli əz-Zühri Şirvani**

Şeyx Əli Şirvani Mədinə şəhərində yaşamış və buradakı hənəfi alimlərinin rəisi olmuşdu. O, alim, zahid, elm və vəra sahibi insan idi. Vaxtının çoxunu mütaliə və elmi tədqiqatla keçirirdi. Alim h. 1134-cü ilin zilqədə ayında (avqust 1722) Mədinə şəhərində, alim ailəsində, dünyaya gəlmiş və bu şəhərdə böyümüşdü. Onun atası, yuxarıda haqqında bəhs etdiyimiz, Muhəmməd əfəndi Şirvani Mədinənin tanınmış hənəfi fəqihlərindən biri idi. Şeyx Əli Şirvini güclü yaddaşa və kəskin zəkaya malik idi. İlk təhsilini atasından alan şeyx Əli Şirvini doqquz yaşında Qur'ani-Kərimi əzbərləyib hafiz olmuşdu. Daha sonra Mədinədə şeyx Muhəmməd Həyyat əs-Sindi, Muhəmməd əfəndi ibn Əbdürrəhim, şeyx Muhəmməd ibn Təyyib əl-Məğribinin tələbəsi olmuş, onlardan fiqh və fiqh üsulunu öyrənmişdi. Şeyx Muhəmməd Dəqqaq, seyyid Ömər əl-Məkki, Sibt Abdullah ibn Salim və şeyx Muhəmməd əl-Hureyşidən hədis dinləmiş və hədis elmlərini oxumuşdu. Hənəfi fiqhinə dair "əl-Hidayə"[1179] adlı əsəri əllamə Mirzə İbrahim əl-Özbəkinin yanında oxumuşdu. Əli Quşçunun "Şərhü't-Təcrid" adlı əsərini əllamə Muhəmməd Razi əl-Abbasinin yanında oxumuş, Əli əfəndi ibn Muhəmməd əl-Qayseridən xəttatlıq dərsləri almışdı. Təhsilini başa vurduqdan sonra Məscidü'n-Nəbəvidə fiqh dərsləri verməyə başlamışdı. O, həmçinin fətva mərcii idi. H. 1186-cı

---

[1177] Nasiriyyə-Şazəliyyə təriqətinin qollarından biridir. Əslən şimali Afrikalı olan Əbü'l-Həsən Əli ibn Abdullah əş-Şazəlinin (öl. 1256) qurucusu olduğu Şazəliyyə təriqəti əsasən Afrika müsəlmanları arasında yayılmışdı. Nasiriyyə təriqəti Şazəliyyənin cərəyanlarından biri idi və yuxarıda adı çəkilən şeyx Yusif ibn Muhəmməd ibn Nasirin əmisi seyyid Əhməd ibn Muhəmməd ibn Nasir tərəfindən təsis edilmişdi. Bu cərəyan XIX əsrin birinci yarısına qədər öz mövcudluğunu davam etdirə bilmişdi.

[1178] MURADİ, *Sülukü'd-Dürər*, C. II, s. 104.

[1179] "əl-Hidayə" hənəfi məzhəbi fiqhinə dair məşhur əsərdir. Şeyxülislam Burhanəddin Əbü'l-Həsən Əli əl-Fərqani Mərginani (öl. 1197) tərəfindən qələmə alınmışdır.

(1772) ildə Mədinə şəhəri qazisinin müavini təyin olunmuşdu. Lakin həsədçilərinin çoxluğu səbəbiylə bir müddət sonra bu vəzifədən azad edilmişdi. Eynu zamanda istedadlı şair olan Şeyx Əli Şirvani "Haşiyə ələ Dibaçətü'd-Dürər", "Həvamiş ələ'l-Müxtəsər" adlı əsərlərin və daha bir neçə şərh və haşiyənin müəllifi idi. Alim h. 1200-cü ilin səfər ayında (dekabr 1785) Mədinədə vəfat etmişdi[1180].

**Şeyx Cəmaləddin Yusif ibn İbrahim ibn Muhəmməd əz-Zühri Şirvani**

Hənəfi məzhəbinə mənsub fəqih və mühəddis idi. 1080-ci ildə (1669), qardaşı şeyx Əkmələddin Əli əfəndidən sonra, Mədinəyə gəlmişdi. O, fiqh elmində dövrün məşhur alimlərindən biri olmuşdu. İslam hüququ sahəsində bir çox müşkül məsələlərdə fəqihlər ona müraciət edirdilər. Dayısı oğlu, Osmanlı dövlətinin şeyxülislamı, seyyid Feyzullah əfəndinin tövsiyəsi ilə Mədinə müftiliyinə təyin olunmuşdu. Ondan əvvəl bu vəzifəni qardaşı Əkmələddin Əli əfəndi icra etmişdi. Cəmaləddin Yusif Şirvani üç il bu vəzifəni icra etdəkdən sonra öz xahişi ilə istefaya göndərilmişdi. Ondan sonra bu vəzifəyə seyyid Əsəd əfəndi əl-Üsküdari təyin olunmuşdu. Cəmaləddin Yusif Şirvani müxtəlif elm sahələrinə dair bir sıra əsərlərin müəllifi idi. Onun qələmə aldığı əsərlərdən ən məşhurları üç cildlik "Şərh ələ Mişkati'l-Məsabih"[1181], "Risalə fi Kərahəti-İqtdai'l-Hənəfi bi'ş-Şafi'i", iki cildlik "Şərhu Mültəqi'l-Əbhər" adlı əsərlərdir. Alim h. 13 şəvval 1134-cü ildə (27 iyul 1722) Mədinədə vəfat etmiş və Rəsulullahın (ﷺ) oğlu İbrahimin qəbrinin yanında dəfn edilmişdi[1182].

**Mustafa ibn Yusif ibn İbrahim əz-Zühri Şirvani**

Şeyx Cəmaləddin Yusif Şirvaninin oğlu, hənəfi məzhəbinə mənsub fəqih idi. O, fiqh və fiqh üsulu sahəsində yaşadığı dövrün görkəmli alimlərindən biri olmuşdu. Fiqh sahəsindəki dərin biliyi ilə yanaşı o, həm də abid, zahid, fəzilətli və saleh insan idi. Mustafa Şirvani h. 1088-ci ildə (1677) Mədinədə alim ailəsində dünyaya gəlmişdi. Onun

---

[1180] MURADİ, *Sülukü'd-Dürər*, C. II, s. 24; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 516.

[1181] Mişkatü'l-Məsabih-xətib Vəliyəddin Əbu Abdullah Muhəmməd ibn Abdullah Təbrizinin (öl. 1348) qələmə aldığı hədis külliyatıdır. Bu əsərin dəfələrlə ərəb dilində çap olunmuşdur. Mustafa Uysal "Mişkatü'l-Məsabih"i türk dilinə tərcümə edərək iki cilddə nəşr etmişdir. "Mişkatü'l-Məsabih"ə çox sayıda şəhr, haşiyə və tə'liqat yazılmışdır. Belə şərhlərdən birinin müəllifi də Cəmaləddin Yusif Şirvanidir.

[1182] MURADİ, *Sülukü'd-Dürər*, C. II, s. 215; BURSALI Mehmed Tahir, *Osmanlı Müəllifləri*, C. II, s. 55-56, İstanbul 1333; KƏHHALƏ, *Mü'cəmü'l-Müəllifin*, C. IV, s. 140.

atası Cəmaləddin Yusif Şirvani yaşadığı dövrün tanınmış fəqihlərindən biri idi. Mustafa Şirvani ilk təhsilini atasından almışdı. Daha sonra əmisi şeyx Əkmələddin Əli əfəndinin tələbəsi olmuşdu. Cəmaləddin Abdullah ibn Salim Bəsridən hədis elminə dair bilikləri öyrənmişdi. Təhsilini başa vurandan sonra Mədinədə, Məscidi-Nəbəvidə dərs vermişdi. Bundan başqa o, Mədinədəki Muhəmməd Ağa mədrəsəsində də fiqh dərsləri vermişdi. Bir müddət Mədinə şəhəri qazisinin müavini işləyən Mustafa Şirvani daha sonra Osmanlı dövləti tərəfindən Məscidi-Nəbəvi imamlığına və xətibliyinə təyin olunmuşdu. Mustafa Şirvani həm də istedadlı şair idi və onun farsca çox gözəl şe'rləri vardı. Misirdən dəniz yolu ilə Anadoluya getmək üçün yola çıxmışdı. Lakin h. 1164-cü ildə (1751) Misirdə vəfat etmişdi[1183].

**Nurah Şirvani**

Hənəfi məzhəbinə mənsub fəqih, müfəssir və mütəkəllim idi. Yaşadığı dövrün tanınmış ziyalılarından biri olan Nurah Şirvani aşağıda haqqında məlumat verdiyimiz əllamə Əbdürrəhim Şirvaninin nəvələrindən idi. Nurah Şirvani "Təəllüqat ələ'l-Bəyzavi", "Şərhu-Təlxis", "Şərhu Fiqhü'l-Əkbər" kimi əsərlərin müəllifi idi. Nurah Şirvani İstanbuldakı yəhudi camaatının liderlərindən xaxam Xagi əfəndini İslam dininə dəvət edərək onun müsəlman olmasına vəsilə olmuşdu. Xagi əfəndini İstanbulun Xasköy səmtindəki sinaqoqun xaxamı idi. Nurah Şirvani bu hadisənin necə baş verdiyi və xaxam Xagi ilə aralarındakı dini müzakirələri "Risaleyi-Məxsusə" adlı əsərində yazmışdı. İslamı qəbul etdikdən sonra Xagi Mehmed əfəndi kimi tanınan sabiq xaxam ərəb dilini mükəmməl şəkildə öyrənərək İslami elmlər sahəsində alim və şair kimi şöhrət tapmışdı. Xagi Mehmed əfəndi h. 1078-ci (1667) ildə İstanbulda vəfat etmişdi[1184]. Nurah Şirvani isə h. 1065-ci (1655) ildə Bursada vəfat etmiş və Əli paşa məscid və mədrəsə kompleksi yaxınlığında dəfn edilmişdi.

**Əllamə Əbdürrəhim Şirvani**

[1183] MURADİ, *Sülukü'd-Dürər*, C. II, s. 201.
[1184] BURSALI, *Osmanlı Müəllifləri*, C. II, s. 43.

Osmanlı dövlətində yaşamış mütəkəllim idi. Aşağıda haqqında bəhs edəcəyimiz Muhəmməd Əmin Şirvaninin müəllimlərindən biri olmuşdu. Əbdürrəhim Şirvani h. 1023-cü (1614) ildə vəfat etmişdi. Alim "Risalə fi'l-Məntiq", "Haşiyə ələ Şərhu-Adabi-Məs'udi", "Haşiyə ələ Şərhi'l-Mətailü'l-Ənvar" kimi əsərlərin müəllifi idi[1185].

**Əbu Bəkr ibn İsmayıl Şirvani**

XVI-XVII əsrlərdə Osmanlı dövlətində yaşamış filoloq alim idi. "Dürrətü'ş-Şirvaniyyə ələ Şərhi'l-Əcurrumiyyə", "Hidayətu Zə'vi'l-Əlbab ilə Məvsiləti't-Tüllab" və "Məvahibü'r-Rəhmaniyyə li'Tüllabi'l-Əcurrumiyyə" Əbu Bəkr Şirvaninin qələmindən çıxmış əsərlərdir. Bunlardan ilk ikisinin əlyazma nüsxələri Türkiyə Diyarbəkir İHK-də, sonuncusunun əlyazma nüsxəsi isə Kastamonu İHK-də saxlanılır. Əbu Bəkr ibn İsmayıl Şirvani h. 1019-cu (1610) ildə vəfat etmişdir.

**Əbdürrəhman ibn Mahmud Şirvani**

XVI-XVII əsrlərdə Osmanlı dövlətində yaşamış kəlam alimi idi. Onun müəllifi olduğu "Haşiyə ələ Ləvamiü'l-Əsrar fi Şərhi Mətalii'l-Ənvar" adlı əsərin əlyazma nüsxəsi Türkiyə Manisa İHK-də mövcuddur. Əbdürrəhman ibn Mahmud Şirvani h. 1024-cü (1615) ildə vəfat etmişdir.

**Şeyx Muhəmməd Əmin ibn Sədrəddin Şirvani**

Yaşadığı dövrdə Osmanlı imperatorluğunda tanınmış hənəfi fəqihi, müfəssir, mütəkəllim, dinlər tarixçisi və filoloqlardan biri idi. İstanbuldakı mədrəsələrdə müdərrislik etmiş və bir sıra əsərlər qələmə almışdı. "Tə'liqət ələ Əmkan min Təfsiri Bəyzavi", "Məqalətu-Əhli'l-İlm və'l-Məzahibi'l-Müxtəlifəti li-Təvaifi'l-Ümən", "Nübzə min əl-Həqaiq və Zübdə min əd-Dəqaiq", "Risalə fi Bəyani-Firaqi'd-Dallə", "Risalətü'l-Bina", "Şərhü'l-İsağuci", "Haşiyə ələ Şərhü'ş-Şəmsiyyə fi'l-Məntiq", "Şərhü'l-Qəvaidü'l-Əqaid li'l-Qəzzali", "Təfsir Surəyi-Fəth", "Risalə fi Təhqiqi'l-Məbdə və'l-Miad", "Risalə fi İlmü'l-Hikmə", "Tə'liqət ələ Təfsirü'l-Ayəti və Qalə Firavnu ya Əyyuhə'l-Məla", "Tə'liqət ələ Təfsiri Ayəteyn min Surəti-Hud", "Fəvaidü'l-Xaqaniyyə"

---

1185 BURSALI, *Osmanlı Müəllifləri*, C. I, s. 359-360.

kimi əsərlərin müəllifi olmuş Şeyx Sədrəddin Şirvani h. 1036-cı ildə (1627) İstanbulda vəfat etmiş, vəsiyyətinə əməl olunaraq Üsküdar səmtində dəfn olunmuşdu[1186]. "Fəvaidü'l-Xaqaniyyə"ni Osmanlı sultanı I Əhmədə (1603-1617) ithafən qələmə alıb sultana təqdim etmişdi[1187]. Alimin Ayətü'l-kürsiyə[1188] yazdığı təfsirin nadir nüsxələrindən biri Paris milli kitabxanasında saxlanır[1189]. Türkiyədə Balıkəsir İHK, Kastamonu İHK, Amasya Bəyazid İHK, Manisa İHK, Ankara Milli Ktbx, Konya BYEK, İstanbul SYEK-də şeyx Muhəmməd Əmin Şirvaninin müəllifi olduğu əsərlərin onlarla əlyazma nüsxəsi mövcuddur. Alimin məntiqə dair "Cəhətü'l-Vahdə" adlı əsərinin Türkiyədəki əlyazma əsər kitabxanalarında yüzlərlə nüsxəsi saxlanılır. Bu da onu göstərir ki, əsər uzun müddət Osmanlı mədrəsələrində dərslik kimi istifadə olunmuşdu. Şeyx Muhəmməd Əmin Şirvani bu əsərinə şərh də yazmışdı. Onun nəvəsi, aşağıda haqqında məlumat verdiyimiz, əllamə Sadiq ibn Ruhullah Şirvani Osmanlı imperatorluğunun şeyxülislamı olmuşdu. Şeyx Muhəmməd Əmin Şirvaninin atası şeyx Sədrəddin Şirvani də yaşadığı dövrün tanınmış alimlərindən biri idi və özünün "Hikmətü'l-Mütəaliyə" adlı əsəri ilə tanınmışdı[1190].

**Şeyxülislam əllamə Sadiq ibn Fəthullah ibn Muhəmməd Əmin əl-Qustantini[1191] Şirvani**

Hənəfi məzhəbinə mənsub fəqih idi. Sadiq Şirvani h. 16 cəmadiələvvəl 1040-cı ildə (21 dekabr 1630) alim ailəsində dünaya gəlmişdi. Onun atası Fəthullah[1192] əfəndi İstanbuldakı mədrəsələrdən birində müdərris idi. Onun babası, yuxarıda haqqında məlumat verdiyimiz şeyx Muhəmməd Əmin ibn Sədrəddin Şirvani də yaşadığı dövrün tanınmış fəqihlərindən idi. Sadiq Şirvani ilk təhsilini atası və babasından almış, İstanbul mədrəsələrində dövrün qabaqcıl alimlərinin tələbəsi olmuşdu. Təhsilini başa

---

1186 BAĞDADLI, *Hədiyyətü'l-Arifin*, C. II, s. 275; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 142; SEYİDOV, *həmin məqalə*.
1187 BURSALI, *Osmanlı Müəllifləri*, C. II, s. 23.
1188 "Ayətü'l-kürsi"-Qur'ani-Kərimin Bəqərə surəsi 255-ci ayəsi.
1189 DE SLANE, *həmin əsər*, s. 151.
1190 BURSALI, *həmin əsər*, C. II, s. 23.
1191 Osmanlıca mətinlərdə İstanbulun qədim adı olan Konstantinia "Qustantiniyyə" formasında yazılır.
1192 Bu şəxsin adı *Sicili-Osmani*də Feyzullah, *Sülukü'd-Dürər*də Ruhullah kimi qeyd olunmuşdur. Ankara Milli kitabxanada "Fəthullah ibn Muhəmməd Əmin ibn Sədrəddin Şirvani" adlı müəllifin "Risalə fi Bəyani-Hikməti-Xaliqi'l-Cinn və'l-İns" adlı türkcə əsəri saxlanılır. Fikrimizcə bu şəxs Sadiq Şirvaninin atasıdır.

vurduqdan sonra İstanbuldakı mədrəsələrdən birində müdərris olmuş, daha sonra Misir qaziliyinə təyin olunmuş və bir müddət bu vəzifəni icra etmişdi. H. 1103-cü ilin məhərrəm ayında (oktyabr 1691) İstanbul qaziliyinə, h. 1104-cü ilin şaban ayında (aprel 1693) Anadolu qaziəsgərliyinə, h. 1105-ci ilin şəvval ayında (iyun 1694) Rumeli qaziəsgərliyinə təyin olunmuşdu. H. 1105-ci ilin zilqədə ayında (iyul 1694) sultan II Əhməd tərəfindən (1691-1695) Osmanlı dövləti şeyxülislamlığına təyin olunan Sadiq Şirvani, sultan II Əhmədin vəfatından (6 fevar 1695) bir ay sonra öz istəyi ilə vəzifəsindən ayrılmışdı. H. 1118-ci ilin şəvval ayında (yanvar 1707) sultan III Əhməd (1703-1730) tərəfindən ikinci dəfə Osmanlı imperatorluğunun şeyxülislamlığı vəzifəsinə təyin olunmuşdu. H. 1119-cu ilin zilqədə ayında (fevral 1708) yaşlılığı səbəbiylə istefaya getmişdi. Əllamə Sadiq əfəndi Şirvani h. 7 ramazan 1120-ci ildə (20 noyabr 1708) İstanbulda vəfat etmiş və Fındıqlı came qarşısındakı qəbristanda dəfn edilmişdi. O, fəzilətli, saleh və abid insan idi. Fiqh və təfsirə dair bir sıra əsərlərin müəllifi olmaqla yanaşı həm də istedadlı şair idi. Ərəb, fars və türk dilində çox gözəl şerlər qələmə almışdı[1193].

**Muhyəddin Muhəmməd ibn Əhməd Şirvani**

Hənəfi məzhəbinə mənsub fəqih və mütəkəllim idi. O, Siracəddin Əbü's-Səna Urməvinin (öl. 1283) əsərinə yazılmış şərhə "Haşiyə ələ Şərhu-Mətaliü'l-Ənvar" adlı haşiyə yazmışdı. Alim h. 797-ci ildə (1493) vəfat etmişdi[1194].

**Şəmsəddin Muhəmməd ibn Şihabəddin Şirvani**

Hənəfi məzhəbinə mənsub mütəkəllim, cədəl və üsul alimi idi. O, Əzudəddin əl-İci, Seyyid Şərif Cürcani, Qütbəddin Muhəmməd Təhtani kimi kəlam alimlərinin əsərlərinə şərh və haşiyələr yazmışdı. Şəmsəddin Muhəmməd Şirvani "Haşiyə ələ Şərhü'l-Əzud", "Haşiyə ələ Şərhü's-Seyyid", "Haşiyə ələ'l-Qütb fi'l-Məntiq" kimi əsərlərin müəllifi idi. Alim h. 892-ci ildə (1487) vəfat etmişdir[1195].

---

1193 MURADİ, *Sülukü'd-Dürər*, C. I, s. 300; SÜREYYA, *Sicil-i Osmani*, C. V, s. 1422.
1194 BAĞDADLI, *Hədiyyətü'l-Arifin*, C. II, s. 217; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 69.
1195 KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C.II, s. 894, 946, 1045; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 347.

**Nurullah ibn Muhəmməd Rəfi ibn Əbdürrəhim Şirvani**

Sultan İbrahim (1640-1648) və sultan IV Mehmedin hakimiyyəti (1648-1687) dövründə Osmanlı imperatorluğunda yaşamış hənəfi fəqihi, mühəddis və mütəkəllim idi. Nurullah Şirvani Bursadakı mədrəsələrdən birində müdərris olmuşdu. Alim "Təəllüqə ələ Ənvarü't-Tənzil", "Şərhu-Təlxisü'l-Miftah fi'l-Məani və'l-Bəyan", "Şərhu Fiqhü'l-Əkbər" kimi əsərlərin müəllifi idi[1196]. Bu sonuncu əsəri imam Əbu Hənifənin fiqhə dair fikir və bəyanlarının toplandığı "Fiqhü'l-Əkbər"ə yazılmış şərhdir. Alim h. 1065-ci ildə (1655) vəfat etmişdi.

**Nurəddin ibn İsmayıl ibn Həsən Şirvani**

XVII-XVIII əsrlərdə yaşamış tarixçi, sosioloq, pedaqoq, mütəkəllim, əxlaq nəzəriyyəçisi, zooloq və riyaziyyatçı alim idi. Nuri Şirvani adı ilə tanınan alim uzun müddət Osmanlı imperatorluğunun İraq vilayətinin Ərbil və Bağdad şəhərlərində yaşamışdı. "Tarixi-Tərbiyə", "Xülasə Tarixü'l-İslam", "Dürusü'l-Və'ziyyə", "Rəddü'l-Əvvam ən İmtahan Malihi'l-Ehtiram", "Zübdətü'l-Həndəsə", "İlmü'l-Heyvanat", "Fəlsəfətü'l-Əxlaqiyyə", "Fəlsəfətü'l-Elmiyyə", "Fəlsəfətü'l-Aliyyə", "Məntiqü'l-Cədid", "Məntiqü'l-Qədim" kimi əsərlərin müəllifi olan Nurəddin Şirvani h. 1283-cü ildə (1822) vəfat etmişdi[1197].

**Şeyx Ziyaəddin Yusif ibn Əli əş-Şamaxi Şirvani**

Məxdumü'l-Xəlvətiyyə ləqəbi ilə tanınmış təsəvvüf şeyxi idi. Ləqəbindən də məlum olduğu kimi o, xəlvətiyyə təriqətinə mənsub idi. "Adabü'l-İrşad" və "Silsilətü'l-Ərvah" adlı əsərlərin müəllifi olan Ziyaəddin Şirvani h. 890-cı ildə (1485) vəfat etmişdi[1198].

**Şihabəddin Əhməd ibn Harun Şirvani**

Şafi'i məzhəbinə mənsub alim idi. Təqribən 870-ci ildə (1466) Qahirəyə getmiş və burada dini və dünyəvi elmlərə dair dərslər almışdı. Fəxrəddin Osman əl-Muqsi və Şəmsəddin Səxavi onun müəllimi olmuşdular. Təhsilini başa vurduqdan sonra Qüdsə

---

[1196] BAĞDADLI, *Hədiyyətü'l-Arifin*, C. II, s. 499; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. IV, s. 45.
[1197] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. IV, s. 45-46.
[1198] BAĞDADLI, *Hədiyyətü'l-Arifin*, C. II, s. 562; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. IV, s. 172.

getmiş və vəfat edənə qədər orada yaşamışdı. Səxavi onun ölüm tarixi haqqında "mən bu kitabı (Zəvu'l-Lami'-E.N) yazıb bitirəndən bir müddət sonra o, vəfat etdi" deyə qeyd etmişdi[1199]. "Zəvu'l-Lami'" 1497-ci ildə vəfat etmiş Səxavinin ən son qələmə aldığı kitablardan biridir. Şihabəddin Əhməd Şirvaninin ölümü bu tarixdən əvvələ təsadüf edir və fikrimizcə o, gənc yaşlarında dünyasını dəyişmişdi. Çünki o, Səxavinin tələbəsi olmuş və Səxavi onun "qərib", yəni kimsəsiz vəfat etdiyini yazır. Buradan onun hələ ki, evlənib ailə və əqrəba sahibi olmadığı anlaşılır.

**Vaiz Əbü'l-Həsən Əli ibn Əhməd ibn Əli əl-Fəzzaz Şirvani**

Vaizliklə yanaşı həm də hədis nəql etmişdir. Əbu Nəsr Mənsur ibn Əbi's-Səqr Şirvanidən hədis dinləmişdi. Şirvanın Yəzdiyyə (Şamaxı) şəhərindəki məscidlərdən birində vaiz idi. Mühəddis Süleyman ibn Abdullah Şirvani onun yalan danışmaqda məşhur olduğu üçün tərk edilmiş bir ravi olduğunu bildirmişdi. Mühəddislər ondan hədis almırdılar. Onun nəql etdiyi hədislərin isnadlarında çox sayıda təhrif olduğu bilinirdi. Əli ibn Əhməd əl-Fəzzaz Şirvani "Əxbaru'l-Həllac"[1200] adlı kitab qələmə almışdı. Əbü'l-Həsən əl-Fəzzaz dəfələrlə Şirvan qazisi Əbü'l-Qasım Həsən ibn Mümşad əz-Zərəndi İsfəhaninin ağır tənqidinə məruz qalmışdı[1201]. Əbu Tahir Əhməd əs-Süləfi İsfəhani (öl. 1181) Azərbaycanın şəhərlərinə səyahət edərkən Yəzdiyyədə onunla görüşmüş və söhbət etmişdi[1202]. Vaiz Əbü'l-Həsən Əli Şirvaninin ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Qazi Qiyasəddin Əbu Nəsr Muhəmməd ibn Abdullah ibn Abbas Şirvani**

XIII əsrdə yaşamış Azərbaycanın tanınmış şafi'i fəqihlərindən idi. Qazi Qiyasəddin Şirvani böyük mütəfəkkir, fəzilət və hikmət sahibi alim olmaqla yanaşı həmçinin dövlət

---

[1199] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. I, s. 418.

[1200] Hüseyn ibn Mənsur Həllac 921-ci ildə Bağdadda edam olunmuş mistik idi. Onun həyatı və sərgüzəştləriylə bağlı bir neçə kitab yazılmışdır. Bunlardan biri də Əli ibn Əhməd ibn Fəzzaz Şirvaninin "Əxbaru'l-Həllac" kitabıdır.

[1201] ZƏHƏBİ, *Mizanü'l-E'tidal*, C. IV, s.189; İBNü's-SABUNİ, *Təkmilətü'l-İkmal*, s. 118; Əbü'l-Həsən Əli ibn Muhəmməd KİNANİ, *Tənzihü'ş-Şəri'ətü'l-Mərfuə*, C. I, s. 86, Beyrut 1982.

[1202] ƏBU TAHİR İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, s. 288; İBN HƏCƏR, *Lisanü'l-Mizan*, C. IV, s. 157. İbn Həcər, digər müəlliflərdən fərqli olaraq, vaiz Əbü'l-Həsən Əli Şirvaninin ləqəbini "Fəzzaz" deyil hekayəçi, hekayə oxuyan, vaiz mənasını ifadə edən "Qussas" [القُصاص ] olaraq qeyd etmişdir. Bunun daha doğru olma ehtimalı böyükdür. Belə ki, biz onun Hüseyn ibn Mənsur Həllacın həyat hekayəsini qələmə aldığını və peşəsinin də vaizlik olduğunu bilirik.

xadimi və ədib idi. İbnü'l-Fuvati onun öz müasiri olan qazilərə yazdığı bəzi məktubları gördüyünü qeyd etmişdir[1203].

**Əbu Bəkr ibn Rüstəm Şirvani**

Osmanlı dövlətində yaşamış tarixçi və dövlət xadimidir. O, uzun müddət Osmanlı vergi dairələrində dəftərdar vəzifəsini icra etmişdi. H. 1139-cu (1727) ildə İstanbulda vəfat etmiş və Süleymaniyyə camesi yaxınlığında dəfn edilmişdi. Əbu Bəkr Şirvani öz dövrünün tanınmış ziyalılarından biri olaraq zəngin şəxsi kitabxanaya malik idi. O, "Malabəd li'l-Ədib" və "Şərhu Tarixi-Vəssaf"[1204] adlı əsərlərin müəllifi idi[1205].

**Muhəmməd ibn Mahmud ibn Hacı Şirvani**

Osmanlı dövlətində yaşamış müfəssir idi. Onun qələmə aldığı "Miftahü'n-Nəcat" adlı qırx iki babdan ibarət əsər Qur'ani-Kərimdəki duaların izahına dair idi. Muhəmməd Şirvani h. 912-ci (1506) ildə vəfat etmişdir[1206]. "Miftahü'n-Nəcat"ın nüsxələrindən biri Türkiyədə, Çorum Həsən paşa İHK-də saxlanılır.

**Kəmaləddin ibn Asayiş ibn Yusif Şirvani**

Hənəfi məzhəbinə mənsub, Osmanlı dövlətində yaşamış fəqih idi. H. 916-cı (1510) ildə vəfat etmiş alim "Miftahü's-Səadə və Misbahü's-Siyadə" kimi bir sıra əsərlərin müəllifi idi[1207]. Bu əsərin nüsxələrindən ikisi Konya BYEK-də saxlanılır. Bunlardan biri 1563-cü ildə istinsəx edilmişdir.

**Əllamə İsmayıl ibn Abdullah Şirvani**

---

[1203] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1211.

[1204] "Tarixi-Vəssaf"- Elxanilər dövrü tarixçilərindən Vəssaf Abdullah ibn Fəzlullah əş-Şirazinin (öl. 1334) "Təcziyətü'l-Əmsar və Təzciyətü'l-Ə'sar" adlı əsərinin qısa adıdır. Əsər beş cilddən ibarət olub Orta Şərq regionunun tarixi və coğrafiyası, həmçinin müəllifin yaşadığı dövrün tarixi hadisələrinə dair qiymətli məlumatlar ehtiva edir. Lakin "Tarixi-Vəssaf" farsca ədəbi dildə və xeyli qəliz üslubla yazıldığı üçün sonrakı tarixçilər tərəfindən bir neçə dəfə ixtisar edilmiş və şərh yazılmışdır. Belə şərhlərdən biri də Əbu Bəkr Şirvaniyə aiddir. Daha ətraflı məlumat üçün bax: ŞEŞEN, *həmin əsər*, s. 239.

[1205] BURSALI, *Osmanlı Müəllifləri*, C. I, s. 233.

[1206] BURSALI, *Osmanlı Müəllifləri*, C. I, s. 392.

[1207] BURSALI, *Osmanlı Müəllifləri*, C. I, s. 392.

Hənəfi məzhəbinə mənsub müfəssir və fəqih idi. Mənbələr onun dərin biliyə malik tədqiqatçı alim olmaqla yanaşı mömin, fəzilətli, saleh əməlli, zahid, xoşrəftar insan olduğunu qeyd edirlər. Cəlaləddin Dəvvanidən[1208] fiqh elmini öyrənmiş, Cəmaləddin Xorasaninin yanında isə hədis oxumuşdu. Daha sonra xacə Übeydullah Səmərqəndinin yanıda təsəvvüf təlimi almışdı. O, xacə Übeydullahın həm müridi, həm də dostu idi. Xacə Übeydullah Səmərqəndinin ölümündən[1209] sonra İsmayıl Şirvani Məkkəyə getmiş və orada tədrislə məşğul olmuşdu. Sultan II Bayəzidin hakimiyyəti dövründə (1481-1512) Anadoluya getmiş və bir müddət Osmanlı dövlətinin hakimiyyəti altındakı torpaqlarda yaşamışdı. Daha sonra yenə Məkkəyə qayıtmış və vəfatına qədər orada yaşamışdı. Əllamə İsmayıl Şirvani "Təfsiri-Bəyzavi"[1210] adlı əsərə haşiyə yazmışdı. Alim h. 942-ci ilin zilhiccə ayında (iyun 1536) 84 yaşında Məkkədə vəfat etmişdi[1211].

**İmam Əbu Xələf Əvəz[1212] ibn Əhməd Şirvani**

Mütəkəllim və fəqih idi. Cüveyninin "əl-Müxtəsər"[1213] adlı əsərini ən gözəl şəkildə izah və şərh edən Əbu Xələf Əvəz Şirvani bu şərhini "əl-Mötəbər fi Məsailü'l-Müxtəsər"

---

1208 Cəlaləddin Muhəmməd ibn Əsəd Dəvvani (1426-1502) İranın Kazerun şəhərinin Dəvvan kəndində dünyaya gəlmişdi. Hənəfi məzhəbi fiqhi üzrə öz dövrünün tanınmış alimi idi. O, Ağqoyunlu sultanı Uzun Həsən (1453-1478) ona dərin hörmət bəsləmiş və himayə etmişdi. Cəlaləddin Dəvvani Ağqoyunlular dövründə Azərbaycanda yaşamış məşhur alimlərdən idi. O, fiqhlə yanaşı, kəlam, üsul, əxlaq, ərəb dili və ədəbiyyatı kimi elm sahələrində böyük mütəxəssis idi. Cəlaləddin Dəvvani həm də şair idi.

1209 Xacə Übeydullah ibn Mahmud ibn Şihabəddin Səmərqəndi 1490-cı ildə Səmərqənddə vəfat etmişdir. Mənbələr İsmayıl Şirvaninin onun ölümündən sonra Məkkəyə getdiyini qeyd edirlər. Lakin haradan Məkkəyə getdiyinə dair məlumat vermirlər. Ehtimal ki, Xacə Übeydullah vəfat edərkən İsmayıl Şirvani də Səmərqənddə idi və buradan Məkkəyə getmişdi.

1210 Tam adı "Ənvarü't-Tənzil və Əsrarü't-Tə'vil" olan, həmçinin Təfsiri-Bəyzavi və ya Qazi Təfsiri adı ilə də tanınan bu əsərin müəllifi Qazi Nasirəddin Abdullah ibn Ömər ibn Muhəmməd Bəyzavidir (öl. 1289). İranda, Şirazın Bəyza qəsəbəsində dünyaya gəlmiş, dövrün məşhur alimlərinin tələbəsi olmuşdu. Bir müddət Şirazın baş qazisi olmuş, daha sonra bu vəzifəni tərk edərək 1252-ci ildə Təbrizə gəlmiş və ölümünə qədər burada yaşamışdır. Təbrizdə tədris fəaliyyəti ilə məşğul olmuşdu. Təfsir, hədis, fiqh, fiqh üsulu, kəlam, ərəb dili və ədəbiyyatı sahələrində bir sıra əsərlərin müəllifidir. Bax: Həmidullah Mustəvfi QƏZVİNİ, *Tarixi-Qozidə*, (Trc. E. G. Browne), s. 222, London 1913.

1211 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s. 141; Nəcməddin Muhəmməd əl-QƏZZİ, *Kəvakibü's-Sairə Bi Əyani'l-Miətü'l-Aşirə*, s. 224, Beyrut 1997; TAŞKÖPRÜZADƏ, *Şəqaiqü'n-Numaniyyə*, s. 214.

1212 Mənbələrdə hərəkəsiz [عوض] kimi yazılan bu kəlməni [عَوَّضَ] əvvəz və ya [عِوَض] ivəz kimi oxumaq mümkündür. Hər ikisi ərəb dilində əvəzini vermə, mükafatlandırma, kompensasiya etmə mənasını ifadə edir. Bu gün Azərbaycanda belə bir şəxs adı olduğu üçün biz burada bunu Əvəz kimi qeyd etdik.

1213 Əbu Muhəmməd Abdullah ibn Yusif ibn Muhəmməd əl-Cüveyni Nişapurinin (öl. 1047) "Muxtəsəru'l-Muxtəsər" adlı əsəri nəzərdə tutulur. Bu alim İmamu'l-Hərameyn ləqəbi ilə məşhur olmuş əşari kəlamçısı Əbü'l-Məali Rüknəddin Əbdülməlik Cüveyninin atası idi.

adlındırmışdı. O, bu əsərini h. 544-cü ilin rəbiəlaxir ayında (avqust 1149) yazıb bitirmişdi. Alimin ölüm tarixi h. 550-ci (1155-1165) illərə təsadüf edir[1214].

**Şeyx Bədrəddin Şirvani**

Fəqih və müfəssir idi. Qazi Bəyzavinin "Ənvarü't-Tənzil və Əsrarü't-Tə'vil" adlı Qur'an təfsirinə geniş şərh yazmış və təfsirdəki sözlərin izahını vermişdi. Şeyx Bədrəddin Şirvani. H. 1020-ci ildə (1611) vəfat etmişdir[1215].

**Fəthəddin Əbdürrəhman ibn Muhəmməd ibn Fəthullah Şirvani**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. Məkkədə getmiş və burada təhsil almışdı. Şəmsəddin Səxavinin dərslərində iştirak etmiş və onun yanında hədis elminə dair biliklərə yiyələnmişdi[1216]. Ölüm tarixi məlum deyil. XV-XVI əsrlərdə yaşamışdır.

**Mövlana Hüseyn ibn Abdullah Şirvani**

XVI əsrdə Osmanlı imperatorluğunda yaşamış hənəfi məzhəbinə mənsub fəqih idi. Onun Azərbaycandan Anadoluya hansı tarixdə getdiyi məlum deyil. Lakin şah Təhmasibin (1524-1576) Şirvanı zəbt etməsindən sonra Səfəvilərin təzyiq və təqiblərindən qurtulmaq üçün vətəni tərk etmək məcburiyyətində qalan alimlərdən biri olduğunu söyləmək olar. Belə ki, mövlana Hüseyn Şirvani "Əhkamü'd-Diniyyə" adlı əsərini Osmanlı sultanı Qanuni I Süleymana (1520-1566) təqdim etmişdi və bu kitab Səfəvilərlə müharibə elan etməyin vacibliyini vurğulayan bir çox fətvanı ehtiva edirdi[1217]. Qanuni I Süleymanın Səfəvilərə qarşı apardığı hərbi kampaniyalarda mövlana Hüseyn Şirvaninin də rolu olduğu istisna deyil. Biri Konya BYEK, ikisi isə Ankara Milli kitabxanasında olmaqla "Əhkamü'd-Diniyyə"nin Türkiyədə üç əlyazma nüsxəsi mövcuddur. Ankara Milli kitabxanasında mövlana Hüseyn Şirvaninin "Seyfü'l-

---

[1214] SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VII, s. 144; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. II, s. 23.
[1215] ƏDNİRƏVİ, *Təbəqatü'l-Müfəssirin*, s. 199-200.
[1216] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 284.
[1217] DE SLANE, *həmin əsər*, s. 280.

Qati fi Bəyani-Etiqadi'r-Rafizi" və "Risalə fi't-Təsəvvüf" adlı iki əsəri də mövcuddur. Alim h. 947-ci ildə (1540) vəfat etmişdi.

**Əbdürrəzzaq Şirvani**

Şafi'i məzhəbinə mənsub fəqih və mütəkəllim idi. Hələbə getmiş və təqribən 20 il bu şəhərdə yaşamışdı. Burada imam Əlaəddin Əbu Abdullah Muhəmməd əl-Buxari (1377-1429) kimi dövrün məşhur alimlərinin tələbəsi olmuş, fiqh və fiqh üsulu dərsləri almışdı. Bundan başqa kəlam elminə dair dərslər də almışdı. Əbdürrəzzaq Şirvani Dəməşqdə ərəb dilinin qrammatikası, ümumi filologiya, natiqlik və məntiq dərsləri vermişdir. Əbdürrəzzaq Şirvani Dəməşqdə vəfat etmişdi[1218]. Ölüm tarixi məlum deyil. XIV-XV əsrlərdə yaşamışdır.

**Şeyx Muhyəddin Muhəmməd ibn Cəmaləddin ibn Ramazan Şirvani**

Müfəssir idi. Qazi Bəyzavinin "Ənvarü't-Tənzil və Əsrarü't-Tə'vil" adlı Qur'an təfsirinə iki cildlik haşiyə yazmışdı. Şeyx Muhyəddin Şirvani h. 1063-cü ildə (1653) vəfat etmişdi[1219].

**Şeyx Hamidəddin Əbdülmuhsin ibn Əbdüssəməd ibn Lütfullah ibn Muhəmməd ibn Həsən Şirvani**

Şafi'i məzhəbinə mənsub müfəssir və fəqih idi. Dayısı şeyx Səfiyəddin Əbdülmömin ibn Əbdürrəhim Şirvanidən ərəb dili, fiqh və məntiq dərsləri almışdı. Dayısının yanında "əl-Ənvar"[1220], "əl-Havi"[1221] və Qonyəvinin bu əsərə yazdığı şərhi[1222] oxumuşdu. Daha sonra şeyx Səlahəddin Musa Ərdəbilinin tələbəsi olmuş, onldan Qur'an elmlərinə dair məna, bəyan, təfsir və təfsir üsulu dərsləri almışdı. Qəvaməddin

---

1218 SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 322.
1219 ƏDNİRƏVİ, *Təbəqatü'l-Müfəssirin*, s. 211; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 198.
1220 Fikrimizcə əllamə İzzəddin Yusif ibn İbrahim Ərdəbilinin (öl. 1377) şafi'i fiqhinə dair "Ənvar li Əməlü'l-Əbrar" adlı əsəri nəzərdə tutmuşdur.
1221 "əl-Haviü's-Səğir" Şeyx Nəcməddin Əbdülğəffar Qəzvininin (öl. 1266) şafi'i məzhəbi fiqhinə dair qələmə aldığı əsərdir.
1222 Şeyx Əlaəddin Əbü'l-Həsən Əli əl-Qonyəvi Təbrizi (öl. 1329) Qəzvininin "əl-Haviü's-Səğir" adlı əsərinə şərh yazmışdır. (bax: səh. ???) Böyük ehtimalla Səxavi bu əsəri nəzərdə tutmuşdur.

Muhəmməd əl-Kərbalinin yanında Zəməxşərinin "əl-Kəşşaf" adlı təfsirini və imam Buxarinin "Səhih" adlı hədis külliyatını oxumuşdu. Muhəmməd Şirazidən hədis elmlərinə dair bilikləri öyrənmişdi. Dini elmlərlə yanaşı şeyx Hamidəddin Şirvani riyaziyyat və astronomiya kimi dəqiq elmlərə dair biliklərə də yiyələnmiş, "Şərhi-Çəğmini"ni[1223] oxumuşdu. Şeyx Hamidəddin Şirvani Məkkəyə gəlmiş və bu şəhərdə məskunlaşmışdı. Burada tədrislə məşğul olmuş və sonralar dövrün tanınmış alimlərindən olmuş Übeydullah ibn Əla əl-İci, Şəmsəddin əz-Zəfərani kimi bir çoxları onun tələbəsi olmuşdular. Şeyx Hamidəddin Şirvani alimliyi ilə yanaşı mömin, abid, zahid, fəzilətli və saleh insan idi. Alim h. 889-cu ilin səfər ayında (mart 1484) Məkkədə vəfat etmişdi[1224].

**Şeyx Səfiyəddin Əbdülmömin ibn Əbdürrəhim Şirvani**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Şirvanda yaşamış, fiqh elmi ilə yanaşı ərəb filologiyası və kəlam üzrə Azərbaycanın tanınmış alimlərindən biri olmuşdu. Yuxarıda haqqında bəhs etdiyimiz şeyx Hamidəddin Şirvanin dayısı və müəllimi idi. Ölüm tarixi məlum deyil. Təqribən XIV-XV əsrlərdə yaşamışdır[1225].

**Şeyx Əbu Abdullah Muhəmməd ibn Abdullah ibn Bakuyə əl-Bakuvi Şirvani**

Təsəvvüf əhlinə mənsub mühəddis idi. Yaşadığı dövrün tanınmış mühəddislərindən biri olan Əbu Abdullah Bakuvi, Əbu Abdullah Muhəmməd ibn Xəfif əş-Şirazi (öl. 981) ilə görüşmüş və onun söhbətlərində iştirak etmişdi. Tanınmış sufi müəllif Əbü'l-Qasım Quşeyri (öl. 1072) və Əbu Sə'd ibn Əbi Sadiq əl-Hiyri Əbu Abdullah Bakuvinin tələbəsi olmuş, ondan hədis dinləmişdilər. Əbu Abdullah Bakuvinin ölüm tarixi h. 420-ci (1029) ildən sonraya təsadüf edir[1226]. Əbu Abdullah əl-Bakuvinin "Əxbarü'l-Arifin" adlı əsərin müəllifi olduğunu qeyd edən Katib Çələbi onun 428-ci (1037) ildə vəfat etdiyini yazır[1227].

---

1223 "Şərhi-Çəğmini" adı ilə tanınmış əsər Bursalı türk riyaziyyatçı və astronom Səlahəddin Musa Qazizadə Ruminin dövrün məşhur riyaziyyatçı və astronomlarından biri olmuş Mahmud ibn Muhəmməd ibn Ömər Çəğmini Xarəzminin (öl. 1221) "Müləxxəs fi'l-Hey'ə" adlı əsərinə yazdığı şərhdir.

1224 SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 466.

1225 SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 473.

1226 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I s. 181; İBNü'l-ƏSİR, *Lübab*, C. I, s. 113.

1227 KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 83.

A. Bakıxanov isə onun h. 442-ci (1051) ildə vəfat etdiyini qeyd etmişdir[1228]. O, həmçinin "Bidayət Halü'l-Həllac və Nihayətuhu" və "Hikayətü's-Sufiyyə"adlı əsərlərin də müəllifi idi[1229].

**Seyyid Yəhya ibn Seyyid Bəhaəddin əş-Şamaxi əl-Bakuvi Şirvani**

Şamaxı şəhərində anadan olmuşdu. Atası varlı insan idi. Yeniyetmə yaşlarında yaxşı təhsil almışdı. Şirvanşahlar dövründə Şamaxı Azərbaycanın elmə və mədəniyyət mərkəzlərindən biri idi. O, Şamaxı mədrəsələrində Şəmsəddin Əxskəti, Hafizəddin Gərdəri, Tacəddin Sərabi və Qütbəddin Sərabi kimi alimlərin tələbəsi olmuşdu. O, zahirən yaraşıqlı insan olmaqla yanaşı gözəl əxlaqlı və xoşrəftar insan idi. Şeyx Pirzadənin vasitəçiliyi ilə şeyx Sədrəddin Xəlvəti ilə tanış olmuş və onun müridi olmuşdu. Atası seyyid Bəhaəddin oğlunun sufizmə meyl etməsinə qəti surətdə etiraz etmişdi. Bunun əsas səbəbi isə həmin dövrdə Şirvanda sufizmə qarşı münasibətin mənfi olması idi. O, şeyx Sədrəddin Xəlvətinin qızı ilə evlənmişdi. Şeyx Sədrəddin Xəlvətinin ölümündən sonra köhnə dostu və bacanağı olan Pirzadə ilə aralarında şeyxlik məsələsinə görə anlaşmazlıq meydana gəlmişdi. Seyyid Yəhya Şamaxıdan Bakıya köçmüş və ömrünün sonuna qədər burada yaşayaraq xəlvəti təriqətini yaymışdı. Şirvanşah Xəlilullah Dərbəndi (1416-1464) onu himayə etmiş və Bakıda xəlvəti təriqətinin ilk dərgahı açılmışdı. Bakıda xəlvəti xanəgahı ilə yanaşı məscid və mədrəsənin inşasına da Şirvanşah Xəlilullah maddi yardım göstərmişdi. Mövlana Yusif Məxdum, Dədə Ömər Rövşəni, qazi Ziya Şirvani, Qubad Şirvani, Əbdülməcid Şirvani seyyid Yəhyanın tanınmış müridlərindən və xəlifələrindən idilər. Seyyid Yəhya Bakuvi "Kəşfü'l-Qülub" adlı əsərini Şirvanşah Xəlilullaha ithaf etmişdi. Bundan başqa seyyid Yəhya Şirvani "Şərhi-Sualati-Gülşəni-Raz"[1230], "Əsrarü't-Talibin"[1231], "Şəfaü'l-Əsrar", "Əsrarü'l-Vəhy", "Əvradü's-Subah"[1232], "Virdü's-Səttar"[1233], "Gülşəni-Əsrar"[1234] adlı

---

[1228] BAKIXANOV, *Gülüstani-İrəm*, s. 195, Bakı 1951.
[1229] MƏMMƏDOV, *həmin əsər*, s. 9-10.
[1230] "Gülşəni-Raz" azərbaycanlı mütəsəvvif şeyx Mahmud Şəbüstərinin (1340) əsəridir.
[1231] Bu iki əsərinin əlyazma nüsxələri Türkiyə, Çorum Həsən paşa İHK-də mövcuddur.
[1232] Bu əsərin əlyazma nüsxələrindən biri Ankara, Milli kitabxanada saxlanılır.
[1233] Türkiyənin əlyazma əsər kitabxanalarında bu əsərin bir neçə nüsxəsi mövcuddur. Bunlardan biri də İstanbul, Nuriosmaniyyə kitabxanasındadır.
[1234] Bu əsərin əlyazma nüsxələrindən biri İstanbul Millət kitabxanasında saxlanılır.

əsərlərin müəllifi idi. H. 868-ci ildə (1464) Bakıda vəfat etmiş və Şirvanşahlar saray kompleksinin həyətindəki türbədə dəfn edilmişdir[1235].

**Mövlana şeyx Yusif Müsküri Şirvani**

Onun ulu babaları h. VII (XIII) əsrdə Mədinədən Qarabağa, oradan da Qubanın Müskür nahiyəsinə gəlmişdilər. Şeyx Yusif Müsküri hicri VIII (XVI) əsrin ortalarında burada dünyaya gəlmişdi. Xəlvəti təriqətinə mənsub olan mövlana Yusif Müsküri seyyid Yəhya Bakuvinin müridi olmuş, irşad xirqəsini ondan almışdı. O, məmləkəti Müskürə qayıdaraq burada irşad və mənəvi tərbiyə ilə məşğul olmuşdu. Ehtimal ki, o, burada öz şeyxinin xəlifəsi olmuşdu. Onun nəslindən olanlar sultanlar və əmirlər tərəfindən ehtiramla qarşılanırdılar. Mövlana Yusif Müskürinin məzarı və onun yurdu sonralar Şeyxlər (indi Xaçmazın Şıxlar kəndi) adı ilə məşhur olmuşdu. Mövlana Yusif Müsküri "Bəyanü'l-Əsrar" adlı ərəbcə qələmə alınmış, müqəddimə və 24 fəsildən ibarət olan, əşyanın maddi və mənəvi xüsusiyyətlərinə, təsəvvüf əhlinin adət və ədəb qaydalarına aid əsərin müəllifi idi. Mövlana Yusif Müskürinin ölüm tarixi XIV əsrin sonlarına təsadüf edir[1236].

**Seyyidü'ş-Şərif Vəli ibn Hüseyn əl-Əcəmi Şirvani**

Şafi'i məzhənə mənsub mühəddis və astronom idi. İmam Həsənin (ﺍ) nəslindən idi. H. 928-ci ildə (1522) həcc ziyarətinə getmiş və qayıdarkən Suriyanın Dəməşq və Hələb şəhərlərində olmuşdu. Bu şəhərlərdəki alimlərdən dərs almışdı. Hələbdə Burhan əl-İmadinin[1237] yanında "Səhihi-Buxari"ni[1238] oxumuşdu. Hələb və Dəməşqdə astronomiyaya dair dərslər vermişdi. Məşhur alim Raziəddin Muhəmməd ibnü'l-

---

1235 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VII, s. 864; TAŞKÖPRÜZADƏ, *Şəqaiqü'n-Numaniyyə*, s. 164-165; Mehmet RIHTIM, *Seyid Yəhya Bakuvi və Xəlvətilik*, s. 18-22, Bakı 2005, Ahmed Hilmi HOCAZADE, *Seyyid Yahya eş-Şirvani*, s. 4-5, İstanbul 1319; NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, s. 783.

1236 BAKIXANOV, *Gülüstani-İrəm*, s. 205; ŞƏRİFOV, *Əbdülqadir Əfəndi...*, s. 77-78. Prof. Kamandar Şərifov mövlana Yusif Şirvaninin "Silsilətü'l-Üyun" adlı bir əsəri haqqında da məlumat vermişdir.

1237 Burhan İbrahim ibn Həsən əl-İmadi Hələbi (öl. 1547) mühəddis idi.

1238 İmam Muhəmməd ibn İsmayıl Buxarinin (810-869) "Cəmi'u's-Səhih" adlı hədis külliyatı . İslam dünyasında mötəbər 6 hədis kitabından (Kutubi-Sittə) biridir.

Hənbəli (öl. 1563) onun tələbəsi olmuş və onun yanında "Mətni-Çəğmini"ni[1239] oxumuşdu. Vəli Şirvani daha sonra Şirvana qayıtmış və burada hədis dərsləri vermişdi. O, Sədri-Şirvan ləqəbi ilə tanınmış mövlalə Şəmsəddin Bərdəinin qələmə aldığı bir əsərə haşiyə yazaraq buradakı hədislərin isnadını müəyyənləşdirmişdi. Alim h. 956-cı ildə (1549) vəfat etmişdi[1240].

**Şeyx Kəmaləddin Muhəmməd ibn şeyx Qiyasəddin Əhməd əş-Şamaxi Şirvani**

Xəlvəti təriqətinə mənsub şeyx və hənəfi məzhəbinə mənsub fəqih idi. Şamaxı şəhərində anadan olmuşdu. O, seyyid Yəhya Bakuvinin tələbəsi və müridlərindən biri idi. Səfəvilərin təzyiq və təqibi səbəbiylə Şirvanı tərk edib Misirə getmiş və Qahirədə yaşamışdı. Qahirədə məskunlaşandan sonra şeyxlik və mürşidlik iddiasında olmadan mütəvazi həyat sürmüşdü. Qahirədə əl-Xəlil karvansarayının yaxınlığında yaşayırdı. Tələbələrinə elm öyrətməklə yanaşı buradakı emalatxanasında müxtəlif incəsənət əsərləri və məişət əşyaları hazırlayıb satırdı. Şeyx Kəmaləddin Muhəmməd Şirvani mömin, ədəb və gözəl əxlaq sahibi, xoşrəftar və təvazökar insan idi. O, uzun ömür yaşamış, h. 927-ci ilin rəbiələvvəl ayında (fevral 1521) 113 yaşında vəfat etmişdi[1241].

**Şeyx İbrahim ibn Muhəmməd əl-Ərdəbili əş-Şamaxi Şirvani**

Şafi'i məzhəbinə mənsub fəqih idi. H. 864-cü ildə (1459) həcc ziyarətinə getimş və h. 865-ci ilin (1460) ilin əvvəllərində həcc ziyarətindən qayıdarkən Qahirəyə gəlmiş və buradakı alimlərlə görüşüb söhbət etmişdi. Fəzilət və təvazö sahibi alim idi. Misirdə qaldığı bir il müddətində tədrislə məşğul olmuş, lakin çox az tələbə onun dərslərindən faydalana bilmişdi. Həmin il yenə həcc ziyarəti üçün Məkkəyə getmiş və daha sonra Azərbaycana qayıtmışdı. Şəmsəddin Səxavi onun öz vətənində tədrislə məşğul

---

[1239] Mahmud ibn Muhəmməd ibn Ömər Çəğmini Xarəzmi (öl. 1221) yaşadığı dövrün məşhur riyaziyyatçı və astronomlarından biri olmuşdur. "Müləxxəs fi'l-Hey'ə" və "Qüvvəi-Kəvakib və Zə'fuha" onun astronomiyaya dair məşhur əsərləridir. Onun bu iki əsəri uzun müddət mədrəsələrdə dəslik kimi oxutulmuşdu. Ehtimal ki, "Mətni-Çəğmini" bu iki əsərdən biridir.

[1240] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s. 176; QƏZZİ, *Kəvakibü's-Sairə*, s. 294.

[1241] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s. 88-89; Ziya BÜNYADOV, "Sufiyskiy Tarikat Qyulşaniyya", *İzbrannıye Soçineniya*, C. III, s. 156, Bakı 1999.

olduğunu və fətva mərcii olduğunu qeyd etmişdir. Alim h. 877-ci ildə (1472) vəfat etmişdi[1242].

**Əbdürrəhman ibn Abdullah ibn Əbü'l-Xeyr əz-Zübeydi əş-Şamaxi Şirvani**

Mühəddis idi. Şam diyarında, Zübeyd şəhərində hədis tədrisi ilə məşğul olmuşdu. Burada onun dərslərində çox sayıda tələbə iştirak etmişdi. Onun tələbələri arasından Nəfisəddin əl-Ələvi kimi mühəddis yetişmişdi. Alim h. 797-ci ilin şaban ayında (iyun 1395) vəfat etmişdi[1243].

**Əbü'l-Fəzl Şaban ibn Hacı ibn Mülkan Şirvani**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. Xorasanın Nişapur şəhərinə getmiş buradadakı hədis və fiqh alimlərinin bir çoxu ilə görüşərək onların tələbəsi olmuşdu. Əbu Muhəmməd Abdullah ibn Yusif ibn Bamuyə əl-İsfəhani (öl. 1018), hafiz Əbu Abdullah Muhəmməd ibn Abdullah Hakim Nişapuri kimi mühəddislərdən dərs almış Əbü'l-Fəzl Şaban Şirvani təhsilini başa vurduqdan sonra Azərbaycana qayıtmış və burada tədrislə məşğul olmuşdu[1244].

**Şeyx Şəmsəddin Muhəmməd ibn Əhməd ibn Səlah Şirvani**

Zahid və abid bir şəxs olmaqla yanaşı hikmət, məntiq, astronomiya və rəsəd elmlərində dövrün tanınmış alimlərindən idi. Dəməşqdəki "Səidü's-Süəda" və "Şihabiyyə" xanəgahlarının şeyxi olmuşdu. Yaşadığı dövrdə Xacə Nəsrəddin Tusi, Əsirəddin Müfəzzəl Əbhəri (öl. 1265), şeyx Qütbəddin İbrahim əl-Misri, imam Fəxrəddin Muhəmməd Razi, şeyx Şərəfəddin Muhəmməd Məs'udi, şeyx Əbü'l-Fəth Muhəmməd ibn Xəyyam, Bəhmənyar Şirvani, rəis Əbu Əli ibn Sina kimi alimlərin fəlsəfə, astronomiya, məntiq, riyaziyyat, həndəsə və.s elm sahələrinə dair əsərlərinin dərin

---

[1242] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. I, s. 107.
[1243] İBN HƏCƏR, *İbnai'l-Ğumr*, s. 167.
[1244] SEYRƏFİNİ, *Müntəxəb*, s. 274.

bilicisi kimi tanınmışdı. H. 698-ci ildə (1299) Dəməşqdən Qahirəyə getmiş və bir il sonra h. 699-cu ildə (1300) burada vəfat etmişdi[1245].

**Şeyx Əli Əkbər ibn Mustafa ibn Mahmud əş-Şamaxi Şirvani**

Şafi'i məzhəbinə mənsub fəqih olmaqla yanaşı ərəb filologiyası və ədəbiyyatı üzrə tanınmış mütəxəssis idi. Hindistanın Heydərabad şəhərində yaşamışdı. Ərəb filologiyası və şafi'i fiqhi sahəsində bir sıra əsərlərin müəllifi idi. Bunlardan "Məsailü't-Təmriniyyə fi's-Sərf", "Məsalətu'l-İxbar bi'z-Zeyy fi'n-Nəhv", "Məşkukü'l-Məvrudə fi'l-Məsaili'l-Məntiqiyyə", "Əcviyyə'ş-Şafi'iyyə fi'l-Məntiq" və "Tuhfətu'n-Nizamiyyə fi'l-Füruqi'l-İstilahiyyə fi'l-Lüğə"ni sadalamaq olar. Sonuncu əsərini h. 1310-cu ildə (1863) qələmə almışdır[1246]. Ölüm tarixi məlum deyil.

**Əbü'l-Fəzl Şaban əş-Şabrani Şirvani**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. Əsnəvi onu "əhli- zöhd, fəzilətli imam" kimi sözlərdə tövsif etmişdi. Əbü'l-Fəzl Şabrani İranın Təbəristan vilayətinin Amul şəhərində fiqh təhsili almış, Əbu Leyla Bəndar ibn Muhəmməd əl-Bəsrinin tələbəsi olmuşdu. Bu şəhərin mühəddislərindən hədis dinləmişdi. Təhsilini başa vurduqdan sonra vətəninə qayıtmış, Şabrandakı mədrəsələrdə dərs vermişdi. Əbü'l-Fəzl Şaban əş-Şabrani h. 494-cü ilin şaban ayında (iyun 1101) vəfat etmişdi[1247].

**Mövlana Fəthullah ibn Əbu Yəzid Abdullah ibn Əbdüləziz ibn İbrahim əş-Şabrani Şirvani**

Riyaziyyatçı və astronom həmçinin şafi'i məzhəbinə mənsub fəqih və müfəssir idi. Təqribən h. 820-ci ildə (1417) Şabran şəhərində anadan olmuş, ilk təhsilini doğma şəhərində aldıqdan sonra təhsilini davam etdirmək üçün səyahətə çıxmışdı. Bir müddət Xorasanın Tus şəhərində təhsil almış, burada Nizaməddin Nişapurinin astronomiyaya

---

[1245] SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. II, s. 101; həmçinin bax: BÜNYADOV, "Novıye Materialı o Vidnıx Deyatelyax Azerbaydjana ve Epoxu Srednevekovya", s. 60.
[1246] HÜSEYNİ, *Nüzhətü'l-Xəvatir*, s. 1311.
[1247] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. II, s. 20.

dair "Şərhü't-Təzkirə fi İlmü'l-Hey'ə" əsərini oxumuşdu. Daha sonra Səmərqəndə getmiş və burada türk riyaziyyatçı və astronom Səlahəddin Musa Qazizadə Ruminin (öl. 1437) tələbəsi olmuşdu[1248]. Səmərqənd mədrəsələrində ərəb filologiyası, fiqh, riyaziyyat, astronomiya və kəlam elmlərini öyrənmişdi. 1440-cı ildə Səmərqənddəki alimlərdən icazət (diplom) alaraq elmi tədqiqat və tədrisə başlamışdı. Əllamə İzzəddin Yusif ibn İbrahim Ərdəbilinin[1249] (öl. 1377) şafi'i fiqhinə dair "Ənvar li Əməlü'l-Əbrar" adlı əsərinə farsca şərh yazmış və Teymuri hökmdarı Uluq bəyə təqdim etmişdi. 1440-cı illərin birinci yarısında vətənə qayıtmışdı. Bir müddət Şirvandakı mədrəsələrdə tədrislə məşğul olmuş daha sonra Anadoluya, Osmanlı ölkəsinə getmişdi. Onun bu ölkəyə gəlişi sultan II Muradın (1421-1451) hakimiyyətinin son illərinə təsadüf etmişdir. Candarlı İsmayıl bəyin tövsiyyəsi ilə bir müddət Qastamonu şəhərindəki mədrəsələrdə dərs vermişdi. Müəllifi olduğu "Ayətü'l-Kürsi" təfsirini 1453-cü ildə Bursada sədriəzəm Candarlı Xəlil paşaya təqdim etmişdi. Musiqi və bəstəkarlığa dair "Məcəllətü fi'l-Musiqi" adlı əsərini də həmin il Osmanlı sultanı Fateh II Mehmedə (1451-1481) təqdim etmişdi. İstanbulun fəthindən sonra onu himayə edən Candarlı ailəsinin başçısı Xəlil paşanın sultanın əmri ilə edam edilməsi ilə vəziyyət bir qədər dəyişmiş və Fəthullah Şirvani 857-ci ilin (1453) ortalarında yenidən Qastamonuya gedərək buradakı mədrəsələrdə tədrislə məşğul olmuşdu. Qastamonuda ustadı Musa Qazizadə Ruminin müəllifi olduğu "Şərhü'l-Müləxxəs fi İlmü'l-Hey'ə" adlı əsərinə "Fəvaid və'l-Fəvaid" adlı bir haşiyə yazaraq sultan Fateh II Mehmedə təqdim etmişdi. Lakin ümid etdiyinin əksinə olaraq sultandan iltifat görməmişdi. "Haşiyəyi-Təlvih", "Şərhu-Əşkali-Tə'sis" də alimin qələmindən çıxmış əsərlərdir. Bundan başqa Fəthullah Şirvani ərəb dilinin qrammatikasına dair "Şərhu-İrşadü'l-Hadi"[1250] adlı bir əsər də qələmə almışdır. 1465-ci ildə həcc ziyarəti üçün yola çıxmışdı. Yolda İraqın bəzi şəhərlərində qalmış və

---

[1248] Bursalı Mehmed Tahir onun Seyyidü'ş-Şərif Əbü'l-Həsən Əli Cürcani (öl. 1413) və Əli Quşçunun (öl. 1474) tələbəsi olduğunu qeyd etsə də (bax: *Osmanlı Müəllifləri*, C. I, s. 392) bu mümkün görünmür. Çünki Seyyidü'ş-Şərif Cürcani onun anadan olmasından 4 il əvvəl ölmüş, Əli Quşçu isə onunla həmyaş olmuşdur. Taşköprüzadə də onun Seyyidü'ş-Şərif Cürcaninin tələbəsi olduğunu qeyd etmişdir (bax: *Şəqaiqü'n-Numaniyyə*, s. 65).

[1249] Haqqında bax: səh. ???

[1250] BAĞDADLI İsmayıl Paşa, *Hədiyyətü'l-Arifin Əsmai'l-Müəllifin və Asarü'l-Müsənnifin*, (Hzr. R. Bilge-İnal M. K), C. I, s. 815, İstanbul 1951; KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 130. Bu əsər Sə'dəddin Təftazaninin ərəb filologiyasına dair yazdığı "İrşadü'l-Hadi"yə yazılmış şərhdir. Katib Çələbi və Bağdadlı İsmayıl Paşa Sə'dəddin Təftəzaninin (öl. 1389) Mövlana Fəthullah Şirvaninin (1417-1478) müəllimi olduğunu qeyd etsə də bu iki şəxsin təvəllüd və vəfat tarixlərindən də görüldüyü kimi bu mümkün deyil. Katib Çələbi alimin adını "Şah Fəthullah Şirvani" olaraq qeyd etmişdir.

mədrəsələrdə dərslər vermişdi. 1466-cı ildəki həcc ziyarətindən sonra bir il Məkkədə mücavir olaraq qalmışdı. Məkkədə qaldığı dövrdə ətrafına toplaşmış tələbələrin istəyi ilə dərslər vermişdi. Qayıdarkən Qahirəyə gəlmiş, buradakı elmi fəaliyyətlərlə tanış olub alimlərlə görüşmüşdü[1251]. Qahirədən İstanbula getmiş, lakin heç vaxt sultan Fateh II Mehmedin etimadını qazana bilməmiş və irəli çəkilməmişdi. Mövlana Fəthullah Şirvani h. 891-cı ildə (1486) Qastamonuda vəfat etmişdi[1252]. O, Əli Quşçu ilə birlikdə Osmanlı mədrəsələrində riyaziyyat və astronomiyaya dair tədqiqat ənənəsinin təməlini qoymuş şəxs idi. Fəthullah Şirvani riyaziyyat, astronomiya, filologiya, ədəbiyyat, təfsir, fiqh üsulu sahələrinə aid 6 məşhur əsərin müəllifidir. Bundan başqa musiqi, həndəsə, optika kimi sahələrə dair onlarla risalə qələmə almışdı. Əsərlərinin çoxunu ərəbcə, bəzilərini isə farsca qələmə almışdı. Onun "Risaleyi-Əqaid" adlı əsərinin bir nüsxəsi Türkiyə Konya şəhəri Yusifağa əlyazmalar kitabxanasında, "Haşiyə ələ Şərhü'l-Məvaqif" adlı əsəri İstanbul Atif əfəndi kitabxanasında, astronomiyaya dair "Haşiyə ələ Şərhi'l-Müləxxəs fi'l-Hey'ə" adlı əsəri Türkiyə Kütahya şəhəri Vahidpaşa İHK, "Məcəllətü fi'l-Musiqa" adlı əsəri İstanbul Topqapı sarayı kitabxanası Nr. 3449-da, Nəsrəddin Tusinin "Təzkirə fi İlmü'l-Hey'ə" adlı əsərinə yazdığı şərh İsfəhanın Muhəmmədşəfi mədrəsəsi kitabxanası və Tehran universitetinin kitabxanasında, əllamə İzzəddin Yusif Ərdəbilinin "Ənvar li Əməlü'l-Əbrar" adlı əsərinə farsca yazdığı şərhin alimin öz dəsti xətti ilə 22 şəvval 845 (5 mart 1442) tarixində qələmə aldığı nüsxəsi Tehran Sipəhsalar kitabxanasında saxlanmaqdadır. Alimin "Məcəllətü fi'l-Musiqa" adlı əsəri 1986-cı ildə Frankfurtda "Ərəb və İslami Elmlər Məcmuası"nda nəşr olunmuşdur.

**Seyyid Sahib Muhəmməd ibn Muhəmməd əl-Əcəmi Şirvani**

O, hələ kiçik ikən atası vəfat etmişdi. H. 886-cı (1482) ildən etibarən təhsil almağa başlayan Sahib Muhəmməd Şirvani Məkkənin hənəfi imamı Şəmsəddin Buxarinin tələbəsi olmuşdu. Məkkədəki alimlərdən hədis dinləmiş və hədis elmlərini öyrənmişdi.

---

[1251] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. III, s. 241.

[1252] TAŞKÖPRÜZADƏ, *Şəqaiqü'n-Numaniyyə*, s. 65-66; KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 130, 573; C. II, s. 1003, 1083; Bayram AKDOĞAN, "Fethullah Şirvani'ye Göre Makamların Tesirleri ve İcra Edileceği Vakitler", **AÜİFD**, C. XLVIII/I, Ankara 2007, s. 77-82; Bursalı Mehmed Tahir Fəthullah Şirvaninin 857-ci (1453) ildə Qastamonuda vəfat etdiyini və burada dəfn edildiyini qeyd etmişdir. Bax: *Osmanlı Müəllifləri*, C. I, s. 392.

Daha sonra Mədinəyə getmiş və Məscidi-Nəbəvidə mücavir olaraq qalmışdı. Bu müddətdə Mədinə alimlərinin dərslərində də iştirak etmişdi. Hicazdakı təhsilini başa vurduqdan sonra h. 895-ci ildə (1490) Qahirəyə getmişdi. Səxavi (öl. 1497) h. 899-cu ildə (1494) onun Qahirədə yaşadığını qeyd etmişdir[1253]. Ölüm tarixini qeyd etmədiyinią görə alimin Şəmsəddin Səxavidən sonra vəfat etdiyini təxmin etmək olar.

**Qənbər ibn Abdullah əl-Əcəmi Şirvani**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Şirvanda təhsil almış, daha sonra Misirə getmiş və əl-Əzhər camesində dərs vermişdi. O, zahid və abid insan idi. Təsəvvüfə meyl etmişdi. Sadə geyinir və dünyəvi şeylərdən mümkün qədər az istifadə edərdi. Başında külah, əynində yun köynək və xirqə olurdu. İbnü'l-İmad və İbn Həcərin verdiyi məlumatdan Qənbər Şirvaninin mövləvi təriqətinə mənsub olduğunu təxmin etmək olar. Çünki hər iki müəllif onun səma' və rəqsi xoşladığını qeyd etmişdilər. Amma mümkündür ki, o, başqa bir təriqətə də mənsub olsun. Çünki rəqs və səma' sufi təriqətlərinin bir çoxunda əsas ritullardan hesab olunur. Qənbər Şirvani kəlam və astronomiya elmləri ilə də məşğul olmuşdu. O, bu sahədə bəzi əsərlərin müllifi idi. H. 801-ci ilin şaban ayında (aprel 1399) vəfat etmişdi[1254].

**Mahmud ibn Muhəmməd Dilşad Şirvani**

XV əsrdə Osmanlı imperatorluğunda yaşamış tarixçi, coğrafiyaşünas, mütərcim və ədib idi. Qələmə aldığı əsərlərdən onun həmçinin təbabətlə də məşğul olduğu məlum olur. Ehtimal ki, oğlu həkim Şükrullah Şirvani də atasının təbabətdəki məharətini davam etdirərək yaşadığı dövrün məşhur tibb alimlərindən biri olmuşdu. Mahmud ibn Muhəmməd Dilşad Şirvani yaxın bir qohumu ilə aralarındakı ziddəyyətlərdən ötrü vətəni tərk edərək Osmanlı ölkəsinə getmiş və orada yaşamışdı. Prof. Kamandar Şərifov Mahmud Dilşad Şirvaninin həyat və yaradıcılığı haqqında Azərbaycanda ən geniş

---

1253 SƏXAVİ, *Zəvu'l-Lami'*, C. V, s. 1.
1254 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VII, s. 704; İBN HƏCƏR, *İbnai'l-Ğumr*, C. II, s. 202.

tədqiqatı aparmış alimdir[1255]. Bundan başqa Türkiyədə möhtərəm ustadım prof. Mikayıl Bayramın elmi rəhbərliyi ilə ərsəyə gəlmiş bir namizədlik dissertasiyasında[1256] alimin həyat və yaradıcılığı haqqında ətraflı və müqayisəli məlumat verilmişdir. Mahmud ibn Dilşad Şirvani bir sıra əsərlərin müəllifi idi. Bunlardan daha çox "Tuhfəyi-Muradi" adı ilə tanınan "Muradi fi Əsnafi'l-Cəvahir" adlı hənəfi fiqhinə dair türkcə qələmə alınmış əsər müəllif tərəfindən Osmanlı sultanı II Murada (1421-1451) təqdim edilmişdir. Bu əsərin bilinən üç əlyazma nüsxəsindən biri Paris milli kitabxanasında, digəri Qahirədə Misir milli kitabxanasında, üçüncüsü isə Türkiyədə Kastamonu İHK-də saxlanılır. Alimin tibbə dair türkcə yazdığı "Kəhhalnaməyi-Nuri'l-Uyun" adlı əsərinin yeganə nüsxəsi İstanbul Millət kitabxanasındadır. Mahmud Şirvaninin ən məşhur əsəri "Tərcüməyi-Tarixi-İbn Kəsir"dir. Mahmud Şirvani məşhur mühəddis, müfəssir və tarixçi İmadəddin İsmayıl ibn Kəsirin (1300-1373) "Bidayə və'n-Nihayə" adlı tarixə dair çoxcildli əsərini ixtisarla ərəbcədən türkcəyə tərcümə etmişdir. Bu əsərin Türkiyədəki kitabxanalarda beş əlyazma nüsxəsi mövcuddur. 2001-cü ildə dissertasiyam üçün elmi material toplayarkən bu əsərin Nr. 900/3693-ə qeydli Konya BYEK-dəkı nüsxəsi ilə tanış olmuşdum. Əsər uzun müddət Burdur İHK-də saxlanmış, daha sonra Konyaya gətirilmişdi. Lakin dissertasiya mövzuma aid olmadığı üçün əsərin sadəcə kataloq nömrəsini götürməklə kifayətlənmişdim. "Tərcüməyi-Tarixi-İbn Kəsir"in müəyyən etdiyimiz digər dörd nüsxəsi isə İzmir İHK-də saxlanılır.

Bursalı Mehmed Tahir Mahmud ibn Muhəmməd Dilşad Şirvaninin həmçinin Ömər ibnü'l-Vərdinin (öl. 1349) "Xəridətü'l-Əcaib və Fəridətü'l-Qəraib" və İsmayıl əl-İstəxrinin (X əsr) "Məsalikü'l-Məmalik" adlı coğrafiyaya dair əsərlərini, həmçinin aşağıda haqqında məlumat verdiyimiz mövlana Muhyəddin Muhəmməd Qarabağinin (öl. 1535) "Calib's-Sürur və Səblü'l-Qürur" adlı əsərini türkcəyə tərcümə etdiyini bildirmişdir[1257]. Lakin Səma Yaniçin fikrinə görə "Xəridətü'l-Əcaib və Fəridətü'l-Qəraib" və "Məsalikü'l-Məmalik" xacə Mahmud ər-Rumi adlı başqa bir alim tərəfinən

---

[1255] Kamandar ŞƏRİFOV, "Mahmud Şirvani", **AMEA Əİ**, **Filologiya Məsələləri**, Bakı 1999, s. 56-67. Həmçinin bax: Səma YANİÇ, "Hace Hatib Mahmud er-Rumi, Eserleri ve Osmanlı İlim Hayatındaki Yeri", **SÜTAD**, S. 17, Konya 2005, 411-423.

[1256] Dissertant yoldaşlarımızdan Səma Yaniç "Hace Hatib Mahmud er-Rumî ve Haridetü'l-Acayib ve Feridetü'l-Garayib" adlı namizədlik dissertasiyasını 2004-cü ildə Konya Səlcuq universitetində müdafiə etmişdir.

[1257] *Osmanlı Müəllifləri*, C. III, s. 139-140, İstanbul 1342.

tərcümə olunmuş və bu iki müəllif müasir tədqiqatçılar tərəfindən eyni şəxs kimi qəbul edilmişdirlər[1258]. Bizim fikrimizə görə də Bursalı Mehmed Tahirin verdiyi məlumatlarda ziddiyət var. Belə ki, Mehmed Tahir alimin sultan II Muradın (1421-1451) dövründə yaşadığını qeyd etməklə yanaşı onun Muhyəddin Qarabağinin "Calib's-Sürur" adlı əsərini türk dilinə tərcümə etdiyini bildirir[1259]. Halbuki Muhyəddin Qarabaği 1535-ci ildə vəfat etmişdir. Mahmud Şirvaninin özündən təqribən bir əsr sonra yaşamış bir şəxsin əsərini tərcümə etməsi şübhəsiz ki, mümkün deyil. Mahmud Şirvaninin ölüm tarixi dəqiq məlum olmasa da h. 843-cü ildən (1439) sonraya təsadüf etdiyi bilinir.

**Həkim Şükrullah Muhəmməd ibn Mahmud ibn Muhəmməd Dilşad Şirvani**

Yaşadığı dövrdə Osmanlı imperatorluğunda tanınmış həkimlərindən biri, həmçinin ərəb filologiyası, təfsir və hədis kimi dini elmlərdə də mütəxəssis idi. Müəllifi olduğu "Risalətü's-Sultaniyyə" və "Kəmaliyyətü't-Tibb" adlı əsərlərdə onun adı "Şükrullah Muhəmməd ibn Mahmud Dilşad" kimi qeyd olunmuşdur. Bu qeydlərə istinadən onun, yuxarıda haqqında bəhs etdiyimiz, Mahmud ibn Muhəmməd Dilşad Şirvaninin oğlu olduğunu söyləmək olar. Pərviz Şahmərasi[1260] və digər bəzi müəlliflər onunla atasını eyni şəxs zənn edərək, adlarını aşağıda sadalayacağımız, tibbə dair əsərləri Mahmud ibn Muhəmməd Dilşada aid etmişdirlər. Bəzən də atasına aid olan əsər oğluna aid edilmişdir[1261]. Həkim Şükrüllah Şirvani həm də istedadlı şair idi. O, farsca "Nəxlistan" adlı mənzumə qələmə almışdı. Bu əsər Sədi Şirazinin "Gülüstan"ı tərzində yazılmışdı. "Nəxlistan"ın yeganə nüsxəsi İstanbul Millət kitabxanasında saxlanılır[1262].

Həkim Şükrullah Şirvani Osmanlı sultanı Fateh II Mehmedin (1451-1481) şəxsi həkimlərindən biri olmuş, qısa müddətdə onun yaxın adamlarından birinə çevrilmişdi. Həcc ziyarətinə getmiş və İstanbula qayıdarkən bir müddət Misirdə qalmışdı. Burada Şəmsəddin Səxavi (öl. 1497) kimi Misirin tanınmış mühəddislərindən hədis dərsləri

---

[1258] YANİÇ, *həmin məqalə*.
[1259] *Osmanlı Müəllifləri*, C. III, s. 139-140, 235.
[1260] Bax: http://shahmarasi.blogfa.com
[1261] Bax: Fərid ƏLƏKBƏRLİ, "Məşhur Orta Əsr Azərbaycan Həkimləri", http://www.alakbarli.aamh.az
[1262] Arzu SÜREN, *Şükrullah-i Şirvani'nin Nahlistan Adlı Eserinin Metni ve Metin İncelemesi*, s. 21, İstanbul 2006. (Nəşr olunmamış magistr işi). A. Sürən bu əlyazmanın Bəyazid Dövlət kitabxanasında saxlanıldığını yazmışdır. 2000-2006-cı illərdə tarixi Millət kitabxanındakı təmir və restavrasiya səbəbiylə bu kitabxanaya məxsus 16 min əlyazma və çap əsəri Bəyazid Dövlət kitabxanasında mühafizə edilmişdi.

almışdı. Həmçinin Fateh II Mehmedin müəllimi mövlana Şəmsəddin Əhməd ibn İsmayıl Güranidən (öl. 1488) də İstanbulda hədis dərsləri almışdı. Hədis elminə dair icazətini (diplom) mövlana Şəmsəddin Əhməd Güranidən almışdı.

Həkim Şükrullah Şirvani müxtəlif elm sahələrinə aid bir sıra əsərin müəllifidir. Bunlardan riyaziyyata dair "Fütuhat fi'l-Cifr"[1263], tibbə dair "Risalətü's-Sultaniyyə fi't-Tibb"[1264], "Risalə fi'l-Qulunc və'l-İxtibas"[1265], "Lətaifü'l-Cəlilə"[1266], "Rəvzətü'l-İtr fi't-Tibb"[1267], "Müxtəsəri-Tibb"[1268], "İxtiyarati-Bədi'i"[1269], "Mürşid fi't-Tibb"i[1270] sadalaya bilərik. Onun tibb sahəsində qələmə aldığı bir digər əsəri də "əl-İlyasiyyə fi't-Tibb" adlanır. Daha çox "Kamalnamə" adı ilə tanınan, tibbə dair "Kəmaliyyətü't-Tibb" adlı türkcə qələmə alınmış əsərinin bir nüsxəsi Bosniya-Hersoqovinanın paytaxtı Sarayevodakı ğazi Xosrov bəy kitabxanasında mühafizə edilir. Həmin əsərin iki əlyazma nüsxəsi İstanbul Universiteti Cərrahpaşa tibb fakultəsinin kitabxanasında saxlanılır. Alim farsca qələmə aldığı "Riyazü'l-Ülum" adlı əsərini Osmanlı sultanı II Bayəzidə (1481-1512) ithaf etmişdi[1271]. Şükrullah Şirvaninin Qur'an elmlərinə dair qələmə aldığı "Miftahü'n-Nəcat" adlı ərəbcə əsərin Türkiyədəki yeganə nüsxəsi Çorum şəhəri Həsən paşa İHK-də saxlanılır. Alim tibbə dair əsərlərinin çoxunu türkcə qələmə almışdı. Həkim Şükrullah Şirvani fəzilət sahibi, saleh insan idi. H. 912-ci ildə (1506) İstanbulda vəfat etmişdi[1272].

### Əbu Nəch Yusif ibn Şaban ibn Yusif Şirvani

---

1263 KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. II, s. 324. Katib Çələbi onun adını "Şükrullah Muhəmməd ibn İbrahim Şirvani" olaraq qeyd etmişdir. Fikrimizcə Katib Çələbi yanılmışdır. Çünki alimin əlyazma əsərlərinin hamısında atasının adı "Mahmud" olaraq yazılmışdır. Bundan başqa Katib Çələbinin əsərindən başqa heç bir yerdə mövlana Şükrullah Şirvaninin "Fütuhat fi'l-Cifr" adlı əsərinin olduğuna rast gəlmədik. "Şükrullah Muhəmməd ibn İbrahim Şirvani"nin "Şükrullah Muhəmməd ibn Mahmud Şirvani"dən fərqli adam olduğu ehtimalı da zəifdir. Çünki Katib Çələbi onun h. 912-ci il (1506) vəfat etdiyini bildirmişdir.

1264 İstanbul Süleymaniyyə kitabxanası Nr. 2756 və 2074/1, Köprülü kitabxanası Nr. 2/184-də saxlanılır.

1265 Süleymaniyyə kitabxanasında Nr. 2045/4 saxlanılır.

1266 Manisa İHK Nr. 4/1848 saxlanılır.

1267 KƏHALLƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 702.

1268 Manisa İHK-də saxlanılır.

1269 Manisa İHK-də saxlanılır.

1270 Manisa İHK və İstanbul Universiteti Cərrahpaşa Tibb Fakültəsi Kitabxanasında saxlanılır.

1271 KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 240, 1152.

1272 TAŞKÖPRÜZADƏ, *Şəqaiqü'n-Numaniyyə*, s. 135; SEYİDOV, *həmin məqalə*.

Şafi'i məzhəbinə mənsub fəqih və təsəvvüfçü idi. Nişapurada təhsil almış, bu şəhərdəki hədis alimlərindən hədis dinləmişdi. Daha sonra Nişapurda Zeynü'l-İslam ləqəbi ilə məşhur olmuş Əbu Nəsr Əbdülkərim ibn Həvazin əl-Quşeyri Nişapurinin (öl. 1072) xidmətinə daxil olaraq onun müridi olmuşdu[1273]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Mövlana həkim Kəmaləddin Məs'ud ibn Hüseyn Şirvani**

Teymurilər dövlətində (1368-1501) yaşamış məşhur həkim və mütəfəkkirlərindən biri idi. O, mövlana Fəthullah əş-Şabrani Şirvaninin (öl. 1486) tələbələrindən biri olmuşdur. Səid Nəfisi onun həmçinin Molla Caminin[1274] yetirmələrindən biri olduğunu qeyd etmişdir[1275]. O, Teymurilərin idarəsi altındakı Xorasana getmiş və Heratdakı mədrəsələrdə tədrislə məşğul olmuşdu. Bu şəhərdəki İxlasiyyə və Gövhərşad mədrəsələrində kəlam, məntiq və hikmət dərsləri vermişdi. Onun dərslərini dinləmək üçün hər gün yüzlərlə tələbə toplaşırdı. Həkim Kəmaləddin Şirvani bir müddət sonra Gövhərşad mədrəsəsini tərk etmiş və Qiyasiyyə mədrəsəsində dərs verməyə başlamışdı. Dərin bilik və dünyagörüşünə sahib alim kimi onun şöhrəti bütün Xorasana yayılmışdı. Teymurilər dövrünün bir çox tanınmış alimi, o cümlədən Nizaməddin Əlişir Nəvai (1441-1501) onun şöhrətini duyub dərslərində iştirak etmişdilər. Onun qələmə aldığı əsərlərdən biri təbib Şəmsəddin Muhəmməd ibn Əşrəf Səmərqəndinin (öl. təqribən 1204) əxlaq fəlsəfəsinə dair "Adabü'l-Fazil" adlı əsərinə yazdığı şərhdir[1276]. Türkiyənin əlyazma əsər kitabxanalarında bu əsərin bir neçə əlyazma nüsxəsi mövcuddur. Bunlardan biri İstanbul Atif əfəndi kitabxanasında saxlanılır. Müəyyən edə bildiyimiz digər iki əsəri isə Əzudəddin əl-İcinin (öl. 1355) əxlaq və ictimaiyyətə dair "Risalə fi Adabü'l-Bəhs" və "Risalətü'l-Və'ziyyə" adlı əsərlərinə yazdığı şərhlərdir. Bu iki şərhdən birincisinin nüsxələri Türkiyədə Manisa İHK və Ankara Milli kitabxana, ikincisi isə İstanbul Nuriosmaniyyə əlyazmalar kitabxanasında saxlanılır. Bundan başqa

---

[1273] SEYRƏFİNİ, *Müntəxəb*, s. 540.

[1274] Nurəddin Əbdürrəhman ibn Əhməd (1414-1492) İranlı mütəfəkkir və ədib idi. Molla Cami adı ilə məşhur olmuşdu.

[1275] NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 332.

[1276] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 96; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 847; SEYİDOV, *həmin məqalə*.

mövlana Kəmaləddin Məs'ud Şirvani "Haşiyə ələ Hikmətü'l-Əyn", "Haşiyə ələ Şərhü'l-Məvaqif" adlı əsərlərin də müəllifi idi[1277]. Bu iki əsərin əlyazma nüsxələri Konya Yusifağa kitabxanasında mövcuddur. Alim h. 905-cü ildə (1499) vəfat etmiş, onun cənazə mərasimində öz dövrünün məşhur alim və mütəfəkkirləri iştirak etmişdilər. Nişancı Mehmed Paşa öz əsərində onun Osmanlı sultanı II Bayəzidin (1481-1512) dövründə vəfat etmiş alimlərdən biri olduğunu yazmış, lakin onun Osmanlı ölkəsində yaşayıb yaşamamasına dair hər hansı bir şey qeyd etməmişdir[1278]. Alimin "Şərhu-Risalə fi Adabü'l-Bəhs" adlı əsərinin Türkiyədəki əlyazma əsər kitabxanalarından onlarla nüsxəsi mövcuddur.

**Əbdürrəhman ibn Əhməd Şirvani**

Hənəfi məzhəbinə mənsub fəqih və mütəkəllim idi. İstanbuldakı mədrəsələrdən birində müdərris olan Əbdürrəhman Şirvani "Haşiəy ələ Şərhu-Risalə fi Adabü'l-Bəhs" adlı əsərin müəllifi idi. Onun haşiyə yazdığı bu şərh, yuxarıda haqqında məlumat verdiyimiz, Kəmaləddin Məs'ud Şirvani tərəfindən qələmə alınmışdır. Alimin digər bir əsəri "Haşiyə ələ Ləvami'ü'l-Əsrar" adlanır. "Ləvami'ü'l-Əsrar" qazi Siracəddin Əbü's-Səna Urməvinin (öl. 1283) məntiqə dair "Mətaliü'l-Ənvar" adlı əsərinə şərh mahiyyətində yazılmış əsərdir. "Ləvami'ü'l-Əsrar" adlı şərh qələmə almış iki müəllif məşhurdur. Bunlardan biri Qütbəddin Muhəmməd ər-Razi Təhtani (öl. 1364), digəri isə Mahmud ibn Əbdürrəhman İsfəhanidir (öl. 1349). Əbdürrəhman Şirvaninin bunlardan hansının şərhinə haşiyə yazdığı məlum deyil. Bunu müəyyənləşdirmək üçün görünür əsərin özünü tədqiq etməyə ehtiyac var. Əbdürrəhman Şirvani h. 1134-cü ildə (1722) vəfat etmişdir[1279].

**Əllamə Şəmsəddin Muhəmməd ibn İbrahim Şirvani**

---

[1277] NƏFİSİ, *yenə orada*.
[1278] NİŞANCI, *Hadisat*, s. 163.
[1279] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 129.

Şafi'i məzhəbinə mənsub mütəkəllim idi. Yaşadığı dövrün məşhur kəlam alimlərindən olan Şəmsəddin Muhəmməd Şirvani özünün müasiri əllamə Muhyəddin əl-Kafiyəci[1280] ilə dost idi. Bu iki alim həm təsəvvüf, həm də kəlam sahələrində bir sıra əsərlərin müllifi idilər. Əllamə Şəmsəddin Şirvani h. 778-ci ildə (1376) anadan olmuş, h. 873-cü ildə (1468) vəfat etmişdi[1281].

**Mövlana Pir Muhəmməd Şirvani**

Bacarıqlı dövlət xadimi olan Pir Muhəmməd Şirvani eyni zamanda hənəfi məzhəbinə mənsub fəqih idi. Xorasanda doğulub boya-başa çatmışdı. Hindistana gedib Bayram xanın[1282] himayəsində yüksək səviyyəli elm adamı və siyasi xadim kimi yetişmişdi. Bacarıq və istedadı ilə özünə yol açan Pir Muhəmməd Şirvani, Baburi sarayının ən bacarıqlı diplomatı və siyasətçisi kimi tanınmış, tezliklə saray məmurları və xalq arasında onun tərəfdar kütləsi meydana gəlmişdi. Onun belə yüksəlişi keçmiş hamisi Bayram xanın ürəyincə olmamış və o, günbəgün özünün itaətindən çıxan Pir Muhəmməd Şirvanini cəzalandırmaq qərarına gəlmişdi. Nə ilə ittiham olunduğu məlum olmayan Pir Muhəmməd Şirvani, Bayram xanın əmri ilə h. 965-ci ildə (1558) həbs edilmişdi. Həbsdə ikən Bayram xana məktub yazan Pir Muhəmməd Şirvani Qur'ani-Kərimdən iqtibas etmiş və "Əgər göydə və yerdə Allahdan başqa məbudlar olsaydı, onların (göy və yerin) hər ikisi fəsada uğrayardı"[1283] ayəsini məktubunda qeyd etmişdi. Bu ayəni qeyd etməklə Pir Muhəmməd Şirvani haqsız yerə həbs edildiyini, ölkədə bir neçə deyil, tək hökmdarın olduğunu və tezliklə ədalətin öz yerini tapacağını bildirmişdi. Bayram xan onun bu məktubuna və ədalət tələbinə məhəl qoymamışdı. Bir müddət sonra həbsdən qurtulan Pir Muhəmməd Dehliyə gələrək münasib bir vaxtda

---

1280 Muhyəddin Əbu Abdullah Muhəmməd ibn Süleyman Kafiyəci (1386-1474) yaşadığı dövrün məşhur alimlərindən idi. Türkiyənin Bergama qəsəbəsində dünya gəlmiş, Misirdə yaşamışdı

1281 SÜYUTİ, *Nəzmü'l-İqyan*, s. 109.

1282 Bayram xan Qaraqoyunluların Baharlı qoluna mənsub azərbaycanlı siyasi xadim, hərbi komandan və şair idi. O, Baburilərdən Babur şah, Humayun şah və Əkbər şahın baş komandanı olmuş, bu dövlətin quruluşu və möhkəmlənməsində müstəsna rol oynamışdı. Əkbər şah (1556-1605) 14 yaşlı yeniyetmə ikən taxta oturmuş və 4 il müddətində dövləti faktiki olaraq Bayram xan idarə etmişdi. Lakin yeniyetməlik çağlarını geridə qoyan Əkbər şah dövləti tək başına idarə etməyə başlamış və Bayram xanın nüfuzundan narahat olaraq onu saraydan qovmuşdu. Bayram xan 1561-ci ildə Qucəratdakı məscidlərdən birində sübh namazını qılarkən bir zabit tərəfindən xəncərlənərək qətlə yetirilmişdi. O, həm də istedadlı şair idi. Türk, fars və ərəb dillərində çox gözəl şerlər yazırdı. Özünün divânı vardı.

1283 *Qur'ani-Kərim*, Ənbiya surəsi, 22-ci ayə. (لَوْ كَانَ فِيهِمَا آلِهَةٌ إِلَّا اللَّهُ لَفَسَدَتَا)

sultanın hüzuruna daxil olmuşdu. Başına gələnləri və uğradığı haqsızlıqları danışmışdı. Sultan tərəfindən yenidən irəli çəkilən Pir Muhəmməd Şirvani Hindistanın cənubunadakı Bicaqda qalasının fəthində iştirak etmişdi. Pir Muhəmməd Şirvani h. 969-cu ildə (1562) vəfat etmişdi[1284].

**Şəmsəddin Muhəmməd ibn Mərahiməddin Şirvani**

Təqribən h. 780-ci ildə (1378) Şirvanda anadan olmuşdu. İlk təhsilini vətənində almış, uşaq yaşlarında ikən Qur'ani-Kərimi əzbərləyib hafiz olmuşdu. Daha sonra Teymuri ölkəsinə gedərək buradakı mədrəsələrdə təhsilini davam etdirmişdi. Seyyid Muhəmməd ibn Əli Cürcani, Səlahəddin Musa Qazizadə Rumi (ö. 1437), Əbdürrəhman əl-Qışlaği, Rüknəddin əl-Xafi, Zeynəddin əl-Xafi kimi alimlərin yanıda dini və dünyəvi elmləri öyrənmiş, xüsusən riyaziyyat elmində ixtisaslaşmışdı. H. 830-cu (1427) ildə Qahirəyə gəlmiş və Təqiyyədin əl-Əcəmi zaviyəsində qalmışdı. Qahirədə Muhyəddin ibnü'l-Ərəbi və Əbu Hamid Qəzzalinin əsərlərini mütaliə etmişdi. Xüsusən Əbu Hamid Qəzzalinin elmi irsini dərindən araşdırmışdı. Bundan başqa Sə'dəddin Taftazani, Seyyid Şərif Əli Cürcani, Əlaəddin əl-Qonyəvi Təbrizi kimi alimlərin əsərlərini, bunlara yazılmış şərh və haşiyələri oxuyaraq öyrənmişdi. Əbü'l-Bərəkat əl-Ğirabi, İbn Həssan, Zeynəddin Tahir, Şihabəddin əl-Ləkvirani, Nəcməddin ibn qazi Əclun, İbn Əbü's-Səud, Molla Əli Kirmani, Abdullah əl-Gürani kimi Qahirənin tanınmış alimlərinin dərslərini dinləmişdi. Təhsilini tamamladıqdan sonra elmi fəaliyyət və tədrislə məşğul olmuşdu. Əvvəlcə Təbərsiyyə mədrəsəsində şafi'i fiqhi dərsləri vermişdi. Daha sonra isə Səidü's-Süəda xanəgahında da dərs verməyə başlamışdı. Bir müddət Qahirəni tərk edərək Qüdsə getmiş və Məscidü'l-Əqsada ibadətlə məşğul olmuşdu. H. 871-ci ilin şəvval ayında (may 1467) Misirdən dəniz yolu ilə həcc ziyarətinə getmişdi. Həccdən sonra bir müddət mücavir olaraq Məkkədə qalmış. Həcc ziyarətindən qayıdandan sonra Qahirədəki Zahiriyyə mədrəsəsinə müdərris təyin olunmuşdu. Alim h. h. 873-cü ilin

---

[1284] HÜSEYNİ, *Nüzhətü'l-Xəvatir*, s. s. 322-323

səfər ayında (sentyabr 1468) vəfat etmiş və Qahirədə şeyx Abdullah əl-Münəvvəfinin qəbrinin yanında dəfn edilmişdi[1285].

**Musa ibn Dövlətşah Şirvani**

Mühəddis idi. Dostu bioqraf-tarixçi Ələməddin Qasım əl-Birzali (1267-1338) onun saleh, xoşrəftar, dərin biliyə malik, gözəl insan olduğunu qeyd etmişdi. Musa Şirvani Dəməşqdə Babü'l-Xütbə adlanın yerdə yaşamış və oradakı məktəbdə hədis dərsləri vermişdi. Alim h. 12 səfər 721-ci ildə (12 mart 1321) Dəməşqdə vəfat etmişdi[1286].

**Şeyx Tacəddin Übeydullah ibn Əvəz ibn Muhəmməd Şirvani**

Onun atası Ərdəbildə tanınmış həkim idi. Ərdəbil şəhərində dünyaya gəlmiş, daha sonra Şirvana köçüb burada təhsil almış və bir müddət yaşamışdı. Daha sonra təhsilini davam etdirmək üçün Şirvandan Misirə getmişdi. Misirdə seyyid Əbü'l-Fəzl Abdullah ibn Muhəmməd Sədiq ibn Əhməd əl-İdrisi əl-Qimari (öl. 1413), Şeyxuniyyə mədrəsəsinin müdərrisi şeyx İrşadəddin əl-Müqəvvili, şeyx Qəvaməddin əl-İtqani, şeyx Rüknəddin əl-Qirami, şeyx Qütbəddin ət-Təhtani kimi alimlərdən dərs almış, müxtəlif elm sahələrinə dair biliklərə yiyələnmişdi. O, məzhəb etibarı ilə hənəfi olsa da şafi'i fiqhini də dərindən bilirdi. Çünki əvvəlcə şafi'i ikən sonradan hənəfi məzhəbini mənimsəmişdi. Şeyx Tacəddin Übeydullah Şirvani əvvəlcə Sürqatmışiyyə[1287] mədrəsəsinə mü'id[1288], daha sonra isə Əbubəkriyyə, Xatuniyyə və Ayıtmışiyyə mədrəsələrinə fiqh dərsləri vermək üçün müəllim təyin olunmuşdu. Misir Məmlüklü sultanı Zahir Seyfəddin Bərququn taxtdan uzaqlaşdırılmasına səbəb olan hərbi çevrilişi[1289] tərtib edənlərdən əmir Mintaş onu qaziəsgər vəzifəsinə təyin etmişdi. Buna görə də o, hərbi çevrilişdə iştirak etməklə ittiham olunmuş, lakin məhkəmədə özünü

---

[1285] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. V, s. 7-8.

[1286] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. III, s. 69.

[1287] Misir Məmlüklü dövlətinin türk mənşəli hərbiçilərindən əmir Seyfəddin Sürqatmış ən-Nasiri, sultan Nasirəddin Muhəmməd ibn Qələvunun məmlüklərindən biri idi. Onun inşa etdirib öz adını verdiyi mədrəsə hədis və hənəfi fiqhinin tədris mərkəzlərindən biri idi.

[1288] Aspirant, müdərris köməkçisi

[1289] Əmir Mintaş Misir Məmlüklü dövlətinin Malatya canişini idi. Əmir Yelbuğa ilə birlikdə Sultan Zahir Bərquqa qarşı çevriliş hazırlayan (bax: s. ???) hərbiçilərdən biri olmuşdu. Sultan Zahir Bərquq həbsdən qurtulub çevriliş iştirakçılarına divan tutmuşdu. Ehtimal ki, şeyş Übeydullah ibnü'l-Ərdəbilinin bu çevrilişdə heç bir rolu olmamışdı. Çünki Məqrizinin qeydlərindən sultanın onu tutduğu vəzifədən azad etmədiyi məlum olur.

müdafiə edərək bəraət qazanmışdı. Üstəlik sultan Zahir Seyfəddin Bərququn (1382-1389/1390-1399) hakimiyyətinin sonuna qədər bu vəzifədə qalmışdı. Alim h. 14 ramazan 807-ci ildə (16 mart 1405) Qahirədə vəfat etmişdi[1290]. Aşağıda onun yaşadıqları dövrün tanınmış alimlərindən olmuş övladları haqqında da bəhs edəcəyik.

### Tacəddin Əhməd ibn Übeydullah ibn Əvəz ibn Muhəmməd Şirvani

Hənəfi məzhəbinə mənsub fəqih idi. H. 791-ci ilin səfər ayında (fevral 1389) anadan olmuşdu. Qahirədə İbn Übeydullah adı ilə tanınmışdı. Misir Məmlüklü dövlətində xidmət edən əmirlər arasında onun dərs verdiyi çox sayıda şəxs var idi. O, dini dərsləri türkcə verirdi[1291]. Ehtimal ki, bunun səbəbi Misir Məmlüklü dövlətində xidmət edən məmurların əksəriyyətinin mənşəcə türk olması olmuşdur. Yəni İbn Übeydullahın dərslərini daha asan anladıqları üçün məmlük məmurlar onun dərslərinə rəğbət göstərmişdilər. İbn Übeydullah bir müddət Misir şəhərlərindən birində hakim köməkçisi işləmişdi. Daha sonra Qahirədəki Şeyxuniyyə mədrəsəsində fiqh dərsləri verməyə davam etmişdi. İbn Übeydullah bağırsaq infeksiyası xəstəliyinə mübtəla olmuş və bu xəstəliyinin ağırlaşması səbəbiylə h. 13 ramazan 844-cü ildə (5 fevral 1441) vəfat etmişdi[1292].

### Əbdürrəhman ibn Übeydullah ibn Əvəz ibn Muhəmməd Şirvani

Hənəfi məzhəbinə mənsub fəqih idi. Əllamə Müzəffərəddin Əhməd ibnü's-Saatinin (öl. 1295) tələbəsi olmuş, onun yanında Qur'ani-Kərimi əzbərləyib hafiz olmuşdu. Atasının vəfatından sonra Qahirədəki Əbubəkriyyə və Aytmışiyyə[1293] mədrəsələrinin müdərrisi olmuşdu. 811-ci ildə (1408) vəfat etmişdi[1294].

### Əbdüllətif ibn Übeydullah ibn Əvəz ibn Muhəmməd Şirvani

---

[1290] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 491-492; MƏQRİZİ, Süluk, C. III, s. 72.
[1291] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. I, s. 240.
[1292] *Yenə orada.*
[1293] "Ayıtmışiyyə" mədrəsəsi Məmluklü ordusundakı türk mənşəli hərbiçilərdən əmir Seyfəddin Ayıtmış ən-Nasiri tərəfindən 1383-cü ildə inşa etdirilmişdi. Əmir Seyfəddin Ayıtmış bir müddət Misir Məmlüklü dövlətinin Şam vilayətində səltənət naibi olmuşdu.
[1294] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. I, s. 248.

Hənəfi məzhəbinə mənsub fəqih və mütəkəllim idi. İmam Nəsəfinin[1295] müəllifi olduğu "Kənzü'd-Dəqaiq", "Mənarü'l-Ənvar" və "Ümdətü'l-Əqaid" adlı əsərləri əzbər bilirdi. Misir Məmlüklü dövlətində bir müddət haciblik vəzifəsini icra etmişdi. Əsasən tədrislə məşğul olmuşdu. H. 845-ci ildə (1442) vəfat etmişdi[1296].

**Muhəmməd ibn Übeydullah ibn Əvəz ibn Muhəmməd Şirvani**

Atası Tacəddin Übeydullah və qardaşı Əbdürrəhman Şirvanidən dərs almışdı. Ümmu's-Sultan mədrəsəsində dərs vermişdi. Qardaşı Əbdürrəhman Şirvaninin vəfatından (1408) sonra Əbubəkriyyə və Ayıtmışiyyə mədrəsələrinin də müdərrisi olmuşdu. H. 819-cu ildə (1416) vəfat etmişdi[1297].

**Mahmud ibn Übeydullah ibn Əvəz ibn Muhəmməd Şirvani**

H. 794-cü ilin rəcəb ayında (iyun 1392) Qahirədə anadan olmuşdu. Uşaq yaşlarında Qur'ani-Kərimi əzbərləyib hafiz olmuş və atası Ümmü's-Sultan mədrəsəsində müdərris ikən oradakı dərslərdə iştirak etmişdi. Yeniyetməlik yaşlarında "əl-Muxtar"ı[1298] və Əxsıkətinin "Üsul"unu[1299] əzbərləmişdi. Bir müddət şeyx Şihabəddin ibn Xasın tələbəsi olmuşdu. Şeyx Cəlaləddin Nəsrullah Bağdadi, şeyx Seyfəddin əs-Seyrami, Kəmaləddin Ömər İbnü'l-Adim (öl. 1262), İzzəddin ibn Cəmaə əl-Kinani kimi alimlərin fiqh və fiqh üsuluna dair qələmə aldıqları əsərləri mütaliə etmişdi. Mahmud ibn Übeydullah Şirvani qaziköməkçisi vəzifəsinə təyin olunmuş və bir müddət bu vəzifəni icra etmişdi. O, Ümmü's-Sultan, Əbubəkriyyə, Ayıtmışiyyə, Mahmudiyyə, əl-Əzhər, Əlcihiyyə, Sürqatmışiyyə mədrəsələrində dərs vermişdi. Bir neçə dəfə həcc ziyarətinə getmiş və Məkkədə mücavir olaraq qalmışdı. Misir Məmlüklü sultanı Zahir Seyfəddin Çaxmaqın (1438-1453) hakimiyyəti dövründə Dəməşq şəhəri qaziliyinə təyin olunmuşdu. Misir və

---

[1295] İmam Hafizəddin Əbü'l-Bərəkat Abdullah ibn Əhməd ən-Nəsəfi (öl. 1310) hənəfi məzhəbinin məşhur alimlərindən fəqih, müfəssir və kəlam alimi idi. "Kənzü'd-Dəqaiq" fiqhə, "Mənarü'l-Ənvar" fiqh üsuluna və "Ümdətü'l-Əqaid" isə alimin kəlam elminə dair qələmə aldığı əsərlərdir.

[1296] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 412.

[1297] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. IV, s. 152.

[1298] Abdullah ibn Mahmud ibn Məvdud əl-Məvsili tərəfindən qələmə alınmış "əl-İxtiyar li-Təlili'l-Muxtar" adlı əsər İmam Əbu Hənifənin (699-767) fiqhə dair fikir və fətvalarını ehtiva edir.

[1299] Hüsaməddin Əbü'l-Vəfa Muhmməd ibn Muhəmməd əl-Əxsıkəti (öl. 1246) əslən Özbəkistanın Fərqanə vilayətinin Əxsıkət qəsəbəsindən olub hənəfi məzhəbinə mənub tanınmış alim idi. "Üsuli'l-Məzhəb ələ'l-Müntəxəb" alimin fiqh üsuluna dair qələmə aldığı əsərdir.

Şam diyarının Qüds, Hələb və Dimyat şəhərlərini gəzmişdi. Əmir Yaşbəklə tanış olmuş və onun yaxın adamlarından birinə çevrilmişdi. Mahmud ibn Übeydullah Şirvani h. 14 şaban 875-ci ildə (5 fevral 1471) vəfat etmişdi[1300].

**Şeyx Əhməd ibn Muhəmməd ibn Əli ibn İbrahim Şirvani**

1200-cü ilin ramazan ayında (1786) Yəməndə anadan olmuşdu. Şafi'i məzhəbinə mənsub fəqih idi. Bundan başqa münşəat, ədəbiyyat və şe'r sənətində yaşadığı dövrün tanınmış alimlərindən idi. Şafi'i fiqhini öz atasından, şeyx Əli ibn Yəhya əl-Əfif Yəməni və seyyid Zeynəlabidin ibnü'l-Ələvi əl-Mədənidən, ədəbiyyat və münşat sənətini şeyx Həsən ibn İsa Nəcəfi, Bəhaəddin ibn Muhsin Amulidən öyrənmişdi. Daha sonra Yəməndən Hindistana getmişdi. Kəlküttə şəhərində mövlana Heydər Əli ət-Təvəkkinin yanında məntiqə dair "Şərhü'ş-Şəmsiyyə" və hədis üsuluna dair "Şərhü'l-Nüxbəti'l-Fikr" adlı kitabları oxumuşdu. Təhsilini başa vurandan sonra bir müddət Kəlkütdədə yaşamışdı. Burada sultan Qaziyəddin Heydəri mədh edən "Mənaqibü'l-Heydəriyyə" adlı əsərini qələmə almışdı. "Şəmsü'l-İqbal" adlı əsərini isə Cahangir Muləmməd xana (1712-1713) ithaf etmişdi. Şeyx Əhməd Şirvani Hindistanın demək olar ki, bütün iri şəhərlərinə səyalət etmişdi. Alim "Tuhfətü'l-Yəmən", "Ucbü'l-Əcaib", "Hədiqətü'l-Əfrah", "Mənahicü'l-Bəyan", "əş-Şafi fi Əruz və'l-Qəvafi", "Bəhrü'n-Nəfais", "Cəvarisü't-Təfrih" və "Cəvhərü'l-Vuqad fi şərh Banət Səad" adlı əsərlərin müəllifidir. Alim h. 1253-cü ildə (1837) vəfat etmişdir[1301].

**Əllamə Şəmsəddin Muhəmməd Şirvani**

Mütəkəllim idi. Qahirədə yaşamış, burada tədris və elmi fəaliyyətlə məşğul olmuşdu. H. 847-ci ildə (1443) vəfat etmişdi[1302].

**Mövlana Əbdülkərim Şirvani**

---

[1300] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. V, s. 68.
[1301] HÜSEYNİ, *Nüzhətü'l-Xəvatir*, s. 903-904; BAĞDADLI, *İzahü'l-Məknun*, C. I, s. 190; C. II, s. 431.
[1302] SÜYUTİ,*Hüsnü'l-Mühazirə*, s. 299.

Hənəfi məzhəbinə mənsub fiqh və kəlam alimi idi. Sultan Qiyasəddin Tuğluq şahın hakimiyyəti illərində (1321-1325) Dehlidə təhsil almışdı. Dərin biliyi və alicənablığı ilə tanınan Əbdülkərim Şirvaninin tələbələri arasından məşhur alimlər yetişmişdi. Bunlardan biri şeyx Nəsirəddin Mahmud ibn Yəhya Dehləvidir. O, Mövlana Əbdülkərim Şirvaninin yanında Bəzdəvinin[1303] fiqh və fiqh üsuluna aid "Şərhü'l-Hidayə" adlı əsərini oxumuşdu[1304]. Mövlana Əbdülkərim Şirvani "Nüqul fi Məsaili'l-Fiqhiyyə"[1305] və "Xüsasətü'l-Məsail" əsərlərin müəllifidir[1306]. Ölüm tarixi məlum deyil. XIV əsrdə yaşamışdır

**Mövlana Muhyəddin Muhəmməd ibn Musa Talışi**

Hənəfi məzhəbinə mənsub fəqih, astronom və kəlam alimi idi. 1440-cı ildə Azərbaycanda anadan olmuş, İstanbulda yaşamış və XVI əsrin birinci rübündə orada vəfat etmişdi. Muhyəddin Talışi kəlam elminə dair bir sıra əsərin müəllifi idi. "Haşiyə ələ Şərhu İsağuci li'l-Hüsaməddin əl-Kati"[1307], "Şərhu Təvaliü'l-Ənvar min Mətalii'l-Ənzar", "Şərhu Hikmətü'l-Əyn li'l-Katibi"[1308], "Risalə fi Bəyani-Ruyəti's-Subhi'l-Kəzibi Qəblə'l-Fəcr", "Risalətü'l-Ünsüriyyə" Muhyəddin Talışinin qələmindən çıxmış əsərlərdir. Bu əsərlərin nüsxələri Paris Milli kitabxanası, İstanbul Köprülü əlyazma əsərlər kitabxanası, Nuriosmaniyyə kitabxanası, Konya BYEK, Çorum Həsən paşa İHK, Ankara Milli kitabxanada saxlanılır. "Şərhu Təvaliü'l-Ənvar min Mətalii'l-Ənzar"ın Türkiyə Manisa İHK-ndəki nüsxəsi 1499-cu ildə müəllifin öz dəsti-xətti ilə qələmə alınmışdır.

Alimin "Haşiyə ələ Şərhu İsağuci" adlı əsərinin dünyanın bir sıra kitabxanalarında yüzlərlə əlyazma nüsxəsi saxlanılır. Sadəcə AMEA Əİ Fondunda bu əsərin 107 nüsxəsi

---

1303 Fəxrü'l-İslam ləqəbi ilə şöhrət tapmış Əli ibn Muhəmməd Bəzdəvi 1009-1089-cu illərdə yaşamış iranlı hənəfi alimlərindəndir.

1304 HÜSEYNİ, *Nüzhətü'l-Xəvatir*, s. 171.

1305 Akad. Ziya Bünyadov Əbdülkərim Şirvani adlı azərbaycanlı alimin "Nüqul fi Məsaili'l-Fiqhiyyə" adlı əsərinin Misir Milli kitabxanasında saxlanıldığını təsbit etmişdir. Əsər 2475/12 sayılı farsca məcmuənin 82-93-cü vərəqlərini ehtiva edir. Fikrimizcə bu şəxs haqqında danışdığımız mövlana Əbdülkərim Şirvanidən başqası deyildir. Bax: Ziya BÜNYADOV, "Soçineniya Azerbaydjanskix Persoyazıçnıx Avtorov v Natsionalnoy Biblioteke Yeqipta", *İzbrannıye Soçineniya*, C. III, s. 184.

1306 BAĞDADLI, *İzahü'l-Məknun*, C. I, s. 216.

1307 ŞƏRİFOV, *Əbdülqəni Əfəndi...*, s. 131-132; DE SLANE, *həmin əsər*, s. 238, 413.

1308 KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 845. "Hikmətü'l-Əyn"-Əllamə Nəcməddin Əbü'l-Həsən Əli əl-Katibi Qəzvininin (öl. 1276) kəlam elmi sahəsində qələmə aldığı əsərdir.

mövcuddur. Bu da onu göstərir ki, əsər uzun müddət mədrəsələrdən dərs vəsaiti kimi istifadə olunmuşdur. Muhyəddin Talışi bu haşiyəni Hüsaməddin Həsən əl-Katinin (öl. 1358) XIII əsrdə yaşamış azərbaycanlı alim Əsirəddin Əbhərinin məntiq elminə dair "İsağuci" adlı əsəninə yazdığı şərhə yazmışdır[1309].

**Həsən ibn Hüseyn Talışi**

XVI əsrdə Osmanlı imperatorluğunda yaşamış fəqih və ədib idi. "Qəsidətü'l-Bürdə"yə ərəbcə şərh yazmışdır[1310]. Bu şərhin nüsxələrindən biri Ankara Milli kitabxanada saxlanılır. Həsən Talışi 1557-ci ildə vəfat etmşidir.

**Əhməd Talışi**

Osmanlı imperatorluğunda yaşamış hənəfi məzhəbinə mənsub fəqih və mütəkəllim idi. "Tə'liqat Haşiyə ələ't-Təcrid" Əhməd Talışinin qələmindən çıxmış əsərdir. Bu şərhin nüsxələrindən biri Konya Yusifağa kitabxanasında saxlanılır. Əhməd Talışinin ölüm tarixini və ya yaşadığı dövrü müəyyənləşdirmək mümkün olmamışdır.

**Hüsaməddin Hüseyn ibn Həsən ibn Hamid Təbrizi**

Hənəfi məzhəbinə mənsub fəqih idi. Mömin, fəzilət sahibi, saleh insan olmaqla yanaşı daim araşdıran, tədqiq edən alim idi. Hüsaməddin Hüseyn Təbrizi gözəl nitq qabiliyyətinə malik idi. Osmanlı sultanı Fateh II Mehmedin (1451-1481) hakimiyyəti dövründə İstanbulda yaşamış və Səmaniyyə mədrəsəsidə dərs vermişdi. O, sultanla birlikdə bir neçə hərbi səfərdə də iştirak etmişdi. Sultan Fateh II Mehmed Hüsaməddin Hüseyn Təbriziyə böyük ehtiram bəsləyirdi. Hüsaməddin Hüseyn Təbrizi huşsuzluq xəstəliyinə tutulmuşdu. Hətta mədrəsədə tez-tez dərs verəcəyi hücrələri səhv salır və tələbələrin xəbərdar etməsindən sonra səhv gəldiyini anlayırdı. Buna baxmayaraq o, yaşadığı dövrün böyük alimlərindən biri olmuşdur. Vaxtının çoxunu mütailə etməklə

---

[1309] ŞƏRİFOV, *həmin əsər*, s. 131-132, 248.

[1310] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. II, s. 422. Belə bir rəvayət var ki, şair Kə'b ibn Züheyr İslamı qəbul edəndən sonra Muhəmməd peyğəmbərlə (ﷺ) görüşmüş və bu görüş vaxtı onun şanına qəsidə demişdi. Peyğəmbər (ﷺ) də hədiyyə olaraq Kə'b ibn Züheyrə öz bürdəsini (üst geyim, xələt) vermişdi. Həmin qəsidə "Qəsideyi-Bürdə" adı ilə məşhur olmuşdu.

və müxtəlif məsələlərə dair risalələr yazmaqla keçirirdi[1311]. Ölüm tarixi məlum deyil. XV əsrdə yaşmışdır.

**Şeyx Kəmaləddin ibn Ömər Təbrizi**

Qari idi. Fəzilət sahibi insan kimi tanınmışdı. Tədqiqatçı alim şeyx Kəmaləddin Təbrizinin əsl peşəsi həkimlik idi. O, tibb və Qur'an tilavəti ilə yanaşı başqa elm sahələrində də mahir idi. Qur'ani-Kərimin qiraət və təcvidini Əbdülməcid ən-Nəssac, Mə'sud əl-Əxlati və qari Əbdüssəməddən öyrənmişdi. Dostu şeyx Əbdülmühin ibn Muhəmməd Təbrizi də onun yanında Qur'an qiraətini öyrənmişdi[1312]. Ölüm tarixi məlum deyil. XIV əsrdə yaşamışdır.

**Mövlana Şəmsəddin Muhəmməd əl-Hənəfi Təbrizi**

Şeybanilər dövlətində yaşamış hənəfi məzhəbinə mənsub fəqih və mütəkəllim idi. Əzudəddin əl-İcinin "Adabü'l-Bəhs" adlı əsərinə şərh yazmışdı[1313]. Bu şərh "Risalətü'l-Hənəfiyyə ələ Adabü'l-Əzudiyyə" adı ilə məşhur olmuşdu. Bu şərhin nüsxələrindən biri Türkiyədə, Balıkəsir İHK-də saxlanılır. Eyni əsərin "Şərhü'l-Adabü'l-Əzudiyyə" adlı nüsxəsi İstanbulda Köprülü əlyazma əsərlər kitabxanasında saxlanılır. Ümuniyyətlə Türkiyənin əlyazma əsər kitabxanalarında bu əsərin ondan çox nüsxəsi saxlanmaqdadır. Bunların əksəriyyəti Ankara Milli kitabxanasındadır. Həmçinin Paris milli kitabxanasında da "Şərhü'l-Adabü'l-Əzudiyyə"nin bir nüsxəsi mövcuddur[1314]. Alimin kəlam sahəsində qələmə aldığı əsərlərdən biri də Cəlaləddin Dəvvaninin "Risalə fi İsbati'l-Vacib"inə yazdığı haşiyədir. "Haşiyə ələ Risalə fi İsbati'l-Vacibü"in nüsxələrindən biri Türkiyə Kastamonu İHK-də saxlanılır. Alimin məntiqə dair "Risalətü'l-Hüseyniyyə fi Fənni'l-Adab" adlı əsərinin nüsxələrindən biri Ankara Milli kitabxanada saxlanılır. Alim təqribən h. 900-cü ildə (1494) vəfat etmişdi[1315].

---

[1311] Təqiyəddin ibn Əbdülqadir əl-Qəzzi ət-TƏMİMİ, *Təbəqatü's-Səniyyə fi Təracimü'l-Hənəfiyyə*, (Nşr. Ə. Muhəmməd), s. 531-532, Riyad 1989.
[1312] İBNü'l-CƏZƏRİ, *Qayətü'n-Nihayə*, s. 533.
[1313] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 97; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 349.
[1314] DE SLANE, *həmin əsər*, s. 174.
[1315] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 97.

**Cübeyr ibn Hüseyn ibn Muhəmməd Təbrizi**

Mühəddis idi. H. 632-ci ildə (1235) Hələbdə anadan olmuşdu. Suriyadan Misirə getmiş, bir müddət Qahirədə qalandan sonra İsgəndəriyyəyə gedərək orada hədis dərsləri vermişdi. H. 12 rəbiəlaxir 703-cü ildə (22 noyabr 1303) İsgəndəriyyədə vəfat etmişdi[1316].

**Şeyx Əbu Səid Mahmud ibn Əyyub ibn Mahmud Təbrizi**

Təsəvvüf əhlinə mənsub qari idi və yaşadığı Mardin şəhərində zahid və abid insan kimi tanınmışdı. Məs'ud ibn Əhməd əl-Əxlatinin tələbəsi olmuş, Qur'ani-Kərimin qiraət və təcvidini ondan öyrənmişdi. Səid ibn Yusif ibn Səid əl-Əxlati də qiraət və təcvidin incəliklərini ondan öyrənmişdi. Şeyş Əbu Səid Təbrizi h. 792-ci ilin zilhiccə ayında (noyabr 1390) Mardində vəfat etmişdi[1317].

**Şeyx Haşim Təbrizi**

Qari idi. Təbrizdə Məs'ud ibn Əhməd əl-Əxlatinin tələbəsi olmuş və Qur'ani-Kərimin qiraət və təcvidini ondan öyrənmişdi. Təbrizdə təhsilini tamamladıqdan sonra Bağdadda yaşamış və bu şəhərin məşhur qarilərindən biri olmuşdu. H. 709-cu ildə (1309) Bağdadı tərk edərək Dəməşqə getmiş və vəfatına qədər burada yaşamışdı[1318]. Ölüm tarixi məlum deyil. XIII-XIV əsrlərdə yaşamışdı.

**Əbdüləziz ibn Osman ibn Yusif ibn Məcd Təbrizi**

Mühəddis və hafiz idi. İmam Buxari və imam Müslimin "Səhih", imam Əbu Hənifənin (/) və imam Əhməd ibn Hənbəlin (/) "Müsnəd" adlı hədis külliyatlarını, Zəməxşərinin "Kəşşaf" adlı Qur'an təfsirini əzbər bildiyi deyilirdi. Bir müddət Dəməşqdə əl-Əməvi camesində tədrislə məşğul olmuş, daha sonra Misirə getmişdi[1319]. Ölüm tarixi məlum deyil. XIV əsrdə yaşamışdır.

---

1316 İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, c.1, s. 261.
1317 İBNü'l-CƏZƏRİ, *Qayətü'n-Nihayə*, s. 735.
1318 İBNü'l-CƏZƏRİ, *Qayətü'n-Nihayə*, s. 784.
1319 İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 24.

**Əbü'l-Vəqt Əbdülməlik ibn Əli ibn Əli ibn Mübarəkşah ibn Əbu Bəkr əl-Bəkri əs-Siddiqi Təbrizi**

I raşid xəlifə Əbu Bəkrin (ʳ) nəslindən olan Əbü'l-Vəqt Əbdülməlik Təbrizi Ağqoyunluların hakimiyyəti illərində Azərbaycanda yaşamış tanınmış şafi'i fəqihi, əxlaq nəzəriyyəçisi və təsəvvüf şeyxi idi. O, "Hədiyyətü'l-Mühibbin fi'l-Əxbar və'l-Ədi'yyə və'l-Əzkar", "Dürərü'l-Mə'ani", "Həblü'l-Mütəyyin fi'l-Əzkar" adlı əsərlərin müəllifi idi. Alim h. 896-cı ildə (1491) vəfat etmişdi[1320].

**Əbü'l-Həsən Əli ibn İbrahim ibn Əli Təbrizi**

Ədib və şafi'i məzhəbinə mənsub mühəddis idi. H. 371-ci (981) ildə anadan olmuş Əbü'l-Həsən Əli Təbrizi bir çox ölkələrə səyahət etmişdi. Ərəb dili və ədəbiyyatı sahəsində öz dövrünün görkəmli alimlərindən biri idi. Əndəlüsə getmiş və bu ölkənin tanınmış alimlərindən dərs almışdı. Gözəl xəttlə malik olan Əbü'l-Həsən Əli Təbrizi həmçinin siqa ravi kimi tanınmışdı[1321]. Ölüm tarixi məlum deyil.

**Xəttat Kəmaləddin Cə'fər Təbrizi**

Ağqoyunlu hökmdarı sultan Baysunqurun (1490-1492) divan katiblərindən biri və saray kitabxanasının müdiri olmuşdu. O, özünün müasirləri arasında nəsxi-təliq xətti ilə ən gözəl yazı yazan xəttat idi. Mövlana Şihabəddin Aşpaz və şeyx Mahmud kimi dövrün mahir xəttatları Kəmaləddin Təbrizinin şagirdi olmuşdular. Kəmaləddin Təbrizi həm də istedadlı şair idi. O, "Cə'fər" təxəllüsü ilə çox gözəl qəsidələr yazırdı[1322]. Ölüm tarixi məlum deyil. XV-XVI əsrlərdə yaşamışdır.

**İsmayıl ibn Muhəmməd Təbrizi**

XIII əsrdə yaşamış azərbaycanlı kəlam alimi və mütəfəkkir idi. İsmayıl Təbrizi Luristan Atabəylərindən[1323] I Yusufşahın (1274-1288) sarayında yaşamış alimlərdən biri idi. O, I Yusifşahın himayəsində elmi fəaliyyətlə məşğul olmuşdu. İsmayıl Təbrizi farsca qələmə

---

[1320] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 319.
[1321] QIFTİ, *İnbahu'r-Ruvat*, C. II, s. 221.
[1322] NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 341.
[1323] Bu sülalə həmçinin "Fəzləvilər" və "Hezarəsblər" kimi də tanınmışdırlar. İranın Luristan bölgəsində (İsfəhanın qərbi, İran körfəzinin şimalı, indiki Xürrəmabad şəhəri və ətrafı) 1148-1424-cü illərdə hakimiyyətdə olmuşdurlar.

aldığı "Hüyutü'n-Nəfs", "Risaleyi-Nəsiriyyə" kimi kəlam elminə dair əsərlərin müəllifi idi[1324].

**Təbib Əli ibn Əhməd ibn Habil Təbrizi**

XII-XIII əsrlərdə Bağdadda yaşamış azərbaycanlı həkim idi. Həyatı haqqında ətraflı məlumat mövcud deyil. Təbib Əli Təbrizi tibb sahəsində "əl-Muxtar fi'l-Muncid" adlı əsərin müəllifi idi. Alim h. 610-cu ildə (1213) vəfat etmişdir[1325].

**Əminəddin Muhəmməd ibn Əhməd ibn Şəhriyar ibn Muhəmməd ibn Əbdüləziz Təbrizi**

Qari idi. Qur'ani-Kərimin qiraət və təcvidini Əbdülməcid ibn Bəyaz Təbrizidən və Məs'ud ibn Əhməd əl-Əxlatinin tələbələrindən olan Əlişah Mərəndidən öyrənmişdi. O, Anadoluya səfər edərək Antakiyaya getmiş, bir müddət burada qaldıqdan sonra Şam diyarına səyahət etmişdi. Şam diyarında bir müddət qarilik etdikdən sonra yenidən Anadoluya getmiş və Larəndə[1326] şəhərində Qur'ani-Kərim tilavəti ilə məşğul olmuşdu[1327]. Ölüm tarixi məlum deyil. XIV-XV əsrlərdə yaşamışdır.

**Hafiz Bədrəddin Əbü'l-Xeyr Bədəl ibn Əbu Müəmmər ibn İsmayıl ibn Əbu Nəsr Təbrizi**

Siqa mühəddis idi. Təvəllüd tarixi h. 550-ci (1155-1165) illərə təsadüf edir. Əbu Səd ibn Əbu Əsrun, Əhməd ibnü'l-Məvazini, Yəhya əl-Səqəfi, İlyas ibn Hamid ibn Mahmud ibn Əbu Hucr əl-Hərrani, Bəhaəddin ibn Əsakirdən hədis dinləmişdi. İsfəhanda Əbu'l-Məkarim əl-Ləban və Muhəmməd ibn Əbu Zeyd əl-Kərranidən, Nişapurda Əbu Səd əs-Səffardan, Misirdə əl-Buseyridən hədis dinləmişdir. Əl-Qövsi, Muhyəddin ibnü's-Sərraqə, Məcdəddin ibnü'l-Ədim, Cəmaləddin əş-Şureyşi, Mahmud ibn Übeydullah ibn Əhməd Zəncani ondan hədis dinləmişdilər. O, Ərbildəki Daru'l-Hədisin baş

---

[1324] NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 150.
[1325] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 400.
[1326] Larəndə-Türkiyənin indiki Qaraman şəhəri. Qari Muhəmməd Təbrizinin yaşadığı dövrdə bu şəhər Qaramanoğulları dövlətin məxsus idi.
[1327] İBNü'l-CƏZƏRİ, *Qayətü'n-Nihayə*, s. 559.

müdərrisliyinə təyin edilmişdi. Moğolların Ərbili işğalından bir müddət əvvəl buradan Hələbə getmişdi. O, hədis elminə dair bir sıra əsərlərin müəllifidir. Bunlardan biri də alimin h. 601-ci ildə (1205) qələmə aldığı "əl-Ərbəin" adlı əsərdir. Hafiz Bədrəddin Bədəl Təbrizi h. 636-cı ilin cəmadiələvvəl ayında (dekabr 1238) Hələbdə vəfat etmişdir[1328].

**Xətib Əbu Zəkəriyyə Yəhya ibn Əli ibn Muhəmməd ibn Həsən ibn Bəstam əş-Şeybani Təbrizi**

Xətib Təbrizi adı ilə şöhrət tapmış Əbu Zəkəriyyə Yəhya Təbrizi şafi'i məzhəbinə mənsub ədib, müfəssir və mühəddis idi. Ərəb dili və ədəbiyyatını Əbü'l-Üla əl-Mə'ərridən (973-1057) öyrənmişdi. Həmçinin dövrün məşhur ədiblərindən Əbü'l-Qasım Fəzl ibn Muhəmməd əl-Bəsri, Əbü'l-Qasım Übeydullah ibn Əli ər-Rəqqi, Əbu Muhəmməd əd-Dəhan əl-Lüğəvinin tələbəsi olmuşdu. Səid ibn Mübarək ibn Əli və Səlim ibn Əyyub ər-Razidən hədis dinləmişdi. Hafiz Xətib əl-Bağdadi və hafiz İbnü'n-Nasir də ondan hədis dinləmişdilər. Bağdadda ərəb ədəbiyyatı üzrə böyük mütəxəssislərdən biri idi. Bağdad Nizamiyyə mədrəsəsində ərəb ədəbiyyatı dərsləri vermişdi. Başda ərəb dili və ədəbiyyatı olmaq üzrə müxtəlif sahələrə dair əsərlərin müəllifi idi. "İ'rabu'l-Qur'ani'l-Əzim", "Şərhü'l-Qəsaid", "Məqatilu'l-Firsan", "əl-Kafi fi İlmu'l-Əruz və'l-Qəvafi", "Şərhu'l-Ləm'ə", "Şərhu'l-Həmasə", "Şərh Divanu'l-Mütənəbbi", "Şərhu'l-Müfəzzəliyyat", "əs-Səb'u't-Tival", "Şərhu'l-Məqsurə", "Şərhu Süqutü'z-Zənd" Əbu Zəkəriyyə Yəhya Təbrizinin qələmindən çıxmış əsərlərdir. Əbu Zəkəriyyə Xətib Təbrizinin müəllifi olduğu əsərlərdən biri də tanınmış ərəb şairi Həbib ibn Əvs ət-Tainin (öl. 846) "Divan"ına yazdığı şərhdir. Bu divan "Divani-Əbu Təmmam" adı ilə məşhur idi[1329]. Paris milli kitabxanasında xətib Əbu Zəkəriyyə Yəhya Təbrizinin "Müləxxəs İ'rabü'l-Quran"[1330], "Şərh Divanu'l-Mütənəbbi"[1331], "Şərhu'l-

---

[1328] HƏNBƏLİ, *Zeyl Təbəqatü'l-Hənabilə*, C. I, s. 317; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. V, s. 539; SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VIII, s. 81; MƏQDİSİ, *Kitabü'l-Müqəffa*, C. II, s. 570; İBN TAĞRIBİRDİ, *Nücumu'z-Zahirə*, C. II, s. 462; KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, 115.
[1329] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 996.
[1330] Özünün müəllifi olduğu "İ'rabu'l-Qur'ani'l-Əzim"in xülasəsidir.
[1331] Bu əsərin adı "Məvzih"dir.

Həmasə", "Şərhü'l-Müəlləqə"[1332], "Şərhu Suqtü'z-Zənd li'l-Mə'ərri"[1333] adlı əsərlərinin əlyazma nüsxələri saxlanılır[1334]. Əbu Mənsur ibn Əhməd əl-Cəvaliqi, Əbü'l-Həsən Səd əl-Ənsari kimi alimlər xətib Əbu Zəkəriyyə Yəhya Təbrizinin tələbəsi olmuşdular. O, h. 502-ci ilin cəmadiəlaxir ayında (yanvar 1109) 81 yaşında vəfat etmişdi. Bağdadda İbriz qəbristanında, şeyxülislam Əbu İshaq Şirazinin məzarının yanında dəfn edilmişdi[1335].

**Əbu Abdullah Muhəmməd ibn Xumartəkin ibn Abdullah Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Onun atası Xumartəkin məşhur ədib, müfəssir və mühəddis Xətib Əbu Zəkəriyyə Yəhya Təbrizinin (öl. 1109) köləsi olmuş, Xətib Təbrizi onun azad etmişdi. Xumartəkin adı bu şəxsin Orta Asiyalı, ehtimal ki, qıpçaq türklərindən, olduğunu düşünməyə əsas verir. Əbu Abdullah Muhəmməd, Xətib Təbrizinin tələbəsi olmuş, onun yanında ərəb dili və ədəbiyyatını öyrənmişdi. Əbü'l-Xəttab əl-Gülvizan və Mübarək əl-Qəssaldan hədis dinləmiş və hədis dərsləri almışdı. Təhsilini başa vurduqdan sonra tədrislə məşğul olmuşdu. Ömər əl-Qurəşi, Əhməd ibn Yəhya ibn Hibətullah, Əhməd əl-Bəndənici, Əbdüllətif ibn Yusif kimi alimlər onun tələbələri arasından yetişmişdilər. Əbu Abdullah Muhəmməd Təbrizi h. 569-cu (1174) ildə vəfat etmişdi. Vəfat edərkən yaşı 80-i ötmüşdü[1336].

**Məcdəddin ibn Muhəmməd əl-Xunəci Təbrizi**

XV əsrdə Misirdə yaşamış əxlaq nəzəriyyəçilərindən və təsəvvüf şeyxlərindən idi. Məcdəddin Təbrizi "Tədibü'n-Nəfs və Təshihü'l-E'tiqad" adlı əsərin müəllifi idi. Ölüm tarixi məlum olmasa da h. 884-cü ildə (1479) həyatda olduğu bilinir[1337].

**Qazi Muhəmməd ibn Əhməd Təbrizi**

---

[1332] Cahiliyyə dövrü ərəb şairi İmrü'l-Qeysin "Müəlləqə"sinə yazılmış şərhdir.

[1333] Əbu Zəkəriyyə Təbrizinin öz ustadı Əbü'l-Üla əl-Mə'ərrinın əsərinə yazdığı şərhdir. Eyni adlı əsər Əbu Yaqub Yusif Xoyi tərəfindən də qələmə alınmışdır, bax: s. ???.

[1334] DE SLANE, *həmin əsər*, s. 139, 549, 550, 576.

[1335] İBNü'l-ƏNBARİ, *Təbəqatü'l-Üdəba*, s. 270-273; YAQUT əl-HƏMƏVİ, *İrşadü'l-Ərib*, s. 1705-1707; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. II, s. 156; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. IV, s.330; YAFİ'İ, *Miratü'l-Cənan*, C. II, s. 210; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XII, s. 328; TAŞKÖPRÜZADƏ, *Mövzuatü'l-Ülum*, C. I, s. 201-202.

[1336] ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'd-Dübeysi*, 26.

[1337] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 15.

XIV əsrdə yaşamış şafi'i məzhəbinə mənsub fəqih və qazilərdən biri idi. Ölüm tarixi bilinmir. Qazilik peşəsi, qazilərin davranış üsul və qaydalarına dair qələmə aldığı "Dəsturü'l-Quzat" adlı əsərini h. 772-ci ildə (1370) yazıb bitirmişdi. Beləcə onun vəfat tarixinin 1370-ci ildən sonraya təsadüf etdiyini təxmin etmək olar[1338].

**İbn Əbü'l-Qasım Hüseyn ibn Muhəmməd Bağır Təbrizi**

Osmanlı dövlətində yaşamış hənəfi məzhəbinə mənsub fəqih və kəlam alimi idi. Həyatı haqqında ətraflı məlumat yoxdur, ölüm tarixi və yaşadığı dövrü müəyyənləşdirmək mümkün olmamışdır. Onun "Tahdidü'l-Müqəddərat", "Tuhfətü'l-Cəlaliyyə" və "Arifü'l-Lətaif" adlı əsərləri Türkiyədə, Amasiya Bəyazid İHK-də saxlanılır.

**Seyyid Şərəfəddin əl-Hüseyni əl-Laləvi Təbrizi**

İmam Hüseynin (ع) nəslindən olan və Mir Şərəf Təbrizi adı ilə tanınan alim hənəfi məzhəbinə mənsub fəqih və tarixçi idi. Osmanlı dövlətində yaşamış Mir Şərəf Təbrizi tarixə dair "Ənfəsü'l-Əxbar fi't-Tarix" adlı əsərin müəllifi idi. O, bu əsərdəki mövzuları 80 başlıq altında qələmə almışdı. Əsər Sasani şahları tarixinin xülasəsi ilə başlayıb raşid xəlifələr, Əməvilər, Abbasilər, Böyük Səlcuqlular, moğol xanları, Teymurilər və Osmanlı sultanlarının tarixi ilə davam etmiş, sultan IV Muradın (1623-1640) hakimiyyəti dövrünün başlanğıcı ilə sona çatmışdı. Mir Şərəf Təbrizi İstanbulun Üsküdar səmtinin qazisi olmuş, bu vəzifədən təqaüdə çıxmışdı. Alim İstanbulda vəfat etmişdi[1339]. Ölüm tarixi məlum deyil. XVI-XVII əsrlərdə yaşamışdır.

**Şeyx Əvhədəddin Əbu Abdullah ibn Sədrəddin Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih və təsəvvüf şeyxi idi. Azərbaycandan Misirə getmiş və Qahirədəki "Səidü's-Süəda" xanəgahında tədrislə məşğul olmuşdu. Şeyx Əvhədəddin Təbrizi təsəvvüf ərbabının ənənəvi geyimi olan sadə yun əba geyinir və vaxtının çoxunu tədris, tədqiqat və ibadətlə keçirirdi. İbn Müləqqin olun bir sıra əsərlərin müəllifi olduğunu qeyd etmiş və vəfatından əvvəl şəxsi kitabxanasını və sahib olduğu

---

[1338] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 54.
[1339] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 268.

az miqdarda əmlakı vəqf etdiyini yazmışdır. Şeyx Əvhədəddin Təbrizi h. 2 şəvval 787-ci ildə (6 noyabr 1385) Qahirədə vəfat etmiş və Sufiyyə qəbristanında dəfn edilmişdi[1340].

**Şeyx Nəcməddin Əbu Bəkr Muhəmməd ibn Məvdud əz-Zahiri Təbrizi**

XII əsrdə yaşamış azərbaycanlı fütuvvət şeyxi idi. O, Təbrizdə Nəcməddin Zərkub adı ilə tanınmışdı. Bu da onun peşəsinin zərgərlik olduğunu göstərir. H. 640-cı (1242) ildə kubrəviyyə şeyxi Sə'dəddin Muhəmməd ibnü'l-Müəyyəd əl-Həmmuyə Cüveyninin (öl. 1252) Təbrizə gəlməsi ilə Nəcməddin Təbrizinin həyatı dəyişmişdi. O, şeyx Sə'dəddin Həmmuyəyə intisab etmiş, onun müridlərindən biri olmuşdu. Şeyx Nəcməddin Zərkub Təbrizi h. 712-ci (1312) ildə vəfat etmiş, Təbrizin Kəcil qəbristanında dəfn edilmişdi. Şeyx Nəcməddin Təbrizi farsca "Risalə dər Bəyani-Fütuvvət" adlı əsərin müəllifi idi. O, həm də farsca sufiyanə şerlərin müəllifi idi[1341].

**Qazi Əbdüssəməd ibn Bəyaz Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih və qari idi. Xüsusən Qur'ani-Kərimin qiraəti və təcvidi sahəsində ixtisaslaşmışdı. Bu səhədə "Müxtəsərü'ş-Şatibiyyə"[1342] adlı əsər qələmə almış və bu əsəri "Müxtəsəri-Təbrizi" adı ilə məşhur olmuşdu. Qazi Əbdüssəməd Təbriz şəhərinin şeyxi idi. O, Məs'ud ibn Əhməd əl-Əxlatinin tələbəsi olmuş, qiraət və təcvid elmini ondan öyrənmişdi. Təbrizdə təhsilini tamamlayandan sonra Əbdüssəməd Təbrizi Dəməşqə getmişdi. Şam diyarının alimlərindən dərs almış və ölkəsinə qayıtmışdı. Təbrizdə çox sayıda insan ondan Qur'an təcvidi və qiraət qaydalarını öyrənmişdi. O, cümlədən oğlu Muhəmməd Təbrizi, Qəvaməddin Həmdani, Əbdürrəhman ət-Təbib ondan qiraət qaydalarını öyrənmişdilər. Qazi Əbdüssəməd Təbrizi imam Şatibinin əsərini ixtisar edərək nizamlamış və daha asan anlaşılan formaya salmışdı. Onun bu müxtəsəri 520 sətir idi. Bu əsər uzun illər qiraət və təcvid sahəsində dərslik kimi istifadə edilmişdi. İbnü'l-Cəzəri onun gözəl əxlaqlı, xoş davranışlı, son dərəcə dindar və təqvalı insan olduğunu, qazilik vəzifəsini icra edərkən

---

[1340] Siracəddin Ömər ibn Əli İBN MÜLQİN, *Təbəqatü'l-Əvliya*, s. 277, www.balligho.com.
[1341] NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 177.
[1342] İmam Əbu Muhəmməd Qasım ibn Firrə Şatibinin (1143-1194) "Şatibiyyə" adlı əsəri uzun illər boyu mədrəsələrdə və məktəblərdə Qur'an təcvidi və qiraəti sahəsində dərslik kimi istifadə olunmuşdur.

heç bir məmurun və əmirin iltimasını dinləmədiyni qeyd etmişdir. Hətta Cəlairi hökmdarı Şeyx Üveys belə onunla ziddləşməyə cəsarət etməzdi. Alim h. 765-ci ildə (1364) Təbrizdə vəfat etmişdi[1343].

**Əbü'l-Kərəm Əbdülqafur ibn Bədəl ibn Həmzə əş-Şüruti Təbrizi**

Azərbaycan Atabəyləri dövündə (1136-1225) yaşamış tanınmış mühəddislərdən idi. H. 545-ci ilin rəbiələvvəl ayında (iyul 1150) Təbrizdə dünyaya gəlmişdi. Əllamə Əbu Mənsur Muhəmməd ibn Əsəd əş-Şafi'i ət-Tusinin tələbəsi olmuş, h. 569-cu ilini ramazan ayında (aprel 1174) ondan "Şərhü's-Sünnə"ni[1344] dinləyib bitirmişdi. Əbü'l-Kərəm Əbdülqafur Təbrizi h. 619-cu ildə (1222) həcc ziyarəti üçün Hicaza getmişdi. Əbu Bəkr Muhəmməd Bağdadi öz əsərində Ərbildə Əbü'l-Kərəm Əbdülqafur Təbrizinin dərslərində iştirak etdiyini və ondan hədis dinlədiyini qeyd etmişdir[1345]. Lakin müəllif alimin ölüm tarixini yazmamışdır. Ehtimal ki, Əbu Bəkr Bağdadi bu məlumatları qeyd edərkən Əbü'l-Kərəm Təbrizi hələ həyatda idi.

**Əbü'l-Fəth Muhəmməd ibn Davud ibn Yusif Təbrizi**

Şafi'i məzhəbinə mənsub mühəddis idi. Məşhur mühəddis Əbu Muhəmməd Hüseyn Bəğəvinin (öl. 1122) "Məsabihü's-Sünnə" adlı əsərinə yazdığı "Şərhü'l-Müşkilati'l-Məsabih" adlı şərhi h. 680-ci ildə (1281) yazıb başa çatdırmışdı[1346]. Deməli ölüm tarixi 1281-ci ildən sonraya təsadüf edir.

**Muhəmməd Rəcəb Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih və mütəkəllim idi. Muhəmməd Rəcəb Təbrizi "Nəfhü'l-Məsk fi Şərhu Tətimməti's-Səlk" adlı əsərin müəllifi idi. Ölüm tarixi h. 909-cu ildən (1503) sonraya təsadüf edir[1347].

---

[1343] İBNü'l-CƏZƏRİ, *Qayətü'n-Nihayə*, s. 322.

[1344] Muhyəddin Hüseyn Bəğəvinin (öl. 1122) çoxcildli hədis külliyatı. Əbu Bəkr Muhəmməd Bağdadi bu qədər dəqiq məlumat verdiyinə görə ehtimal ki, "Şərhü's-Sünnə"nin həmin nüsxəsini, yəni əllamə Əbu Mənsur Tusinin tələbəsi Əbü'l-Kərəm Təbriziyə oxuduğu nüsxəsini görmüşdü. Çünki əlyazma əsərlərin ilk səhifələrində qiraət və səmə' qeydəlir olur. Yəni həmin nüsxənin nə vaxt kim tərəfindən oxunduğu və dinləndiyi mədrəsələrdə qeyd olunurdu.

[1345] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 254.

[1346] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 285.

[1347] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 291.

**Cəmaləddin Muhəmməd ibn Muhəmməd ibn Muhəmməd əl-Aqsarayi Təbrizi**

Filoloq, ədib və həkim idi. Cəmaləddin Muhəmməd Təbrizi öz dövrünün tanınmış alimlərdən biri idi. O, ərəb filologiyasına dair "Kəşfü'l-İ'rab fi Şərhü'l-Lübab" adlı əsərin müəllifi idi. Katib Çələbi və ona istinadən Ömər Rza alimin h. 740-cı ildə (1339) həyatda olduğunu yazmışdırlar[1348]. Katib Çələbinin qeydinə görə alim adı çəkilən əsərini həmin ildə Şirazda yazıb başa çatdırmışdır[1349]. Buradan Cəmaləddin Təbrizinin XIV əsrdə yaşadığını təxmin etmək olar. "Kəşfü'l-İ'rab fi Şərhü'l-Lübab"ın Türkiyədəki yeganə nüsxəsi Konya şəhərində, Yusifağa kitabxanasında saxlanılır. Bu nüsxənin üzü h. 759-cu ildə (1359) katib Yusif ibn Hüseyn Ağşəhri tərəfindən köçürülmüşdür. Bundan başqa alim "Haşiyə ələ Şərhu Məcməi'l-Bəhreyn", "Haşiyə ələ'l-Kəşşaf ", "İzahü'l-İzah", "Həllü'l-Mu'cəz" kimi əsərlərin müəllifi idi. "Haşiyə ələ Şərhu Məcməi'l-Bəhreyn" əllamə Müzəffərəddin Əhməd ibnü's-Saati Bağdadinin (öl. 1295) hənəfi fiqhinə dair "Məcməi'l-Bəhreyn və Mültəqəi'n-Nəhreyn" adlı əsərinə yazılmış bir şərhə haşiyə idi. Bu haşiyənin Paris milli kitabxanasında[1350] və Türkiyədə Manisa İHK-də əlyazma nüsxələri var. Manisadakı kitabxanada Cəmaləddin Muhəmməd Təbrizinin Carullah Zəməxşərinin müllifi olduğu Qur'an təfsirinə yazılmış "Haşiyə ələ'l-Kəşşaf" adlı əsərinin də bir nüsxəsi mövcuddur. Həmin kitabxanada alimin tibbə dair "Həllü'l-Mu'cəz" adlı əsərinin də bir nüsxəsi mühafizə edilir. "Həllü'l-Mucəz"in digər əlyazma nüsxəsi isə Ankara milli kitabxanasındadır. "İzahü'l-İzah" isə Xətibu-Diməşq ləqəbi ilə tanınmış Qütbəddin Muhəmməd Qəzvininin (öl. 1338) ərəb filologiyası sahəsindəki "İzah Məna və'l-Bəyan" adlı əsərinə şərh mahiyyətində yazılmışdır. "İzahü'l-İzah"ın müəyyən etdiyimiz üç nüsxəsindən biri Paris milli kitabxanasında[1351], digər ikisi isə Türkiyədə Çorum İHK və Kastamonu İHK-də mühafizə edilir.

**Əbdülməcid ibn Bəyaz Təbrizi**

---

[1348] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. II, s. 708; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 676.
[1349] KATİB ÇƏLƏBİ, *həmin əsər*.
[1350] DE SLANE, *həmin əsər*, s. 185.
[1351] DE SLANE, *həmin əsər*, s. 699.

Qari və yuxarıda haqqında məlumat verdiyimiz qazi Əbdüssəməd Təbrizinin qardaşı idi. O, da Təbrizdə Məs'ud ibn Əhməd əl-Əxlatinin tələbəsi olmuş, Qur'ani-Kərimin qiraət və təcvidini ondan öyrənmişdi. Əbdülməcid Təbrizi Təbrizdə qiraət və ticvid dərsləri vermişdi. Sədrəddin ibn Hacı ibn Ədib, Əminəddin Muhəmməd ibn Əhməd ibn Şəhriyar, qardaşı Əminəlmülk ibn Bəyaz Təbrizi, şeyxülislam Xətib ibn Əbdüllətif, Əbdürrəhman əl-Kürd, Kəmaləddin ibn Ömər ondan Qur'ani-Kərimin qiraət və təcvidini öyrənmişdilər[1352].

**İmadəddin Əbu Abdullah Muhəmməd ibn Əbdürrəhman ibn Əbdülməcid ibn Abdullah əl-Übeydi Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih və qari olan İmadəddin Əbu Abdullah Təbrizi həmçinin siyasi xadim və idarəçi idi. Onun mənsub olduğu ailə Təbrizin fəzilət sahibi alimləri ilə məşhur nəsillərdən biri idi. O, mövlana Şəmsəddin Əbdülkafinin tələbəsi olmuşdu. Həmçinin atasından və Seyyidü'l-Müəzzəm Əbu Nəsr Muhəmməddən Marağada hədis dərsləri almışdı. İbnü'l-Fuvati alimlə h. 706-cı ildə (1306) Təbrizdə görüşdüyünü və həmin vaxt onun Təbrizdə Sultanü'l-Ətiqə mədrəsəsində olduğunu qeyd etmişdir[1353]. Ölüm tarixi məlum deyil. XIII-XIV əsrlərdə yaşamışdır.

**İmadəddin Əbü'l-Məkarim Muhəmməd ibn Əbdülvəhhab ibn İbrahim Təbrizi**

Onun ailəsi əslən zəncanlı idi. Atası İzzəddin Əbdülvəhhab əl-Xəraci Zəncani haqqında irəlidə ətraflı məlumat veriləcəkdir. İmadəddin Əbü'l-Məkarimin mənsub olduğu nəsil alimləri və fəzilətli insanları ilə məşhur idi. O, atasından fiqh və hədis dərsləri almışdı. Hələ uşaqlıq və yeniyetməlik illərində kəskin zəkası, hazırcavablığı və natiqliyi ilə fərqlənmişdi. Elxanilərin hakimiyyəti illərində Təbrizdəki vəqflərin baş mütəvəllisi[1354] təyin edilmişdi. İmadəddin Əbü'l-Məkarim Təbrizi həmçinin istedadlı şair idi və farsca çox gözəl şerlər yazırdı. İbnü'l-Fuvati onun sahib Şəmsəddin ibn Muhəmməd ibn

---

[1352] İBNü'l-CƏZƏRİ, *Qayətü'n-Nihayə*, s. 382.
[1353] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 826.
[1354] Mütəvəlli-Vəqflərin, xeyriyyə cəmiyyətlərinin idarəçiliyi ilə məşğul olan şəxs.

Muhəmməd Cüveynini[1355] mədh edən şe'rini öz əsərində qeyd etmişdi[1356]. Ölüm tarixi məlum deyil. H. 670-ci ildə (1272) həyatda olduğu bilinir. XIII-XIV əsrlərdə yaşamışdır.

**Şeyx Vəliyəddin Əbu Abdullah Muhəmməd ibn Abdullah əl-Öməri Təbrizi**

XIV əsrin məşhur mühəddislərindən idi. Onun müəllifi olduğu "Mişkətü'l-Məsabih" adlı hədis külliyatında 4719 hədis qeyd edilmişdir. "Mişkətü'l-Məsabih" mühəddis şeyx Muhyəddin Hüseyn Bəğəvinin (öl. 1122) "Məsabihü's-Sünnə" adlı hədis külliyatının təkmilləşdirilmiş və genişləndirilmiş formasıdır[1357]. Həyatı haqqında ətraflı məlumatın olmadığı şeyx Vəliyəddin Təbrizi digər bəzi əsərlərin də müəllifi idi. Bunlardan "Kitabü'l-İkmal fi Əsmai'r-Rical" hədis raviləri haqqında və hədis üsuluna dair əsərdir[1358]. O, həmçinin "Şərhu Məqsurəti İbn Dureyd" adlı tövhid və əqaidə dair əsərin müəllifi idi. Ömər Rza onun hədis elmlərinə dair "əl-Məsəbih fi'l-Hədis və Zeynü'l-Əbvabih" adlı başqa bir əsərin də müəllifi olduğunu bildirmişdi[1359]. Şeyx Vəliyəddin Təbrizinin fiqhə dair "Minəhü'l-Qəffar Şərhu Tənvirü'l-Əbsar" adlı əsərinin nadir əlyazma nüsxələrindən biri Türkiyə Manisa İHK-də mühafizə edilir. Məhəmmədəli Tərbiyət "Mişkətü'l-Məsabih"in daha çox hindli müsəlmanların müraciət etdikləri hədis əsəri olduğunu qeyd etmişdir[1360]. Şeyx Vəliyəddin Təbrizi öz əsərindəki hədislərin raviləri haqqında "Əsmaü'r-Rical fi'l-Mişkət" adlı bir əsər də qələmə almışdı. Bu əsərin nüsxələrindən biri Türkiyə Çorum Həsən paşa İHK-də saxlanılır. "Mişkətü'l-Məsabih" Mustafa Uysal tərəfindən türkcəyə tərcümə olunaraq iki cild halında Türkiyədə nəşr edilmişdir. Bu əsərə Əbü'l-Həsən Übeydullah əl-Mübarəkfuri və Nurəddin Əbü'l-Həsən Əli əl-Qari (öl. 1605) kimi tanınmış alimlər şərh yazmışdırlar[1361]. Şeyx Vəliyəddin Təbrizi h. 749-cu (1348) ildə vəfat etmişdir.

---

[1355] Şəmsəddin Muhəmməd ibn Muhəmməd Cüveyni (öl. 1284) Elxani hökmdarlarından ilk üçünün Hülagü xan (1258-1265), Əhməd xan Təküdar (1262-1282) və Abaqa xanın (1282-1284) sahibi-divanı, baş vəziri olmuşdu. O, məşhur tarixçi, "Tarixi-Cahanquşa"nın müəllifi, Əlaəddin Əta-Məlik Cüveyninin (öl. 1283) qardaşı idi. Bax: *İstoriya İrana s Drevneyşix Vremyon do Kontsa XVIII veka*, s. 366.

[1356] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 830-831.

[1357] TƏRBİYƏT, *Danişməndan*, s. 369-370.

[1358] *Yenə orada*.

[1359] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 437.

[1360] *Danişməndan*, s. 369-370.

[1361] NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 394.

**Katib İmadəddin Muhəmməd ibn Əli ibn Muhəmməd ibn Əli Təbrizi**

XIII əsrin ikinci yarısı-XIV əsrin əvvəllərində Azərbaycanın tanınmış siyasət və dövlət xadimi olmuş, Elxanilərin sarayında müxtəlif vəzifələrdə çalışmışdı. Bir müddət Elxani hökmdarı Əbu Səid Bahadırın (1316-1335) baş vəziri Tacəddin Şərəf Əlişah Təbrizinin (öl. 1324) müavini olmuşdu[1362].

**Əlaəddin Əli ibn Abdullah ibn Yusif ibn Həsən Təbrizi**

Hələbdə böyümüş və burada təhsil almışdı. Əbu Cə'fər ibn Abdullah Əndəlüsinin tələbəsi olmuş, ondan ərəb filologiyası və ədəbiyyatını öyrənmişdi. Əlaəddin Əli Təbrizi qısa müddətdə nəsr, nəzm, münşəat və hüsnxətt sahəsindəki istedadı ilə tanınmışdı. Onun qələmə aldığı ədəbi əsərlərə böyük maraq yaranmışdı. Misir Məmlüklü sultanı Zahir Seyfəddin Bərququn (1382-1389/1390-1399) Hələb canişini əmir Yelbuğa Nasiri onu öz sarayına dəvət etmişdi. Əlaəddin Əli Təbrizi bir müddət sonra əmir Yelbuğa Nasirinin sirr katibliyinə[1363] təyin edilmişdi[1364]. Sultan Zahir Bərququn Hələb canişinliyi vəzifəsindən azad etdiyi əmir Yelbuğa qiyam qaldırmış və bəzi komandanlarla birlikdə Qahirədə hərbi çevrilişlə sultan Zahir Bərququ taxtdan uzaqlaşdırmışdı. Qiyamçılar sultanı Kərək şəhərindəki zindanda həbs etmişdilər. Lakin tezliklə sultan Zahir Bərquq öz tərəfdarlarının köməyi ilə həbsdən qurtulub yenidən Misir Məmlüklü taxtına oturmuşdu[1365]. Hərbi çevrilişdə iştirak edənlərin bir çoxu, o cümlədən Əlaəddin Əli Təbrizi h. 794-cü ildə (1392) edam edilmişdilər. Əmir Yelbuğanın məmurlarından və Əlaəddin Əli Təbrizinin dostlarından olan Şəmsəddin ibnü'l-Mühacir alimin faciəli ölümündən duyduğu kədəri yazdığı qəsidə ilə dilə gətirmişdi[1366].

**Əbü'l-Hüseyn Əbdüləziz ibn Əbdürrəzzaq ibn İsa Təbrizi**

---

[1362] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 835-836.

[1363] Katibü's-sirr, sirr katibi orta əsr müsəlman dövlətlərində dövlət başçısının gündəlik, həm siyasi, həm də şəxsi, həyatını da qələmə alırdı. Bundan başqa gizli yazışma və müqavilələrini də sirr katibləri qələmə alırdılar.

[1364] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 105-106.

[1365] Əyman Ömər ŞÜKRİ, *Sultan Bərquq-Müəssis Dövlətü'l-Məmalikü'l-Cərakizə*, s. 234-250, Qahirə 2002.

[1366] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 106.

Mühəddis idi və Sahib Təbrizi adı ilə tanınmışdı. İbn Malik əl-Qutey'i, Muhəmməd ibn İsmayıl əl-Vərraq, Təyyib ibn Yəmən əl-Mötəzidi kimi alimlərdən hədis dərsləri almışdı. Əbü'l-Hüseyn Əbdüləziz Təbrizi h. 436-cı ilin cəmadiələvvəl ayında (dekabr 1044) Bağdadda vəfat etmiş və Babi-Hərb qəbristanında dəfn edilmişdi[1367]. Nəql silsiləsində Əbü'l-Hüseyn Əbdüləziz Təbrizinin də olduğu hədislərdən biri aşağıdakıdır:

Cərir ibn Abdullah (ا) dedi: "Ayın bədrlənmiş olduğu bir gecədə Allah Rəsulu (ق) ilə birlikdə idik, Rəsulullah (ق) aya baxaraq buyurdular: "Siz bu ayı gördüyünüz kimi Rəbbinizi də (cənnətdə) belə, pərdəsiz, görəcəksiniz, onu görməkdə heç bir çətinliyə düşməyəcəksiniz"[1368].

**İmam Eynəddin Əbü'l-Abbas Əhməd ibn Muhmud ibn Abdullah əs-Sivasi Təbrizi**

Qur'ani-Kərim hafizi və qari idi. Əslən Anadolunun Sivas şəhərindən idi. İbnü'l-Fuvati onunla h. 706-cı ildə (1306) Təbrizdə görüşdüyünü qeyd etmişdir. Eynəddin Sivasi Təbrizdə Elxanilərin baş vəziri Rəşidəddin Fəzlullah Qəzvininin inşa etdirdiyi camenin imam-camaatı idi[1369]. Ölüm tarixi məlum deyil.

**Tacəddin Şərəf Əlişah ibn Əbu Bəkr Təbrizi**

Dövlət xadimi, həmçinin şafi'i məzhəbinə mənsub fəqih idi. Vəzir Rəşidəddin Fəzlullahın edam edilməsindən sonra Elxani hökmdarlarından Əbu Səid Bahadırın (1316-1335) vəziri olmuşdu. Mömin, fəzilətli və müdrik bir insan idi. Onun təşəbbüsü ilə əvvəlki Elxani hökmdarı Olcaytunun (1304-1316) din sahəsində etdiyi dəyişikliklər tamamən aradan qaldırılmışdı. Olcaytu həyatı boyunca qəribə şəkildə bir neçə dəfə din və məzhəb dəyişdirmişdi. Nestorian məzhəbli xristian olan anası Aruk xatun körpə ikən onu xaç suyuna salaraq adını Nikolay qoymuş və xristian kimi tərbiyə etmişdi. Lakin yeniyetməlik yaşlarında Olcaytu buddizmi qəbul etmişdi. Gənclik illərində isə

---

[1367] XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. X, s. 468.

[1368] XƏTİB BAĞDADİ, *yenə orada*. Bu hədis üçün bax: BUXARİ, *Səhih*, Məvaqifü's-Səlat Nr. 6/26; MÜSLİM, *Səhih*, Məsacid Nr. 211; ƏBU DAVUD, *Sünən*, Sünnət Nr. 19/4729; TİRMİZİ, *Sünən*, Cənnət Nr. 16/2551. (كنا عند رسول الله ق ليلة البدر فقال انكم سترون ربكم كما ترون القمر لا تضامون في رؤيته)

[1369] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1121.

müsəlman olmuş, sünni əqidəni mənimsəmsəyərək adını dəyişdirib Muhəmməd Xudabəndə qoymuşdu. Bir neçə il sonra monqol Olcaytu yenidən buddist olmaq istəmişdi. Amma bunun irtidad sayılaraq əhali və yerli məmurlar arasında ciddi narazılığa səbəb olacağı barədə xəbərdarlıqdan sonra fikrindən daşınmışdı. Daha sonra tanış olduğu iraqlı şiə ilahiyyatçısı Cəmaləddin ibn Mütəhhər əl-Hillinin təsiri ilə şiə əqidəsini mənimsəmiş və şiəliyi Elxanilərin rəsmi məzhəbi elan etmişdi. Bundan sonra Elxani sarayında iraqlıların nüfuzu artmağa başlamış və yüksək rütbəli mülki məmurların əksəriyyəti iraqlılardan təyin olunmuşdu. Bu isə istər hərbi, istərsə də mülki məmurlar və yerli əhali arasında narazılıqlara səbəb olmuşdu. Zorakı şiələşdirmə Azərbaycan, İraq, Fars və İsfəhan vilayətlərində iğtişaşların başlamasına səbəb olmuş, hətta Bağdadda hənbəlilərlə hökumət qüvvələri arasında silahlı toqquşma baş vermişdi[1370]. Olcaytunun alkoqola düşkünlüyü səbəbiylə xəstələnərək təqribən 40 yaşında ölməsindən sonra hakimiyyətə 11 yaşlı oğlu Əbu Səid Bahadır keçmişdi. Faktiki dövləti və ordunu, uşaq yaşlarındakı hökmdarın yeznəsi, əmir Çoban idarə edirdi. Şərəf Əlişah Təbrizi Əmir Çobanla olan səmimi münasibəti səbəbiylə baş vəzirlik vəzifəsində qalmışdı. Hakimiyyətin dəyişməsindən sonra bir sıra iri dövlət məmuru edam edilmiş və əmlakları müsadirə edilmişdi. Olcaytunun dövründə dini sahədə edilmiş bütün dəyişikliklər aradan qaldırılmışdı. Cümə xütbələrində isə yenidən 4 raşid xəlifənin adları sıra ilə oxunmağa başlanmışdı. Şərəf Əlişah Təbrizi h. 724-cü ilin cəmadiəlaxir ayında (iyun 1324) Azərbaycanın Ucan şəhərində vəfat etmişdi[1371]. Onu da qeyd edək ki, Şərəf Əlişah Təbrizi Elxanilərin vəzirlərindən öz əcəli ilə ölən yeganə vəzirdir[1372]. Daha doğrusu onu Elxani hökmdarının əmri ilə edam edilməmiş, qətlə yetirilməmiş vəzir adlandırmaq daha doğru olardı. Əbu Bəkr əl-Əhərinin verdiyi məlumata görə ölümündən bir müddət əvvəl vəzir Şərəf Əlişahla əmir Çobanın arasında soyuqluq meydana gəlmişdi. Əmir Çobanın oğlu Timurtaş tez-tez baş vəzirə hədə-qorxu gəlir və ondan əmlakına dair bəyannamə tələb edirdi. Vəzir Şərəf Əlişah onun bu davranışını əmir Çobana şikayət etmişdi. Əmir Çobandan da eyni

---

[1370] Əbu Abdullah Muhəmməd İBNü'l-ƏZRAQ, *Bidai's-Sülk fi Təbai'l-Mülk*, (Nşr. Ə. Nəşşar), C. I, s. 93-94, Dəməşq 2006.

[1371] QƏZVİNİ, *Tarixi-Qozidə*, s. 149-150; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 144-147, 400; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VI, s. 615; FƏHMİ, *həmin əsər*, s. 215-217, 221-223.

[1372] QƏZVİNİ, *yenə orada*; MÜŞTƏRƏK, *İstoriya İrana s Drevneyşix Vremyon do Kontsa XVIII veka*, s. 207.

münasibəti gördüyü üçün tamamilə ümidini itirmiş və xəstələnmişdi. Daha sonra bu xəstəliyi səbəbiylə vəfat etmişdi. Əbu Bəkr əl-Əhəri "deyirdilər ki, o, nəsə içib və ölüb"[1373] yazaraq vəzir Şərəf Əlişahın intihar etdiyinə eyham vurmuşdu. Lakin bu uzaq ehtimaldır. Şərəf Əlişahın qorxudan xəstələnib ölməsi də mümkündür. Çünki ondan əvvəlki bütün vəzirlər edam edilmişdilər. Rəşidəddin Fəzlullah özündən əvvəlki vəzir Sə'dəddin əs-Savinin edamı üçün çalışmış, buna nail olmuş və onun yerinə keçmişdi. Vəzir Şərəf Əlişah da Rəşidəddin Fəzlullahın edam edilməsi üçün əlindən gələni etmiş və onun yerinə keçmişdi. Əvvəlki acı təcrübə istənilən şəxsin səhhətinə ağır təsir edə bilərdi. Görünür vəzir Şərəf Əlişahın qorxması üçün kifayət qədər səbəb olub. Çünki Şərəf Əlişah Təbrizi həm də varlı tacir idi. Onun Təbriz, Sultaniyyə və Bağdadda ticarət müəssisələri fəaliyyət göstərirdi. Qarabağla Təbriz arasındakı yol üzərindəki 5 karvansaraydan 3-nü Şərəf Əlişah Təbrizi tikdirmişdi. O, həmçinin Təbrizdə möhtəşəm bir qəsr (Ərk qalası) və "Əlişah camesi" adı ilə tanınan gözəl bir məscid tikdirmişdi[1374]. Həmidullah Müstəvfi mərmərdən tikilmiş bu məscidin öz ehtişamına görə ancaq Mədaindəki Sasani şahlarının sarayı ilə müqayisə edilə biləcəyini qeyd etmişdir. Qəzvini bu məscidin sadəcə ibadət zalının eninin 250 uzunluğunun 200 gəz olduğunu qeyd etmişdir. Əlişah Təbrizi Səlmas şəhərinin dağılmış qala divarlarını da bərpa etdirmişdi[1375].

**Əllamə Şəmsəddin Əbu Muhəmməd Əbdülhəmid ibn İsa ibn Əmuyyə ibn Yunis ibn Xəlil ibn Abdullah ibn Yusif Xosrovşahi Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih, mütəkəllim və təbib idi. H. 580-ci ildə (1184) Xosrovşahda[1376] anadan olmuşdu. Fəxrəddin Razinin tələbəsi olmuş və ondan kəlam elmini öyrənmişdi. Muidəddin Tusidən hədis dinləmişdi. Əbu Muhəmməd Əbdülhəmid Təbrizi Şam vilayətinə getmiş, Kərək[1377] şəhərində məskunlaşmış və burada elmi fəaliyyətlə məşğul olmuşdu. O, İbn Sinanın tibbə dair "əş-Şəfa" adlı əsərini

---

[1373] Əbu Bəkr əl-Kutubi əl-ƏHƏRİ, *İstoriya Şeyxa Uveysa*, s. 14, Bakı 1984.
[1374] ONULLAHİ, *XIII-XVII Əsrlərdə Təbriz Şəhəri*, s. 58.
[1375] QƏZVİNİ, *Nüzhətü'l-Qülub*, s. 79-80, 87. Gəz farsca uzunluq ölçüsüdür. 1 gəzin uzunluğu 0,7-1 m. arasıdır.
[1376] Xosrovşahi-Təbrizdən bir neçə km. cənubi-qərbində, Təbriz-Marağa yolu üzərində, dəniz səviyyəsindən 1357 m. hündürlükdə, yerləşən qəsəbə. İndi Xosrovşəhr və ya Xisroşəhr adlanır.
[1377] Kərək şəhəri indiki İordaniya ərazisində, paytaxt Əmmanın cənubunda, Ölü dənizin 17 km şərqində yerləşir.

ixtisar etmişdi. Bundan başqa fiqh və fiqh üsuluna dair bəzi risalələrini, məntiqə dair "İşkalat və İradat" (Şübhələr və İradlar) adlı əsərini də Kərəkdə qələmə almışdı. Bundan başqa alim "Müxtəsər Kitabü'l-Mühəzzəb" və "Tətimmət Kitabü'l-Ayatü'l-Bəyanat" adlı əsərlərin də müəllifi idi[1378]. Xətib Zeynəddin ibnü'l-Mürəhhəl onun yetişdirdiyi alimlərdən biri idi. Alim h. 652-ci ilin şəvval ayında (noyabr 1254) Dəməşqdə vəfat etmiş və Qasiyyun qəbristanında dəfn edilmişdi[1379].

**Əllamə Əbü'l-Fəth Şəbüstəri Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Dəməşqdə yaşayan əllamə Əbü'l-Fəth Təbrizi fəzilət, gözəl əxlaq sahibi, xoşrəftar insan olmaqla yanaşı tədqiqatçı alim kimi də tanınmışdı. Onun tələbələri arasından şeyx İsmayıl Nəblusi, şeyx İmadəddin, şeyx Şəmsəddin əl-Münqari, Nəcməddin əl-Bəhanisi, qazi Əbdürrəhman ibnü'l-Fərfuri kimi alimlər yetişmişdi. O, Sümeysatiyyə xanəgahında yaşayır, ibadət və tədrislə də orada məşğul olurdu. H. 962-ci ildə (1555) Dəməşqdə taun epidemiyası vaxtı ölmüşdü[1380].

**Əllamə Nizaməddin Əbu Muhəmməd Əbdüssəməd ibn Hamid ibn Əbü'l-Bərəkat ibn Əbdüssəməd ibn Bədəl ibn Nəhşəl ən-Nəhşəli Təbrizi**

Müfəssir, qari və fəqih idi. H. 703-cü ilin cəmadiəlaxir ayında (yanvar 1304) Təbrizdə anadan olmuşdu. Azərbaycanın müxtəlif şəhərlərindəki alimlərdən ərəb dili, təfsir, fiqh və hədis dərsləri almışdı. Onun müəllimi olmuş alimlərdən şeyx Şəmsəddin əl-Xəffaf, imam Şəmsəddin Qəzvini, əllamə Şərəfəddin Əbu Abdullah ət-Təyyi, əllamə Fəxrəddin əl-Carbərdinin adlarını çəkmək olar. Nizaməddin Əbdüssəməd Təbrizi həmçinin astronomiya elmi ilə də məşğul olmuşdu. O, h. 762-ci ildə (1361) Suriya yolu ilə həcc ziyarətinə getmişdi. Vəfatından bir müddət əvvəl Təbrizin qaziü'l-quzatlığına təyin edilmişdi[1381]. Mənbələrdə ölüm tarixi qeyd edilməmişdir. XIV əsrdə yaşamışdır.

---

[1378] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 64. "Kitabü'l-Mühəzzəb" Şeyxülislam Əbu İshaq İbrahim Şirazinin (öl. 1083) şafi'i fiqhinə dair əsəridir. "Kitabü'l-Ayatü'l-Bəyanat" isə Fəxrəddin Razinin (öl. 1209) əsəridir. Əllamə Şəmsəddin Xosrovşahi Təbrizi bu bunlardan birincisini ixtisar etmiş, ikincisinə isə şərh və əlavələr yazmışdır.
[1379] İBN TAĞRIBİRDİ, *Mənhəlü's-Safi*, C. II, s. 92; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. V, s.581.
[1380] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s.189.
[1381] DAVUDİ, *Təbəqatü'l-Müfəssirin*, C. I, s. 303; İBNü'l-CƏZƏRİ, *Qayətü'n-Nihayə*, s. 320.

**Hüseyn ibn Hamid ibn Hüseyn əs-Sarayi Təbrizi**

Yaşadığı dövrün mahir qarilərindən biri olan Hüseyn ibn Hamid Təbrizi həmçinin varlı tacir idi və tez-tez ticarət məqsədiylə səyahətlərə çıxırdı. H. 769-cu ildə (1368) Dəməşqə getmiş, burada şeyx Şəmsəddin Əbü'l-Məali Muhəmməd ibn Əhməd ibnü'l-Ləbanın tələbəsi olmuşdu. Dəməşqdən geri, vətənə qayıtmışdı. Bir müddət sonra yenidən Şam diyarına gedərək burada İbnü's-Səlabdan Qur'ani-Kərimin qiraət və təcvidinin incəliklərini öyrənmişdi. Daha sonra Anadoluya getmiş, oradan da Azərbaycana qayıtmışdı. Hüseyn ibn Hamid Təbrizi h. 785-ci ilin rəbiəlaxir ayında (iyun 1383) yenidən Dəməşqə getmiş, bir müddət orada qaldıqdan sonra Hələbə gedərək bu şəhərdə yaşamışdı. Hələbdə Menglibuğa camesində qiraət dərsləri vermişdi. Daha sonra Qüdsə gedərək h. 801-ci ildə (1399) vəfat edənə qədər bu şəhərdə yaşamışdı[1382].

**Nəfis ibn Davud ibn Ə'nan əd-Davudi Təbrizi**

Həkim olan Nəfis İbn Davud Təbriz yəhudilərindən idi. H. 654-cü ildə (1256) Təbrizdən Qahirəyə getmişdi. Burada oynaq ağrılarından (ehtimal ki, revmatizmdən) əziyyət çəkən əmir Qəlaini müalicə etmişdi. Misirdə müsəlman ilahiyyatçılarla bir neçə dəfə teoloji mövzularda mübahisəyə girişmişdi. Bir müddət sonra İslamı qəbul etmişdi. Bundan sonra bacarıqlı həkim kimi tanınmışdı. Oğullarından Mö'təsim Təbrizə qayıtmış və haqqında bəhs edəcəyimiz Fəthullah Fəthəddin Təbrizi burada dünyaya gəlmişdi. Digər oğlu Bədi' Təbrizi isə Qahirədə, atası Nəfisin yanında qalmışdı. Atasının ölümündən sonra Fəthəddin Fəthullah Qahirəyə əmisinin yanına gəlmişdi[1383]. Nəfis ibn Davud Təbirizinin XIII əsrdə yaşadığı və Qahirədə vəfat etdiyi bilinsə də ölüm tarixi məlum deyil.

**Fəthəddin Fəthullah ibn Mö'təsim ibn Nəfis əd-Davudi Təbrizi**

[1382] İBNü'l-CƏZƏRİ, *Qayətü'n-Nihayə*, s. 195; SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 66.
[1383] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. III, s. 80-81.

Təbib və hənəfi məzhəbinə mənsub fəqih idi. H. 759-cu ildə (1358) anadan olmuşdu. Onun babası Nəfis, Misir Məmlüklü sultanı Nasirəddin Muhəmməd ibn Qəlavunun[1384] hakimiyyəti illərində köçüb Qahirədə məskunlaşmışdı. Atası o, kiçik ikən vəfat etmiş və Fəthullah Təbrizi həkim olan əmisi Bədi' ibn Nəfis Təbrizinin himayəsində böyümüşdü. Yaxşı təhsil almış və tibbə dair bir çox kitab və "əl-Muxtar"ı[1385] oxumuşdu. Fəthəddin Fəthullah Təbrizi dindar, fəzilətli, gözəl əxlaq sahibi və təvazökar insan idi. O, Qahirədə əczaçılıqla, müxtəlif dərmanların hazırlanması və satışı ilə məşğul olurdu. Misir Məmlüklü sultanı Zahir Seyfəddin Bərquq (1382-1399) Bədi' ibn Nəfis Təbrizini ölkəsinin baş həkimliyinə (rəisu'l-ətibba), yəni səhiyyə nazirliyinə təyin etmişdi. Əmisinin vəfatından sonra Fəthəddin Fəthullah Təbrizi bu vəzifəyə təyin olunmuşdu[1386]. O, sultan Bərququn mübtəla olduğu bir xəstəliyi uğurla müalicə etdiyi üçün sultanın yanında hörmət və ehtiramı daha da artmışdı. Sultan onu özünün sirr katibliyinə[1387] təyin etmişdi. Alim h. 815-ci ilin rəbiələvvəl ayında (iyun 1412) vəfat etmişdi[1388]. Təqiyəddin Əhməd Məqrizi Fəthəddin Fəthullah Təbrizinin babası Nəfisin Davud (×) peyğəmbərin nəslindən olan yəhudi olduğunu və İslamı qəbul etdiyini qeyd etmişdir[1389]. Ehtimal ki, "əd-Davudi" nisbəsi də bundan qaynaqlanırdı.

**Həkim Sədrəddin Bədi' ibn Nəfis Təbrizi**

Fəthəddin Fəthullah Təbrizinin əmisi idi. Fəzilətli, xoşrəftar, şair təbiətli insan olan Bədi' Təbrizi Misir Məmlüklü sultanı Zahir Seyfəddin Bərququn (1382-1399) şəxsi həkimlərindən biri və ölkənin baş həkimi (rəisu'l-ətibba) Əlaəddin ibn Səğirin köməkçisi idi. Sultan Zahir Əlaəddin ibn Səğirin ölümündən sonra Bədi' ibn Nəfis

---

[1384] Nasirəddin Muhəmməd ibn Qəlavun 1293-1294, 1299-1309 və 1310-1341-ci illərdə, üç dəfə Misir Məmlüklü sultanı olmuşdu. Bunlardan ilk ikisində hərbi çevriliş, üçüncüsündə isə vəfatı ilə hakimiyyətdən ayrılmışdı.
[1385] Abdullah ibn Mahmud ibn Mövdud əl-Mövsili tərəfindən qələmə alınmış "əl-İxtiyar li-Təlili'l-Muxtar" adlı əsər İmam Əbu Hənifənin (699-767) fiqhə dair fikir və fətvalarını ehtiva edir.
[1386] Sultan Bərququn həyatı haqqındakı monoqrafiyasında Əyman Ömər Şükri Fəthullah Fəthəddinin bu vəzifəyə Əlaəddin ibn Səğirin vəfatından sonra təyin edildiyini qeyd edir. Bax: ŞÜKRİ, *Sultan Bərquq*, s. 474.
[1387] Katibü's-sirr, sirr katibi orta əsr müsəlman dövlətlərində dövlət başçısının gündəlik, həm siyasi, həm də şəxsi, həyatını da qələmə alırdı. Bundan başqa gizli yazışma və müqavilələrini də sirr katibləri qələmə alırdılar.
[1388] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VII, s. 785; İBN TAĞRIBİRDİ, *Nücumu'z-Zahirə*, C. III, s.50; MƏQRİZİ, *Kitabu's-Süluk,* C. II, s. 498.
[1389] MƏQRİZİ, *Kitabu's-Süluk,* C. II, s. 494. Əyman Ömər Şükri, Fəthullah Fəthəddinin babası Nəfisin yəhudi olduğunu, lakin Davud (×) peyğəmbərin nəslindən olması məsələsinin isə tamamilə yalan olduğunu qeyd etmişdir. Lakin müəllif bunu nəyə istinad edərək inkar etdiyini təəssüf ki, qeyd etməmişdir. Bax: ŞÜKRİ, *həmin əsər*.

Təbrizini ölkəsinin baş həkimliyinə təyin etmişdi. Sədrəddin Bədi' Təbrizi h. 797-ci ilin rəbiələvvəl ayında (yanvar 1395) vəfat etmişdi[1390]. İbn Tağrıbirdi onun bacarıqlı həkim və dərin biliyə malik tibb alimi kimi tövsif etmiş, tibbə dair bir sıra əsərin müəllifi olduğunu qeyd etmişdi[1391]. Səid Nəfisi həkim Bədi'nin farsca çox gözəl qəzəllər yazdığını qeyd etmişdi. Digər bir azərbaycanlı şair Heydər Təbrizi isə Bədi' Təbrizini həcv edən şerlər yazmışdı[1392].

**Qazi Hidayətullah ibn Yarəli əl-Qustantini[1393] Təbrizi**

Hənəfi məzhəbinə mənsub fəqih və mütəkəllim idi. Bundan başqa ərəb dili və fiqh üsulu üzrə də dövrün tanınmış alimlərindən biri idi. Mövlana Pir Əhəd, mövlana Muhyəddin əl-Fənari və İbn Kamal paşanın[1394] tələbəsi olmuşdu. Məkkə qaziliyinə təyin olunan Hidayətullah Təbrizi h. 940-cı ildə (1533) Hələb və Dəməşq yolu ilə Məkkəyə gələrək vəzifəsinin icrasına başlamışdı. Lakin gözlərindəki xəstəlik səbəbiylə vəzifəsindən istefa edərək müalicə üçün Misirə getmiş və ölümünə qədər orada qalmışdı. Alim h. 949-cu ildə (1542) vəfat etmişdi[1395].

**Hüsaməddin Əbu Abdullah Həsən ibn Şərəf Təbrizi**

Hənəfi məzhəbinə mənsub fəqih və müfəssir idi. Misir Məmlüklüləri dövründə Şam vilayətində yaşamışdır. Filoloq, tarixçi və müfəssir Muhibbəddin Əbü'l-Fəzl Muhəmməd ibnü'ş-Şihnə (öl. 1412) onun tələbəsi olmuş və onun yanında Zəməxşərinin "Kəşşaf" adlı təfsirini oxumuşdu. Hüsaməddin Həsən Təbrizi hənəfi fiqhinə dair "Dürrü'l-Bihar" adlı əsərin müəllifi idi. Bu əsərin nadir əlyazma nüsxələrindən biri Paris milli kitabxanasında saxlanılır[1396]. "Damğətü'l-Mübtədiyin və Nasirətü'l-Mühtədiyin" və "Mənzumə fi Fürui'l-Hənəfiyyə" isə onun qələmə aldığı digər əsərlərdir. "Damğətü'l-Mübtədiyin"in Türkiyədəki yeganə nüsxəsi Ankara milli

---

[1390] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. I, s. 230; İBN HƏCƏR, *İbnai'l-Ğumr*, C. II, s. 69, 166; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VII, s. 785.
[1391] İBN TAĞRIBİRDİ, *Mənhəlü's-Safi*, C. I, s. 249.
[1392] NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 525-526.
[1393] Osmanlıca mətinlərdə İstanbulun qədim adı olan Konstantinia "Qustantiniyyə" formasında yazılır.
[1394] Şəmsəddin Əhməd Kamalpaşazadə 1526-1534-cü illərdə Osmanlı dövlətinin 10-cu şeyxülislamı olmuşdur.
[1395] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s.159.
[1396] DE SLANE, *həmin əsər*, s. 190.

kitabxanasında mühafizə edilir. Mənbələr alimin ölüm tarixinin h. 770-ci (1369-1370) illərə təsadüf etdiyini yazırlar[1397]. "Damğətü'l-Mübtədiyin"in Ankara milli kitabxanasındakı nüsxəsindəki qeydlərdən Hüsaməddin Həsən Təbrizinin h. 790-cı (1388) ildə vəfat etdiyini öyrənirik.

**Hüsaməddin Həsən ibn Şərəf Təbrizi**

Hənəfi məzhəbinə mənsub fəqih idi. Mardinə[1398] getmiş və burada Xeyrəddin Xəlil ibnü'l-Əla əl-Buxarinin tələbəsi olmuşdu. Təhsilini başa vurandan sonra Mardində qalıb tədrislə məşğul olmuşdu. Şeyx Bədrəddin ibü's-Sələmə Əstərabadi, Rüknəddin Məvsili kimi alimlər onun tələbələri arasından yetişmişdilər. İbn Həcər Əsqəlani onun Nəsrəddin Tusi ilə görüşdüyünü qeyd etmişdir. O, Nəcməddin Əbdülğəffar Qəzvininin "əl-Havi" adlı əsərinə şərh yazmışdı. Alim h. 715-ci ildə (1315) vəfat etmişdir[1399].

**İmam Nəcməddin Əbu Neman Bəşir ibn Hamid ibn Süleyman ibn Yusif ibn Süleyman ibn Abdullah əl-Cə'fəri Təbrizi**

Şafi'i məzhəbinə mənsub mühəddis, fəqih və müfəssir idi. Cə'fər ibn Əbu Talibin[1400] (ˡ) nəslindən olan imam Nəcməddin Bəşir Təbrizi h. 570-ci ilin rəbiüləvvəl ayında (oktyabr 1174) Ərdəbildə anadan olmuşdu. O, Təbrizdə böyümüş, bu şəhərin mədrəsələrində təhsil almış, Qur'an hafizi olmuşdu. Əbdülmün'im ibn Kuleyb, Yəhya əs-Səqəfi, Əbu Əhməd ibn Səkinə, Əbu Həfs ibn Təbərzəd və digər mühəddislərdən hədis dinləmiş və nəql etmişdi. Hafiz Şərəfəddin Əbdülmömin ibn Xələf əd-Dimyati və başqaları ondan hədis dinləmişdilər. Nəcməddin Bəşir Təbrizi Bağdadda Əbü'l-Qasım ibn Fəzlan və Yəhya ibnü'l-Rəbi'nin tələbəsi olmuş, onlardan şafi'i fiqhi, fiqh üsulu və xilaf elmini[1401] öyrənmişdi. O, Bağdad Nizamiyyə mədrəsəsində dərs verirdi, fətva mərcii idi və tez-tez

---

[1397] TƏMİMİ, *Təbəqatü's-Səniyyə*, s. 491; KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 896; C. II, s. 1055.

[1398] Mardin-Türkiyənin cənubi-şərqində şəhər. Oğuzların Qayı boyuna mənsub Artuqlu dövlətinin üç mərkəzindən biri olmuşdur. Hısn-Keyfa Artuqluları, Harput Artuqluları və Mardin Artuqluları adlanan bu kiçik dövlətlərdən sonuncusu Nəcməddin İlqazi tərəfindən 1105-ci ildə qurulmuş və 1409-cu ilə qədər mövcud olmuşdur. Bu dövrdə Mardin regionun mədəniyyət və elm mərkəzlərindən birinə çevrilmişdi. Hüsaməddin Həsən Təbrizi də bu dövrdə Mardində yaşamışdı.

[1399] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. I, s. 273.

[1400] Cə'fər ibn Əbu Talib (ˡ) - Əli ibn Əbu Talibin (ˡ) qardaşı idi. 629-cu ildə Bizans imperiyası qüvvələrinə qarşı aparılan Mutə döyüşündə şəhid olmuşdu.

[1401] Xilaf elmi (İlmu'l-xilaf)-Müqayisəli hüquq.

elmi diskussiyalarda iştirak edirdi. Səxavi onu "şeyxü'l-hərameyn"[1402] kimi təqdim etmiş, həmçinin Məkkə və Mədinə müftisi olduğunu qeyd etmişdir[1403]. Nəcməddin Bəşir Təbrizi Qur'ani-Kərimə "Tibyan fi İ'rabü'l-Qur'an" adlı bir neçə cildlik təfsir yazmışdı. Bu əsərin h. 649-cu ildə (1251) Mədinə şəhərində üzü köçürülmüş bir nüsxəsi Türkiyədə, Konya BYEK-də saxlanılır. Onun qələmindən çıxmış "Ərbəun Hədisən Əhasini'l-Kəlam və Məhasinü'l-Kiram" hədis elminə dair əsərdir[1404]. O, "Hədisü'l-Ərbəin fi Umuri'd-Din" adlı hədis elminə aid başqa bir əsərin də müəllifidir. Nəcməddin Bəşir Təbrizi fəzilət sahibi, xoşrəftar, mömin, gözəl əxlaqlı, saleh əməlli insan idi. O, həmiçinin şair idi və çox gözəl şerlər yazırdı[1405]. Nəcməddin Bəşir Təbrizi h. 3 səfər 646-cı ildə (28 may 1248) Məkkədə mücavir[1406] ikən vəfat etmişdi[1407].

### Qazi İzzəddin Muhəmməd ibn Muhəmməd ibn Muhmud ibn Bəndar Təbrizi

Mühəddis idi. Mühəddis əl-Cəraidinin tələbəsi olmuş, ondan hədis dinləmiş və hədis elmlərini öyrənmişdi. Misir Məmlüklü dövləti tərəfindən Qəzzə qaziliyinə təyin olunmuşdu. Qəzzə qazisi olduğu illərdə tədqiqatla məşğul olmuş və bir sıra əsərlər qələmə almışdı. İzzəddin Muhəmməd Təbrizi "Cəmiü'l-Üsul"[1408] adlı çoxcildli hədis külliyatını ixtisar etmişdi. Bu əsər "Müxtəsərü'l- Cəmiü'l-Üsul" adı ilə tanınmışdı. Onun qələmə aldığı bir digər əsər isə "Müxtəsərü'l-Rəuzə" adlanır. Qəzzə qaziliyindən sonra Dəməşqə gəlmiş və buradakı Nasiriyyə mədrəsəsində hədis dərsləri vermişdi[1409]. Alim h. 16 zilhiccə 770-ci ildə (21 iyul 1369) Dəməşqdə vəfat etmiş və Qasiyyun qəbristanında dəfn edilmişdi[1410].

### Şeyx İzzəddin Yusif ibn Həsən ibn Mahmud əs-Sarayi Təbrizi

---

1402 Məkkə və Mədinə şəhərlərinin şeyxi.
1403 SƏXAVİ, *Tuhfətü'l-Lətifə*, C. I, s. 143.
1404 BAĞDADLI, *İzahü'l-Məknun*, C. I, s. 15.
1405 ƏBBADİ, *Zeyl Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, s. 70.
1406 Mücavir sözü lüğətdə qonşu, qonşuluq mənasını ifadə edir. Mədinədəki Məscidi-Nəbəvi və Məkkədəki Məscidi Həramın yaxınlığında bir müddət yaşayaraq ibadətlərini bu məscidlərdə edən şəxslərə mücavir deyilirdi.
1407 SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VIII, s. 70-71; SÜYUTİ, *Təbəqatü'l-Müfəssirin*, s. 11; ƏDNİRƏVİ, *Təbəqatü'l-Müfəssirin*, s. 104; ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'd-Dübeysi*, s. 148; KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 593, 794.
1408 "Cəmiü'l-Üsul" İmam Məcdəddin Əbü's-Səadə Mübarək ibn Muhəmməd ibü'l-Əsir əl-Cəzəri Məvsilinin məşhur hədis külliyatıdır.
1409 İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 463.
1410 İBN RAFİ', *əl-Vəfayat*, s. 90; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 692.

Şafi'i məzhəbinə mənsub müfəssir, mühəddis və fəqih idi. H. 730-cu ildə (1330) anadan olmuşdu. Təbriz mədrəsələrində təhsil almış, şeyx Cəlaləddin Qəzvini, şeyx Bəhaəddin Xunəci və qazi Əzudəddin əl-İcidən (öl. 1355) fiqh dərsləri almışdı. Daha sonra təhsilini davam etdirmək üçün Bağdada getmiş və burada Şəmsəddin Kirmaninin yanında imam Buxarinin "Səhih"ini və oradakı hədislərin şərhini oxumuşdu. Təhsilini başa vurandan sonra Təbrizə qaytımış, burada tədris və elmi fəaliyyətlə məşğul olmuşdu. Toxtamış xanın Təbrizi işğalı vaxtı Azərbaycanı tərk edərək Anadoluya getmiş və Mardində məskunlaşmışdı[1411]. Qızıl Orda hökmdarı Toxtamış xanın ordusu 4 yanvar 1386-cı ildə Təbrizə hücum etmiş, lakin əhalinin ciddi müqavimətinə rast gələrək hücumu dayandırmışdı. Əldə edilmiş sazişə əsasən Təbriz əhalisi 250 tümən qızıl pul ödəyəcək və Toxtamış xan ordusunu şəhərdən uzaqlaşdıracaqdı. Toxtamış xan şəhər müdafiəçilərinin bu razılaşmadan sonra döyüş yerlərini tərk etməsindən sui-istifadə edərək şəhərə qoşun yeritmişdi. Bir həftə boyunca tatarlar Təbrizdə qətl və qarət törətmişdilər. 12 gün sonra Toxtamış xanın ordusu ikinci dəfə Təbrizi zəbt etmişdi. Bu iki hücum vaxtı əhalidən 10 min nəfər öldürülmüş və 100 min nəfərə yaxını əsir edilib aparılmışdı. Şəhər qarət edilmişdi. Toxtamış xanın ordusu Marağa, Naxçıvan və Qarabağı da qarət edəndən sonra təqribən 200 min əsirlə Azərbaycanı tərk etmişdi[1412]. Əmir Teymurun Azərbaycanı zəbt etməsindən sonra Təbriz hakimi olan oğlu Ömər Mirzə Mardinə xəbər göndərərək İzzəddin Yusif Təbrizinin geri qayıtmasını istəmişdi. İzzəddin Yusif Təbrizi doğma şəhərinə qayıtmış, Ömər Mirzə onu hörmət və ehtiramla qarşılamışdı. O, yenidən tədris və elmi fəaliyyətlə məşğul olmağa başlamış, Zəməxşərinin "Kəşşaf"ına haşiyə yazmışdı. Bundan başqa qazi Nasirəddin Bəyzavinin "Minhəc", İbn Həcərin "Əsmai'l-Hüsnə" və imam Nəvəvinin "Qırx Hədis" adlı əsərlərinə[1413] şərh yazmışdı. İzzəddin Yusif Təbrizi mömin, təmiz əqidəli, çox ibadət edən, zöhd və vəra' sahibi insan idi. O, həcc üçün yola çıxmış və həcc ziyarətindən sonra 1 il Mədinədə mücavir olaraq qalmışdı. Lakin vətənə qayıdandan sonra Təbrizdə zülm və hərc-mərcliyin artması səbəbiylə yenidən Təbrizi tərk etmiş və Anadoluya

---

[1411] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VII, s. 710; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. III, s. 207.

[1412] ONULLAHİ, *həmin əsər*, s. 67; MÜŞTƏRƏK, *Azərbaycan Tarixi*, s. 350.

[1413] Muhyəddin Əbu Zəkəriyyə Yəhya ibn Şərəf Nəvəvi (1233-1277) Suriyada, Nəva qəsəbəsində dünyaya gəlmişdir. İslam tarixində yetişmiş böyük alimlərdəndir. 40-dan çox əsərinə müəllifidir. "Riyazü's-Salihin" adlı hədis külliyatı və "Qırx Hədis" ən tanınmış əsərləridir.

getmişdi. Cəzirədə[1414] məskunlaşaraq h. 804-cü ildə (1402) vəfat edənə qədər orada yaşamışdı[1415].

### Mircan əş-Şafi'i Təbrizi

Şafi'i məzhəbinə mənsub fəqih idi. Şah İsmayıl Xətainin Təbrizi ələ keçirməsindən sonra təzyiq və təqibə məruz qaldığı üçün vətəni tərk edib Suriyaya, Hələb şəhərinə getmişdi. Hələbdə yaşamış və burada tədrislə məşğul olmuşdu. H. 934-cü ilin şaban ayında (may 1528) isə Dəməşqə köçmüş və tədris fəaliyyətini burada davam etdirmişdi. Mircan Təbrizi Kubrəviyyə təriqətinə mənsub sufi idi. H. 935-ci ilin məhərrəm ayında (sentyabr 1528) Dəməşqi tərk edərək Azərbaycana getmiş və h. 936-cı ildə (1529) vəfat etmişdi[1416].

### Mövlana Muhyəddin Muhəmməd ibn Əbdüləvvəl Əbdi əl-Qəzvini Təbrizi

Hənəfi məzhəbinə mənsub fəqih, bununla yanaşı görkəmli ədib və mahir xəttat idi. Əslən Qəzvinli olan atası Ağqoyunlular dövründə Təbriz şəhərinin qazisi olmuşdu. O, ilk təhsilini Azərbaycanın tanınmış hənəfi fəqihlərindən olan atası Əbdüləvvəl Əbdi Təbrizidən almışdı. Uşaqlıq çağlarında Ağqoyunlular dövründə Azərbaycanda yaşamış məşhur alimlərdən Cəlaləddin Dəvvanini (öl. 1502) görmüşdü. Atası ilə birlikdə Osmanlı sultanı II Bayəzidin (1481-1512) hakimiyyəti dövründə Anadoluya getmişdi. Burada alim kimi yetişmişdi. Amasyalı mövlana Əbdürrəhman Müəyyidzadə tərəfindən Osmanlı sultanı II Bayəzidə təqdim olunmuşdu[1417]. Mövlana Əbdürrəhman Müəyyidzadə Cəlaləddin Dəvvaninin tələbəsi olmuş[1418], təhsilini Azərbaycan mədrəsələrində almışdı. Böyük ehtimalla mövlana Muhəmməd Təbrizi və onun atası qazi Əbdüləvvəl Əbdi Təbrizini də tələbəlik illərində tanımışdı. Sultan mövlana Muhəmməd Təbrizini mədrəsələrdən birinə müdərris təyin etmişdi. O, sonra

---

1414 İndi Türkiyənin cənubi-şərqində, Suriya-Türkiyə sərhəddində, Şırnak vilayətində kiçik bir qəsəbədir və Cizrə adlanır.

1415 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VII, s. 710, 724; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. III, s. 207; ƏDNİRƏVİ, *Təbəqatü'l-Müfəssirin*, s. 141; SƏXAVİ, *Zəvu'l-Lami'*, C. V, s. 187; İBN HƏCƏR, *İbnai'l-Ğumr*, C. II, s. 216, 242.

1416 QƏZZİ, *Kəvakibü's-Sairə*, s. 276; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s. 122.

1417 TAŞKÖPRÜZADƏ, *Şəqaiqü'n-Numaniyyə*, s. 289.

1418 NİŞINCI, *Hadisat*, s. 159; BURSALI, *Osmanlı Müəllifləri*, C. I, s. 355.

Anadoludakı şəhərlərdən birinə qazi, sonra İstanbuldakı vəzir Qoca Mustafa paşa mədrəsəsinə müdərris təyin olunmuşdu. Daha sonra Manisada və Ədirnədəki mədrəsələrdən birinin müdərrisi olmuşdu. Mövlana Muhəmməd Təbrizi İstanbula gələrək Səmaniyyə mədrəsəsində dərs vermişdi. Sonra Hələb və Dəməşq şəhərləri qaziliyinə, daha sonra isə İstanbul şəhəri qaziliyinə təyin olunmuşu. Mövlana Muhəmməd Təbrizi mübtəla olduğu göz xəstəliyi səbəbiylə ayda 80 aqça almaqla təqaüdə çıxmışdı. Alim bir sıra əsərlərin müəllifi idi. O, əsərlərini ərəb, fars və türk dillərində qələmə almışdı. Mövlana Muhəmməd Təbrizi həm də mahir xəttat idi. Çox gözəl xətt nümunələri ilə sənət əsərləri meydana gətirmişdi. O, təmiz etiqadlı, fəzilət, zöhd və vəra' sahibi insan idi. Ərəb, fars və türk dillərində elmi və ədəbi əsərlərin müəllifi idi. Bunlardan "Haşiyə ələ Şərhu-Fəraizü's-Siraciyyə"[1419], "Həvaşi ələ Umurü'l-Amməª"[1420], "Risalə fi Qətü'l-Yəd"[1421], "Şərhu Hidayətü'l-Hikmə"nin[1422] adlarını sadalamaq olar. Mövlana Muhəmməd Təbrizi h. 966-cü ildə (1559) vəfat etmişdi[1423].

### Muhəmməd ibn Əbu Muhəmməd Təbrizi

Həkim və şafi'i məzhəbinə mənsub mütəkəllim idi. Təbrizdə təhsul almış, təhsilini davam etdirmək üçün Dəməşqə getmişdi. Dəməşqdə Qüdbəddin ət-Təhtavidən məntiq və kəlam elmlərini öyrənmişdi. Əmir Mengli Buğa[1424] onu Qahirədəki əl-Mənsuriyyə xəstəxanasına tibb tədrisi və müalicə üçün təyin etmişdi. Daha sonra əmir Mengli Buğa əl-Mənsuriyyə mədrəsəsinin şafi'i fiqhi tədrisini də Muhəmməd Təbriziyə həvalə

---

1419 "Fəraizü's-Siraciyyə" və ya "Fəraizü's-Səcavəndi" İslam miraz hüququna dair Siracəddin Muhəmməd Səcavəndinin (öl. 1200) qələmə aldığı əsərdir. Muhyəddin Təbrizi bu haşiyəni h. 957-ci ilin şaban ayında (avqust 1550) yazıb bitirmişdi. Türkiyədəki əl yazma əsər kitabxanalarında bu əsərin bir neçə nüsxəsi mövcuddur. Bunlardan üçü Ankarada, Milli kitabxanada saxlanılır.

1420 Əzudəddin əl-İcinin (öl. 1355) İslam mülkü hüququna dair əsərinə yazılmış haşiyədir. Muhyəddin Təbrizi bu haşiyəni h. 954-cü ilin rəcəb ayında (avqust 1547) yazıb bitirmişdi.

1421 İslam cinayət prosesual hüququna dair əsərdir. Muhyəddin Təbrizi bu haşiyəni h. 950-ci ilin zilqədə ayında (fevral 1544) yazıb bitirmişdi.

1422 "Hidayətü'l-Hikmə" Əsirəddin Müfəzzəl ibn Ömər Əbhərinin (öl. 1265) məntiq elminə dair əsəridir.

1423 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s. 173; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 382;Taşköprüzadə alimin h. 963-cü ildə (1556) vəfat etdiyini qeyd etmişdir, bax: *həmin əsər*, 289; NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 391. Səid Nəfisi alimin h. 966-cı ildə (1559) vəfat etdiyini qeyd etmişdir. İbnü'l-İmad isə onun h. 954-cü ildə (1547) vəfat etdiyini bildirmişdir.

1424 Əmir Seyfəddin Mengli Buğa əş-Şəmsi Misir Məmlüklü dövlətinin yüksək rütbəli hərbi bürokratlarından biri olmuşdur. Çərkəz mənşəli Məmlüklü sultanı II Şaban (1363-1377) onu h. 764-cü ilin zilqədə ayında (avqust 1363) Şam vilayəti naibü's-səltənətliyinə təyin etmişdi. Əmir Mengli Buğa mömin və xeyriyyəçi bir şəxs idi. Bax: İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 454-455.

etmişdi. Muhəmməd Təbrizi əl-Mənsuriyyə mədrəsəsi müdərrisi vəzifəsindən azad edilndən sonra Qahirədəki əl-Mardiniyyə camesində dərs verməyə başlamışdı. Burada onun ətrafında böyük tələbə kütləsi toplanmış və onun dərslərinə böyük maraq yaranmışdı. Muhəmməd Təbrizi h. 776-cı ilin zilhiccə ayında (may 1375) vəfat etmişdi[1425].

**Muhibbəddin Muhibbullah Təbrizi**

Şafi'i məzhəbinə mənsub müfəssir idi. Həcc ziyarəti üçün yola çıxaraq Suriya yolu ilə Məkkəyə getmiş, həcc ziyarətindən sonra bir müddət Məkkədə mücavir olaraq qalmışdı. Daha sonra geri qayıdarkən Dəməşqdə gəlmiş və orada məskunlaşmışdı. Muhibbədin Təbrizi şeyx Muhyəddin ibnü'l-Ərəbinin irsini araşdırır, onun əsərlərini mütaliə edirdi. H. 958-ci ildə (1551) Dəməşqdə vəfat etmişdi[1426].

**Şeyx Muhibbəddin Əbü's-Səna Mahmud ibn Əli ibn İsmayıl ibn Yusif əl-Qonyəvi əl-Mısri Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Bundan başqa fiqh üsulu və ərəb dili üzrə də tanınmış mütəxəssis idi. H. 719-cu ildə (1319) Misirdə anadan olmuşdu. O, hələ kiçik ikən atası vəfat etmişdi. Mühibbəddin Mahmud Təbrizi yaxşı təhsil almış, Misirin ən tanınmış alimlərinin tələbəsi olmuşdu. Təhsilini başa vurandan sonra tədris və elmi fəaliyyətlə məşğul olmuşdu. O, həm də fətva mərcii idi. Bioqraf-tarixçi Cəmaləddin Əsnəvi onun yaxın dostu idi. İbnü'l-İmad bu səbəbdən Cəmaləddin Əsnəvinin öz əsərində onu tərifləyərkən mübaliğə etdiyini qeyd etmişdi[1427]. Lakin Cəmaləddin Əsnəvinin onun haqqında mübaliğə etdiyini söyləmək çətindir. Əsnəvi onun Qur'ani-Kərimi çox tilavət etdiyini, çox ibadət edən, zahid bir insan olduğunu, fenomenal yaddaşa sahib olduğunu, mütaliə və tədqiqat xaricində çox az şeylə maraqlandığını, ciddi insan olduğunu, insanlarla mümkün qədər az ünsiyətdə olmağa çalışdığını,

---

1425 İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. III, s. 5; İBN HƏCƏR, *İbnai'l-Ğumr*, C. II, s. 29.
1426 QƏZZİ, *Kəvakibü's-Sairə*, s. 342; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s. 122.
1427 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VI, s. 688.

atasının[1428] dostlarını daim hörmət və ehtiramla qarşıladığını qeyd edir. Mühibbəddin Mahmud Təbrizi Qahirədə Şərifiyyə mədrəsəsinin müdərrisi olmuşdu. Alim h. 758-ci ilin rəbiəlaxir ayında (aprel 1357) vəfat etmişdi[1429]. O, fiqh və fiqh üsuluna dair bir sıra əsərlərin müəllifi idi. İbnü'l-Hacib Düveyninin fiqh üsuluna dair əsərinə yazdığı şərhi "Şərhu Müxtəsərü'l-Müntəha" adlandırmışdı. "Etirazat ələ Şərhü'l-Havi fi'l-Fiqh" adlı əsər də alimin qələmindən çıxmışdı[1430].

**Şeyx Əlaəddin Əbü'l-Həsən Əli ibn Nurəddin Əbi'l-Fida İsmayıl ibn Yusif əl-Qonyəvi Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih olan şeyx Əlaəddin Əli Təbrizi yuxarıda haqqında bəhs etdiyimiz şeyx Muhibbəddin Mahmud Təbrizinin atası idi. H. 668-ci ildə (1270) Konyada[1431] dünyaya gəlmişdi. İlk təhsilini Konyada almışdı. Burada Tacəddin əl-Xilafi və Şəmsəddin əl-İykidən üsul və xilaf dərsləri almışdı. H. 693-cü ildə (1294) təhsilini davam etdirmək üçün Dəməşqə gəlmişdi. Burada şeyx Nəcməddin Məkki, şeyx Şəmsəddin əl-Abəci, İbrahim ibn Ənbər əl-Mardini kimi alimlərin tələbəsi olmuş, hədis dinləmiş və ərəb dilinin qrammatikasını öyrənmişdi. Dəməşqdə Əməvi məscidində dərs vermişdi. Bu vaxt həm də Dəməşqdəki "Səidü's-Süəda" xanəgahının şeyxi vəzifəsini icra etmişdi[1432]. Daha sonra İqbaliyyə mədrəsəsində tədrislə məşğul olmuşdu. H. 700-cü ildə (1301) Suriyadan Misirə köçmüş və burada dövrün tanınmış mühəddislərindən şeyx Şərəfəddin Dimyati və şeyx Təqiyəddin ibn Dəqiqdən hədis dərsləri almışdı. Qahirədəki Şərifiyyə mədrəsəsində dərs vermiş, daha sonra Şam və Misir vilayətlərinin şeyxü'ş-şüyuxluğuna[1433] təyin olunmuşdu. O, bu vaxt Qahərədəki Toloniyyə məscidinin də imamı idi. H. 727-ci ildə (1327) Dəməşq qaziliyinə təyin olunmuşdu. Əlaəddin Əli Təbrizi fiqh, hədis, təfsir, sərf, kəlam, fiqh üsuluna dair bir sıra əsərlərin müəllifi idi. O, həm də şair idi və gözəl şerlər yazırdı. Onun əsərlərinin ən

---

[1428] Atası Əlaəddin Əli Təbrizi öz dövrünün məşhur alimlərindən idi. Sonrakı səhifələrdə onun haqqında da məlumat verilmişdir.
[1429] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. II, s. 172; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. III, s. 152.
[1430] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 819.
[1431] Konya-Türkiyədə, Anadolunun mərkəzində şəhər.
[1432] DƏVADARİ, *Kənzü'd-Dürər*, C. IX, s. 322.
[1433] Şeyxü'ş-Şüyux-şeyxlərin şeyxi, baş şeyx.

tanınmışları Zəməxşərinin "Kəşşaf", Həliminin "Minhəc"[1434], Nəcməddin Əbdülğəffar Qəzvininin "əl-Haviü's-Səğir" adlı əsərlərinə yazdığı şərhlər və ixtisarlardir. Bundan başqa o, "Şərhu-Tə'ərrüf"[1435], "Müsənnif fi Həyatü'l-Ənbiya", "əş-Şafi fi'l-Üsul", "əl-İbtihac fi İntixabü'l-Minhəc" adlı əsərlərin də müəllifi idi[1436]. Alim h. 14 zilqədə 729-cu (9 sentyabr 1329) ildə Dəməşqdəki bağında vəfat etmiş və Qasiyyun qəbristanında[1437] dəfn edilmişdi.

Bioqraf Cəmaləddin Əsnəvi şeyx Əlaəddin Əli Təbrizinin mömin, fəzilətli, zahid insan olmaqla yanaşı, həmçinin həşmətli və vüqarlı şəxsiyyətə sahib olduğunu qeyd etmişdi. O, bəziləri kimi maddi mənfəət naminə sultana yaranmırdı. Sultanın hüzuruna çağırılıb müəyyən məsələlərə dair fikri soruşulduğu vaxt doğruluq və obyektivlikdən uzaqlaşmırdı. Buna görə də Misir Məmlüklü sultanı Nasirəddin Qəlavun ona dərin hörmət bəsləyir və deyirdi: "Mənim ölkəmdə onun misli ola biləcək alim yoxdur"[1438].

**Həkim Fəxrəddin Əbu Bəkr Əhməd ibn Mikayıl ibn Əbdullah əl-Qonyəvi Təbrizi**

Kəmaləddin ibnü'l-Fuvati (1244-1323) h. 705-ci ildə (1306) onunla Təbrizdə görüşdüyünü qeyd edir. İbnü'l-Fuvati onun gənc və zəki bir insan olduğunu, Təbrizdə tibb elminin tədrisi və müalicə işi ilə məşğul olduğunu qeyd etmişdi. Fəxrəddin Qonyəvi ona h. 663-cü ildə (1265) Konyada anadan olduğunu, Misirə gedib orada mənşəcə yəhudi olub İslamı qəbul etmiş Bəhaəddin Əbdüsseyyid ibn İshaq ibn Yəhya əl-İsrailidən tibb təhsil aldığını, daha sonra Dəməşqə gedib bu şəhərdə yaşadığını və İbn Hud ləqəbi ilə məşhur olmuş həkim Bədrəddin Həsən ibn Əli ibn Əbi'l-Həccac Yusifin tələbəsi olduğunu söyləmişdi[1439].

**Şeyx Müslihəddin Əbü'l-Fəth Musa ibn Əmirhəcc ibn Muhəmməd Təbrizi**

---

[1434] Fəqih və mühəddis Hüseyn ibn Həsən ibn Muhəmməd ibn Həlimi Cürcaninin (949-1012) "Minhəcü'd-Din" adlı əsəri şeyx Əlaəddin Əli Təbrizi tərəfindən ixtisar edilmişdi. Bax: KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. II, s. 1061.

[1435] Bu şərh Muhəmməd ibn İbrahim Gülabadinin (X əsrdə yaşayıb. Gülabad Buxaranın qəsəbələrindən biridir)"Kitabü't-Tə'ərrüf li-Məzhəbü't-Təsəvvüf" adlı əsərinə yazılmışdır.

[1436] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 406.

[1437] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. II, s. 170-172; YAFİ'İ, *Miratü'l-Cənan*, C. II, s. 648; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 242; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. III, s. 126; İBN TOLON, *Səğru'l-Bəssam*, s. 91-92.

[1438] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. II, s. 171.

[1439] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 108.

Hənəfi məzhəbinə mənsub fəqih idi. H. 669-cü ildə (1271) anadan olmuşdu. H. 710-cu ildə (1310) Təbrizdən Dəməşqə getmiş bir müddət bu şəhərdə qaldıqdan sonra vətənə qayıtmışdı. Daha sonra h. 726-cı ildə (1326) Qahirəyə getmiş, bu şəhərdə yaşamağa başlamışdı. Hənəfi alimlərindən əllamə Müzəffərəddin Əhməd ibnü's-Saatinin (öl. 1295) fiqh üsuluna dair "əl-Bədyi'" adlı əsərinə iki cildlik şərh yazmışdı. Şeyx Müslihəddin Musa Təbrizi fəzilətli, saleh insan kimi tanınmışdı. H. 736-cı ilin zilhiccə ayının axırlarında (avqust 1336) həcc ziyarətindən qayıdarkən Mədinə yaxınlığındakı Bəni-Salim vadisində vəfat etmiş və orada dəfn edilmişdi[1440].

**Şeyxülislam Feyzullah Muhəmməd ibn Muhəmməd ibn Pir Muhəmməd Ərzurumi Təbrizi**

H. 1049-cu ildə (1639) Ərzurumda alim ailəsində dünyaya gəlmişdi. Seyyid Feyzullah əfəndinin atası seyyid Muhəmməd ibn Pir Muhəmməd ibn Əhməd ibn şeyx Cüneyd Təbrizi Ərzurum müftisi olmuşdu. Seyyid Muhəmmədin fars dilinin qrammatikasına dair türkcə qələmə aldığı "Düsturü'l-Əməl fi Zurubi-Əmsali-Əcəm" adlı əsərin yeganə əlyazma nüsxəsi İstanbul Topqapı muzeyi kitabxanasında saxlanılır. Feyzullah əfəndi ilk təhsilini atasından almışdı. Daha sonra Ərzurumun məşhur alimlərindən müxtəlif elm sahələrinə dair bilikləri öyrənmişdi. Onun müəllimlərindən biri də şeyx Mehmed Vani əfəndi olmuşdu. Feyzullah əfəndi daha sonra şeyx Mehmed Vaninin qızı ilə evlənmişdi. Müəlliminin tövsiyəsi ilə h. 1074-cü ildə (1663) İstanbula getmişdi. H. 1078-ci ildə (1668) həcc ziyarətindən qayıdandan sonra Osmanlı sarayına yaxınlığı ilə tanınan qaynatasının vasitəçiliyi ilə sultan IV Mehmedə (1648-1687) təqdim olunmuşdu. IV Mehmedin təqdirini qazanan seyyid Feyzullah əfəndi sultan tərəfindən şahzadə Mustafa ilə şahzadə Əhmədin müəllimliyinə təyin olunmuşdu. Həmin illərdə seyyid Feyzullah əfəndi İstanbuldakı Heydər paşa, Mehrimah sultan, Ayasofiya və Səxni-Səman mədrəsələrində müdərrislik etmişdi. H. 8 rəbiülaxir 1099-cu ildə (11 fevral 1688)

---

[1440] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. III, s. 69; İBN QUTLUBUĞA, *Tacü't-Təracim*, s. 35; Əlaəddin Əli ibn Əmrullah XINALIZADƏ, *Təbəqatü'l-Hənəfiyyə*, v. 22ª, Hacı Mahmud Əfəndi Kitabxanası, Nr: 4662. Xınalızadə Əli Əfəndi şeyx Müslihəddin Musa Təbrizinin iki dəfə Dəməşqə getdiyini yazmışdır. Əli əfəndi əmçinin "əl-Bədiy'" şərhinin alimin öz dəsti-xətti ilə yazılmış nüsxəsini gördüyünü qeyd etmişdir. Lakin Xınalızadə şeyx Müslihəddin Təbrizinin ölüm tarixini yanlışlıqla "h. 636-cı il" olaraq qeyd etmişdir. Bunun müəllifin deyil, əsərin üzünü köçürmüş müstənsixin yol verdiyi xəta olması da mümkündür.

Sultan II Süleyman (1687-1691) tərəfindən Osmanlı imperatorluğu şeyxülislamlığına təyin edilmişdi. Lakin iki həftə sonra bəzi yüksək rütbəli hərbiçilərin təzyiqi ilə başqa bir neçə mülki dövlət məmuru ilə birlikdə əvvəlcə istefaya sonra da Ərzuruma sürgünə göndərilmişdi. H. 1106-cı ilin cəmaziəlaxirində (yanvar 1695) sürgün müddəti bitmiş və İstanbula qayıtmışdı. Həmin il Osmanlı taxtına oturan tələbəsi II Mustafa (1695-1703) tərəfindən ikinci dəfə Osmanlı şeyxülislamlığına təyin olunmuşdu. Xoşrəftar, fəzilətli, yumuşaq xasiyyətli insan, hədis, təfsir və filologiya sahələrində tanınmış alim olmasına baxmayaraq şeyxülislam Feyzullah əfəndi tez-tez səlahiyyət sahəsindən kənara çıxaraq mülki və hərbi işlərə müdaxilə etmişdi. O, başda oğulları və yeznələri olmaqla, bir çox əqrəbasını dövlət vəzifələrinə təyin etdirmişdi. Sultan II Mustafanı öz təsirində saxlamağı bacaran şeyxülislam Feyzullah əfəndi sədriəzəmlər (baş vəzir) Daldaban Mustafa paşa və Rami Mehmed paşaya daim təzyiq göstərmiş, vəzifəyə təyin və vəzifədən azad edilmə kimi işlərə müdaxilə etmişdi. Şeyxülislam Feyzullah əfəndi ona qədər və ondan sonra heç bir şeyxülislamın etmədiyi bir işi də etmişdi. O, sultan II Mustafadan özündən sonra oğlu Fəthullah əfəndinin şeyxülislam olacağına dair fərman almışdı. 15 iyul 1703-cü ildə sədriəzəm Rami Mehmed paşanın təhriki ilə bir qrup hərbiçi gecikən maaşlarının ödənməsi tələbi ilə İstanbuldakı atmeydanında (hippodrom) toplaşmışdılar. Onlara mülki əhalidən də qoşulanların sayı tezliklə bir neçə mini keçmişdi. Üç gün sonra atmeydanına toplaşanların sayı, 20 mini əsgər olmaqla, 70 mini keçmişdi. İstanbulda xaos, özbaşnalıq, qətl və qarət hadisələri baş vermişdi. Bu vaxt sultan II Mustafa Ədirnədə idi. Qiyamçılar tələblərinin sultana çatdırılması üçün Ədirnəyə heyət göndərmişdilər. Ən başlıca tələbləri Feyzullah əfəndinin istefaya göndərilməsi idi. Lakin şeyxülislam Feyzullah əfəndi heyət üzvlərini həbs etdirmişdi. Bu qiyamçıların daha da qəzəblənməsinə səbəb olmuşdu. Bu dəfə sultanın taxtdan uzaqlaşması tələbi ilə Ədirnəyə yürüş etmiş və şahzadə Əhmədin taxta oturmasını tələb etmişdilər. Sultanın 13 rəbiüləvvəl 1115-ci ildə (27 iyul 1703) şeyxülislam Feyzullah əfəndini istefaya göndərməsi də onları təskin etməmişdi. Qiyamçıların qarşısını ala bilməyən II Mustafa 22 avqust 1703-cü ildə hakimiyyəti qardaşı III Əhmədə (1703-1730) təhvil verməyə məcbur olmuşdu. 3 sentyabr 1703-cü

ildə qiyamçıların əlinə keçən şeyxülislam Feyzullah əfəndinin aqibəti qorxunc olmuşdu. Qiyamçı əsgərlər onu başını kəsərək öldürmüşdülər[1441].

Şeyxülislam Feyzullah əfəndi müxtəlif elm sahələrinə aid bir sıra əsərlərin müəllifidir. Bunlardan ən məşhuru "Məcmuayi-Fətəva"dır. Bu əsərdə seyyid Feyzullah əfəndinin şeyxülislam ikən verdiyi fətvalar toplanmışdır. Əsərin türkcə əlyazma nüsxələri Türkiyə Çorum Həsən paşa İHK, İzmir Milli kitabxanası, Ankara Diyanət İşləri Başqanlığı kitabxanası, İstanbul Bələdiyyəsi kitabxanası, Almaniya Berlin Milli kitabxanasında saxlanılır. Feyzullah əfəndinin türk dili və ədəbiyyatı sahəsində qələmə aldığı "Şərhi-Qəsidəyi-Hacı Bayram vəli" adlı əsərinin iki əlyazma nüsxəsindən biri Misirdə Qahirə Milli kitabxanasında, digəri isə İstanbul Bələdiyyəsi kitabxanasında saxlanılır. Şeyxülislam Feyzullah əfəndinin digər bir əsəri qazi Bəyzavinin "Ənvarü't-Tənzil və Əsrarü't-Tə'vil" adlı Qur'an təfsirinə yazdığı şərhdir.

**Nizaməddin Əbu Abdullah Muhəmməd ibn Əbdülkərim ibn Əli Təbrizi**

Dəməşqin tanınmış qarilərindən və Qur'an hafizlərindən idi. H. 613-cü ildə (1216) Təbrizdə anadan olmuşdu. Atası ilə birlikdə ticarət məqsədiylə Hələbə getmiş və burada qalıb təhsil almışdı. Hələbdə İbn Rəvahə və İbn Şəddad kimi alimlərin tələbəsi olmuş, onlardan Qur'an təcvidi və tilavətinin incəliklərini öyrənmişdi. H. 635-ci ildə (1238) imam Səxavi, Əbü'l-Qasım əs-Səfravi, Əbu Əmr, Əfifəddin ibnü'r-Rəmmah, Əbdüzzahir ibn Nəşvan kimi alimlərin yanında hədis külliyatlarını oxumuş və müxtəlif sahələrə aid bilikləri öyrənmişdi. Misirə gedib iki il İsgəndəriyyədə yaşamışdı. Sonra Suriyaya qayıdıb Dəməşqdə məskunlaşmış və mütəvazi həyat sürmüşdü. Burada Qur'ani-Kərimin tilavəti ilə məşğul olmuşdu. Mübtəla olduğu xəstəlik səbəbiylə bir neçə ay Dəməşq xəstəxanasında yatmış və h. 704-cü ilin rəbiəlaxir ayında (noyabr 1304) vəfat etmişdi. Onun oğlu Şəmsəddin Muhəmməd ibn Muhəmməd Təbrizi də qari idi. Atasından 6 il sonra h. 710-cu ildə (1310) vəfat etmişdi[1442].

---

[1441] KOMİSYON, *Türk ve İslam Ansiklopedisi*, C. II, s. 681-682, Tercuman Tarih ve Kültür Yayınları 1979; SÜREYYA, *Sicil-i Osmani*, C. II, s. 533.

[1442] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 339, 437; ZƏHƏBİ, *Mə'rifəti'l-Qurrai'l-Kibar*, s. 123; SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. III, s. 231. Səlahəddin Səfədi, Nizaməddin Muhəmməd Təbrizinin h. 706-cı ildə (1306) vəfat etdiyini qeyd etmişdir.

**İmadəddin Əbu Nəsr Muhəmməd ibn Muhəmməd ibn Əbu Muhəmməd Təbrizi**

İbnü'l-Fuvati onun xoşrəftar və yaraşıqlı bir gənc olduğunu, Təbriz hakimi olan atası Sədrəddin Muhəmmədin vəfatından sonra h. 668-ci ildə (1270) onun yerinə keçdiyini qeyd etmişdi. İmadəddin Əbu Nəsr Təbrizi gənc olmasına baxmayaraq bacarıqlı idarəçi olmuş, Təbriz və ətraf vilayətlərin həqiqi hakiminə çevrilmişdi. O, Elxanilərin baş vəziri Şəmsəddin Muhəmməd Cüveyni ilə dostluq edirdi. İmadəddin Əbu Nəsr Təbrizi h. 676-cı ildə (1277) gənc yaşlarında vəfat etmiş, Təbrizdə atasının inşa etdirdiyi əs-Sədriyyə mədrəsəsinin həyətində, atasının məzarının yanında dəfn edilmişdi[1443].

**Muhəmməd ibn Muhəmməd Təbrizi**

Mütəkəllim idi. Təbrizdə dünyaya gəlmiş və təhsil almaq məqsədiylə vətəni tərk etmişdi. Qütbəddin Təhtaninin[1444] bilik, bacarıq və istedadı ilə fərqlənən tələbələrindən biri idi. Təhsilini başa vurduqdan sonra Qahirədə tədrislə məşğul olmuşdu. Qahirədə bir çox tələbə onun dərslərində iştirak etmiş və onun biliyindən faydalanmışdı. Alim h. 776-cı ilin zilhiccə ayında (may 1375) Qahirədə vəfat etmişdi[1445].

**Qazi Bədrəddin Muhəmməd ibn Mahmud ibn Muhəmməd ibn Bəndar Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Fələstindəki Qüds, əl-Xəlil və Bəəlbək şəhərinin qazisi olmuşdu. Yuxarıda haqqında məlumat verdiyimiz mühəddis qazi İzzəddin Muhəmməd Təbrizinin yaxın qohumu idi. Qazi Bədrəddin Təbrizi xeyirxah və saleh insan kimi tanınmışdı. H. 725-ci ilin şəvval (sentyabr 1325) ayında əl-Xəlil şəhərində vəfat etmişdi[1446].

**Şeyx Əlaəddin Əli ibn Hüseyn ibn Abdullah Təbrizi**

---

1443 İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 848-849.

1444 Qütbəddin Muhəmməd ibn Muhəmməd ər-Razi ət-Təhtani (1290-1365) əslən İranın Rey şəhərindəndir. Yaşadığı dövrün tanınmış fəlsəfə və məntiq alimlərindən biri idi. Bu sahəyə dair bir sıra əsərlərin müəllifidir. Əsərləri uzun müddət mədrəsələrdə dərslik kimi oxutulmuş və üzərinə şərhlər yazılmışdı.

1445 SÜYUTİ, *Hüsnü'l-Mühazirə*, s. 297.

1446 İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. III, s. 6; SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. V, s. 253.

Təsəvvüf əhlinə mənsub şeyx idi. Onun ata və babaları da təsəvvüfçü idilər. Təbrizi tərk edib Marağa yaxınlığındakı Beyxaq kəndindəki Həvvariyyə[1447] zaviyəsində məskunlaşmış və bütün ömrünü burada keçirmişdi. Şeyx Əlaəddin Əli Təbrizi şeyx Muhyəddin Əli ibn Sadiq əl-Həvvarinin müridi olmuş, təriqət xirqəsini onun əlindən geymişdi. Şeyx Əlaəddin yaşadığı və irşadla məşğul olduğu zaviyənin yaxınlığında kənd təsərrüfatı ilə məşğul olur, bostan məhsulları becərirdi[1448]. Ölüm tarixi məlum deyil. XIII-XIV əsrlərdə yaşamışdır.

**Səlahəddin Muhəmməd ibn Əli ibn Əbdülhəqq əl-Ənsari Təbrizi**

Hənəfi məzhəbinə mənsub alim idi. Qahirədə yaşamış və bu şəhərdə İbnü'l-Molla Əli adı ilə tanınmışdı. Mühibbəddin Bağdadi, İbnü'l-Hümam və İbn Həcər Əsqəlani kimi alimlərdən müxtəlif elm sahələrinə dair dərslər almışdı. Zahiriyyə mədrəsəsinin tələbəsi olmuş, burada imam Buxarinin "Səhih"ini dinləmişdi. Qahirə xəstəxanasında xəzinədar işləyən Səlahəddin Təbrizi bir neçə dəfə həcc ziyarətinə getmişdi. H. 856-ci ildə (1452) Şəmsəddin Səxavi ilə birlikdə həcc ziyarətində olmuşdu. İbnü'l-Molla Əli h. 876-cı ilin zilqədə ayında (aprel 1472) vəfat etmişdi[1449].

**Qazi İmadəddin Əbü'l-Fəzl Əhməd ibn Əli ibn Əbü'l-Fəzail Təbrizi**

Qazi İmadəddin Əhməd Təbrizi yaşadığı dövrdə Azərbaycanın görkəmli alimi, fiqh sahəsində tanınmış mütəxəssisi olmaqla yanaşı həm də Təbriz şəhərinin idarəçiliyində mühüm rol oynamışdır. İbnü'l-Fuvati onu xoşsima, xoşrəftar və gözəl əxlaq sahibi insan kimi tövsif etmişdi[1450]. Ölüm tarixi məlum deyil. XII-XIII əsrlərdə yaşamışdır.

**İmadəddin Əbu Əli Hüseyn ibn Yusif ibnü'l-Hacı Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Əl-Qəlanisi ləqəbi ilə tanınmışdı. İmadəddin əl-Qəlanisi fəzilət sahibi alim, həmçinin şair idi. İbnü'l-Fuvati onun şe'rlərindən bir neçə

---

[1447] Həvvariyyə təriqəti-XIII əsrdə yaşamış şeyx Əbu Bəkr ibn Həvvar əl-Həvvari tərəfindən qurulmuş təsəvvüf təriqətidir.
[1448] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1048.
[1449] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. IV, s. 183.
[1450] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 671.

beyti öz əsərində qeyd etmişdi[1451]. “əl-Qəlanis”[1452] və onunla eyni kökdən olan “əl-Qələnsut” sözü ərəb dilində papaq, başlıq mənasını ifadə edir. İlk dövrlərdə qazilərin, sonrakı əsrlərdə isə daha çox təsəvvüf mənsublarının geydikləri hündür, silindrvari və yundan hazırlanan papağa “qələnsut” və ya “qəlansuva” deyilirdi. “əl-Qəlanisi” nisbəsi də öz mənşəyini buradan götürmüşdür[1453]. XIII əsrdə yaşamışdır.

**İmadəddin Hüseyn Təbrizi**

Şair və ədib idi. O, Elxanilərin baş vəziri Rəşidəddin Fəzlullah Qəzvininin övladlarının şəxsi müəllimi idi. İbnü’l-Fuvati onunla Təbrizdə şeyx Şəmsəddin Əbdülkafi əs-Seyyidinin yanında görüşdüyünü və onun h. 641-ci il (1243) təvəllüdlü olduğunu qeyd etmişdir[1454]. Müəllif İmadəddin Hüseyn Təbrizinin ölüm tarxini qeyd etməmişdir. Ehtimal ki, İbnü’l-Fuvati (1323) vəfat etdiyi vaxt İmadəddin Hüseyn Təbrizi hələ həyatda idi.

**Qazi İmadəddin Əbdülhəmid ibn Əbü’l-Fəth ibnü’l-Müəyyəd Təbrizi**

Təbriz şəhəri və ətraf nahiyələrin qazisi olmuşdur. Qazi İmadəddin Əbdülhəmid Təbrizinin ulu babaları əslən İranın Deyləm vilayətindən idilər, Qəzvinə oradan da Təbrizə köçüb gəlmişdilər. Qazi İmadəddin Əbdülhəmid alim ailəsində dünyaya gəlib böyümüşdü[1455]. Ölüm tarixi məlum deyil. XIII-XIV əsrlərdə dünyaya gəlmişdir.

**Kəmaləddin Muhəmməd ibn Bayəzid ibn Həsən Təbrizi**

Şafi’i məzhəbinə mənsub mühəddis idi. Gənc yaşlarından etibarən ticarətlə məşğul olmuş və çox səyahət etmişdi. Ərəb filologiyasını öyrənmişdi. Məkkədə Şəmsəddin Səxavinin tələbəsi olmuş, onun yanında imam Nəvəvinin “Qırx Hədis” kitabını oxumuşdu. Səxavi onun başqa alimlərdən də hədis dərsləri aldığını qeyd etmişdir.

---

[1451] İBNü’l-FUVATİ, *Məcməü’l-Adab* , C. IV/2, s. 714.
[1452] əl-Qəlanis [القلانس] və “əl-Qələnsut” [القنسوة] sözləri üçün bax: SARI, *Arapça-Türkçe Lugat*, s. 1253; BARANOV, *Arabsko-Russkiy Slovar*, s. 657.
[1453] “əl-Qəlanisi” nisbəsi üçün bax: SƏM’ANİ, *Kitabü’l-Ənsab*, C. IV, s. 66-67.
[1454] İBNü’l-FUVATİ, *Məcməü’l-Adab* , C. IV/2, s. 714-715.
[1455] İBNü’l-FUVATİ, *Məcməü’l-Adab* , C. IV/2, s. 757.

Səxavi h. 898-ci ildə (1493) onunla yenidən Məkkədə görüşdüyünü qeyd etmişdir[1456]. Ölüm tarixini qeyd etmədiyinə görə ehtimal ki, Şəmsəddin Səxavi vəfat edərkən (1497) o, həyatda olmuşdu.

**Yaqubşah ibn Usta Əli Təbrizi**

H. 810-cu ildə (1407) Ərzincanda anadan olmuş, uşaqlıq illərində bibisi ilə birlikdə Təbrizə gəlmiş və bu şəhərdə böyümüşdü. Onun bibisi Qaraqoyunlu hökmdarı Qara Yusifin (1389-1421) sahibi-divanı (baş vəziri) Əbu Yəzidin xanımı idi. Yaqubşah ilk təhsilini Təbrizdə almış, burada Qur'an qiraət və təcvidini öyrənmişdi. Daha sonra Təbriz mədrəsələrində təhsilini davam etdirmişdi. Təhsilini başa vurduqdan sonra Qara Yusifin oğlu sultan İskəndərə (1421-1438) xidmət etmişdi. H. 833-cü (1430) ildə Azərbaycandan Misir Məmlüklü sarayına gedən diplomatik heyətə daxil olmuşdu. Misirdə qalmış və buradakı alimlərdən müxtəlif elm sahələrinə dair bilikləri öyrənmişdi. Misirdə qalaraq Məmlüklü dövlətinə xidmət etmişdi. Sultan Seyfəddin Əbu Səid Xoşqədəm (1461-1467) və sultan Əşrəf Qayıtbayın (1468-1496) hakimiyyəti dövründə müxtəlif dövlət vəzifələrində qulluq etmişdi[1457]. Ölüm tarixi məlum deyil.

**Əlaəddin Əşrəf ibn Əhməd ibn Həsən ibn Məvdud əl-Həsəni Təbrizi**

Əlaəddin Əşrəf Təbrizi yaşadığı dövrün tanınmış şafi'i qarilərindən idi. O, imam Həsənin (ﺃ) nəslindən idi. Babası Hicazdan köçüb Azərbaycana gəlmiş və Təbrizdə məskunlaşmışdı. Əlaəddin Əşrəf Təbrizi gözəl əxlaqlı, xoşrəftar, təvazökar, xeyriyyəçi, möhtaclara əl tutan insan idi. Təbrizdə Qur'ani-Kərim qiraəti və təcvidi dərsləri verirdi[1458]. Ölüm tarixi məlum deyil. XIII-XIV əsrlərdə yaşamışdır.

**Qazi Əbu Saleh Şueyb ibn Saleh ibn Şueyb Təbrizi**

Yaşadığı dövrün tanınmış mühəddislərindən idi. Onun atası da mühəddis idi və atasından hədis dinləmişdi. Bundan başqa şeyx Əbu İmran Musa ibn İmran Səlmasi,

---

[1456] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. V, s. 26.
[1457] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. V, s. 166.
[1458] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 998-999.

Muhəmməd ibn Muhəmməd ibn Həyyan, Xudadad ibn Asim ibn Bəkran Naxçıvanidən hədis dinləmişdi. Bağdadda Xətib Təbrizi adı ilə məşhur olmuş ədib Əbu Zəkəriyyə Yəhya Təbrizi və Əbü'l-Əla Əhməd ibn Abdullah ibn Süleyman əl-Muqrinin tələbəsi olmuşdu. Daha sonra Şam diyarına getmiş, Əbü'l-Fəth Səlim ibn Əyyub ər-Razi, Əbü'l-Qasım Übeydullah ibn Əli Rəqqi və Əbü'l-Qasım Əbdülkərim ibn Muhəmməd əs-Səyyardan hədis dinləmişdi. İmam-xətib Əbu Bəkr Əhməd ibn Əli ibn Sabit, Əbü'l-Fəzl Muhəmməd ibn Nasir əs-Səllami, Əbu Mənsur Məvhub ibn Əhməd ibn Muhəmməd ibn Xıdr əl-Cəvaliqi, Əbü'l-Həsən Sə'dülxeyr ibn Muhəmməd ibn Səhl əl-Əndəlusi Bağdadda, Əbu Tahir ibn Muhəmməd ibn Abdullah əs-Sənci Mərvdə ondan hədis nəql etmişdilər. Alim h. 502-ci ilin cəmadiəlaxir ayında (yanvar 1109) Bağdadda vəfat etmiş və Babü'l-İbriz qəbristanında dəfn edilmişdi[1459].

**Əlaəddin Əbu Muhəmməd Əfridun ibn Bəhram Təbrizi**

Eldənizlər dövrünün dövlət xadimlərindən biri di. Bir sıra yüksək dövlət vəzifələrində işləmişdi. Həmçinin xeyriyyəçi idi. İbnü'l-Fuvati onun oğlu imam Hümaməddin Əbü'l-Fəzl Muhəmməd Təbrizdən dərs aldığını qeyd etmişdir[1460]. Ölüm tarixi məlum deyil. XII-XIII əsrlərdə yaşamışdır.

**Qazi Fəxrəddin Əbü'l-Fəzl Muhəmməd ibn Əhməd ibn Həsən ibn Əli əl-Həddadi Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. Əbu Nəsr Muhəmməd ibn Muhəmməd əz-Zeynəbi və başqalarından hədis dinləmişdi. Böyük Səlcuqlu imperatoru Səncərin (1118-1157) və Atabəy Şəmsəddin Eldənizin (1136-1175) hakimiyyəti dövründə Təbriz şəhərinin qazisi və xətibi olmuşdu. Tarixçi alim Əbü'l-Qasım Əli ibn Əsakir (öl. 1175) qazi Əbü'l-Fəzl Muhəmməd Təbrizinin bu şəhərdəki mədrəsələrdə tədrislə də məşğul olduğunu qeyd etmişdir[1461]. Alimin ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır. Mənbələrdə "əl-Həddadi" nisbəsi ilə tanınan bir neçə fəqih və qaziyə rast

---

[1459] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 299-300; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. II, s. 156; İBN MAKULA, *İkmal*, C. I, s. 142.

[1460] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 999.

[1461] İBN ƏSAKİR, *Mu'cəmü'ş-Şüyux*, s. 217, 286; BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 484.

gəlinir. Bu soyadı (nisbəni) eyni nəslə mənsub şəxslər daşımışdırlar və bu ailədən bir çox alim çıxmışdı[1462]. Bunlardan bəziləri haqqında burada məlumat verilmişdir.

**Qaziü'l-quzat seyyidü's-şərif Şəmsəddin Muhəmməd ibn Əbdüləvvəl əl-Cə'fəri əl-Hüseyni Təbrizi**

İmam Hüseynin (ᶦ) nəslindən olan, şafi'i məzhəbinə mənsub fəqih idi. Təbrizdə böyük hörmət sahibi alimlərdən biri olmuşdu. Molla Muhəmməd Barlasidən fiqh öyrənmişdi. Bir müddət Azərbaycandakı mədrəsələrdə tədrislə məşğul olmuş, sonra Osmanlı torpaqlarına köçmüşdü. Anadolunun müxtəlif şəhərlərindəki mədrəsələrdə dərs vermişdi. Burada olduğu vaxt hənəfi məzhəbini mənimsəmişdi. İstanbulda Səmaniyyə mədrəsəsində müəllim olmuş, h. 949-cu ildə (1542) Hələb qaziliyinə, daha sonra isə Dəməşq qaziliyinə təyin olunmuşdu. H. 952-ci ilin rəbiülaxir ayında (iyun 1545) Dəməşqə gələrək vəzifəsinin icrasına başlamışdı. O, bu vəzifədə ikən bəzi fəqihlər qəhvənin satışı və istehlakının haram elan edilməsi ilə bağlı fətva çıxarmışdılar. Lakin bu qərar birmənalı qarşılanmamış, digər bəzi fəqihlər bu fətvanın İslam hüququna zidd olması səbəbiylə ləğv olunması tələbi ilə çıxış etmişdilər. Qərarın ləğv olunması tələbi ilə sultan Qanuni I Süleymana (1520-1566) müraciət edən fəqihlərin arasında qazi Şəmsəddin Muhəmməd ibn Əbdüləvvəl Təbrizi də var idi. Beləcə h. 953-cü ilin şəvval ayında (dekabr 1546) qəhvənin idxalı, satışı və istehlakına qoyulan qadağa ləğv olunmuşdu. Qazi Şəmsəddin Muhəmməd Təbrizi dərin biliyə, yüksək natiqlik qabiliyyətəni malik olan alim idi. O, həm də mahir xəttat idi və gözəl xəttlə yazı yazırdı. Alim h. 963-cü ildə (1556) İstanbulda vəfat etmişdi[1463].

Burada hadisələrin baş verdiyi tarix və yerlə bağlı bəzi məsələlərə aydınlıq gətirməyə ehtiyac var. İbnü'l-İmad öz əsərində qazi Şəmsəddin Muhəmməd Təbrizinin Dəməşq qaziliyinə təyini tarixini qeyd edir, lakin hansı tarixə qədər bu vəzifəni icra etdiyini yazmır. Bununla belə yenə onun əsərindən alimin İstanbulda vəfat etdiyini öyrənirik. Ehtimal ki, qazi Şəmsəddin Muhəmməd Təbrizi Dəməşq qazisi ikən Şam vilayətindəki bəzi fəqihlər tərəfindən sadəcə Şam vilayətinə şamil edilən qəhvə qadağasına dair fətva

---

[1462] Bax: BÜNYADOV, *Azərbaycan Atabəyləri Dövləti*, s. 183.
[1463] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s.193.

çıxarılmışdı. Hələ Osmanlı hakimiyyətindən əvvəl, Misir Məmlüklüləri dövründə də Hicaza şamil edilən qəhvə qadağası mövcud olmuşdu. Məmlüklülərin Məkkə valisi Xeyir bəy qəhvə içilməsinin haram olduğuna dair fətva çıxartdırıb bu şəhərin din alimlərinə təsdiq etdirmişdi. Sadəcə Məkkə qazisi belə bir qadağanın İslam hüququnda heç bir əsası olmadığını bildirərək fətvanı təsdiq etməkdən imtina etmişdi. Osmanlı ölkəsində isə qəhvə istehlakı məhz Misirin fəthindən (1517) sonra yayılmağa başlamışdı. İbrahim Peçevi öz əsərində h. 962-ci (1555) ilə qədər İstanbulda və bütün Osmanlı ölkəsində qəhvə istehlakının olmadığını bildirməkdədir. Bu tarixdən sonra Suriyalı iki ərəb İstanbulda ilk qəhvəxananı açmışdılar. Bundan sonra İstanbulda qəhvəxanaların sayı sürətlə artımşdı. Belə ki, insanlar işi-gücü buraxıb qəhvəxanalara toplaşır, nərd, şahmat oynayıb qəzəl oxuyaraq vaxt öldürürdülər. Belə bir mənzərə fəqihlər və qazilərin şeyxülislama şikayət etmələrinə səbəb olmuş və şeyxülislam Əbu'S-Süud əfəndi qəhvə idxalı, satışı və istehlakını qadağan edən fətva çıxarmışdı[1464]. Bu qadağa 1589-ci ilə qədər qüvvədə qalmış, bu tarixdən sonra Bostanzadə Mehmed Əfəndi[1465] tərəfindən ləğv edilmişdi. Qazi Şəmsəddin Muhəmməd Təbrizin ölüm tarixi (1556) həmin bu qadağanın qüvvəyə mindiyi tarixə təsadüf edir. Yəni onun yaşadığı dövrdə bu qadağa ləğv olunmamış, əksinə 34 il qüvvədə qalmışdı. Buna görə də qazi Şəmsəddin Muhəmməd Təbrizinin etirazına səbəb olan qadağa qərarı sırf Şam vilayətinə şamil edilən qadağa olmalıdır. Çünki İbnü'l-İmad da bu qadağanın şeyx Yunis əl-Eysavi adlı bir alimin təşəbbüsü ilə meydana çıxdığını qeyd etmişdir[1466].

**Əbu Bəkr Sədiq ibn Osman ibn İbrahim əd-Dibaci Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Bağdadda təhsil almış, Əbu Abdullah Hüseyn ibn Əhməd ibn Təlhə ən-Nəali Bağdadinin tələbəsi olmuşdu. Tarixçi alim Əbü'l-Qasım Əli ibn Əsakir onun Təbrizdə fiqh dərsləri verdiyini, özünün də bu dərslərdə iştirak etdiyini qeyd etmişdir.[1467]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

---

[1464] PEÇEVİ, *Tarixi-Peçevi*, C. I, s. 363-364. Əbu's-Süud Əfəndi (1545-1574) 15-ci Osmanlı şeyxülislamıdır.
[1465] Bostanzadə Mehmed Əfəndi (1589-1592) 21-ci Osmanlı şeyxülislamıdır.
[1466] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s.193.
[1467] İBN ƏSAKİR, *Mu'cəmü'ş-Şüyux*, s. 112; BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 485; C. III, s. 574.

**Naib İmadəddin Əbü'l-Həyat Xıdır ibn İbrahim ibn Muhəmməd əl-Mömini Təbrizi**

Yaşadığı dövrdə Azərbaycanın görkəmli şəxsiyyətlərindən və siyasi xadimlərindən biri olmuşdu. Alimliyi və müdriklilyi ilə tanınmışdı. H. 707-ci ildə (1307) Elxanilərin baş vəziri Rəşidəddin Fəzlullah Qəzvininin naibi, müavini olmuşdu. İbnü'l-Fuvati onun h. 710-cu ildə (1310) Bağdada getdiyini qeyd etmişdir. Əbü'l-Həyat Təbrizi həmçinin şair idi[1468].

**Katib Əbü'l-Fəzl Muhəmməd ibn Məmlan ibn Bikamiz ibn Mənuçöhr Təbrizi**

Katiblik və münşəat sənətinin böyük ustadların olan Əbü'l-Fəzl Muhəmməd Təbrizi həmçinin tarix və ədəbiyyat sahələrində də dərin elmi biliyə malik idi. O, çox sürətli yazı yazırdı. Onun bir gündə 16 dəftər yazı yazdığı deyilirdi. Gözəl əxlaqlı, mömin insan idi. Bağdaddakı alimlərlə yoldaşlıq edir, onların məclislərində iştirak edirdi. Əbü'l-Fəzl Muhəmməd Təbrizi h. 643-cü ildə (1245) 70 yaşında Bağdadda vəfat etmişdi[1469].

**Qazi Ümdətəddin Əbü'l-Müzəffər Əhməd ibn Əbdüllətif ibn Əhməd Təbrizi**

Şafi'i məzhəbinə mənsub tanınmış fəqih idi. Hikmət və fəzilət sahibi alim kimi tanınmış qazi Ümdətəddin Təbrizi həmçinin dövlət xadimi idi. İbnü'l-Fuvati h. 659-cu ildə (1261) onunla Azərbaycanda, Vəravi (indiki Meşkin) qalasında görüşdüyünü qeyd etmişdir. O, yüksək xitabət qabiliyyəti və parlaq zəkaya malik insan idi. Müxtəlif sahələrə aid risalə və kitabların müəllifi idi. Bunlardan biri də Qur'an təfsirinə dair "Məcməü'l-Əltaf fi'l-Cəmi' beyn Lətaifü'l-Bəsit və'l-Kəşşaf" adlı əsərdir[1470]. O, həmçinin istedadlı şair idi və farsca çox gözəl şerlər yazırdı. Onun şe'rlərinin bəzisi Elxanilərin baş vəziri

---

[1468] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 718-719.

[1469] SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. V, s. 43. Səlahəddin Səfədi onun atasının adını [مملاذ] Məmlaz olaraq yazmışdı. Biz bunu [مملان] Məmlan olaraq qeyd etdik. Çünki orta əsrlər Azərbaycan tarixində Məmlaz adına rast gəlinməmişdir. Məmlan adını daşıyan tarixi şəxsiyyətlərə isə rast gəlmək mümkündür. Məsələn Azərbaycan Rəvvadilər dövlətinin hökmdarlarından Əbu Mənsur Vəhsudanın atasının adı Məmlan idi. "Məmlan"ın "Məmlaz" kimi yazılması iki səbəbdən ola bilər. Birincisi ərəb olan Səlahəddin Səfədi bu qeyri-ərəb adla tanış olmadığı üçün müraciət etdiyi mənbədən yanlış köçürmüşdü. İkincisi Səlahəddin Səfədinin əsərini təhqiq edərək çapa hazırlayan Zəki Mustafa və Əhməd əl-Arnavut xətaya yol verərək [ن] "nun" hərfini [ذ] "za" kimi oxumuşdular. Belə ki, əlyazmalarda bu iki hərfin yazılışı bir-birinə çox bənzər olur.

[1470] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. II, s. 764.

Şəmsəddin Muhəmməd Cüveyninin mədhinə həsr olunmuşdu. Qazi Ümdətəddin Təbrizi Elxanilərin hakimiyyəti illərində Vəravi, Əhər, Sərab, Kəleybər, Bərgüşad şəhər və ətraf ərazilərin canişini vəzifəsinə təyin olunmuşdu[1471].

**Xətib Cəmaləddin Əbu Bəkr Əbdülqahir ibn Muhəmməd ibn Əbdülvahid ibn Muhəmməd ibn Musa əl-Hərrani Təbrizi**[1472]

Şafi'i məzhəbinə mənsub fəqih idi. Varlı tacir olan atası Təbrizdən Hərrana köçmüş və Cəmaləddin Təbrizi h. 648-ci ilin şaban ayının ortalarında (noyabr 1250) Hərranda[1473] dünyaya gəlmişdi. O, daha sonra ailəsi ilə birlikdə Dəməşqə köçmüşdü. Hələ azyaşlı uşaq ikən əvvəl anası sonra da atası vəfat edən Cəmaləddin Təbrizi əmisi Əbdülxaliq ibn Əbdülvahid Təbrizinin himayəsində böyümüşdü. O, Dəməşqədəki mədrəsələrdə fiqh oxumuş, Nəcməddin Muğani, Zeynəddin ibn Əmr, şeyx Tacəddin əl-Fizari, şeyx Yəhya əs-Səlavi və qaziü'l-quzat Bədrəddin ibn Cəmaənin tələbəsi olmuşdu. İbn Tağrıbirdi onun şeyx Şəmsəddin Hüseyn Sührəvərdinin müridi olduğunu qeyd etmişdir[1474]. Cəmaləddin Təbrizi gənclik yaşlarına çatandan sonra Hərrana gedərək atasının buradakı əmlakını 80 min dirhəmə[1475] sataraq Dəməşqə qayıtmışdı. O, Səfəd[1476] qaziliyinə təyin edilmiş, lakin cəmi bir neçə ay bu vəzifədə qalmışdı. Cəlaləddin Qəzvini baş qaziliyə təyin olunandan sonra Cəmaləddin Təbrizini Səfəd qaziliyi vəzifəsindən azad etmişdi. Cəmaləddin Təbrizi Misirə getmiş və müəllimi İbn Cəmaənin təşəbbüsü ilə Dimyat qaziliyinə təyin edilmişdi. Lakin Cəlaləddin Qəzvini Misirə gələndən sonra onun Dimyat qaziliyindən də azad edilməsini təmin etmişdi. Bu hadisədən sonra Cəmaləddin Təbrizi Suriyaya qayıtmışdı. Bədrəddin ibn Cəmaənin təşəbbüsü ilə yenidən Dimyat qaziliyinə təyin olunmuş və ömrünün sonuna qədər bu vəzifədə qalmışdı. O, zahirən yaraşıqı insan idi və güclü xitabət qabiliyyətinə malik idi. Cəmaləddin Təbrizi fəqih olmaqla yanaşı həm də şair idi. Alim h. 740-cı ilin

---

1471 İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 886.

1472 Şəmsəddin Zəhəbi alimin adını belə qeyd etmişdir: "Cəmaləddin Əbu Muhəmməd Əbdülqahir ibn Əbdülvahid ibn Muhəmməd Təbrizi", bax: *Mu'cəmü'ş-Şüyux*, C. II, s. 408.

1473 Hərran Türkiyənin cənubi-şərqində, bu gün Şanlıurfa vilayətində yerləşən qəsəbədir.

1474 İBN TAĞRIBİRDİ, *Mənhəlü's-Safi*, C. II, s. 138

1475 Dirhəm-2,975 gr gümüş pul.

1476 Səfəd Fələstinin qədim şəhərlərindən birdir. Hazırda İsrail işğalı altındadır (İsrail-Livan-Suriya sərhəddində) və Zefat adlanır.

cəmadiəlaxir ayında (dekabr 1339) Misirin Dimyat şəhərində vəfat etmişdi[1477]. Xeyrəddin Zirikli onun "Məcmuatü'l-Xutb" adlı əsərin müəllifi olduğunu qeyd etmişdir[1478].

**Qazi Qütbəddin Əbü'l-Fəzail Muhəmməd ibn Ömər ibnü'l-Fəzl Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. H. 668-ci ildə (1270) Təbrizdə anadan olmuşdu[1479]. Əxəveyn ləqəbi ilə tanınmışdı. Təbrizdə təhsil almış, Muhyəddin Əbu Muhəmməd Hüseyn Bəğəvinin (öl. 1122) "Şərhü's-Sünnə" adlı çoxcildli hədis külliyatını dinləmişdi. Qütbəddin Muhəmməd Təbrizi Bağdad qaziliyinə təyin olunmuşdu. O, fiqhlə yanaşı təfsir, üsul, məntiq, ərəb dili və xitabət kimi elm sahələrində dövrün tanınmış mütəxəssislərindən idi. O, həm də mahir xəttat idi, gözəl xəttlə yazı yazırdı. Bağdad Müstənsiriyyə mədrəsəsinin müdərrisi olmuş, bundan başqa Bağdaddakı bir neçə mədrəsədə də dərs vermişdi. O, gözəl əxlaqlı, yumuşaq xasiyyətli və təvazökar insan idi. Qütbəddin Təbrizi həm də xeyriyyəçi idi. Yoxsulları daim himayə edir, onlara maddi yardım göstərirdi. Alim h. 736-cı ilin məhərrəm ayında (sentyabr 1335) Bağdadda vəfat etmiş və evinin yaxınlığındakı türbədə dəfn edilmişdi[1480].

**Burhanəddin Übeydullah ibn Yusif Təbrizi**

Qahirəyə gəlmiş və bu şəhərdə məskunlaşmışdı. Şəmsəddin Səxavi, Übeydullah Təbrizi haqqında yazarkən "şeyximizdən dərs almışdır" deyə qeyd etmişdir[1481]. Şəmsəddin Səxavinin ən çox ehtiram bəslədiyi və rəğbət göstərdiyi müəllimi İbn Həcər Əsqəlani (1449) olmuşdur[1482]. Ehtimal ki, Burhanəddin Übeydullah Təbrizi İbn Həcər Əsqəlaninin tələbəsi olmuşdur. Yenə Səxavi onun haqqında yazarkən belə deyir:

---

[1477] SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. XXIV, s. 105-106; İBN ŞAKİR, *Fəvatü'l-Vəfayat*, C. I, s.328-329; İBN TAĞRIBİRDİ, *Nücumu'z-Zahirə*, C. III, s. 288; *Mənhəlü's-Safi*, C. II, s. 138; MƏQRİZİ, *Kitabu's-Süluk*, C. II, s. 40.
[1478] ZİRİKLİ, *Ə'lam*, C. IV, s. 64.
[1479] Məhəmməd Əli Tərbiyət, İbn Həcər Əsqəlaninin əsərinə istinad edərək onun h. 680-ci ildə (1281) anadan olduğunu qeyd edir. Bax: *Danişməndani-Azərbaycan*, s. 139. Halbuki həmin əsərdə Qütbəddin Muhəmməd Təbrizinin h. 668-ci ildə (1270) anadan olduğu qeyd edilmişdir.
[1480] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 390; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 281; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VI, s. 645; SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. IV, s. 682-683. Səlahəddin Səfədi qazi Qütbəddin Təbrizinin h. 730-cu (1330) ildə vəfat etdiyini qeyd etmişdir.
[1481] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 494.
[1482] ŞEŞEN, *həmin əsər*, s. 223-224.

"şeyximiz onu (yəni Burhanəddin Übeydullahı) tövsif edərkən "imam, əllamə, tədiqiqatçıların yeganəsi, Burhanəddin ibn imam İzzəddin" demişdi"[1483]. Bizim fikrimizcə Burhanəddin Übeydullah şeyx İzzəddin Yusif əs-Sarayi Təbrizinin (öl. 1402) oğlu idi. Çünki həmin dövrdə "imam İzzəddin Təbrizi" adlı başqa bir alimə rast gəlmək mümkün olmamışdır. Burhanəddin Übeydullah Təbrizinin ölüm tarixi məlum deyil. XV əsrdə yaşamışdır.

**Mövlana Şəmsəddin Muhəmməd ibn Əhməd ibn Hacı Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih və qari idi. Təbrizdə dünyaya gəlmiş və təvəllüdü h. 755-ci ildən (1354) əvvələ təsadüf edir. Dəməşqdə yaşamış və bu şəhərdə İbn Əzibə ləqəbi ilə tanınmışdı. Mövlana Şəmsəddin Təbrizi tacir idi və ticarət məqsədiylə İran, Anadolu, Hindistan, Yəmən və Hicaza səfərlər etmişdi. Getdiyi ölkələrdəki məşhur alimlərdən ərəb filologiyası, qiraət, fiqh və hədis elmlərinə dair dərslər almışdı. Misirdə Cəmaləddin Əbu Muhəmməd Əbdürrəhim ibn Həsən Əsnəvi (öl. 1370), Hələbdə Şihabəddin Əbü'l-Abbas Əhməd ibn Həmdan əl-Əzrai (öl. 1381), Dəməşqdə İmadəddin İsmayıl ibn Ömər İbn Kəsir (öl. 1373) və Təqiyəddin Muhəmməd ibn Rafi' (öl. 1372) ilə görüşmüşdü. O, zəngin şəxsi kitabxanaya malik idi. H. 795-ci ildə (1393) Qüds şəhərinə getmişdi. İki il burada qaldıqdan sonra Məkkəyə getmişdi. Mövlana Şəmsəddin Təbrizi mömin, çox ibadət və zikr edən, fəzilətli və saleh insan idi. Elmi və elm əhlini sevər, alimlərə ehtiram göstərərdi. O, ərəb dili, qiraət və təfsir dərsləri vermişdi. H. 835-ci ilin məhərrəm ayında (sentyabr 1431) Məkkədə uzun sürən xəstəlikdən sonra vəfat etmişdi[1484].

**Şeyx Ümdətəddin Əbu Mənsur Muhəmməd ibn Əsəd ibn Muhəmməd ibn Cə'fər ət-Tusi Təbrizi**

Mühəddis idi. H. 486-cı ildə (1093) Xorasanın Tus şəhərində anadan olmuşdu. Tusda Əbu Hamid Qəzzalinin tələbəsi olmuş, ondan şafi'i fiqhini öyrənmişdi. Daha sonra Mərvə getmiş, Muhəmməd ibn Mənsur əs-Səm'aninin tələbəsi olmuşdu. Mərvərrudda

---

[1483] SƏXAVİ, *həmin əsər,* C. II, s. 494.
[1484] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. III, s. 328.

Hüseyn ibn Məs'ud Bəğəvi, Əbdülqəffar əş-Şirazi, Hüseyn ibn Məs'ud əl-Fərradan hədis dərsləri almışdı. H. 551-ci ildə (1156) Bağdada gəlmiş və bu şəhərdə hədis dərsləri vermişdi. Daha sonra Təbrizə getmiş, Təbriz mədrəsələrində hədis dərsləri vermiş, h. 573-cü ilin rəcəb ayında (yanvar 1178) bu şəhərdə vəfat etmişdir. Əbu Əhməd Əbdülvəhhab ibn Səkinə onun tələbələri arasından yetişmiş mühəddislərdəndir. "Şərhü's-Sünnə" və "Məalimü't-Tənzil" şeyx Ümdətəddin Təbrizinin qələmindən çıxmış məşhur əsərlərdir[1485].

**Seyyidü'ş-şərif Şəmsəddin Muhəmməd ibn Muhəmməd ibn Abdullah ibn Muhəmməd əş-Şafi'i Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. O, ata və ana tərəfindən imam Hüseyn (ع) və imam Həsənin (ع) nəslindən idi. Öz dövrünün tanınmış alimlərindən biri olan seyyid Şəmsəddin Muhəmməd Təbrizi h. 881-ci ildə (1476) 65 yaşında Məkkədə vəfat etmişdi[1486].

**Fəxrəddin Əbü'l-Məali Muhəmməd ibn Muhəmməd ibn Muhəmməd ibn Yusif əl-Əxlati Təbrizi**

Qari, xəttat və katib idi. Təbrizdə məskunlaşmış, bu şəhərdə yaşamışdı. İbnü'l-Fuvati onunla h. 664-cü ildə (1266) Təbrizdə görüşdüyünü qeyd etmişdir. Onun Təbrizin Meydan məhəlləsində sahib Şəmsəddin ibn Muhəmməd ibn Muhəmməd Cüveyninin[1487] tikdirdiyi Darü'z-Ziyafə ilə üzbəüz məscidin bitişiyində tələbələrinə Qur'ani-Kərim qiraət və təcvidini öyrətdiyi məktəbi var idi. İbnü'l-Fuvati Fəxrəddin Əbü'l-Məali Əxlatinin xoşsima və mülayim insan olduğunu, onun məktəbində son Abbasi xəlifəsi Müstə'sim Billahın (1242-1258) nəvələrini gördüyünü qeyd etmişdir.

---

[1485] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 897.

[1486] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VII, s. 875.

[1487] Şəmsəddin Muhəmməd ibn Muhəmməd Cüveyni (öl. 1284) Elxani hökmdarlarından ilk üçünün Hülagü xan (1258-1265), Əhməd xan Təküdar (1262-1282) və Abaqa xanın (1282-1284) sahibi-divanı, baş vəziri olmuşdu. O, məşhur tarixçi, "Tarixi-Cahanquşa"nın müəllifi, Əlaəddin Əta-Məlik Cüveyninin (öl. 1283) qardaşı idi. Bax: *İstoriya İrana s Drevneyşix Vremyon do Kontsa XVIII veka*, s. 366.

Müəllif həmçinin Fəxrəddin Əxlatinin şeyx Əbu İshaq ibn Şəhriyar əl-Kazeruninin[1488] təriqətinə mənsub olduğunu qeyd etmişdir[1489].

**Şeyx Əminəddin Əbu'l-Xeyr Müzəffər ibn Əbu Muhəmməd ibn İsmayıl ibn Əli əl-Varani Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. H. 558-ci ildə (1163) anadan olmuşdu. Mosulda Əbü'l-Müzəffər Muhəmmədin tələbəsi olmuşdu. Daha sonra Bağdadda Nizamiyyə mədrəsəsində təhsil almış, Əbü'l-Qasım ibn Fəzlandan fiqh elmini öyrənmişdi. Əbu Əhməd ibn Səkinə və Əbü'l-Fərəc ibn Kuleybdən hədis dinləmişdi. Daha sonra həcc ziyarətinə getmiş, həccdən sonra Misirə getmişdi. Misirdə Nasiriyyə və Səlahiyyə mədrəsələrində dərs vermişdi. Əminəddin Müzəffər Təbrizi fiqh və fiqh üsulu sahələrində dərinləşmiş abid və zahid insan idi. Qahirədə Şərifiyyə məscidinin yaxınlığında yaşayırdı. Burada fətva mərcii idi. Tez-tez elmi diskussiyalarda iştirak edirdi. Çox mütaliə edir və risalələr qələmə alırdı. O, fiqh və ərəb dilinin qrammatikasına dair üç cildlik "Səmtu'l-Fəvaid" adlı bir əsər qələmə almışdı. "əl-Məhsul"[1490] adlı əsəri ixtisar və icmal etmişdi. Onun bu əsəri "əl-Müxtəsər" adı ilə məşhur olmuş və mədrəsələrdə dərslik kimi istifadə olunmuşdu. Əbu Hamid Qəzzalinin "əl-Vəciz" adlı əsərinə giriş yazmışdı. "Simkü'l-Fəraiz" və "Sibtü'l-Məsail" adlı əsərlər də Əminəddin Təbrizinin qələmindən çıxmış əsərlərdir. Onun tələbələri arasından hafiz Zəkiəddin əl-Mənzəri kimi tanınmış alimlər yetişmişdi. Ölümündən bir müddət əvvəl İraqa, daha sonra İrana getmiş və h. 621-ci ilin zilhiccə ayında (1224) Şiraz şəhərində vəfat etmişdi[1491].

---

[1488] Şeyx Əbu İshaq ibn Şəhriyar Kazeruni (öl. 1034) Şiraz yaxınlığındakı Kazerun qəsəbəsində dünyaya gəlmişdi. Babası məcusi olsa da atası İslamı qəbul etmişdi. Mənbələrdə qeyd edildiyinə görə şeyx Əbü'l-İshaq Kazeruni minlərlə məcusinin İslamı qəbul etməsinə səbəb olmuşdu. Onun ətrafında böyük bir mürid kütləsi toplanmışdı. Ölümündən sonra müridlərinin səyi ilə onun adı ilə, Kazeruniyyə adlanan təriqət qurulmuşdu. Bu təriqət həmçinin İshaqiyyə və Mürşidiyyə adı ilə də tanınmışdı. Kazeruniyyə təriqəti XII-XVI əsrlərdə İran, Azərbaycan və Anadoluda ən çox mənsubu olan təriqətlərdən biri idi. Şeyx Əbu İshaq Kazeruni və Kazeruniyyə təriqəti haqqanda ətraflı məlumat üçün bax: CAMİ, *Nəfəhatü'l-Üns*, s. 297; Kadir ÖZKÖSE, "Anadolu'nun Türkleşmesi ve İslamlaşmasında Tasavvuf Zümre ve Akımlarının Rolü", **CÜİFD**, C. VII/1, Sivas 2003, s. 249-279.

[1489] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 371.

[1490] əl-Məhsul-Fəxrəddin Razinin kəlam elminə dair əsəridir.

[1491] SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VIII, s. 206; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. III, s. 81; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. II, s. 151-152; İBNü's-SABUNİ, *Təkmilətü'l-İkmal*, s. 53; SÜYUTİ, *Hüsnü'l-Mühazirə*, s. 218; KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. II, s. 35, 67, 794; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 893.

**Şeyx Fəxrəddin Əbu Cə'fər Ömər ibn Əhməd ibn Ömər Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. Onun atası şeyxü'l-arif Nəcməddin Təbrizi də yaşadığı dövrün tanınmış fiqh, hədis və təfsir alimlərindən idi. Fəxrəddin Ömər Təbrizi atası Nəcməddin Təbrizi, imam Zəhirəddin Ramazan ibn Muhəmməd Təbrizi, Ümdətəddin Muhəmməd ibn Əsəd əl-Əttari kimi alimlərdən dərs almışdı. O, bu alimlərin yanında imam Muhyəddin Hüseyn Bəğəvinin (öl. 1122) "Şərhü's-Sünnə" adlı çoxcildli hədis külliyatını, imam Məcdəddin Əbü's-Səadə ibnü'l-Əsir əl-Cəzəri Məvsilinin "Cəmiü'l-Üsul" adlı hədis külliyatını, şeyx Şihabəddin Ömər Sührəvərdinin "Əvarifü'l-Məarif" adlı əsərini, həmçinin bu alimlərin özlərinin müəllifi olduqları əsərləri oxuyub öyrənmişdi. İbnü'l-Fuvati, Fəxrəddin Ömər Təbrizi ilə Təbrizin cümə camesində görüşdüyünü, həmçinin onun atası şeyxü'l-arif Nəcməddin Təbrizini də gördüyünü qeyd etmişdir[1492]. Əfsus ki, müəllif onlarla neçənci ildə görüşdüyünü və vəfat tarixlərini qeyd etməmişdir. Lakin İbnü'l-Fuvatinin 1260-cı illərdən 1280-ci ilə qədər, daha sonra 1304, 1310-1311, 1316-1318-ci illərdə Azərbaycanda olduğunu[1493] nəzərə alaraq bu görüşün də həmin bu illərdə baş verdiyini təxmin etmək olar.

**Əbü's-Səfa Xəlil ibn Əhməd ibn Xəlil Təbrizi**

Təsəvvüf əhlinə mənsub mühəddis idi. Əbü's-Səfa Xəlil Təbrizinin təvəllüdü h. 560-cı illərə (1165-1175) təsadüf edir. Təhsil almaq məqsədiylə Dəməşqə getmiş və burada Əbu Həfs ibn Təbərzəddən hədis dərsləri almışdı. Təhsili başa vurduqdan sonra Dəməşqdə qalmış və tədrislə məşğul olmuşdu. Əbü's-Səfa Xəlil Təbrizi h. 27 şəvval 655-ci ildə (6 noyabr 1257) Dəməşqdə vəfat etmiş və buradakı Sufiyyə qəbristanında dəfn edilmişdi[1494].

**Qazi Əbü'l-Hüseyn Budeyl ibn Əli Təbrizi**

---

[1492] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 266.
[1493] ŞEŞEN, *həmin əsər*, s. 237.
[1494] İBNü's-SABUNİ, *Təkmilətü'l-İkmal*, s. 25.

Şafi'i məzhəbinə mənsub fəqih və mütəkəllim idi. Təhsil almaq üçün Bağdad getmiş və burada şeyxülislam Əbu İshaq İbrahim Şirazidən fiqh, fiqh üsulu və xilaf (müqayisəli hüquq) elmlərini öyrənmişdi. O, həmçinin ərəb ədəbiyyatı üzrə mütəxəssis idi. Təhsilini başa vurduqdan sonra Təbrizə qayıtmış, burada tədrislə məşğul olmuşdu. Təbriz yaxınlığındakı vilayətlərdən birinin qaziliyinə də təyin olunmuşdu[1495]. Ölüm tarixi məlum deyil. Şeyxülislam Əbu İshaq Şirazinin tələbəsi olduğuna görə onun XI-XII əsrlərdə yaşadığını təxmin etmək olar.

**Şeyx Kəmaləddin Təbrizi**

İbnü'l-İmad öz əsərində onun tədqiqatçı alim və saleh insan kimi tövsif etmiş, Dəməşqdə yaşadığını və təsəvvüf əhlindən olduğunu qeyd etmişdi. O, geyiminə xüsusi diqqət yetirir, daim təmiz və gözəl geyinirdi. Şeyx Kəmaləddin Təbrizi h. 957-ci ilin rəbiəlaxir ayında (1550) Dəməşqdə vəfat etmişdi[1496].

**Şeyx Tacəddin Əbdürrəhman ibn Muhəmməd Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih və vaiz idi. H. 661-ci ildə (1263) anadan olmuşdu. Təbriz şəhərinin şeyxi idi və Əfzəli ləqəbi ilə tanınırdı. O, abid, zahid, saleh əməlli, mübarək insan idi. Səlahəddin Səfədi şeyx Tacəddin Əbdürrəhman Təbrizinin sələfi-salehinin etiqadına sıx bağlı olduğunu qeyd etmişdi[1497]. Şeyx Tacəddin Təbrizi Elxanilərin baş vəziri Rəşidəddinin[1498] üsuli-idarəsini daim tənqid edir, onun əleyhinə çıxışlar edirdi. Vəzir Rəşidəddin müxtəlif yollarla şeyx Tacəddin Əbdürrəhman Təbrizini ələ almaq və öz tərəfinə çəkmək istəmişdi. Lakin şeyx Tacəddin Təbrizi gözütox insan olduğu üçün

---

[1495] SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. X, s. 63.
[1496] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s. 181.
[1497] SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. III, s. 37.
[1498] Rəşidəddin Fəzlullah ibn Əbü'l-Xeyr Əli Həmədani (1247—1318) Elxani hökmdarlarından Qazan xan və Olcaytu xanın baş vəziri olmuşdur. Mənşəcə yəhudi idi, sonradan İslamı qəbul etmişdi. O, Qazan xanın məşhur islahatlarının ideya müəllifi idi. Vəzir Rəşidəddin Fəzlullah həm də həkim və varlı tacir idi. Onun İran, İraq və Azərbaycanın bir çox şəhərlərində, hətta o vaxt hələ Bizansın paytaxtı olan İstanbulda, ticarət müəssisələri var idi. Rəşidəddin Fəzlullahdan sadəcə nəqd pul olaraq qalan mirasın məbləği 37. 500. 000 dinar (1 dinar=4,25 gr qızıl) idi. Rəşidəddin Fəzlullah daim korrupsiyada, xalqın və dövlətin əmlakını talamaqla suçlanmışdı. Nəhayət, başda Tacəddin Şərəf Əlişah Təbrizi olmaqla, rəqibləri onu Olcaytu xanı müalicə bəhanəsi ilə (Rəşidəddin Fəzlullahın əsl ixtisası həkimlik idi) zəhərləyərək öldürməkdə ittiham edib 1318-ci ildə qılıncla (şaquli) iki yerə bölünərək edam edilməsinə və əmlakının müsadirə edilməsinə nail olmuşdular. Ətraflı məlumat üçün bax: ONULLAHİ, XIII-XVII Əsrlərdə Təbriz Şəhəri, s. 58; *İstoriya İrana s Drevneyşix Vremyon do Kontsa XVIII veka*, s. 207

vəzirin bütün cəhdləri boşa çıxmışdı. Ümumiyyətlə şeyx Tacəddin Təbrizi heç bir səlahiyyət sahibinə meyl etməmiş və heç kimdən heç bir iltimas qəbul etməmişdi. Vəzir Rəşidəddin xidmət etdiyi moğolların qəzəbinə gələrək edam ediləndən sonra şeyx Tacəddin Əbdürrəhman Təbrizi "onun öldürülməsi 100 min səlibçinin öldürülməsindən daha xeyirli olmuşdur" demişdi. Şeyx Tacəddin Əbdürrəhman Təbrizi atası imam Əfzələddin Əbu Hamid Muhəmməd Təbrizi və öz oğulları ilə birlikdə həcc ziyarətinə getmişdi. Həcc ziyarətinə gedərkən bir müddət Dəməşqdə qalmış, ehtimal ki, buradakı alimlərlə görüşmüşdü. Alim h. 719-cu ilin səfər ayının ilk ongünlüyündə (24 mart-2 aprel 1319) həcc ziyarətindən qayıdarkən Bağdadda, 58 yaşında ikən vəfat etmiş və Şunuziyyə qəbristanında dəfn edilmişdi[1499].

**Xacə Şeyxi ibn Muhəmməd ibn Əli Təbrizi**

Tarixçi idi. Məkkədə yaşamış və İbn Fəhddən tarix dərsləri almışdı. H. 865-ci ildə (1461) Məkkədə vəfat etmişdi[1500].

**Vaiz Fəxrəddin Əbü'l-Fəzl İsmayıl ibnü'l-Müsənna Təbrizi**

Şafi'i məzhəbinə mənsub vaiz, tarixçi və fəqih idi. Fəzilət və alicənablağı ilə tanınmış vaiz Fəxrəddin Təbrizi gözəl nitq və xitabət qabilyətinə malik idi. Şafi'i məzhəbinin tanınmış alimlərindən imam Sədrəddin Əbu Bəkr Muhəmməd ibn Əldülləfit Xocəndi (öl. 1154) h. 543-cü ildə (1148) Təbrizə gəldiyi vaxt onunla görüşmüş, onu təriflämiş və təqdir etmişdi. Ona olan heyranlığını imam Sədrəddin Əbu Bəkr Xocəndi aşağıdakı beytlə dilə gətirmişdi:

Salət əni'l-mubərriz fi'l-məani سألت عن المبرّز في المعاني

Bi Təbriz fəqalu ibnü'l-Musənnə بتبريز فقالوا ابن المثنَّى

Fəqalət fəhl ləhu san iləyh فقالت فهل له ثان يليه

Fəqal huvə'l-vəhid fələyisənnə فقال هو الوحيد فلايثنّى

---

1499 İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 170; SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. III, s. 37; İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 3-4; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VI, s. 606.

1500 SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s.176.

"Təbrizin əsl, bariz şəxsiyyətini soruşdum, İbnü'l-Müsənna dedilər, onun sanında başqası varmı dedim? Yoxdur, o yeganədir dedilər". Fəxrəddin İsmayıl Təbrizi həmçinin "Tarixi-Azərbaycan"[1501] adlı bir əsərin də müəllifi idi. Alim h. 580-ci ildə (1184) vəfat etmişdi[1502].

**Şeyx Ziyaəddin Ziya ibn İmadəddin Təbrizi**

Mühəddis idi. O, hədis elmindəki dərin biliyi ilə yanaşı fəzilətli, saleh və mömin insan kimi tanınmışdı. Onun dərslərinə çox sayıda tələbə toplanırdı. Kəlam və fəlsəfə ilə məşğul olanların onun belə izdihamlı tələbə qruplarına dərs verməsindən xoşları gəlmirdi. Buna görə də Ziyaəddin Təbrizi ilə fəlsəfəçilər arasında münafirət var idi. Alim h. 801-ci ildə (1399) vəfat etmişdi[1503].

**Fələkəddin Əbü'l-Məali Abdullah ibn Əli ibn Muhəmməd Təbrizi**

Fələkəddin Əbü'l-Məali yaşadığı dövrdə Azərbaycanın görkəmli mütəfəkkiri, filologiya, kəlam və məntiq sahəsində tanınmış mütəxəssisi olmaqla yanaşı həm də Təbriz şəhərinin idarəçiliyində mühüm rol oynamışdır. İbnü'l-Fuvati Fələkəddin Əbü'l-Məali Təbrizini "katib, hikmət və fəzilət sahibi insan" kimi sözlərlə tövsif etmişdir. Fələkəddin Əbü'l-Məali gözəl əxlaqlı, bacarıqlı alim idi. O, bir sıra risalələrin müəllifi idi. O, həmçinin Elxanilərin vəziri Rəşidəddin Fəzlullahın (öl. 1318) "Təvzihatü'r-Rəşidiyyə" adlı əsərinə geniş və gözəl bir şərh yazmışdı[1504]. İbnü'l-Fuvati (öl. 1323) Fələkəddin Əbü'l-Məalini Təbrizdə gördüyünü yazmışdır. Lakin onun ölüm tarixi barədə hər hansı bir məlumat verməmişdir. Fələkəddin Əbü'l-Məali Təbrizi

---

[1501] Şübhəsiz bu əsər həm Azərbaycan Atabəyləri, həm də ümumiyyətlə Azərbaycan tarixi haqqında çox qiymətli əsərdir. Fəqət mərhum akademik Z. Bünyadovun da qeyd etdiyi kimi bu əsər dövrümüzə qədər gəlib çatmamışdır. Yaxud da əlyazması hələ ki, tapılmamışdır.

[1502] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 117-118. Mərhum akademik Ziya Bünyadov, Fəxrəddin Əbü'l-Fəzl İsmayıl ibn Müsənna Təbrizi haqqında məlumat verərkən yazmışdır: "Görkəmli şəxsiyyətlərin kartotekasını tərtib edən İbnü'l-Fuvati yazır: "Mən Təbrizdə tam mənasında görkəmli şəxsiyyətlər barəsində soruşanda mənə İbnü'l-Müsənnanın adını çəkdilər......... " (bax: *Azərbaycan Atabəyləri Dövləti*, s. 230). Yəni yuxarıda qeyd etdiyimiz şe'rdəki mənanın İbnü'l-Fuvati tərəfindən ifadə edildiyini bildirmişdir. 1244-1323-cü illərdə yaşamış İbnü'l-Fuvatinin 1184-cü ildə ölmüş Fəxrəddin Əbü'l-Fəzl Təbrizinin müasiri olması mümkün deyil. Mətndən də görüldüyü kimi Fəxrəddin Əbü'l-Fəzl Təbrizi haqqında soruşub bu məlumatı alan İbnü'l-Fuvati deyil 1148-ci ildə Təbrizə səyahət etmiş imam Sədrəddin Əbu Bəkr Xocəndi (öl. 1154) olmuşdur.

[1503] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 187.

[1504] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 502-503.

filologiyaya dair "Hadiyyət ilə Həlli'l-Kafiyyə" və "Zəvabitü'l-Kafiyyə" adlı əsərlərin müəllifi idi[1505]. Alimin XIII-XIV əsrlərdə yaşadığını təxmin etmək olar.

**Katib Fəxrəddin Əbü'l-Fərəc Əhməd ibn Xəttab Təbrizi**

Alim və fəizlətli insan idi və İbnü'ş-Şəva adı ilə tanınmışdı. Elxanilər dövləti (1256-1335) ordusunda katib vəzifəsinə təyin olunmuşdu. Onun atası Təbrizin əyan və əşraf zümrəsinə mənsub idi. Bir müddət Bağdadda Səfiyəddin Əbdülmömin Urməvinin[1506] xidmətində olmuşdu. Onun xidmətində olduğu dövrdə maddi imkanları artmışdı. İbnü'l-Fuvati əsərində onu xeyir-dua ilə yad etmkdədir[1507]. Təəssüf ki, müəllif onun təvəllüd və ya ölüm tarixini qeyd etməmişdi. Katib Fəxrəddin Əhməd Təbrizi təqribən XIII-XIV əsrlərdə yaşamışdır.

**Katib Fəxrəddin Əbü'l-Məkarim Əhməd ibn Abdullah ibn Ömər ibn Muhəmməd ibn Hüseyn əş-Şərif əl-Hüseyni Təbrizi**

İmam Hüseynin (ع) nəslindən idi. O, alim ailəsində dünyaya gəlmişdi. Atası qazi Məcdəddin Abdullah Mərəndi Təbrizin şafi'i məzhəbinə mənsub tanınmış alimlərindən idi. Fəxrəddin Əbü'l-Məkarim yaxşı təhsil almışdı. Biliyi və bacarığı ilə Təbrizin əyan və əşrafı arasında hörmət qazanmışdı. O, bir müddət Bağdadda yaşamış və bu şəhərin alimlərinin yanında müxtəlif elm sahələrinə dair biliklərə yiyələnmişdi. Elxanilər dövlətində divan katibi və mühasiblik vəzifələrinə təyin olunmuşdu. Katib Fəxrəddin Əbü'l-Məkarim Əhməd Təbrizi Təbriz qazisi Nasirəddin Bəyzavinin (öl. 1289) əsərini "Müxtəsər Mənhəcü'l-Vüsul ilə İlmə'l-Üsul" adlı ilə ixtisar etmişdi[1508]. Alim h. 719-cu ilin ramazan ayında (oktyabr 1319) vəfat etmişdi[1509].

---

1505 KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 263. Bu iki əsər İbnü'l-Hacib Düveyninin "Kafiyyə fi'n-Nəhv" adlı əsərinə yazılmış şərh və təəllüqdür.

1506 Səfiyəddin Əbdülmömin ibn Yusif ibn Faxir Urməvi (öl. 1293) azərbaycanlı məşhur xəttat, bəstəkar və musiqişünas.

1507 İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 79.

1508 KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. II, s. 1067. Katib Çələbi Fəxrəddin Əbü'l-Məkarim Təbrizinin adını "Əhməd ibn Həsən" olaraq qeyd etmiş və h. 746-cı ildə (1345) vəfat etdiyini yazmışdır.

1509 İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 85.

**Şeyx Nəcməddin Tahir ibn Əbu Bəkr ibn Mahmud ibn Səid Təbrizi**

Mühəddis idi. Dəməşqdə təhsil almış, bu şəhərin hafiz Yusif əl-Mizzi (öl. 1341), Şəmsəddin Muhəmməd əl-Cəzəri (öl. 1338) kimi tanınmış mühəddislərindən hədis dinləmişdi. Şeyx Həccardan[1510] "Səhihi-Buxari"ni və hədislərin şərhini dinləmişdi. İbn Həcər Əsqəlani onun haqqında məlumat verərkən onun təsəvvüf əhlinə mənsub olduğunu və Sümeysatiyyə xanəgahında yaşadığını qeyd etmişdi. Şeyx Nəcməddin Tahir Təbrizi h. 17 səfər 774-cü ildə (17 avqust 1372) 84 yaşında Dəməşqdə vəfat etmiş və Qasiyyun qəbristanında dəfn edilmişdi[1511]. Onunla eyni dövrdə məşhur mühəddis, müfəssir və tarixçi İbn Kəsir də Dəməşqdəki Əşrəfiyyə hədis mədrəsəsində şeyx Həccarın hədis dərslərini dinləmişdi. Şeyx Nəcməddin Tahir Təbrizi ilə İbn Kəsirin tələbə yoldaşı olduğu ehtimalı var.

**Şeyx Tacəddin Əbu Bəkr Əli ibn Abdullah ibn Hüseyn ibn Əbu Bəkr əl-Ərdəbili Təbrizi**

Yaşadığı dövrün tanınmış şafi'i alimlərindən idi. H. 667-ci ildə (1269) anadan olmuşdu. Ərdəbildə dünyaya gələn Tacəddin Əli Təbrizdə böyümüş və burada təhsil almışdı. Təbriz mədrəsələrində Qütbəddin Şirazi, Cəmaləddin Həsən Şirazi, Şəmsəddin ibnü'l-Müəzzin, Nizaməddin Tusi, Əlaəddin Nu'man əl-Xarəzmi, seyyid Rüknəddin Ərdəbili və Siracəddin Ərdəbili kimi alimlərdən dərs almışdı. Bu alimlərdən fiqh, fiqh üsulu, hədis, təfsir, ərəb dili və ədəbiyyatı, məntiq, cədəl, xitabət, həndəsə, riyaziyyat və fəraiz elmlərini öyrənmiş, onların yanında Bəyzavi və Fəxrəddin Razinin əsərlərini oxumuşdu. H. 726-cı ildə (1326) Bağdada gəlmiş, buradan həcc ziyarətinə yollanmışdı. Həcc ziyarətindən sonra bir müddət Hicazda qalmış və h. 728-ci ildə (1328) Misirə getmişdi. Misir və Şam vilayətlərinin mühəddislərindən hədis dinləmişdi. Tacəddin Əli Təbrizi fiqh, təfsir, ərəb dili, kəlam, riyaziyyat və fəraiz[1512] sahəsində dövrünün ən məşhur alimlərindən biri idi. Qahirənin Hüsamiyyə mədrəsəsində dərs vermişdi. Onun

---

[1510] Şeyxü'l-müsnid Şihabəddin Əbü'l-Abbas Əhməd ibn Əbu Talib ibn Ni'mə ibn Həsən əs-Salehi əl-Həccar (öl. 1330) yaşadığı dövrün məşhur mühəddislərindən biri idi və İbn Şıhnə ləqəbi ilə tanınmışdı. Misir Məmlüklü sultanı Nasirəddin Muhəmməd ibn Qəlavun ona dərin hörmət bəsləyirdi. Bir neçə dəfə dərslərində iştirak etmiş və ona öz əli ilə xələt geyindirmişdi. Bax: İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 247.
[1511] İBN RAFİ', *əl-Vəfayat*, s. 95; İBN HƏCƏR, *İbnai'l-Ğumr*, C. II, s. 12.
[1512] Fəraiz elmi-İslam vərəsəlik hüququ.

dərslərinə böyük tələbə qrupları toplaşırdı. Onun zəif hədisləri topladığı iki cildlik əsəri var idi. Şəmsəddin Zəhəbinin "Mizanü'l-E'tidal"[1513] adlı əsərindəki hədisləri cərh[1514] etmişdi. Nəcməddin Qəzvininin "əl-Havi" adlı əsərini bir ay ərzində 7 dəfə oxumuş və bu əsərə haşiyə yazmışdı. İbnü's-Səlahın "Ülumu'l-Hədis"[1515] adlı əsərini ixtisar etmişdi. Şeyx Tacəddin Əbu Bəkr Təbrizi "Məbsutü'l-Əhkam", "Qistasü'l-Müstəqim fi'l-Hədisi's-Səhihi'l-Qəvim", "Kitabü'l-Kafi fi Ülumü'l-Hədis" adlı əsərlərdən başqa təfsir, hədis, hədis üsulu, fiqh, fiqh üsulu və riyaziyyata dair onlarla risalənin müəllifi idi[1516]. Alimin "Kitabü'l-Kafi fi Ülumü'l-Hədis" adlı əsərinin nadir əlyazma nüsxələrindən biri Türkiyədə, Amasiya Bəyazid İHK-də saxlanılır. Bu nüsxə hələ alim həyatda ikən, h. 737-ci (1337) ildə yazılmışdır. Nüsxənin şəxsən şeyx Tacəddin Əbu Bəkr Təbrizinin qələmindən çıxdığı ehtimal olunur. Alim h. 746-cı ilin ramazan ayının 6-sı[1517] (31 dekabr 1345) Qahirədə vəfat etmişdi. Qahirədəki Dəvadariyyə xanəgahının yanındakı qəbristanda dəfn olunmuşdu[1518].

**Şihabəddin Əbü'l-Abbas Əhməd ibn Əbdülkərim ibn Əbdussəməd ibn Ənuşirvan Təbrizi**

Hənəfi məzhəbinə mənsub fəqih idi. Dəməşqdə əl-Mismariyyə səmtində yaşayırdı və İbnü'l-Mükəvvəşə ləqəbi ilə tanınmışdı. O, həmçinin istedadlı şair və ədib idi, çox gözəl şe'rlər yazırdı. Xüsusən Allah Rəsulu (ﷺ) haqqında yazdığı "Qəsidətü'n-Nəbəviyyə" adlı qəsidəsi məşhur olmuşdu. Onun tələbələri arasından Bəhaəddin ibn Xəlil,

---

1513 İmam Şəmsəddin Muhəmməd ibn Əhməd ibn Osman ibn Qaymaz Türkmani Zəhəbi (1273-1347) yaşadığı dövrün məşhur mühəddis, tarixçi və bioqrafı idi. Hədis, hədis üsulu, tarix, əqaid, qiraət, fiqh, fiqh üsulu, bioqrafiya, və'z və nəsihət kimi müxtəlif mövzulara aid 230-dan çox irili-xırdalı əsərin müəllifi idi.
1514 Cərh və tə'dil-hədis elmlərindən biridir. Hədisləri nəql edən ravilərin şəxsi keyfiyyətlərini və qüsurlarını bəyan edir.
1515 Şeyx Təqiyəddin Əbu Əmr Osman ibn Əbdürrəhman ibnü's-Səlah Şəhrizuri (1181-1245) tanınmış mühəddis idi. Bir sıra əsərlələrlə yanaşı *Ülumu'l-Hədis* (Hədis Elmləri) adlı əsərin müəllifi idi.
1516 ZİRİKLİ, *Ə'lam*, C. IV, s. 455.
1517 İBN RAFİ', *əl-Vəfayat*, s. 54.
1518 SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, c.10, s. 78; SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. II1, s. 144; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. III, s. 142; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VI, s. 665-666; SÜYUTİ, *Hüsnü'l-Muhazirə*, s. 296; İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 104-105; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. II, s. 154-155. Sübki, Səfədi və İbn Qazi Şuhbə alimin künyəsini "Əbu Bəkr", Əsnəvi isə "Əbü'l-Həsən" olaraq qeyd etmişdir. Səlahəddin Səfədi onun h. 674-cü ildə (1275) anadan olduğunu qeyd etmişdir.

Səlahəddin əl-Əlai kimi alimlər yetişmişdir. Şihabəddin Əhməd Təbrizi h. 735-ci ildə (1335) vəfat etmişdir[1519].

**Qazi Fəxrəddin Əbü's-Səna Ömər ibn Əbdüləziz ibn Məs'ud əl-Xəlili Təbrizi**

Təbriz şəhərinin qazisi olmuşdur. Onun atası Ziyaəddin Əbdüləziz Təbrizi də qazi olmuşdu. Qazi Fəxrəddin Əbü's-Səna Ömər Təbrizin sayılıb seçilən əyanlarından və alimlərindən biri idi. Ölüm tarixi qeyd olunmamışdır[1520]. XIII əsrdə yaşadığı ehtimal olunur.

**Əbü'l-Həsən Əli ibn Muhəmməd ibn Əli Təbrizi**

Yaşadığı dövrün böyük təfsir alimlərindən idi. Əbü'l-Həsən Əli Təbrizi həm də istedadlı şair idi. H. 602-ci (1206) ildə 82 yaşında vəfat etmişdi[1521].

**Şeyx Əlaəddin Təbrizi**

Şafi'i məzhəbinə mənsub mühəddis və fəqih idi. Hədis və fiqh sahələrindəki dərin biliyi ilə yanaşı şeyx Əlaəddin Təbrizi həm də şahmatdakı məharəti ilə məşhur olmuşdu. Yaşadığı dövrün bir çox şahmat ustası onun qarşısında aciz qalmışdı. Bir çox mahir şahmatçını məğlub etmiş şeyx Əlaəddin Təbrizinin ən məşhur rəqibi əmir Teymur (1370-1405) olmuşdu. Məlum olduğu kimi Əmir Teymurun özü də yaşadığı dövrün mahir şahmatçılarından idi. Bu haqda, onun tarixini yazmış İbn Ərəbşah (öl. 1450), maraqlı bir əhvalat da qeyd etmişdir[1522]. Əmir Teymur şeyx Əlaəddinə: "həqiqətən şahmatda sənin mislin yoxdu" demişdi[1523]. Təəssüf ki, onun haqqında məlumt vermiş

---

1519 İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, c.1, s. 82, TƏMİMİ, *Təbəqatü's-Səniyyə*, s. 244-245; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VI, s. 643.

1520 İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 269.

1521 ZƏHƏBİ, *Müştəbih*, s. 68.

1522 İbn Ərəbşah öz əsərində belə bir əhvalat nəql etmişdi; bir gün əmir Teymur adəti üzrə rəqibi ilə şahmat oynayırdı. Əmir "şah" verərək rəqibini sıxışdırıb çətin vəziyyətə salmışdı. Rəqib "taxta"da düşdüyü "mat" vəziyyətdən qurtulmanın yollarını fikirləşərkən iki qasid xəbər gətirmişdi. Qasidlərdən biri əmirə xanımının bir oğlan uşağı dünyaya gətirdiyini, digəri isə onun əmri ilə Sırdərya çayı sahilində tikilməkdə olan liman şəhərin inşasının başa çatdığı xəbərini gətirmişdi. Əmir Teymur şahmatda rəqibi üzərindəki qələbənin şərəfinə oğlunun adını Şahrux, şəhərin adını isə Şahruxiyyə qoymuşdu. Bax: Şihabəddin Əhməd İBN ƏRƏBŞAH, *Əcaibü'l-Məqdur fi Tarixi-Teymur*, (Trc. H. Bababekov), s. 38, Daşkənd 2007.

1523 İBN TAĞRIBİRDİ, *Mənhəlü's-Safi*, C. I, s. 347.

İbn Tağrıbirdi alimin ölüm tarixini qeyd etməmişdir. Lakin əmir Teymurun müasiri olduğunu nəzərə alaraq onun XIV-XV əsrlərdə yaşadığını söyləmək olar.

**Şeyx Fəxrəddin Əbü'l-Fütuh Muhəmməd ibn Əhməd əl-Cə'fəri Təbrizi**

Mütəkəllim, həmçinin təsəvvüf əhlinə mənsub şeyx idi. İbnü'l-Fuvati onun haqqında yazarkən "şeyxü'l-mühəqqiq", yəni tədqiqatçı, həqiqəti axtaran şeyx ifadəsini işlətmişdi. O, təsəvvüfdə atası şeyx Tacəddin Əhməd Təbrizinin müridi olmuşdu. Şeyx Tacəddin Əhməd Təbrizi isə şeyx Tacəddin Ömər ibn Muhəmməd Deyləminin müridi olmuş, onun əlindən xirqə geymişdi. Şeyx Tacəddin Deyləmi isə təsəvvüf xirqəsini şeyx Sə'dəddin Muhəmməd ibnü'l-Müəyyəd əl-Həmmuyədən almışdı. Şeyx Sə'dəddin Muhəmməd ibnü'l-Müəyyəd əl-Həmmuyə Cüveyni[1524] (1191-1252) şeyx Nəcməddin Kübranın (öl. 1226) müridlərindən biri və Kübrəviyyə təriqətinə mənsub idi. Bu isə o deməkdir ki, Fəxrəddin Əbü'l-Fütuh Muhəmməd ibn Əhməd əl-Cə'fəri Təbrizi də Kübrəviyyə təriqətinə mənsub sufi şeyxi idi. Şeyx Fəxrəddin Əbü'l-Fütuh Muhəmməd Təbrizi h. 680-ci ildə (1281) vəfat etmişdir[1525].

**Xətib Əbdürrəhim ibn İbrahim Təbrizi**

Təbrizin məşhur xətib və şafi'i fəqihlərindən biri idi. Təqribən h. 710-cu ildə (1310) anadan olmuşdu. O, fiqh sahəsindəki üstünlüyü və dərin biliyi ilə Təbrizdə "əynü'l-füqəha", yəni fəqihlərin gözü ləqəbi ilə tanınmışdı. Fihqə dair bir sıra əsərlərin müəllifi idi[1526]. Ölüm tarixi məlum deyil.

**Xətib Şəmsəddin Muhəmməd ibn Əbdülvəhhab Təbrizi**

---

[1524] "Risalə dər Tə'vilat", "Həqaiqü'l-Hüruf", "Məhbubü'l-Mühibbin və Mətlubü'l-Vasilin", "Kitabü'l-Məhbub", "Risaleyi-Zikri-Cəbrail", "Risalə fi İlmü'l-Hüruf", "Məhbubü'l-Qülub" və "Kitabü'n-Nöqtə" şeyx Sə'dəddin Muhəmməd Həmmuyənin qələmindən çıxmış əsərlərdir və əlyazmaları İstanbul Süleymaniyyə kitabxanasında saxlanılır. Doğrusu bunlardan "Həqaiqü'l-Hüruf" və "Risalə fi İlmü'l-Hüruf"un adları diqqəti cəlb edir. Ümid edirəm ki, bu əsərlər, ümumiyyətlə şeyx Sə'dəddin Həmmuyənin təsəvvüfi irsi, araşdırılaraq Fəzlullah NUEYMİ Əstərabadi və İmadəddin Nəsiminin Hürufilik nəzəriyyəsinə təməl təşkil edib etmədiyi ilə əlaqədar dəyərli nəticələr meydana çıxarılar. Əgər şeyx Sə'dəddin Həmmuyə və onun adı çəkilən əsərlərinin Hürufiliyin meydana çıxmasında hər hənsı bir təsiri olubsa deməli şeyx Fəxrəddin Əbü'l-Fütuh Təbrizinin də bunda müstəsna rolu olmuşdur.

[1525] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 303.

[1526] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 10; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 128.

Şafi'i məzhəbinə mənsub imam və xətib idi. Dəməşqdə yaşayırdı. O, mömitnliyi, abidliyi və salehliyi ilə tanınmışdı. H. 977-ci ildə (1569) vəfat etmişdi[1527].

**Qazi Fəxrəddin Əbü'l-Fəzl Əhməd ibn Əbdülməlik Muhəmməd əl-Həddadi Təbrizi**

Təbriz şəhərinin qazisi olmuşdu. Fəziləti və alicənablığı ilə tanınmışdı. İbnü'l-Fuvati öz əsərində belə yazır: "Mən xətib Şihabəddindən soruşdum ki, onun "əl-Həddadi" nisbəsi ilə tanınmasının səbəbi nədir? O, dedi: "Onda Kəbənin açarları var idi, ona görə də o, əl-Həddadi nisbəsi ilə tanınırdı". İbnü'l-Fuvati daha sonra "bu hər hansı bir insanı etimad və ehtirama şayan etməz" deyə qeyd etmişdir[1528]. Nisbəsi ilə maraqlındığı halda çox təəssüf ki, müəllif qazi Fəxrəddinin təvəllüd və ya ölüm tarixini, yaşadığı dövrü qeyd etməmişdir. Qazi Fəxrəddin Əhməd Təbrizinin təsəvvüfə dair qələmə aldığı "Siracü'l-Qülub" adlı əsərin əlyazma nüsxələrindən biri Qahirə Milli kitabxanasında saxlanılır. Müəllif əsərində toxunduğu mövzuları 41 başlıq altında qələmə almışdı. Bu əlyazma əsərdə müəllifin künyəsi "Əbü'l-Fəzl" deyil "Əbu Hamid" olaraq qeyd edilmişdir. "Siracü'l-Qülub" 1976-cı ildə Əbdüllətif Muhəmməd əl-Əbd tərəfindən Qahirədə nəşr edilmişdir. "Siracü'l-Qülub"un Türkiyənin əlyazma əsər kitabxanalarında onlarla nüsxəsi mövcuddur. Bunlardan biri Ankara milli kitabxanasında, ikisi isə Konya BYEK-də saxlanılır. Qazi Fəxrəddin Əhməd Təbrizi h. 485-ci ildə (1092) vəfat etmişdir.

**Qazi Qəvaməddin Əbu Abdullah Muhəmməd ibn Əbdülməlik Muhəmməd əl-Həddadi Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Azərbaycan Atabəylərindən Özbəyin (1211-1225) hakimiyyəti illərində Təbriz şəhərinin qazisi olmuşdu. Cəlaləddin Xarəzmşahın Təbrizi işğalından (1225) sonra bir sıra azərbaycanlı bürokratla yanaşı o, da vəzifəsindən azad edilmişdi. Qazi Qəvaməddin Təbrizinin vəzifəsindən azad edilməsinin səbəbi barədə

---

[1527] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s.219.

[1528] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 100-101. Kəbə açarlarının bir çox nümunələri var və hal-hazırda muzeylərdə və şəxsi kolleksiyalarda saxlanılır. Ehtimal ki, belə nümunələrdən biri də qazi Fəxrəddin Təbrizi və onun mənsubu oluduğu ailədə idi. İbnü'l-Fuvatinin bu kimi şeylərə, yəni əşyalara mənəvi və ruhani dəyər ətf edilməsinə etimad göstərməməsi ehtima ki, onun hənbəli məzhəbinə mənsub olmasından irəli gəlirdi.

mənbələr maraqlı məlumat verirlər. Moğol hücumları qarşısında atası Muhəmməd Xarəzmşahla birlikdə öz ölkəsini tərk edib qaçan Cəlaləddin Xarəzmşah Azərbaycan torpaqlarına daxil olandan sonra Atabəy Özbək öz elçi heyətini sultan Cəlaləddinin yanına göndərib onunla razılıq əldə etməyə cəhd etmişdi. Lakin bu cəhd uğursuzluqla nəticələnmişdi. Atabəyin elçi heyətinə daxil olan fəqih İzzəddin Əbü'l-Fəzail ibn Əbdülhəmid Qəzvini (öl. 1250) sultan Cəlaləddinin Azərbaycanı işğal etmək fikrindən daşındırmağın mümkün olmadığını görəndən sonra Xarəzmşahın vəziri Şərəfü'l-Mülklə təklikdə görüşərək özünün Təbriz qaziliyinə təyin ediləcəyinə dair söz almışdı[1529]. Lakin Cəlaləddin Xarəzmşahın Təbrizi ələ keçirməsindən sonra şəhərin hakimi Şəmsəddin Tuğrayini öz vəzifəsində saxlaması səbəbiylə bu iş baş tutmamışdı. Çünki Təbriz qazisi Qəvaməddin əl-Həddadi[1530] Təbrizi şəhərin hakimi Şəmsəddin Tuğrayinin bacısının oğlu idi. Dayısı vəzifədə olduğu müddətcə Qəvaməddin Təbrizinin də qazilik vəzifəsindən azad edilməyəcəyini dərk edən İzzəddin Qəzvini Xarəzmşahın vəziri Şərəfü'l-Mülklə hər dəfə görüşəndə Şəmsəddin Tuğrayinin əleyhinə danışmağa başlamışdı. Nəhayət Şərəfü'l-Mülkün qəlbində Şəmsəddin Tuğrayiyə qarşı nifrət meydana gəlmişdi. Cəlaləddin Xarəzmşah Gürcüstanda hərbi yürüşdə olduğu vaxt Şəmsəddin Tuğrayi Atabəylərə sadiq bəzi köhnə bürokratlar və zadəganlarla birlikdə çevriliş planı hazırlamışdı. Plana görə Təbrizdə qiyam qaldırılandan sonra atabəy Özbəyin əsgərləri ilə gürcü ordusu birləşərək xarəzmliləri ölkədən qovub çıxaracaqdılar. Lakin Təbrizdə olan Şərəfü'l-Mülk bu plandan vaxtında xəbərdar olmuş və sultana bildirmişdi. Cəlaləddin Xarəzmşah gürcü ordusunu məğlub etmiş və Təbrizdəki qiyamın da qarşısını ala bilmişdi. Şəmsəddin Tuğrayiyə yaxınlığı ilə tanınan bir sıra şəxslər edam və həbs edilmişdilər. Şəmsəddin Tuğrayi də həbs edilmişdi. Cəlaləddin Xarəzmşah ordusu ilə Təbrizin qala divarlarının yaxınlığında ikən atabəy Özbəyin xanımı Məlikə xatun qala divarlarının üstündən şəhəri mühasirədə saxlayan orduya tamaşa etmişdi. Bu qadın İraq Səlcuqlu sultanı III Toğrulun (1176-1194) qızı idi.

---

[1529] NƏSƏVİ, *Siyrətü's-Sultan Cəlaləddin Məngübərti*, s. 208.

[1530] Nəsəvinin əsərində bu qazinin nisbəsi "Həddadi" deyil "Cidari" kimi yazılmışdır. Ehtimal ki, buna əlyazmanın təhqiqi vaxtı naşirlərin "حدادي"ni "جداري" kimi oxumaları səbəb olmuşdur. Ərəbcə əlyazma əsərlərdə "ra" ilə "dad" hərflərini bəzən bir-birindən ayırmaq çətin olur. Yaxud da Nəsəvinin özü səhvən "Həddadi"ni "Cidari" kimi yazmışdır. Nəsəvidən başqa bu barədə məlumat verən mənbələrin heç birində Qəvaməddin Təbrizinin nisbəsi "Cidari" kimi qeyd olunmamışdır.

Cəlaləddin Xarəzmşah Təbrizi alandan sonra Məlikə xatunu mühafizə dəstəsi ilə birlikdə onun öz mülkü olan Xoy şəhərinə göndərmişdi. Məlikə xatun bir müddət sonra Xoydan Cəlaləddin Xarəzmşahın yanına adamlarını göndərərək onunla evlənmək istədiyini bildirmişdi. Sultan Cəlaləddin onun bu təklifinə müsbət cavab vermiş, lakin qazi Qəvaməddin Muhəmməd əl-Həddadi Təbrizi evli bir qadının başqa biri ilə evlənməsinin mümkün olmayacağını bildirib buna mane olmuşdu. Bu vaxt İzzəddin Qəzvini özünün Təbriz qaziliyinə təyin olunacağı təqdirdə bu işi həll edə biləcəyini bildirmişdi[1531]. Beləcə İzzəddin Əbü'l-Fəzail Qəzvini öz istəyinə nail olmuşdu. O, yalançı şahidlərdən güya atabəy Özbəyin nə vaxtsa öz kölələrindən biri barədə "əgər onu öldürsəm arvadım boş olsun" dediyini, daha sonra həmin köləni öldürdüyünü və beləcə boşanmanın gerçəkləşdiyinə dair ifadə almışdı. Qazi İzzəddin Qəzvininin məsələni beləcə "həll" etməsindən sonra Cəlaləddin Xarəzmşah Məlikə xatunla evlənmişdi[1532]. Sabiq qazi Qəvaməddin Muhəmməd Təbrizi vəzifəsindən azad ediləndən sonra Xarəzmşahın vəziri Şərəfü'l-Mülk onu dayısı Şəmsəddin Tuğrayi və digər qiyamçılarla əlbir olmaqda ittiham edib həbs etdirmişdi. Xarəzmşahın rəsmi salnaməçisi Nəsəvi bunun iftira olduğunu, qazi Qəvaməddin Təbrizinin qiyamçılarla əlbir olmadığını qeyd edir. Qəvaməddin Təbrizi vəzir Şərəfü'l-Mülkə 10 min dinar rüşvət ödədikdən sonra həbsdən çıxa bilmişdi[1533].

Nəsəvi atabəy Özbəyin baş verənlərdən sığındığı Əlincə qalasında xəbər tutduğunu qeyd edir. O, Cəlaləddin Xarəzmşahın Məlikə xatunla evləndiyini eşidəndə bu xəbəri gətirəndən bunun arvadının istəyi ilə yoxsa zorakılıqla olduğunu soruşmuşdu. Məlikə xatunun könüllü Cəlaləddin Xarəzmşaha ərə getdiyini eşidəndə isə atabəy Özbək qızdırmadan yatağa düşmüş və bir neçə gün sonra qəhrindən ölmüşdü[1534].

Təbriz qaziliyi İzzəddin Qəzviniyə də uzun müddət qismət olmamışdı. Xarəzmşahın səfir olaraq Suriya hökmdarı məlikü'l-müəzzəm İsa ibn Adil Əyyubinin (1218-1227) sarayına göndərdiyi qazi Müciräddin Ömər Xarəzmi geri qayıdarkən Dəməşq qazisi Nəcməddin Xəlili də Əyyubilərin səfiri olaraq özü ilə birlikdə Azərbaycana gətirmişdi.

---

1531 RƏŞİDƏDDİN, *Cəmiü't-Təvarix*, C. I, s. 243; NƏSƏVİ, *həmin əsər*, s. 207; BÜNYADOV, *Azərbaycan Atabəyləri Dövləti*, s. 124.
1532 İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. XII, s. 392-394; NƏSƏVİ, *həmin əsər*, s. 207.
1533 NƏSƏVİ, *həmin əsər*, s. 255.
1534 NƏSƏVİ, *həmin əsər*, s. 207.

Onlar vəzirin qəbulunu gözləyərkən qazi Mücirəddin qazi Nəcməddinə "qazi İzzəddinin sənə dediklərin vəzirə de" demişdi. Lakin qazi Nəcməddin Xəlil bundan imtina etmişdi. Qazi Mücirəddin Ömərin onu dilə tutmasından sonra Şərəfü'l-Mülklə görüşərkən səfir vəzirə demişdi: "qazi İzzəddin Qəzvini mənə "sizin hömdarınız (məlik İsa ibn Adil Əyyubi) nə fikirləşir? Nə vaxt öz doğma qardaşlarını rahat buraxıb bunlarla (xarəzmlilərlə) məşğul olacaq? Allaha and olsun ki, qardaşlarının düşmənliyi onun üçün bu qaragüruhun (xarəzmlilərin) dostluğundan daha xeyirlidir. O, bir gün bu dostluqdan ötrü peşman olacaq, sonra peşmançılıq da ona fayda verməyəcək" demişdi. Vəzir Şərəfü'l-Mülk bunu eşidəndə bərk qəzəblənmişdi. O, qazi İzzəddin Qəzvinini çağırıb səfirlə üzləşdirmişdi. Bəlağət sahibi qazinin nitqi qurumuş, kəkələməyə başlamışdı. Vəzir isə ona "əgər yaşına və alimliyinə hörmət olmasaydı kəskin qılınc indi kəlləni uçurmuşdu. Rədd ol buradan, yaramaz!" deyib hüzurundan qovmuşdu. Qazi İzzəddin Qəzvini vəzifəsindən azad olunaraq əmlakı müsadirə edilmişdi[1535].

Məlikə xatuna gəldikdə isə İbnü'l-Əsirin yazdığına görə evləndikdən bir müddət sonra Cəlaləddin Xarəzmşah bu qadına əsla maraq göstərməmiş və ona iltifat etməmişdi[1536]. Nəsəvinin yazdığına görə Cəlaləddin Xarəzmşah evləndikləri vaxt ona sahib olduğu Xoyla yanaşı Səlmas və Urmiyə şəhərlərinin də hakimliyini vermişdi[1537]. Belə anlaşılır ki, bu qadının Cəlaləddinə ərə getməkdə məqsədi hökmdar arvadı olaraq qalmaq idi. Hömdarın kim olduğunun isə elə də əhəmiyyəti yox idi. Çünki mənbələrin verdiyi məlumata görə bu qadın atabəy Özbəklə evli olduğu vaxtlarda dövlət işlərinə müdaxilə edirdi və idarəçilikdə söz sahibi idi. Belə ki, nə atabəy Özbəyin, nə də hər hansı bir dövlət məmurunun sözünün onun yanında keçərliliyi yox idi[1538].

Mərhum akad. Ziya Bünyadov, bir əvvəlki bioqrafiyada sözü gedən, qazi Fəxrəddin Əbü'l-Fəzl Əhməd Təbrizinin qazi Qəvaməddin Əbu Abdullah Muhəmməd Təbrizinin oğlu olduğununun ehtimal edildiyini yazmışdır[1539]. Lakin hadisələrin tarixi bunun mümkün olmadığını göstərir. Belə ki, qazi Fəxrəddin Əbü'l-Fəzl Əhməd Təbrizi 1092-ci ildə ölmüşdü. Burada sözü gedən və qazi Qəvaməddin Əbu Abdullah Muhəmməd

---

[1535] NƏSƏVİ, *həmin əsər*, s. 208.
[1536] İBNü'l-ƏSİR, *Kamil fi't-Tarix*, C. XII, s. 429.
[1537] NƏSƏVİ, *həmin əsər*, s. 207.
[1538] İBNü'l-ƏSİR, *həmin əsər*, C. XII, s. 429.
[1539] BÜNYADOV, *Azərbaycan Atabəyləri Dövləti*, s. 183.

Təbrizinin də daxil olduğu bu hadisələr isə XIII əsrin ilk rübündə baş vermişdi. Bu iki şəxs sözsüz ki, eyni soydan və qohum idilər. Lakin bu qohumluq əlaqəsinin necəliyin dəqiqləşdirmək təəssüf ki, mümkün deyil.

**Qazi Muhyəddin Əbü'l-Həsən ibn Əbü'l-Fəzail ibn Əbdülhəmid əl-Qəzvini Təbrizi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. O, yuxarıda sözü gedən qazi İzzəddin Əbü'l-Fəzail Qəzvininin (öl. 1250) oğlu idi. Qazi Muhyəddin Təbrizi Elxanilərin hakimiyyəti dövründə həm Təbriz şəhərinin, həm də bütün Azərbaycanın baş qazisi (qaziü'l-quzat) idi. İbnü'l-Fuvati onu dərin elmi biliyə malik, alicənab insan kimi təsvir etmişdi. Qazi Muhyəddin Təbrizi h. 697-ci ilin zilhiccə ayında (sentyabr 1296) Təbrizdə vəfat etmişdir[1540].

**Yusif ibn Həsən ibn Əxi Dinar Təbrizi**

Hədis ravisi idi. Əbü'l-Fəzl Cə'fər ibn Əhməd ibn Cə'fər ər-Rəsi'nidən hədis nəql etmişdi[1541]. Ölüm tarixi məlum deyil. IX-X əsrlərdə yaşamışdır.

**Şeyx Muizəddin Üveys ibn şeyx Həsən ibn Həsən ibn Ağbuğa əl-Moğoli Təbrizi**

Şeyx Muizəddin Üveys Təbrizi Cəlairilər sülaləsinin hökmdarlarından biri idi və 1356-1374-cü illər arasında Azərbaycanın hökmdarı olmuşdur. O, mömin, çox ibadət edən, saleh, yumuşaq qəlbli, alim və mücahid bir şəxs idi. Təbrizi ölkənin paytaxt şəhərinə çevirmişdi. Hakimiyyəti illərində bir sıra islahatlar aparmış, haqsız vergiləri aradan qaldırmışdı. Dövlət başçısı və alim kimi üstün keyfiyyətləri səbəbiylə Məkkədə cümə namazı xütbələrində onun adı çəkilirdi. O, Məkkə hakimi İclan ibn Rumeysəyə qiymətli hədiyyələrlə yanaşı Kə'bəyi-Şərifi işıqlandırmaq üçün düzəltdirdiyi qızıl qəndillər də göndərmişdi. Onun hakimiyyəti illərində Azərbaycanın iqtisadi və ictimai həyatında

[1540] BÜNYADOV, "Vidnıye Deyateli Azerbaydjana v Soçinenii İbn al-Fuvati", s. 61-67.
[1541] İBN MAKULA, *İkmal*, C. II, s. 236.

canlanma baş vermişdi. Şeyx Üveys Təbrizi elm əhlinə hörmət bəsləyir, alimləri himayə edirdi. Şeyx Üveys Təbrizi h. 776-cı ildə (1374) vəfat etmişdi[1542].

**Şeyx Cəlaləddin Təbrizi**

Şeyx Bədrəddin Əbu Səid Təbrizinin tələbəsi və müridi olmuşdu. Şeyx Bədrəddinin vəfatından sonra Bağdada gəlmiş və Şihabəddin Ömər Sührəvərdi ilə görüşmüş və onunla dostlaşmışdı. Şeyx Bəhaəddin Əbu Muhəmməd Zəkəriyyə əl-Multani ilə birlikdə Hindistana getmişdi. Hindistanın şərqində, Benqalda[1543] məskunlaşmış və burada yaşamışdı. Şeyx Cəmaləddin Təbrizi gündüzlərini orucla, gecələrini ibadətlə keçirən mömin və saleh insan idi. Əbdülhəyy Hüseyni onun son Abbasi xəlifəsi Müstə'sim Billahın (1242-1258) yaxın adamlarından olduğunu qeyd etmişdir[1544]. Şeyx Şihabəddin Ömər Sührəvərdi ilə yaxın dostluğunu da buna əlavə etsək ehtimal etmək olar ki, şeyx Cəmaləddin Təbrizi fütuvvət əhlinə mənsub şeyxlərdən idi və Hindistana xüsusi missiya ilə göndərilmişdi. Çünki şeyx Şihabəddin Ömər Sührəvərdi xəlifə Nasir li Dinillahın (1180-1225) xüsusi əhəmiyyət verdiyi və dəstəklədiyi fütuvvət təşkilatının ideya müəlliflərindən biri idi və uzun müddət bu təşkilata rəhbərlik etmişdi. Şeyx Cəlaləddin Təbrizi h. 642-ci ildə (1244) Tibetlə həmsərhəd olan Kamir əyalətində vəfat etmişdi[1545].

**Kafiyəddin Əbu Muhəmməd Abdullah ibn Əbdürrəhman ibn Sə'id Təbrizi**

Müfəssir və filoloq idi. Filologiyaya dair bir sıra əsərlərin müəllifi idi[1546]. İbnü'l-Fuvati onun yaşadığı dövrü və ya ölüm tarixini qeyd etməmişdi. Ehtimal ki, Kafiyəddin Təbirzi İbnü'l-Fuvatinin (öl. 1323) müasiri olmuşdu.

---

[1542] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VI, s. 720; İBN HƏCƏR, *İbnai'l-Ğumr*, C. II, s. 23. Şeyx Üveysin fəaliyyəti ilə bağlı ətraflı məlumat üçün bax: ƏHƏRİ, *İstoriya Şeyxa Uveysa*, s. 21-29.

[1543] Benqal-Hindistanla Banqladeş arasında paylaşılmışdır. Hindistanın şərqində, Banqladeşlə həmsərhəd olan Qərbi Benqaliya ştatı yerləşir.

[1544] HÜSEYNİ, *Nüzhətü'l-Xəvatir*, s. 149.

[1545] *Yenə orada*.

[1546] BÜNYADOV, "Vidnıye Deyateli Azerbaydjana v Soçinenii İbn al-Fuvati", s. 61-67.

**Qazi Kəmaləddin Əbu Abdullah Əbdülhəmid ibn Muhəmməd ibn Əli ibn Əbi Muaz Təbrizi**

Onun mənsub olduğu nəsildən bir çox alim, qazi və rəis çıxmışdı. Yaşadığı dövrün böyük alimlərindən, tanınmış hüquqşünaslarından biri olan qazi Kəmaləddin Əbdülhəmid Təbrizi öz qardaşlarının həm yaşca ən böyüyü, həm də ən biliklisi idi. O, Azərbaycan Atabəyləri dövründə Marağa şəhərinin qazisi və bu şəhərdəki əl-Atabəkiyyə mədrəsəsinin müdərrisi olmuşdu. Eldənizli hökmdarları ona böyük ehtiramla yanaşırdılar. Sultan Cəlaləddin Xarəzmşah da onu hüzuruna böyük hörmətlə qəbul edir, onu özü ilə yanaşı taxtında oturdurdu. Qazi Kəmaləddin Əbdülhəmid Təbrizi vəfatından bir müddət əvvəl İraqın Ərbil şəhərinə getmiş və h. 628-ci (1231) ildə orada vəfat etmişdi[1547].

**Muhyəddin Əbu Abdullah Muhəmməd ibn Yəhya ibn Əbi'l-Məhasin Təbrizi**

Yaşadığı dövrün tanınmış fəqihlərindən və alimlərindən biri olmuşdur[1548]. İbnü'l-Fuvati alimin yaşadığı dövr və ya ölüm tarixiylə bağlı heç bir məlumat verməmişdir.

**Katib Kafiyəddin Hibətullah ibn Əlişah ibn Fəramurz əl-Fərəhani Təbrizi**

XIII əsrdə yaşamış azərbaycanlı dövlət xadimi idi. Onun mənsub olduğu nəsildən görkəmli dövlət xadimləri, sədrlər, katiblər, rəislər və vəzirlər çıxmışdı. İbnü'l-Fuvati onunla h. 705-ci (1306) ildə Arranda şeyx Zeynəddin Əbu Hamid Muhəmməd əl-Kişinin yanında ikən görüşdüyünü qeyd edir. Müəllif həmçinin katib Kafiyəddin Təbrizinin maliyyə idarəsinə rəhbərlik etdiyini, onun hesablama və idarəetmə işində mahir olduğunu qeyd edir. O, daha sonra vəqflər idarəsinə rəhbərlik etmişdi. İbnü'l-Fuvati katib Kafiyəddin Təbrizinin mülayim xasiyyəti və gözəl xətti olduğunu yazır. İbnü'l-Fuvati deyir: "mən ondan harada anadan olduğunu soruşdum. O, h. 665-ci (1267) ildə Bərdədə anadan olduğunu dedi". Katib Kafiyəddin Təbrizi daha sonra maliyyə dəftərxanasının idarə edilməsi üçün Bağdada göndərilmişdi. İbnü'l-Fuvati

---

[1547] BÜNYADOV, *həmin məqalə*.
[1548] BÜNYADOV, *həmin məqalə*.

Bağdaddakı Müstənsiriyyə mədrəsəsi kitabxanasının müdirliyinə təyin olunarkən katib Kafiyəddin Təbrizinin yeni iş yeri ilə onu tanış etdiyini yazır[1549]. Kafiyəddin Təbrizinin ölüm tarixi qeyd olunmur. Güman ki, o, İbnü'l-Fuvatidən (öl. 1323) sonra vəfat etmişdi.

**Mirzə Lütfullah ibn Şükrullah Təbrizi**

Müfəssir və mütəkəllim idi. Eyni zamanda fəlsəfə, məntiq, münşəat, şe'r və ədəbiyyatda öz dövrünün tanınmış simalarından biri idi. Onun atası köçüb Hindistanda məskunlaşmış və Lütfullah Təbrizi 1095-ci ildə (1684) Hindistanda dünyaya gəlmişdi. Atasından münşəat sənətini öyrənmiş, Həbibullah İsfəhani, Ağa Hüseyn Xansarinin tələbəsi olmuşdu. Parlaq zəkası və çalışqanlığı ilə öz həmyaşlarından fərqənmişdi. Təhsilin başa vurandan sonra ticarət məqsədiylə Benqala getmişdi. Benqal hökmdarının naibi Şücaüddövlə ilə tanış olub dostlaşmışdı. Bir müddət sonra Benqalı tərk edib Heydərabada gəlmiş və h. 1164-cü (1751) ildə orada ölmüşdü[1550]. Mirzə Lütfullah Təbrizi "Xülasətü'l-Minhəc fi't-Təfsir" adlı əsərin müəllifidir[1551].

**Mövlana Elməddin Həkim Təbrizi**

Öz dövrünün məşhur alimlərindən idi. Tibb sahəsində şöhrət tapmışdı. Gülbərgədə sultan Əlaəddin Həsən əl-Bəhməninin[1552] (öl. 1358) himayəsində yaşayırdı. Gülbərgə şəhərində tibb dərsləri verir və müalicə işi ilə məşğul olurdu[1553]. Ölüm tarixi məlum deyil. XIV əsrdə yaşamışdır.

**Bədrəddin Təbrizi**

---

[1549] BÜNYADOV, *həmin məqalə*.
[1550] HÜSEYNİ, *Nüzhətü'l-Xəvatir*, s. 790-791.
[1551] BAĞDADLI, *İzahü'l-Məknun*, C. I, s. 216.
[1552] Muhəmməd şah Tuğluqun (1325-1351) hakimiyyəti illərində Hind yarımadasının mərkəzində yerləşən Dəkkən vilayətində qiyam qaldırılmış və bu qiyam nəticəində Əlaəddin Həsən Bəhməni adlı şəxs özünü sultan elan edərək Dəkkən və ətraf vilayətləri Dehli sultanlığından ayırmışdı. Paytaxt olaraq özünə Gülbərgə şəhərini seçən Əlaəddin Həsən Bəhmənilər sülaləsinin əsasını qoymuşdu. Gülbərgə Hindistanın mərkəzində, Heydərabad şəhərinin qərbində yerləşir.
[1553] HÜSEYNİ, *Nüzhətü'l-Xəvatir*, s. 177.

XIII əsrdə Anadoluda yaşamış memar idi. O, həmçinin riyaziyyat, həndəsə, kimya, astronomiya kimi elm sahələrində də öz dövrünün tanınmış mütəxəssislərindən biri idi. İlk moğol hücumları (1220-1221) vaxtı Azərbaycanı tərk edərək Anadoluya gələn[1554] Bədrəddin Təbrizi mövlana Cəlaləddin Ruminin müridlərindən biri olmuşdu[1555]. Mövlana Cəlaləddin Ruminin digər müridləri əmir Aləməddin Qeysər[1556], Müinəddin Süleyman Pərvanə[1557] və onun xanımı Gürcü xatunun təşəbbüsü ilə Cəlaləddin Ruminin ölümündən (1274) sonra məzarının üstündə türbə tikilməsi üçün 160 min dirhəm pul toplanmışdı[1558]. Türbənin inşası memar Bədrəddin Təbriziyə həvalə edilmişdi. Bədrəddin Təbrizi türbənin inşasını 1274-cü ildə başa çatdırmışdı[1559]. 1284-cü ildə baş verən zəlzələdən sonra türbənin təmirə ehtiyacı olmuşdu. Təmir işlərinə də Bədrəddin Təbirzi rəhbərlik etmişdi[1560]. İ. H. Konyalının fikrinə görə hal-hazırda Konyadakı bu türbə və üzərindəki yaşıl qübbə memar Bədrəddin Təbrizinin əsəri deyil, sonradan Qaramanoğlu Əlaəddin bəy (öl. 1291) tərəfindən əsaslı təmir etdirilərək indiki halını almışdı[1561]. Memar Bədrəddin Təbrizinin ölüm tarixi 1284-cü ildən sonraya təsadüf edir.

**Qazi Əminəddin Təbrizi**

Əminəddin Təbrizi Anadolu Səlcuqlu sultanı Qiyasəddin III Keyxosrovun (1266-1284) hakimiyyəti dövründə, 1266-cı ildə Ağsaray şəhəri qaziliyinə təyin edilmişdi. Qazi Əminəddin Təbrizi fiqh və kəlam elmləri sahəsində öz dövrünün tanınmış alimlərindən idi[1562]. Əminəddin Təbrizi haqqında məlumat verən yeganə mənbə "Müsamərətü'l-Əxbar"dır. Kərimməddin Aqsarayi alimin ölüm tarixi barədə məlumat verməmişdir.

Yuxarıda Məcdəddin Baba Mərəndinin də Ağsarayda qazilik vəzifəsini icra etdiyini qeyd etmişdik. Anadolu Səlcuqlu sultanlarının bu şəhərə məmur təyin edərkən

---

1554 ÜNVER, *Selçuklu Tababeti*, s. 94.

1555 ƏFLAKİ, *Ariflerin Menkıbeleri*, C. I, s. 151, 210.

1556 Aləməddin Qeysər Anadolu Səlcuqlu dövlətini məmurlarından biri idi. Uzun müddət moğollara sədaqətlə xidmət etməsinə baxmayaraq 1297-ci ildə Elxani Qazan xanın əmri ilə edam edilmişdi.

1557 Müinəddin Süleyman Pərvanə də moğollara sədaqətlə xidmət etməsinə baxmayaraq 1277-ci ildə Elxani Abaqa xanın əmri ilə edam edilmişdi.

1558 ƏFLAKİ, *Ariflerin Menkıbeleri*, C. I, s. 204.

1559 İbrahim Hakkı KONYALI, *Konya Tarihi*, s. 636, Konya 1964.

1560 Hasan ÖZÖNDER, "Mevlana Türbe ve Külliyesinin Tamir ve İlaveler Kronolojisi", **Selçuk Dergisi**, S. 2, Konya 1988, s. 11-19.

1561 KONYALI, *həmin əsər*, s. 636-641.

1562 AQSARAYİ, *Müsamərətü'l-Əxbar*, s. 90

azərbaycanlılara üstünlük verməsi ehtimal ki, Ağsaray əhalisinin böyük əksəriyyətinin Azərbaycandan Anadoluya köçürülmüş olması ilə əlaqədardır. Sultan İzzəddin II Qılıncarslan (1155-1192) Ağsaray şəhərinin təməlini qoymuş, burada evlər, imarətlər, saraylar, məscidlər, mədrəsələr, hamam, karvansaray kimi ictimai-iaşə binaları inşa etdirərək Azərbaycandan bu şəhərə alimlər, tacirlər, sənətkarlar və digər zümrələrə mənsub insanları köçürərək məskunlaşdırmışdı[1563].

**Təbib Fəxrəddin Əbu İshaq İbrahim ibn Muhəmməd Təbrizi**

XIII-XIV əsrlərdə Anadoluda yaşamış tanınmış azərbaycanlı həkim, tibb alimi idi. O, yaşadığı dövrdə Anadoluda daha çox təbib Qəzənfər Təbrizi adı ilə məşhur olmuşdu. Anadolu Səlcuqlularının saray həkimlərindən biri olan təbib Qəzənfər Təbrizi həmçinin Konyadakı xəstəxanada da müalicə işi ilə məşğul olmuşdu[1564]. O, tibbə dair bir sıra əsərlərin müəllifi idi. Bunlardan ən tanınmışı "Hasilü'l-Məsail fi't-Tibb" adlanır. Bu əsərin cəmi iki əlyazma nüsxəsi müəyyən edilmişdir. "Hasilü'l-Məsail fi't-Tibb" Abbasilər dövrünün məşhur tibb alimlərindən olan Hüneyn ibn İshaqın (öl. 873) "Məsail fi't-Tibb" əsərinin xülasəsi idi və güman ki, tibb mədrəsəsi tələbələri üçün dərslik kimi tərtib edilmişdi. Təbib Qəzənfər Təbrizinin bu əsərinin əlyazma nüsxəsinin surəti şəxsi kitabxanamda mövcuddur və gələcəkdə tərəfimizdən tədqiq və nəşr ediləcəkdir.

Məhəmmədəli Tərbiyət sözü gedən əsəri "Həllü'l-Məsail" adlandıraraq Qəzənfər Təbrizinin hicri-qəməri XII-XIII (miladi XVIII-XIX) əsrlərdə yaşadığını güman etmişdir[1565]. Doğrusu bunun Məhəmmədəli Tərbiyətinmi, yoxsa "Danişməndani-Azərbaycan"ı azəri türkcəsinə tərcümə edənlərinmi xətası olduğunu müəyyən edə bilmədik.

Təbib Qəzənfər Təbrizinin bilinən digər əsərləri İbn Sinanın "İşarat və't-Tənbihat" və "Təbiyyat", Əbu Reyhan Biruninin "Risalətü'l-Fihrist" adlı əsərlərinə yazdığı şərhlər, o cümlədən Bəhmənyarın əsərlərindən birinə yazdığı tənqiddir[1566]. Bundan başqa onun 1279-cu ildə Əbu Reyhan əl-Biruninin "Kitabü's-Saydələ fi't-Tibb" adlı əsərinin üzün

---

[1563] *Həmin əsər*, s. 31-32.
[1564] ÜNVER, *Selçuklu Tababeti*, s. 66, 93.
[1565] *Danişməndani-Azərbaycan*, s. 65.
[1566] BAYAT, *həmin məqalə*.

köçürdüyü də bilinir[1567]. Mövlana Cəlaləddin Rumi ölüm döşəyində ikən onun yanında təbib Əkmələddin Naxçıvani ilə yanaşı təbib Qəzənfər Təbrizi də var idi[1568]. Alimin ölüm tarixi məlum deyil. Lakin onun İbn Sinanın "İşarat və't-Tənbihat"ına yazdığı şərhi 1302-ci ildə başa vurduğu məlumdur[1569]. Deməli ölüm tarixi də bundan sonraya təsadüf etmişdir.

**Əbu Abdullah İsmayıl ibn Muhəmməd ibn Sirri ibn Bənnun ibn Hümeyd Tiflisi**

Yaşadığı dövrün tanınmış şafi'i mühəddislərindən idi. H. 373-cü ildə (983) Tiflisdə anadan olmuşdu. O, Xorasanın Nişapur şəhərinə getmiş və burada yaşamışdı. Əbu Abdullah İsmayıl Tiflisi alim olmaqla yanaşı həm də varlı tacir idi. Əbu Bəkr Əhməd ibn Hüseyn ibn Mehran Nişapuri, Əbu Həsən Muhəmməd ibn Əhməd ibn Əli əs-Sıbği kimi dövrün tanınmış hədis alimlərindən dərs almışdı[1570]. Ölüm tarixi məlum deyil.

**Əbu Bəkr Muhəmməd ibn İsmayıl ibn Muhəmməd ibn Sirri ibn Bənnun Tiflisi**

Əksər hadis alimlərinin siqa, bəzilərinin isə səduq kimi qiymətləndirdikləri mühəddis idi. Atası köçüb Nişapurda məskunlaşmış və Əbu Bəkr Tiflisi də h. 400-cü ilin rəcəb ayında (mart 1010) Nişapurda dünyaya gəlmişdi. Hafiz idi və minlərlə hədisi əzbər bilirdi. Hafiz Əbu Abdullah Muhəmməd ibn Abdullah, Əbu Tahir Muhəmməd ibn Muhəmməd əz-Ziyadi, Əbu Sadiq əs-Səydəlani, Abdullah ibn Yusif əs-Süləmi, Əbu Yə'la Həmzə ibn Əbdüləziz Nişapuridən hədis dinləmiş və nəql etmişdi. İsfəhanda hafiz Əbü'l-Qasım İsmayıl ibn Muhəmməd, Nişapurda Əbü'l-Qasım Əhməd ibn İbrahim əl-Muqri, Mərvdə Əbu Əli Hüseyn ibn Əli əş-Şihami ondan dinlədikləri hədisləri nəql etmişdilər Alim h. 483-cü ilin şəvval ayında (dekabr 1090) vəfat etmişdir[1571].

**Qazi Əlaəddin Ömər ibn Əbdüləziz ibn Əbdülcabbar Tiflisi**

---

[1567] ÜNVER, *həmin əsər*, s. 66, 93.
[1568] RUMİ, *Mektuplar*, (Önsöz qismi), s. 228.
[1569] BAYAT, *həmin məqalə*.
[1570] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. I, s. 330; SEYRƏFİNİ, *Müntəxəb*, s. 14.
[1571] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 314; ZƏHƏBİ, *Siyəru Ə'lamü'n-Nübəla*, s. XXIII, s. 133; BEYHƏQİ, *Məvsusəti-Rical*, s. 30; SEYRƏFİNİ, *Müntəxəb*, s. 57.

Onun atası şeyx Fəxrəddin Əbdüləziz əslən Əxlatlı idi. Qazi Əlaəddin Ömər ilk təhsilini atasından almışdı. İbnü'l-Fuvati onun gənc, fəzilətli alim olduğunu, h. 705-ci ildə (1306) onunla Arranda görüşdüyünü qeyd edir. Müəllif, Əlaəddin Ömərin burada Elxani hökmdarına özünün Tiflis qaziliyinə təyini üçün iltimas etdiyini qeyd etmişdi. Ondan əvvəl bu vəzifəni İbnü's-Sabuni adı ilə tanınmış Cəmaləddin Muhəmməd ibn Haşim Tiflisi icra etmişdi[1572]. Qazi Əlaəddin Ömər Tiflisinin ölüm tarixi məlum deyil. İbnü'l-Fuvati onu gördüyü vaxt gənc yaşlarında olduğunu qeyd etmişdir. Ehtimal ki, qazi Əlaəddin Ömər Tiflisi İbnü'l-Fuvatidən (öl. 1323) çox sonra vəfat etmişdir.

**Əbu Əhməd Hamid ibn Yusif ibn Əhməd ibn Hüseyn Tiflisi**

Mühəddis idi. Tiflisdəki hədis alimlərindən hədis dinləmiş, daha sonra hədis dinləmək məqsədiylə səyahətə çıxmışdı. Bağdada gələrək buradakı mühəddislərin dərslərində iştirak etmişdi. Qüdsdə Əbu Abdullah Muhəmməd ibn Əli ibn Əhməd Beyhəqi, Əbu Bəkr Muhəmməd əl-Bişnəvidən, Məkkədə Əbu Həsən Əli ibn İbrahim əl-Aqulidən, Bağdadda Əbu Həkim Abdullah ibn İbrahim əl-Xeyridən, Əbü'l-Fəzl Muhəmməd Əbivədidən hədis dinləmiş və nəql etmişdi. Əli ibn Muhəmməd Savi, Hüseyn ibn Əli əl-Fərzi, Şüca ibn Faris əz-Zıhli, Əbu Həsən Əli ibn Abdullah ibn Əbu Curadə əl-Antaki ondan hədis dinləmişdilər. Alim h. 483-cü ilə (1090) qədər Dəməşqdə yaşamış, bu tarixdən sonra Dəməşqdən getmişdi. Əbu Əhməd Hamid Tiflisi Böyük Səlcuqlu hökmdarı Məlikşahın (1072-1092) vəziri Tacülmülkün[1573] dostu idi. Ölüm tarixi h. 484-cü ildən (1091) sonraya təsadüf edir[1574].

**Əbu Sə'd Məs'ud ibn Əbdürrəhman ibn Əli ibn Həsən Tiflisi**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. h. 410-cu (1019) ildə Tiflisdə dünyaya gəlmişdi. Təhsil almaq üçün Xorasana getmiş və Nişapurda Əbu Sə'd Muhəmməd ibn

---

[1572] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1065.

[1573] Vəzir Tacülmülk 1092-ci ildə vəzir Nizamülmülkün sui-qəsd nəticəsində öldürülməsindən sonra bu vəzifəyə təyin edilmiş, lakin cəmi 7 ay bu vəzifəni icra etmişdi. O, da sələfinin aqibətinə uğramış, sui-qəsd nəticəsində qətlə yetirilmişdi.

[1574] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 314; SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. X, s. 101; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. II, s. 84-85.

Əbdürrəhman Gəncərudi[1575], Əbu Bəkr Əhməd ibn Mənsur əl-Bəzzar kimi alimlərin tələbəsi olmuşdu. Alim h. 11 cəmadiəlaxir 490-cı ildə (26 may 1097) vəfat etmişdi[1576].

**Qazi Əbü'l-Qasım Mahmud ibn Yusif ibn Hüseyn əl-Bərzəndi Tiflisi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Təhsil almaq üçün Bağdada getmiş, Nizamiyyə mədrəsəsində təhsil almışdı. Burada şeyxülislam Əbu İshaq İbrahim Şirazinin tələbəsi olmuş, ondan fiqh və hədis dərsləri almışdı. Şərif Əbü'l-Hüseyn Muhəmməd ibn Əli ibnü'l-Mühtədi Billah əl-Haşimi və şərif Əbü'l-Qənaim Əbdüssəməd ibn Əli ibnü'l-Mə'mun əl-Haşimidən[1577] hədis dinləmişdi. Onun Bağdadda görüşüb hədis dərsləri aldığı alimlərdən biri də qazi Əbu Yə'la Mahmud ibn Hüseyn ibn Xələf ibnü'l-Fərra əl-Hənbəli olmuşdur. Təhsilin başa vurandan sonra Əbü'l-Qasım Mahmud doğma şəhəri Tiflisə qayıtmış, bu şəhərin qaziliyinə təyin olunmuş[1578] və həmçinin burada hədis dərsləri vermişdi. Əbu Bəkr Təyyib ibn Əhməd əl-Əbivərdi Mərvdə ondan hədis nəql etmişdi. Alimin ölüm tarixi h. 550-ci ildən (1155) sonraya təsadüf edir[1579].

**Əbu Hərb Muhəmməd ibn Muhsin ibn Həsən əl-Hüseyni Tiflisi**

İmam Hüseynin (ع) nəslindən olan Əbu Hərb Tiflisi şafi'i məzhəbinə mənsub fəqih, tarixçi və bioqraf idi. Uzun müddət Bağdadda yaşadıqdan sonra Qəznəvilər dövlətinin hakimiyyəti altındakı Əfqanıstana köçmüşdü. Alim h. 480-ci ildə (1087) Qəznə şəhərində vəfat etmişdi. O, ənsaba (bioqrafiya) dair ensklopedik bir əsərin müəllifi idi[1580].

**İbrahim ibn Zeyd əl-Əsləmi Tiflisi**

Zəif hədis ravisi idi. Muhəmməd ibn Yəzid Muhəmməd ondan hədis dinləmiş və nəql etmişdi. Şəmsəddin Zəhəbi onun bəzən batil xəbər nəql etdiyini qeyd etmişdi. Onun

---

[1575] Gəncərud-və ya Cənzərud Nişapurun kəndlərindən biri idi. Bax: SÜYUTİ, *Lübbü'l-Lübab*, s. 47.
[1576] SEYRƏFİNİ, *Müntəxəb*, s. 475.
[1577] Əbü'l-Qasım Mahmud Tiflisinin hədis dərsləri aldığı bu iki şafi'i mühəddis imam Həsərin (ع) nəslindən idilər.
[1578] ƏBU TAHİR İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, s. 361-362.
[1579] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 314; SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VII, s. 166-167; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 149.
[1580] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 616.

nəql etdiyi zəif hədislərdən biri aşağıdakıdır: "Əbu Hüreyrədən (ا): Biz Allah Rəsulu (ق) birlikdə oturarkən bir oğlan uşağı gəldi və peyğəmbərdən ona dua öyrətməsini istədi, peyğəmbər ona belə dua etdi: Allahım sənin qullarının zülmünün çoxluğu səbəbiylə səndən əvf və bağışlanma diləyirəm..... " [1581]. Bu uzun bir hədisdir. Bu hədisin səhih olmadığına dair keçmiş və müasir mühəddislər həmfikir olmuşdurlar[1582]. İbrahim əl-Əsləmi Tiflisinin ölüm tarixini müəyyən etmək mümkün olmamışdır. Əbü'l-Həsən Əli Darəqutni (öl. 995) və Əbu Nueym Əhməd İsfəhani (öl. 1038) kimi alimlər onun haqqında fikir bəyan etdiklərinə görə İbrahim ibn Zeyd əl-Əsləmi Tiflisi bu iki şəxsdən əvvəl vəfat etmişdir.

**İbrahim ibn Zeyd Tiflisi**

Təbəi-tabiundan[1583] olan hədis ravisi idi. Ənəs ibn Malik (ا), Abdullah ibn Utbə ibn Məs'ud (ا) və Abdullah ibn Ömərdən (ا) mərfuən[1584] hədis nəql etmişdir. Əbü'l-Fəzl Əbdürrəhim İraqi öz əsərində onun, yuxarıda haqqında bəhs etdiyimiz, İbrahim ibn Zeyd əl-Əsləmi deyil, başqa bir şəxs olduğunu, lakin Şəmsəddin Zəhəbinin bu iki şəxsin eyni adam olduğunu düşündüyünü qeyd etmişdir. Əbü'l-Fəzl İraqi bu mövzuda Xətib əl-Bağdadinin də özü ilə həmfikir olduğunu və bu iki şəxsin ayrı-ayrı adamlar olduğunu qeyd etmişdir. Əbü'l-Fəzl İraqinin qeydlərindən belə məlum olur ki, İbrahim ibn Zeyd Tiflisi qədəriyyə və rafiziyyəni İslam ümmətinə aid etməyərək, əqidəvi mövzularda kifayət qədər prinsipial mövqe tutmuşdu. Həmçinin müəllif tanınmış mühəddis Əbü'l-Həsən Əli Darəqutninin, İbrahim ibn Zeyd Tiflisinin nəql etdiyi hədisləri qeyd etdiyini bildirmişdir. İbrahim ibn Zeyd Tiflisinin ölüm tarixi məlum deyil. Təqribən VIII-IX əsrlərdə yaşamışdı[1585].

---

1581 ZƏHƏBİ, *Mizanü'l-E'tidal*, C. I, s.19.

1582 ZƏHƏBİ, *yenə orada*; İBN HƏCƏR, *Lisanü'l-Mizan*, C. I, s. 46; Əbü'l-Fərəc Əbdürrəhman ibn Əli İBNü'l-CƏVZİ, *İ'lili'l-Mütənahiyə*, C. II, s. 845, Beyrut (trz); Bundan başqa bax: http://akhawat.islamway.com/forum/index.php?showtopic=190320

1583 Rəsulullahın (ق) əshabından sonra gələn ikinci nəsil müsəlmanlar.

1584 Mərfu' hədis-Sənədinin, yəni nəql silsiləsinin keyfiyyətindən aslı olmayaraq, hökm olaraq və sərahətən, aşkar olaraq Rəsulullaha (ق) aid edilən hədis. "Mərfu' hukmən" və "Mərfu' mürsəl" olaraq iki qismə ayrılır. Daha ətraflı məlumat üçün bax: AYDINLI, *Hadis Istılahları Sözlüğü*, s. 96.

1585 İRAQİ, *Zeyl Mizanü'l-Etidal*, s. 16.

### İmam Nəcməddin Əbü'l-Bəqa' Sabit ibn Tavan Tiflisi

Fütuvvət şeyxi olan imam Nəcməddin Sabit Tiflisi şafi'i fiqhi, fiqh üsulu, ərəb filologiyası, tarix, ədəbiyyat və əxlaq kimi elm sahələrində tanınmış mütəxəssis idi. O, həmçinin istedadlı şair idi və çox gözəl şerlər yazırdı. İmam Nəcməddin Tiflisi çox ibadət edir və riyazətlə məşğul olurdu. Şeyx Şihabəddin Ömər Sührəvərdinin yaxın dostu idi. Nəcməddin Əbü'l-Bəqa' Tiflisi həm də bacarıqlı diplomat idi. Misirə, Əyyubi sultanının sarayına Abbasi xilafətinin elçisi olaraq göndərilmişdi. Onun çox zəngin şəxsi kitabxanası var idi. Vəfatından əvvəl bütün kitablarını tələbələrin istifadəsi üçün Sümeysatiyyə xanəgahına vəqf etmiş, bağışlamışdı. Alim h. 631-ci ildə (1234) vəfat etmişdi[1586]. Əbu Şamə Məqdisi, Nəcməddin Tiflisinin h. 632-ci ildə (1235) Dəməşqdə vəfat etdiyini, bu vaxt özünün də Dəməşqdə oluğunu və alimin Sufiyyə qəbristanında dəfn edildiyini qeyd etmişdir[1587].

### Əbu Nəsr Əhməd ibn Ömər ibn Muhəmməd Natan əl-Muqri Tiflisi

Azərbaycan Atabəyləri dövründə yaşamış tanınmış mühəddislərdən idi. Hafiz Əbu Tahir əs-Süləfi İsfəhani (öl. 1181) Tiflisdə onunla görüşüb söhbət etmiş, hədis dinləmişdi. Mühəddis Əbü'l-Qasım Əli ibn Əbdürrəhman Nişapuri Əbu Nəsr Əhməd Tiflisinin hədis dinlədiyi alimlərdən biri idi. Hafiz Əbu Tahir əs-Süləfi Tiflisdə Əbu Nəsr Əhməddən dinlədiyi aşağıdakı hədisi əsərində qeyd etmişdi. Ənəs ibn Malik (ا) dedi: "Allah Rəsulu (ق) sabah üçün heç bir şey saxlamazdı"[1588]. Əbu Nəsr Əhməd Tiflisinin ölüm tarixi məlum deyil. XII əsrdə yaşamışdır.

### Əbü'l-Qasım Abdullah ibn Əbdüləziz ibn Abdullah Tiflisi

---

[1586] İBN ŞAKİR, *Fəvatü'l-Vəfayat*, C. I, s. 111; SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. X, s. 155. Səlahəddin Səfədi, imam Nəcməddin Tiflisinin h. 631-ci (1234) ildə vəfat etdiyini qeyd etmişdir.

[1587] MƏQDİSİ, *Təracim Ricali'l-Qərneyn*, s. 162.

[1588] ƏBU TAHİR İSFƏHANİ, *Ərbəinü'l-Büldaniyyə*, s. 134. [عن أنس انّ النبيّ ص : كان لا يدّخر شيئاً لغدٍ]. Bu hədis üçün bax: TİRMİZİ, *Sünən*, Zöhd, Nr. 2362. Bu hədisdə diqqətə yetirilmək istənən xüsus Allah Rəsulunun (ق) Allaha təvəkkülünün nəhayətsiz olduğudur. Bu təvəkkülü səbəbiylə sabah yoxsulluğa düçar olacağı əndişəsini daşımaz, buna görə də hər hansı bir şeyi ehtiyat üçün saxlamağa ehtiyac duymazdı. Tirmizi "bu hədis qəribdir", Muhəmməd Əbdürrauf əl-Münavi (öl. 1622) isə Süleyman ət-Təbəraninin (öl. 971) əsərinə yazdığı "Feyzü'l-Qədir fi Cami'üs-Səğir" adlı şərhdə [اسناد جيّد] "isnadı gözəl hədisdir" demişdilər.

Fəqih və təsəvvüf əhlinə mənsub şeyx idi. Bağdadda Hibətullah əş-Şibli, Muhəmməd ibnü'l-Bəttə və Əbu Zur'ədən hədis dərsləri almışdı. O, Bağdadda tədrislə məşğul olmuşdu. Hafiz Zeynəddin Xalid odan hədis dinləmiş və hədis dərsləri almışdı. Əbü'l-Qasım Abdullah Tiflisi şeyx Əbu'n-Nəcib Əbdülqahir Sührəvərdinin (öl. 1168) yaxın dostlarından biri olmuşdu. Alim h. 626-cı ilin rəbiələvvəl ayında (fevral 1229) Bağdadda vəfat etmişdi[1589].

**Əbü'l-Qasım Sabit ibn Bəndar ibn Əsəd Tiflisi**

Mühəddis idi. Əbu Əli Hamid ibn Muhəmməd əl-Hərəvi və Əbu Əhməd ibn Ədiyy Cürcanidən (890-976) hədis dinləmiş və nəql etmişdir[1590]. Ölüm tarixi məlum deyil. X əsrdə yaşamışdır. Nəql silsiləsində Əbü'l-Qasım Sabit Tiflisinin də olduğu hədislərdən biri aşağıdakıdır:

Ummu Hani bint Əbu Talib[1591] (ا) dedi: "Allah Rəsulu (ق) Məkkənin fəthi günü[1592] şəhərin ən yüksək yerində səkkiz rəkat namaz qıldı. Ondan "ey Allahın elçisi! Bu nə namazı idi?" soruşdum. "Bu duha namazı idi" deyə cavab verdi"[1593].

**Şeyx Fəthəddin Əbu Abdullah Muhəmməd ibn Əhməd ibn Haşim ibn Əhməd ibn Ömər Tiflisi**

Mühəddis idi. h. 658-ci ildə (1260) Qahirədə anadan olmuşdu. Mühəddis Əbü'l-Fərəc Əbdüllətif əl-Hərraninin tələbəsi olmuş, ondan hədis elmlərinə dair bilikləri öyrənmişdi. Fəthəddin Tiflisi h. 11 cəmaziəlaxir 720-ci ildə (iyul 1320) Fələstinin Hums şəhərində vəfat etmişdi[1594].

---

[1589] ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'd-Dübeysi*, s. 217.
[1590] ƏBU NUEYM İSBƏHANİ, *Zikr Əxbaru-İsbəhan*, C. I, s. 241
[1591] Bu xanım səhabə Allah Rəsulunun (ق) bibisi idi.
[1592] 11 yanvar 630-cu il.
[1593] ƏBU NUEYM İSBƏHANİ, *Zikr Əxbaru-İsbəhan*, C. I, s. 241. Duha namazına dair hədislər üçün bax: CANAN, *Kutubi-Sitte, Tercüme ve Şerhi*, C. IX, s. 326. (لما قدم رسول الله صلعم الفتح فتح مكة نزل بأعلى مكة وصلى ثمان ركعات فقلت يا رسول الله ما هذه الصلاة فقال صلاة الضحى)
[1594] MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. V, s. 287.

**Tacəddin Əbü's-Səna Mahmud ibn Muhəmməd ibn Əhməd ibn Hişam ibn Əhməd ibn Ömər Tiflisi**

Misir Məmlüklü ordusunda zabit olan Tacəddin Mahmud Tiflisi həmçinin mühəddis idi. Yuxarıda haqqında bəhs etdiyimiz Fəthəddin Əbu Abdullah Muhəmməd Tiflisinin oğlu olan Tacəddin Əbü's-Səna Mahmud atası ilə yanaşı şeyx Fəxrəddin ibnü'l-Buxarinin tələbəsi olmuş, onun yanında Tirmizinin "Şəmailü'n-Nəbi" adlı hədis kitabını oxumuşdu. Tacəddin Mahmud Tiflisi h. 11 ramazan 746-cı ildə (5 yanvar 1346) Dəməşqdə vəfat etmiş, əl-Müzəffəriyyə camesində qılınan cənazə namazından sonra Qasiyyun qəbristanında dəfn edilmişdi[1595].

**Muhəmməd ibn Bəyan ibn Həmran Tiflisi**

Mühəddis idi. Bağdadda yaşayırdı. Atası Bəyan ibn Həmran hədis ravisi idi və Muhəmməd Tiflisi ondan hədis dinləmişdi. Daha sonra Həmmad ibn Yəzid, Osman əl-Bərri, Əbu İmran Mərvan ibn Şüca' əl-Cəzəri, Səid ibn Məsləmə əl-Əməvi, Abdullah ibn Həmmad Tiflisi, Muafi ibn İmran, Əbdüləziz ibn Xalid, Yəhya ibn Nəsr ibn Hacib, Əbu Əbdürrəhman əl-Muqri kimi mühəddislərdən hədis dinləmiş və hədis elmələrinə dair bilikləri öyrənmişdi. Əhməd ibn Yusif ibn Yaqub əl-Kufi ondan hədis dinləmiş və nəql etmişdi[1596]. Ölüm tarixi məlum deyil. Onun hədis müəllimlərindən Əbu İmran Mərvan əl-Cəzəri h. 184-cü ildə (800) vəfat etmişdir. Bu səbəblə Muhəmməd ibn Bəyan Tiflisinin də VIII-IX əsrlərdə yaşadığını təxmin etmək olar.

**Əbu İshaq İbrahim ibn Hümeyd ibn Əhməd Tiflisi**

Mühəddis idi. H. 532-ci ildə (1138) Tiflis şəhərində anadan olmuşdu. İlk təhsilini doğma şəhərində aldıqdan sonra təhsilini davam etdirmək üçün Misirə getmişdi. İsgəndəriyyədə dövrün tanınmış mühəddislərindən şeyx Əbü'l-Qasım Sibt əs-Sələfinin tələbəsi olmuşdu. Təhsilini başa vurandan sonra Misirdə qalmış və hədis elmlərinin tədrisi ilə məşğul olmuşdu. Onun tələbələri arasından Əbu Muhəmməd əl-Mənzəri və Əbü'l-Hüseyn əl-Qurəşi kimi hədis alimləri yetişmişdi. Əbu İshaq İbrahim Tiflisi

---

[1595] İBN RAFİ', *əl-Vəfayat*, s. 54.

[1596] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 314; XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. II, s. 96.

alimliyi ilə yanaşı xoşrəftar, abid, zahid, saleh və xeyriyyəçi insan kimi tanınmışdı. Alim h. 13 zilqədə 618-ci ildə (29 dekabr 1221) Misirdə vəfat etmişdi[1597].

**Qazi Hüseyn ibn Muhəmməd ibn Bəyan Tiflisi**

Mühəddis və Tiflis şəhərinin qazisi idi. Babası Bəyan Tiflisidən hədis dinləmiş və nəql etmişdi[1598]. Ölüm tarixi məlum deyil. Təqribən IX əsrdə yaşamışdı.

**Şeyx Bədrəddin Muhəmməd ibn Səbih ibn Abdullah Tiflisi**

Mühəddis, qari və müəzzin idi. Dəməşqdə rəisü'l-müəzzinin, yəni müəzzinləin başçısı adı ilə tanınmışdı. O, Dəməşqdəki əl-Əməvi camesinin müəzzini idi. Təvəllüdü h. 650-ci (1252-1262) illərə təsadüf edir. Aşağıda haqqında məlumat verdiyimiz qazi Kəmaləddin Ömər Tiflisi onun ana tərəfdən babası idi. Əmir İzzəddin Aybək əl-Cəmali, Əhməd ibn Ne'mət əl-Məqdisi, Əli ibn Əbdüddaim, Ömər əl-Kirmani, Əbu Bəkr ibnü'n-Nəşəbi kimi alimlərdən hədis dinləmişdi. Şeyx Yəhya əl-Mənbicinin tələbəsi olmuş, ondan Qur'an təcvid və tilavətinin incəliklərini öyrənmişdi. Muhəmməd Tiflisi özünün gözəl və məftunedici səsi ilə məşhur olmuşdu. Bir müddət səltənət naibliyi, daha sonra isə Salehiyyə şəhərinin möhtəsibi vəzifəsinə təyin edilmişdi. H. 725-ci ilin zilhiccə ayında (noyabr 1325) vəfat etmişdi[1599].

**Şeyx Əbu Abdullah Muhəmməd ibn Muhəmməd ibn Əbü'l-Vird Tiflisi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. H. 626-cı ilin rəcəb ayında (iyun 1229) Dəməşqdə anadan olmuşdu. Şam diyarının mədrəsələrində təhsil almış, fiqh və hədis elmlərini öyrənmişdi. Bir müddət Hələbin əl-Kəlasə[1600] məhəlləsinin imam-cüməsi olmuş, daha

---

[1597] MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. I, s. 146-147.

[1598] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. XLII, s.242. İbn Əsakir qazi Hüseyn ibn Muhəmməd ibn Bəyan Tiflisinin babasının adını "Əbu Şərif ibn Saiq Tiflisi" kimi qeyd edir. Ehtimal ki, bu Bəyan Tiflisinin künyəsi "Əbu Şərif" olmuşdu. Lakin Səm'ani, İbn Əsakirdən fərqli olaraq Bəyan Tiflisinin atasının adını "Saiq" deyil "Həmran" olduğunu qeyd etmişdir.

[1599] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. I, s. 305; SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. IV, s. 474-475.

[1600] [الكلاسة] – əl-Kəlasə və ya Kiçik Kəlasə XIX əsrdə Hələb şəhərindəki 107 böyük məhəllədən biri idi. Bax: EROĞLU, Cengiz-Murat BABUÇOĞLU-KÖÇER, Mehmet, *Osmanlı Vilayet Selnamelerinde Halep* s. 151, Anrara 2007.

sonra Misirə getmiş və burada hədis dərsləri vermişdi. Fəzilət sahibi, saleh insan kimi tanınmışdı. H. 14 şaban 691-ci ildə (30 iyul 1292) vəfat etmişdi[1601].

**Mübarək ibn Muhəmməd ibn Əli əl-Məvsusi Tiflisi**

Fəqih idi. Yəhya ibnü'r-Rəbi'nin tələbəsi olmuş, ondan şafi'i fiqhini öyrənmişdi. Fiqhə dair bir əsər qələmə almışdı. Ölüm tarixi 644-cü ildən (1246) sonraya təsadüf edir[1602].

**Əminəddin İbrahim ibn Əbu Bəkr ibn İbrahim əl-Bəkri Tiflisi**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. Raşid xəlifələrdən Əbu Bəkrin (ﺭ) nəslindən olduğu üçün əl-Bəkri nisbəsi ilə də tanınırdı. Atası Tiflisdən Misirə köçmüşdü. Əminəddin İbrahim Tiflisi h. 625-ci ilin məhərrəm ayında (dekabr 1227) Qahirədə dünaya gəlmişdi. Şeyx Əbü'l-Qasım Sibt əs-Sələfinin tələbəsi olmuş, ondan hədis elmlərini öyrənmişdi. Əminəddin İbrahim Tiflisi dərin elmi biliyi ilə yanaşı fəzilətli şəxsiyyəti ilə də tanınmışdı. Məmlüklü sultanı Rüknəddin Zahir Bəybarsın hakimiyyəti illərində (1260-1277) Misir ordusunda möhtəsiblik[1603] vəzifəsinə təyin olunmuşdu. Alim h. 680-ci ildə (1281) vəfat etmiş və Qahirədə imam Muhəmməd ibn İdris əş-Şafi'inin (//öl. 819) məqbərəsinin yanında dəfn edilmişdi[1604].

**Nəcməddin İsmayıl ibn İbrahim ibn Əbu Bəkr Tiflisi**

Mühəddis idi. İsmayıl ibn Əzvən, Osman ibn Ruşeyq kimi mühəddislərdən hədis dinləmişdi. İsmayıl ibn İbrahim ibn Musa əl-Qazi onun tələbəsi olmuş və ondan hədis dərsləri almışdı. Nəcməddin İsmayıl Tiflisi h. 746-cı ilin zilhiccə ayında (aprel 1346) 89 yaşında ikən vəfat etmişdi[1605].

**Qazi Kəmaləddin Əbü'l-Fəth Ömər ibn Bəndar ibn Ömər ibn Əli Tiflisi**

---

[1601] MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. VII, s. 100.
[1602] SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VIII, s.196; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 11.
[1603] Möhtəsib-maliyyə müfəttişi.
[1604] MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. I, s. 117.
[1605] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. I, s. 175.

Şafi'i məzhəbinə mənsub fəqih idi. Fiqh, fiqh üsulu, hədis, hədis üsulu, kəlam kimi elm sahələrində dərin biliyə malik alim idi. H. 601-ci ildə (1205) Tiflisdə anadan olmuşdu[1606]. Şeyx Təqiyəddin ibnü's-Səlah və şeyx Muhyəddin ən-Nəvəvidən hədis və hədis üsulu dərsləri almışdı. Qazi Kəmaləddin Tiflisi Dəməşqdə fətva mərcii idi və bu şəhərin Adiliyyətü'l-Kəbir və Dimağiyyə kimi[1607] mədrəsələrində müdərrislik edirdi. Kəmaləddin Tiflisi 11 il Dəməşq qazisi Sədrəddin Əhməd ibn Yəhya ibn Səniyyüddövlənin müavini olmuşdu[1608]. Məlum olduğu kimi Hülagü xan 1258-ci ildə Bağdadı zəbt edərək Abbasi xilafətinin varlığına son qoymuşdu. Onun növbəti hədəfi İslam coğrafiyasında moğol təhlükəsi qarşısında öz varlığını qoruyub saxlaya bilmiş yeganə dövlət olan Misir Məmlüklüləri idi. Hülagü xan xristian tatar olan komandanı Kətbuğa Noyana Suriyanın işğalı əmrini verəndən sonra bu ölkə 31 yanvar 1260-cı ildə zəbt olunmuşdu[1609]. İşğaldan sonra Hülagü xan şeyx Kəmaləddin Tiflisini Şam, Cəzirə, Mosul, Mardin, Məyyafariqin və Hısn-Kəyfə[1610] baş qaziliyinə və vəqflər nazirliyinə təyin etdi. Hülagü xanın fərmanı 26 rəbiələvvəl 558-ci (10 mart 1260) ildə Dəməşqdə, yaşıl meydan adlanan yerdə xalqa oxunmuşdu. Kəmaləddin Tiflisinin Hülagü xanın və ümumiyyətlə moğol hərbi məmurlarının nəzdində sözü keçirdi. Bu səbəblə də Kəmaləddin Tiflisi əlindən gəldiyi qədər müsəlman xalqı moğolların zülmündən, qətl və qarətdən qorumağa çalışmışdı[1611]. Dəməşqin sabiq qaziləri Muhyəddin ibn Zəki və Sədrəddin ibn Səniyyuddövlə Hələbə, Hülagü xanın hüzuruna gedərək əvvəlki vəzifələrinə qaytarılmalarını xahiş etmişdilər. Muhyəddin ibn Zəki yoldaşı Sədrəddin ibn Səniyuddövləyə kələk gələrək moğol dövlət məmurlarına böyük miqdarda rüşvət vermiş və Dəməşq qaziliyinə təyin olunmasına nail olmuşdu. Sədrəddin ibn Səniyyuddövlə isə Bəəlbək qaziliyinə təyin olunmuşdu. Lakin bu vəzifə də ona qismət olmamış, yolda xəstələnmiş və Bəəlbəkə çatandan qısa müddət sonra ölmüşdü. Muhəddin ibn Zəki Hülagü xanın fərmanı ilə Dəməşqə gəlib vəzifəsinin icrasına

---

[1606] ƏYNİ, *İqdü'l-Cüman*, s. 139.

[1607] NUEYMİ, *Daris fi Tarixi'l-Mədaris*, C. I, s. 178, 274.

[1608] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 152-153; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIII, s. 457; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. V, s. 625.

[1609] FƏHMİ, *həmin əsər*, s. 148-150.

[1610] Mardin, Məyyafariqin və Hısn-Kəyfə şəhərləri Türkiyənin cənubi-şərqində yerləşirlər.

[1611] İBN TAĞRIBİRDİ, *Nücumu'z-Zahirə*, C. II, s. 518; İBN TOLON, *Səğru'l-Bəssam*, s. 94-95; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. II, s. 123; SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VIII, s. 173-174; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. V, s. 625, İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIII, s. 387-388.

başlamışdı. Kəmaləddin Tiflisi isə Hələb və ətraf vilayətlərin qaziliyinə təyin olunmuşdu. Lakin o, Suriyada uzun müddət qalmayaraq 1265-ci ildən sonra Misirə köçmüşdü[1612].

1260-cı ildə Şam vilayəti, xüsusən də Suriya döyüş meydanına çevrilmiş, bir neçə dəfə əldə ələ keçmişdi. Nəhayət 3 sentyabr 1260-cı ildə Misir Məmlüklü sultanı Seyfəddin Müzəffər Qutuzun (1259-1260) ordusu Fələstin ərazisində baş vermiş Əyn Calut dövyüşündə Kətbuğanın ordusunu ağır məğlubiyyətə uğratmışdı. Kətbuğa noyan bu döyüşdə əmir Cəmaləddin Ağquş tərəfindən öldürülmüşdü. Məğlub olmuş 20 minlik moğol ordusundan çox az adam sağ qurtulmuşdu. Suriya moğol işğalından təmizlənmişdi[1613]. Bu moğolların ilk ciddi məğlubiyyəti idi. Bununla da Hülagü xanın Suriyanı, Misiri, bunların ardınca da Məkkə və Mədinəni zəbt etmə planı pozulmuşdu.

Misirə gedən Kəmaləddin Tiflisi Qahirədə məskunlaşmış, burada tədris və elmi fəaliyyətlə məşğul olmuşdu. Onun dərslərinə böyük tələbə qrupları toplaşırdı. O, dərin biliyə malik alim olmaqla yanaşı fəzilətli və izzətli insan idi. Ailəsinin böyük və ehtiyacının çox olmasına baxmayaraq heç vaxt vəzifəsindən sui-istifadə etməmişdi. Misirə gələndən sonra da sultandan hər hansı bir vəzifəyə təyin olunmasını xahiş etməmişdi. Alim h. 672-ci ilin rəbiələvvəl ayında (sentyabr 1273) Qahirədə vəfat etmişdi[1614].

**Səfiyəddin Cövhər ibn Abdullah Tiflisi**

Mühəddis idi. Yaşadığı dövrün tanınmış hədis alimlərindən hədis dinləmiş və hədis elmlərinə dair bilikləri öyrənmişdi. Gözəl əxlaqlı, himmət sahibi, saleh əməlli, yumuşaq xasiyyətli və kəskin zəkalı şəxs idi. Şəxsi kitabxanasında hədis elmlərinə dair çox sayıda

---

[1612] Şəmsəddin Əbu Abdullah Muhəmməd ibn Əhməd ZƏHƏBİ, *İbər fi Xəbər mən Ğəbər*, C. III, s. 154, Küveyt 1966; İBN TAĞRIBİRDİ, *yenə orada*; İBN TOLON, *yenə orada*; İBN QAZİ ŞUHBƏ, *yenə orada*; SÜBKİ, *yenə orada*; İBNü'l-İMAD, *yenə orada*.

[1613] FƏHMİ, *yenə orada*, s. 148-150; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIII, s. 388-392; Mahmud ŞƏLBİ, *Həyatü'l-Məlikü'l-Müzəffər Qutuz*, s. 285-288, Beyrut 1992.

[1614] İBN TOLON, *yenə orada*; ƏSNƏVİ, *yenə orada*; İBN QAZİ ŞUHBƏ, *yenə orada*; SÜBKİ, *yenə orada*; İBNü'l-İMAD, *yenə orada*; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIII, s. 457; MƏQRİZİ, *Kitabu's-Süluk*, C. I, s. 140.

kitab var idi. Vəfatından əvvəl şəxsi kitabxanasını hədis tələbələrinin istifadəsi üçün vəqf etmiş, bağışlamışdı. Səfiyəddin Cövhər Tiflisi h. 700-cü ildə (1301) vəfat etmişdi[1615].

**Həkim Kəmaləddin Əbü'l-Fəzl Hübeyş ibn İbrahim ibn Muhəmməd əl-Mütətəbbib Tiflisi**

XII əsrdə yaşımış məşhur həkim, əczaçı, filoloq, astronom və ilahiyyatçı idi. Təqribən 1113-1116-cı illərdə Tiflisdə dünyaya gələn[1616] Kəmaləddin Əbü'l-Fəzlin ailəsi Anadoluya köçmişdi. Onun ailəsinin hansı tarixdə Azərbaycandan Rum diyarına köçdüyü barədə mənbələrdə məlumat yoxdur. Ehtimal ki, bu köç münfərid olmamışdır, yəni 1122-ci ildə gürcülərin Tiflisi işğalından[1617] sonra bir çox azərbaycanlı öz doğma şəhərlərini tərk etmək məcburiyyətində qalmışdır. Uzun müddət Kayseri şəhərində yaşayan Kəmaləddin Hübeyş Tiflisi Anadolu Səlcuqlu sultanı İzzəddin II Qılıncarslanın (1155-1292) sarayına dəvət olunmuş, elmi fəaliyyətini sultanın himayəsində davam etdirmişdi. Bu səbəbdən də alim əsərlərinin çoxunu II Qılıncarslana ithaf etmişdi. Onunla eyni dövrdə məşhur tibb alimləri süryani Həsnun Nəsrani ər-Ruhavi, əndəlüslü yəhudi Musa ibn Maymun da Anadolu Səlcuqlularının sarayında fəaliyyət göstərmişdilər[1618]. İslam dünyasında yaşamış tibb alimləri və məşhur həkimlərin tarixini yazmış Cəmaləddin Qıfti (1172-1248) Kəmaləddin Hübeyş Tiflisinin müasiri olmasına baxmayaraq əsərində onun haqqında məlumat verməmişdi. Cəmaləddin Qıfti öz əsərində Hübeyş ibnü'l-Həsən əl-Asim adlı bir təbib haqqında geniş məlumat verərək hicri VI (XII) əsrdə yaşamış bu şəxsin bir çox yunanca kitabı, cümlədən Qalenin (Galenios) tibbə dair bir neçə əsərini də ərəb dilinə tərcümə etdiyini qeyd edir[1619]. Cəmaləddin Qıftinin haqqında məlumat verdiyi bu şəxs fikrimizcə Kəmaləddin Hübeyş Tiflisidən başqası deyildir. Çünki irəlidə də görəcəyimiz kimi Kəmaləddin Tiflisi yunan dilini mükəmməl şəkildə bilirdi və tibbə dair bir çox yunanca

---

[1615] İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 62; İBN TAĞRIBİRDİ, *Mənhəlü's-Safi*, C. I, s. 407; ƏYNİ, *İqdü'l-Cüman*, s. 393.

[1616] Kəmaləddin Əbü'l-Fəzl Hübeyş TİFLİSİ, *Bəyanü's-Sənə'ət*, (Nşr. Q. Mixaleviç), s. 13 (Önsöz qismi), Moskva 1976; s. 13; Zəbihullah SƏFA, *Tarixi-Ülume-Əqli dər Təməddüne-İslami*, C. II, s. 998-999, Tehran 1329.

[1617] BÜNYADOV, *Azərbaycan Atabəyləri Dövləti*, s. 19-20.

[1618] Cəmaləddin Əbü'l-Həsən Əli ibn Yusif əl-QIFTİ, *Tarixü'l-Hükəmayi-Qıfti*, (Nşr. B. Darayi), s. s. 234, 445, Tehran 1347.

[1619] QIFTİ, *Tarixü'l-Hükəma*, s. 244-245.

əsəri ərəb və fars dillərinə tərcümə etmişdi. Cəmaləddin Qıfti onun adını, künyə və nisbəsini fərqli qeyd edən yeganə müəllif olmamışdır. Türkiyə Bursa EYBEK Orxan Ğazi kolleksiyasında saxlanılan, Kəmaləddin Hübeyş Tiflisinin müəllifi olduğu "Kifayətü't-Tibb" adlı əsənin istinsəx qeydində onun adı Əbü'l-Fəzl Hübeyş ibn Muhəmməd Qəznəvi kimi qeyd edilmişdir. Bu qeyd Cavad İzgini Kəmaləddin Hübeyş Tiflisinin əslən Qəznəli olduğu, sonradan özünün və ya ailəsinin Tiflisə köçməsi[1620] kimi yanlış nəticəyə istiqamətləndirmişdir. İranlı tədqiqatçılar Kəmaləddin Hübeyş Tiflisinin əsərlərində istifadə etdiyi farsca ləhcənin Xorasanın dəri ləhcəsindən fərqli olduğu qənaətinə gəlmişdirlər[1621]. Alimin ləqəbini "Şərəfəddin" kimi qeyd edən Səid Nəfisi onun əsərlərini fars və tacik dillərində yazdığını bildirmişdir[1622]. Azərbaycanın tarixi coğrafiyasından danışarkən Suğdabil şəhərinin inşasından sonra Sasani şahı Ənuşirvanın buraya əhalini Soğddan köçürərək məskunlaşdırdığını qeyd etmişdik. Ehtimal ki, Kəmaləddin Tiflisi əsərlərinin bəzilərini soğd ləhcədə yazmışdır. Əlbəttə ki, bu köçürmə və məskunlaşmanın üzərindən uzun əsrlər ötdüyü üçün dil mütləq müəyyən dəyişikliyə uğramışdı.

Kəmaləddin Hübeyş Tiflisinin 25 əsəri müəyyən edilmişdir. Bunlardan 10-u fars, digərləri isə ərəb dilindədir. Alimin əsərlərinin əksəriyyəti tibbə aiddir. Bununla yanaşı onun filologiya, farmakologiya (əczaçılıq) və astronomiya (nücum elmi) sahəsində də əsərləri mövcuddur.

Tibbə dair əsərləri: "Bəyanü't-Tibb" adlı əsərinin bir nüsxəsi Tehran Sipəhsalar kitabxanasında saxlanılır. "Təqvimü'l-Ədviyyə fi't-Tibb" adlı əsəri əczaçılığa aiddir. Burada cəmi 734 növ dərmandan ərəb, fars, yunan, latın və süryani dillərindəki adları qeyd olunaraq bəhs edilir. Bu əsərin əlyazma nüsxələri İranın Maliki-Milli, İran Məclis kitabxanalarında və Türkiydə Manisa İHK-də mövcuddur. "Sihhətü'l-Əbdan"ın adı məlum olsa da bu vaxta qədər əlyazma nüsxəsinə rast gəlinməmişdir. Kəmaləddin Tiflisi "Kamilü't-Tə'bir" adlı əsərinin müqəddiməsində "Bu əsəri (Kamilü't-Tə'bir-E.N) "Sihhətü'l-Əbdan"ı yazıb başa vurduqdan sonra qələmə aldım" deyə yazır. "Kifayətü't-Tibb" adlı əsərini Anadolu Səlcuqlu şahzadəsi Qütbəddin II Məlikşaha (öl. 1193) ithafən

---

[1620] Cevat İZGİ, "Hubeyş et-Tiflisî", **İA** (TDV), C. XVIII, İstanbul 1998, ss. 298-299.

[1621] Əli Təqi MÜNZƏVİ, *Fərhəngnaməyi Ərəbi bə Farsi*, s. 200, Tehran 1337.

[1622] NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 128.

qələmə almışdır. Bu əsərin nüsxələrindən biri Daşkənd Şərq Əlyazmaları kitabxanasında, digəri isə Almaniya Frankfurt Qota kitabxanasında saxlanılır[1623].

"Nəzmü's-Süluk", "Risalə fi Şərhi bə'zi'l-Məsail li-Əsbab və'l-Alamat", "Müntəxabat min əl-Qanun" da Kəmaləddin Tiflisinin tibb və farmakologiyaya dair yazdığı əsərlərdir[1624]. Kəmaləddin Tiflisi burada İbn Sinanın "əl-Qanun fi't-Tibb" adlı əsərində qeyd olunmuş bəzi məsələləri şərh etmişdir. Bundan başqa ilk dəfə Hippokrat andını da "Əhdi-Buqrat" adı ilə süryani dilindən fars dilinə Kəmaləddin Tiflisi tərcümə etmişdir. Bu kitabın bir nüsxəsi Berlin Milli kitabxanası Nr. 4959-6235 saxlanılır. Kəmaləddin Hübeyş Tiflisi klassik yunan filosofu və təbibi Qalenin "Qalibi-Qutubi", "Kitab Mənfəət-i Əza", "Hisbü'l-Bədən" kimi əsərlərini də farscaya tərcümə etmişdir[1625].

Kəmaləddin Tiflisinin tibbə dair qələmə aldığı digər bir əsər də "Məcmuatu'r-Rəsailü't-Tibbiyyə" adlanır. Müəllif bu əsərini ərəb dilində yazmışdır və əsərin yeganə nüsxəsi ABŞ Princeton universiteti kitabxanasında Nr. 1108-də saxlanılır. Əsər cəmi doqquz risalədən ibarətdir. Bunlar "Təqvimü'l-İlac və Bərəkatü'l-Mənhəc", "Rumuzü'l-Mənhəc və Künzü'l-İlac", "Təhsilü's-Sihhə bi'l-Əsbabü's-Sittə", "Ədviyyatü'l-Ədviyyat", "Risalətü'l-Mütəarifə", "Lübabu-Əsbab", "İxtisar Fusuli-Buqrat" adlı risalələr bunlardan bir neçəsidir. "Məcmuatu'r-Rəsailü't-Tibbiyyə"nin əlyazma nüsxəsinin surəti şəxsi kitabxanamda mövcuddur.

Filologiyaya və ilahiyyata dair əsərləri: "Bəyanü't-Təsrif", "Vücuhü'l-Qur'an" müəllif tərəfindən 1163-cü ildə Konya şəhərində qələmə alınmışdır. "Vücuhül-Qur'an" adlı əsərin yeganə nüsxəsi Türkiyə Süleymaniyyə kitabxanası Nr. 3246-da mühafizə edilir. "Cəmiü'l-Bəyan dər Tərcümani-Qur'an", "Təlxis ələ'l-Qur'an" Kəmaləddin Tiflisinin Qur'an və dini elmlər sahəsində qələmə aldığı əsərlərdir. "Qanunü'l-Adab dər Lüğət" (və ya Qanunü'l-Ədəb fi Zəbti Kəlimati'l-Ərəb) Tiflisinin müəllifi olduğu ərəbcə-farsca lüğətdir. Əsər eyni zamanda ərəbcə-farsca müqayisəli qrammatika kitabıdır. Dünyanın bir çox kitabxanasında nüsxəsi mövcuddur. Bir nüsxəsi də İstanbul Aya Sofiya kitabxanası Nr. 472-də saxlanılır. Əsərin digər  əlyazma nüsxələri Ankar Milli

---

[1623] TİFLİSİ, *Bəyanü's-Sənə'ət*, (Nşr. Q. Mixaleviç), s. 38-47.
[1624] BROCKELMANN, *Geschıchte der Arabıschen Lıtteratur*, E.S, C. I, s. 893.
[1625] SƏFA, *həmin əsər*, C. I, s. 347.

kitabxana, Amasiya Bəyazid İHK və Çorum Həsən paşa İHK-də mövcuddur. “Kitabü’l-Qəvafi” ədəbiyyat, şe’r və qafiyə qaydalarına dair əsərdir. Müəllif bu əsərini 1189-cu ildə yazıb bitirmiş və sultan İzzəddin II Qılıncarslana ithaf etmişdir.

Astronomiyaya dair əsərləri: “Bəyanü’n-Nücum”, “Mədxəl ilə İlmü’n-Nücum”, “Məlhamətü’d-Daniyal”. Bu son əsərinin əlyazma nüsxəsi İstanbul Aya Sofiya kitabxanası Nr. 2706-da saxlanılır. Həmçinin Çorum Həsən paşa İHK-də bir nüsxəsi mövcuddur. “Kamilü’t-Tə’bir” adlı əsəri isə yuxu yozmaları sahəsində yazılmışdır. “Kamulü’t-Tə’bir”in bir nüsxəsi Antaliya Təkəlioğlu kitabxanası Nr. 2142-də saxlanılmaqdadır. Həmçinin İstanbul Süleymaniyyə əlyazma əsərlər kitabxanası və Konya Yusifağa kitabxanasında da əlyazma nüsxələri mövcuddur.

Rus şərqşünası Georgi Mixaleviç Kəmaləddin Hübeyş Tiflisinin “Bəyanü’s- Sənə‘ət” adlı əsərini rus dilinə tərcümə və nəşr etmişdir. Bu əsərin molla Qurban ibn Cəlil tərəfindən h. 1217-ci (1802) ildə istinsax edilmiş əlyazma nüsxəsi AMEA Əİ Fondu Nr. B-796/3830-da saxlanılan məcmuənin (vərəq 301b-321a) içində yerləşir. Əsər iyirmi fəsildən ibarətdir. Kəmaləddin Tiflisi əsərin müqəddiməsində belə yazır: “Mən Bəyanü’n-Nücum adlı əsəri yazıb bitirəndən sonra bu kiçik risaləni yazmağa başladım. Məqsədim müxtəlif sən’ətlər haqqında söhbət açmaqdır. Onlar haqqında müxtəlif ərəbcə risalələrdən məlumatlar topladım və müxtəlif sirrləri bəyan etdim. Hansı ki, bunları müəlliflər öz əsərlərində sirr kimi saxlamışdılar. Kitabı “Bəyan-üs-Sən’ət” adlandırdım. Hər bir başlığın altında haqqında danışılan sən’ətin müdrikliyini izah etdim ki, inşaallah oxucu asan dərk etsin. Əgər bu kitab hər hansı bir şəxsin əlinə keçsə və həmin şəxs bu kitabdan fayda hasil etsə qoy məni xeyirli dualarla yada salsın. Bu mənim haqqımda xoş xatirə olaraq qalsın. Bu kitabda 20 fəsil var. Mən onları sıra ilə sadalayacağam. İnşaallah oxucu istədiyini asanlıqla tapa bilər”[1626].

Müəllif ilk fəsil olan əl-Kimyada misi və ya qalayı gümüşə çevirə bildiyini iddia edənləri tənqid edərək onları yalançı adlandırır, sonra isə onların bu saxtakarlığı necə etdiklərini açıqlayır[1627]. Əsərin yeddinci fəsli isə o dövrdə silah industriyasının inkişaf səviyyəsi haqqında təsəvvür yaranması üçün yetərli məlumatı ehtiva edir. Kəmaləddin

---

[1626] TİFLİSİ, *Bəyanü’s-Sənə‘ət*, s. 65.
[1627] *Həmin əsər*, s. 66-67.

Tiflisi burada qılınc, ox ucu, nizə və.s silahların necə daha kəskin və öldürücü gücə sahib ola biləcəyini və bunların yollarını açıqlayır. Oxların və nizələrin hədəfdən yayınmaması üçün alim maqnitin odda qızarana qədər saxlanılıb sonra suya atılmasını, daha sonra isə ox, nizə ucları və ya qılıncın da odda qızarana qədər saxlanaraq həmin suda soyudulmasını təklif edir. Belə edildikdə silahların dəmir əşyaları maqnit kimi özünə çəkəcəyini və zirehləri daha asan deşəcəyini bildirir. Bununla yanaşı müəllif zirehli döyüş geyimləri, ox və nizə uclarının hazırlanma qaydalarını da izah edir[1628]. Əsərin digər fəsillərində isə Kəmaləddin Hübeyş Tiflisi rəngli və şəffaf şüşələrin istehsalı, qiymətli daşların müəyyən edilməsi və emalı, şüşə qablar, stəkanlar və çıraqların hazırlanma üsullarını açıqlayır.

Kəmaləddin Hübeyş Tiflisi 1204-cü ildə vəfat etmişdir[1629]. Alimin öldüyü və dəfn edildiyi yer haqqında mənbələrdə heç bir məlumata rast gəlmək mümkün olmamışdır. Ehtimal ki, Kəmaləddin Hübeyş Tiflisi Kayseri şəhərində vəfat etmiş və orada dəfn edilmişdir.

**Əbu Abdullah Hüseyn ibn Abdullah ibn Hüseyn ibn Muhəmməd ibn Hüseyn ibn Muhəmməd ibn Şuveyx Urməvi**

Mühəddis idi. Bağdadda və Bəsrədə təhsil almışdı. Bağdadda Əbu Muhəmməd Abdullah ibn Übeydullah ibn Yəhya İbnü'l-Bəyi'dən, Bəsrədə Əbu Əmr Muhəmməd ibn Muhəmməd ibn Bəkr əl-Hizanidən hədis dərsləri almış, hədis dinləmişdi. Misirə getmiş və orada hədis dərsləri vermişdi. Hafiz Əbü'l-Qasım Hibətullah ibn Əbdülvaris Şirazi, Əbü'l-Fityan Ömər ibn Əbdülkərim ər-Rəvvasi ondan hədis dinləmiş və nəql etmişdilər. H. 460-cı ildə (1068) Misirdə vəfat etmişdi[1630].

**Əbu Bəkr Muhəmməd ibn Hüseyn ibn Ömər Urməvi**

---

[1628] *Həmin əsər*, s. 90-91.

[1629] Səid Nəfisiyə görə Kəmaləddin Hübeyş Tiflisinin h. 629-cu (1232) ildə vəfat etmişdi. Bax: *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 128.

[1630] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 74-75; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 154; İBNü'l-ƏSİR, *Lübab fi Təhzibü'l-Ənsab*, C. I, s. 44-45.

Şafi'i məzhəbinə mənsub fəqih idi. H. 465-ci ildə (1073) Bağdada gəlmiş, Nizamiyyə mədrəsəsində oxumuş və Əbu İshaq Şirazidən fiqh təhsili almışdı. Əbü'l-Hüseyn ibn Mühtədi Billah əl-Haşimi və Əbü'l-Hüseyn ibnü'n-Nuqəvvərdən hədis elmlərini öyrənmiş və hədis dinləmişdi. Təhsilini başa vurduqdan sonra Bağdadda qalmış və buradakı mədrəsələrdə tədris fəaliyyəti ilə məşğul olmuşdu. Əllamə Əbu İshaq İbrahim ibn Mənsur əl-Misri Əbu Bəkr Muhəmməd Urməvinin tələbəsi olmuş, ondan fiqh elmini öyrənmişdi[1631]. Əbu Müəmmər əl-Ənsari isə ondan hədis dinləmişdi. Alim h. 537-ci ilin məhərrəm ayında (avqust 1142) vəfat etmiş və Kərəc qəbrisatnında dəfn edilmişdi[1632].

**Əbü'l-Fəzl Muhəmməd ibn Ömər ibn Yusif Urməvi**

Mühəddis idi. Əbü'l-Qənaim Əbdüssəməd ibn Əli ibn Mə'mun, Əbu Cə'fər ibnü'l-Məsləmə, Əbu Ömər əl-Adəmi kimi mühəddislərdən hədis dinləmişdi. Əbü'l-Həsən Əli ibn Ömər Darəqutni (öl. 995) Əbü'l-Fəzl Muhəmməd Urməvidən hədis dinləmiş alimlərdən biridir[1633]. Alimin ölüm tarixi məlum deyil. IX-X əsrlərdə yaşamışdır.

**Əbu Cə'fər Muhəmməd ibn Hibətullah ibn Firuz Urməvi**

Mühəddis idi. H. 529-cu ildə (1135) Qəzvinə getmiş və bu şəhərdə təhsil almışdı. Onun hədis dinlədiyi alimlərdən Əbu İshaq əş-Şəhhazinin adını çəkmək olar. Əbu Cə'fər Muhəmməd Urməvi Əbu Mə'şər Əbdülkərim ət-Təbəri kimi ravilərdən hədis nəql etmişdi[1634]. Ölüm tarixi məlum deyil. XII əsrdə yaşamışdır.

**Hafiz Əbu'n-Nəcib Əbdülğəffar ibn Əbdülvahid ibn Muhəmməd ibn Əhməd ibn Nəsr ibn Hişam ibn Ruzman Urməvi**

---

[1631] İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. II, s. 5.

[1632] SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, c.6, s.52; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 62; İBN KƏSİR əl-ƏNSARİ, *Zeyl Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, v. 119b.

SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 74-75. Səm'ani, Əbu Bəkr Muhəmməd Urməvinin h. 636-cı ildə (1239) vəfat etdiyini qeyd etmişdir.

[1633] RAFİ'İ, *Tədvin*, C. I, s. 122.

[1634] RAFİ'İ, *Tədvin*, C. II, s. 41.

Yaşadığı dövrün tanınmış hədis hafizlərindən idi. Hədis dinləmək üçün səyahət etmiş, Bağdad, Şam diyarı, İsfəhan, Misir və Məkkədəki ravilərdən hədis dinləmişdi. Onun ulu əcdadı Ruzman, Cərir ibn Abdullah əl-Bəcəlinin[1635] köləsi olmuş, daha sonra Cərir ibn Abdullah əl-Bəcəli tərəfindən azad edilmişdi[1636]. Hafiz Əbu'n-Nəcib Əbdülğəffar Urməvi Misirdə Muhəmməd ibn Nuzeyf əl-Misridən, Bağdadda Əbü'l-Qasım Əbdülməlik ibn Muhəmməd ibn Buşran, Əbu Abdullah Əhməd ibn Abdullah əl-Mühamili, Əbu Əmr Osman ibn Muhəmməd ibn Yusif ibn Dostdan, İsfahanda Əbu Nueym əl-İsfəhanidən (947-1039) və daha onlarla ravidən hədis dinləmiş və nəql etmişdi. Bir müddət Dəməşqdə yaşamış və burada hədis nəql etmişdi. Əbdüləziz ibn Əhməd əl-Kinani, Əbu'n-Nəcib Muhəmməd ibn Mənsur Maraği, Nəca ibn Əhməd, Əbu İmran Musa əs-Səqəli və daha onlarla ravi ondan hədis dinləmişdilər. Əbu'n-Nəcib Əbdülğəffar ibn Əbdülvahid Urməvi həm də şair idi və gözəl şerlər yazırdı. İbn Əsakir onun h. 433-cü ilin şəvval ayında (iyun 1042) Dəməşq yaxınlığında vəfat etdiyini qeyd etmişdir[1637].

**Vaiz Əbü'l-Vəfa Reyhan ibn Əbdülvahid ibn Əhməd ibn Nəsr ibn Hişam ibn Ruzman Urməvi**

Səduq hədis ravisi və hafiz Əbu'n-Nəcib Əbdülğəffar Urməvinin qardaşı idi. Bağdada gəlmiş və burada təhsil almış, hədis dinləmişdi. Xətib Bağdadi əsərində onun Əbu Əli ibn Həbəş Dinəvəridən hədis nəql etdiyini və özünün də ondan hədis dinlədiyini qeyd etmişdir. Əbu Tahir Muhəmməd ibn Əli əl-Əşnani ondan hədis dinləmişdi. Əbü'l-Vəfa Reyhan Urməvi h. 430-cu ildə (1039) Urmiyədə vəfat etmişdi[1638].

**Şeyx Fəthəddin Əbü'l-Fəzl Əbdülhəmid ibn Muhəmməd ibn Səid Urməvi**

---

[1635] Cərir ibn Abdullah əl-Bəcəli (ا. öl. 674) Allah Rəsulunun (ق) səhabələrindən idi. Buveyb döyüşü qəhrəmanlarından biri, Hulvan şəhərinin fatehi idi. İranın və Azərbaycanın fəthi vaxtı Səid ibn Əsin (ا) başkomandanlığı altındakı İslam ordusundakı hərbi hissələrdən birinə əmirlik etmişdi. Bax: NƏSIROV, *Raşidi Xəlifələr Dövründə Azərbaycanın Fəthi*, s. 42, 46.

[1636] XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. II, s. 116.

[1637] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. XXXVI, s. 389-391; İBN MAKULA, *İkmal*, C. I, s. 65; KƏTTANİ, *Zeyl Tarixi-Məvlid*, s. 181.

[1638] XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. VIII, s. 427.

Fütuvvət əhlinə mənsub şeyx idi. İbnü'ş-Şəhir adı ilə məşuh olmuşdu. Onun ata və babaları da zöhd və abidlikləri ilə tanınmış təsəvvüf şeyxlərindən idilər. İbnü'ş-Şəhir Urmiyədə öz adı ilə tanınan zaviyədə irşad və mənəvi tərbiyə ilə məşğul olmuşdu. Bundan başqa onun zaviyəsində şəhərə gəlmiş qonaqlar, kimsəsizlər, qəriblər və yetimlər sığınacaq tapırdılar. Şeyx İbnü'ş-Şəhir gözəl əxlaq, həya sahibi, saleh insan idi. Əxi şeyx Ömər ibn Muhəmməd əl-Xubbaz əş-Şirazi onun yaxın dostu idi[1639]. Ölüm tarixi məlum deyil. Təqribən XIII əsrdə yaşamışdır.

**İbrahim ibn Nasir Urməvi**

Mühəddis idi. Qəzvində Əbü'l-Həsən Əli ibn Həsən Cə'duyə, şeyx Əbu Tahir Muhəmməd ibn Əhməd ibn Əli Urməvi kimi alimlərdən hədis dinləmiş və hədis elmlərinə dair bilikləri öyrənmişdi[1640]. Ölüm tarixi məlum deyil. X-XI əsrlərdə yaşamışdır.

**Əbu Tahir Qasım ibn Əhməd əs-Saiği Urməvi**

Mühəddis idi. H. 477-ci (1084) ildə Qəzvində hədis dərsləri vermişdi. Fəqih Əbü'l-Qasım Əbdülkərim ibn Həsən əl-Kərəci, Əbü'l-Həsən Əbdüləziz ibn İsmayıl Həsnuyə, İsmayıl ibn Hibətullah əl-Kəmmuni kimi mühəddislər onun tələbəsi olmuş, dərslərini dinləmişdilər[1641]. Alimin ölüm tarixi məlum deyil. XI əsrdə yaşamışdır.

**Siracəddin Əbü'l-Abbas Əhməd ibn Mahmud ibn Əhməd Urməvi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Qaziü'l-Hüseyniyyə ləqəbi ilə tanınmışdı. Qahirədəki Əmr ibnü'l-As məscid-mədrəsə kompleksində fiqh dərsləri vermişdi. H. 667-ci ilin cəmaziələvvəl ayında (yanvar 1269) Qahirədə vəfat etmiş və Qələtü'l-Cəbəlin[1642] ətəklərindəki bağda dəfn olunmuşdu[1643].

---

[1639] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 36.
[1640] RAFİ'İ, *Tədvin*, C. II, s. 54.
[1641] RAFİ'İ, *Tədvin*, C. IV, s. 136.
[1642] Qələtü'l-Cəbəl-hərfi tərcümədə dağ qalası, dağdakı qala mənasını ifadə edir. Qələtü'l-Cəbəl Əyyubi hökmdarı Səlahəddin Yusif Əyyubi (1169-1193) tərəfindən Qahirə yaxınlığındakı əl-Müqəttəm dağı üzərində inşa etdirilmiş qala idi.
[1643] MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. I, s. 658.

**Əbü'l-Məali Məs'ud ibn Şüca' Urməvi**

H. 510-599-cu (1116-1203) illərdə yaşamış şafi'i məzhəbinə mənsub fəqih idi. Onun müəllifi olduğu "Mültəqatat minə'l-Məsaili'l-Vaqeat" adlı əsərin əlyazma nüsxəsi Türkiyə Amasiya Bəyazid İHK-də saxlanılır.

**Loqman ibn seyyid Hüseyn əl-Aşuri Urməvi**

Osmanlı dövlətində yaşamış tarixçi, astronom və dövlət xadimi idi. Sultan III Murad (1574-1595) və III Mehmedin (1595-1603) hakimiyyətləri dövründə rəsmi saray tarixçisi və şahzadə müəllimi olan Loqman Urməvinin əsərləri yaşadığı dövr Osmanlı siyasi, ictimai, mədəni tarixi, həmçinin saray həyatının təsviri baxımından əvəzedilməz mənbələrdir. Alim h. 1010-cu (1601) ildə vəfat etmişdir. "Qiyafətü'l-İnsaniyyə fi Şəmailü'l-Osmaniyyə" adlı əsərində III Murada qədərki Osmanlı sultanlarının zahiri görünüşü, geyimləri və dövrlərində baş vermiş mühüm hadisələr haqqında məlumat vermişdir. Onun bir digər əsəri "Hünərnamə" adlanır. Bu əsərində sultan Yavuz I Səlim (1512-1520) və Qanuni I Süleymanın (1520-1566) hakimiyyəti dövründə baş vermiş mühüm hadisələrdən bəhs etmişdir. "Səlim Şahnamə" adlı əsərində sultan II Səlimin (1566-1574) hakimiyyəti dövrü təsvir olunmuşdur. "Şahənşahnamə" adlı əsəri isə sultan III Muradın hakimiyyəti dövründə baş vermiş hadisələr haqqındadır. Alimin "Mücməlü't-Tomar" adlı əsərində bir neçə risalə yazılmışdır. Buna "Nəsəbnameyi-Humayun", "Tarixçeyi-Mehr və Müştəri li-Muhəmməd Əssar", "Tərcümə Ləmiətü'l-Ənvar", "Sələfnamə", "Xələfnamə", "Müasirnamə", "Moğolnamə", "Zəfərnamə", "Risalətu-Alati'l-Rəsədiyyə" adlı risalələr daxil idi. Loqman Urməvi sultan III Muradla birlikdə bir sıra hərbi səfərlərdə iştirak etmişdi. Məsələn 1596-cı ildə Əyri qalasının[1644] fəthində Loqman Urməvi də iştirak etmişdi[1645]. Bundan başqa Loqman Urməvi "Şahnaməyi Ali-Osman", "Silsilənamə", "Zübdətü't-Təvarix" kimi əsərlərin müəllifi idi. İstanbul Topqapı sarayı muzeyinin kitabxanasında alimin "Qiyafətü'l-İnsaniyyə fi

[1644] Əyri (türkcə Eğri, macarca Eger, almanca Erlau) şəhəri Macarıstanda, Budapeştin təqribən 110 km şimali-şərqində yerləşir.
[1645] BURSALI, *Osmanlı Müəllifləri*, C. III, s. 135.

Şəmailü'l-Osmaniyyə", "Silsilənamə" və "Zübdətü't-Təvarix" adlı əsərləri mühafizə edilir. British Library-də isə Loqman Urməvinin "Şahnaməyi Ali-Osman" və "Mücməlü't-Tomar" adlı əsərləri saxlanılır.

**İmam Əbü'l-Fəzl Surxab ibn Əbü'l-Qərib ibn Yəhya Urməvi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Bir müddət Hələbdə yaşamış və buradakı mədrəsələrdən birinə rəhbərlik etmiş, müdərris olmuşdu. Hələb şəhərinin tarixini yazmış Kəmaləddin ibnü'l-Adim onunla bağlı maraqlı bir hadisəni öz əsərində qeyd etmişdir. İmam Əbü'l-Fəzl Surxab Urməvinin müdərrisi olduğu Hələbəki mədrəsənin həyətində bulaq var idi. Bulağın ətrafında içində balıqların olduğu hovuz tikilmişdi. Bir gün həmin mədrəsənin müəllimi olan fəqihlərdən bir neçəsi öz paltarlarını bu hovuzda yumuşdular. Sabunun təsirindən hovuzdakı balıqlar ölmüş və Əbü'l-Fəzl Surxab Urməvi bundan xəbər tutan kimi həmin fəqihləri mədrəsədən qovmuşdu. Mədrəsədəki işlərindən qovulan şəxslər bununla bağlı Hələb hakimi Məlikü'z-Zahirə (öl. 1216) şikayət etmişdilər. Məlikü'z-Zahir isə xeyli ədalətsiz bir qərar verərək imam Əbü'l-Fəzl Surxab Urməvini tutduğu vəzifədən azad etmiş və Ərbilə göndərmişdi. Əbü'l-Fəzl Surxab Urməvi buradakı Müzəffəriyyə mədrəsəsinə müəllim təyin olunmuşdu. Lakin o, bu mədrəsədə dərs verdiyi vaxtlarda xəstələnmişdi. İbnü'l-Adim alimlə həmin mədrəsədə görüşdüyünü qeyd etmişdi. Bir müddət sonra Əbü'l-Fəzl Surxab Urməvi Ərbildəki Darü'l-Zayf qonaq evinə aparılmış və burada yaşamağa başlamışdı. O, vəfatından bir müddət əvvəl sahib olduğu qul və kənizləri azad etmiş, bütün var-dövlətini onlara və ehtiyacı olan insanlara paylamışdı. O, cümlədən şəxsi kitabxanasını da xeyriyyə məqsədiylə bağışlamışdı. Onun kimsəsi, yəni övladı yox idi. Alim h. 11 cəmadiəlaxir 607-ci ildə (30 noyabr 1210) Ərbildə, Darü'l-Zayfda vəfat etmişdi[1646].

**Şeyx Fəxrəddin Əbu Əli İbrahim ibn Yusif ibn Abdullah Urməvi**

Mühəddis idi. H. 642-ci ildə (1244) qardaşı Şərəfəddin Muhəmmədlə birlikdə Misirdə şeyxü'ş-şərif Kəmaləddin Əbü'l-Həsən Əli ibn Şüca' əl-Abbasidən hədis dərsləri almış,

---

[1646] İBNü'l-ADİM, *Buğyətü't-Tələb*, C. VIII, s. 225-226.

onun yanında imam Buxarinin "Səhih"ini oxumuşdu[1647]. Ölüm tarixi məlum deyil. XIII əsrdə yaşamışdır.

**Zeynəddin Əli ibn Əhməd ibn Əli ibn Urməvi**

Hənbəli məzhəbinə mənsub fəqih idi. Həyatı haqqında ətraflı məlumat yoxdur. Zeynəddin Əli Urməvi "Cəvahirü't-Təbsir fi İlmü'r-Ruya" adlı əsərin müəllifi idi. Alim h. 835-ci ildə (1432) vəfat etmişdir[1648].

**Əbu'r-Ruh Fərəc ibn Əbu Bəkr ibn Fərəc Urməvi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Əbu'r-Ruh Fərəc Urməvi fəzilətli, saleh və xoşrəftar insan idi. Xorasanın Nəvqan[1649] şəhərində təhsil almış, Muhəmməd ibn Əbü'l-Abbasdan fiqh öyrənmişdi. Əbu Səd Nasir ibn Səhl Bağdadi, Muhəmməd ibn Əbu Sə'd ibn Həfs Nəvqani və Əbu Səid Fərruxzadədən hədis və təfsir dərsləri almışdı. Mərv və İraqa səyahət etmiş və burada tədrislə məşğul olmuşdur[1650]. Ölüm tarixi məlum deyil. XI-XII əsrdə yaşamışdır.

**Fəxrəddin Həsən ibn Əli ibn Əhməd ibn Əli ibn Hüseyn əl-Hüseyni Urməvi**

Seyyid Şərəfəddin Əbü'l-Hüseyn Əli Urməvinin (öl. 1356) nəticəsi idi. Ulu babası kimi o, da naqibü'l-əşraflığa təyin olunmuşdu. Bir müddət Misir Məmlüklü dövlətində qaziəsgər müvini vəzifəsini də icra etmişdi. Fəxrəddin Həsən Urməvi yaxşı təhsil almasına və alim olmasına baxmayaraq bədxərc idi. Bədxərcliyi onun müflisləşməsinə səbəb olmuşdu. Fəxrəddin Həsən Urməvi büdcədən ayrılmış vəsaitin aidiyyatı üzrə xərclənməməsi səbəbiylə, əmir Ərənbuğa adlı başqa bir məmurla birlikdə, tutduğu vəzifədən azad edilmişdi. H. 853-cü ilin səfər ayında (aprel 1449) vəfat etmişdi[1651].

**Həkim Əbu Səid Urməvi**

---

[1647] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 67-78.
[1648] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 396.
[1649] Nəvqan-İranın şimali-şərqində, Tus şəhəri yaxınlığında, indiki Məşhəd vilayəti ərazisində yerləşirdi.
[1650] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 74-75.
[1651] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 44.

XII əsrdə yaşamış tanınmış azərbaycanlı təbiblərindən biri idi. Nişaburda yaşayan həkim Əbu Səid Urməvi burada Fəxrülmülkün[1652] övladlarına müxtəlif fənnlərdən xüsusi dərslər vermişdi. O, Fəxrülmülkdən aldığı məvacibi toplayaraq 1000 dinara çatdırdıqdan sonra tədrisdən və insanlarla ünsiyyətdən uzaqlaşaraq sadəcə elmi tədqiqatla məşğul olmaq istəmiş, lakin 880 dinar toplaya bildikdən sonra vəfat etmiş və arzusuna qovuşa bilməmişdi. Həkim Əbu Səid Urməvi kəlama dair "Kitab fi'l-Alih", fəlsəfə sahəsində "Kitabü'l-Məntiq", ehtimal ki, həndəsəyə dair "Şərhü'l-Məqaləti'l-Əvvəli və's-Saniyə min Kitabi-Uqlidis" adlı əsərlərin müəllifi idi. Bunlardan sonuncusu qədim yunan alimi Evkidin əsərlərindən birinə yazılmış şərhdir. Ölüm tarixi məlum deyil. Vəzir Fəxrülmülkün ölüm tarixi ilə müqayisə edərək həkim Əbu Səid Urməvinin XII əsrdə yaşadığını söyləmək olar. Zəhirəddin Beyhəqi öz əsərində həkim Əbu Səid Urməvinin söylədiyi dəyərli kəlamlardan iqtibaslar etmişdi[1653].

**Qiyasəddin Əbü'l-Fəzl Muhəmməd ibn Muhəmməd ibn Əbu Bəkr Urməvi**

XIII əsrdə yaşamış təsəvvüf əhlinə mənsub qari idi. Vətəni Urmiyəni tərk edib şərq ölkələrinə gedərək buradakı alimlər və fəzilətli insanlarla görüşüşdü. Daha sonra Bağdada gəlmiş və h. 650-ci ildə (1252) Bağdadın mühəddislərindən hədis dinləmişdi. H. 666-cı ildə (1268) Marağaya qayıtmışdı. İbnü'l-Fuvati onun mülayim və xoşrəftar insan olduğunu, gündüzlər demək olar ki, əksər hallarda, oruclu oldğunu qeyd etmişdir[1654]. Ölüm tarixi məlum deyil.

**Şeyx Əbdürrəhim ibn Əbdülkərim Urməvi**

Hənəfi məzhəbinə mənsub mühəddis idi. Dəməşqdə yaşamışdı. Şeyx Şihabəddin əl-Hisbaninin tələbəsi olmuş, ondan hədis dərsləri almışdı. Şəmsəddin Səxavi h. 865-ci

---

[1652] Fəxrülmülk 1094-cü ilə qədər Suriya Səlcuqlu sultanı Tutuşun vəziri olmuşdu. Bu tarixdən sonra isə Böyük Səlcuqlu imperatorlarından Rüknəddin Börkyaruqun (1093-1104) vəziri olmuşdu. 1095-1096-cı illərdə Böyük Səlcuqlu imp-nda baş vəzir olan Fəxrülmülk atası vəzir Nizamülmülk kimi batıni-xaşxaşilər tərtib etdikləri sui-qəsdə uğrayaraq öldürülmüşdü. Daha ətraflı məlumat üçün bax: Aydın TANERİ, "Büyük Selçuklu İmparatorluğu'nda Vezirlik" , **AÜTAD**, C. V/8, İstanbul 1967, s. 75-187.

[1653] BEYHƏQİ, *Tətimmət Səuəni'l-Hikmə*, v[b] 47; həmçnn bax: TƏRBİYƏT, *Danişməndan*, s. 106.

[1654] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 1214-1215.

ildə (1461) onun dərslərini dinlədiyini qeyd etmişdir. Ölüm tarixi məlum deyil. XV əsrdə yaşamışdır[1655].

**Əbü'l-Fəth Nəsr ibn Əhməd ibn Sinat Urməvi**

Fəqih idi. Təhsil almaq üçün Mərvə getmiş və burada Yusif ibn Əyyub Həmədani (öl. 1141) və Əbu Mənsur əl-Kərrainin tələbəsi olmuşdur. Daha sonra doğma şəhəri Urmiyəyə qayıtmış və bu şəhərin qazisi təyin olunmuşdu[1656]. Ölüm tarixi məlum deyil. XII əsrdə yaşamışdır.

**Əbü'l-Ənəs Xəlil ibn Osman ibn Məkki Urməvi**

Təsəvvüf əhlinə mənsub mühəddis, zahid və abid insan idi. Bağdadda Əbü'l-Hüseyn əl-Əbbadidən hədis dinləmiş və onun söhbət məclislərində iştirak etmişdi. Bir müddət Fələstinin Əsqəlan şəhərində yaşamış, daha sonra Misirin Dimyat şəhərinə köçmüş və burada ailə qurub yaşamışdı. Misirin məşhur alimləri ilə görüşmüş və onların elmindən faydalanmışdı. Əbu Tahir Əhməd əs-Süləfi İsfəhani onun haqqında "o, Qur'an əhlindən idi" demişdi. Əbü'l-Ənəs Xəlil Urməvi h. 536-cı ildə (1142) vəfat etmişdi[1657].

**Fəxrü'l-quzat Əbü'l-Fəzl Muhəmməd ibn Ömər ibn Yusif ibn Muhəmməd Urməvi**

Şafi'i məzhəbinə mənsub mühəddis və fəqih idi. İbnü'l-İmad onun siqa, mötəbər mühəddislərdən biri olduğunu qeyd etmişdi[1658]. H. 459-cu (1066-1067) ildə anadan olmuş və o, azyaşlı ikən ailəsi ilə birlikdə Bağdada köçmüşdü[1659]. Bağdadda təhsil almış, şeyxülislam Əbu İshaq İbrahim Şirazinin tələbəsi olmuşdu. Şərif Əbü'l-Hüseyn Muhəmməd ibn Əli ibnü'l-Mühtədi Billah əl-Haşimi, şərif Əbü'l-Qənaim Əbdüssəməd ibn Əli ibnü'l-Mə'mun əl-Haşimi, Əhməd ibn Muhəmməd ibnü'n-Nəfur əl-Bəzzaz,

---

[1655] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 245.

[1656] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 74-75.

[1657] ƏBU TAHİR İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, s. 76.

[1658] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. IV, s. 403.

[1659] Səm'ani onun h. 457-ci ildə (1065) anadan olduğunu, atası ilə birlikdə Bağdada köçdüyünü (*Kitabü'l-Ənsab*, C. I, s. 75), YAQUT əl-HƏMƏVİ h. 459-cu ildə (1067) anadan olduğunu (*Mu'cəmü'l-Büldan*, C. I, s. 154), Tacəddin Sübki isə h. 459-cu ilin səfər ayında (dekabr 1066) və Bağdadda anadan olduğunu qeyd etmişdirlər (*Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VI, s. 91).

Əbü'l-Qasım Yusif ibn Muhəmməd əl-Mehrvani, Əbu Cə'fər ibnü'l-Məsləmə əl-Müəddəl və hafiz Əbu Bəkr Əhməd ibn Əli ibn Sabitdən hədis elmlərinə dair dərslər almış, hədis dinləmişdi. Daha sonra Deyru'l-Aqul[1660] qaziliyinə təyin olunmuş və bir müddət bu vəzifəni icra etmişdi. İbn Əsakir[1661], İbnü's-Səm'ani, Əbu Tahir əs-Süləfi İsfəhani, Əbdülxaliq ibn Əsəd ibn Təbərzəd, Fəth ibn Əbdüssəlam ondan hədis dinləmişdilər. Şeyx Əbü'l-Fərəc ibnü'l-Cəvzi ondan fiqh dərsləri almışdı. Əbü'l-Fəzl Muhəmməd Urməvi siqa hədis ravisi olmaqdan başqa, çox ibadət edən, fəzilətli, saleh, xoşrəftar insan idi və Qur'ani-Kərimi çox tilavət edərdi[1662]. O, uzun ömür yaşamış, 85 yaşında vəfat etmişdi. Səm'aninin qeyd etdiyinə görə onunla həmyaş olan hədis ravilərinin hamısı vəfat etmişdilər[1663]. Bağdadda hədis təhsili almış ravi və mühəddislərin bir çoxu fəxrü'l-quzat Əbü'l-Fəzl Urməvidən hədis dinləmişdilər. Alim h. 547-ci ilin rəcəb ayında (oktyabr 1152) vəfat etmişdi[1664].

**Əbu İshaq Yusif ibn Muhəmməd ibn Muhəmməd ibn Ömər ibn Yusif Urməvi**

Yaşadığı dövrdə Bağdadın tanınmış mühəddislərindən olan Əbu İshaq Yusif Urməvi yuxarıda haqqında danışdığımız fəxrü'l-quzat Əbü'l-Fəzl Muhəmməd Urməvinin nəvəsi idi. Babasından və şeyx Əbü'l-Həsən ibn Əbdüssəlamdan hədis dərsləri almış, hədis dinləmişdi. Bağdadda hədis dərsləri vermişdi. Ziya əd-Dəməşqi, Nəcib Əbdüllətif kimi hədis alimləri onun tələbəsi olmuşdular. Alim h. 612-ci ilin rəbiəlaxir ayında (avqust 1215) Bağdadda vəfat etmişdi[1665].

---

1660 Deyru'l-Aqul-İraqda, təqribən indiki Vasit vilayətinin ərazisində yerləşirdi. Deyru'l-Aqul haqqında daha ətraflı məlumat üçün bax: Əbü'l-Qasım Übeydullah ibn Əhməd İBN XORDADBEH, *Məsalikü'l-Məmalik*, s. 19, Leiden 1889; İbrahim ibn Muhəmməd İSTƏXRİ, *Məsalikü'l-Məmalik*, s. 34, 39, Leiden 1927.

1661 İbn Əsakir öz əsərində qazi Əbü'l-Fəzl Muhəmməd Urməvi ilə Bağdadda görüşdüyünü və onun dərslərini dinlədiyini qeyd etmişdir. Bax: *Mu'cəmü'ş-Şüyux*, s. 260.

1662 SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, c.6, s. 91; İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 358.

1663 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 75.

1664 ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 64; SƏM'ANİ, *yenə orada*; İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/3, s. 358; YAQUT əl-HƏMƏVİ, *yenə orada*; SÜBKİ, *yenə orada*; İBNü'l-İMAD, *yenə orada*; İBN KƏSİR əl-ƏNSARİ, *Zeyl Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, v. 125b-126a; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 154. Yaqut əl-Həməvi və Tacəddin Sübki alimin h. 547-ci ilin rəcəb ayında (oktyabr 1152) vəfat etdiyini qeyd etmişdir.

1665 ZƏHƏBİ, *Müxtəsər Tarixi-İbnü'd-Dübeysi*, s. 379.

**Əllamə Tacəddin Əbu Əhməd Muhəmməd ibn Hüseyn[1666] ibn Abdullah Urməvi**

Mütəkəllim və şafi'i fəqihi idi. H. 584-cü ilin məhərrəm ayında (mart 1188) Urmiyədə anadan olmuşdu[1667]. Fəxrəddin Razinin (öl. 1209) sevimli tələbələrindən biri idi. Ustadının "əl-Məhsul" adlı əsərini ixtisar etmiş və bu əsərini "əl-Hasil"[1668] adlandırmışdı. Tacəddin Urməvinin Abbasi sarayı tərəfindən diplomatik missayalarla müxtəlif ölkələrə göndərildiyini Təqiyəddin Məqdisinin əsərindən öyrənirik. Müəllif Tacəddin Urməvinin səfir olaraq Misirə, Əyyubi hökmdarı Məlik Kamilin (1218-1238) sarayına göndərildiyini qeyd etmişdir[1669]. Misirdə qaldığı müddətdə tədris fəlayyəti ilə də məşğul olan Tacəddin Urməvi h. 624-cü ildə (1227) Misirdən Şam diyarına getmişdi[1670]. İbnü'l-İbrinin əsərindən biz onun Anadoluda da yaşadığını öyrənirik. Müəllif Fəxrəddin Razinin müxtəlif ölkələrdə yaşayan tələbələrindən bəhs edərkən Anadoluda, Konya şəhərində Razinin tələbələrindən Tacəddin Urməvi ilə Siracəddin Urməvinin yaşadığını qeyd etimşdi[1671]. Bu dövrdə Fəxrəddin Razinin Tacəddin Urməvi adlı başqa bir tələbəsinin olmadığını nəzərə alaraq bu şəxsin Tacəddin Əbu Əhməd Muhəmməd ibn Hüseyn Urməvi olduğunu demək mümkündür. Səlahəddin Səfədi də öz əsərində Tacəddin Urməvinin bir müddət "türk məmləkətlərində" yaşadığını yazmış, lakin bunun hansı ölkə olduğunu qeyd etməmişdir[1672]. Şübhəsiz ki, müəllif Anadolunu nəzərdə tutmuşdur. Muhəmməd Sivasi öz əsərində Tacəddin Urməvinin dövrün böyük alimlərindən, fəzilət sahibi və şeyx Əvhədəddin Kirmaninin (öl. 1238) müridi olduğunu qeyd etmişdir. Sivasi, Tacəddin Urməvinin Bağdadda bu şəhərin tanınmış alimlərindən birini Əvhədəddin Kirmaninin yanına apararaq onunla tanış etdiyini yazır[1673]. Əvhədəddin Kirmani Bağdada, uzun sürən səyahətindən sonra, 1234-cü ildə qayıtmış[1674] və 4 il sonra burada vəfat etmişdi. Bu görüş də ehtimal ki, bu

---

1666 Alimin künyəsi və atasının adı mənbələrdə müxtəlif şəkildə yazılır. İbnü'l-Müqəffa onun künyəsini"Əbu Əhməd", "Əbu Abdullah", atasının adını isə "Hüseyn" kimi qeyd edir. Zəkəriyya Qəzvini onun künyəsinin "Əbu Əhməd", Səlahəddin Səfədi və İbnü'l-Fuvati isə alimin atasının adının "Həsən" olduğunu bildirmişdilər.
1667 MƏQDİSİ, *Kitabü'l-Müqəffa*, C. V, s. 585.
1668 Əsərin tam adı "Hasilü'l-Məhsul fi Üsulü'l-Fiqh"dir. Bax: KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 252.
1669 MƏQDİSİ, *Kitabü'l-Müqəffa*, C. V, s. 585.
1670 *Yenə orada.*
1671 İBNü'l-İBRİ, *Tarixu Müxtəsərü'd-Düvəl*, s. 212.(و في هذا الزمان كان جماعة من ....بالروم و تاج الدين الارموي وسراج الدين الارموي بقونيه تلامذة الإمام فخرالدين الرازي)
1672 SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. II, s. 261.
1673 BAYRAM, *Şeyh Evhaü'd-Din El-Kirmânî ve Menâkıb-Nâmesi*, s. 197-198.
1674 *Yenə orada*, s. 26.

tarixlərdə baş vermişdi. Dəmək ki, həmin bu tarixdə Tacəddin Urməvi artıq Bağdadda yaşayırdı və mənaqibnamə müəllifinə görə o, burada qazi idi[1675]. Onun Anadoluya gəlişi ehtimal ki, 1204-cü ildə olmuşdur. Çünki şeyx Əvhədəddin Kirmani də məhz bu tarixdə, Anadolu Səlcuqlu sultanı Qiyasəddin I Keyxosrovun müəllimi şeyx Məcdəddin İshaqın (öl. 1221) dəvəti ilə Anadoluya getmişdi. Şeyx Kirmani buraya aralarında Əbu Cə'fər Muhəmməd Bərdəi, şeyx Nasirəddin Mahmud Urməvinin də olduğu bir qrup alim və sufi şeyxi ilə gəlmişdi[1676]. Ehtimal ki, onların arasında gənc yaşlarında olan Tacəddin Muhəmməd Urməvi də olmuşdu. Zəkəriyya Qəzvini Tacəddin Əbu Əhməd Muhəmməd Urməvinin fiqh, fiqh üsulu, kəlam, ədəbiyyat kimi elm sahələrində öz dövrünün nadir alimlərindən biri olduğunu, gözəl nitq qabiliyyətinə malik olan alimin danışarkən zərbi-məsəllər, hikmətli sözlər, zərif misallarla öz nitqini bəzəyərək onu dinləyənləri valeh etdiyini qeyd edir[1677]. Tacəddin Muhəmməd Urməvi Abbasi xəlifəsi Müstənsir Billahın (1226-1242) əmri h. 628-ci ilin şəvval (1231 avqust) ayının sonlarında Bağdada yeni inşa edilib istifadəyə verilmiş Şərəfiyyə mədrəsəsinin müdərrisliyinə təyin olunmuşdu[1678]. Tacəddin Əbu Əhməd Muhəmməd Urməvi maddi cəhətdən imkanlı olmaqla yanaşı son dərəcə təvazökar və ləyaqətli insan idi. Alim moğolların Bağdadı işğalından bir müddət əvvəl, h. 656-cı ilin məhərrəm ayında (1258) bu şəhərdə vəfat etmişdi[1679].

**Əllamə Zeynəddin Əbü'l-Vəfa Ürfə ibn Muhəmməd Urməvi**

Şafi'i məzhəbinə mənsub fəqih və riyaziyyatçı idi. Dəməşqdə yaşayırdı. İbnü'l-İmad onun daim tədqiqatda olan alim, xüsusən riyaziyyat və fəraiz sahələrində ixtisaslaşmış olduğunu və bu sahədə şöhrət tapdığını qeyd etmişdir. O, riyaziyyat və fəraiz elmini şeyx Şəmsəddin ibn Fəqir, əllamə Şihabəddin ibn Arslan ər-Rəmli[1680] və əllamə Şihabəddin ibnü'l-Haimdən öyrənmişdi. Şihabəddin Gəncəvi kimi bir neçə tanınmış

---

[1675] *Yenə orada*, s. 197.
[1676] *Yenə orada*, s. 13.
[1677] *Asarü'l-Bilad*, s. 478.
[1678] İBNü'l-FUVATİ, *Həvadisü'l-Camiə'*, s. 11.
[1679] İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. II, s. 88; MƏQDİSİ, *Kitabü'l-Müqəffa*, C. V, s. 585; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 216. Səlahəddin Səfədi alimin h. 655-ci ildə (1257) vəfat etdiyini qeyd etmişdir. Bax: *Vafi bi'l-Vəfayat*, C. II, s. 261.
[1680] Türk mənşəli bu alim Suriyanın Rəmlə şəhərindən idi.

alim onun tələbələri arasında yetişmişdi. Zeynəddin Urməvi "Təriqü'l-Vazihat fi Əməlü'l-Münasixat", "Haşiyə ələ Nüzhətü'n-Nizar fi Qələmü'l-Ğubar", "Haşiyə ələ'l-Lüma' li-İbnü'l-Haim" və "Şərhi-Mənzumə Fəthü'l-Vəhhab fi'l-Hisab" adlı əsərlərin müəllifi idi. Alim 11 şəvval 930-cu ildə (11 avqust 1524) vəfat etmişdi[1681].

**Əbü'l-Qənaim Qanim ibn Hüseyn əl-Muşeyli Urməvi**

Şafi'i məzhəbinə mənsub fəqih və mütəkəllim idi. Bağdadda Nizamiyyə mədrəsəsində təhsil almış, şeyxülislam Əbu İshaq Şirazinin tələbəsi olmuşdu. Təhsilini başa vurduqdan sonra Bağdaddan Nişapura getmiş və burada İmamu'l-Hərameyn ləqəbi ilə tanınmış əş'ari kəlamçısı Rüknəddin Əbü'l-Məali Əbdülməlik Cüveyni ilə tanış olmuşdu. O, Nişapurda İmamü'l-Hərameyndən kəlam elminin incəliklərini öyrənmişdi. Tez-tez elmi diskussiyalarda iştirak edən Əbü'l-Qənaim Urməvi İslam hüququ sahəsindəki dərin biliyi ilə tanınmışdı. Alim h. 525-ci ildə (1131) Urmiyədə vəfat etmişdi[1682].

**Şeyx Zəkiyəddin Əbdülqadir ibn İbrahim ibn Muhəmməd ibn İbrahim ibn Abdullah ibn Yusif Urməvi**

Yaşadığı dövrün tanınmış mühəddislərindən idi. Şeyx Əbu İshaq İbrahim Urməvinin (öl. 1292) nəticəsi, Əbu Abdullah Muhəmməd Urməvinin (öl. 1312) isə nəvəsi idi. H. 735-ci ildə (1334) alim ailəsində anadan olmuşdu. Onun anası Zeynəb məşhur mühəddislərdən birinin qızı idi. Təəssüf ki, Şəmsəddin Səxavi bu şəxsin adını sadəcə "Kamaləddin" olaraq qeyd etmişdir. Lakin müəllif Zəkiyəddin Urməvinin uşaq yaşlarından etibarən babasının dostları olan Yusif ibn Əbdürrəhman əl-Mizzi (öl. 1341), Elməddin Qasım ibn Muhəmməd əl-Birzali (öl. 1338), Muhəmməd ibn Əhməd ibn Təmmam, Əbu Bəkr ibn Muhəmməd ibnü'r-Rza, Muhəmməd ibn Yusif ibn Dəvalə, Muhəmməd ibn Əbi Zöhr, Muhəmməd ibn Əbu Bəkr ibn Əbdüddaim, Əhməd ibn Hazim Dəməşqi kimi mühəddislərin məclislərində iştirak etdiyini bildirmişdir. Zeynəb

---

[1681] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s. 99; BAĞDADLI, *Hədiyyətü'l-Arifin*, C. I, s. 663; ZİRİKLİ, *Ə'lam*, C. IV, s. 331.

[1682] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 62; İBN KƏSİR əl-ƏNSARİ, *Zeyl Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, v. 114a.

bintü'l-Xubbaz, Sittülərəb bint Əhməd ibn Bədr, Fatimə bint İzzəddin ibn Cəmaə əl-Kinani kimi qadın hədis alimlərindən də hədis dinləmişdi. Ümumiyyətlə o, qadınlı-kişili 24-dən çox alimdən hədis dərsləri almışdı. Zəkiyəddin Urməvi hədis dərsləri vermiş və onun dərslərində çox sayıda tələbə iştirak etmişdi. İbn Həcər Əsqəlani, İbn Musa əl-Mərakeşi, Şihabəddin ibn Zeyd kimi alimlər onun tələbəsi olmuşdular. Zəkiyəddin Urməvi h. 821-ci ilin şəvval ayında (noyabr 1418) vəfat etmişdi[1683].

**Muhəmməd ibn İbrahim ibn Muhəmməd ibn Abdullah Urməvi**

Mühəddis idi. Fatimə bint İzzəddin ibn Cəmaə və başqa alimlərdən hədis dərsləri almışdı. İbn Həcər Əsqəlani, Muhəmməd ibn İbrahim Urməvinin dərslərini dinləmişdi. Alim h. 804-cü ildə (1402) Dəməşqdə vəfat etmişdi[1684].

**Hafiz Əbu Bəkr Əbdürrəzzaq ibn Əbdülqadir ibn Əbu Saleh Urməvi**

Hənbəli məzhəbinə mənsub siqa hədis hafizi, mühəddis idi. H. 18 zilqədə 528-ci ildə (9 sentyabr 1134) Bağdadda anadan olmuşdu. Atası şeyx Əbdülqadir Urməvi Bağdadın tanınmış hədis alimlərindən idi. Atasından və Bağdadın məşhur mühəddislərindən hədis dinləmişdi. Ziya əl-Məqdisi onun haqqında "hədis isnadı və mətnin araşdırılması sahəsindəki etina və dəqiqliyinə görə Bağdadda onun misli bərabəri yox idi" demişdi. Mühəddis olmaqla yanaşı o, həm də hənbəli məzhəbi üzrə tanınmış fəqih idi. Əbu Bəkr Əbdürrəzzaq Urməvi mömin, mütədəyyin insan idi. O, mütaliə və tədqiqat xaricindəki vaxtını ibadətlə keçirirdi. Tələbələrinə evində dərs verir, ehtiyacı olmadıqca evindən çıxmır və insanlarla çox az ünsiyyətdə olurdu. Onun tələbələri arasından Əbu Abdullah əd-Dübeysi, Muhəmməd ibn Mahmud ibnü'n-Nəccar (öl. 1245), Ziya əd-Dəməşqi, Nəcib Əbdüllətif, Təqi əl-Yeldani kimi alimlər yetişmişdi. Sonralar baş qazi olmuş oğlu Əbu Saleh ibn Əbdürrəzzaq Urməvi də atasından hədis və fiqh dərsləri almışdı. Əbu Bəkr Əbdürrəzzaq Urməvi son dərəcə təvazökar və gözəl əxlaqlı insan idi. Sələfi-salihin mənhəcinə sıx bağlı olan Əbu Bəkr Əbdürrəzzaq Urməvi kasıb və bəsit məişətə sahib idi. Buna baxmayaraq izzəti-nəfsindən ötrü heç kimdən heç bir şey istəməmiş və

---

[1683] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. II, s. 367.
[1684] SƏXAVİ, *Zəvu'l-Lami'*, C. III, s. 311.

fəqirliyinə səbr etmişdi. Alim h. 6 şəvval 603-cü ildə (5 may 1207) vəfat etmiş və imam Əhməd ibn Hənbəlin (//780-855) qəbrinin yanında dəfn edilmişdi[1685].

**Müzəffər ibn Yusif Urməvi**

Mühəddis idi. Əbü'l-Qasım Hibətullah ibn Muhəmməd ibnü'l-Husayn əş-Şeybanidən (1041-1131) hədis dinləmiş və hədis elmlərinə dair bilikləri öyrənmişdi[1686]. Ölüm tarixi məlum deyil. Lakin onun tarixçi və mühəddis Əli ibn Həsən ibn Əsakirin (öl. 1175) müasiri olduğunu nəzərə alaraq XII əsrdə yaşadığını təxmin etmək olar. İbn Əsakir də Əbü'l-Qasım Hibətullah ibnü'l-Husaynın tələbəsi olmuş və onun yanında imam Əhməd ibn Hənbəlin (/) "Müsnəd" adlı hədis külliyatını oxumuşdu.

**Yusif ibn Müzəffər ibn Yusif Urməvi**

Müzəffər ibn Yusif Urməvinin oğlu idi. Katiblik və münşəat işlərində ixtisaslaşmışdı. Abbasi xəlifələrindən Nasir Li-Dinillah (1180-1225) onu işrafu'd-divan təyin etmişdi[1687]. Ölüm tarixi məlum deyil. XII-XIII əsrlərdə yaşamışdır.

İşrafu'd-Divan və ya divan müşrifi orta əsrlər müsəlman dövlətlərində xeyli mühüm vəzifə idi. İşrafu'd-divan dövlətin baş maliyyə müfəttişi idi. Bu vəzifəyə təyin olunmaq üçün sadəcə hesab və maliyyə işlərində ixtisaslaşmaq kifayət etmirdi. Divan müşrifləri, maliyyə işlərini mükəmməl bilməklə yanaşı, mömin, saleh əməlli, ədalətli, dürüst və insaf sahibi insanların arasından seçilirdi. Çünki baş maliyyə müfəttişi istənilən dövlət orqanını təftiş edərək dövlətin ayırdığı maliyyə vəsaitinin aidiyyatı üzrə xərclənib-xərclənmədiyini, hər hansı bir maliyyə fırıldağı və korrupsiya halının olub-olmadığını müəyyən edirdi. Mülki və hərbi dövlət məmurlarının taleyi işrafu'd-divanın dövlət başçısına təqdim etdiyi raportlardan aslı olurdu. Maliyyə fırıldağı və korrupsiya səbəbiylə edam olunmuş bir çox yüksək rütbəli dövlət məmuru olmuşdur. Bu vəzifə o qədər mühüm idi ki, raşid xəlifələrdən Ömər ibn Xəttab (', 634-644), başqasını təyin etməyərək, bu işi şəxsən özü icra etmişdi.

---

1685 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. V, s. 447.
1686 YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 154.
1687 YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 154.

**Əbu Osman Səid ibn Sə'd Urməvi**

Hədis ravisi idi. Bir çox ravidən hədis dinləmiş və nəql etmişdi. Onun hədis dinlədiyi ravilərdən biri də Əhməd ibn Yəqla əl-Hulvani idi[1688]. Əbu Osman Urməvinin ölüm tarixi məlum deyil. IX əsrdə yaşamışdır. Nəql silsiləsində Əbu Osman Səid Urməvinin də olduğu hədislərdən biri aşağıdakıdır:

Ənəs ibn Malik (ا) dedi: Allah Rəsulu (ق) buyurdular: "Mən sizi (rüku və səcdə etdiyiniz vaxt) önümdə gördüyüm kimi, arxamda da görürəm"[1689].

**Qazi Əbu Təyyib Nueym ibn Müsafir ibn Cə'fər Urməvi**

Mühəddis idi. Bağdadda təhsil almış, hafiz Əbü'l-Qasım Übeydullah ibn Ömər ibn Əhməd ibn Şahindən[1690] (öl. 995) hədis dinləmişdi. Urmiyə qazisi olmuşdu. Urmiyədə Əbü'l-Fityan Ömər ibn Əbü'l-Həsən ər-Rəvasi ondan hədis dərsləri almış və hədis dinləmişdi. Əbu Təyyib Nueym Urməvinin ölüm tarixi h. 460-cı (1068-1078) illərə təsadüf edir[1691].

**Qazi Şəmsəddin Əbu Abdullah Muhəmməd ibn Hüseyn ibn Muhəmməd ibn Həsən ibn Zeyd ibn Həsən ibn Zəfər əl-Ələvi əl-Hüseyni Urməvi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Şəmsəddin Muhəmməd Urməvi h. 578-ci ildə (1182) Urmiyədə anadan olmuşdu. "əl-Ələvi" və "əl-Hüseyni" nisbələrindən də göründüyü kimi o, Əli ibn Əbu Talibin (ا) və onun oğlu Hüseynin (ا) nəslin idi. O, Bağdadda şeyxü'ş-şüyux Sədrəddin Əbü'l-Həsən ibn Həmmuyənin tələbəsi olmuş, ondan şafi'i fiqhini öyrənmişdi. Şeyx Sədrəddin Həmmuyə onun həm fiqhdə ustadı, həm də mürşidi idi. Mürşidinin vəfatından sonra Şəmsəddin Muhəmməd Urməvi Əyyubi hökmdarı Məlik Kamil ibn I Adilin (1218-1238) hakimiyyəti illərində Şam və əl-Cəzirə

---

1688 ƏBU BƏKR İSFƏHANİ, *Mu'cəm*, C. II, s. 403.

1689 ƏBU BƏKR İSFƏHANİ, *yenə orada*. Bu hədis üçün bax: MÜSLİM, *Səhih*, Namaz, 24/425. "(Namaz qılarkən) Rüku və səcdələri düzgün icra edin. Vallahi mən siz rüku və səcdə etdiyiniz vaxt (mən sizin önünüzdə durub sizə namaz qıldırarkən, siz mənim kürəyimin ardında ikən) arxamda ikən də sizi görürəm". (أقيموا الركوع والسجود فوالله إني لأراكم من بعدي وربما قال من بعد ظهري).

1690 Məşhur mühəddis hafiz Əbu Həfs Ömər ibn Əhməd ibn Osman ibn Şahin Bağdadinin (öl. 995) oğlu idi.

1691 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 75; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 58.

diyarına səyahət etmişdi. Qahirəyə gəlmiş və buranın mədrəsələrindəki mühəddislərdən hədis dinləmiş və hədis elminin incəliklərini öyrənmişdi. Təhsilini başa vurduqdan sonra h. 630-cu ildə (1233) Qahirədəki Şərifiyyə, daha sonra isə Nasiriyyə mədrəsələrinin müdərrisi olmuşdu. Sultan Məlik Kamil onu həmçinin Darü'l-Ədl naibliyinə[1692] təyin etmişdi. Alim H. 635-ci ildə (1238) Əyyubi hökmdarı II Adil (1238-1240) tərəfindən qaziəsgər və naqibü'l-əşraf[1693] vəzifələrinə təyin olunmuşdu. Şəmsəddin Muhəmməd Urməvi fəraiz, fiqh üsulu və nəzəriyyəçilik sahələrində ixtisaslaşmışdı. Qazi Şəmsəddin Muhəmməd Urməvi möminliyi, dürüstlüyü, yumuşaq xarakteri və xoşrəftarlığı ilə tanınmışdı. O, daim ona müraciət edən insanların hüquqi problemləri ilə ciddi maraqlanıb yoluna qoymağa çalışırdı. Fəxrəddin Razinin "əl-Məhsul" adlı əsərinə şərh yazmışdı. Alim h. 650-ci ilin şəvval ayının 13-ü (16 dekabr 1252) Qahirədə vəfat etmiş və Babü'l-Qirafədəki qəbristanda dəfn edilmişdi[1694].

**Şeyx Şihabəddin Əbü'r-Rəkəb Hüseyn ibn Muhəmməd ibn Hüseyn ibn Həsən ibn Zeyd ibn Həsən Urməvi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Misirdə İbn Qaziəsgər adı ilə tanınmışdı. Nəsil şəcərəsinə əsaslanaraq onun qazi Şəmsəddin Əbu Abdullah Muhəmməd Urməvi (öl. 1252) ilə yaxın əqrəba olduğunu söyləmək olar. Ölüm tarixləri arasında 120 il fərq olduğunu nəzərə alaraq onların görüşmədiklərini söyləmək olar. Ehtimal ki, şeyx Şihabəddin Əbü'r-Rəkəb Urməvi, qazi Şəmsəddin Muhəmməd Urməvinin əmisinin nəvəsi idi. Misir Məmlüklü dövlətində naqibü'l-əşraf və divanü'l-inşa[1695] katibi idi. Daha sonra Məmlüklülər tərəfindən katiblik vəzifəsinə təyin edilərək Hələb şəhərinə göndərilmişdi. Bir müddət bu vəzifəni icra etdəkdən sonra istefaya çıxarılmışdı. Vəzifəsindən ayrılandan sonra Şam diyarında qalmayıb Qahirəyə qayıtmışdı. Şeyx Şihabəddin Hüseyn Urməvi fəzilət sahibi alim idi. O, həmçinin istedadlı şair və ədib

---

[1692] Müasir dövrlə müqayisə etməli olsan ədliyyə nazirinin müavini deyə bilərik.

[1693] Naqibü'l-Əşraf-Allah Rəsulunun (ﷺ) nəslindən olanların, seyyidlərin başçısı.

[1694] İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. II, s. 9; SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. III, s. 15; MƏQRİZİ, *Süluk*, C. I, s. 127; MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. V, s. 597-598.

[1695] Divanü'l-İnşa (İnşa Divanı)-Orta əsr müsəlman dövlətlərində dövlət başçısının əyalətlərdəki vəzifə sahibi şəxslərlə xəbərləşməsini təmin edən rəsmi qurum idi. Bundan başqa fərman, nişan, mənşur və bəraət kimi hökmdar tərəfindən verilən rəsmi dövlət sənədləri inşa divanında qələmə alınırdı. Müsəlman-Türk dövlətlərində divanü'l-inşa rəisi "tuğrai" adlanırdı. Çünki bu qurumda yazılan bütün rəsmi sənədlər hökmdarın rəsmi imzası sayılan tuğra ilə imzalanırdı.

idi, çox gözəl şerlər yazırdı. İbn Tağrıbirdi onun bioqrafiyasını yazarkən şe'rlərindən bəzi nümunələri qeyd etmişdi. Qahirəyə qayıdandan sonra Qarasunquriyyə mədrəsəsində dərs vermiş və eyni zamanda İbn Əbdüzzahir camesində xətiblik etmişdi. Alim h. 16 şaban 772-ci ildə (5 mart 1371) Qahirədə vəfat etmişdi[1696].

**Şeyx Sədrəddin Əbu Abdullah Muhəmməd ibn Həsən ibn Yusif ibn Musa əl-Firuzi Urməvi**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. H. 610-cu ildə (1213) Urmiyədə anadan olmuşdu. Təhsil almaq üçün Dəməşqə gəlmiş və Təqiyəddin Əbu Əmr Osman ibnü's-Səlahla (öl. 1245) görüşüb ondan hədis elmlərinə dair dərslər almışdı. Bundan başqa o, Tacəddin ibn Həmmuyə və İbn Qumeyrə kimi alimlərdən də hədis dinləmiş və nəql etmişdi. İmam Şəmsəddin Zəhəbi tələbəlik illərində şeyx Sədrəddin Urməvidən dərs almışdı. Alim h. 700-cü ildə (1300) vəfat etmişdi[1697].

**Şeyx Səfiyəddin Əbü's-Səna Mahmud ibn Muhəmməd ibn Hamid Urməvi**

Şafi'i məzhəbinə mənsub mühəddis və filoloq idi. H. 647-ci ilin cəmadiələvvəl ayında (avqust 1249) Qirafədə[1698] anadan olmuşdu. Hədis sahəsində təhsil almıq üçün səyahət etmişdi. İbn Ə'laq, İbnü's-Sabuni, İbn Qəstəlani və Fəxrəddin Hərrani kimi mühəddislərdən hədis dinləmiş və hədis elminə dair bilikləri öyrənmişdi. Qahirədə İbnü'l-Fəratdan, İsgəndəriyyə və Dəməşqdə Kəmaləddin İbn Əbd və İbnü'd-Dərəcidən hədis dinləmişdi. Uzun müddət Dəməşqdə, Sümeysatiyyədə yaşamışdı. Şəmsəddin Zəhəbi şeyx Səfiyəddin Mahmud Urməvidən hədis dərsləri almışdı. İki dəfə həcc ziyarəti üçün Məkkəyə getmiş və həcc sonrası bir müddət Mədinədə mücavir olaraq qalmışdı. Aşağıda haqqında məlumat verdiyimiz şeyx Şihabəddin Əbü'l-Abbas Əhməd Urməvi onun böyük qardaşı idi. Şeyx Səfiyəddin Mahmud Urməvi h. 723-cü ilin

---

[1696] İBN TAĞRIBİRDİ, *Mənhəlü's-Safi*, C. I, s. 433-431.

[1697] SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. II, s. 274; SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. IV, s. 409; ZƏHƏBİ, *Mu'cəmü'l-Muxtəs*, s. 89; ZƏHƏBİ, *Mu'cəmü'ş-Şüyux*, C. II, s. 184.

[1698] Qirafə-bu adla tanınan iki coğrafi məkan vardır. Babü'l-Qirafə, yəni Qirafə qapısı Misirdə, qədim Qahirənin səmtlərindən birinin adı idi. Digəri isə Əlcəzairin şimalında yerləşən kənddir. Səfiyəddin Əbü's-Səna Urməvi böyük ehtimalla Qahirədə anadan olmuşdu.

cəmadiəlaxir ayında (iyun 1323) Dəməşqin Nuri xəstəxanasında 76 yaşında ikən vəfat etmişdi[1699].

**Seyyid Şərəfəddin Əbü'l-Hüseyn Əli ibn Həsən ibn Muhəmməd ibn Hüseyn ibn Muhəmməd əl-Hüseyni Urməvi**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. İmam Hüseynin (ع) nəslindən idi. H. 691-ci ildə (1292) anadan olmuşdu. Hədis, fiqh, fiqh üsulu və ərəb filologiyası üzrə tanınmış mütəxəssis idi. Qahirədə imam Hüseynin (ع) mübarək başının dəfn edildiyi məqbərənin yanındakı məsciddə dərs verirdi və orada fətva mərcii idi. Həmçinin Qahirədəki Fəxriyyə və Təbərsiyyə mədrəsələrində dərs verirdi. Misir Məmlüklü dövləti tərəfindən naqibü'l-əşraflığa təyin edilmiş, daha sonra beytü'l-mal vəkaləti[1700] və hisbə təşkilatının[1701] rəisliyi vəzifəsini icra etmişdi. O, fəzilətli, dərin zəkalı, elm və bilik sahibi, alicənab, nəzakətli, istedadlı və bacarıqlı insan kimi tanınmışdı. Bütün bunlarla yanaşı seyyid Şərəfəddin Əli Urməvi, şeyx Cəmaləddin ibn Nəbatə və qazi Şihabəddin ibn Fəzlullahla birgə, yaşadığı dövrdə Misirin ən görkəmli ədibi idi. Nəzm və nəsrdə mahir olan seyyid Şərəfəddin Əli Urməvi müxtəlif elm sahələrinə aid bir sıra əsərlərin müəllifi idi. Seyyid Şərəfəddin Əli Urməvi, Fəxrəddin Razinin "Məalim fi Üsuli'l-Fiqh" adlı əsərinə şərh yazımışdı. Alim h. 757-ci ilin cəmadiəlaxir ayında (iyun 1356) Qahirədə vəfat etmişdi[1702].

**Vaiz Əbü'l-Qasım Rüstəm ibn Sərhəng ibn Ömər əl-Bəzzaz Urməvi**

---

1699 İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. III, s. 49, 52; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VI, s. 614; ZƏHƏBİ, *Mu'cəmü'l-Muxtəs*, s. 111-112; SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. V, s. 366-367.

1700 Beytü'l-mal vəkili-Baş xəzinədar.

1701 Hisbə təşkilatı-Orta əsr müsəlman dövlətlərində iqtisadi və ticari işlərə nəzarət edən təşkilat. Bu təşkilatın əsas vəzifəsi süni qiymət artımı, kiyfiyyətsiz mal sıtışı, möhtəkirlik, inhisarçılıq, yalan reklam, haqsız rəqabət, çəki və ölçüdə aldatma kimi halları müəyyən edib qarşısını almaq idi. Bazarlarda bu işə nəzarət edənlər möhtəsiblər, qurumun rəisi isə baş möhtəsib idi. Hisbə və ehtisabla bağlı daha ətraflı məlumat üçün bax: Cengiz KALLEK, *Asrı-Saadette Yönetim Piyasa İlişkisi*, s. 175-200, İstanbul 1997.

1702 İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. III, s. 12; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VI, s. 686; SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. III, s. 334-335. Buradakı mənbələrdə alimin ata və babasının adlarında müəyyən fərqliliklər var. Biz Səlahəddin Səfədinin qeydini əsas götürdük. Çünki Səlahəddin Səfədi "Ə'yanü'l-Əsr" adlı əsərində müasiri olduğu şəxslərin bioqrafiyasını qələmə almışdır. Səfədi həmçinin seyyid Şərəfəddin Əli Urməvinin, yuxarıda haqqında bəhs etdiyimiz, şeyx Şihabəddin Əbü'r-Rəkəb Urməvinin əmisi oğlu olduğunu qeyd etmişdir.

Bağdada yaşamış və buradakı məscidlərdə insanlara və'z vermişdi. O, şeyx Əbü'l-Həsən Əli ibn Übeydullah ibnü'z-Zağuni Bağdadinin tələbəsi və yaxın dostlarından biri olmuşdu. Əbü'l-Həsən ibnü'z-Zağuni və Əbü'l-Qasım ibnü'l-Husayndan hədis dinləmişdi. Alim h. 569-cu ildə (1174) 60 yaşında vəfat etmişdi[1703].

**Şeyx Əbu Abdullah Muhəmməd ibn Qəhtan ibn Əbi Abdullah Urməvi**

Mühəddis idi. Quru və dəniz ticarəti ilə məşğul olan Əbu Abdullah Muhəmməd Urməvi böyük sərvət və var-dövlət sahibi idi. Buna baxmayaraq o, saleh əməlli və xoşrəftar insan idi. Səm'ani onun çox ibadət etdiyini, Qur'an tilavəti və təhəccüd namazlarını buraxmadığını qeyd etmişdir. Böyük Səlcuqluların hakimiyyətinin ilk illərində oğuzlar Nişapurda onun ticarət mallarını qarət etmişdilər. Əbu Abdullah Muhəmməd Urməvi Buxara, Mərv və Sərəxs şəhərlərini gəzmiş və buralarada hədis nəql etmişdi[1704]. Ölüm tarixi məlum deyil. Təqribən XI əsrdə yaşamışdır.

**Əbu Əli Həsən ibn Hüseyn ibn Şəhham əl-Fərfəqabadi[1705] Urməvi**

Mühəddis və şafi'i məzhəbinə mənsub fəqih idi. Təhsil almaq üçün Nişapura getmiş və burada öz həmyerlisi, mühəddis Əbu Bəkr Muhəmməd ibn Əli əl-Fərfəqabadidən hədis dərsləri almışdı[1706]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Şihabəddin Əbü'l-Abbas Əhməd ibn Muhəmməd ibn Hamid əl-Muqri Urməvi**

Qur'ani-Kərim qarisi idi. Mühəddis və filoloq Səfiyəddin Əbü's-Səna Muhmud ibn Muhəmməd ibn Hamid Urməvinin qardaşı idi. H. 716-cı ildə (1316) vəfat etmişdi[1707].

**Əbü'l-Həsən Əli ibn Muhəmməd ibn Əli Urməvi**

---

[1703] SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. XIV, s. 81.
[1704] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 74-75.
[1705] Fərfəqabad-Urmiyə şəhərinin kəndlərindən biri idi. Bax: SÜYUTİ, *Lübbü'l-Lübab*, s. 62.
[1706] SEYRƏFİNİ, *Müntəxəb*, s. 196; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. V, s. 242.
[1707] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. I, s. 126; SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. V, s. 367.

Mühəddis idi. Onun xanımı Sittülərəb məşhur mühəhddis Muhəmməd ibn Fəxrəddin Buxarinin qızı idi. Bu qadın da tanınmış hədis alimi, mühəhddisə idi. Şeyx Əbü'l-Fəzl ibnü'l-İraqi (1325-1404) xanım Sittülərəbin tələbəsi olmuş, ondan hədis dinləmişdi[1708]. Əbü'l-Həsən Əli Urməvinin ölüm tarixi məlum deyil. XIV əsrdə yaşamışdır.

**Hafiz Əbu İshaq İbrahim ibn Muhəmməd ibn Əhməd ibn Əli Urməvi**

Yaşadığı dövrdə siqa hədis hafizi və dərin biliyə malik fəqih kimi tanınmışdı. Əbu İshaq İbrahim Urməvi imam Buxari və imam Müslimin hədis külliyatlarındakı hədisləri əzbər bilirdi. Əbu Əhməd əl-Qutrifi və Əbü'l-Qasım Abdullah ibn Əhməddən hədis, Həsən ibn Süfyandan isə fiqh dərsləri almışdı. Azərbaycan, Xorasan və İraqın bir çox şəhərlərini gəzərək buradakı alimlərin dərslərində iştirak etmişdi. H. 428-ci ildə (1037) Nişapurda vəfat etmiş və buradakı Şahənbər qəbristanında dəfn edilmişdi. Vəfat edərkən yaşı xeyli irəliləmişdi[1709].

**Şeyx Əbu İshaq İbrahim ibn Abdullah ibn Yusif ibn İbrahim ibn Süleyman Urməvi**

Mühəddis idi. H. 615-ci ildə (1218) Dəməşqin[1710] Qasiyyun dağı ətəklərindəki məhəllərdən birində anadan olmuşdu. Onun atası Abdullah Urməvi də hədis alimi idi və h. 631-ci ildə (1234) Şam diyarından Misirə köçmüşdü. Əbu İshaq İbrahim Urməvi şeyx Müvəffəqəddin Abdullah İbn Qudamə[1711] və Əbu Abdullah Hüseyn ibnü'z-Zübeydinin tələbəsi olmuş, onlardan hədis dinləmişdi. Suriyada İbnü'l-Bəngu ləqəbi ilə tanınan şeyx Əbu İshaq İbrahim Urməvi abid və zahid insan idi. Vaxtının çoxunu elm öyrətmək, ibadət və zikr etməklə keçirirdi. Dəməşq əhalisi onu çox sevir və ehtiram göstərirdilər. Əkkə qalası fatehi Misir Məmlüklü sultanı Əşrəf Səlahəddin Xəlil (1290-1293) də ona dərin hörmət və ehtiram bəsləyirdi. Sultan səlibçilərin yaxın və orta şərqdəki son istinadgahı olan Əkkə qalasını 30 günlük mühasirənin ardından h. 11 rəcəb 691-ci ildə (28 iyun 1291) fəth edib İslam coğrafiyasını səlibçi işğalından tamamən

---

1708 İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 126.

1709 SEYRƏFİNİ, *Müntəxəb*, s. 129.

1710 Təqiyəddin Məqdisi şeyx Əbu İshaq İbrahim Urməvinin 615-ci ildə (1218) Qüdsdə anadan olduğunu qeyd etmişdir. bax: *Kitabü'l-Müqəffa*, C. I, s. 238.

1711 Müvəffəqəddin Əbu Muhəmməd Abdullah ibn Əhməd ibn Muhəmməd İbn Qudamə əl-Məqdisi (öl. 1213) öz dövrünün tanınmış hənbəli mühəddisi idi.

təmizləyənədən sonra Dəməşqə gəlmiş[1712] və şeyx Əbu İshaq İbrahim Urməvini ziyarət edərək ondan xeyir-dua istəmişdi. Alim h. 692-ci ilin məhərrəm ayının 12-sində (23 dekabr 1292) vəfat etmişdi. Onun dəfn mərasimində sultan Əşrəf, eləcə də bütün Şam vilayətinin əmirləri və qaziləri iştirak etmişdilər. İnsanlar onun cənazəsini dəfn ediləcəyi yerə qədər başlarının üzərində daşımışdılar. Tarixçi Təqiyəddin Məqdisi alimin dəfn mərasimində iştirak etdiyini qeyd etmişdir. Şeyx Əbu İshaq İbrahim Urməvi Qasiyyun dağındakı Səfih qəbristanında, atasının məzarının yanında dəfn edilmişdi[1713].

**Şeyx Əbu Abdullah Muhəmməd ibn İbrahim ibn Abdullah ibn Yusif ibn Yunis ibn İbrahim ibn Süleyman Urməvi**

Mühəddis idi. H. 645-ci ildə (1274) anadan olmuşdu. Şeyx Əbu İshaq İbrahim Urməvinin oğlu idi. Əhməd ibn Əbdüddaimin tələbəsi olmuş, ondan hədis dinləmişdi. Əbu Abdullah Urməvi həmçinin öz dövrünün tanınmış ədiblərindən biri idi. Səlahəddin Səfədi alim haqqında məlumat verərkən onun zahirən yaraşıqlı insan olmaqla yanaşı böyük alim, arif, tədqiqatçı, fəzilət sahibi, saleh insan kimi tövsif etmişdi. Məşuh tarixçi, mühəddis, bioqraf və filoloq imam Şəmsəddin Zəhəbi Türkmani, Əbu Abdullah Muhəmməd Urməvinin tələbəsi olmuş, ondan hədis dinləmişdi. Alim h. 711-ci ilin ramazan ayında (yanvar 1312) Dəməşqdə vəfat etmişdi[1714].

**Şeyx Əlaəddin Əbü'l-Həsən Əli ibn Muhəmməd ibn İbrahim ibn Abdullah ibn Yusif ibn Yunis ibn İbrahim ibn Süleyman Urməvi**

Mühəddis idi. H. 677-ci ilin rəcəb ayında (dekabr 1278) anadan olmuşdu. Mühəddis Əbu Abdullah Muhəmməd ibn İbrahim Urməvinin oğlu, şeyx Əbu İshaq İbrahim

---

1712 Sultan Əşrəfin Dəməşqə gəlişi şəhər əhalisində böyük coşğunluğa səbəb olmuşdu. Əhali küçələrə çıxıb bu fateh hökmdarı salamlamış, onun üçün dualar etmiş və 3 gün şənliklər tərdib edilmişdi. Sultan Əşrəf paytaxt Qahirəyə gələrkən bundan daha möhtəşəm mərazimlərlə qarşılanmışdı. İbn Kəsir bu mərasimləri təfərrüatı ilə qeyd etmişdir. Bax: *Bidayə və'n-Nihayə*, C. XIII, s. 541-546.

1713 MƏQDİSİ, *Kitabü'l-Müqəffa*, C. I, s. 238-239; İBN ŞAKİR, *Fəvatü'l-Vəfayat*, C. I, s. 9; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIII, s. 550; SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. VI, s. 11; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. V, s. 669.

1714 İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 216; MƏQDİSİ, *Kitabü'l-Müqəffa*, C. V, s. 100; SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. IV, s. 215-216; ZƏHƏBİ, *Mu'cəmü'ş-Şüyux*, C. II, s. 132.

Urməvinin nəvəsi idi. Fəxrəddin ibnü'l-Buxari kimi Şam diyarınını məşhur hədis alimlərindən hədis dinləmiş və hədis elmlərinə dair bilikləri öyrənmişdi. Qısa müddətdə Dəməşqin tanınmış hədis alimlərindən birinə çevrilmişdi. Çox ibadət edən, zahid və saleh insan idi. H. 14 şəvval 755-ci ildə (31 oktyabr 1354) Dəməşqdə vəfat etmişdi[1715].

**Şeyx Abdullah ibn Yunis Urməvi**

Şəmsəddin Zəhəbi onun son dərəcə təvazökar, dünya işlərindən üz çevirmiş, mömin və saleh insan olduğunu qeyd etmişdir. Şeyx Abdullah Urməvi Dəməşqdə, Qasiyyun dağındakı bir bağın içində yerləşən və öz adı ilə tanınan "Zaviyətü'l-Urməviyyə"də yaşayırdı. Şeyx Abdullah Urməvi h. 631-ci ilin şəvval ayında (iyul 1231) tədrislə məşğul olduğu bu zaviyədə vəfat etmişdi[1716].

**Qaziü'l-quzat Siracəddin Əbü's-Səna Mahmud ibn Əbu Bəkr ibn Hamid ibn Əhməd Urməvi**

Şafi'i məzhəbinə mənsub fəqih və mütəkəllim idi. H. 594-cü ildə (1198) anadan olmuşdu. Mosuldakı mədrəsələrdən birində təhsil almış, Kəmaləddin ibn Yunisin[1717] və Fəxrəddin Razinin tələbəsi olmuşdu. Mənbələrdə onun bu iki alimin hansından daha əvvəl dərs aldığını qeyd edilmir. Ümumiyyətlə onun Fəxrəddin Razinin tələbəsi olduğunu qeyd edən yeganə mənbə İbnü'l-İbridir[1718]. Fəxrəddin Razinin 1209-cu ildə vəfat etdiyini nəzərə alaraq bunun mümkün olmadığını deyə bilərik. Çünki Siracəddin Mahmud Urməvi bu vaxt cəmi 10 yaşında uşaq idi. Onun bu yaşda mədrəsəyə getməsi və ya başqa bir şəraitdə Fəxrəddin Razidən kəlam və fiqh dərsləri almasını düşünmək çətindir. Ehtimal ki, Siracəddin Urməvi kəlam, məntiq və fəlsəfədə Fəxrəddin Razi məktəbinin davamçısı və onun tələbələrindən birinin tələbəsi olmuşdu. Hətta onun, yuxarıda haqqında bəhs etdiyimiz, Fəxrəddin Razinin tələbsi olmuş, bir müddət

---

[1715] İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 117; İBN RAFİ', *əl-Vəfayat*, s. 72.
[1716] ZƏHƏBİ, *İbər fi Xəbər mən Ğəbər*, C. III, s. 114; NUEYMİ, *Daris fi Tarixi'l-Mədaris*, C. II, s. 152-153.
[1717] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 80; SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VIII, s. 205; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. II, s. 61.
[1718] İBNü'l-İBRİ, *Tarixu Müxtəsərü'd-Düvəl*, s. 212.

Konyada yaşayıb sonra Bağdada köçərək 1258-ci ildə vəfat etmiş, əllamə Tacəddin Əbü'l-Fəzail Muhəmməd Urməvinin tələbəsi olduğunu da təxmin etmək mümkündür.

Muhəmməd Sivasinin qeyd etdiyinə görə Siracəddin Urməvi Anadoluya Misirdən gəlmişdi. Onun bu diyara gəlişi Anadolu Səlcuqluları sultanı Əlaəddin I Keyqubadın (1220-1237) hakimiyyəti dövrünə təsadüf edir. Özünün dediyinə görə Anadoluya getməkdə əsas məqsədi tanınmış fütuvvət şeyxi Əvhədəddin Kirmaniyə xidmət etmək şərəfinə nail olmaq olmuşdu. Əlaəddin I Keyqubadın əmri ilə o, Malatya şəhərinin cümə məscidinin qarşısındakı mədrəsəyə müdərris təyin olunmuşdu. Əsr namazına qədər mədrəsədə tədrislə məşğul olan Siracəddin Urməvi, namazdan sonra şeyx Əvhədəddin Kirmaninin xidmətində olurdu[1719].

Sultan Rüknəddin IV Qılıncarslanın (1259-1266) hakimiyyəti dövründə Konya qazisi olan[1720] Siracəddin Urməvi 1266-cı ildə sultan Qiyasəddin III Keykavusun (1266-1284) əmri ilə Anadolu Səlcuqlu dövlətinin qaziü'l-quzatlığına, yəni baş qaziliyinə təyin edilmişdi[1721]. Cimri hadisəsi[1722] vaxtı qazi Siracəddin Urməvi verdiyi bir fətva ilə Konya xalqını Qaramanoğlu Mehmed bəy və Əlaəddin Səyavuşa qarşı mübarizəyə çağırmışdı. Konya qalası Qaramanoğlu Mehmed bəy və Səyvuşun əsgərələri tərəfindən mühasirədə saxlanarkən (1276) qazi Siracəddin Urməvi şəxsən şəhərin müdafiəsində iştirak etmiş və qala divarlarının üzərindən mühasirəçilərə ox atmışdı[1723].

İbn Bibi Siracəddin Urməvi haqqında belə yazırdı: "qazilər qazisi, alimlərin hökmdarı, imamların sultanı, dövrün şarihi, məliklər və sultanların atası, İslamın hüccəti Siracəddin Əbü's-Səna Mahmud əl-Urməvi alimlərin və mütəfəkkirlərin qabaqcıllarından idi. Bütün fənni və nəzəri elmlərdə, üsul, məntiq, fiqh və cədəl elmində yaşadığı dövrdə onun misli-bərabəri yox idi"[1724]. Kəriməddin Aqsarayi isə onu

---

1719 SİVASİ, *Mənaqibi-şeyx Əvhədəddini-Kirmani*, s. 91; BAYRAM, *həmin əsər* 171.

1720 ƏFLAKİ, *Ariflerin Menkıbeler*, C. I, s. 373.

1721 Kəriməddin Mahmud AQSARAYİ, *Müsamərətü'l-Əxbar və Müsayərətü'l-Əxyar*, (nşr. Osman Turan), s. 90, Ankara 1944.

1722 Cimri (xəsis) hadisəsi-Qaramanoğlu Mehmed bəyin 1276-cı ildə cimri ləqəbi ilə tanınan Səyavuş adlı bir şəxsi, onun Səlcuqlu ailəsinə mənsub şahzadə olduğunu iddia edərək, taxta oturtmağa cəhd etməsi və bunun ətrafında cərəyan edən hadisələrdir. Bu saxta şahzadə daha sonra qətlə yetirilmişdi.

1723 İBN BİBİ, *Əvamirü'l-Əlaiyyə*, s. 690-701. İbn Bibi bu hadisənin 1277-ci ildə baş verdiyini qeyd edir. Prof. Osman Fərid Sağlam tərəfindən aşkar və tədqiq edilmiş Əlaəddin Səyavuşun adına zərb edilmiş sikkənin üzərində isə h. 675/1276-cı il həkk olunmuşdur. Ətraflı məlumat üçün bax: Osman F. SAĞLAM, "Şimdiye Kadar Görülmeyen Cimri Sikkesi", **TTK, Belleten**, C. IX, S. 35, Ankara 1945, s. 301-302.

1724 İBN BİBİ, *Əvamirü'l-Əlaiyyə*, s. 700.

aşağıdakı sözlərlə mədh etmişdi: “Qazi Siracəddin Urməvi bütün sahələrdə alim, fəzilət dəryası, şəriət asimanının günəşi, həqiqət və təriqət mühitinin mərkəzi, din və hikmət elmlərində alimlərin lideri idi. Onun elm məclislərində iştirak və onun elmindən faydalanmaq üçün paytaxt Konyaya gələnlərin hər biri ülkər ulduzu kimi buradan ətrafa saçılırdılar”[1725].

Siracəddin Mahmud Urməvi h. 682-ci ildə (1283) Konyada vəfat etmişdi[1726]. Onun dəfn edildiyi türbə Konyanın “Müsəlla” qəbrisatınının şimal-şərq hissəsində idi. Hal-hazırda mövcud deyil. Ehtimal ki, şəhərdə aparılan abadlıq işləri vaxtı dağıldılmışdı[1727].

Siracəddin Urməvinin yetişdirdiyi tələbələr arasından Osmanlı dövlətinin quruluş dövründə mühüm vəzifələr tutaraq bu dövlətin təşəkkülünə xidmət etmiş şəxslər yetişmişdir. Orxan ğazinin hakimiyyəti dövründə (1324-1362) İznikin fəthindən sonra burada açılan mədrəsənin baş müdərrisliyinə Siracəddin Urməvinin tələbəsi şeyx Davud Qeysəri təyin olunmuşdu[1728]. Onun başqa bir tələbəsi Tacəddin Kürdi də bu mədrəsədə dərs vermişdi[1729].

Siracəddin Urməvi fiqh, fiqh üsulu, kəlam və cədələ dair bir sıra əsərlərin müəllifidir. Onun qələmə aldığı ən məşhur əsər məntiq elminə aid olan “Mətaliü’l-Ənvar”dır. Alim “Lübabü’l-Ərbəin fi Üsuliddin” adlı əsərini Fəxrəddin Razinin “Ərbəin fi Üsuliddin” adlı əsərinə şərh olaraq qələmə almışdır[1730]. Bundan başqa Siracəddin Urməvinin qələmindən “Ləvamiü’l-Mətali”, “Bəyanü’l-Həqq fi’l-Məntiq və’l-Hikmə”, “Mənahic fi’l-Məntiq və’l-Hikmə”, “Risalə fi Əmsilətü’t-Təərüd”, “Risalə fi İlmü’l-Cədəl”, “əl-Əs’ilə”, “ət-Təhsil”[1731], “Şərhü’l-İşarat və’t-Tənbihat fi’l-Məntiq və’l-Hikmə” və “Lətaifü’l-Hikmə” adlı əsərlər də çıxmışdır[1732]. “Şərhü’l-Vəciz li’l-Qəzzali”,

---

1725 AQSARAYİ, *Müsamərətü’l-Əxbar*, s. 121.

1726 ƏSNƏVİ, *Təbəqatu’ş-Şafi’iyyə*, C. I, s. 80; SÜBKİ, *Təbəqatü’ş-Şafi’iyyə əl-Kübra*, C. VIII, s. 205; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü’ş-Şafi’iyyə*, C. II, s. 61.

1727 Bu haqda daha ətraflı məlumat üçün bax: Elnur NƏSİROV, *XIII Yüzyıl Başlarında Anadolu-Azerbaycan İlişkileri*, s. 176, Konya 2003 (Nəşr olunmamış Ph. Doktorluq dissertasiyası).

1728 XACƏ SƏDƏDDİN Mehmed, *Tacü’t-Təvarix*, C. I, s. 43, İstanbul 1279; NİŞINCI, *Hadisat*, s. 110.

1729 NİŞINCI, *Hadisat*, s. 110.

1730 KATİB ÇƏLƏBİ, *Kəşfü’z-Zünun*, C. I, s. 122. Ömər Rza Kəhhalə bu əsərin adını “Təlxisü’l-Ərbəin fi Üsuli’d-Din” olaraq qeyd etmişdir. Bax: *Mu’cəmü’l-Müəllifin*, C. III, s. 801.

1731 Bu əsər Fəxrəddin Razinin “əl-Məhsul” adlı əsərinə yazılmış haşiyədir.

1732 KATİB ÇƏLƏBİ, *Kəşfü’z-Zünun*, C. I, s. 161, 362, 1045, 1109; C. II, s. 1033; MƏMMƏDOV, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, s. 39.

"Müxtəsərü'l-Məhsul", "Təhsilü'l-Üsul min Kitabü'l-Məhsul"[1733] adlı əsərlər də alimin zehninin məhsuludur. Siracəddin Urməvinin bu vaxta qədər məlum olmayan, fiqhə dair qələmə aldığı "Kitab Təkmilətü't-Təhrir və't-Təqrir" adlı əsəri bizim tərəfimizdən aşkar edilmişdir. Əsər 6 zilhiccə 666/cı ildə (18 avqust 1269) Konyada istinsəx edilmişdir. Bu kitab Konya Darü'l-Hüffazında dərs kitabı olaraq tələbələrə oxudulmuşdu[1734].

**Əbu Bəkr Hüseyn ibn Əli ibn Yəzdanyar Urməvi**

Şafi'i məzhəbinə mənsub vaiz və fəqih idi. Haqqında məlumat verən mənbələrdə onun təsəvvüfdə özünə xas yolu olduğu qeyd edilmişdir. İbn Yəzdanyar adı ilə şöhrət tapmış bu şəxs fiqh, hədis və təfsir elmlərində öz dövrünün tanınmış alimlərindən olmaqla yanaşı zahid, abid və vəra' sahibi insan idi[1735]. İbn Yəzdanyar mənəvi tərbiyə və irşadın İslamın təməl prinsiplərinə uyğun və həmahəng olmalı olduğu barədə fikirlər səsləndirirdi. Öz müasiri olan bəzi ifrat cərəyanlara mənsub şəxslərin İslama zidd olan hal, hərəkət və sözlərini kəskin şəkildə tənqid edən İbn Yəzdanyar bu mənada bidətçilərə qarşı mübarizə aparmışdı. Buna görə də özü ilə eyni dövrdə yaşamış bəzi şəxslərin tənqid və təzyiqlərinə məruz qalmışdı[1736].

İbn Yəzdanyar ifrat cərəyanlara mənsublarını tənqid etməkdə məqsədini belə izah edirdi: "Siz mənim onlar haqqında danışdığımı eşidirsiniz. Allaha and olsun ki, bu sözləri sadəcə onlara yazığım gəldiyi üçün deyirəm. İdrak sahibi olan bir qrup insan sözlərimin qiymətinin anladı. Əsl məqsədim onları bu saxtakarların əlindən xilas edib Haqqın yolunu göstərməkdir. Sözlərimdəki məqsəd bundan ibarət idi"[1737]. İbn Yəzdanyar bəzi ifrat cərəyan mənsublarını tənqid edərkən belə deyirdi: "Bir yandan tövbə və istiğfar edir, digər tərəfdən günah işləməyə davam edirlər. Belə olarmı? Bir

---

[1733] KƏHHALƏ, *yenə orada*. Buradakı son iki əsər Fəxrəddin Razinin "əl-Məhsul" adlı əsərinin ixtisarı və şərhi idi.

[1734] Siracəddin Urməvinin "Kitab Təkmilətü't-Təhrir və't-Təqrir" adlı əsəri, eləcə də digər əsərləri ilə bağlı ətraflı məlumat üçün bax: NƏSİROV, *XIII Yüzyıl Başlarında Anadolu-Azerbaycan İlişkileri*, s. 176-179.

[1735] Əbu Əbdürrəhman Muhəmməd SÜLƏMİ, *Təbəqatü's-Sufiyyə*, (Hzr. Ə. Şərbas), s. 140-141, Qahirə 1998; Əbdülvəhhab ŞƏ'RANİ, *Təbəqatü'l-Kübra*, (Trc. A. Akçiçek), C. I, s. 472-473, İstanbul 1968; Əbdülbaqi GÖLPINARLI, *Mövlana Cəlaləddin*, s. 115-116, İstanbul 1959.

[1736] SÜLƏMİ, *Təbəqatü's-Sufiyyə*, s. 140-141; ŞƏ'RANİ, *Təbəqatü'l-Kübra*, C. I, s. 472-473; CAMİ, *Nəfəhatü'l-Üns*, s. 231-232; Əbü'l-Qasım Əbdülkərim QÜŞEYRİ, *Risalə fi İlmü't-Təsəvvüf*, s. 137, Qahirə 1986.

[1737] SÜLƏMİ, *Təbəqatü's-Sufiyyə*, s. 140-141; ŞƏ'RANİ, *Təbəqatü'l-Kübra*, C. I, s. 472-473.

yandan tövbə edib bir yandan günahlara davam edən şəxs tövbənin dadından məhrum qalar"[1738].

İbn Yəzdanyara görə yüksək əxlaqa sahib olmanın ilk şərti həya sahibi olmaqdır[1739]. Özünün zöhd anlayışını İbn Yəzdanyar belə ifadə etməkdə idi: "İnsanlarla ünsiyyəti xoşlayırsansa əsla Allahla ünsiyətdə olmağa tamah salma. Boş və lüzumsuz şeyləri xoşlayırsansa əsla Allah eşqinə tamah etmə"[1740]. İbn Yəzdanyara görə hədis alimləri Muhəmmədin (ق) sünnəsinin gözətçiləridirlər[1741].

İbn Yəzdanyar özü də tez-tez tənqid və təzyiqlərə məruz qalırdı. Bir dəfə Bağdadda ikən onu sınamaq və utandırmaq üçün məsciddə və'z etməsi istənmişdi. Ehtimal ki, onlar İbn Yəzdanyarın ərəb olmadığı üçün ərəbcə və'z etməkdə çətinlik çəkəcəyini və ya ləhcəsi ilə gülünc vəziyyətə düşəcəyini düşünmüşdülər. Məscidin kürsüsünə qalxan İbn Yəzdanyar "əcəm kimi yatıb ərəb kimi oyandım" deyə sözə başlayaraq fəsih ərəbcə ilə bəlağətli və'z etmiş, onu çətin vəziyyətə salmaq istəyənləri utandırmışdı[1742]. Əbu Bəkr Hüseyn ibn Yəzdanyar Urməvi h. 332-ci ildə (944) vəfat etmişdir[1743].

İbn Yezdanyarın qələm aldığı hər hansı bir əsəri müəyyən etmək mümkün olmamışdır. Lakin onunla yaxın qohumluq əlaqəsinin olduğunu güman etdiyimiz Əbu Cə'fər Muhəmməd ibn Hüseyn ibn Əhməd İbn Yəzdanyar adlı şəxsin müəllifi olduğu "Rəvzətü'l-Müridin" və "Kitabü's-Söhbə məə's-Sufiyyə" adlı əsərlər İstanbulda, Köprülü əlyazma əsərlər kitabxanasında saxlanılır. "Rəvzətü'l-Müridin"in bir nüsxəsi də ABŞ-nın Princeton universitetinin kitabxanasında saxlanılır. Bu nüsxənin üzü Qasım ibn Nasir ibn Salman adlı müstənsix tərəfindən h. 28 rəcəb 728-ci ildə (26 sentyabr 1383) köçürülüb başa çatdırılmışdır. Eyni əsərin h. 980-ci ildə (1572) üzü köçürülmüş bir nüsxəsi də Paris milli kitabxanasında mühafizə edilir[1744].

İbn Yəzdanyar, sonrakı əsrlərdə İslam coğrafiyasında geniş tərəfdar kütləsinə sahib olan, fütuvvət məfkurəsinin müəllifi hesab olunur. Onun vəfatından sonra fütuvvətlə

---

[1738] SÜLƏMİ, *yenə orada*; ŞƏ'RANİ, *yenə orada*.
[1739] ŞƏ'RANİ, *Təbəqatü'l-Kübra*, C. I, s. 472-473.
[1740] QÜŞEYRİ, *Risalə*, s. 137.
[1741] SÜLƏMİ, *Təbəqatü's-Sufiyyə*, s. 140-141; CAMİ, *Nəfəhatü'l-Üns*, s. 231-232.
[1742] BAKUVİ, *Təlxisü'l-Asar*, s. 81; TƏRBİYƏT, *həmin əsər*, s. 178; GÖLPINARLI, *həmin əsər*, s. 116.
[1743] SÜLƏMİ, *Təbəqatü's-Sufiyyə*, s. 140-141; ŞƏ'RANİ, *Təbəqatü'l-Kübra*, C. I, s. 473.
[1744] DE SLANE, *həmin əsər*, 261.

bağlı çox sayıda əsər qələmə alınmışdır. Fütuvvətin ilk pilləsi mürüvvətdir (mərdlik, igidlik). Fütuvvətin mürüvvət anlayışına görə bu yola qədəm qoyan şəxs hər şeydən əvvəl şəhvət və qəzəb kimi pis xüsusiyyətlərdən, duyğu və düşüncələrdən nəfsini təmizləməli, özünü ali və ülvi hisslərə təchiz etməli idi. İkinci pillə lətafət idi ki, bu da iffət, şücaət və ədalət kimi əxlaqi keyfiyyətlərlə təchiz olmağı ifadə edirdi. Fütuvvətin üçüncü və ən ali pilləsi vəlayətdir. Fütuvvət əhlinə görə vəlayət dünyəvi ləzzətləri ayağının altına alıb, onlardan qurtulmaq mənasını ifadə edirdi[1745].

Fütuvvət əhli məfkurələrində özlərinə Əli ibn Əbu Talibi (ا) və Əshabi-Kəhfi nümunə götürməkdə idilər. Bunu da Rəsulullahın (ق) Əli ibn Əbu Talibə (ا) xitabən dediyi "Sən bu ümmətin gəncisən (igidisən)" (Əntə fəta həzihi'l-ümmə) sözünə əsaslandırırdılar[1746]. Fütuvvət əhlinə görə tövbə iffət və saleh əməlin başlanığıcı idi. Fütuvvət mənsubu təkəbbür və ücubdan uzaq olmalı idi. Onlara görə təvazö qəzəbin qarşısında sədd və şücaətin ilk şərti idi[1747]. Fütuvvət yoluna qədəm qoyan şəxs müəyyən təlim və tərbiyə mərhələlərindən keçməli idi. Bunlar sıra ilə hidayət, nəsihət və vəfa mərhələləri idi[1748]. Fütuvvət mənsubu bu yoldakı ən ali məqama elm, əhval və müşahidə yolu ilə çata bilərdi. Onlara görə vəlayət məqamı fənayi-xilqətdə sona çatır ki, bu da həqiqətin gözüdür[1749].

İbn Yəzdanyardan sonra fütuvvət cərəyanının ən məşhur təmsilçisi Azərbaycanın Zəncan şəhərindən[1750] olan Əxi Fərəc Zəncanidir (öl. 1065). Əbü'l-Abbas Nəhavəndinin müridlərindən olan Əxi Fərəc Zəncani ilk əxi zaviyəsini quran şəxsdir. Bir qədər şübhə doğursa da Hacı Zeynəlabdin Şirvani və Əlişir Nəvayi öz əsərlərində məşhur fütuvvət şeyxi Şihabəddin Ömər Sührəvərdinin əmisi və mürşidi Əbu'n-Nəcib Sührəvərdinin Əxi Fərəc Zəncaninin müridi olduğunu, onun əlindən xirqə geydiyini qeyd etmişdilər[1751]. Sonrakı əsrlərdə Abbasi xəlifəsi Nasir li-Dinillah (öl. 1225) fütuvvət

---

[1745] ANONİM, *Tuhfətü'l-İxvan dər Bəyani-Üsuli-Fütuvvət və Adabi-Fityan*, (Nşr. M. Damadi), s. 5-9, Tehran 1351.
[1746] *Tuhfətü'l-İxvan*, s. 13.
[1747] *Tuhfətü'l-İxvan*, s. 27.
[1748] *Tuhfətü'l-İxvan*, s. 21-25, 37-40, 44-48.
[1749] *Tuhfətü'l-İxvan*, s. 9. [و ىهتنم دوش آنفب تقيلخ نيعرد تقيقح]
[1750] HİMYƏRİ, *Nisbə ilə'l-Məvazi'*, C. I, s. 368.
[1751] Hacı Zeynəlabdin ŞİRVANİ, *Riyazü's-Səyahə*, s. 91, 365, Tehran 1339; NƏVAYİ, *Nəsayimü'l-Məhəbbə*, s. 694. Şeyx Əbu'n-Nəcib Sührəvərdi Əxi Fərəc Zəncaniyə, böyük ehtimalla, intisab silsiləsi ilə bağlıdır, yəni onun müridlərindən birinin müridi olmuşdur. Onların görüşmələri mümkün deyil. Zeynəlabdin Şirvani və Əlişir Nəvayinin burada yanıldıqlarını və ya əskik məlumat nəql etdiklərini düşünürük. Belə ki, 1097-ci ildə dünyaya gəlmiş Əbu'n-Nəcib

təşkilatını yenidən formalaşdırmışdı. İslam coğrafiyasındakı bir çox hökmdar bu təşkilatın üzvü idi. Bunların ən məşhurlarından, müasirlərinin "uluq sultan" adlandırdıqları Anadolu Səlcuqlu hökmdarı Əlaəddin I Keyqubad (1220-1237) idi. Sultan Əlaəddin I Keyqubad xəlifə Nasir li-Dinillahın nümayindəsi kimi hüzuruna gəlmiş şeyxü'-şüyux Şihabəddin Ömər Sührəvərdinin vasitəçiliyi ilə bu təşkilata üzv olmuşdu[1752]. Həmçinin Azərbaycan Atabəylərindən də bəzilərinin fütuvvət təşkilatına mənsub olduqlarını düşünürük. Güman ki, atabəy Muhəmməd Cahan Pəhləvan (1175-1186) və atabəy Osman Qızıl Arslan (1186-1191) fütuvvət təşkilatına mənsub idilər.

Prof. Mikayıl Bayram haqlı olaraq Azərbaycan və Anadoluda fəaliyyət göstərmiş əxi təşkilatının mahiyət etibarı ilə Türk fütuvvət hərəkatı olduğunu qeyd etmişdir[1753]. Bu təşkilat üzvlərinin əksəriyyəti Anadoluda Bizans imperiyasına və səlibçilərə qarşı aparılan mücahidədə iştirak edən könüllülər idi. Həmin dövrün tarixi mənbələrində "ğaziyane-Rum" (Anadolu qaziləri) adlanan bu zümrəyə mənsub şəxslərin bir çoxu Türk fütuvvət təşkilatına mənsub əxilər idi[1754].

**Hüsaməddin Həsən Çələbi ibn Əxi Muhəmməd ibn Əxi Türk Urməvi**

Onun ata-babaları Urmiyədən köçüb Konyada məskunlaşmışdılar. Hüsaməddin Həsən Urməvi 1220-ci illərdə dünyaya gəlmişdi. Onun atası Əxi Muhəmməd Konyada mənəvi nüfuza malik olmaqla yanaşı sərvət sahibi insanlardan biri idi[1755]. Hüsaməddin Həsən Çələbi fütuvvət idologiyasının və təşkilatının banisi, yuxarıda haqqında danışdığımız, Əbu Bəkr Hüseyn ibn Əli ibn Yəzdanyar Urməvinin nəslindən idi. Kiçik yaşlarında atasını itirən Hüsaməddin Çələbi Urməvi Konyadakı əxilərin himayəsində böyüyüb tərbiyə almışdı. Yeniyetməlik illərində mövlana Cəlaləddin Rumi ilə tanış olub onun müridlərindən biri olmuşdu[1756]. Mövlana Cəlaləddin Rumi "Məsnəvi"sini yazarkən

---

Sührəvərdinin 1065-ci ildə vəfat etmiş Əxi Fərəclə görüşmələri mümkün deyildi. Şirvani ilə Nəvayi bu məlumatı, böyük ehtimalla, sufi mülliflərin yazdıqları təzkirələrdən nəql etmişdilər. Təsəvvüfdə isə ölmüş bir şəxsdən də, feyz yolu ilə, dərs və irşad almaq mümkündür!?.

[1752] ƏFLAKİ, *Ariflerin Menkıbeler*, C. I, s. 373.

[1753] Mikail BAYRAM, *Ahi Evren ve Ahi Teşkilatının Kuruluşu*, s. 129, Konya 1991.

[1754] BAYRAM, *həmin əsər*, s. 132-133.

[1755] Neşet ÇAĞATAY, *Bir Türk Kurumu Olan Ahilik*, s. 97, Ankara 1974.

[1756] ƏFLAKİ, *Ariflerin Menkıbeleri*, C. II, s. 153.

Hüsaməddin Həsən Çələbi daim onun yanında olmuş, ustadı bədahətən şe’r deyərkən o, qeyd etmiş, beləcə 10-11 il ərzində “Məsnəvi” yazılıb başa çatdırılmışdı[1757]. Hüsaməddin Urməvi mövlana Cəlaləddin Ruminin ölümündən sonra onun postnişini olmuşdu. Mövləvilik bir təriqət kimi Hüsaməddən Həsən Çələbinin şeyxliyi vaxtı formalaşmış, qayda və rituallar onun postnişinliyi dövründə meydana çıxmışdı. O, 12 sentyabr 1284-cü ildə Konyada ölmüş və Cəlaləddin Ruminin məzarının yanında dəfn edilmişdi[1758].

**Fəxrəddin Ömər ibn Müin Urməvi**

Urmiyə şəhərinin alimlərindən idi. Ehtimal ki, bu şəhərin qazisi və ya hakimlərindən biri olmuşdur. Çünki İbnü’l-Fuvati onun məsciddəki təziyə və cənazə mərasiminə şəhərin alimlərinin, hakimlərinin və qabaqcıl insanlarının toplaşdıqlarını, onu ədalətli insan kimi yad etdiklərini qeyd etmişdir. Fəxrəddin Ömər ibn Mu’in h. 693-cü ildə (1294) vəfat etmişdir[1759].

**Əllamə Səfiyəddin Muhəmməd ibn Əbdürrəhim ibn Muhəmməd əl-Hindi Urməvi**

Şafi’i məzhəbinə mənsub fəqih və mütəkəllim idi. h. 644-cü ilin rəbiəlaxir ayında (avqust 1246) Hindistanda anadan olmuşdu. Onun atası Azərbaycanın Urmiyə şəhrindən Hindistana köçmüşdü. İlk təhsilini ana tərəfindən babasından almış və onun yanında fiqh oxumuşduu. Səfiyəddin Muhəmməd Urməvi h. 667-ci ilin rəcəb ayında (mart 1269) Hindistanı tərk edərək Yəmənə gəlmişdi. Yəmən hökmdarı Müzəffər onu bir müddət qonaq etmiş və ona ərməğan olaraq 900 dinar[1760] vermişdi. Səfiyəddin Muhəmməd Urməvi Məkkəyə gedib 3 ay orada qalmışdı. Həcc ziyarətindən sonra h. 671-ci ildə (1273) Misirə getmişdi. Misirdə çox qalmayan Səfiyəddin Urməvi dəniz yolu ilə Antakiyaya gəlmişdi[1761]. O, Anadolunu gəzmiş Konyada 11 il, Sivasda 5 il, Kayseridə

---

[1757] Abdülbaki GÖLPINARLI, *Mevlana Celaleddin*, s. 121, İstanbul 1959.
[1758] ƏFLAKİ, *Ariflerin Menkıbeleri*, C. II, s. 189-191.
[1759] İBNü’l-FUVATİ, *Məcməü’l-Adab* , C. IV/3, s. 271.
[1760] Dinar-4,25 gr qızıl pul. Əbdülhəyy Hüseyni bu məbləğin 900, İbn Kəsir isə 400 dinar olduğunu qeyd etmişdir.
[1761] HÜSEYNİ, *Nüzhətü’l-Xəvatir*, s. 200-201; İBN KƏSİR, *Bidayə və’n-Nihayə*, C. XIV, s. 143; SÜBKİ, *Təbəqatü’ş-Şafi’iyyə əl-Kübra*, C. IX, s. 102; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü’ş-Şafi’iyyə*, C. II, s. 67.

isə 1 il yaşamışdı. Həmyerlisi qazi Siracəddin Əbü's-Səna Urməvi ilə görüşmüş və ondan məntiqə dair dərslər almışdı[1762]. Konyada Pənbəfüruşan mədrəsəsində dərs verən[1763] Səfiyəddin Urməvi, digər bəzi fəqihlərlə birlikdə, dərvişlərin şəhərin küçələrində rəbab kimi musiqi alətləri ilə çalğı çalmalarına etiraz etmişdi. Lakin Mövlana Cəlaləddin Ruminin məsələyə müdaxilə etməsi ilə dərvişlərin rəbab çalmaları qadağan edilməmişdi. Mövləvi salnaməçi Əflaki Səfiyəddin Urməvinin abid və zahid insan olduğunu qeyd etmişdir[1764].

H. 685-ci ildə (1286) Səfiyəddin Urməvi Anadolunu tərk edərək Dəməşqə getmiş və bu şəhərdə məskunlaşmışdı. Səfiyəddin Urməvi burada Atabəkiyyə, Zahiriyyə, Rəvahiyyə, Dövliyyə və Cəvaniyyə mədrəsələrində dərs vermiş, fətva mərcii olmuşdu[1765]. Alim "Nihayətü'l-Vüsul ilə İlmü'l-Üsul", "Zübdətü'l-Kəlam fi İlmü'l-Kəlam", "əl-Faiq fi Üsuliddin", "Risalətü'n-Nəfsiyyə"[1766] və "Risalətü's-Siniyyə" kimi əsərlərin müəllifidir[1767].

H. 705-ci ilin rəcəb ayının 8-ci günü (24 yanvar 1306) Dəməşqdə naibü's-səltənə[1768] əmir Tengizin hüzurunda bəzi alimlər şeyxülislam Təqiyəddin Əhməd ibn Teymiyyəni (öl. 1328) müəllifi olduğu "Əqidətü'l-Vasitiyyə" adlı əsərə dair sorğu-sual etmişdilər. Burada sorğu və təhqiqat aparan alimlərin arasında Səfiyyəddin Urməvi də var idi. İbn Kəsirin ifadəsi ilə desək "çaydan su daşımağa vərdiş olanlar bu dəfə dəryaya rast gəlmişdilər"[1769]. İbn Teymiyyə burada öz fikirlərini uğurla müdafiə etmişdi. Səfiyəddin Urməvi onunla uzun müddət mübahisə etmiş, lakin İbn Teymiyyənin bütün mövzulara aid suallara dolğun və tətminkar cavablar verməsi qarşısında "Sən quş kimi oradan ora, buradan bura uçursan, bir az yavaş ol" deməkdən başqa söz tapmamışdı[1770]. Səfiyəddin Urməvinin İbn Teymiyyə qarşısında əqaid mövzusundakı zəifliyi hər halda

---

[1762] SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. XXVIII, s. 239; SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. IX, s. 102; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 143.
[1763] ƏFLAKİ, *həmin əsər*, C. I, s. 323-324.
[1764] *Yenə orada*.
[1765] İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 143; SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. IX, s. 102; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. II, s. 67; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VI, s. 600.
[1766] SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. XXVIII, s. 239; MƏMMƏDOV, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, s. 46.
[1767] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 1074.
[1768] Naibü's-Səltənə-sultanın köməkçisi mənasını ifadə edir. Burada Misir Məmlüklü sultanının Şam vilayətində idari işlər üzrə tüm hüquqlu vəkili nəzərdə tutulur.
[1769] İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 88-89.
[1770] HÜSEYNİ, *Nüzhətü'l-Xəvatir*, s. 201; İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 334-335.

ixtisaslaşmadan irəli gəlirdi. Səfiyəddin Urməvi fiqh və kəlam sahəsində dərinləşmişdi. Əqaid isə daha çox Qur'an və hədis sahəsində dərin bilik tələb edən sahədir. Mənbələr Səfiyəddin Urməvinin bu sahədə nisbətən zəif olduğunu, Qur'anın dörddə birindən daha az bir qismini əzbər bildiyi, üstəlik ərəbcə danışarkən dilindəki hind ləhcəsindən də heç cür qurtula bilmədiyini qeyd edirlər[1771]. Səfiyəddin Urməvi daha sonra İbn Teymiyyəni həbsə göndərən məhkəmə heyətinə də daxil edilmişdi[1772].

Şəmsəddin Zəhəbi, Səfiyyəddin Urməvinin vəfatından bəhs edərkən "o, sələfin yolunda idi" ifadəsini işlətmişdir. Səfiyəddin Muhəmməd Urməvi təsəvvüf əhlinə yaxınlığı ilə tanınan kəlam alimi idi. Buna dair mötəbər mənbələrdə çox sayıda qeyd var. Məsələn Əbdürrəhman Nəimi onun Dəməşqin Atabəkiyyə mədrəsəsindəki əşa'ari kəlam alimlərindən biri olduğunu qeyd etmişdir[1773]. Bundan başqa onun sıx bağlı olduğu müəllimi Siracəddin Əbü's-Səna Urməvi şeyx Əvhədəddin Kirmaninin (öl. 1238) müridi idi. Onun əvhədiyyə təriqətinə bağlı olduğunu Şəmsəddin Sivasi öz əsərində qeyd etmişdir[1774]. Bədrəddin Əyni əsərində Səfiyəddin Urməvinin h. 702-ci ildə (1303) Şam diyarındakı sufilərin işləri üzrə məsul vəzifəyə təyin edildiyini yazmışdır[1775]. İbn Kəsir isə öz əsərində sufilərin Dəməşqdə naibü's-səltənə əmir Cəmaləddin Əfrəmdən Səfiyəddin Urməvini onlar üçün şeyxü'ş-şüyux vəzifəsinə təyin etməsini xahiş etdiklərini və onların bu istəyinin yerinə yetirildiyini qeyd etmişdir[1776]. Yenə İbn Kəsir Dəməşqdə rüfai[1777] təriqətinə mənsub sufilərin naibü's-səltənəyə İbn Teymiyyə barəsində şikayət edərək onun sufilərin rəqs və səma mərasimlərinə mane olmamasını tələb etdiklərini qeyd etmişdir[1778]. Bu şikayətdən bir müddət sonra isə yuxarıda haqqında danışdığımız elmi diskussiya baş vermiş və Səfiyəddin Urməvi də bu münazirədə aparıcı rol oynamışdı. Əgər ömrünün sonlarına doğru əqidəsini

---

1771 İBN HƏCƏR, *Dürərü'l-Kaminə*, C. II, s. 334-335.
1772 SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. IX, s. 103.
1773 NUEYMİ, *Daris fi Tarixi'l-Mədaris*, C. I, s. 97.
1774 BAYRAM, *Şeyh Evhaü'd-Din El-Kirmânî ve Menâkıb-Nâmesi*, s. 171. Mənaqibnamənin müəllifi, Siracəddin Urməvinin "Misirdən Diyari-Ruma (Anadoluya-E. N) gəldiyim vaxt bütün məqsəd və məramım şeyx Əvhədəddinə xidmətlə müşərrəf olmaq idi" dediyini qeyd etmşidi.
1775 ƏYNİ, *İqdü'l-Cüman*, s. 428.
1776 İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 75.
1777 Rüfaiyyə təriqəti və ya rüfailik-şeyx Əhməd Rüfainin (öl. 1182) davamçıları tərəfindən meydana gətirilmiş sufi təriqəti. Bu təriqətə həmçinin "əhmədiyyə" və ya "əhmədiyyəyi-rüfaiyyə" də deyilirdi. İbn Kəsir öz əsərində bu təriqəti məhz belə, yəni "əhmədiyyə" və "əhmədiyyəyi-rüfaiyyə" şəklində qeyd etmişdir.
1778 İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 88-89; SƏFƏDİ, *Ə'yanü'l-Əsr*, C. IV, s. 501.

dəyişməmişdisə Səfiyəddin Muhəmməd Urməvi sələfin minhəcinə deyil, təsəvvüf əhlinə yaxınlığı ilə tanınan kəlam alimi idi. Bununla belə Zəhəbinin verdiyi məlumatın da doğru olma ehtimalı az deyil. Səfiyəddin Urməvinin sonradan sələfi-salihin mənhəcini mənimsəmiş olması mümkündür. Çünki Şəmsəddin Zəhəbi Səfiyəddin Urməvini şəxsən tanıyırdı, onun müasiri idi və onlar eyni şəhərdə, Dəməşqdə yaşamışdılar. Hətta Zəhəbi Səfiyəddin Urməvinin dəfn mərasimində də iştirak etmişdi. Səfiyəddin Urməvi h. 29 səfər 715-ci ildə (3 iyun 1315) Dəməşqdə, Zahiriyyə mədrəsəsində vəfat etmişdi[1779].

**Qazi İzzəddin Urməvi**

Qazi İzzəddin Urməvi Anadolu Səlcuqlu sultanı Qiyasəddin III Keyxosrovun (1266-1284) hakimiyyəti dövründə, 1266-cı ildə Sivas şəhəri qaziliyinə təyin edilmişdi. Qazi İzzəddin Urməvi fiqh və kəlam elmləri sahəsində öz dövrünün tanınmış alimlərindən idi[1780]. O, Sivas qaziliyindən əvvəl Ağsaray şəhərində öz adı ilə tanınan mədrəsənin müdərrisi idi. Bu mədrəsə sonralar Osmanlı imperatorluğunun hakimiyyəti illərində də fəaliyyət göstərmişdi[1781].

Misir Məmlüklü sultanı Rüknəddin Zahir Bəybars (1260-1277) bəzi Səlcuqlu dövlət məmurlarının təşviqi ilə Anadolunu moğol işğalından xilas etmək üçün 1276-cı ildə Anadolu səfərinə başlamış, 15 aprel 1277-cü ildə Əlbistan ovalığında baş verən döyüş Rüknəddin Bəybarsın ordusunun qələbəsi ilə başa çatmışdı. Todaun noyan və Toku ağanın əmrindəki 10 min nəfərlik moğol ordusunun 6700-ü məhv edilmiş, geri qalanı əsir götürülmüşdü. Bu Əyn-Cəlut döyüşündən (3 sentyabr 1260) sonra Misir Məmlüklərinin moğollar üzərindəki ikinci böyük qələbəsi idi. Lakin başda vəzir Muinəddin Süleyman olmaqla bəzi Səlcuqlu dövlət məmurlarının qətiyyətsizliyi və səbatsızlıqları ucbatından Məmlüklü ordusu Anadoluda möhkəmlənə bilməyərək geri, Suriyaya qayıtmışdı. Elxanlı hökmdarı Abaqa xan Misir Məmlüklüləri ilə əməkdaşlıqda şübhəli bilinən bir çox Səlcuqlu dövlət məmurunu, o cümlədən qazi İzzəddin Urməvini

---

[1779] İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s. 75-76; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VI, s. 600.
[1780] AQSARAYİ, *Müsamərətü'l-Əxbar*, s. 90
[1781] UZLUK, *Fatih Devrinde Karaman Eyaleti Vakıfları Fihristi*, s. 43.

1277-ci ildə edam etdirmişdi[1782]. Bu hadisə ilə əlaqəli edam edilənlərin arasında digər bir azərbaycanlı alim Qarahisar (Afyon) qazisi Tacəddin Xoyi də var idi.

**Əbu Cə'fər Muhəmməd ibn Həfs Uşnuhi**

Mühəddis idi. Həyatı haqqında ətraflı məlumata rast gəlinməmişdir. Tanınmış tarixçi və mühəddis, "Tarixi-Buxara" əsərinin müəllifi Əbu Abdullah Muhəmməd ibn Əhməd əl-Qəncar əl-Buxari (948-1019) Əbu Cə'fər Uşnuhinin tələbəsi olmuş, ondan hədis dinləmişdi[1783]. Alimin ölüm tarixi məlum deyil. Əbu Abdullah əl-Qəncarın ustadı və müasiri olduğunu nəzərə alaraq Əbu Cə'fər Uşnuhinin X əsrdə yaşadığını təxmin etmək olar.

**Şeyx Əbü'l-Fəzl Əbdüləziz ibn Əli ibn Əbdüləziz ibn Hüseyn Uşnuhi**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. Bağdadda təhsil almış, şeyxülislam Əbu İshaq İbrahim Şirazinin tələbəsi olmuş, ondan şafi'i fiqhini öyrənmişdi. Hədis dinləmək məqsədiylə səyahət etmiş, bir çox mühəddislərlə yanaşı Əbu Cə'fər ibn Məsləmədən də hədis dərsləri almışdı. Səyahətini başa vurduqdan sonra Bağdada getmişdi. Bir müddət Bağdadda yaşadıqdan sonra Azərbaycana qayıtmış, vətənində tədris və tədqiqatla məşğul olmuşdu. Fəzl ibn Muhəmməd ən-Nəvqani ondan hədis dinləmişdi. Əbü'l-Fəzl Əbdüləziz Uşnuhi çox ibadət edən, zahid insan idi. O, İslam vərəsəlik hüququna dair "əl-Uşnuhiyyə fi'l-Fəraiz" adlı əsər qələmə almışdı[1784]. Bu əsər daha çox "Fəraizü'l-Uşnuhiyyə" adı ilə tanınmışdı. Cəmaləddin Əsnəvi onun öz vətənində vəfat etdiyini yazsa da ölüm tarixini qeyd etməmişdir. Alimin "əl-Uşnuhiyyə fi'l-Fəraiz" adlı əsərinin öz dəsti xətti ilə h. 505-ci ildə (1111) yazılmış nüsxəsi

---

[1782] Hüseyn ibn Muhəmməd İBN BİBİ, *Əxbari-Səlacuqe-Rum*, (Nşr. M.C.Məşkur), s. 317, Tehran 1971. İbn Bibinin əsərini tədqiq və nəşr etmiş Muhəmməd Cavad Məşkur Sivas qazisi İzzəddin Urməvi ilə Anadolu Səlcuqlu sultanı İzzəddin II Keykavusun vəziri qazi İzzəddin Muhəmmədi eyni şəxs hesab edərək kitabın fihristində də bu şəkildə qeyd etmişdi. Halbuki Vəzir qazi İzzəddin Muhəmməd 14 oktyabr 1256-cı ildə Ağsaray yaxınlığındakı Sultanxanı döyüşündə Səlcuqlu ordusunun moğollara məğlub olmasından sonra Baycu noyanın əmri ilə, əsir düşmüş 14 Səlcuqlu dövlət xadimi ilə birlikdə, edam edilmişdi. Sivas qazisi İzzəddin Urməvi isə, yuxarıda qeyd etdiyimiz kimi, 1277-ci ildə qətlə yetirilmişdi. Vəzir İzzəddin Muhəmmədlə bağlı ətraflı məlumat üçün bax: Mikayıl BAYRAM, "Selçuklu Veziri Kadı İzzeddin Tarafından Düzenlenen bir Vakıf-Name", **Ata Dergisi**, S. 8, Konya 1997, ss. 48-49.

[1783] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 116.

[1784] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 58; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. I, s. 135; SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VII, s. 94; İBN XƏLLİKAN, *Vəfayatü'l-Əyan*, C. VI, s. 148.

mövcuddur və Qahirədə, Misir Milli kitabxanasında saxlanılır. Bu əsərin Türkiyədəki iki əlyazma nüsxəsindən biri Çorum Həsən paşa İHK, digəri isə Konya BYEK-də mühafizə edilir. Konyadakı nüsxəni h. 983-cü ildə (1575) Zeynəddin ibn Ağacan Naxçıvani adlı şəxs istinsəx edilmişdir. Şeyx Əbdüləziz Uşnuhi həmçinin "əl-İlhaq" və "Kifayə fi'l-Fiqh" adlı bir əsərlərin də müəllifi idi. İbnü's-Səlah Şəhrəzuri ölüm tarixini qeyd etməsə də onun Uşnuhda vəfat etdiyini yazmışdır. Ömər Rza alimin h. 550-ci ildə (1155) vəfat etdiyini qeyd etmişdir[1785].

**Şeyxü'l-İslam Tacəddin Mahmud ibn Həddad ibn Əbu Bəkr ibn Yusif Uşnuhi**

Şafi'i məzhəbinə mənsub fəqih və fütuvvət şeyxi idi. XII əsrin əvvəllərində Azərbaycanın Uşnuh şəhərində anadan olmuş və ilk təhsilini vətənində almışdı. Daha sonra Əfqanıstanın Herat şəhərinə getmişdi. Heratda şeyx Şəmsəddin Muhəmməd ibn Əbdülməlik Deyləmi ilə tanış olaraq onun müridi olmuşdu. Şeyx Tacəddin Uşnuhi məşhur fütuvvət şeyxi Şihabəddin Ömər Sührəvərdinin (öl. 1234) yaxın dostlarından idi. Alim "Kitab Qayətü'l-İmkan fi Dirayətü'l-Məkan" adlı əsərin müəllifi idi. Şeyx Tacəddin Uşnuhi həm də istedadlı şair idi və farsca gözəl şerlər yazırdı. Səid Nəfisi onun "Tacinamə" adlı şe'rlər kitabının olduğunu qeyd etmişdir. Şeyx Tacəddin Uşnuhi XIII əsrin ikinci yarısında Heratda vəfat etmiş, burada şeyx Məcdəddin Talibinin məzarının yanda dəfn edilmişdi[1786].

**Əbü'l-Abbas Əhməd ibn Musa ibn Cəvseyn Uşnuhi**

Şafi'i məzhəbinə mənsub mühəddis və fəqih idi. H. 450-ci ildə (1058) anadan olmuşdu. Bağdada köçmüş və burada yaşamışdı. Əbu Sə'd əl-Mütəvəllinin[1787] tələbəsi olmuş, ondan şafi'i fiqhini öyrənmişdi. Əbu Cə'fər Muhəmməd ibn Əhməd əl-Nəccari və Əbü'l-Qənaim əd-Dəqqaq kimi mühəddislərdən hədis dinləmişdi. Əbu Bəkr əl-Mübarək və Əbü'l-Qasım Zakir ibn Kamil əl-Xəffaf kimi alimlər onun tələbəsi olmuş və

---

[1785] ŞƏHRƏZURİ, *Təbəqati'l-Füqəhai'ş-Şafi'iyyə*, C. I, s. 550; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 164.

[1786] NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. II, s. 750.

[1787] Əbu Sə'd Əbdürrəhman ibn Mə'mun ibn Əli əl-Mütəvəlli (öl. 1085) yaşadığı dövrün tanınmış şafi'i alimlərindən idi. Şeyx Əbu İshaq Şirazinin (öl. 1083) ölümündən sonra Bağdad Nizamiyyə mədrəsəsinin baş müdərrisi, rektoru olmuşdu. "Tətimmə" onun fiqhə dair qələmə aldığı əsər idi.

ondan hədis dinləmişdilər. Əbü'l-Abbas Uşnuhi salehliyi və fəziləti ilə tanınmış alim idi. H. 515-ci ilin zilhiccə ayında (fevral 1122) vəfat etmişdi[1788].

**Mənsur ibn Ətiq ibn Mənsur Uşnuhi**

Müfəssir idi. Əbu Bəkr Übeydullah ibn Cami, Səid ibn Hüseyn ər-Ravəndi, Əbü'l-Qasım Fəzl ibn Abdullah ibnü'l-Mühib kimi alimlərin tələbəsi olmuşdu. Tarixçi İbn Əsakirin qeydlərindən Mənsur Uşnuhinin Qur'anın təfsirinə dair əsərin müəllifi olduğu anlaşılır. İbn Əsakir onun Qur'ani-Kərimin İsra surəsi 110-cu ayəsini təfsir edərkən Abdullah ibn Abbasın (ﺍ) fikrini əsas götürdüyünü qeyd etmişdi. İbn Abbas (ﺍ) bu ayənin enmə səbəbi haqqında belə demişdi:

Bu ayə Allah Rəsulunun (ق) (hicrətdən əvvəl, İslamın ilk illərində) Məkkədə əshabı ilə birlikdə gizli namaz qıldığı vaxtlarda nazil olmuşdu. Allah Rəsulu (ق) əshabına namaz qıldırıb Qur'an oxuyarkən səsini qaldırırdı. Qüreyş müşrikləri onu eşidəndə Qur'anı, onu endirəni və endiriləni söyürdülər. Bundan sonra bu ayə nazil oldu: "(Ey Rəsulum) Namaz qılarkən səsini nə çox qaldır, nə də çox alçalt. Bunun (bu ikisinin) arasında orta bir yol tut!" . Allah öz elçisinə "namazdakı Qur'an oxunuşlarında, müşriklər eşidib Qur'anı söyməsinlər deyə, səsini çox yüksəltmə, əshabın da sənin Qur'an oxumağını dinləməkdən məhrum olmasınlar deyə səsini çox alçaltma. Bu ikisinin arasında bir yol tut" deyə bəyan etdi[1789].

**Şeyx Təqiyəddin Əbu't-Təqi Saleh ibn Muxtar ibn Saleh ibn Əbü'l-Fəvaris Uşnuhi**

Mühəddis idi. Şeyx İbn Əbdüddaim, Şəmsəddin Muhəmməd ibnü'l-Kamal Əbdürrəhim və Fəxrəddin Əbü'l-Həsən Əli ibn Əhməd ibnü'l-Buxari kimi dövrün məşhur mühəddislərinin tələbəsi olmuş, onlardan hədis dərsləri almışdı. Muhəmməd ibn Əbdülhadi və İbrahim ibn Xəlildən şafi'i fiqhini öyrənmiş və bu alimlərdən icazət (diplom) almışdı. Şeyx Təqiyəddin Saleh Uşnuhi hədis elminə dair bir sıra əsərlərin

---

[1788] SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VI, s. 35; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 58; SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. VIII, s. 129. Səlahəddin Səfədi onun babasının adını "Huşeyn" kimi qeyd etmişdir.

[1789] İBN ƏSAKİR, *Mu'cəmü'ş-Şüyux*, s. 301-302. Bu ayənin təfsiri üçün bax: TƏBƏRİ, *Camiü'l-Bəyan*, C. V, s. 326-328; BUXARİ, *Səhih*, Təfsirü'l-Qur'an, Nr. 27; MÜSLİM, *Səhih*, əs-Səlat, Nr. 17; TİRMİZİ, *Sünən*, 48/3146. ( ولا تجهر بصلاتك ولا تخافت بها).

müəllifi idi. Onun tələbələri arasından tanınmış mühəddislər çıxmışdı. Alim h. 738-ci ilin cəmaziələvvəl ayında (dekabr 1337) Qahirədə vəfat etmiş və bu şəhərin Qirafə səmtindəki qəbristanda dəfn edilmişdi[1790].

**Qütbəddin Əbu Muhəmməd Əmiri ibn Bəxtiyar Uşnuhi**

Mühəddis idi. İraqın Ərbil şəhərində yaşamışdı. Yaşadığı dövrün tanınmış şafi'i alimlərindən biri idi. Abdullah ibn Əhməd ibn Muhəmməd Məvsilidən hədis dinləmişdi. Alim h. 614-cü ilin cəmadiəlaxir ayında (sentyabr 1217) təqribən 70 yaşında vəfat etmişdi[1791].

**Əbu Nəsr Nueym ibn Əhməd ibn Muhəmməd ibn Əla Varsani**

Mühəddis idi. Fəqih Əbu Bəkr Muhəmməd ibn Həfsuyənin tələbəsi olmuş, ondan hədis dərsləri almışdı. Əbu Nəsr Nueym Varsani h. 345-ci (956) ildə İranın Cürcan şəhərində hədis dərsləri vermişdir[1792]. Ölüm tarixi məlum deyil.

**Əbü'l-Fərəc Əbdülvahid ibn Bəkr ibn Muhəmməd Varsani**

Mühəddis idi. Hədis dinləmək üçün çox səyahət etmişdi. Dəməşqdə Cuməh ibnü'l-Qasım, Muhəmməd ibn Abdullah ibn Cə'fər ər-Razi, Yəhya ibn Abdullah əz-Zəccac, Əbu Bəkr Əhməd ibn Abdullah ibn Əbu Dücanə, Əbü'l-Qasım ibn Əbi'l-Əqəb, Muhəmməd ibn Harun ibn Şueyb, Əbu Yə'la Abdullah ibn Əbi Kərimə əs-Səydavi, Əbu Bəkr Muhəmməd ibn Davud əd-Duqqi, Mənsur ibn Əhməd əl-Hərəvi kimi mühəddislərdən hədis dinləmiş və nəql etmişdi.

Həmzə ibn Yusif əs-Səhmi, Müzəffər ibn Əhməd əl-Fəqih, Əbü'l-Həsən Əbdülvahid ibn Şah, Əbu Əhməd Əbhəri, Əbu Sə'd əl-Maleyni, Əbu Əbdürrəhman əs-Süləmi, Əbu Muhəmməd Həsən ibn İsmayıl Ğəssani ondan hədis dinləmişdilər. Əbü'l-Fərəc Əbdülvahid Varsani tanınmış mühəddis Əhməd ibn Mənsur Şirazinin yaxın dostu idi.

---

1790 İBN RAFİ', *əl-Vəfayat*, s. 10.
1791 SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VIII, s.70.
1792 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV, s.467.

Əbü'l-Fərəc Varsani h. 365-ci ildə (976) Cürcana getmiş orada hədis dərsləri vermişdi. Alim h. 372-ci ildə (982) Hicazda vəfat etmişdi[1793].

**Əhməd ibn Duləf Varsani**

Mühəddis idi. Qəzvində təhsil almış, burada Həsən Əli ibn Muhəmməd ibn Quttandan (öl. 1231) hədis dinləmişdi. Əhməd ibn Duləf Varsani İbrahim ibn Nəsr, Abdullah ibn Rica kimi ravilərdən hədis nəql etmişdi[1794]. Ölüm tarixi məlum deyil, XIII əsrdə yaşamışdır.

**Əbü'l-Həsən Əli ibnü's-Sirri ibn Səqr ibn Həmmad Varsani**

Mühəddis idi. Əbü'l-Qasım Abdullah ibn Muhəmməd əl-Bəğəvi (öl. 929), Əbu Bəkr Muhəmməd ibn Qasım İsfəhani, Cə'fər ibn İsa Hulvani, Əbu Bəkr Muhəmməd ibn Həsən ibn Davuddan hədis dinləmiş və nəql etmişdi. Əbü'l-Həsən Əli Varsani bir müddət Qəzvində təhsil almış, burada Əbu Hatim əs-Sicistani, Əbu Əli ət-Tusi kimi alimlərdən hədis dinləmişdi. İbn Bilal və İbn Bərkan, Əbü'l-Həsən Əli Varsanidən hədis dinləmişdilər[1795]. Ölüm tarixi məlum deyil. IX-X əsrlərdə yaşamışdır.

Əhməd əl-Bəlazuri əsərində "əl-Varsani" nisbəli bir şəxsin Abbasi xəlifələrindən Cə'fər ibn Mənsurun (754-775) qızı Umm Cə'fər Zübeydənin[1796] (öl. 831) məvlası olduğunu qeyd etmişdir. Əsərin naşiri Dr. Abdullah Ənis ət-Təbba' "əl-Varsani" nisbəli bu şəxsin Əbü'l-Həsən Əli ibnü's-Sirri olduğunu qeyd etmişdir[1797]. Lakin təəssüf ki, naşir istinadını bildirməmişdir.

**Müəllim Əbü'l-Hüseyn Əli ibn Davud ibn Əhməd əl-Azərbaycani Varsani**

Yaşadığı dövrün tanınmış mühəddislərindən idi. İbn Əbü'd-Dünya, katib Əbu Cə'fər Muhəmməd ibnü'l-Əzhər, Abdullah ibn Hazır ər-Razi, Muhəmməd ibn İsrail əl-Cəvhəri, Muhəmməd ibn Qalib ət-Təmmam, Hamid ibn Səhl əs-Səğri, Əhməd ibn

---

[1793] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. XXXVII,s. 206-208; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. V, s. 556.
[1794] RAFİ'İ, *Tədvin*, C. II, s. 175.
[1795] YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. V, s. 556; RAFİ'İ, *Tədvin*, C. IV, s. 75.
[1796] Zübeydə bint Cə'fər 781-ci ildə əmisi oğlu, xəlifə Harun ər-Rəşidlə evlənmişdi.
[1797] Bax: BƏLAZURİ, *Fütuhü'l-Büldan*, s. 461.

Muhəmməd əl-Amiri, Əhməd ibn Nəsr Tirmizi, Əbü'l-Abbas Sərrac əs-Səqəfidən hədis dinləmiş və nəql etmişdi. Əbü'l-Hüseyn ər-Razi, Əbü'l-Fərəc İmran əl-Xəffaf, Əbü'l-Fəth Müzəffər əl-Muqri, Əbu Haşim əl-Müəddəb, Əbü'l-Qasım Əbdürrəhman Şeybani, Əbü'l-Fəth Əbdülmün'im ibn Xıdır Ğəssani ondan hədis dinləmiş və qeyd etmişdilər. Alimin ölüm tarixi h. 338-ci ildən (949) sonraya təsadüf edir. O, Dəməşq yaxınlığındakı Neyrəb kəndində yaşamış və orada vəfat etmişi[1798]. Əbü'l-Hüseyn Əli Varsaninin nəql silsiləsində yer aldığı hədislərdən bəzilərini burada qeyd etmək yerinə düşəcəkdir:

Əbu Zərr əl-Ğifari dedi (ا), Rəsulullah (ق) buyurdular ki: "Müəllim (öyrədən) xeyir tapmışdır. Alim üçün yerdəki canlılar, uçan quşlar, hətta dənizdəki balıqlar xeyir-dua edər, günahlarının əvf edilməsi üçün Allaha yalvarar"[1799].

Əbu Hüreyrə dedi (ا) Rəsulullah (ق) buyurdular ki: "Allah əcəlini altımış yaşına qədər uzatdığı şəxsin hər cür üzr və bəhanələrini aradan qaldırmışdır"[1800]. Yəni altımış yaşa qədər yaşamış bir şəxsin dini mükəlləfiyyətlərindən ötrü istər həyatda, istərsə də Allahın qarşısında: "vaxtım olmadı, bilmədim, öyrədən olmadı, öyrənə bilmədim" və.s bu qəbildən olan heç bir bəhanəsi qəbul edilməyəcəkdir.

### Qazi Əbu Bəkr Muhəmməd ibn Xuzeymə Varsani

Mühəddis və Varsan şəhərinin qazisi idi. Mühəddis Əbu Zərr Muhəmməd ibn Yusif ibn Muhəmməddin tələbəsi olmuş, ondan hədis dərsləri almışdı. Tanınmış mühəddis imam Əhməd ibn Əli ibn Lal qazi Əbu Bəkr Varsaninin tələbələrindən biri olmuş, ondan hədis dinləyərək nəql etmişdi[1801]. Qazi Əbu Bəkr Varsaninin ölüm tarixi məlum deyil. İmam Əhməd ibn Əli ibn Lal məşhur azərbaycanlı hədis hafizi Əbü'l-Qasım Həfs ibn Ömər Ərdəbilinin (öl. 950) də tələbəsi olmuş, ondan hədis dinləmişdi[1802]. Deməli qazi Əbu Bəkr Varsani hafiz Əbü'l-Qasım Ərdəbilinin müasiri olmuşdur. Beləcə onun da IX-X əsrlərdə yaşadığını söyləyə bilərik.

---

[1798] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. XLI, s. 467-469.

[1799] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. XLI, s. 469. Ləfz və məna baxımından bənzər hədislər üçün bax: TİRMİZİ, *Sünən*, İlm, hədis Nr: 2681, 2682, 2685; İBN MACƏ, *Sünən*, Müqəddimə, 239. (معلم الخير والعامل به شريكان يصلي عليهما كل شئ حتى الدواب في الأرض وطير السماء ونون البحر)

[1800] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. XLI, s. 469. Bundan başqa bax: BUXARİ, *Səhih*, Riqaq 4; TİRMİZİ, *Sünən*, Dəvət, Nr: 3545, Zöhd, Nr: 2332; İBN MACƏ, *Sünən*, Zöhd, Nr: 4236. (من أتت عليه ستون سنة فقد أعذر الله إليه في العمر)

[1801] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. IV, s.467.

[1802] Bax: ZƏHƏBİ, *Kitab Təzkərətü'l-Hüffaz*, s. 850-851.

**Əllamə Hüseyn ibn Həsən əl-Hüseyni Xalxali**

İmam Hüseynin (ع) nəslindən olan əllamə Hüseyn Xalxali sultan III Murad (1574-1595) və III Mehmedin (1595-1603) hakimiyyəti illərində Osmanlı imperatorluğunda yaşamış tanınmış müfəssir, filoloq, kəlamçı və astronom idi. Əllamə Hüseyn Xalxali Mirzə Can Şirazinin tələbəsi olmuşdu. O, müxtəlif elm sahələrinə dair ərəbcə, farsca və türkcə qələmə aldığı bir sıra əsərlərin müəllifi idi. "Haşiyə ələ Şərhü'l-Əqaidü'l-Əzudiyyə"[1803], "Şərhü'd-Dairətü'l-Hindiyyə"[1804], "Haşiyə ələ Ənvarü't-Tənzil"[1805], "Miftah fi Həllü'l-Məsabih", "Risalə fi'l-Məbdəi'l-Əvvəl və Sifatihi", "Şərhü'l-Kafiyyə li İbnü'l-Hacib", "Risalə fi Təhqiqi-Vəqti'z-Zəval", "Haşiyə ələ Risalətü İsbati'l-Vacib", "Haşiyə ələ Şərhi'd-Dəvvani li-Təhzibü'l-Məntiq"[1806] Hüseyn Xalxalinin əsərlərindən bəziləridir. Alim h. 1014-cü ildə (1605) vəfat etmişdir[1807]. Türkiyənin əlyazma əsər kitabxanalarında əllamə Hüseyn Xalxalinin əsərlərinin yüzlərlə nüsxəsi mövcuddur.

**Əbu İshaq İbrahim ibn Xosrovşah ibn Hüseyn ibn Ömər Xalxali**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. Xalxal şəhərində dünyaya gəlmiş və Azərbaycandakı mədrəsələrdə təhsil almışdı. Daha sonra Misirə getmiş və burada yaşamışdı. H. 646-cı ildə (1248), yəni Əyyubilərin Misirdəki hakimiyyətinin son illərində Bilbeys[1808] şəhəri qaziliyinə təyin olunmuşdu. Qazilik vəzifəsinin icrası ilə yanaşı hədis tədrisi ilə də məşğul olmuşdu. Misirdə yaşadığı dövrdə şafi'i fiqhi

---

1803 Bu haşiyə Əzudəddin əl-İcinin "Əqaidü'l-Əzudiyyə" adlı əsərinə Cəlaləddin Dəvvaninin yazdığı şərh üzərinə qələmə alınmışdır.

1804 Bu Sədrəddin Şirazinin əsərinə yazılmış şərhdir.

1805 Bu haşiyə qazi Nasirəddin Bəyzavinin təfsirinə yazılmış haşiyədir.

1806 "Təhzibü'l-Məntiq və'l-Kəlam" Sə'dəddin Təftazaninin (öl. 1390) kəlam elmi sahəsində qələmə aldığı əsərdir. Cəlaləddin Dəvvani (öl. 1502) bu əsərə "Şərhu Təhzibü'l-Məntiq" adı ilə bilinən şərh yazmışdır. Hüseyn Xalxali də bu şərhə haşiyə yazmışdır. Bu şərhə haşiyə yazmış digər bir azərbaycanlı alim, yuxarıda haqqında məlumat verdiyimiz, Mir Əbü'l-Fəth Ərdəbilidir.

1807 KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 1092; ZİRİKLİ, *Ə'lam*, C. II, s. 351; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. I, s. 549, 606; NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. I, s. 393. Səid Nəfisi alim barədə məlumat verərkən mühüm bir səhvə yol vermişdir. S. Nəfisi alimin adını "Əllamə Seyyid Həsən əl-Hüseyni Xalxali" olaraq qeyd etmiş, onun h. 1014-cü (1605) ildə vəfat etdiyini və yuxarıda adları qeyd olunmuş əsərlərin müəllifi olduğunu bildirmişdir. Halbuki alim haqqında məlumat verən bütün mənbələrdə, o cümlədən onun əsələrinin əlyazma nüsxələrində adı "Hüseyn ibn Həsən əl-Hüseyni Xalxali" kimi yazılmaqdadır.

1808 Bilbeys-(qədim Misirin Felbs adlanırdı), orta əsrlərdə Misirin şəmali-şərqində, Nil deltasının şərq sahilində yerləşən strateji əhəmiyyətə malik qala-şəhər idi. İndi Qahirədən 20-25 km şimali-şərqdə yerləşən kiçik şəhərdir.

sahəsində böyük mütəxəssis kimi şöhrət tapmışdı. Alim h. 16 ramazan 668-ci ildə (8 may 1270) Dəməşqdə vəfat etmişdi[1809].

**Şəmsəddin Muhəmməd ibn Müzəffər Xalxali**

Elxanilərin hakimiyyəti illərində (1256-1357) Azərbaycanın tanınmış şafi'i fəqihi, mühəddis, ədəbiyyatşünas və mütəkəllimlərindən biri idi. Xətibi ləqəbi ilə məşhur olmuş Şəmsəddin Xalxali müxtəlif elm sahələrinə aid bir sıra əsərlərin müəllifi idi. Bunlardan "Tənvirü'l-Məsabih", "Şərhu Mişkatü'l-Məsabih", "Şərhu Müntəhiyü's-Sul və'l-Əməl fi İlmü'l-Üsul", "Şərhu Miftahü'l-Ülum", "Şərhu Təlxisü'l-Miftah"ı[1810] sadalamaq olar. Alim h. 745-ci ildə (1344) Arranda vəfat etmişdi[1811]. "Şərhu Təlxisü'l-Miftah"ın nadir əlyazma nüsxələrindən biri Türkiyə Afyon Gədik Əhməd paşa İHK, "Şərhu Miftahü'l-Ülum"un nüsxələrində biri isə İstanbul Köprülü yazma əsərlər kitabxanasında saxlanılır.

**Nəsrullah ibn Muhəmməd əl-Öməri Xalxali**

Şafi'i məzhəbinə mənsub fəqih, müfəssir, mütəkəllim, əxlaq nəzəriyyəçisi, riyaziyyatçı və şair idi. Nəsrullah Xalxali Səfəvilərin təzyiq və təqibləri nəticəsində vətəni tərk etmək məcburiyyətində qalan alimlərdən biri idi. Alim Osmanlı imperatorluğu idarəsində olan Şam diyarına getmiş, Hələb şəhərində məskunlaşmışdı. Nəsrullah Xalxali Hələbdəki Əsruniyyə mədrəsəsində dərs vermişdi[1812]. Dəyərli həmkarım Bilal Dədəyev mənbələrdəki məlumatlardan Nəsrullah Xalxalinin, yuxarıda haqqında məlumat verdiyimiz, Şəmsəddin Muhəmməd Xalxalinin oğlu olduğu qənaətini hasil etmişdir[1813]. Şəmsəddin Muhəmməd Xalxali h. 745-ci ildə (1344), Nəsrullah Xalxali isə h. 962-ci ildə (1555) vəfat etmişdir. Ata ilə oğulun ölüm tarixləri arasında 211 il olması mümkün deyil. Yəni Şəmsəddin Muhəmməd Xalxalinin Nəsrullah Xalxalinin atası olma

---

[1809] MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. I, s. 148.

[1810] "Miftahü'l-Ülum" tanınmış ədəbiyyatşünas və mütəkəllim Yusif ibn Əbu Bəkr əs-Səkkakinin (öl. 1299) ərəb filologiyasına dair əsərdir. Xətib Şəmsəddin Muhəmməd ibn Əbdürrəhman Qəzvini (öl. 1338) bu əsərin xülasəsini yazmış və bunu "Təlxisü'l-Miftah" adlandırmışdı. Şəmsəddin Xalxali isə bu iki əsərə şərh yazmışdı.

[1811] HİMYƏRİ, *Nisbə ilə'l-Məvazi'*, C. I, s. 143; KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 612; BAĞDADLI, *İzahü'l-Məknun*, C. I, s. 165; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 726.

[1812] İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. III, s. 222; NƏFİSİ, *Tarixi-Nəzm və Nəsr*, C. II, s. 706; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. IV, s. 28.

[1813] DƏDƏYEV, *həmin məqalə*.

ehtimalı yoxdur. Lakin biz İbnü'l-İmadın qeydlərindən Nəsrullah Xalxalinin atasının da Azərbaycanın tanınmış şafi'i fəqihlərindən biri olduğunu öyrənirik[1814]. İbnü'l-İmad onun haqqında "fəqih oğlu fəqih"[1815] ifadəsini işlədir. Nəsrullah Xalxali haqqındakı bir digər yanılğı isə onun Şamaxı yaxınlığındakı Xalxal vilayətindən olmasıdır[1816]. Orta əsrlərə aid tarixi mənbələr və bioqrafiya kitablarında "Xalxali" nisbəsi ilə Şirvandakı vilayət deyil, Azərbaycanın cənubunda, Ərdəbillə Sultaniyyə və Zəncan arasında, Talış dağlarının ətəyində, Gilanla həmsərhəd ərazidə yerləşən Xalxal şəhəri nəzərdə tutulur[1817]. Xalxal şəhəri haqqında Azərbaycanın tarixi coğrafiyası barədə yazarkən ətraflı məlumat vermişik. Ömər Rza öz əsərində Nəsrullah Xalxalinin h. 946-cı ildə (1539) vəfat etdiyini qeyd etsə də [1818] mənbələrdə bunu təsdiq edən heç bir məlumata rast gəlinmir.

Nəsrullah Xalxali müxtəlif elm sahələrinə dair bir sıra əsərin müəllifi idi. Qazi Bəyzavinin təfsirinə yazılmış "Haşiyə ələ Ənvarü't-Tənzil", Cəlaləddin Dəvvaninin əsərinə yazılmış "Haşiyə ələ İsbatü'l-Vacib", "Haşiyə ələ Şərhü'l-Hidayətü'l-Hikmə"[1819], "Şərhü'l-Cədidətü'l-Cəlaliyyə"[1820], "Talibətü'r-Rayihə min Tələbi'l-Fatihə", "Tuhfətü'l-Əcaib və Turfətü'l-Qəraib", "Cami'ü'l-Kəbir fi Sən'ətü'l-Mənzum", "Məcmuətü'l-Hesab" Nəsrullah Xalxalinin qələmindən çıxmış əsərlərdir[1821].

Ömər Rza, Katib Çələbiyə istinad edərək, "Rəsail İbnü'l-Əsir" adlı əsəri də Nəsrullah Xalxaliyə aid etmişdir[1822]. Halbuki Katib Çələbi bu əsər haqqında məlumat verərkən "bu

---

1814 İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. VIII, s. 195.

1815 [الفقيه ابن الفقيه]

1816 DƏDƏYEV, *həmin məqalə*.

1817 YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. III, s. 145. [ مدينة وكورة في طرف أذربيجان متاخمة لجيلان]; HİMYƏRİ, *Nisbə ilə'l-Məvazi'*, C. I, s. 279. [الخلخال، قرية من نواحي السلطانية].

1818 KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. IV, s. 28.

1819 "Hidayətü'l-Hikmə" Əsirəddin Müfəzzəl ibn Ömər Əbhərinin (öl. 1265) məntiq elminə dair əsəridir. Bu əsərə bir çox alim tərəfindən şərh yazılmışdır. Belə şərhlərdən biri də qazi Mir Hüseyn ibn Müin əl-Meybədi Yəzdiyə (öl. 1498) məxsusdur. Nəsrullah Xalxali də bu şərhə haşiyə yazmışdır.

1820 Bu şərh Cəlaləddin Dəvvaninin (öl. 1502) "Risalətü'l-İsbati'l-Vacibü'l-Cədidə" adlı əsərinə yazılmışdır. Bu əsərin zəmanəmizə iki variantı gəlib çatmışdır. Bu variantlardan biri "qədim", digəri isə "yeni" (cədid) variant hesab olunur. Birinci variantı Dəvvani gənclik illərində iki gün ərzində yazmışdır. Sonralar bu nüsxə ixtisar edilərək geniş oxucu kütləsi üçün münasib hala gətirilmişdi. Bu əsər barəsində daha ətraflı məlumat üçün bax: ŞƏRİFOV, *Əbdülqəni Əfəndi...*, s. 34.

1821 KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. II, s. 774; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. IV, s. 28.

1822 KƏHHALƏ, *yenə orada*, C. IV, s. 28.

əsərin müəllifi 637-ci ildə (1239) vəfat etmiş Ziyaəddin Nəsrullah ibn Muhəmməddir, hansı ki, İbnü'l-Əsir əl-Cəzəri kimi tanınmışdır"[1823] deyə qeyd etmişdir.

Həmkarım Bilal Dədəyev Katib Çələbinin "Məcmuətü'l-Hesab" adlı əsəri Nəsrullah Xalxaliyə aid etdiyini, lakin bunun dəqiq məlumat olmadığını və Məhəmmədəli Tərbiyətin də bu barədə tərəddüdlü olduğunu öz məqaləsində qeyd etmişdir[1824]. Məsələ burasındadır ki, "Məcmuətü'l-Hesab" həqiqətən Nəsrullah Xalxalinin zehninin məhsuludur və bu əsərin Türkiyədəki yeganə əlyazma nüsxəsi Kayseri şəhəri Raşid əfəndi əski əsərlər kitabxanasında saxlanılır. Ankara Milli kitabxanada alimin "Haşiyə ələ Şərhü'l-Hidayətü'l-Hikmə" adlı əsəri mühafizə edilir. Bu əsərin digər bir əlyazma nüsxəsi də Konya BYEK-də saxlanılır. Alimin "Talibətü'r-Rayihə min Tələbi'l-Fatihə" adlı əsərinin əlyazma nüsxəsi Türkiyə Afyon Gədik Əhməd paşa İHK-ndədir. Onun "Şərhü'l-Cədidətü'l-Cəlaliyyə" adlı əsərinin yeganə nüsxəsi İstanbul Nuriosmaniyyə əlyazmalar kitabxanasında mühafizə edilir.

### Əbu Bəkr Muhəmməd ibn Yəhya ibn Müslim Xoyi

Hədis ravisi idi. Cə'fər ibn İbrahim əl-Müəzzindən hədis dinləmiş və nəql etmişdi. Əbü'l-Qasım Abdullah ibn Muhəmməd ər-Razi ondan hədis dinləmişdi[1825]. Ölüm tarixi məlum deyil. Təqribən X-XI əsrlərdə yaşamışdır.

### Əbu Muaz Əbdan Mütətəbbib Xoyi

Hədis ravisi və həkim idi. əl-Cahizin[1826] tələbəsi olmuş, tibbi biliklərlə yanaşı ondan hədis dinləmiş və nəql etmişdi. Əbu Əli əl-Qali, Əbu Yaqub Yusif ibn Tahir əl-Xoyi

---

1823 KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. II, s. 1216.[... لضياء الدين نصر الله بن محمد بن محمد المعروف بابن الأثير الجزري ...]

1824 DƏDƏYEV, *həmin məqalə*; TƏRBİYƏT, *həmin əsər*, s. 56; KATİB ÇƏLƏBİ, Kəşfü'z-Zünun, C. II, s.

1825 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 163.

1826 Əbu Osman Əmr ibn Bəhr ibn Məhbub əl-Cahiz əl-Kinani əl-Bəsri (777-869). Əl-Kinani nəsbəsi daşısa da o, Kinanə qəbiləsinə mənsub saf ərəb deyildi. Babası Məhbub əslən şərqi Afrikalı kölə idi və Kinanə qəbiləsi üçün dəvə çobanlığı edirdi. Sonra köləlikdən azad edilmiş və ərəbləşmişdi. Cahiz qısa boylu, zəif bədənli, qalın dodaqlı, qara dərili afro-ərəb idi. Cahiz ləqəbi ona sağ gözü partlaq olduğu üçün verilmişdi. Cahiz yaşadığı dövrün ən məşhur alimlərindən idi. Zoologiya və antropologiya sahələrində ixtisaslaşsa da Cahiz tibb, ərəb dili və ədəbiyyatı, ilahiyyat, siyasət, tarix, dinlər və məzhəblər tarixi, fəlsəfə, əxlaq, iqtisadiyyat və ticarət kimi sahələrdə 360-dan çox kitab və məqalənin müəllifi idi. O, zoologiya sahəsində qələmə aldığı əsərlərdə təmsil üsulundan istifadə edir, hər bir hevanın xüsusiyyətlərini onun öz dili ilə anlatırdı. Cahiz ilk dəfə ətraf mühitin, səslərin, eləcə də musiqinin insanların psixologiyasına və heyvanların davranışlarına təsirini müəyyən etmiş və bu haqda risalə yazmışdı. İlk dəfə o, insanın tənəffüs sistemini dəqiqliklə izah etmişdi. Zahiri görkəminə rəğmən Cahiz hazırcavablığı və zarafatcıllığı ilə

ondan hədis dinləmiş və nəql etmişdilər[1827]. Ölüm tarixi məlum deyil. X əsrlərdə yaşamışdır.

**Əbu Yaqub Yusif ibn Tahir ibn Yusif ibn Həsən Xoyi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. O, həmçinin ədib və şair idi, gözəl şe'rlər yazmışdı. Xorasanın Tus şəhərində yaşamış, buradakı Nəvqan qəsəbəsində qazi müavini olmuşdu. Fəzilətli və xoşrəftar insan idi. O, fəqhə dair bir sıra əsərlərin müəllifi idi. Bunlardan "Fəraidü'l-Xəraid fi'l-Əmsilə", "Şərhu Suqtü'z-Zənd li'l-Mə'ərri", "Tənzihü'l-Qur'an"ın adlarını sadalamaq olar. Təvəllüd və vəfat tarixləri məlum deyil. Lakin əsərlərindəki qeydlərindən onun h. 532-ci ildə (1138) həyatda olduğu bilinir[1828]. Buna istinadən alimin XI-XII əsrlərdə yaşadığını təxmin etmək olar. "Fəraidü'l-Xəraid fi'l-Əmsilə"nin əlyazma nüsxələrindən biri İstanbul Köprülü kitabxanasında mövcuddur.

**Qazi Əbu Nueym Muhəmməd ibn Übeydullah Xoyi**

Şafi'i məzhəbinə mənsub mühəddis və fəqih idi. Xoy şəhərinin qazisi olmuş, həmçinin Xoyda hədis dərsləri də vermişdi. Bağdadda təhsil almış, burada Əbu Muhəmməd əs-Seyrəfini və xətib Əbu Muhəmməd Abdullah ibn Muhəmməd ibn Hezarmərddən hədis dinləmişdi[1829]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Əbü'l-Vəfa Budeyl ibn Əbi'l-Qasım ibn Budeyl əl-İmli Xoyi**

---

insanların sevimlisi olmuşdu. Onun hekayələri ərəblər arasında lətifəyə çevrilmişdi. Onun yaşadığı dövrdə mö'təzilə məzhəbi hakim mövqedə idi. Buna görə də Cahiz Bağdadın elmi dairələrinə daxil ola bilmək üçün mö'təzilə məzhəbini qəbul etmişdi. Bundan başqa onun yaşadığı dövrdə dəqiq elmlərlə məşğul olan alimlərin böyük əksəriyyəti mö'təzili idi. O, Abbasilərin vəziri İbnü'z-Zəyyatla dost idi və əsərlərinin böyük əksəriyyətini ona ithaf edərək Bağdadda rifah içində yaşamışdı. İbnü'z-Zeyyatın ölümündən sonra Cahiz həbs edilərək bir müddət zindanda qalmiş, lakin sonra azad edilmişdi. Cahiz ömrünün axırlarına doğru iflic olmuş, xəstəliyi səbəbiylə Bağdaddan doğma şəhəri Bəsrəyə köçmüş və 92 yaşında orada vəfat etmişdi.

[1827] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 163; YAQUT əl-HƏMƏVİ, *Mu'cəmü'l-Büldan*, C. III, s. 182-183.

[1828] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. IV, s. 165; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 164. Səm'ani əsərində alimin adını "Yusif ibn Muhəmməd" olaraq qeyd etmişdir.

[1829] ZƏHƏBİ, *Müştəbih*, s. . 130; BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s.179.

Səm’ani onun “əl-İmli” nisbəsini maraqlı bir xüsusla izah edərək xoyluların ləhcəsindəki “imlə” sözünün ərəbcədəki mənasının “pəltəkləyən, kəkələyən”[1830] olduğunu bildirir. Müəllif, Əbü’l-Vəfa Budeyl Xoyinin bu ləqəblə tanınmasının səbəbinin onun babasının pəltək, kəkəmə olduğunu qeyd etmişdir. Əbü’l-Vəfa Budeyl Xoyi şafi’i məzhəbinə mənsub fəqih və mühəddis idi. Qazi Əbü’l-Fəth Nasir ibn Əhməd ibn Bəkran Xoyinin tələbəsi olmuş, ondan hədis dinləmişdi. Tanınmış tarixçi, mühəddis və bioqraf hafiz Əbü’l-Qasım Əli ibn Həsən ibn Hibətullah İbn Əsakir Dəməşqi (1105-1175) ondan hədis dinləmiş və nəql etmişdi. Alimin ölüm tarixi h. 530-cu (1136-1146) illərə təsadüf edir[1831].

**Əbu’r-Ruh Fərəc ibn Übeydullah ibn Əbi Nueym Xələf ibn Həsən Xoyi**

Şafi’i məzhəbinə mənsub fəqih idi. Bağdadda təhsil almış, şeyx Əbu İshaq Şirazi və Əbu Sə’d əl-Mütəvəllinin tələbəsi olmuşdu. Təhsilini başa vurduqdan sonra Xoya qayıtmış və burada təsis etdiyi mədrəsənin müdərrisi olmuşdu. Qısa müddətdə bu mədrəsəyə çox sayıda tələbə cəlb olunmuşdu. Yaşadığı dövrdə Azərbaycanın ən tanınmış fəqihlərindən biri olmuşdu. Alim h. 521-ci ildə (1127) doğma şəhəri Xoyda vəfat etmişdi[1832].

**Vaiz Əbu Sə’d Əhməd ibn Hacı ibn Əmmar Xoyi**

Şafi’i məzhəbinə mənsub fəqih və mühəddis idi. Əbü’l-Qasım ibn Əbu İshaq əs-Səbi’nin tələbəsi olmuş ondan hədis dinləmişdi. Əbü’l-Qasım ibnü’l-Əsakir Azərbaycan, İran və Xorasana səyahəti vaxtı Xoyda onunla görüşüb dərslərində iştirak etmişdi[1833]. Ölüm tarixi məlum deyil. XII əsrdə yaşamışdır.

---

[1830] ( وبلغة أهل خوي يقال للتمتام أمله). Ərəbcədəki [تَمْتَمَة] (təmtəmə) sözünün azərbaycan türkcəsindəki mənaları (donquldanma, kəkələmə, pəltəkləmə, burun altında danışma)dir. İngiliscdə [تَمْتَمَة]- to mutter, to stutter (bax: VerbAce-Arabic-English-Arabic Electronic Dictionary), ruscada [تَمْتَمَة]- бормотание, ворчание (bax: BARANOV X. K, *Arabsko-Russkiy Slovar*, s. 105, Moskva 2007). Beləcə [تَمْتَمَة] bab dəyişərək [تمتام]-(pəltək, kəkəmə) mənasını ifadə edəcəkdir. Cəlaləddin Süyuti də “əl-İmli” nisbəsi ilə bağlı Səm’ani ilə eyni fikirləri bəyan etmişdir. Bax: *Lübbü’l-Lübab*, s. 15.

[1831] SƏM’ANİ, *Kitabü’l-Ənsab*, C. I, s. 141; ZƏHƏBİ, *Müştəbih*, s. 27; BAĞDADİ, *Təkmilətü’l-İkmal*, C. I, s.251.

[1832] ƏSNƏVİ, *Təbəqatu’ş-Şafi’iyyə*, C. I, s. 241; SÜBKİ, *Təbəqatü’ş-Şafi’iyyə əl-Kübra*, C. VII, s. 145.

[1833] BAĞDADİ, *Təkmilətü’l-İkmal*, C. II, s. 180.

**Əbu Abdullah Muhəmməd ibn Mehran ibn Əhməd Xoyi**

Yaşadığı dövrün tanınmış mühəddislərindən biri idi. Şeyxülislam Əbu Tahir Muhəmməd ibn Əbdürrəhman ibnü'l-Abbas əl-Muxlis və Əbü'l-Həsən Əhməd ibn Muhəmməd ibn İmran Musa, Əbu Bəkr Muhəmməd ibn Ömər ibn Əli ibn Xələf ibn Zənbur kimi öz dövrünün tanınmış mühəddislərindən hədis dərsləri almışdı. Əbu Abdullah Muhəmməd Xoyi Qəzvinə gedərək burada tədrislə məşğul olmuş, hədis dərsləri vermişdi. Onun tələbələri arasından mühəddis Hibətullah ibn Zazan kimi alimlər yetişmişdi. Əbu Abdullah Muhəmməd Xoyinin ölüm tarixi məlum deyil. Əbdülkərim Rafi'i onun h. 442-ci (1050) ildə Qəzvində hədis dərsləri verdiyini qeyd etmişdi. Buna istinadən alimin XI əsrdə yaşadığını deyə bilərik. Əbdülkərim Rafi'i həmçinin öz əsərində Əbu Abdullah Muhəmməd Xoyinin Əbu Bəkr Muhəmməd ibn Zənburdan dinləyib nəql etdiyi aşağıdakı hədisi qeyd etmişdi: Abdullah ibn Ömər (ا) dedi: Allah Rəsulu (ق) buyurdular ki: "Əbu Bəkr (ا) anadan olduğu gecə Allah Ədn cənnətinə dedi: izzətim və cəlalım haqqı üçün, sənə daxil olacaqların arasında mənim üçün bu doğulandan daha sevimli olanı olmayacaq"[1834].

**Əbü'l-Məali Muhəmməd ibn Hüseyn ibn Musa Xoyi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Bağdadda Nizamiyyə mədrəsəsində təhsil almış, Tacəddin Urməvi, Əbü'l-Abbas Əhməd ibnü't-Tilayə Bağdadi (1070-1153) kimi alimlərin tələbəsi olmuşdur. Əbü'l-Məali Xoyi dərin elmi biliyi ilə yanaşı fəziləti və müdrikliyi ilə də tanınmışdı. Bağdadi onun bacarıqlı pedaqoq olduğunu, həmçinin gözəl səslə Qur'an oxuduğunu qeyd etmişdi[1835]. Ölüm tarixi məlum deyil. XII əsrdə yaşamışdır.

**Muhəmməd ibn Qütbəddin Xoyi**

Qaraqoyunluların hakimiyyəti dövründə yaşamış hənəfi məzhəbinə mənsub fəqih və mütəkəllim idi. Həyatı haqqında ətraflı məlumat yoxdur. Muhəmməd Xoyi "Nüsus fi

---

[1834] RAFİ'İ, *Tədvin*, C. II, s. 93-94. [ثنا سفيان بن عيينة عن الزهري عن نافع عن ابن عمر قال قال رسول الله ﷺ: الليلة التي ولد فيها أبو بكر رضي الله عنه نظر الله تعالى إلى جنة عدن، فقال وعزتي وجلالي لا أدخلك إلا من أحمد هذا المولود]

[1835] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 181.

Təhqiqü't-Təvri'l-Məxsus" adlı əsərini h. 856-cı ildə (1452) yazıb başa çatdırmışdı. Beləcə onun XV əsrdə yaşadığın söyləmək olar[1836].

**Muhəmməd ibn Əbdülhəyy ibn Süveyd Xoyi**

Hədis ravisi idi. İmran ibn Musa Cündişapuridən hədis dinləmiş və nəql etmişdi. Əbü'l-Fəzl əş-Şeybani Kufi (öl. 997) ondan hədis dinləmişdi[1837]. Ölüm tarixi məlum deyil. X əsrdə yaşamışdır.

**Qazi Şihabəddin Muhəmməd ibn Mahmud Xoyi**

Şafi'i məzhəbinə mənsub fəqih idi. İbn Yasir əl-Cəyyanidən hədis dinləmişdi. Zəhəbi onun h. 580-ci ildə (1184) oğulları İmadəddin Muhəmməd və Zeynəddin Əliyə hədis və fiqh dərsləri verdiyini qeyd etmişdir[1838]. Ölüm tarixi məlum deyil. XII-XIII əsrlərdə yaşamışdır.

**Pir Muhəmməd ibn Qütbəddin ibn Həsən Xoyi**

Ağqoyunlular dövründə Azərbaycanda yaşamış hənəfi məzhəbinə mənsub fəqih və təsəvvüf şeyxi idi. Pir Muhəmməd Xoyi "Zübdətü't-Təhqiq və Nüzhətü't-Təvfiq" adlı əsərin müəllifi idi. Şeyx Sədrəddin Qonyəvi (öl. 1275) atalığı Muhyəddin ibnü'l-Ərəbinin (öl. 1240) "Füsusü'l-Hikəm" adlı əsərini ixtisar edərək bunu "Nüsus fi Təhqiqi'l-Məxsus" adlandırmışdı. Pir Muhəmməd Xoyi bu ixtisara şərh yazmış və bunu "Zübdətü't-Təhqiq və Nüzhətü't-Təvfiq" adlandırmışdı. Pir Muhəmməd Xoyinin bu əsərinin nüsxələrindən biri Paris milli kitabxanasında saxlanılır[1839]. Türkiyədə əsərin iki əlyazma nüsxəsi mövcuddur. Bunlardan biri Ankara milli kitabxanada, digəri isə İstanbul Millət kitabxanasında saxlanılır. Alimin ölüm tarixi məlum deyil. H. 856-cı ildə (1452) həyatda olduğu bilinir.

---

1836 KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. III, s. 603.
1837 SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 163-164.
1838 ZƏHƏBİ, *Müştəbih*, s. 130.
1839 DE SLANE, *həmin əsər*, s. 264.

**Muhəmməd ibn Əbdürrəhim Xoyi**

Hədis ravisi idi. Muhəmməd ibn Abdullah Nişapuridən hədis dinləmişdi. Muhəmməd ibn Əbdürrəhman Xoyi siqa mühəddislərdən Əbü'l-Abbas Muhəmməd ibn Həsən ibn Quteybə Əsqəlaninin (öl. 922) hədis məclislərində iştirak edir və hədis nəql edirdi. Əbu Bəkr Muhəmməd İsfəhani bu məcləslərdə iştirak etmiş və onun nəql etdiyi hədislərdən bəzilərini öz əsərinə daxil etmişdi[1840]. Ölüm tarixi məlum deyil. IX-X əsrlərdə yaşamışdır.

**Qaziü'l-quzat Şəmsəddin Əbu'l-Abbas Əhməd ibn Xəlil ibn Səadə ibn Cə'fər ibn İsa əş-Şafi'i əl-Bərməki Xoyi**

h. 583-cü ilin şəvval ayında (dekabr 1187) anadan olmuşdu. Xorasana getmiş, burada[1841] Fəxrəddin Razinin tələbəsi olmuş, onun yanında kəlam və üsul elmlərini öyrənmişdi. O, Qütbəddin əl-Misri və Əlaəddin ət-Tavus kimi alimlərdən cədəl, fiqh və hədis elmlərini öyrənmişdi. Nişapura gedərək burada dövrün tanınmış mühəddislərindən biri olan Əbü'l-Həsən Muid ibn Muhəmməd ət-Tusidən hədis dərsləri almışdı[1842]. Dəməşqə getmiş, burada Əbu Abdullah Hüseyn ibnü'z-Zübeydi və Təqiyəddin Əbu Əmr Osman ibnü's-Səlah (öl. 1245) kimi mühəddislərdən hədis dinləmiş və hədis elmlərinə dair bilikləri öyrənmişdi. Tacəddin ibn Əbu Cə'fər, Əbu Əmr ibnü'l-Hacib, Camal Muhəmməd ibnü's-Sabuni onun tələbəsi olmuş və ondan müxtəlif elmə sahələrinə dair bilikləri öyrənmişdiləri. Onun tələbələrindən biri də oğlu, baş qazi Şihabəddin Muhəmməd Xoyi olmuşdur[1843].

Şəmsəddin Əhməd Xoyi Qur'an hafizi, fiqh, fiqh üsulu, kəlam, tibb, ərəb dili və ədəbiyyatı, cədəl kimi elm sahələrində tanınmış alim idi. O, həm də şair idi. Şəmsəddin Əhməd Xoyi himmət sahibi, mömin insan idi. O, çox namaz qılar və çox oruc tutardı. Əminiyyə[1844], Adiliyyə[1845] və Qəzzaliyyə mədrəsələrinin müdərrisi idi. Şam vilayətinin

---

[1840] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 164; ƏBU BƏKR İSFƏHANİ, *Mu'cəmü'ş-Şüyux*, s. 99-100; BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 179.

[1841] Ehtimal ki, Şəmsəddin Əhməd Xoyi Əfqanıstanın Heart şəhərində təhsil almışdı. Çünki Fəxrəddin Razi bu şəhərdə yaşayır və tədrislə məşğul olurdu.

[1842] İBNü's-SABUNİ, *Təkmilətü'l-İkmal*, s. 40.

[1843] SÜBKİ, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, C. VIII, s. 7-8; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. II, s. 19.

[1844] NUEYMİ, *Daris fi Tarixi'l-Mədaris*, C. I, s. 140.

qaziü'l-quzatlığına təyin olunmuşdu. İbn Nəzif əl-Həməvi onun bu vəzifəyə h. 623-cü ildə (1226) təyin olunduğunu qeyd etmişdir[1846]. Alim kəlam elmi sahəsində "Kitab fi'l-Üsul", ərəb filologiyasına dair "Kitab fi'n-Nəhv", ərəb ədəbiyyatına dair "Kitab fi'l-Əruz", fəlsəfəyə dair "Rumuz-u Hökmiyyə" adlı əsərlərin müəllifi idi. Qazi Şəmsəddin Əhməd Xoyi ustadı Fəxrəddin Razinin (öl. 1209) Təfsiri-Kəbir adı ilə tanınan "Miftahü'l-Qeyb" adlı Qur'an təfsirinə şərh və əlavələr yazmışdır. Qazi Şəmsəddin Xoyinin bu əsərinin bir nüsxəsi Paris milli kitabxanasında saxlanılır[1847]. Qazi Şəmsəddin Əhməd Xoyi Suriyada qazilik vəzifəsini icra etmiş həmkarlarının bioqrafiyasına dair "Rəvzu'l-Bəssam fi mən Vəlyə Qəzaü'ş-Şam" adlı bir əsər də qələmə almışdı[1848]. Onun bioqrafiyaya dair qələmə aldığı digər bir əsəri isə "Əxbarü'l-Əxyar bima Vəcədu ələ'l-Qübur minə'l-Əş'ar" adlanır[1849]. Alim h. 7 şaban 637-ci ildə (3 mart 1240) Dəməşqdə vəfat etmiş və Qasiyyun dağındakı Səfih qəbristanında dəfn edilmişdi[1850].

**Əbu İshaq İbrahim ibn Safi əl-Müqri Xoyi**

Mühəddis idi. Əbu Hatim Muhəmməd ibn İbrahim və digər mühəddislərdən hədis dinləmişdi. Xoydakı mədrəsələrdən birində hədis dərsləri vermişdi. Xətib Əbu Səid Əbdürrəhman Xoyi, Əbü'l-Qasım ibn Əsakir kimi tanınmış alimlər onun tələbələri arasından yetişmişdilər[1851].

**Xətib Əbu Səid Əbdürrəhman ibn İsa ibn Muhəmməd Xoyi**

Mühəddis idi. Əbu İshaq İbrahim ibn Safi əl-Müqri Xoyinin tələbəsi olmuş, ondan hədis dinləmişdi. Xoyda yaşamış, burada hədis dərsləri vermişdi. Tarixçi alim Əbü'l-Qasım

---

[1845] İBNü's-SABUNİ, *yenə orada.*
[1846] Əbü'l-Fəzl Muhəmməd İBN NƏZİF əl-Həməvi, *Təlxisü'l-Kəşf və'l-Bəyan fi Həvadisü'z-Zaman*, (Hzr. Ə. Dəvdəv), s. 122, Dəməşq 1981.
[1847] DE SLANE, *həmin əsər*, s. 141-142.
[1848] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 1129. Şəmsəddin Əhməd Xoyidən üç əsr sonra Şəmsəddin Muhəmməd ibn Əli İbn Tolon Diməşqi (öl. 1546) eyni mövzuya dair əsər qələmə almış və adını da bənzədərək "Səğru'l-Bəssam fi zikri mən vəlyə Qəzaü'ş-Şam" qoymuşdu.
[1849] BAĞDADLI, *İzahü'l-Məknun*, C. I, s. 20.
[1850] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 240-241; SÜBKİ, *yenə orada*; İBN QAZİ ŞUHBƏ, *yenə orada*; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. V, s. 670; İBNü'l-ADİM, *Buğyətü't-Tələb*, C. II, s. 121; MƏMMƏDOV, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, s. 45.
[1851] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 180.

Əli ibn Əsakir 1130-cu illərdə Xoyda olarkən Əbu Səid Xoyinin dərslərini dinləmişdi[1852]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Qazi Əbü'l-Qasım Nasir ibn Əhməd ibn Bəkran Xoyi**

Fəqih, mühəddis, filoloq, ədib və şair olan Əbü'l-Qasım Nasir Xoyi h. 466-cı ilin məhərrəm ayında (sentyabr 1073) anadan olmuşdu. Ərəb filologiyasını Əbu Tahir Şirazidən öyrənmiş, şeyxülislam Əbu İshaq İbrahim Şirazinin yanında isə şafi'i fiqhi oxumuşdu. Əbü'l-Qasım Əli ibn Əhməd ibnü's-Sirri, İbnü'n-Nüqəvvər əl-Asimi adı ilə tanımış Əbü'l-Hüseyn Asim ibn Hüseyn, Əbu Zeyd Nizamülmülk kimi mühəddislərdən hədis dinləmişdi. Yaşadığı dövrdə Azərbaycanın, mübahisəsiz, ən böyük ədəbiyyatçısı idi. O, həm də istedadlı şair idi və özünün divanı var idi. Atasından sonra Xoy şəhəri qaziliyinə təyin olunmuşdu. Əbü'l-Qasım Nasir Xoyi, İbn Cinninin "əl-Lüma'"[1853] adlı əsərinə şərh yazmışdı[1854]. Alim h. 509-cu ilin rəbiəlaxir ayında (sentyabr 1115) vəfat etmişdi[1855]. Səm'ani Əbü'l-Vəfa Budeyl əl-İmli Xoyi (öl. 1136-1146 illər arasında) haqqında məlumat verərkən onun qazi Əbü'l-Fəth Nasir ibn Əhməd ibn Bəkran Xoyi adlı bir alimin tələbəsi olduğunu və ondan hədis dinlədiyini qeyd etmişdir[1856]. Göründüyü kimi bu iki şəxsin sadəcə "Əbü'l-Qasım" və "Əbü'l-Fəth" olaraq künyələrində fərq var. Səm'ani və Əbu Tahir əs-Süləfi İsfəhani baba adını "Bəkran", Yaqut əl-Həməvi isə burada haqqında daşıdığımız şəxsin babasını adını "Bəkr" olaraq qeyd etmişdir. Yaşadıqları dövrlərin də bir-birinə müvafiq olduğunu nəzərə alaraq bu ikisinin eyni şəxs olduğunu düşünmək olar.

**Şeyx Nəcibəddin Əbu Abdullah Muhəmməd ibn Məzyəd ibn Mübəşşir Xoyi**

---

[1852] İBN ƏSAKİR, *Mu'cəmü'ş-Şüyux*, s. 140-141.

[1853] Əbü'l-Fəth Osman ibn Cinni əl-Məvsilinin (934-1002) "Kitabü'l-Lüma' fi'l-Lüğəti'l-Ərəbiyyə" (Ərəb Dilinin İşıq Saçan Kitabı) adlı ərəb dilinin qrammatikasına və morfologiyasına aid əsəri.

[1854] ƏBU TAHİR İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, s. 396.

[1855] YAQUT əl-HƏMƏVİ, *İrşadü'l-Ərib*, s. 1651. Əbu Tahir İsfəhani onun h. 507-ci ilin rəbiəlaxir ayında (sentyabr 1113) Xorasanda vəfat etdiyini qeyd etmişdir. Bax: *Mu'cəmü's-Səfər*, s. 396.

[1856] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. I, s. 141. Bax: səh. ???.

Mühəddis idi. H. 593-cü ildə (1197) Xoyda anadan olmuşdu. Vətənində təhsilini başa vurduqdan sonra Misirə getmiş və burada hədis tədris etmişdi. H. 12 şəvval 674-cü ildə (30 mart 1276) Qahirədə vəfat etmişdi[1857].

**Qaziü'l-quzat Şihabəddin Əbu Abdullah Muhəmməd ibn Əhməd ibn Xəlil ibn Səadə ibn Cə'fər Xoyi**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. Yuxarıda haqqında bəhs etdiyimiz qaziü'l-quzat Şəmsəddin Əhməd Xoyinin oğlu idi. H. 14 şəvval 626-cı ildə[1858] (4 sentyabr 1229) Dəməşqin Adiliyyə səmtində anadan olmuş və bu şəhərdə böyümüşdü. Alim ailəsində böyüyən Şihabəddin Xoyi hələ kiçik yaşlarından elmi biliklərə yiyələnməyə başlamışdı. O, 11 yaşında ikən atasını itirmişdi. Atasının vəfatından sonra Adiliyyə mədrəsəsində qalmış və tələbəliyə başlamışdı. Tezliklə o, öz yaşıdlarından daha istedadlı və çalışqan olduğunu göstərmişdi. Şihabəddin Xoyi fenomenal yaddaşa sahib idi. O, istənilən mövzuya dair bilikləri asanlıqla əzbərləyb yaddaşında saxlaya bilirdi. Üstün bilik, bacarıq və istedı ilə tanınmış və hələ çox gənc yaşlarında Dimağiyyə mədrəsəsində dərs verməyə başlamışdı. Daha sonra Adiliyyə və Qəzzaliyyə mədrəsələrində də dərs vermişdi. İbn Kəsir, Şihabəddin Muhəmməd Xoyinin hədisi, hədis elmlərini və hədis alimlərini sevdiyini qeyd etmişdir. O, Misir, Şam vilayəti, Bağdad, Xorasan və İsfahana səyahət edərək buradakı ən tanınmış mühəddislərdən dərs almışdı. Onun müəllimi olmuş məşhur mühəddislərdən İbnü'l-Lətiy, İbnü'l-Müqəyyir, Səxavi, Əbu Abdullah Hüseyn ibnü'z-Zübeydi, İbü's-Səlahın adını çəkmək olar. Bundan başqa o, Xorasanda Fəxrəddin Razinin yetişdirdiyi alimlərdən və elmi irsinin davamçılarından olan Qütbəddin əl-Misri və əllamə ət-Tavusidən məntiq və kəlam dərsləri almışdı[1859]. Mənbələr onun hədis dinlədiyi ravi və mühəddislərin sayının 250-300 arasında olduğunu qeyd edirlər. Alim fiqh, fiqh üsulu, hədis, təfsir, pedaqoqika, riyaziyyat, astronomiya, fəraiz, filologiya, poeziya kimi müxtəlif elm sahələrinə aid 20-dən çox kitabın və bir çox risalənin müəllifi idi. Bunlardan İbnü's-

[1857] MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. VII, s. 231.
[1858] İbn Həcər Əsqəlani onun h. 626-cı ilin rəcəb ayında (iyun 1229) anadan olduğunu qeyd etmişdir. Bax: *Rəfi'ü'l-İsr ən Quzat Misir*, s. 144, London 1908.
[1859] İBN HƏCƏR, *Rəfi'ü'l-İsr*, s. 144.

Səlahın "Ülumü'l-Hədis" adlı əsərinə nəzm formasında şərh, "əl-Fəsih", "Şərhü'l-Füsul", "əl-Müləxxəs", "Əqalimü't-Təalim" və yenə nəzm formasında qələmə alınmış, ərəb filologiyasına dair, "Kifayətü'l-Mütəhəffiz fi'l-Lüğə" adlı əsərlərin adını çəkmək olar. Pedaqoqikaya aid "Əqalimü't-Təalim" adlı əsərində alim təfsir, hədis, fiqh, tibb, həndəsə və riyaziyyat kimi elmlərin tədris metodları haqqında geniş məlumat vermişdir[1860]. "Əqalimü't-Təalim"in nadir nüsxələrindən biri Paris milli kitabxanasında mühafizə edilir[1861]. Şihabəddin Muhəmməd Xoyi bir müddət Qüds qazisi olmuş, h. 657-ci ildə (1259) bu vəzifəni icra etmək üçün Dəməşqdən Qüdsə getmişdi[1862]. Hülagü xanın Suriyanı işğalı vaxtı (1260) isə Şam diyarını tərk edərək Misirə getmişdi. Bir müddət sonra Qahirə qaziliyinə təyin olunmuşdu. 5 il bu vəzifəni icra etdikdən sonra qaziü'l-quzat, yəni bütün Misirin baş qazisi olmuşdu. Dəməşq qazisi Bəhaəddin ibnü'z-Zəkinin ölümündən sonra bu şəhərin qaziliyi vəzifəsi də ona tapşırılmışdı. Onun yetişdirdiyi tələbələr arasından məşhur alimlər çıxmışdır. Bunlardan hafiz Yusif ibn Əbdürrəhman əl-Mizzi , Elməddin Qasım əl-Birzali, ən-Nəblusi, əl-Xotəni, Cəmaləddin ibnü's-Sabuni, Əlaəddin Məqdisinin adını çəkmək olar. Alim h. 25 ramazan 693-cü ildə (19 avqust 1294) Dəməşqdə vəfat etmişdi. Əl-Müzəffəri məscidində qılınan cənazə namazından sonra atasının qəbrinin yanıda dəfn edilmişdi[1863].

**Əbü'l-Həsən Əli ibn Bəxtiyar ibn Əli Xoyi**

Ədəbiyyatçı və mühəddis idi. Şeyx Əbu Sə'd Muhəmməd ibn Hüseyn əl-Bəkri Nişapurinin tələbəsi olmuşdu. Xoy şəhərinin mərkəzi camesində hədis, tarix və ədəbiyyat dərsləri vermişdi. Tarixçi alim Əbü'l-Qasım Əli ibn Əsakir Xoyda olarkən Əbü'l-Həsən Əli Xoyinin dərslərində iştirak etmişdi[1864]. Ölüm tarixi məlum deyil. XI-XII əsrlərdə yaşamışdır.

**Şeyx Nəsirəddin Əbü'l-Həqayiq Mahmud ibn Əhməd Xoyi**

[1860] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 211.
[1861] DE SLANE, *həmin əsər*, s. 406.
[1862] ANONİM, *Mu'cəmü'ş-Şüyux minə'r-Rical və'n-Nisa*, v. 10a-11b; ƏYNİ, *İqdü'l-Cüman*, s. 55.
[1863] İBN ŞAKİR, *Fəvatü'l-Vəfayat*, C. II, s. 138-139; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 240-241; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIV, s.19; İBN HƏCƏR, *Rəfi'ü'l-İsr*, s. 144; MƏMMƏDOV, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, s. 45.
[1864] İBN ƏSAKİR, *Mu'cəmü'ş-Şüyux*, s. 181.

Şeyx Nəsirəddin Mahmud Xoyi fütuvvət təşkilatının Anadoludakı ən məşhur təmsilçisi, həmçinin Əxi təşkilatının qurucusu və lideri idi. Əxi Əvrən adı ilə tanınan bu şəxs Əxi təşkilatının, bununla yanaşı fütuvvət hərəkatının Anadoluda möhkəmlənməsi və yayılması üçün böyük işlər görmüşdü. O, hətta bir müddət Anadolu Səlcuqlu sultanlarından birinin vəziri vəzifəsini də icra etmişdi. Əxi Əvrən, digər adı ilə şeyx Nəsirəddin Mahmud Xoyi haqqında aparılmış ən geniş tədqiqat möhtərəm ustadım prof. Mikayıl Bayrama məxsusdur. M. Bayram uzun illər apardığı ətraflı tədqiqatların nəticəsində şeyx Nəsirəddin Mahmud Xoyi ilə hazırcavablığı, incə təfəkkürü və müdrikliyiylə bütün türk dünyasında məşhur olan, lətifələri dildən-dilə dolaşan Molla Nəsrəddinin eyni şəxs olduğunu sübuta yetirmişdir[1865].

Şeyx Nəsirəddin Mahmud Xoyi məşhur alim Fəxrəddin Razinin tələbələrindən biri olmuşdu. O, həmçinin şeyx Əvhədəddin Kirmaninin müridlərindən biri və şeyxin kürəkəni olmuşdu. 1262-ci ildə Anadolunun bir çox yerində moğolların əlaltısına çevrilmiş hakimiyyətə qarşı qiyam olmuş, Ankara, Çankırı, Qastamonu, Ağsaray, Danişmənd eli və Qırşəhərdə əxilər üsyan qaldırmışdılar. Bu üsyanlar qanlı qırğınlarla müşayət olunmuş, moğol orduları tərəfindən amansızlıqla yatırılmışdı[1866]. Şeyx Nəsirəddin Mahmud Anadoludakı əxi qiyamının ilhamvericisi idi. Moğol komandanı Nurəddin Cacanın ordusu 1262-ci ildə Qırşəhər üsyanını yatırarkən şeyx Nəsirəddin Mahmud şəhid edilmişdi[1867].

Şeyx Nəsirəddin Mahmud Xoyi "Mətaliü'l-İman", "Lətaifi-Qiyasiyyə", "Mürşidü'l-Kifayə", "İlmü't-Təşrih", "Lətaifi-Hikmə", "Mədhi-Fəqr və Zəmmi-Dünya" kimi əsərlərin müəllifi idi[1868].

**Qazi Tacəddin Xoyi**

Fəqih Tacəddin Xoyi Anadolu Səlcuqlu sultanı Qiyasəddin III Keyxosrovun (1266-1284) əmri ilə 1266-cı ildə Qarahisar (Afyon) şəhəri qaziliyinə təyin olunmuşdu. Kəriməddin Aqsarayi qazi Tacəddin Xoyinin müctəhid alim olduğunu, əqli və nəqli elmlərdə

---

[1865] BAYRAM, *Ahi Evren ve Ahi Teşkilatının Kuruluşu*, s. 80-85.
[1866] AQSARAYİ, *Müsamərətü'l-Əxbar*, s. 74-75.
[1867] BAYRAM, *həmin əsər*, 102-107.
[1868] BAYRAM, *həmin əsər*, 66-71.

yüksək dərəcəyə çatdığını qeyd etmişdir[1869]. K. Aqsarayi alimin 1277-ci ildə vəfat etdiyini bildirmişdir[1870]. Əlbistan döyüşündə (15 aprel 1277) moğol ordusunun Misir Məmlüklü sultanı Rüknəddin Bəybars tərəfindən ağır məğlubiyyətə uğratılmasından sonra Anadoluya gələn Elxani hökmdarı Abaqa xanın bu hadisəylə bağlı günahkar bilərək edam etdirdiyi bəzi Səlcuqlu dövlət xadimləri[1871] arasında ehtimal ki, qazi Tacəddin Xoyi də olmuşdur.

Mövlana Cəlaləddin Rumi alimə ünvanladığı bir məktubunda qazi Tacəddin Xoyini belə təsvir etmişdi: "alim, qazilərin qazisi, ədaləti yayan, üstünlüyü saçan, müdriklərin qüruru, İslamın və müsəlmanların fəxri, sultanlara öyüd verən Tacü'l-millə və'd-din......." [1872]. Məktubun sonrasında mövlana Cəlaləddin Rumi qazi Tacəddin Xoyinin Hüsaməddin Çələbi Urməvi ilə bağlı ona bir söz verdiyini xatırladaraq özünün də qazinin verdiyi bu vədə zamin durduğunu bildirir. Bu vədin nədən ibarət olduğunu açıqlamayan Cəlaləddin Ruminin məktubu "əlbəttə, siz mənim üzümü ağ etsəniz, bu xüsusda uca köməyinizi lütf etmiş olarsınız" sözləri ilə başa çatır[1873].

**Məcdəddin İsmayıl ibn Əli Xunəci**

Şafi'i məzhəbinə mənsub fəqih və mütəkəllim idi. Həyatı haqqında ətraflı məlumat mövcud deyil. "Muqtəsər fi'l-Müxtəsər", "Risalətü'l-Mənzumiyyə", "Risalə fi Mənai'l-Qəvl", "Fəkuk fi Rəfi'l-Şükuk", "Ümdətü's-Səil fi Dəfi's-Sail" kimi əsərlərin müəllifi olan Məcdəddin Xunəci h. 744-cü ilin cəmadiələvvəl ayında (oktyabr 1343) vəfat etmişdir[1874].

**Qazi Zeynəddin Əli ibn Ruzbihan ibn Muhəmməd Xunəci**

Şafi'i məzhəbinə mənsub fəqih, filoloq və mütəkəllim idi. Qazi Zeynəddin Xunəci, İbnü'l-Hacib Düveyninin əsərinə "Mu'təbər fi Şərhü'l-Müxtəsər" adlı təəllüqün, "Nihayə fi Şərhü'l-Qayə", qazi Nasirəddin Bəyzavinin əsərinə "Şərhü'l-Minhəc",

---

1869 AQSARAYİ, *Müsamərətü'l-Əxbar*, s. 90, 121.
1870 *Həmin əsər*, 121.
1871 İBN BİBİ, *Əxbari-Səlacuqe-Rum*, s. 317.
1872 RUMİ, *Mektuplar*, s. 51.
1873 *Yenə orada*. Bax: məktub Nr. XXXIII
1874 KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. I, s. 373.

İbnü'l-Hacib Düveyninin digər bir əsərinə "Şükuk ələ'l-Kafiyyə" adlı təhiqin, Fəxrəddin Razinin əsərinə "Əcvibəi-İradat ələ Kitabü'l-Məhsul" adlı şərhin müəllifi idi. Alim h. 707-ci ilin səfər ayında (avqust 1307) vəfat etmişdir[1875].

**Əlaəddin Əbü'l-Abbas Əhməd ibn Davud ibn Xalid Xunəci**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Çox ibadət edən, zahid və saleh insan idi. Əlaəddin Xunəci həm də istedadlı şair idi. Ərəbcə gözəl qəzəllər yazmışdı. İbnü'l-Fuvati onun öz oğluna vəsiyyətnaməsini nəzmlə, məsnəvi üslubunda yazdığını qeyd etmişdir[1876]. Təqribən XII-XIII əsrlərdə yaşamışdır.

**Əllamə Əfzələddin Əbu Abdullah Muhəmməd ibn Namavər ibn Əbdülməlik Xunəci**

Şafi'i məzhəbinə mənsub fəqih, mütəkəllim və təbib olan Əfzələddin Xunəci h. 590-cı ilin cəmadiələvvəl ayında (may 1194) Azərbaycanın Xalxal vilayətinin Xunə[1877] qəsəbəsində anadan olmuşdu. Əfzələddin Xunəci ilk təhsilini Azərbaycanda alandan sonra təhsilini davam etdirmək üçün səyahətə çıxmışdı. İbnü'l-İbri onun Fəxrəddin Razinin yetirmələrindən biri olduğunu qeyd etmişdir[1878]. Əfzələddin Xunəci Misirə getmiş, burada həkim, fəqih və mütəfəkkir kimi yetişərək Qahirədəki Səlahiyyə mədrəsəsinin müəllimi olmuşdu[1879]. Əfzələddin Xunəcinin tələbəsi olmuş məşhur tibb tarixçisi İbn Əbi Üseybiyə müəllimini "əl-imamü'l-alim, əs-sədrü'l-kamil, seyyidü'l-üləma və'l-hükəma, əvhədü'z-zaman" kimi sözlərlə mədh etmişdir[1880].

Əbu Bəkr Dəvadari öz əsərində fəqih Əfzələddin Xunəcinin Əyyubi hökmdarları Məlik Kamil (1218-1238) tərəfindən h. 637-ci ildə (1237) Anadoluya göndərildiyini qeyd etmişdir. Sultan Əlaəddin I Keyqubadın (1220-1237) vəfatından sonra yerinə oğlu Qiyasəddin II Keyxosrov keçmiş və Əfzələddin Xunəci də böyük ehtimalla yeni

---

[1875] KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. II, s. 443.
[1876] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 992.
[1877] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s.87; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. II, 38; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. V, s. 571. Yaqut əl-Həməvinin verdiyi məlumata görə Xuna və ya Xunəc Azərbaycanda, Marağa ilə Zəncan arasında, Rey yolu üzərində yerləşir və indi Kağezkonan adlanır. Bax: *Mu'cəmü'l-Büldan*, C. III, s. 180.
[1878] İBNü'l-İBRİ, *Tarixu Müxtəsərü'd-Düvəl*, s. 212.
[1879] İBN ƏBİ USEYBİYƏ, *Təbəqatü'l-Ətibba*, s. 586-587; İBN KƏSİR, *Bidayə və'n-Nihayə*, C. XIII, s. 326.
[1880] İBN ƏBİ USEYBİYƏ, *Təbəqatü'l-Ətibba*, s. 586. (rəhbər alim, kamil lider, alimlərin və müdriklərin ağası, dövlün yeganəsi).

sultanın cülus (inaqurasiya) mərasimində iştirak etmək üçün Əyyubi sultanının təmsilçisi olaraq Anadoluya getmişdi. Yeni sultan Əfzələddin Xunəcini qiymətli hədiyyələrlə təltif etmişdi[1881]. Qiyasəddin II Keyxosrovun (1237-1246) hakimiyyəti dövründə Anadoluda yaşamış Əfzələddin Xunəci buradakı mədrəsələrdə tibb və fiqh dərsləri vermişdi[1882]. Alim Kayseridəki Gövhər Nəsibə xəstəxanası və Qiyasiyyə tibb mədrəsəsində dərs vermiş və müalicə işi ilə məşğul olmuşdu[1883]. Kosadağ müharibəsindən[1884] sonra Anadolunu tərk edərək Misirə qayıdan Əfzələddin Xunəci sultan Saleh tərəfindən (1240 - 1249) bu ölkənin qaziü'l-quzatlığına təyin edilmişdi[1885].

Əfzələddin Xunəci müxtəlif elm sahələrinə dair əsərlərin müəllifidir. "Mu'cəz fi'l-Məntiq", "Cüməl fi Müxtəsəru-Nihayətü'l-Əməl fi'l-Məntiq", "Kəşfü'l-Əsrar ən Qəvamidü'l-Əfkar", "Şərh mə Qəvləhü'r-rəis İbn Sina" onun fəlsəfə və məntiq sahəsində qələmə aldığı əsərlərdir[1886]. "Məqalətü'-Hüdud və'r-Rüsum", "Müxtəsərü'l-Mətalibü'l-Aliyyə", "Vəsayə" adlı əsərləri fiqh, "Kitab Ədvarü'l-Hümayat" isə tibb sahəsində qələmə aldığı əsərlərdir[1887]. Bundan başqa Əfzələddin Xunəci kəlam elminə dair qələmə aldığı "Tuhfətü's-Sultaniyyə fi Əsrari'l-Kəlamiyyə" adlı əsərin müəllifidir ki, bu əsərin nüsxələrindən biri Antaliya Təkəlioğlu əlyazmalar kitabxanasında Nr. 158/2-de saxlanmaqdadır. Həmin kitabxanada Nr. 426/2-də alimin "Vəsaya" adlı fiqhə dair əsərinin də nüsxələrindən biri saxlanılır[1888]. Onun "Məqalətü'l-Hüdud və'r-Rüsum" adlı İslam vergi hüququna dair əsərinin əlyazma nüsxəsi Süleymaniyyə kitabxanası Nr. 322-də mühafizə edilməkdədir[1889]. Ehtimal ki, alim bu əsərləri Anadoluda yaşadığı müddətdə qələmə almışdır. İbn Xəldun mütəəxxir alimlərin[1890] mədrəsələrdə oxudulan kitabları və dərs proqramlarını ixtisar etmələrini tənqid edərkən Əfzələddin Xunəcinin

---

1881 DƏVADARİ, *Kənzü'd-Dürər*, C. VII, s. 319.
1882 Claud CAHEN, *Osmanlılardan Önce Anadoluda Türkler*, s. 251, (trc. Y. Moran), İstanbul 1994.
1883 Ahmed Süheyl ÜNVER, *Tıb Tarihi*, s. 104, İstanbul 1943.
1884 Kosadağ müharibəsi 4 iyul 1243-cü ildə moğollarla türklər arasında baş vermişdi. Daha doğrusu burada döyüş əməliyyatları aparılmamış, oğuz əsgərləri və onların komandanları sultan Qiyasəddin II Keyxosrova nifrət etdikləri üçün döyüş meydanını tərk etmişdilər. Bununla da Anadolu moğol istilasına uğramışdı.
1885 TAŞKÖPRÜZADƏ, *Mövzuatü'l-Ülum*, C. I, s. 274.
1886 BROCKELMANN, *Geschıchte der Arabıschen Lıtteratur*, E.S, C. I, s. 838; TAŞKÖPRÜZADƏ, *Mövzuatü'l-Ülum*, C. I, s. 274; KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. I, s. 744;MƏMMƏDOV, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, s. 42-43; SƏFƏDİ, *Vafi bi'l-Vəfayat*, C. V, s. 108.
1887 BROCKELMANN, *yenə orada*; Mürtəza Müdərris ÇƏHARDEHİ, *Tarixi-Fəlsəfeyi-İslam*, C. I, s. 608-610, Tehran 1347.
1888 *Türkiye Yazmaları Toplu Kataloğu*, C. IV, s. 110-111, (Nşr. İ. Parmaksızoğlu-Uysal. A), İstanbul 1984.
1889 *Türkiye Yazmaları Toplu Kataloğu*, C. III, s. 4, (Nşr. İ. Parmaksızoğlu), Ankara 1987.
1890 Mütəəxxir alimlər, yəni son dövr alimləri deyərkən İbn Xəldun (öl. 1406) öz yaşadığı və ona yaxın keçmişdəki alimləri nəzərdə tutmuşdur.

də bu işi məntiq və fəlsəfə dərsləri sahəsində etdiyini qeyd etmişdir[1891]. Alim h. 6 ramazan 646-cı ildə (23 dekabr 1248) vəfat etmiş və Qahirə yaxınlığındakı Səfhi-müqəttəm qəbristanında dəfn edilmişdi[1892].

**Qazi Saleh ibn İshaq əş-Şirvani Qarabaği**

Hənəfi məzhəbinə mənsub fəqih, tarixçi, müfəssir, bioqraf və şair olan qazi Saleh Qarabaği h. 1031-ci ildə (1622) dünyaya gəlmişdi. Sultan IV Mehmedin hakimiyyəti illərində (1648-1687) Osmanlı dövlətinin tanınmış elm xadimlərindən biri olan qazi Saleh Qarabaği, Zühri İsqahzadə adı ilə tanınmışdı. Osmanlı sarayı tərəfindən Beyrut şəhəri qaziliyinə təyin edilmiş alim daha sonra Misir qaziliyi vəzifəsini icra etmişdi. O, bir sıra əsərlərin müəllifi idi. Bunların ən məşhuru "Haşiyə ələ Təfsiri'l-Bəyzavi" adlı əsərdir. Alim h. 1083-cü ildə (1672) vəfat etmişdi[1893].

**Molla Şəmsəddin Əhməd əl-Ənsari Gəncəvi Qarabaği**

Hənəfi məzhəbinə mənsub fəqih və mühəddis idi. Azərbaycan mədrəsələrində təhsil aldıqdan sonra Osmanlı ölkəsinə getmiş, İstanbuldakı mədrəsələrdən birində müdərris olmuşdu. H. 989-cu ilin cəmaziyələvvəl ayında (iyun 1581) Dəməşq mollalığına təyin olunmuşdu. Daha sonra Ədirnə və h. 990-cı ilin zilhiccə ayında (yanvar 1583) İstanbul şəhəri mollalığına təyin olunmuşdu. Bir il yarım bu vəzifədə qaldıqdan sonra Anadolu qaziəsgəri olmuş, daha sonra Misir müftiliyinə təyin olunmuşdu. H. 997-ci ildə (1589) həcc ziyarətindən qayıdandan sonra ikinci dəfə Anadolu qaziəsgərliyinə, bir il sonra da Rumeli qaziəsgərliyinə təyin olunmuşdu. 1001-ci ilin səfər ayında (noyabr 1592) Osmanlı baş vəziri Qoca Sənan paşanın (öl. 1596) tikdirdiyi Darü'l-Hədisin (hədis mədrəsəsi) inşası başa çatmış və Şəmsəddin Qarabaği, 130 aqça maaşla, bu mədrəsənin baş müdərrisliyinə təyin olunmuşdu. H. 1006-cı ilin məhərrəm ayında (avqust 1597) təqaüdə çıxarılmışdı. Fəziləti ilə tanınan alim Şəmsəddin Qarabaği h. 13 səfər 1009-cu ildə (24 avqust 1600) İstanbulda vəfat etmişdi. Məzarı İstanbulun Vəfa adlanan

---

[1891] Vəliyəddin Əbdürrəhman İBN XƏLDUN, *Kitabü'l-İbər və Divanü'l-Mübtəda və'l-Xəbər*, C. I, s. 731, Beyrut 1979.
[1892] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 241; TAŞKÖPRÜZADƏ, *Mövzuat*, s. 325; İBN QAZİ ŞUHBƏ, *Təbəqatü'ş-Şafi'iyyə*, C. II, 38; İBNü'l-İMAD, *Şəzəratü'z-Zəhəb*, C. V, s. 571.
[1893] BAĞDADLI, *İzahü'l-Məknun*, C. I, s. 71; KƏHHALƏ, *Mu'cəmü'l-Müəllifin*, C. I, s. 829.

səmtindədir. O, qazi Bəyzavinin "Ənvarü't-Tənzil və Əsrarü't-Tə'vil" adlı Qur'an təfsirinə haşiyə, "Tə'liqat ələ't-Təlvih", "Tə'liqati-Miftah", "Tə'liqati'l-Məvaqif" və "Kəlimat ələ'l-Hidayə" adlı əsərlərin müəllifi idi[1894].

**Mövlana Muhyəddin Muhəmməd ibn Əli Qarabaği**

Hənəfi məzhəbinə mənsub fəqih idi. Bundan başqa ərəb filologiyası, təfsir, hədis, üsul və kəlam sahələrində də yaşadığı dövrün tanınmış alimlərindən biri idi. Azərbaycanın qədim diyarı Qarabağda dünaya gəlmiş, ilk təhsilini vətənində aldıqdan sonra təhsilini davam etdirmək üçün Osmanlı ölkəsinə getmişdi. Anadolunun şəhərlərini gəzmiş və buradakı mədrəsələrdə təhsil almışdı. Mövlana Yaqub ibn Seyyidi Əlinin tələbəsi olaraq alim kimi yetişəndən sonra Osmanlı dövlətinin ilk mədrəsələrindən biri olan İznikdəki mədrəsənin müdərrisliyinə təyin olunmuşdu. Mövlana Muhyəddin Qarabaği vəfatına qədər bu mədrəsədə tədrislə məşğul olmuşdu. Taşköprülüzadə onun haqqında "gecə və gündüz elmi tədqiqatla məşğul idi" yazmışdı. Mövlana Muhyəddin Qarabaği Carullah Zəməxşəri (öl. 1144), Əzudəddin əl-İci (öl. 1355), Nasirəddin Bəyzavi (öl. 1289), Cəlaləddin Dəvvani (öl. 1502), Übeydullah ibn Məs'ud (öl. 1346) kimi alimlərin əsərlərinə şərh və haşiyələr yazmışdı. Bundan başqa o, "Kitabü'l-Muhazirat" adlı əsərin müəllifi idi. Mövlana Muhyəddin Muhəmməd Qarabaği gözəl əxlaqlı, təmiz əqidəli, həlim, təvazökar və saleh insan idi. O, həmçinin şair idi və gözəl şe'rlər yazırdı. Alim h. 942-ci ildə (1535) vəfat etmişdi[1895]. Onun müəllifi olduğu "Haşiyəi-Sədrü'ş-Şəriə" və "Şərhi-Adabi-Əzudiyyə"[1896] Türkiyənin Kütahya şəhəri Vahidpaşa İHK, "Şərhu-risaləti İsbati'l-Vacib li'd-Dəvvani"[1897] İstanbul Köprülü yazma əsərlər kitabxanasında, "Haşiyətu ələ'l-Bəyzavi li'l-cüzi'l-axir"[1898] İstanbul Atıf əfəndi yazma əsər kitabxanası,

---

[1894] SÜREYYA, *Sicil-i Osmani*, C. V, s. 1578; BURSALI, *Osmanlı Müəllifləri*, C. II, s. 22. Mehmed Süreyya onun Gəncəli, Bursalı Mehmed Tahir isə Qarabağlı olduğunu yazmışdırlar. Ehtimal ki, mövlana Şəmsəddin Əhməd əslən Qarabağlı idi və Gəncədə təhsil almış və yaşamışdı.

[1895] TAŞKÖPRÜZADƏ, *Şəqaiqü'n-Numaniyyə*, s. 272.

[1896] Məşhur şafi'i alimi Əzudəddin əl-İcinin (öl. 1355) məntiq elmi sahəsindəki "Adabü'l-Bəhs" adlı əsərinə yazılmış şərhdir. Mövlana Muhyəddin Qarabağinin qələmə aldığı bu şərhin əlyazma nüsxələrindən biri AMEA Əİ-nun fondunda saxlanılır. Bu şərh haqqında ətraflı məlumat üçün bax: ŞƏRİFOV, *Əbdülqəni Əfənd...i*, s. 260.

[1897] Ağqoyunlular dövrü hənəfi alimlərindən Cəlaləddin Dəvvaninin əqaid və kəlam elminə dair (öl. 1502) "Risalə fi İsbati'l-Vacib" adlı əsərinə yazılmış şərhdir.

[1898] Elxanilərin hakimiyyəti dövründə Təbriz qazisi olmuş Nasirəddin Bəyzavinin (öl. 1289) Qur'ani-Kərimə yazdığı "Ənvarü't-Tənzil və Əsrarü't-Tə'vil" adlı təfsirin son cildinə yazılmış haşiyədir.

"Haşiyə ələ Şərhi-Viqayəti'r-Rivayə fi Məsailü'l-Hidayə"[1899] Konya BYEK, "Calib's-Sürur və Səblü'l-Qürur" Konya Yusifağa kitabxanasında saxlanılır.

**Əbu Həfs Ömər ibn Əli ibn Əhməd Zəncani**

Şafi'i məzhəbinə mənsub fəqih idi. Bir müddət Dəməşqdə yaşayandan sonra Bağdada getmiş və orada məskunlaşmışdı. Qazi Əbu Təyyib ət-Təbəridən fiqh, Mosul qazisi Əbu Cə'fər Əhməd ibn Muhəmməd əs-Simnanidən kəlam elmini öyrənmişdi. Əbu Muhəmməd əl-Cəvhəri və Əbu Nəsr ibn Təlabdan hədis dinləmiş və nəql etmişdi. Fəqih Əbu Əli ibn Əbu Hureysə əl-Maliki ondan hədis dinləmişdi. H. 459-cu ilin cəmadiələvvəl ayında (aprel 1067) vəfat etmişdi[1900]. Əbu Həfs Ömər Zəncani "əl-Mu'təməd" adlı əsərin müəllifi idi[1901].

**Vaiz Əbü'l-Məşhur Mə'ruf ibn Muhəmməd ibn Mə'ruf Zəncani**

Mühəddis və vaiz idi. Dəməşqdə Əbü'l-Müstənzi Müaviyyə ibn Əvs ibn Lihyə', Məkkədə Əbu Muhəmməd Əbdürrəhman ibn Abdullah ibnü'l-Müqri, Əbu Sə'id ibnü'l-Əaribi (854-951), Həsən ibn Müləyyəh əl-Misri, Qasım ibn İbrahim əl-Muləti, qazi Übeydullah ibn Hüseyn əl-Antaki, Əbü'l-Həsən İbrahim ibn Əbdüssəlam əl-Haşimi, Əbu Abdullah Cə'fər ibn İdris Qəzvinidən hədis dinləmiş və nəql etmişdi. Əbu Nəsr Hüseyn ibn Əbdülvahid Şirazi, Əbü'l-Həsən Əli ibn Şüca İsfəhani, Əbü'l-Həsən əl-Ətiqi, Əbu Bəkr əl-Birqani, Rizvan ibn Muhəmməd Dinəvəri ondan hədis dinləmişdilər[1902]. Ölüm tarixi məlum deyil. X əsrdə yaşamışdır. Nəql silsiləsində Əbü'l-Məşhur Mə'ruf Zəncaninin də olduğu əsərlərdən biri aşağıdakıdır:

Abdullah ibn Ömər (ا) ərəfə günü orucuna dair ona verilən suala belə cavab verdi: "Allah Rəsulu (ق), Əbu Bəkr (ا), Ömər (ا), Osman (ا) ərəfə günü oruc tutmadılar. Mən də

---

[1899] "Haşiyə ələ Şərhi-Viqayəti'r-Rivayə fi Məsailü'l-Hidayə" və "Haşiyəi-Sədrü'ş-Şəriə" fikrimizcə eyni əsərə müstənsixlər, yəni əsərin üzünü köçürmüş katiblər tərəfindən, verilmiş iki müxtəlif addır. Çünki mövlana Muhyəddin Qarabaği bu əsərini Sədrü'ş-Şəriə ləqəbi ilə məşhur olmuş Türküstanlı hənəfi fəqihi və kəlamçısı Übeydullah ibn Məs'ud əl-Məhbubi əl-Buxarin (öl. 1346) əqaidə dair "Şərhi-Viqayəti'r-Rivayə fi Məsailü'l-Hidayə" adlı əsərinə haşiyə olaraq qələmə almışdı.

[1900] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. IV5, s. 298; ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 305; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 328-329.

[1901] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. II, s. 912.

[1902] İBN ƏSAKİR, *Tarixu-Mədinəti-Diməşq*, C. LIX, s. 351.

ərəfə günü oruc tutmuram. Sizə ərəfə günü oruc tutmanızı əmr etmirəm, bunu sizə qadağan da etmirəm"[1903].

**Əbu Talib Əhməd ibn Muhəmməd Zəncani**

Hədis ravisi idi. Əbdülvəhhab ibn Hüseyn ibn Ömər əl-Qəzzaldan hədis dinləmişdi. Abdullah ibn Əhməd ibnü's-Səmərqəndi də ondan hədis dinləmişdi[1904]. Ölüm tarixi məlum deyil.

**Əbu Bəkr Ətiq ibn Bədəl Zəncani**

Mühəddis idi. Bağdadda Əbü'l-Fəth ibnü't-Tayidən, Zəncanda Əbu Hənifə əl-Xətibidən hədis dərsləri almışdı. Əbu Bəkr Muhəmməd Bağdadi onunla Məkkədə görüşdüyünü və alimin h. 618-ci ildə (1221) Məkkədə vəfat etdiyini qeyd etmişdir[1905].

**Əbu Abdullah Məkki ibn Bəndar ibn Məkki ibn Asim Zəncani**

Mühəddis idi. Üsamə ibn Əli ibn Səid ər-Razi, Muhəmməd ibn Zəncveyh əl-Qəzvini, U'rs ibn Fəhd əl-Məvsili, Muhəmməd ibn Hüseyn əz-Zəfəranidən hədis dinləmiş və nəql etmişdi. Hədis dinləmək üçün səyahət etmiş, Misir, İraq və Şam diyarını gəzmişdi. H. 339-cu ildə İsfahana gedərək buradakı mühəddislərdən hədis dinləmişdi. Əbü'l-Həsən Əli ibn Ömər Darəqutni, Əbü'l-Həsən Muhəmməd ibn Əhməd əl-Bəzzaz, hafiz Əbu Bəkr Əhməd ibn Musa ibn Mərduyə ondan hədis dinləmişdilər[1906]. Nəql silsiləsində Əbu Abdullah Məkki Zəncaninin olduğu hədislərdən biri aşağıdakıdır:

Ənəs ibn Malik (ʳ) dedi: Allah Rəsulu (ʲ) buyurdular ki: "Qadınların hüznü şiddətli olur, onları (dəfn mərasimi vaxtı) cənazədən uzaq tutun"[1907].

---

[1903] İBN ƏSAKİR, *yenə orada*. Daha ətraflı məlumat üçün bax: Müvəffəqəddin Abdullah ibn Əhməd İBN QUDAMƏ əl-Muğni, *Kitabu's-Siəm*, hədis Nr. 2137, http://www.islamweb.net/newlibrary/Bookslist.php
(حججت مع النبي ﷺ ، فلم يصمه - يعني يوم عرفة - ومع أبي بكر فلم يصمه ، ومع عمر فلم يصمه ، ومع عثمان فلم يصمه ، وأنا لا أصومه ، ولا آمر به ، ولا أنهى عنه )

[1904] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. II, s. 754.

[1905] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. IV, s. 122.

[1906] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 328-329; XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. XIII, s. 120.

[1907] XƏTİB BAĞDADİ, *Tarixu-Bağdad*, C. XIII, s. 120. Bu hədis üçün bax: İBNü'l-CƏVZİ, *İ'lili'l-Mütənahiyə*, Kitabu's-Sədəqə, C. II, s. 817. Qadınların dəfn mərasimlərində iştirak etməmələrinə dair bax: ƏBU DAVUD, *Sünən*, Cənaiz 25/3127.

**İmam Əbu Abdullah Əhməd ibn Muhəmməd ibn Sakin Zəncani**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. İraq, Hicaz və Misirə səyahət edərək dövrün məşhur alimlərindən hədis və fiqh dirsləri almışdı. Bağdadda Əhməd ibnü'l-Müqəddəm əl-İcli və Yaqub əd-Dəvraqidən, Bəsrədə Nəsr ibn Əli və Əbu Musa Bəsridən, Kufədə İsmayıl əs-Səviyy və Əbu Kərəb Kufidən, Misirdə Yusus ibn Əbdüləla, ər-Rəbiy və əl-Muzənidən fiqh və hədis dərsləri almışdı. Hədis elmində onun ən əsas ustadı Əbu Zur'ə Əbdürrəhman ibn Əmr Dəməşqi (öl. 893) olmuşdu. İmam Əbu Abdullah Əhməd Zəncani yaşadığı dövrün böyük mühəddisi və fəqihlərindən biri kimi şöhrət tapmışdı. Ölüm tarixi h. 300-cü (913) ildən əvvələ təsadüf edir[1908].

**Əllamə Şihabəddin Əbü'l-Mənaqib Mahmud ibn Əhməd ibn Mahmud ibn Bəxtiyar Zəncani**

Yaşadığı dövrdə tanınmış şafi'i fəqihlərindən biri idi. Bağdadda təhsil almış, buradakı mühəddislərdən hədis dinləmişdi. İcazətnaməsini (diplomunu) ona şəxsən xəlifə ən-Nasir Lidinillah (1180-1225) təqdim etmişdi. Daha sonra xəlifə onu Bağdad şəhərinin və İraqın baş qaziliyinə (qaziü'l-quzat) təyin etmişdi. Lakin o, bu vəzifəni icra etdiyi altı ay müddətində çox haqsızlıqlara və ədalətsizliklərə yol vermişdi. Əbu Bəkr Bağdadi onun haqqında "xətası çox, insafı az idi, nəhayət h. 619-cu ilin rəbiələvvəl ayında (1222) vəzifəsindən azad edildi və beləcə Allah müsəlmanları onun şərrindən qorudu"[1909]. Lakin xəlifə sadəcə onu vəzifəsindən azad etməklə kifayətlənməmiş, həmçinin əmlakı müsadirə edilmişdi. Vəzifəsindən sui-istifadə etməsinə baxmayaraq öz dövrünün qabaqcıl hüquqşünaslarından olan Əbü'l-Mənaqib Mahmud Zəncani h. 625-ci ildə (1228) Bağdaddakı Nizamiyyə mədrəsəsinə müdərris təyin edilmişdi. H. 626-cı ildə (1229) o, yenidən irəli çəkilmiş və Abbasi sarayında məmur olmuşdu. Lakin bu vəzifədə də uzun müddət qalmamış və azad edilmişdi[1910]. Şəmsəddin Zəhəbi onun həris və dünya malına düşkün bir insan olduğunu qeyd etmişdi. 633-cü ildə (1236) əllamə Əbü'l-Mənaqib Mahmud Zəncani Bağdaddakı Müstənsiriyyə mədrəsəsinə müdərris

---

[1908] MƏQRİZİ, *Kitabü'l-Müqəffa*, C. I, s. 720.
[1909] BAĞDADİ, *Təkmilətü'l-İkmal*, C. IV, s. 144.
[1910] İBNü'l-FUVATİ, *Həvadisü'l-Camiə'*, s. 2.

təyin olunmuşdu. O, "Tənqihü's-Sihah" kimi fiqh və fiqh üsuluna dair bir sıra əsərlərin müəllifi idi. Alim h. 656-cı ildə (1258) Hülagü xanın Bağdadı işğalı vaxtı moğollar tərəfindən öz oğulları və bir sıra yüksək rütbəli dövlət məmuru ilə birlikdə Müstənsiriyyə mədrəsəsində qətlə yetirilmişdi[1911].

**İmam Əbu Bəkr Əhməd ibn Muhəmməd ibn Əhməd ibn Zəncuveyh Zəncani**

Şafi'i məzhəbinə mənsub fəqih və mühəddis idi. H. 403-cü ildə (1012) Zəncanda dünyaya gəlmişdi. Qazi Əbu Təyyib ət-Təbərinin tələbəsi olmuş, ondan fiqh dərsi almışdı. Yaşadığı dövrdə Zəncanın mötəbər və qabaqcıl alimlərindən olan Əbu Bəkr Əhməd Zəncani fəzilət, vəra' sahibi, zahid insan idi. O, h. 500-cü ildə (1107) vəfat etmişdi[1912]. Onun hədis dinlədiyi mühəddislərin arasında qazi Əbu Abdullah Hüseyn ibn Muhəmməd ibn Hüseyn əl-Fəlaki də var idi. Əbu Tahir Əhməd əs-Sübləfi İsfəhani Zəncanda onunla görümüş və ondan hədis dinləmişdi[1913]. Onun Əbu Bəkr Əhməd Zəncanidən dinləyib nəql etdiyi hədislərdən biri aşağıdakıdır:

Əbu Hureyrə (ا) dedi: Rəsulullah (ق) buyurdular ki; "Ölülərinizi saleh insanların arasında dəfn ediniz. Çünki yaşayan (hər hansı bir şəxs) özünün pis qonşusundan əziyyət gördüyü kimi ölü də pis qonşusundan əziyyət görür"[1914].

**Əbü'l-Qasım Yusif ibn Əli ibn Muhəmməd ibn Hüseyn Zəncani**

Şafi'i məzhəbinə mənsub fəqih idi. H. 439-cu ildə (1047) anadan olmuşdu. Bağdadda şeyxülislam Əbu İshaq İbrahim Şirazinin tələbəsi olmuşdu. Təhsilini başa vurduqdan sonra Bağdadda qalmış və tezliklə bu şəhərin tanınmış fəqihlərindən birinə çevrilmişdi. O, Bağdada şafi'i məzhəbinə mənsub fətva mərcilərindən biri idi. Alim h. 500-cü ilin səfər ayında (oktyabr 1106) vəfat etmişdi[1915].

---

1911 ZƏHƏBİ, *Siyəru Ə'lamü'n-Nübəla*, s. XXIII, s. 133.
1912 ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 301-302.
1913 ƏBU TAHİR İSFƏHANİ, *Ərbəinü'l-Büldaniyyə*, 63.
1914 ƏBU TAHİR İSFƏHANİ, *Mu'cəmü's-Səfər*, s. 31. Mühəddis Əbü'l-Həsən Müzəffər ibn Həsən ibn Mihnəd Səlmasi də bu hədisi (Abdullah ibn Məs'uddan (ا) nəql etmişdi. Bax: s. ???.
1915 ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 306.

**Əbü'l-Qasım Yusif ibn Həsən ibn Muhəmməd ət-Təfəkküri Zəncani**

Mühəddis idi. Alim, fəzilət sahibi, saleh insan idi. Hafiz Əbu Yə'la Xəlil ibn Abdullah Qəzvini, Əbu Abdullah Hüseyn ibn Muhəmməd əl-Fəlaki və hafiz Əbu Nueym Əhməd ibn Abdullah İsfəhaninin tələbəsi olmuş, onlardan hədis dinləmişdi. Əbü'l-Qasım ibnü's-Səmərqəndi, Əbü'l-Fərəc Əbdülxaliq ibn Əhməd ibn Yusif, hafiz Əbu Şüca' Şiruyə ibn Şəhrdar Həmədani ondan hədis dinləmiş və hədis elminə dair bilikləri öyrənmişdilər. Bağdadda yaşamış, h. 11 rəbiəlaxir 473-cü ildə (28 sentyabr 1080) bu şəhərdə vəfat etmiş və Babi-hərb qəbristanında dəfn edilmişdi[1916].

**Əbü'l-Fəzail Əbdürrəhim ibn Rüstəm Zəncani**

Təfsir, fiqh və fiqh üsulu sahələrində tanınmış mütəxəssis idi. O, həm də istedadlı şair idi. Bağdadda təhsil almış, İbn Rəzzazın tələbəsi olmuşdu. Əsərləri və çıxışları ilə əhli-sünnənin Qur'an anlayışına zidd cərəyanlara qarşı şiddətli mübarizə aparmışdı. Dəməşqdə Mücahidiyyə və Qəzzaliyyə mədrəsəsində dərs vermişdi. Bəəlbək qaziliyinə təyin olunmuş və bu vəzifəni icra etmişdi. Bəəlbək qazisi ikən h. 563-cü ilin rəbiəlaxir ayında (yanvar 1168) batini-xaşxaşlərin sui-qəsdinə uğrayaraq şəhid olmuşdu. Cənazəsi Dəməşqə gətirilərək burada dəfn edilmişdi[1917].

**Əbü'l-Həsən Əbdülmuhsin ibn Abdullah ibn Əbdülmuhsin Zəncani**

Alim ailəsində dünyaya gəlmişdi. Atasından və əmisindən fiqh dərsləri almışdı. Daha sonra Bağdada getmiş və Üseyd əl-Meyhəninin tələbəsi olmuşdu. Bağdad mühəddislərindən hədis dinləyən Əbü'l-Həsən Zəncani Azərbaycana qayıtmışdı. Zəncan qaziliyinə təyin edilmiş, bu vəzifəni icra etməklə yanaşı hədis və fiqh dərsləri vermişdi. Ölüm tarixi h. 580-ci (1184-1194) illərə təsadüf edir[1918].

**Şeyx Zəhirəddin Əbü'l-Məhamid Mahmud ibn Übeydullah ibn Əhməd Zəncani**

---

[1916] İBN NÖQTƏ, *Təqyid li-Mərifəti-Ruvat*, s. 285.
[1917] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 307; NUEYMİ, *Daris fi Tarixi'l-Mədaris*, C. I, s. 317, 346.
[1918] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 307.

Şafi'i məzhəbinə mənsub fəqih və fütuvvət şeyxi idi. Onun atası qazi Əbu Muaz Übeydullah Zəncani də yaşadığı dövrün tanınmış alimlərindən biri idi. H. 597-ci (1201) ildə Dəməşqdə dünyaya gələn şeyx Zəhirəddin Mahmud Zəncani bu şəhərdə yaşamışdı. O, şeyxü'ş-şüyux Şihabəddin Ömər Sührəvərdinin (öl. 1234) tələbəsi və yaxın dostu olmuşdu. Şihabəddin Sührəvərdidən onun "Əvarifü'l-Məarif" adlı əsərini dinləmişdi. Təsəvvüfə dair digər bir əsəri, Əbu Nəsr əs-Sərracın müəllifi olduğu "əl-Lüma'"nı isə h. 623-cü (1226) ildə şeyx Əbdüssəlam əd-Dahiridən dinləmişdi. Zəhirəddin Zəncani hafiz Bədrəddin Əbü'l-Xeyr Bədəl Təbrizi (öl. 1238), Əbü'l-Məali Said kimi mühəddislərdən hədis dinləmiş, bu elm sahəsinə dair biliklərə yiyələnmişdi. O, h. 674-cü ilin ramazan ayında (18 fevral-19 mart 1276) vəfat etmişdi. Şeyx Zəhirəddin Mahmud Zəncani ilə görüşüb söhbət etmiş Şəmsəddin Zəhəbi ondan eşitdiyi aşağıdakı hədisi əsərində qeyd etmişdi. Ömər ibn Xəttab (ا) dedi: Allah Rəsulu (ق) buyurdular ki: "Məscidlərini (qızılla) bəzəyəcək olan millət necə də bəd əməllidir"[1919].

Bu hədis İbn Macənin müəllifi olduğu hədis külliyatında, "Məscidlər" (hədis Nr. 741) bölümündə də qeyd edilmişdir. İbn Macənin "Sünən"ini türkcəyə tərcümə etmiş Heydər Xətiboğlu bu hədisi şərh edərkən əl-Heysəminin "Məcməü'z-Zəvaid" adlı əsərinə istinadən hədisin nəql silsiləsindəki ravilərdən Əbu İshaqın tədlis[1920] etdiyini, Cübarə ibnü'l-Muğlisin isə yalan danışdığının eşidildiyini qeyd etmişdir[1921]. Buna baxmayaraq məscidlərin ifrat bəzədilməsi İslami nöqteyi-nəzərdən bəyənilən bir iş deyildir. Bu haqda bir çox hədis mövcuddur.

**Şəmsəddin Əbü'l-Məkarim Mənsur ibn Həsən ibn Mənsur Zəncani**

Şəmsi-Zəncani ləqəbi ilə tanınan Əbü'l-Məkarim Mənsur Zəncani şafi'i məzhəbinə mənsub fəqih idi. Bağdad Nizamiyyə mədrəsəsində təhsil almışdı. Təhsilini başa vurduqdan sonra Bağdaddakı əs-Suqtiyyə mədrəsəsində dərs vermişdi. Tədris fəaliyyəti ilə məşğul olduğu dövrdə Bağdadda əl-Qəsr camesində təşkil olunan elmi

---

[1919] ZƏHƏBİ, *Mu'cəmü'ş-Şüyux*, C. II, s. 332. [ما سَاءَ عمل قومٍ قط الاَّ زَخْرفُوا مساجِدَهم]

[1920] Tədlis etmək-Ravinin nəql etdiyi hədisin gizli bir cəhəti, qüsuru olduğu halda belə bir cəhətinin, qüsurunun olmadığını düşündürəcək formada həmin hədisi nəql etməsidir. Belə ravilərə müdəllis, yəni tədlisçi deyilir. Tədlisin 10-a yaxın növü var. Bu haqda daha ətraflı məlumat üçün bax: AYDINLI, *həmin əsər*, s. 152.

[1921] İBN MACƏ, *Sünən*, C. II, s. 549.

diskussiyalarda iştirak edirdi. Əbü'l-Məkarim Mənsur Zəncani h. 599-cu ilin ramazan ayında (may 1203) Bağdadda vəfat etmişdi[1922].

**Şeyx Əbu Müzəffər Əbdüssəməd ibn Hüseyn ibn Əbdülqəffar Zəncani**

Mühəddis, abid və saleh insan idi. Bağdadda Əbü'l-Qasım Hibətullah ibn Muhəmməd ibnü'l-Husayn əş-Şeybani (öl. 1131) və Əbü'l-Qasım Zahir ibn Tahir əş-Şihamidən hədis dinləmişdi. Hafiz Əbu Bəkr əl-Hazimi onun tələbəsi olmuş və ondan imam Əhməd ibn Hənbəlin (/) "Müsnəd" adlı hədis külliyatındakı hədisləri dinləmişdi. Alim h. 14 ramazan 581-ci ildə (8 dekabr 1185) vəfat etmişdi[1923].

**Əbu Cə'fər Muhəmməd ibn Mənsur ibn Muhəmməd Zəncani**

Mühəddis və şafi'i məzhəbinə mənsub fəqih idi. Ömrünün son bir neçə ilini Əstərabadda[1924] yaşamışdır. Mömin, fəzilət, zöhd və vəra' sahibi insan idi. Əbu Abdullah Muhəmməd ibn Cə'fər əl-Qəzai, Əhməd ibn İbrahim ibn Musa əd-Dəqqaq, Əbu Muhəmməd Əbdürrəhman ibn Muhəmməd ibn Həsən əl-Farisidən hədis dinləmişdi. Əbu Həfs Ömər ibn Muhəmməd ibn Həsən əl-Fərğuvali Mərvdə, Əbu Nəsr Əbdülvəhhab ibn Əhməd ibn Əbdüssəlam Əstərabadda ondan hədis nəql etmişdilər. Alim h. 480-cı (1087-1097) illərdə Əstərabadda vəfat etmişdi[1925].

**Şeyx İmadəddin İbrahim ibn Əbdülvəhhab ibn Əbü'l-Məali Zəncani**

İmadi-Zəncani olaraq tanınan İbrahim ibn Əbdülvəhhab Zəncani yaşadığı dövrün tanınmış fəqih və mühəddislərindən idi. O, h. 594-cü ildə (1198) Mərv şəhərinə gedərək Fəxrəddin İsmayıl ibn Muhəmməd əl-Faşaninin (öl. 1206) tələbəsi olmuş və onun yanında hədis elminə dair biliklərə yiyələnmişdi. İbnü'l-Fuvati İmadəddin Zəncanini "öz dövrünün yeganəsi, fəziltli insan, ədib, alim və fəqih" kimi sözlərlə yad etməkdə

---

[1922] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 308.
[1923] İBN NÖQTƏ, *Təqyid li-Mərifəti-Ruvat*, s. 218.
[1924] Əstərabad-İranın şimali-şərqində, Xəzər dənizinin cənubi-şərq sahilindən bir neçə km aralıda yerləşən şəhər.
[1925] SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 328-329.

idi[1926]. İmadəddin Zəncani, Əbu Hamid Qəzzalinin şafi'i fiqhinə dair "əl-Vəciz" adlı əsərinə iki cildlik şərh yazmışdı. Bundan başqa o, Qur'ani-Kərimin bəzi surələrinin təfsirinə dair "Nəqavətü'l-Əziz" adlı əsərin də müəllifi idi. Alim h. 625-ci ilin şaban ayında (iyul 1228) vəfat etmişdi[1927].

**Şeyx İzzəddin Əbü'l-Fəzail Əbdülvəhhab ibn İbrahim ibn Əbdülvəhhab ibn Əbü'l-Məali Zəncani**

XIII əsrin tanınmış filoloq və ədəbiyyatşünaslarından biri olan şeyx İzzəddin Əbdülvəhhab Zəncani yuxarıda haqqında bəhs etdiyimiz İmadi-Zəncaninin (öl. 1228) oğlu idi. Şeyx İzzəddin Zəncani Bağdaddan cənubda yerləşən Mədain şəhərində dünyaya gəlmişdi. O, "Mə'ribu-İ'ma fi's-Sihah", "Məğrib fi'l-Lüğə", "Me'yarü'ş-Şe'r", "Hadi fi'n-Nəhv və's-Sərf", "Mübadi' fi't-Təsrif" və "Kitabü'l-İzz fi't-Təsrif" adlı əsərlərin müəllifi idi. Alim həmçinin İbnü'l-Hacib Düveyninin əsərinə də "Şərhü'l-Kafiyyə" adlı şərh yazmışdır. Bunlardan ərəb dilinin qrammatikası sahəsində qələmə alınmış "Kitabü'l-İzz fi't-Təsrif" adlı əsər uzun müddət bütün İslam coğrafiyasındakı mədrəsələrdə dərslik kimi istifadə olunmuşdur. Türkiyədəki əlyazma əsər kitabxanalarında "Kitabü'l-İzz fi't-Təsrif"in yüzlərlə nüsxəsi mövcuddur. Bu əsər daha çox "Təsrifü'l-İzzi" adı ilə tanınmışdır. "Kitabü'l-İzz fi't-Təsrif"in əlyazma nüsxələrindən biri AMEA Əİ-nun fondunda mövcuddur[1928]. Bu əsərin əlyazma nüsxələrindən biri də Qahirə Milli kitabxanasında saxlanılır. "Me'yarü'n-Nizar fi İlmü'l-Əş'ar" da alimin qələmindən çıxmış əsərlərdəndir. Şeyx İzzəddin Zəncani h. 654-cü ilin zilqədə ayında (dekabr 1256) Bağdadda vəfat etmişdi[1929].

**Hafiz Əbü'l-Qasım Sə'd ibn Əli ibn Muhəmməd Zəncani**

Hədis hafizi, mühəddis idi. Təqribən h. 380-ci ildə (990) anadan olmuşdu. Şeyxü'l-Həram adı ilə tanınan Əbü'l-Qasım Sə'd Zəncani Məkkədə məskunlaşmış, bu şəhərdə

---

[1926] İBNü'l-FUVATİ, *Məcməü'l-Adab* , C. IV/2, s. 652.
[1927] ƏSNƏVİ, *Təbəqatu'ş-Şafi'iyyə*, C. I, s. 309.
[1928] ŞƏRİFOV, *Əbdülqəni Əfəndi...*, s. 95.
[1929] KATİB ÇƏLƏBİ, *Kəşfü'z-Zünun*, C. II, s. 213, 744, 918, 923, 1058; BAĞDADLI, *İzahü'l-Məknun*, C. II, 330; BÜNYADOV, "Vidnıye Deyateli Azerbaydjana v Soçinenii İbn al-Fuvati", s. 61-67.

yaşamışdı. Hədis dinləmək və hədis dərsləri almaq üçün səyahət etmişdi. Doğma şəhəri Zəncanda Muhəmməd ibn Əbu Übeyddən, Misirdə Əbu Abdullah Muhəmməd ibn Nəzif əl-Fərra, Hüseyn ibn Maymun əs-Sədəfidən, Qəzzədə Əli ibn Səlamədən, Dəməşqdə Əbdürrəhman ibn Yasir əl-Cəvbəri və Əbü'l-Qasım ibnü't-Tubəyyizdən hədis dinləmişdi. İmam Əbü'l-Müzəffər Mənsur ibn Əbdülcəbbar əs-Səm'ani, Əbu Bəkr əl-Xətib, Məkki ibn Əbdüssəlam ər-Rumeyli, Hibətullah ibn Faxir, Əbü'l-Fəzl Muhəmməd ibn Tahir əl-Məqdisi, Əbdülmün'im ibn Əbü'l-Qasım əl-Quşeyri, Əbu Cə'fər Həmədani ondan hədis dinləmiş və nəql etmişdilər. Böyük hədis alimi kimi onun şöhrəti sadəcə Məkkədə deyil, Misir və Şam diyarına da yayılmışdı. Məkkə əmiri hafiz Əbü'l-Qasım Sə'd Zəncani haqqında "onun əlini öpənlərin sayı, hacərü'l-əsvədi öpənlərdən çoxdur" demişdi. Alim h. 471-ci ildə (1078) Məkkədə vəfat etmişdi[1930].

**İzzəddin Əbu Muhəmməd Əbdülvəhhab ibn İbrahim ibn Muhəmməd əl-Xəraci Zəncani**

Yaşadığı dövrün tanınmış ədiblərindən idi. O, Zəncandan köçüb Təbrizdə məskunlaşmışdı. Daha əvvəl (ehtimal ki, tələbəlik illərində-E.N) bir müddət Mosulda yaşamış və burada şeyx Şəmsəddin ibn Xubbazın[1931] şəxsi katibi olmuş, onun diktə etdiyi elmi və ədəbi əsərləri qələmə almışdı. İzzəddin Əbdülvəhhab Zəncani ümumi dilçilik, ərəb dilinin qrammatikası, xitabət (ritorika), qafiyə (stilistika) haqqında bir sıra əsərlərin müəllifi idi. Bunlardan biri də "Təzkirətü'l-Məcdiyyə" adlanır. Əvvəl Xorasana, sonra isə Mavəraünnəhrə səyahət edən alim bir müddət Buxarada yaşamış, sonra yenidən Təbrizə qayıtmışdı. İzzəddin Əbdülvəhhab Zəncani h. 660-cı (1262) ildə vəfat etmişdi[1932]. Yuxarıda onun oğlu İmadəddin Əbü'l-Məkarim Muhəmməd Təbrizi haqqında məlumat vermişik

---

[1930] Əbü'l-Fərəc Əbdürrəhman ibn Əli İBNü'l-CƏVZİ, *Sifətü's-Səfvə*, (Hzr. M. Dəfaxuri), C. II, s. 266-267, Beyrut 1985; ZƏHƏBİ, *İbər fi Xəbər mən Ğəbər*, C. II, s. 48; SƏM'ANİ, *Kitabü'l-Ənsab*, C. II, s. 328-329. İBN ƏBDÜLHADİ, *Təbəqatu-Üləma*, C. III, s. 367-368.

[1931] Şeyx Şəmsəddin Əbu Abdullah Əhməd ibn Hüseyn ibn Əhməd ibn Xubbaz əl-Ərbili (öl. 1273) yaşadığı dövrün tanınmış filoloq və ədəbiyyatşünaslarından biri olmuşdu. O, "Nihayə fi'n-Nəhv", "Fihristü'l-Kitabü'n-Nəhvi'l-Mutəbəvvi'ə" adlı əsərlərin müəllifi idi.

[1932] BÜNYADOV, *həmin məqalə*.

# NƏTİCƏ

Bilindiyi kimi qədim yunan mifologiyasında Prometey politeist yunanların tanrılarına qarşı silah kimi istifadə etmələri üçün insanlara odu vermişdi. İnsanlar bu od sayəsində qaranlıqdan aydınlığa çıxmış, onları əsir etmək istəyən qara qüvvələrlə mübarizə aparmışdılar. Maddi (elm-düşüncə) və mənəvi (vəhy-din) alovların işığının birgə aydınlatdığı yol bəşəriyyəti uğura, yeniliklərə və sonsuz səadətə aparan yoldur. Bu mənada hər bir yenilikçi insan müəyyən mənada Prometeydir, qaranlıqları aydınladan alovu yandırandır. Muhəmməd (ﷺ), İsa (×), Musa (×), İbrahim (×) və digər peyğəmbərlər, Farabi, İbn Sina, Biruni, İbn Teymiyyə, İbn Rüşd, Konfiçus, Solon, Kopernik, Nyuton, Eynişteyn, Edison və daha kimlər, kimlər. Ziyalılar tarixin bütün dövrlərində millətlərin və cəmiyyətlərin düşünən beyni, lokomotivi, aparıcı qüvvəsi olmuşdurlar. Hər bir mütəfəkkir, alim yaşadığı cəmiyyətin, mənsub olduğu millətin və mədəniyyətin tərəqqisinə öz töhfəsini verməklə əslində bəşər mədəniyyəti adlandırdığımız nəhəng binaya bir qızıl kərpic qoymuşdur. Təfəkkürləri ilə aid olduqları sivilizasiyaya nəfəs verən nadir şəxslər təfəkkürlərinin məhsulu olan əsərlər sayəsində həm də əsrlər boyu yaşamağa müvəffəq olmuşdurlar. Bu əsərdə biz orta əsrlərdə Azərbaycanın, eləcə də İslam coğrafiyasındakı bir sıra ölkələrin dini, elmi və mədəni həyatında mühüm rol oynamış, düşüncələri və əsərləri ilə keçmişdən günümüzə səslənə bilmiş insanların tərcümeyi-hallarını qələmə aldıq. Haqqında məlumat verdiyimiz şəxslər arasında Azərbaycanda, eləcə də bütün cənubi Qafqazda İslamın yayılmasında mühüm rol oynamış alimlər də mövcuddur. Bu baxımdan orta əsrləri siyasi baxımdan olduğu kimi elmi-mədəni tərəqqi baxımından da Azərbaycan tarixinin ən parlaq dövrü hesab etmək olar. Düşünürəm ki, bu sahədə hələ görüləcək işlər kifayət qədər çoxdur.

# İSTİFADƏ OLUNMUŞ MƏNBƏLƏR


**Əlyazma Əsərlər**

ANONİM, *Həyakilü'n-Nur Müəllifi Şeyx Sührəvərdi Həzrətlərinin Fəlsəfəsi*, **KBYEK**, Nr. 1792.

ANONİM, *Mu'cəmü'ş-Şüyux minə'r-Rical və'n-Nisa*, **KSU** Library, Nr: 3065.

BEYHƏQİ, Zəhirəddin Əli ibn Zeyd, *Tətimmət Səuanü'l-Hikmə*, **AMEA Əİ** Fondu, Nr: Fp-744.

İBN KƏSİR əl-ƏNSARİ, Əbu İbrahim İsmayıl ibn Cə'fər, *Zeyl Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, http://www.way2wannah.com

ŞUŞTƏRİ, Qazi Seyyid Nurullah, *Məcalisü'l-Mu'minin*, **AMEA Əİ** Fondu, Nr. D 106/10083.

XINALIZADƏ, Əlaəddin Əli ibn Əmrullah, *Təbəqatü'l-Hənəfiyyə*, Hacı Mahmud Əfəndi Kitabxanası, Nr: 4662.

**Nəşr Olunmuş Əsərlər**

AHMADOV, Shahı, *Azerbaycan'da Şiîliğin Yayılma Süreci*, Ankara 2005.

ANONİM, *Əcaibü'd-Dünya*, (Trc. L. Smirnova), Moskva 1993.

ANONİM, *Hüdudü'l-Aləm minə'l-Məşriq ilə'l-Məğrib*, (Nşr. Y. əl-Hadi), Qahirə 1999.

ANONİM, *Tuhfətü'l-İxvan dər Bəyani-Üsuli-Fütuvvət və Adabi-Fityan*, (Nşr. M. Damadi), Tehran 1351.

AQSARAYİ, Kəriməddin Mahmud, *Müsamərətü'l-Əxbar və Müsayərətü'l-Əxyar*, (Nşr. O. Turan), Ankara 1944.

ARTAMONOV, Mixail, *İstoriya Xazar*, Leninqrad 1962.

ASİMİ, Əbdülməlik əl-Məkki, *Səmtü'n-Nücumu'l-Əvali fi Ənbai'l-Əvail və't-Təvali*, (Hzr. A. Ə. Əbdülmövcud-Əvəz Ə. M), Beyrut 1998.

AŞURBƏYLİ, Sara, *Şirvanşahlar Dövləti, VI-XVI əsrlər*, Bakı 2006.

AYDINLI, Abdullah, *Hadis Istılahları Sözlüğü*, İstanbul 1987.

BAĞDADİ, Əbu Bəkr Muhəmməd ibn Əbdülqəni, *Təkmilətü'l-İkmal*, (Nşr. Ə. Əbdülqəyyum), C. I-VI, Məkkə 1410.

BAĞDADİ, Xətib Əhməd ibn Əli, *Əsmai'l-Mübhəmə fi'l-Ənbai'l-Məhkəmə*, www.almeshkat.net.

_____________, *Tarixu-Mədinətü's-Səlam Bağdad*, C. I-XIV, Qahirə 1931.

BAĞDADLI, İsmayıl Paşa, *Hədiyyətü'l-Arifin Əsmai'l-Müəllifin və Asarü'l-Müsənnifin*, (Hzr. R. Bilge-İnal M. K),C. I, İstanbul 1951.

_____________, *Hədiyyətü'l-Arifin Əsmai'l-Müəllifin və Asarü'l-Müsənnifin*, (Hzr. R. Bilge-İnal M. K), C. II, İstanbul 1955.

_____________, *İzahü'l-Məknun fi'z-Zeyli ələ Kəşfü'z-Zünun*, (Nşr. M. R. Kilisli-Yaltkaya Ş), C. I, II, İstanbul 1945.

BAKIXANOV, Abbasqulu ağa, *Gülüstani-İrəm*, Bakı 1951.

BAKUVİ, Əbdürrəşid ibn Saleh ibn Nuri, *Təlxisü'l-Asar və Əcaibü'l-Məlikü'l-Qəhhar*, (Trc. Z. Bünyadov), Bakı 1992.

BARANOV, X. K., *Arabsko-Russkiy Slovar*, Moskva 2007.

_____________, *Soçineniya*, C. II/1, Moskva 1963.

_____________, *Soçineniya*, C. III, Moskva 1965.

BAYRAM, Mikail, *Ahi Evren ve Ahi Teşkilatının Kuruluşu*, Konya 1991.

_____________, *Şeyh Evhaü'd-Din El-Kirmânî ve Menâkıb-Nâmesi*, Konya 2006.

BƏLAZURİ, Əbü'l-Abbas Əhməd ibn Yəhya, *Fütuhü'l-Büldan*, (Nşr. A. ət-Təbba), Beyrut 1987.

BEYHƏQİ, Əbu Bəkr Əhməd ibn Hüseyn, *Məvsusətu-Ricali's-Sünəni'l-Kübra*, Qahirə (trz).

BİDLİSİ, Şərəfxan ibn Şəmsəddin, *Şərəfnamə*, (Trc. Y. Vasilyeva), C. II, Moskva 1976.

_____________, *Şərəfnamə*, (Trc. Y. Vasilyeva), C. I, Moskva 1969.

BİRUNİ, Əbu Reyhan Muhəmməd ibn Əhməd əl-Xarəzmi, *Asarü'l-Baqiyə əni'l-Qüruni'l-Xaliyə*, Leipzig 1878.

BROCKELMANN, Carl, *Geschıchte der Arabıschen Lıtteratur*, E.S, C. I-II, Leiden 1937.

BURSALI, Mehmed Tahir, *Osmanlı Müəllifləri*, C. I-II, İstanbul 1333.

_____________, *Osmanlı Müəllifləri*, C. III, İstanbul 1342.

BUXARİ, Muhəmməd ibn İsmayıl, *Ədəbü'l-Müfrəd*, C. I-II, (Nşr. A. F. Yavuz), İstanbul 1974.

BÜNYADOV, Ziya, *Azərbaycan Atabəyləri Dövləti*, Bakı 1985.

_____________, *Azərbaycan VII-IX Əsrlərdə*, Bakı 1989.

_____________, *İzbrannıye Soçineniya*, C. III, Bakı 1999.

CAHEN, Claud, *Osmanlılardan Önce Anadoluda Türkler*, (Trc. Y. Moran), İstanbul 1994.

CAMİ, Əbdürrəhman, *Nəfəhatü'l-Üns min Həzəratü'l-Qüds*, İstanbul 1279.

CANAN, İbrahim, *Kutubi-Sitte, Tercüme ve Şerhi*, C. I-XVIII, Akçağ Yayınları 2004

CƏNDİ, Bəhaəddin Muhəmməd ibn Yusif, *Süluk fi Təbəqati'l-Üləma və'l-Müluk*, (Nşr. M. Həvali), C. I, Səna 1995.

ÇAĞATAY, Neşet, *Bir Türk Kurumu Olan Ahilik*, Ankara 1974.

_____________, *İslam Dönemine Dek Arap Tarihi*, Ankara 1989.

ÇƏHARDEHİ, Mürtəza Müdərris, *Tarixi-Fəlsəfeyi-İslam*, C. I, Tehran 1347.

DAVUDİ, Şəmsəddin Muhəmməd ibn Əli, *Təbəqatü'l-Müfəssirin*, C. I, Qahirə (trz).

DE SLANE, Mac Guckin, *Catalogue des Manuscrits Arabes*, Paris 1883-1895.

DƏVADARİ, Əbu Bəkr ibn Abdullah ibn Aybək, *Kənzü'd-Dürər və Camiü'l-Ğürər*, (Nşr. S. Ə. Aşur), C. I-VIII, Qahirə 1972.

DEYLƏMİ, Əbu'ş-Şüca Şiruyə ibn Şəhrdar əl-Həmədani, *Firdəvsu'l-Əxbar*, C. I, Dəməşq 1997.

DİMƏŞQİ, Şəmsəddin Əbu Abdullah Muhəmməd əl-Ənsari, *Nuxbətü'd-Dəhr fi Əcaibü'l-Bərr və'l-Bəhr*, (Nşr. A. Mehren), Leipzig 1923.

ƏBBADİ, Muhəmməd ibn Əhməd, *Zeyl Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, (Nşr. Ə. Haşim-Əzb M), Qahirə (trz).

ƏBDİZADƏ, Hüseyn Hüsaməddin, *Tarix-i Amasya*, C. I, İstanbul 1327-1330.

_____________, *Tarix-i Amasya*, C. III, İstanbul 1927.

ƏBÜ'L-FİDA, İmadəddin İsmayıl ibn Əli, *Kitabü't-Tibrü'-Məsbuk fi Təvarixi'l-Müluk*, (Nşr. M. Əzəb), Qahirə 1990.

_____________, *Təqvimü'l-Büldan*, (Nşr. M. Reinaud-De Slane McG.), Paris 1840.

ƏDNİRƏVİ, Əhməd ibn Muhəmməd, *Təbəqatü'l-Müfəssirin*, Beyrut (trz).

ƏFLAKİ, Əhməd, *Ariflerin Menkıbeleri*, (Trc. T. Yazıcı), C. I-II, İstanbul 1989.

ƏHƏRİ, Əbu Bəkr əl-Kutubi, *İstoriya Şeyxa Uveysa*, Bakı 1984.

ƏHMƏDOV, Qara, *Qədim Beyləqan*, Bakı 1997.

ƏKFANİ, Hibətullah ibn Əhməd, *Zeylu-Zeyl Tarixi-Məvlidi'l-Üləma və Vəfayatihim*, (Nşr. A. Həməd), Riyad 1409.

ƏLİ, Cavad, *Müfəssəl fi Tarixü'l-Ərəb Qəblə'l-İslam*, C. I, II, Bağdad 1993.

ƏNDƏLÜSİ, Əbü'l-Həsən ibn Abdullah ən-Nəbahi, *Tarixu Quzatu'l-Əndəlus*, Beyrut 1983.

ƏNSARİ, Əbu Muhəmməd Abdullah ibn Muhəmməd, *Təbəqatu'l-Mühəddisin bi-İsbəhan və'l-Varidin Əleyha*, Beyrut 1989.

EROĞLU, Cengiz-Murat BABUÇOĞLU-KÖÇER, Mehmet, *Osmanlı Vilayet Selnamelerinde Halep*, Anrara 2007.

ƏSNƏVİ, Cəmaləddin Əbdürrəhim ibn Həsən, *Təbəqatu's-Şafi'iyyə*, C. I-II, Beyrut 1987.

ƏYNİ, Bədrəddin Mahmud, *İqdü'l-Cüman fi Tarixi Əhlü'z-Zəman*, Qahirə 1987.

FAHRİ, Macit, *İslam Felsefesi Tarihi*, İstanbul 1998.

FAZİLİ, Abdulla, *Atropatena er.əv. IV-er. VII əsri*, Bakı 1992.

FƏHMİ, Əbdüssalam Əbdüləziz, *Tarixu'd-Dövləti'l-Moğoliyyə fi İran*, Qahirə 1981.

GÖLPINARLI, Abdülbaki, *Mevlana Celaleddin*, İstanbul 1959.

_____________, *Mevlana Müzesi Yazmalar Kataloğu*, C. I, Ankara 1967.

_____________, *Yunus Emre ve Tasavvufu*, İstanbul 1992.

GÖYÜŞOV, Rəşid, *Azərbaycan Arxeologiyası*, Bakı 1983.

HACIYEV, Qasım, *Bərdə Şəhəri, Coğrafi, Siyasi və Mədəni Tarixi*, Bakı 2008.

HƏLƏBİ, Əli Əsğər, *Tarixi-Fəlasifəyi-İran, Əz Ağaze-İslam ta İmruz*, Tehran (Trz).

HƏMƏVİ, Şihabəddin Yaqut ibn Abdullah ər-Rumi, *İrşadü'l-Ərib*, Dəməşq 1980.

_____________, *Mu'cəmü'l-Büldan*, C. I-VII, Beyrut (trz).

HƏMİDULLAH, Muhəmməd, *Vəsaiqü's-Siyasiyyə*, Beyrut 1985.

HƏNBƏLİ, Əbdürrəhman ibn Əlməd ibn Rəcəb, *Zeyl Təbəqatu'l-Hənabilə*, C. I, Qahirə 1952.

HİDAYƏT, Rzaqulu Xan, *Riyazü'l-Arifin*, Tehran 1305.

HİMYƏRİ, Cəmaləddin Abdullah Təyyib ibn Abdullah ibn Əhməd, *Nisbə ilə'l-Məvazi' və'l-Büldan*, C. I, Beyrut (trz).

HOCAZADE, Ahmed Hilmi, *Seyyid Yahya eş-Şirvani*, İstanbul 1319.

HÜSEYNİ, Əbdülhəyy ibn Fəxrəddin, *Nüzhətü'l-Xəvatir və Behcətü'l-Məsami' və'n-Nəvazir*, Beyrut 1999.

İBN BATTUTA, Muhəmməd ibn Abdullah, *Rıhlə*, C. I-II, Qahirə 1322.

İBN BİBİ, Hüseyn ibn Muhəmməd, *Əvamirü'l-Əlaiyyə fi Umuri'l-Əlaiyyə*, (Nşr. A. S. Erzi), Ankara 1956.

_____________, *Əxbari-Səlacuqe-Rum*, (Nşr. M.C.Məşkur), Tehran 1971.

İBN ƏBDÜLHADİ, Əbu Abdullah ibn Muhəmməd ibn Əhməd əd-Diməşqi, *Təbəqatu-Üləmai'l-Hədis*, C. I-IV, (Nşr. Ə. Buşi-Zeybəq İ), Beyrut 1997.

İBN ƏBİ ÜSEYBİYƏ, Müvəffəqəddin Əbü'l-Abbas, *Üyunü'l-Ənba fi Təbəqatü'l-Ətibba*, Beyrut (trz).

İBN ƏBİ YƏ'LA, Əbü'l-Hüseyn Muhəmməd ibn Muhəmməd, *Təbaqatü'l-Hənabilə*, Qahirə 1952.

İBN ƏBÜ'l-VƏFA, Muhyəddin Əbu Muhəmməd Əbdülqadir əl-Quraşi, *Cəvahirü'l-Muziyyə fi Təbəqatü'l-Hənəfiyyə*, C. I-V, Beyrut 1993.

İBN ƏRƏBŞAH Şihabəddin Əhməd, *Əcaibü'l-Məqdur fi Tarixi-Teymur*, (Trc. H. Bababekov), Daşkənd 2007.

İBN ƏSAKİR, Əbü'l-Qasım Əli ibn Həsən, *Mu'cəmü'ş-Şüyux*, (Nşr. S. əş-Şihabi), Dəməşq 1980.

_____________, *Tarixu-Mədinəti-Diməşq*, (Nşr. M. Əmrəvi), C. I-LXXX, Beyrut 1995-2000.

İBN FƏQİH, Əhməd ibn Muhəmməd əl-Həmədani, *Kitabü'l-Büldan*, (Nşr. M. De Goeje), Leiden 1885.

İBN FƏRHUN, Əbu Muhəmməd Fərhun ibn Muhəmməd Tunisi, *Dibacü'l-Müzəhhəb fi Mə'rifəti Ə'yani-Üləmai'l-Məzhəb*, Qahirə 1972.

İBN FƏZLAN, Əhməd, *Səyahətnamə*, (Nşr. R. Şeşen), İstanbul 1995.

İBN HƏCƏR, Əhməd ibn Əli əl-Əsqəlani, *Dürərü'l-Kaminə fi Əyanü'l-miəti's-saminə*, C. I-III, Heydərabad 1929.

_____________, *İbnai'l-Ğumr bi Əbnai'l-Umr*, C. II, Heydərabad 1968.

_____________, *Lisanü'l-Mizan*, C. I-VII, Beyrut 1986.

_____________, *Nüzhətü'l-Əlbab fi'l-Əlqab*, (Nşr. Ə. Sudeyri), Riyad 1989.

____________, *Rəfi'ü'l-İsr ən Quzat Misir*, London 1908.

İBN HİBBAN, Əbu Hatim Muhəmməd ət-Təmimi əl-Busti, *Kitabu's-Suqat*, C. I-IX, Heydərabad 1975.

İBN KƏSİR, İmadəddin İsmayıl ibn Ömər, *Bidayə və'n-Nihayə*, (Trc. M. Keskin), C. I-XIV, İstanbul 1994.

İBN MACƏ, Əbu Abdullah Muhəmməd ibn Yəzid əl-Qəzvini, *Sünən*, (Trc. H. Hatipoğlu), C. I-IX, İstanbul 1983.

İBN MAKULA, Əbu Nəsr Əli ibn Hibətullah, *İkmal*, C. I-II, Qahirə 1976.

İBN MİSKƏVEYH, Əbu Əli Muhəmməd ibn Muhəmməd, *Təcaribü'l-Üməm*, (Trc. H. Amedroz), C. IV, V, London 1921.

İBN MÜLQİN, Siracəddin Ömər ibn Əli, *Təbəqatü'l-Əvliya*, www.balligho.com.

İBN NƏZİF, Əbü'l-Fəzl Muhəmməd əl-Həməvi, *Təlxisü'l-Kəşf və'l-Bəyan fi Həvadisü'z-Zaman*, (Hzr. Ə. Dəvdəv), Dəməşq 1981.

İBN NÖQTƏ, Əbu Bəkr Muhəmməd ibn Əbdülqəni Bağdadi, *Təqyid li-Mə'rifəti-Ruvatü's-Sünən və'l-Əsanid*, Beyrut 2001.

İBN QAZİ ŞUHBƏ, Əbu Bəkr ibn Əhməd ibn Muhəmməd əd-Diməşqi, *Təbəqatü'ş-Şafi'iyyə*, (Nşr. H. Əbdüləlim Xan), C. I-III, Heydərabad 1978.

İBN QUDAMƏ, Müvəffəqəddin Abdullah əl-Muğni, *Kitabu's-Siəm*, www.islamweb.net

İBN QUTLUBUĞA, Zeynəddin Əbü'l-Ədl Qasım əl-Misri, *Tacü't-Tərcim fi Təbəqatü'l-Hənəfiyyə*, Bağdad 1962.

İBN RAFİ', Təqiyyəddin Muhəmməd, *əl-Vəfayat*, Dəməşq 1986.

İBN ŞAKİR, Səlahəddin Muhəmməd əl-Kutubi, *Fəvatü'l-Vəfayat*, (Nşr. M. Əbdülhəmid), C. I-II, Qahirə, 1951.

İBN ŞƏDDAD, Bəhaəddin Yusif ibn Rafi, *Sirətü's-Sultanü'l-Malikü'n-Nasir Səlahəddin*, (Nşr. A. Schultens), Leiden 1755.

İBN TAĞRIBİRDİ, Cəmaləddin Əbü'l-Məhasin Yusif, *Mənhəlü's-Safi və'l-Müstəvfi bə'də'l-Vafi*, (Nşr. M. M. Əmin), C. I-II, Qahirə 1984.

____________, *Nücumu'z-Zahirə fi Müluki-Misr və'l-Qahirə*, C. I-IV, Qahirə 1930.

İBN TEYMİYYƏ, Təqiyəddin Əbü'l-Abbas Əhməd, *Hüseyn b. Mansur el-Hallac*, (Trc. M. Bayram), Konya (trz).

____________, *Kitabü'l-İman*, (Trc. S. Uçan), İstanbul 1994.
İBN TOLON, Şəmsəddin Muhəmməd ibn Əli əs-Sahili, *Səğru'l-Bəssam fi Zikri mən Vəlyə Qəza'u'ş-Şam*, Beyrut 1956.
İBN XƏLDUN, Vəliyəddin Əbdürrəhman, *Kitabü'l-İbər və Divanü'l-Mübtəda və'l-Xəbər*, C. I, Beyrut 1979.x
İBN XƏLLİKAN, Şəmsəddin Əhməd, *Vəfayatü'l-Əyan və Ənba Əbnaü'z-Zaman*, C. I-VII, Beyrut 1974.
İBN XORDADBEH, Əbü'l-Qasım Übeydullah ibn Əhməd, *Məsalikü'l-Məmalik*, Leiden 1889.
İBNü'l-ADİM, Kəmaləddin Ömər ibn Əhməd, *Buğyətü't-Tələb fi Tarixi-Hələb*, (Nşr. S. Zəkkar), C. I-III, Beyrut 1987.
İBNü'l-CƏVZİ, Əbü'l-Fərəc Əbdürrəhman ibn Əli, *İ'lili'l-Mütənahiyə*, C. II, Beyrut (trz).
____________, *Müntəzəm fi't-Tarixi'l-Müluk və'l-Üməm*, (Nşr. M. Ə. Əta-Əta M. Ə), C. I-XIX, Beyrut 1992-1993.
İBNü'l-CƏVZİ, Əbü'l-Fərəc Əbdürrəhman ibn Əli, *Sifətü's-Səfvə*, (Hzr. M. Dəfaxuri), C. II, Beyrut 1985.
İBNü'l-CƏZƏRİ, Şəmsəddin Muhəmməd, *Qayətü'n-Nihayə fi Təbəqatü'l-Qurra*, Beyrut 2006.
İBNü'l-Ə'SƏM, Əhməd əl-Kufi, *Fəthlər Kitabı*, (Trc. Z. Bünyadov), Bakı 1995.
İBNü'l-ƏNBARİ, Kəmaləddin Əbü'l-Bərəkat Əbdürrəhman, *Nuzhətü'l-Əlba fi Təbəqatü'l-Üdəba*, Zərqa 1985.
İBNü'l-ƏSİR, İzzəddin Əli, *Kamil fi't-Tarix*, (Trc. A. Ağırakça-Özaydın A), C. I-XII, İstanbul 1987.
____________, *Lübabfi Təhzibü'l-Ənsab*, C. I-III, Bağdad (trz).
İBNü'l-ƏZRAQ, Əbu Abdullah Muhəmməd, *Bidai's-Sülk fi Təbai'l-Mülk*, (Nşr. Ə. Nəşşar), C. I, Dəməşq 2006.
İBNü'l-FUVATİ, Kəmaləddin Əbü'l-Fəzl Əbdürrəzzaq ibn Əhməd, *Həvadisü'l-Camiə' və't-Təcaribü'n-Nafiə'*, (Nşr. M. Cavad), Bağdad 1351.
____________, *Məcməü'l-Adab fi Mu'cəmü'l-Əlqab*, C. IV/2, (Nşr. M. Cavad), Dəməşq 1963.

____________, *Məcməü'l-Adab fi Mu'cəmü'l-Əlqab*, C. IV/3, (Nşr. M. Cavad), Dəməşq 1965.

İBNü'l-İBRİ, Əbü'l-Fərəc Qriqoriy, *Tarixu Müxtəsərü'd-Düvəl*, Beyrut 1992.

İBNü'l-İMAD, Əbdülhəyy ibn Əhməd, *Şəzəratü'z-Zəhəb fi Əxbari mən Zəhəb*, (Nşr. Ə. Arnavud), C. I-X, Dəməşq 1986-1991.

İBNü'l-QEYSƏRANİ, Əbü'l-Fəzl, *Ənsabü'l-Müttəfiqə*, Bağdad 1970.

İBNü'l-VERDİ, Siracəddin Əbü'l-Həfs Ömər, *Xəridətü'l-Əcaib və Fəridətü'l-Qəraib*, (Nşr. A. Bədravi), Beyrut 1970

İBNÜ'n-NƏDİM, Muhəmməd ibn İshaq, *əl-Fihrist*, (Nşr. R. Təcəddüd), Beyrut 1978.

İBNü's-SABUNİ, Cəmaliddin Muhəmməd, *Təkmilətü'l-İkmalü'l-İkmal fi'l-Ənsab*, (Nşr. M. Cavad), Bağdad 1957.

İBNü'l-MÜRTƏZA, Əhməd ibn Yəhya, *Kitab Təbəqatü'l-Mu'təzilə*, Beyrut 1987.

İDRİSİ, Şərif Əbü'l-Həsən Muhəmməd, *Nüzhətü'l-Müştaq fi İxtiraqi'l-Afaq*, Riyad 1989.

İRAQİ, Əbü'l-Fəzl Əbdürrəhim ibn Hüseyn, *Zeyl Mizanü'l-Etidal*, (Nşr. M. Müəvvəz-Əbdülmövcud A. Ə), Beyrut 1995.

İSBƏHANİ, Əbu Nueym Əhməd ibn Abdullah, *Hilyətü'l-Əvliya və Təbəqatü'l-Əsfiya*, C. I-XII, Beyrut 2007.

____________, *Zikr Əxbaru-İsbəhan*, C. I-II, Leiden 1934.

İSFƏHANİ, Əbu Bəkr Muhəmməd ibn İbrahim, *Mu'cəmü'ş-Şüyux*, C. I-III, www.balligho.com.

İSFƏHANİ, Əbu Tahir Əhməd ibn Muhəmməd əs-Sübəfi, *Ərbəinü'l-Büldaniyyə*, (Hzr. A. Rabih), Dəməşq 1992.

____________, *Mu'cəmü's-Səfər*, Məkkə (trz).

İSTƏXRİ, İbrahim ibn Muhəmməd, *Məsalikü'l-Məmalik*, Leiden 1927.

İZMİRLİ, İsmayıl Hakkı, *İslam'da Felsefe Akımları*, (Nşr. N.A. Özalp), İstanbul 1995.

KAFESOĞLU, İbrahim, *Harezmşahlar Devleti Tarihi*, Ankara 1992.

KALANKATUKLU, Moisey, *Albaniya Tarixi*, (Trc. Z. Bünyadov), Bakı 1993.

KALLEK, Cengiz, *Asrı-Saadette Yönetim Piyasa İlişkisi*, İstanbul 1997.

KANAR, Mehmet, *Büyük Farsça-Türkçe Sözlük*, İstanbul 1993.

KATİB ÇƏLƏBİ, Hacı Xəlifə, *Kəşfü'z-Zünun ən Əsami'l-Kütb və'l-Fünun*, C. I-II, İstanbul 1311.

KƏHHALƏ, Ömər Rza, *Mu'cəmü'l-Müəllifin*, C. I-IV, Beyrut 1993.

KƏTTANİ, Əbu Muhəmməd Əbdüləziz, *Zeyl Tarixi-Məvlidi'l-Üləma və Vəfayatihim*, (Nşr. A. Həməd), Riyad 1409.

KİNANİ, Əbü'l-Həsən Əli ibn Muhəmməd, *Tənzihü'ş-Şəri'ətü'l-Mərfuə*, C. I, Beyrut 1982.

KLEVTSOVA, S., *Russko-Persidskiy Slovar*, Tehran 1374.

KONYALI, İbrahim Hakkı, *Konya Tarihi*, Konya 1964.

KUTALMIŞ, Orhan Güdül, *Türkçe İnsan Adları ve Anlam-kökenleri*, www.kitablar.org.

MAHMUDOV, Malik, *Ərəbcə Yazmış Azərbaycanlı Şair və Ədiblər VII-XII Əsrlər*, Bakı 2006.

MATTHİEU D'ÉDESSE, *Chronique*, (Nşr. E. Dulaurier), Paris 1858.

MAY, Timothy, *Chormaqan Noyan: The First Mongol Military Governor in the Middle East*, Indiana 1996.

MƏMMƏDOV, Zakir, *Orta Əsr Azərbaycan Filosof və Mütəfəkkirləri*, Bakı 1986.

MƏQDİSİ, Şəmsəddin Muhəmməd əl-Bəşşari, *Əhsənü't-Təqasim fi Mərifəti'l-Əqalim*, Tehran 2006.

MƏQDİSİ, Şihabəddin Əbu Şamə Əbdürrəhman ibn İsmayıl, *Rəvzəteyn fi Əxbari'd-Dövləteyn*, (Nşr. İ. Zeybəq), Beyrut 1997

_____________, *Təracim Ricali'l-Qərneynü's-Sadis və's-Sabi'*, Beyrut (trz).

MƏQRİZİ, Təqiyəddin Əhməd ibn Əli, *Dürərü'l-Uqudu'l-Fəridə fi Təracimü'l-Ə'mali'l-Müfidə*, (Hzr. A. Dərviş-əl-Misri M), C. I, Dəməşq 1995.

_____________, *Kitabu's-Süluk fi Mərifəti-Düvəl və'l-Müluk*, C. I-III, Beyrut 1997.

_____________, *Kitabü'l-Müqəffai'l-Kəbir*, (Nşr. M. ibn Təlhə), C. I-VIII, Beyrut 1991.

MƏS'UDİ, Əbü'l-Həsən Əli, *Mürucü'z-Zəhəb və Mə'adini'l-Cəvhər*, (Nşr. M.M. Əbdülhəmid), C. I-II, , Beyrut 1973.

MƏS'UDİ, Əbü'l-Həsən Əli, *Tənbih və'l-İşraf*, Beyrut 1981.

MICHEL le SYRIEN, *Chronique*, (J.B. Chabot), C. II, III, Paris 1905.

MİNORSKİY, Vladimir, *İstoriya Şirvana i Derbenta X-XI vekov*, (Trc.A.Əlizadə), Moskva 1963.

_____________, *Tarixi-Təbriz*, (Trc. Ə. Karəng), Tehran 1337.

MİRXOND, Hamidəddin Muhəmməd ibn Xondşah, *History of the Early Kings of Persia*, (Trc. D. Shea), London 1832.

MURADİ, Muhəmməd Xəlil, *Sülukü'd-Dürər fi Əyanü'l-Qərni's-Sani Əşər*, C. I-II, Beyrut 1997.

MÜDƏRRİS, Mirzə M. Əli, *Reyhanətü'l-Ədəb*, C. I, Təbriz (Trz).

MÜNZƏVİ, Əli Təqi, *Fərhəngnaməyi Ərəbi bə Farsi*, Tehran 1337.

MÜSLİM, Əbü'l-Hüseyn ibnü'l-Həccac əl-Quşeyri Nişapuri, *Səhih*, (Trc. A. Davutoğlu), C. I-IX, İstanbul 1968.

MÜŞTƏRƏK, *A Title Catalogue of Persian Manuscripts in the National Library Till 1963*, C. I, Kahire 1966.

MÜŞTƏRƏK, *Azərbaycan Tarixi*, Bakı 1994.

MÜŞTƏRƏK, *Fehriste-Kitabxaneyi-Astanqüdse-Rezəvi*, C. XI, Tehran 1926.

MÜŞTƏRƏK, *Fihris Mahtutat-ı Mektebet-i Köprülü*, (Nşr. E. İhsanoğlu), C. II, İstanbul 1986.

MÜŞTƏRƏK, *İstoriya İrana s Drevneyşix Vremyon do Kontsa XVIII veka*, Leninqrad 1958.

MÜŞTƏRƏK, *Qarabağnamələr*, C. I, Bakı 1989.

MÜŞTƏRƏK, *Qarabağnamələr*, C. II, Bakı 1991.

MÜŞTƏRƏK, *Türk ve İslam Ansiklopedisi*, C. II, Tercuman Tarih ve Kültür Yayınları 1979.

NƏFİSİ, Səid, *Tarixi-Nəzm və Nəsr dər İran və dər Zebane-Farisi*, C. I-II, Tehran 1344.

NƏSƏVİ, Muhəmməd ibn Əhməd, *Siyrətü's-Sultan Cəlaləddin Məngübərti*, (Nşr. Ə. Həmdi), Qahirə 1952.

NƏSİROV, Elnur, *Raşidi Xəlifələr Dövründə Azərbaycanın Fəthi*, Bakı 2006.

_____________, *XIII Yüzyıl Başlarında Anadolu-Azerbaycan İlişkileri*, Konya 2003.

NƏVAYİ, Əlişir, *Nəsayimü'l-Məhəbbə min Şəmayimü'l-Fütuvvə*, (Nşr. K. Eraslan), İstanbul 1979.

NİŞANCI, Mehmed paşa, *Hadisat*, İstanbul 1983.

NUEYMİ, Əbdülqadir ibn Muhəmməd əd-Diməşqi, *Daris fi Tarixi'l-Mədaris*, C. I-II, (Nşr. Ş. İbrahim), Beyrut 1990.

ONULLAHİ, Seyidağa, *XIII-XVII Əsrlərdə Təbriz Şəhəri*, Bakı 1982.

ORMANIAN, Malachia, *The Church of Armenia*, (Trc. M. Gregory), London 1910.

ÖVLİYA ÇƏLƏBİ, Mehmed Zılli ibn Dərviş, *Səyahətnamə*, (Nşr. Ə. Cəvdət), İstanbul 1314.

PARMAKSIZOĞLU, İsmet, *Türkiye Yazmaları Toplu Kataloğu*, C. III, İstanbul 1984.

PARMAKSIZOĞLU, İsmet-Abdullah UYSAL, *Türkiye Yazmaları Toplu Kataloğu*, C. IV, İstanbul 1984.

PEÇEVİ, İbrahim, *Tarixi-Peçevi*, C. I-II, İstanbul 1281.

PETRUŞEVSKİY, İlya P., *Oçerki po İstorii Feodalnıx Otnoşeniy v Azerbaydjane i Armenii v XVI-XIX vv*, Leninqrad 1949.

PİRİYEV, Vaqif, *Azərbaycanın Tarixi-Siyasi Coğrafiyası*, Bakı 2006.

QANZAKETSİ, Kirakos, *İstoriya Armenii*, (Trc. L. Xanlaryan), Moskva 1976.

QARAYEV, Elçin, *Azərbaycan XVIII Əsr Rus və Qərbi Avropa Səyyahlarının Təsvirində*, Bakı 2005.

QAZİ ƏBDÜLCƏBBAR, İmadəddin Əbü'l-Həsən ibn Əhməd Əstərabadi, *Təbəqatü'l-Mu'təzilə*, Tunis 1974.

QAZİ İ'YAZ, Əbü'l-Fəzl ibn Musa əs-Səbti, *Tərtibü'l-Mədarik və Təqribü'l-Məsalik*, (Nşr. M. S. Naşim), Beyrut 1998.

QƏZVİNİ, Həmdullah Mustəvfi, *Tarixi- Qozidə*, (Trc. E. G. Browne), London 1913.

___________, *Tarixi-Qozidə*, (Nşr. A. Nəvayi), Tehran 1364.

___________, *Nüzhətü'l-Qülub*, (Trc. G. Le Strange), London 1919

QƏZVİNİ, Zəkəriyya Muhəmməd, *Asarü'l-Bilad və Əxbarü'l-İbad*, (Nşr. S.M.Şahmuradi), Tehran 1373.

QƏZZİ, Nəcməddin Muhəmməd, *Kəvakibü's-Sairə bi Əyani'l-Miətü'l-Aşirə*, Beyrut 1997

QIFTİ, Cəmaləddin Əbü'l-Həsən Əli ibn Yusif əl-, *Tarixü'l-Hükəmayi-Qıfti*, (Nşr. B. Dayayi), Tehran 1347.

___________, *İnbahu'r-Ruvat ələ Ənbahi'n-Nuhat*, (Nşr. M. Ə. İbrahim), C. II, III, Beyrut 1986.

QIRNATİ, Əbu Hamid Muhəmməd ibn Əbdürrəhman, *Nuxbətü'l-Əlzan fi Əcaibü'l-Büldan*, (Trc. O. Bolşakov), Moskva 1971.

QLİNKA, Sergey, *Opisaniye Pereseleniya Armyan Azerbaydjanskix v Predelı Rossii*, Moskva 1831.

QOŞ, Mxitar, *Alban Salnaməsi*, (Trc. Z. Bünyadov), Bakı 1993.

QÜŞEYRİ, Əbü'l-Qasım Əbdülkərim, *Risalə fi İlmü't-Təsəvvüf*, Qahirə 1986.

RAFİ'İ, Əbdülkərim ibn Muhəmməd əl-Qəzvini, *Tədvin fi Əxbari Qəzvin*, (Nşr. Ə. Utaridi), C. I-IV, Beyrut 1978.

RƏŞİDƏDDİN Fəzlullah, *Cəmiü't-Təvarix*, (Trc. L. Xetaqurov), C. I, Leninqrad 1952.

REZƏVİ, Muhamməd Təqi, *Əhval və Asar Xacə Nasirəddini-Tusi*, Tehran 1354.

RIHTIM, Mehmed, *Seyid Yəhya Bakuvi və Xəlvətilik*, Bakı 2005.

RUMİ, Mövlana Cəlaləddin, *Mektuplar*, (Trc. Ə. Gölpınarlı), İstanbul 1963.

SAMİ, Şəmsəddin, *Qamusi-Türki*, (Nşr. Ö. F. Akün), İstanbul 1998.

SARI, Mevlüt, *Arapça-Türkçe Lugat*, İstanbul 1982.

SCHİMMEL, Annamarie, *İslamın Mistik Boyutları*, (Trc. E. Kocabıyık), İstanbul 2001.

SƏFA, Zəbihullah, *Tarixi-Ədəbiyyat dər İran*, C. II, Tehran 1339.

___________, *Tarixi-Ülume-Əqli dər Təməddüne-İslami*, C. II, Tehran 1329.

SƏFƏDİ, Səlahəddin Xəlil ibn Aybək, *Ə'yanü'l-Əsr və Ə'vanü'n-Nəsr*, C. I-VI, Dəməşq 1998.

___________, *Tuhfətü'z-Zəviə'l-Əlbab*, (Nşr. İ. S. Xülusi-Səmsam Z. H), C. I-II, Dəməşq 1991.

___________, *Vafi bi'l-Vəfayat*, (Nşr. Z. Mustafa-Arnavut Ə), C. I-XXIX, Beyrut 2000.

SƏLMASİ, Əbu Zəkəriyya Yəhya ibn İbrahim, *Mənazili'l-Əimməti'l-Ərbəə'*, (Nşr. M. Ə. Qədəh), Mədinə 2002.

SƏM'ANİ, Əbu Səid Əbdülkərim ibn Muhəmməd, *Kitabü'l-Ənsab*, (Nşr. A. əl-Barudi), C. I-IV, Beyrut 1988.

SƏXAVİ, Şəmsəddin Əbü'l-Xeyr Muhəmməd ibn Əbdürrəhman, *Tuhfətü'l-Lətifə fi Tarixi'l- Mədinətü'ş-Şərifə*, C. I-II, Qahirə 1958.

___________, *Zəvu'l-Lami' fi Üləmai'l-Qərnü't-Tasi'*, C. I-V, Əmman 1992.

SEYRƏFİNİ, Təqiyəddin Əbu İshaq İbrahim ibn Muhəmməd, *Müntəxəb min Kitabi's-Siyaqi't-Tarixi-Nişabur*, (Nşr. X. Heydər), Beyrut 1414.

SİPEHSALAR, Feridun ibn Ahmed, *Menâkıb-ı Hazreti Hüdavendigâr*, (Çev. M. Biharî), İstanbul 1331.

SİVASİ, Muhəmməd, *Mənaqibi-şeyx Əvhədəddini-Kirmani*, Tehran 1369.

SMBAT SPARAPET, *Letopis*, (Trc. Qlastyan), İrəvan 1974.

SPULER, Berthold, *Vierter Band Iranistik Zweiter Abschnitt Literatur*, Leiden 1968.

STOREY, Charles Ambrose, *Persian Literature, A Bio-Bibliographical Survey*, C. II/2, London 1971.

SULTAN VƏLƏD, *Divan*, (Nşr. F.N.Uzluk), Uzluk Basımevi 1941.

SÜBKİ, Tacəddin Əbdülvəhhab ibn Əli, *Təbəqatü'ş-Şafi'iyyə əl-Kübra*, (Nşr. M. ət-Tənnahi-əl-Hülv Ə), C. I-X, Qahirə 1964-1976.

SÜHRƏVƏRDİ, Şihabəddin Yəhya, *Məcmuate-Asari-Farisi Şeyx İşraq*, C. II, (Nşr. S.H.Nasr-Corbin H), Tehran 1970.

___________, *Məcmuate-Müsənnifati-Şeyx İşraq*, C. II, (Nşr. H. Corbin), Tehran 1373.

SÜLƏMİ, Əbu Əbdürrəhman Muhəmməd, *Təbəqatü's-Sufiyyə*, (Hzr. Ə. Şərbas), Qahirə 1998.

SÜMER, Faruk, *Oğuzlar*, İstanbul 1999.

SÜREN, Arzu, Şükrullah-i Şirvani'nin Nahlistan Adlı Eserinin Metni ve Metin İncelemesi, İstanbul 2006.

SÜREYYA, Mehmed, *Sicil-i Osmani*, (Hzr. N. Akbayar), C. I-VI, İstanbul 1996.

SÜYUTİ, Cəlaləddin Əbdürrəhman ibn Əbu Bəkr, *Hüsnü'l-Mühazirə fi Əxbari-Müluk Misr və'l-Qahirə*, Beyrut 1997.

___________, *Lübbü'l-Lübab fi Təhrir'l-Ənsab*, (Nşr. M. Əbdüləziz), Beyrut 1991.

___________, *Nəzmü'l-İqyan fi İ'yanü'l-Əyan*, Beyrut 2001.

___________, *Təbəqatü'l-Hüffaz*, Qahirə 1973.

____________, *Təbəqatü'l-Müfəssirin*, Qahirə 1972.

ŞƏ'RANİ, Əbdülvəhhab, *Təbəqatü'l-Kübra*, (Trc. A. Akçiçek), C. I, İstanbul 1968.

ŞƏHRƏZURİ, Təqiyəddin Əbu Əmr Osman ibnü's-Səlah, *Təbəqatü'l-Füqəhai'ş-Şafi'iyyə*, (Hzr. M. Ə. Nəcib), C. I-II, Beyrut 1992.

ŞƏHRİSTANİ, Muhəmməd ibn Əbdülkərim, *Miləl və'n-Nihal*, (Trc. M. Öz), İstanbul 2008.

ŞƏLBİ, Mahmud, *Həyatü'l-Məlikü'l-Müzəffər Qutuz*, Beyrut 1992.

ŞƏRİFLİ, Kamandar, *Əbdülqəni Əfəndi Nuxəvi Xalisəqarızadə Kitabxanasının Kataloqu*, C. I, Bakı 2009.

ŞEŞEN, Ramazan, *Müslümanlarda Tarih-Coğrafya Yazıcılığı*, İstanbul 1998.

ŞİRAZİ, Əbu İshaq İbrahim ibn Əli, *Təbəqatü'l-Füqəha*, Beyrut 1970.

ŞİRVANİ, Hacı Zeynəlabdin, *Riyazü's-Səyahə*, Tehran 1339.

ŞOPEN, İvan, *İstoriçeskiy Pamyatnik Sostoyaniya Armyanskoy Oblasti v Epoxu Yeyo Prisoyedineniya k Rossiyskoy İmperii*, St.Peterburq 1852.

ŞÜKRİ, Əyman Ömər, *Sultan Bərquq-Müəssis Dövlətü'l-Məmalikü'l-Cərakizə*, Qahirə 2002.

TAŞKÖPRÜZADƏ, İsaməddin Əhməd, *Mövzuatü'l-Ülum*, C. I-III, Beyrut 1985.

____________, *Şəqaiqü'n-Numaniyyə fi Üləmai-Dövləti'l-Osmaniyyə*, Beyrut 1985.

TƏBƏRİ, Əbu Cə'fər Muhəmməd ibn Cərir, *Camiü'l-Bəyan fi Təfsiri'l-Qur'an*, C. VIII, İstanbul 1996.

____________, *Tarixi-Təbəri*, C. V, Tehran 1383.

TƏBRİZİ, Şəmsəddin Muhəmməd, *Məqalati-Şəmsi-Təbrizi*, (Nşr. Ə. Xoşnüvis), Tehran 1349.

TEHRANİ, Ağa Bozorg, *Təbəqatü'l-İ'lami'ş-Şafi'iyyə*, (Hzr. Ə. T. Fənrəvi), Beyrut 1971.

TƏMİMİ, Təqiyəddin ibn Əbdülqadir əl-Qəzzi, *Təbəqatü's-Səniyyə fi Təracimü'l-Hənəfiyyə*, (Nşr. Ə. Muhəmməd), Riyad 1989.

TƏRBİYƏT, Məhəmməd Əli, *Danişməndani Azərbaycan*, (Trc. İ. Şəms-Kəndli Q), Bakı 1987.

TİFLİSİ, Kəmaləddin Əbü'l-Fəzl Hübeyş, *Bəyanü's-Sənə'ət*, (Nşr. Q. Mixaleviç), Moskva 1976.

